Mehman Süleymanov

# AZƏRBAYCAN ORDUSU
# (1918-1920)



Hərbi Nəşriyyat
Bakı – 1998

68.4 Az
S 98
97

Elmi redaktoru:
**Pərvin DARABADİ**
tarix elmləri doktoru, professor

**Mehman Sirac oğlu SÜLEYMANOV**
"Azərbaycan Ordusu (1918-1920)", Bakı, "Hərbi Nəşriyyat", 1998, 488 səh. (şəkilli).

Tarix elmləri namizədi, polkovnik-leytenant M.Süleymanovun çoxsaylı arxiv sənədləri və mənbələri əsasında hazırladığı bu kitab Azərbaycan xalqının qəhrəmanlıq tarixinin şərəfli səhifələrindən biri olan Cümhuriyyət ordusunun formalaşdırılmasına, onun möhkəmlənməsinə və respublikanın ərazı bütövlüyü uğrunda yorulmaz mübarizəsinə həsr edilmişdir.

Kod 022



*Azərbaycan Xalq Cümhuriyyətinin və Azərbaycan Respublikası Silahlı Qüvvələrinin yaradılmasının 80 illiyinə həsr olunur*

*Kitab Azərbaycan Respublikası Müdafiə Nazirinin 27 oktyabr 1997-ci il tarixli 0136 saylı əmri ilə yaradılmış Azərbaycan Respublikası Silahlı Qüvvələrinin tarixinə aid materialların öyrənilməsi üzrə komissiya tərəfindən çapa tövsiyə edilmişdir*

## ÖN SÖZ

*Azərbaycan Xalq Cümhuriyyəti Azərbaycan xalqının zəngin keçmişinin ən qiymətli səhifələrindən biri olduğu kimi, Cümhuriyyət ordusunun formalaşdırılması, onun yadelli işğalçılara qarşı dönməz mübarizəsi də Azərbaycanın qəhrəmanlıq tarixinin şərəfli bir mərhələsidir. Qısa müddət ərzində hərbin inkişaf səviyyəsinə cavab verən ordunun yaradılması, təchiz edilməsi, yüksək hazırlıq səviyyəsinə gətirilməsi yorulmaz əsgəri xidmətin misilsiz nümunəsi idi. Həmin misilsiz və şərəfli tarixi yaradıb nəsillərimiz üçün miras qoyan isə Vətəninə, xalqına bütün varlıqları ilə bağlı olan Azərbaycan oğulları, Azərbaycan vətəndaşları idilər. Uzun illər boyu hərb işindən sün'i surətdə uzaqlaşdırılmış olan xalqımızın S.Mehmandarov, Ə.Şıxlinski, H.Səlimov, T.Novruzov və digərləri kimi sərkərdələrinin və hərbçilərinin təşkilatçılıq işi nəticəsində güclü bir ordunun formalaşdırılması Azərbaycanın bu sahədəki potensial imkanlarını nümayiş etdirirdi. Mövcud olan obyektiv çətinliklərə baxmayaraq, mübariz qoşun hissələrinin yaradılması əslində xalqımızın əldə etdiyi müstəqilliyin taleyini müəyyənləşdirən bir addım idi və bu zərurət lazımınca dərk edildiyi üçün bütün Azərbaycan xalqı müstəqil ordunun təşkilinə səfərbər edilmişdi. Xalqımızın hərb tarixinin qürur və fəxr mənbəyi olan Azərbaycan Ordusunun təşkili Azərbaycan xalqının və Azərbaycanın igid hərbçilərinin birgə yaradıcılıq işinin və fəaliyyətinin əməli təcəssümü idi. Elə bu günümüzün təcrübəsi də göstərir ki, güclü ordunun formalaşdırılmasının başlıca yollarından biri xalqla ordunun vəgdətidir və bu iki tərəfi bir-birindən ayrı təsəvvür etmək mümkün deyil.*

*Cümhuriyyət ordusunun tarixi təcrübəsinin aktual tərəflərindən biri də ordu quruculuğuna dövlət rəhbərliyinin düzgün istiqamətləndirilməsi idi. Bu məsələ əslində bütün dövrlər üçün səmərəli ordu quruculuğunun vacib sahələrindən biridir və Cümhuriyyət ordusunun uğurlu təşkilinin ibrətamiz səbəblərindən biri də bu olmuşdu ki, dövlət və ordu arasında əlaqələr düzgün qurulmuşdu. Dövlət rəhbərliyi ordu quruculuğunun qayğılarını öz üzərinə götürdüyü kimi, ordu rəhbərliyi də dövlətin müəyyənləşdirdiyi xəttə ciddi riayət edir, hər cürə siyasi oyunlardan kənar qalaraq silahlı qüvvələrin qarşısına qoyulmuş vəzifələrin icrası ilə məşğul olurdu. Ordu rəhbərliyinin əmr, sərəncam və çıxışlarında ifadə olunan fikirlər də onların ordu quruculuğunun nəzəri dəyərləri-*

*nə riayət etdiyini, bu nəzəri dəyərləri yerli və milli xüsusiyyətlərlə əlaqələndirdiyini nümayiş etdirir. Cümhuriyyət ordusu rəhbərliyinin təşkilatçılıq məharəti də məhz onda idi ki, onlar ordu quruculuğunun milli xüsusiyyətlərini dəqiqliklə müəyyənləşdirə bilmiş və onun icrasına nail olmuşdular.*

*Azərbaycan Xalq Cümhuriyyəti ordusunun qısa tarixinin öyrənilməli və ibrət götürülməli olan çox dəyərləri mövcuddur. Bu dəryərlər arasında bir məqamı da xüsusi olaraq qeyd etmək lazımdır. Bu da zabit və əsgər, komandir və tabeçilikdə olanlar arasındakı münasibətlərin xarakteri idi. Həmin münasibətlər əsgəri nizamnamələrin pozulmaz ifadəsi olduğu qədər də humanist xarakter daşıyırdı. Bu münasibətlərdə hərbi tələbkarlıqla insani qayğı üzvü vəhdət təşkil etmişdi. Ordu rəhbərliyi əsgəri xidmətə çağırılmış olan hər bir gəncə Azərbaycanın müstəqilliyinin yenilməz keşikçisi, xalqın e'tibar etdiyi övladı kimi baxır, onlara qayğı hərbi xidmətin aparıcı xəttini təşkil edirdi. S.Mehmandarov, Ə.Şıxlinski kimi sərkərdələrin böyüklüyü həm də onda idi ki, onlar sadəcə inzibatçı deyildilər, hər bir əsgərin, zabitin qəlbinə yol tapmağı, öz səmimiliklləri ilə onların ağır zəhmətini yüngülləşdirməyi bacarırdılar.*

*Bütünlükdə Azərbaycan Xalq Cümhuriyyəti ordusunun tarixinin öyrənilməli və bugünkü ordu quruculuğunda istifadə edilməli olan çox məqamları vardır. Oxucuların diqqətinə təqdim olunan bu kitab da həmin zərurətdən doğmuşdur. Kitabda Cümhuriyyət ordusunun formalaşma tarixi, onun respublikanın ərazi bütövlüyü uğrunda qəhrəmancasına mübarizəsi ilk dəfə geniş tədqiqin obyektinə çevrilmişdir. Çoxsaylı arxiv materialları əsasında hazırlanan və Cümhuriyyət ordusunun tarixi barədə dolğun təsəvvür yaradan bu kitab, heç şübhəsiz ki, həm hərbi qulluqçular, həm də Azərbaycanın qəhrəmanlıq tarixini öyrənən oxucular tərəfindən maraqla qarşılanacaqdır.*

**Səfər ƏBİYEV,**
**Azərbaycan Respublikasının**
**Müdafiə Naziri, general-leytenant**



# GİRİŞ

Müstəqil Azərbaycan Ordusunun yaradılması, möhkəmləndirilməsi və real qüvvəyə çevrilməsi 1918-1920-ci illərdə mövcud olmuş Azərbaycan Xalq Cümhuriyyətinin fəaliyyətinin çox mühüm və samballı səhifələrindən birini təşkil edir. Çünki istiqlaliyyətin e'lan edildiyi elə ilk günlərdən ordunun qurulması hökumət və dövlət orqanlarının diqqət mərkəzində dayanırdı və qarşıya qoyulan məqsədə çatmaq üçün respublikanın bütün imkanları səfərbər edilmişdi. Bu da təsadüfi deyildi. Uzun illərdən sonra milli dövlətçiliyinə nail olmuş Azərbaycan xalqının taleyi, onun istiqlaliyyətinin sabahı əslində müstəqil ordunun təşkili səviyyəsi ilə birbaşa bağlı idi.

Konkret tarixi şəraitdə Azərbaycanın istiqlaliyyətinə, onun ərazi bütövlüyünə qarşı istiqamətlənmiş olan xarici təhlükələrin qarşısını güclü ordu olmadan almaq mümkün deyildi. Ordu xalqın nicatı, əmin-amanlığının dayağı olmalı idi və ardıcıl şəkildə həyata keçirilən quruculuq işləri çox qısa zaman ərzində xalqın qüruruna və iftixarına layiq olan güclü ordunun meydana çıxması ilə nəticələndi. Aradan xeyli keçməsinə baxmayaraq bu ordunun şərəfli tarixi öz əhəmiyyətini nəinki itirməmiş,əksinə onun ətraflı araşdırılması, mahiyyətinə nüfuz edilməsi böyük bir zərurət kəsb etmişdir. Xüsusilə Azərbaycanın yenidən müstəqilliyə qovuşması, onun Azərbaycan Xalq Cümhuriyyətinin varisi e'lan edilməsi istiqlal mübarizəsinin tarixi səhifələrinin yeni ideya-məfkurə baxımından öyrənilməsini, onun ayrılmaz qolu olan ordu quruculuğunun tədqiq edilməsini, Cümhuriyyət ordusu ilə bu günkü ordu arasında bir körpü və bağlılıq yaradılmasını tələb edir.

Azərbaycanda 1918-20-ci illərdə ordu quruculuğunun öyrənilməsi ilk növbədə Azərbaycan Xalq Cümhuriyyətinin tarixinin öyrənilməsi baxımından əhəmiyyətlidir. Dövrün ictimai, siyasi və praktiki fəaliyyəti araşdırılmadan Azərbaycan Xalq Cümhuriyyətinin tarixinin öyrənilməsi də bütöv olmazdı.

1918-20-ci illər Azərbaycan Ordusunun tarixinin öyrənilməsi Azərbaycanın ümumi tarixinin öyrənilməsi baxımından da qiymətlidir. Tədqiq olunan dövr Azərbaycanın uzunillik tarixinin çox maraqlı səhifəsini təşkil edir və vaxt ötdükcə bu dövrə maraq daha da artmaqdadır. Müstəqil şəkildə yaşamaq müstəqillik tarixini öyrənmədən, ondan ibrət götürmədən mümkün deyil.

Cümhuriyyət ordusunun tarixinin araşdırılması heç şübhəsiz ki, Azərbaycanın hərb tarixinin öyrənilməsi baxımından da əhəmiyyət kəsb edir. Cümhuriyyət ordusunun təşkili Azərbaycanın hərb tarixində yeni bir mərhələdir və bu mərhələ lazımınca öyrənilərək Azərbaycan tarixində öz şərəfli yerini tutmalıdır.

Cümhuriyyət ordusunun tarixinin öyrənilməsi bu günkü ordu quruculuğu üçün də praktiki əhəmiyyətə malikdir. Bir sıra problemlərin Cümhuriyyət dövründə qoyuluşu və həlli , o cümlədən ordu və dövlət orqanları arasında qarşılıqlı əlaqələrin səviyyəsi və səmərəliliyi, Hərbi Nazirlıyin rəhbərliyinin izlədiyi xəttin ardıcıllığı, qətiyyəti, tə'lim və tərbiyənin qurulması prinsipləri, mə'nəvi tərbiyənin aparılması, şəxsi hey'ətə qarşı tələbkarlıqla qayğının əlaqələndirilməsi və s. öz metodoloji əhəmiyyətini indi də itirməmişdir. Həmin təcrübənin nəzərə alınması və yaradıcı şəkildə inkişaf etdirilməsi müstəqil ordu quruculuğunda ən'ənəçiliyin canlandırılmasını şərtləndirə bilər.

Cəmiyyət quruculuğunun bütün sahələrində olduğu kimi, ordu quruculuğunun da özünəməxsus obyektiv qanunauyğunluqları vardır və bu qanunauyğunluqlara riayət edilməməsi ordunun formalaşdırılmasında ciddi çətinliklərin ortaya çıxması ilə şərtlənə bilər.Bütün dövrlərdə,bütün ordular üçün ümumi olan qanunauyğunluqlar eyni zamanda milli ən'ənələrdən, xalqın mə'nəvi potensialından, ölkənin iqtisadi, siyasi, demoqrafik imkanlarından, coğrafi vəziyyətindən və s. irəli gələn xüsusiyyətləri də istisna etmir. Ordu quruculuğu üçün ümumi cəhətlər çoxluq təşkil etsə də, hər bir ölkədə bu prosesin həmin ölkəyə xas olan xarakterik xüsusiyyətlərini də görmək mümkündür. Azərbaycan Xalq Cümhuriyyətinin ordusunun qısa vaxt ərzində formalaşdırılmasının əsas səbəblərindən biri də bu idi ki,həmin prosesə rəhbərlik edən şəxslər ümumi nəzəri dəyərlər və əldə olan təcrübə ilə ordu quruculuğunun Azərbaycan şəraitindən irəli gələn xüsusiyyətlərini çox incəliklə və üzvi şəkildə birləşdirə bilmişdi. Ordu quruculuğunun türk və Rusiya təcrübəsinin güclü tə'sirə malik olmasına baxmayaraq, Azərbaycanda milli zəminə dayaqlanan bir ordu formalaşdırılmışdı və proseslərin sonrakı inkişafı da qonşu dövlətlərin ordu quruculuğu təcrübəsinin kor-koranə təkrarlanmamasının doğruluğunu təsdiqləyirdi.

Azərbaycan Ordusunun təşkili S.Mehmandarov, Ə.Şıxlinski kimi sərkərdələrin və onların ətrafına toplaşmış olan məsləkdaşlarının Azərbaycan xalqı qarşısında gördükləri böyük işdir, xalqın qəhrəmanlıq tarixinə yazılmış olan sədaqətli və yaradıcı xidmətin bariz nümunəsidir. Bu şəxsiyyətlərin təşkilatçılıq fəaliyyəti, heç bir ən'ənəyə və bazaya malik olmadan qısa vaxt ərzində güclü ordu yarada bilmələri özü də bir təcrübə məktəbidir, Vətən və xalq yolunda yorulmaz fəaliyyət üçün bir örnəkdir.

Azərbaycan Xalq Cümhuriyyətinin tarixinə müraciət edən çox az tədqiqatçı tapmaq olar ki, bu və ya digər şəkildə Azərbaycan Ordusuna toxunmasın, ona öz münasibətini bildirməsin. Bu tədqiqatçıların böyük bir hissəsi sovet ehkamlarını əsas tutduqlarından sözsüz ki, onların qənaətlərini obyektiv saymaq olmaz.Digər tərəfdən, mövzuya toxunanlar



hərbçi olmadıqlarından və ya bu elm sahəsinin qanunauyğunluqlarını bilmədiklərindən Azərbaycanda ordu quruculuğuna kənar me'yarlar çərçivəsindən qiymət vermişlər ki, bu da onları həqiqətlə səsləşməyən nəticələrə gətirib çıxarmışdır.

Bu baxımdan sovet tarixşünaslığında çox tez-tez təsadüf edildiyi kimi, Cümhuriyyət ordusu ilə bolşevik ordusunun qarşı-qarşıya qoyulması, bolşevik ordusuna müqavimət göstərə bilmədiyi üçün Cümhuriyyət ordusunun zəifliyi və ya böhranı barədə qənaət çıxarılması da yanlış təsəvvürdən başqa bir şey deyildir. Hərbin ali qanunu olan qüvvələr nisbəti qanununun tələblərini yaddan çıxarmamaqla qeyd edilməlidir ki, Cümhuriyyət ordusunun qiyməti onun özündən müqayisəsiz dərəcədə üstün olan düşmən qarşısında geri çəkilməsi ilə yox, konkret tarixi şəraitdə, məhdud imkanlar daxilində qısa vaxt ərzində formalaşması və real qüvvəyə çevrilməsi ilə müəyyənləşməlidir.

1918-20-ci illərdə Azərbaycanda ordu quruculuğunun obyektiv və əhatəli tədqiqinə həsr edilmiş əsərlər yox dərəcəsindədir. Azərbaycan və sovet tarixşünaslığında bir sıra əsərlər vardır ki, onlar qeyri-obyektiv işlənmiş, ya da problemə ümumi tarix baxımından yanaşılmışdır ki,bu da problemin yalnız ümumi tərəflərini əks etdirmişdir. Ordu quruculuğu prosesinin xüsusiyyətləri və mahiyyəti barədə bu əsərlərdə lazımi səviyyədə araşdırma olmasa da, onlar mövzunun öyrənilməsi üçün müəyyən əhəmiyyət kəsb edir.

Bütünlükdə mövzu ilə bağlı olan yazıları, əsərləri, araşdırmaları üç qrupda ümumiləşdirmək olar. Birinci qrupa istiqlal mücadiləsinin fəallarının, iştirakçılarının, şahidlərinin yazılarını, əsərlərini,xatirələrini daxil etmək olar. İkinci qrupa sovet ehkamları çərçivəsində və Azərbaycanın müstəqilliyi ideyasına zidd olan mövqedən yazılmış əsərləri, üçüncü qrupa isə obyektiv mövqedən, yeni ideya-məfkurə mövqeyindən yazılmış olan əsərləri daxil etmək olar.

Birincə qrupa daxil olan əsərlər Azərbaycan Xalq Cümhuriyyətinin təşəkkülü, onun həyata keçirdiyi tədbirlər, izlədiyi siyasət, dövrün ictimai-siyasi və hərbi şəraiti barədə ilkin mə'lumat almaq üçün əhəmiyyətlidir.

İstiqlal mücadiləsinin öndərlərindən biri olan M.Ə.Rəsulzadənin "Azərbaycan Cümhuriyyəti" (288), "Əsrimizin Səyavuşu" və "Çağdaş Azərbaycan tarixi" (289) əsərlərində müstəqil Azərbaycan Ordusunun yaradıldığı ictimai-siyasi şərait, ordu quruculuğunun obyektiv çətinlikləri, S.Mehmandarovun böyük təşkilatçılıq fəaliyyəti, Gəncə üsyanı barədə xeyli mə'lumat mövcuddur.

Azərbaycan Ordusunun formalaşması və inkişaf mənzərəsi barədə M.B.Məmmədzadənin "Milli Azərbaycan hərəkatı" (257) kitabında daha geniş və ətraflı mə'lumat verilmişdir. Müəllif müstəqil Azərbaycan Or-

dusunun təşkilini haqlı olaraq istiqlal mübarizəsinin vacib istiqamətlərindən biri kimi təqdim edir və bu istiqamətdə qazanılmış uğurları obyektivcəsinə işıqlandırır. Əsərdə Azərbaycan Xalq Cümhuriyyətinin ordusunun müxtəsər tarixi ilə rastlaşmaq mümkündür. Türk qoşunlarının Azərbaycana gəlməsi, onların tərkibi, hərəkət marşrutları, maddi-texniki bazası, Bakının azad edilməsi uğrunda mübarizəsi, Azərbaycan Ordusunun strukturu, qoşun hissələrinin iştirak etdiyi döyüşlər, bolşevik işğalından sonra baş verən antisovet üsyanları barədə M.B.Məmmədzadə öz əsərində geniş mə'lumat vermişdir.

Cümhuriyyət ordusu barədə geniş mə'lumata "Azərbaycan Respublikasının ünvan-təqvimi" (183) kitabında da rast gəlmək mümkündür. Bu kitabda dövr və şərait barədə mə'lumat verilməsi ilə bərabər hökumət və dövlət orqanlarının ordu quruculuğu ilə bağlı qərarları, Gürcüstanla Azərbaycan arasında hərbi-müdafiə sazişi, Hərbi Nazirlik tərəfindən yaradılmış olan hissələrin, bölmələrin, idarə və qurumların siyahısı da verilmişdir.

Ordu quruculuğu barədə Miralay İsrafil bəyin "Azərbaycan ordusu haqqında" (262) və Hüseyn Baykaranın "Azərbaycan istiqlal mübarizəsi tarixi" (194) kitabında da qiymətli mə'lumatlarla rastlaşmaq mümkündür. Miralay İsrafil bəyin yazısı xatirə şəklində yazılmışdısa, H.Baykaranın kitabı ciddi tədqiqat əsəridir. Müsəlman Korpusu bölmələrinin Şəmkir *stansiyası yaxınlığında rus hərbçilərini tərksilah* etməsi, Azərbaycan Ordusunun zabit hey'ətinin tərkibi, tə'lim məktəbləri,ordunun tərkibi və s. barədə müəllifin toplamış olduğu faktlar tədqiqat üçün böyük əhəmiyyət kəsb edir. H.Baykara kitabında ordu ilə bağlı olan araşdırmasını hətta xüsusi bir paraqraf altında ümumiləşdirməyə cəhd göstərmişdir. Bununla belə, kitabdakı bə'zi faktlar dəqiqləşdirmə tələb edir. Məsələn, adı çəkilən kitabda göstərilir ki,hərbi məktəb 600 nəfər leytenant rütbəli mə"zun hazırlamışdı və İtaliyadan 50 min əsgər üçün geyim alınmışdı (194,s. 257). Ancaq mə'lumdur ki, İtaliyadan yalnız 25 min nəfər üçün geyim ləvazımatı alınmış və yaranmış vəziyyət üzündən həmin geyim bir də bolşevik işğalı ərəfəsində Azərbaycana çatdırılmışdı. Zabitlərin sayına gələndə isə köhnə və habelə digər millətlərdən olan bütün zabitlərin ümumi sayı heç 600 nəfərə çatmamışdı. Hərbi məktəblərin Gəncədə və Bakıda cəmi üç buraxılışı olmuşdu və hər buraxılışda da 100 nəfərdən bir qədər artıq gənc ilkin zabit rütbəsinə layiq görülmüşdü.

Ə.M.Topçubaşovun "Azərbaycanın təşəkkülü" (306), C.Hacıbəylinin "İlk müsəlman respublikası Azərbaycan" (207), Y.V.Çəmənzəminlinin "Müstəqilliyimizi istəyiriksə..." (311), "Xarici siyasətimiz" (312), Məhəmməd Muradzadənin "Mart hadisəyi-əliməsi" (263), Miryaqub Mehdizadənin "Beynəlmiləl siyasətdə petrol" (256), R.İsmayılovun "Azərbaycan tarixi" (234), Ü.Hacıbəyovun bir sıra məqalələri (bax:308), Ə.Şıxlinskinin "Xatirələrim" (322) əsərləri də mövzunun öyrənilməsi, Azərbaycan Ordusunun formalaşdığı dövrün xüsusiyyətlərinin araşdırılması baxımından müəyyən əhəmiyyət kəsb edir. Sadalanan əsərlər arasında Ə.Şıxlinskinin "Xatirələrim" kitabı sovet dövründə yazıldığından burada Cümhuriyyət dövrü barədə çox qısa mə'lumat verilmişdir. Bununla belə, müəllifin qeyd etdiyi bir sıra faktlar Müsəlman Korpusunun formalaşmasının çətinlikləri barədə tədqiqatçıda lazımi təsəvvür yarada bilir.



İkinci qrupa daxil olan araşdırmalar və hadisələrin şahidlərinin, iştirakçılarının xatirələri sayca daha çoxdur. Bu əsərlərin böyük əksəriyyəti sovet *tarixçiləri tərəfindən işlənmişdir. Onlar sovet ideya-məfkurəsi*, sovet ehkamları mövqeyindən işləndiyi üçün, heç şübhəsiz, tənqidi yanaşmanı, dövriyyəyə gətirilmiş olan faktlara yenidən, real şəraitlə qarşılıqlı əlaqədə baxılmasını tələb edir. Həmin əsərlər sovet ideologiyasının təsdiqinə xidmət etdiyindən Cümhuriyyət ordusunun çətinlikləri, dövlət quruculuğunun problemləri ilə bağlı mə'lum həqiqətlər qabardılaraq ictimaiyyətə qeyri-obyektiv şəkildə çatdırılmış və bununla da reallıq xeyli saxtalaşdırılmışdır. Tədqiq olunan mövzuya bu və ya digər şəkildə toxunan belə əsərlərdə indinin tələbləri ilə səsləşməyən aparıcı ideya-siyasi xətt, sovet ehkamçılığı ciddi təhlilə və tənqidə ehtiyac duysa da, müəllif bu yolla getməmiş, həmin əsərlərdə istinad edilmiş real faktları əsasən sovet ehkamçılığı kontekstindən təcrid edərək baş verdiyi konkret tarixi şəraitə görə onların mahiyyətinə nüfuz etməyə çalışmışdır.

Sovet ehkamçılığı mövqeyindən yazılmış olan əsərlər müxtəlif dövrlərdə meydana gəldiyindən onların məzmununda və əhatə dairəsində də fərqlər vardır. Məsələn, 20-30-cu illərdə meydana gəlmiş əsərlərlə II Dünya müharibəsindən sonra aparılan araşdırmalar əhatə dairəsi, problemlərə yanaşma tərzi ilə bir-birindən xeyli fərqlənir. Azərbaycan Xalq Cümhuriyyətinin xarici siyasəti ilə bağlı sanballı araşdırmasında C.Həsənovun (310) qeyd etdiyi kimi, 20-30-cu illərdə meydana gələn əsərlərin çoxu daha çox təbliğat xarakteri daşıyırdı. Belə əsərlərin *müəllifləri bir qədər də həyasızcasına* tezliklə bolşevizmin müsavatçılıq üzərindəki üstünlüyünü sübut etməyə çalışır və buna görə faktlara da qarşıya qoyulan məqsədin tələb etdiyi mövqedən yanaşırdılar. Müharibədən sonra yazılmış əsərlərdə isə toxunulan problemlərin elmi şərhinə, əhatəli əsaslandırılmasına daha çox cəhd göstərilmişdir.

Ə.Qarayevin (243), M.D.Hüseynovun (218), Ratqauzerin (286), A.Rayevskinin (284, 285), Sarkisin (290), Sur.Şaumyanın (320), A.Steklovun (297, 298) S.Sefin (314,313), T.Hüseynovun (296) əsərlərində məhz 20-30-cu illərin araşdırmalarına xas olan xüsusiyyətlər özünü qabarıq şəkildə əks etdirir. Ə.Qarayev kitabında Azərbaycan Ordusunun rəhbərliyinin ingilis hərbçilərinin hərəkətlərinə qarşı münasibətinə, Denikin təhlükəsinin reallaşmasına toxunmaqla bərabər əlavə edir ki, aprel çevrilişi

ərəfəsində Ə.Şıxlinski hökumətin siyasəti və hərbi nazir S.Mehmandarovun mövqeyi ilə razılaşmadığı üçün istefa vermişdi (243,s.118). Bu faktların haradan götürüldüyü mə'lum deyil. Hərbi Nazirliyin mövcud olan arxivində də söylənilən faktı təsdiq edəcək heç bir sənəd yoxdur. Ona görə də Ə.Qarayevin bu iddiası ilə razılaşmaq olmaz. Ə.Şıxlinskinin Sovet hakimiyyətinin ilk illərində sürdüyü həyat da sübut edir ki, o heç də Azərbaycan hökumətinə əks gedib bolşevikləri müdafiə etməmişdi. Yoxsa Ə.Şıxlinski sovetlərin dözülməz təzyiqləri ilə rastlaşmazdı.

Suren Şaumyan qeyd olunan kitabında etnik xislətinə sadıq qalaraq Azərbaycanın milli hərəkatı, onun milli tərkibli qoşun hissələrinin formalaşması,türk qoşunlarının Azərbaycana gəlməsi və fəaliyyəti barədə hədyan və iftiralar yazmaqdan çəkinməmişdir. Bununla belə, bu əsərdə Bakı Komissarları devrilənədək bolşevik qüvvələrinin Azərbaycanın milli qoşun hissələri və türk-Azərbaycan qoşun hissələri ilə apardığı döyüşlər barədə xeyli mə'lumat əldə etmək mümkündür. Suren Şaumyana görə Müsəlman Korpusunun komandiri knyaz Maqalov, korpusun qərargah rəisi isə H.Səlimov idi (320, s.31-32). Bu fakt da doğru deyildir. Çünki korpusun komandiri Ə.Şıxlinski, qərargah rəisi isə Mençukov olmuşdu.

Mahiyyət və izlənilən məqsəd e'tibarilə bir-birinə yaxın olan bu əsərlər içərisində A.Steklovun "Müsavat Azərbaycanının ordusu" kitabı tədqiqat üçün xüsusi maraq doğurur. Bu kitab sovet tarixşünaslığında yeganə kitabdır ki, Cümhuriyyət ordusunun formalaşmasına və onun döyüş fəaliyyətinə həsr edilmişdir. Kitabın başqa bir qiymətli cəhəti ondan ibarətdir ki,müəllif mövzuya ümumi tarix baxımından deyil, hərb tarixinin me'yarları baxımından yanaşmışdır. Bu metod mövzunun dərindən araşdırılmasına geniş imkan aça bilərdi. Lakin qarşıya qoyulan məqsəd sovet ideologiyasının təsdiqinə xidmət etdiyindən müəllif də yalnız münasib olan faktlara istinad etmiş və araşdırmasını da bu faktlar üzərində qurmuşdur.

A.Steklovun kitabı faktların zənginliyi ilə diqqəti cəlb edir. Arxivlərin bağlı qaldığı bir vaxtda Cümhuriyyət ordusu barədə müəyyən təsəvvürü məhz bu kitabdan almaq olardı. A.Steklov Müsavat ordusunun meydana gəldiyi dövrün çətinliklərinə, ordunun təşkilinə, hərbi infrastrukturanın yaradılmasına, maddi-texniki təchizat və tə'minat məsələlərinə, qoşun hissələrinin zabit və sıravi hey'ətlə komplektləşdirilməsinə toxunmuş və bütün bu məsələlərin mənzərəsini yaratmağa çalışmışdır. Lakin əsiri olduğu siyasi ehkamlar onu toxunduğu məsələlərin yalnız mənfi məqamlarını qabartmağa məcbur etmişdir. Bununla belə, faktların zənginliyi ilə A.Steklovun əsəri uzun müddət tədqiqatçıların diqqət mərkəzində olmuş və sonradan ortaya çıxan əsərlərdə ordu ilə bağlı məqamların işıqlandırılmasına öz tə'sirini göstərmişdir. Bu tə'sir isə heç də həmişə müsbət olmamış və həmin əsərdə birtərəfli şəkildə işıqlandırılan faktlar istinad mənbəyinə çevrilmişdi.

50-ci illərdən e'tibarən 1918-1920-ci illərdə Azərbaycanda baş verən proseslər daha çox tədqiqat əsərlərinin obyektinə çevrilmişdi. Sovet ideologiyasının təsdiqinə xidmət edən tədqiqat metodu bu əsərlərin də obyektivliyinə mənfi tə'sir göstərmişdir. Həmin əsərlərdə müsbət məqamların olması ilə bərabər, sovet ideologiyasına uyğun gəlməyən bütün reallıqlar inkar olunur, ya da onlar sovet həyat tərzinin üstünlüklərini sübut etmək üçün istifadə edilirdi.Bu araşdırmalarda Cümhuriyyət ordusuna çox ötəri toxunulur, onun təşkili və fəaliyyəti barədə ciddi təhlil aparılmır. Digər tərəfdən, Cümhuriyyət ordusu ilə bağlı verilən mə'lumatlar ilkin mənbələrə əsaslanmırdı. Ümumiyyətlə, bu tədqiqat əsərlərində Azərbaycan Xalq Cümhuriyyətinin Hərbi Nazirliyinin arxivinə çox az müraciət edilmişdir. Bu və ya digər şəkildə Azərbaycan Ordusu ilə bağlı olan faktların, hadisələrin şərhinə xarici müdaxiləyə qarşı mübarizəyə həsr edilmiş əsərlərdə daha çox rast gəlmək mümkündür. İ.Hüseynovun (217), M.Osipovun (280), P.Mosesovun (256), A.Kadişevin (240, 239), Z.İbrahimovun (230, 229), Y.Tokarjevskinin (303, 304, 305) bu problemə həsr edilmiş əsərlərində yalnız türk və ingilis qoşunlarının Azərbaycana gəlişi hərbi müdaxilə kimi qiymətləndirilir, erməni və bolşevik qoşunlarının Azərbaycan ərazisinə daxil olması isə hərbi müdaxilə kimi səciyyələndirilmir. 50-60-cı illərdə Azərbaycanın tanınmış alimləri olan Y.Tokarjevskinin, İ.Hüseynovun, P.Mosesovun, Z.İbrahimovun, M.Qazıyevin, A.Kadişşevin "İntervensiya i qrajdanskaya voyna v Zakavkazye" kitabının ilkin variantına yazdıqları rə'y bu tədqiqatçıların hamısının öz araşdırmalarında əsas tutduqları ideoloji ehkamlara, qeyri-obyektiv yanaşmaya bariz nümunədir. Həmin alimlər Kadişşevi Zaqafqaziya hökumətini xarici müdaxiləçilərin agenturası, Müsavat ordusunu isə Müsavat bandaları adlandırmamaqda günahlandırırdılar (240, v.11, 16). A.Kadişşevin mövzusu daha çox hərbi sahəni əhatə etsə də Azərbaycanın tanınmış alimləri ondan tələb edirdilər ki, bütün hadisələrin şərhinə siyasi-ideoloji mövqedən yanaşsın.

Belə bir qeyri-obyektiv tədqiqat üsulu erməni müəlliflərinin, həmçinin Mərkəzin elmi metodologiyasını formalaşdırmağa çalışan müəlliflərin əsərlərində də çox qabarıq şəkildə tətbiq olunmuşdur (bax:318, 307, 250a, 198, 197, 244, 324, 300, 209a, 196, 244, 251). Bakı komissarlarının tərkibinə daxil olmuş N.Kolesnikovanın xatirə kitabını da bu qəbil əsərlər sırasına daxil etmək olar (503). Bu əsərlərdə erməni bolşevik fəallarının lider olduğu Bakı komissarlarının silah və zor gücünə Bakıda hakimiyyəti ələ keçirmələri böyük ilhamla vəsf olunur, milli qoşun bölmələrinin formalaşması və Azərbaycanın müxtəlif bölgələrinin onların nəzarəti altında olması irticanın güclənməsi kimi qiymət-

ləndirilir. Azərbaycanda milli ordunun yaradılmasının qeyri-obyektiv işıqlandırılmasının təsdiqində,milli qoşun bölmələrinin yalnız milli burjuaziyanın,bəylərin və mülkədarların zor vasitəsi kimi təqdim edilməsində. beləliklə sovet tarixşünaslığında ziyanlı baxışların formalaşmasında bu əsərlər mühüm rol oynamışdır.

Təkrarçılığa yol verilməməsi üçün qeyd olunmalıdır ki, 60-80-ci illərdə Azərbaycan alimlərinin ortaya çıxardığı tədqiqat əsərlərində də dövrün tələblərindən irəli gələn nöqsanlar mövcuddur. Çoxsaylı yeni faktları tədqiqatın obyektinə çevirməklə bu əsərlərin müəllifləri sovet ehkamçılığının sərt çərçivəsindən kənara çıxa bilməmişlər və əslində heç çıxa da bilməzdilər. Bununla belə, tənqidi yanaşılarsa bu əsərlərdə Cümhuriyyət ordusunun təşkilinin və fəaliyyətinin bu və ya digər məqamları ilə bağlı qiymətli mə'lumatlar tapmaq mümkündür (186, 187, 214, 215, 216, 223, 224, 227a, 231, 242, 245, 261, 283, 309, 321).

Sovet dövründə Cümhuriyyət ordusunun rəhbərlərinin fəaliyyəti ilə bağlı araşdırmalar da meydana çıxmışdır. Ə.Abbasovun S.Mehmandarovun (181), S.İbrahimovun isə Ə.Şıxlinskinin həyat və fəaliyyəti ilə bağlı (228) apardığı araşdırmalar dövrün tələblərindən yan keçə bilməsə də, mövzusu e'tibarilə uğurlu bir addım sayılmalıdır. Hərbi Nazirliyin iki böyük rəhbərinin xidmət yolunun tədqiq obyekti seçilməsinin özü Azərbaycan tarixşünaslığında təqdirəlayiq bir hal idi bu generalların Cümhuriyyət dövrü fəaliyyələrinə çox ötəri toxunulsa da müəlliflər onların ömür yolu, şəxsiyyətləri barədə geniş təsəvvür yarada bilmişlər.

Qafqaz bölgəsində gedən proseslərlə bağlı Lloyd Corcun (253), general Denstervilin (209), general Lyudendorfun (254), general Denikinin (208) və ağqvardiyaçı zabitlərin xatirələri də (287) tədqiqat üçün müəyyən əhəmiyyət kəsb edir. Bu xatirələr arasında general Denstervilin memuarları xüsusilə diqqətəlayiqdir. Azərbaycan tarixşünaslığında həmin xatirələrə tədqiq olunan mövzu kontekstində ötəri toxunulmuşdur. Ancaq bu əsərin qiymətli tərəfi onun 1918-ci ilin avqust ayında və sentyabr ayının birinci yarısında Bakı ətrafında gedən döyüşlər barədə ətraflı mə'lumat verməsidir ki, bu da tədqiqatların əhatə dairəsindən kənarda qalmışdır.

80-ci illərin ikinci yarısından başlayaraq cəmiyyətdə meydana gələn yeniləşmə ab-havası tarixi həqiqətlərə münasibətdə də obyektivliyin genişlənməsinə tə'sir göstərdi. Köhnə ehkamların çərçivəsinə sığışmayan yeni tədqiqat əsərləri işıq üzü gördü. 90-cı illərin əvvəllərində köhnə ehkamçılıq öz mövqeyini birdəfəlik itirdi və Azərbaycan tarixşünaslığı üçün bağlı qalmış olan Cümhuriyyət dövrü çoxlu tədqiqatların obyektinə çevrildi. N.Nəsibzadənin (186), A.Balayevin (191), N.Yaqublunun (237), V.Çıraqzadənin (313) və digərlərinin (184) əsərləri tarixə yeni baxışın formalaşmasında və təsdiqində lazımi əhəmiyyətə malikdir. Bu əsərlərin



mövzusu çərçivəsində Azərbaycan Ordusunun təşkilinə və fəaliyyətinə də toxunulmuşdur. N.Nəsibzadənin qeyd olunan kitabında Azərbaycan Ordusuna aid ayrıca oçerk çap edilmiş və müxtəsər şəkildə ordunun təşkili işi ümumiləşdirilmişdir. Lakin bu əsərlərdə bir sıra qeyri-dəqiq faktlara da yol verilmişdir. Ola bilsin ki bu xətalar müəlliflərin hərb işinin incəliklərinə bələd olmaması ilə bağlıdır. Ancaq onların olduğu kimi saxlanılması və gələcəkdə digər müəlliflərin istinad mənbəyinə çevrilməsi Cümhuriyyət ordusunun tarixinin bu və ya digər məqamları ilə bağlı yanlış meyllərə yol aça bilər.

A.Balayevin əsərində göstərilir ki, 1918-ci il sentyabrın 1-də Hərbi Nazirlik yarandı. F.Xoyski hərbi nazir, S.Mehmandarov isə onun müavini tə'yin edildi (191, s.34). Halbuki mə'lumdur ki, Hərbi Nazirlik 1918-ci ilin noyabrında təşkil olunmuşdur. Sentyabrın 1-də türk qoşunları hələ Azərbaycanda idi. Onların vaxtında isə Azərbaycanda Hərbi Nazirlik yox idi. Müəllifin Hərbi Nazirliyin aparatının 1919-cu ilin aprel ayında Bakıya köçməsini iddia etməsi ilə də razılaşmaq olmaz (191, s.43). Aprel ayında Bakıya Azərbaycanın qoşun hissələri daxil olmuşdu. Nazirliyin aparatı isə Bakıya iyul ayının ilk günlərində gəlmişdi.

"Azərbaycan Demokratik Respublikası" adlı məqalələr toplusunda M.Əliyevin S.Mehmandarova həsr edilmiş yazısında göstərilir ki, S.Mehmandarov 1918-ci il dekabrın 15-də hərbi nazir tə'yin olunmuşdu, Azərbaycanın 40 minlik ordusu, döyüş taktikasına rəhbərlik etmək üçün hərbi qərargah yaradılmışdı (184, s.44). Qeyd etmək lazımdır ki, S.Mehmandarov nazir vəzifəsinə dekabrın 15-də yox, 25-də tə'yin olunmuşdu. Azərbaycanın 40 minlik ordusu yox idi. Nazirliyin rəhbərliyi 1920-ci ilin sonunda bu sayda orduya malik olmağı planlaşdırırdı.Və nəhayət, müəllif hərbi qərargah deyəndə yə'qin ki, Ərkani-hərbi nəzərdə tutmuşdur. Bu orqanın fəaliyyətini isə yalnız döyüş taktikasına rəhbərliklə məhdudlaşdırmaq onun mahiyyətini tamamilə bəsitləşdirmək deməkdir.

N.Nəsibzadənin Azərbaycanın qoşun bölmələrinin1919-cu ilin noyabrında Zəngəzurda bir ay döyüş aparması, Lənkəran əməliyyatına 4 min nəfərdən ibarət 2 alayın göndərilməsi barədə fikirləri də (274, s.64) dəqiqləşdirmə tələb edir(bu barədə müvafiq paraqrafda geniş mə'lumat veriləcəkdir-M.S.). Müəllif daha sonra Hərbi Nazirliyin "1919-cu ildə 25 minlik münəzzəm ordu yaratmaq" vəzifəsinə toxunur (274, s.64). Çox güman ki, o, "münəzzəm ordu" dedikdə "nizami ordunu" nəzərdə tutur. Bu iki söz mə'naca nə qədər yaxın olsa da, hərb işində kəsb etdikləri məzmun və mahiyyət baxımından bir birinin əksini təşkil edir. Azərbaycan Ordusunu münəzzəm ordu adlandırmaq onun mahiyyətinin, təşkili istiqamətində Azərbaycan hökumətinin və Hərbi Nazirliyin fəaliyyətinin yanlış təsəvvür edilməsi deməkdir.

N.Yaqublunun əsərində də ordunun təşkili və strukturu ilə bağlı bir-sıra faktlar dəqiqləşmə tələb edir. Müəllif Cümhuriyyət ordusunun tərkibində artilleriya diviziyasının, xüsusi hissələrin daxil olduğu teleqraf, atlı, pulemyotçu və polk artilleriyası dəstələrinin yaradılması planlarına toxunur (237, s.113). Qeyd etmək lazımdır ki, Cümhuriyyət ordusunun tərkibində belə hərbi vahidlər olmamışdır. Həmin əsərin bir yerində göstərilir ki, "Müsəlman Korpusunda yeganə nizami korpus Birinci atlı tatar polku idi. Bu polku "dikiy" (vəhşi) diviziya adlandırırdılar (237, s.113). Əvvələ korpusun tərkibində korpus ola bilməz. Çox güman ki, yeganə nizami korpus, deyəndə müəllif yeganə nizami hissə demək istəmişdir. Hətta belə olduğu təqdirdə də Müsəlman Korpusunun tərkibində yalnız bir nizami hissənin olduğunu bildirmək həmin korpusun təşkili istiqamətində görülən işləri danmaq demək olardı. Çünki bir tərəfdən Müsəlman Korpusu bütünlükdə nizami korpus idi, digər tərəfdən də onun tərkibində bir yox, bir neçə nizami hissə var idi.

Müsəlman Korpusunun hissələrinin "Dikaya diviziya" ilə əlaqələndirilməsi isə, ümumiyyətlə, milli tərkibli qoşun hissələrinin tarixinin öyrənilməsi baxımından ziyanlı meyl sayılmalıdır. Bu termin dövriyyəyə milli qüvvələrə zidd olan şəxslər və dairələr tərəfindən gətirilmiş və bir çox müəlliflər də mahiyyətinə varmadan ondan istifadə etmişlər. N.Yaqublunun yuxarıdakı fikrinin bir məqamı ilə razılaşmaq olar ki, Müsəlman Korpusundakı Tatar süvari alayının Çar Rusiyası ordusunda mövcud olmuş "Dikaya diviziya" ilə əlaqəsi olmuşdur. Vaxtilə həmin diviziyanın tərkibində müsəlmanlardan ibarət belə bir alay var idi. Sonradan bu hissənin qalıqları Azərbaycana gəlmiş və onun bazasında eyni adlı alay təşkil edilmişdir. Tatar süvari alayı artıq Müsəlman Korpusunun süvari alayı idi. Onun və ya hər hansı digər milli tərkibli qoşun hissəsinin "Dikaya diviziya" adlandırılması heç bir həqiqətə uyğun deyildir. Məsələn, V.Çıraqzadə öz əsərində 1918-ci ilin mart qırğınlarının başlanmasına toxunarkən yazır ki, "...zabit Ə.Əsədullayevin başçılıq etdiyi, Lənkərana getməyə hazırlaşan "Dikaya diviziyanın" atlı polkunun əsgər və zabitlərinin silahları alındı" (313, s.19). Bir daha qeyd olunmalıdır ki, Azərbaycanda "Dikaya diviziya" adlı birləşmə olmamışdır. Digər tərəfdən Ə.Əsədullayevin başçılıq etdiyi hərbi hissə "atlı polku" (süvari alayı) yox, Bakıda təşkil edilib sonradan Lənkərana köçürülmüş Müsəlman süvari divizionu idi.

Başqa bir əsərdə isə göstərilir ki, mart qırğınları ərəfəsində müsəlmanlardan ibarət yeganə hərbi qurum Lənkəranda könüllülərdən təşkil edilmiş "Dikaya diviziya" idi (266, s.54).

Son illərdə Cümhuriyyət dövrü tarixinin araşdırılması ilə bağlı bir sıra maraqlı tədqiqat əsərləri işıq üzü görmüşdür. Onların arasında C.Həsənovun (310), T.Nəsirovun (267), B.Nəcəfovun (266), N.Ağamalıyeva və R.Xudiyevin (182), İ.Musayevin (265) əsərlərini göstərmək olar. Mövzu çərçivəsində Azərbaycan Ordusunun bu və ya digər məsələlərinə toxunan bu əsərlər içərisində C.Həsənovun tədqiqat işinin əhəmiyyəti xüsusilə qeyd olunmalıdır. Azərbaycanda və onun ətrafında formalaşan hərbi şəraitin öyrənilməsi planında bu tədqiqat işi maraqlı və əhatəli bir araşdırmadır. B.Nəcəfovun və İ.Musayevin əsərlərində isə Ermənistanla Azərbaycan arasındakı hərbi münasibətlərin mənzərəsi barədə kifayət qədər mə'lumat vardır.



Cümhuriyyət ordusunun tarixinin öyrənilməsində tədqiqatçı-jurnalist Ş.Nəzirlinin əsərləri də böyük əhəmiyyətə malikdir (268, 269, 270, 271, 272, 273). Doğrudur, bu əsərlər publisistik planda yazılmışdır. Lakin müəllifin istinad etdiyi çoxsaylı arxiv materialları onun əsərlərinin tarixi reallığını gücləndirir, oxucuda və ictimaiyyətdə toxunulan problemlə bağlı obyektiv təsəvvür yarada bilir.

Cümhuriyyət ordusunun elmi ümumiləşdirilməsi baxımından isə P.Darabadinin tədqiqat əsərləri xüsusi maraq doğurur (bax: 201, 202, 204, 205,). Müəllifin bu sahədə apardığı araşdırmalar Cümhuriyyət ordusunun təşkilinin və fəaliyyətinin öyrənilməsi sahəsində Azərbaycan tarixşünaslığında atılmış uğurlu addımlardandır.

Son vaxtlar Cümhuriyyət ordusunun təşkili və fəaliyyətinin ayrı-ayrı sahələri ilə bağlı H.Osmanovun da bir sıra məqalələri çap olunmuşdur (276, 277, 278, 279).

Göründüyü kimi, Cümhuriyyət ordusunun təşkili, formalaşması, döyüş fəaliyyəti barədə əhatəli tədqiqat işi yox dərəcəsindədir. Təqdim olunan əsərdə bu məsələnin həllinə cəhd göstərilmişdir. Bununla belə, Cümhuriyyət ordusunun formalaşma və fəaliyyət yolu ilk dəfə belə geniş tədqiqat obyektinə çevrildiyindən bütün məsələlərin tam işıqlandırıldığını iddia etmək doğru olmazdı. Ona görə də tədqiqat işi haqqında söylənəcək fikir və mülahizələr gələcəkdə onun daha da təkmilləşdirilməsinə kömək etmiş olardı.

X X X

*Tədqiqat işinin hazırlanmasında göstərdiyi köməklik və məsləhətlərə görə müəllif Mərkəzi Dövlət Arxivinin direktoru Fikrət Əliyevə, habelə polkovnik Çingiz Məmmədova, iste'fada olan polkovnik Mustafa Məhərrəmova, iste'fada olan polkovnik Sabir İbrahimova, mayor Şamistan Nəzirliyə, professor Pərvin Darabadiyə, mayor Əlisəftər Hüseynova, Loğman Süleymanova, Hərbi Nəşriyyatın və Müdafiə Nazirliyi Hərbi-Elmi Tədqiqatlar İdarəsinin kollektivinə öz minnətdarlığını bildirir.*

# BİRİNCİ FƏSİL

## İLK MİLLİ HƏRBİ QÜVVƏLƏRİN FORMALAŞMASI VƏ ONLARIN FƏALİYYƏT GÖSTƏRDİYİ HƏRBİ-SİYASİ ŞƏRAİT

Hər bir xalqın müstəqilliyinin, ərazi bütövlüyünün, milli azadlığının, namusunun, şərəfinin, iftixar mənbəyi olan mədəniyyətinin, mə'nəvi dəyərlərinin, tarixinin və s. məsələlərin məcmusundan ibarət olan milli mənafeyinin (259, s.6) reallaşdırılması və qorunması müəyyən obyektiv və subyektiv amillərin mövcudluğu ilə şərtlənir. Bu obyektiv və subyektiv amillər özünü hər bir millətin maddi və mə'nəvi gücünü ehtiva edən (260, s.34) ümummilli gücündə təcəssüm etdirir. Yə'ni hər hansı dövlətin, millətin varlığı, yaşaya bilməsi əslində bu ümummilli gücün varlığından, onun düzgün formalaşdırılmasından və istiqamətləndirilməsindən birbaşa asılıdır. Həmin gücün real və səmərəli qüvvəyə çevrilməsi isə onun tərkibinə daxil olan bütün ünsürlərin qarşılıqlı münasibətinin nəzərə alınması, onların inkişaf dialektikasına düzgün riayət olunması ilə sıx əlaqədədir. Bu ünsürlər aşağıdakılardır: siyasi güc, iqtisadi güc, hərbi güc, mə'nəvi-sosial güc (201, s.15; 258, s.16) Bə'zi ölkələrdə demoqrafik güc, coğrafi güc, diplomatik güc və s. ünsürlər də ümummilli gücün tərkib hissəsi kimi öyrənilir və planlaşdırılır.

Qeyd olunan qarşılıqlı dialektika nəzərdən qaçırılmadan konkret tarixi şəraitdə yatırlanan ünsürlərdən hər hansı biri daha qabarıq zərurət kəsb edə bilər. XX əsrin ikinci onilliyinin sonlarında, öz dövlət müstəqilliyini əldə etməsi ərəfəsində Azərbaycan xalqının qarşısında dayanan başlıca vəzifələrdən biri milli hərbi qüvvələrin yaradılması məsələsi idi. Bu məsələnin həlli və reallaşdırılması Azərbaycan xalqının milli mənafelərinin qorunması zərurəti ilə deyil, bəlkə də yaranmış şəraitdə millətin fiziki mövcudluğunun qorunması zərurəti ilə şərtlənirdi. Milli ideyaları daşıyan və onların həyata keçməsi uğrunda mübarizə aparan qüvvələr şübhə etmirdilər ki, istər Azərbaycanın daxil olduğu imperiya hüdudlarında, istər Azərbaycanın özündə, istərsə də yaxın bölgədə gedən proseslər xalqı böyük faciələrlə üzləşdirə bilər. Ölkə daxilində arxalanmaq üçün dövlət üsuli-idarəsinə heç bir ümid bəslənilmədiyi bir vaxtda xalqı bu faciədən qurtaracaq real e'tibarlı arxa isə "Vətəni müdafiəni ən müqəddəs milli vəzifə hesab edən" (190, s.87) milli hərbi qüvvələr ola bilərdi. Azərbaycan xalqının fiziki məhvində maraqlı olan qüvvələrin hərbi gücə malik olması və



kimsəyə məhəl qoyulmadan ondan istənilən vaxt, istənilən şəkildə istifadə edilməsi ilə artmaqda olan ümummilli təhlükə yalnız müvafiq hərbi qüvvələrin təşkili ilə aradan qalxa bilərdi. Belə qüvvələrin olmaması milli-azadlıq mübarizəsində əldə edilən nəticələrin qorunub saxlanacağını da şübhə altında qoyurdu.

Mə'lumdur ki, ordu dövlətin yaratdığı əsas silahlı təşkilatdır. Orduya dövlət tərəfindən rəhbərlik edilir. Azərbaycanın milli hərbi qüvvələrinin yaradılmasına tarixi zərurət meydana gəldiyi vaxt hələ heç də dövlət müstəqilliyi əldə edilməmişdi. Lakin dövlət müstəqilliyinin e'lan edilməsi ərəfəsində xalq milli-azadlıq hərəkatının fəalları belə bir məsələyə xüsusi diqqət yetirirdilər ki, çar üsuli-idarəsinin yeritdiyi məqsədyönlü siyasət nəticəsində ermənilər və gürcülərlə müqayisədə azərbaycanlıların heç bir hərbi hazırlığı yoxdur və azərbaycanlıların hərbi xidmətə cəlb edilməməsi heç də Azərbaycan xalqının strateji maraqlarına cavab vermir. Ona qarşı güclənməkdə olan təcavüzün və təhlükənin qarşısının alınması, milli-azadlıq mübarizəsinin e'tibarlı qüvvələrə dayaqlanması üçün mövcud olan boşluğun aradan qaldırılması, milli tərkibli hərbi qüvvələrin təşkilinə başlanmasına nail olunması istiqlal mübarizələrinin qarşısında dayanan başlıca vəzifələrdən biri hesab edilirdi. Təşkilati baxımdan sözsüz ki, müstəqil idarəçiliyə malik olan hərbi strukturların yaradılması qeyri-mümkün idi. Ona görə də milli-azadlıq hərəkatının fəalları ilk növbədə azərbaycanlıların çağırışa cəlb olunması, ölkə ordusu daxilində heç olmasa sıravi hey'əti azərbaycanlılardan ibarət olan hissələrin təşkil edilməsini irəli sürürdülər. Belə hissələr gələcək Azərbaycan Ordusunun özülünü təşkil edə bilərdilər.

### 1. *MÜSƏLMAN KORPUSU (QOLORDUSU)*

Milli hərbi strukturların təşkil edilməsi fikirlərinin daha əsaslı şəkildə irəli sürülməsi və onların reallaşdırılması 1917-ci ilə təsadüf edir. Mə'lumdur ki, həmin ilin fevralında çar üsuli-idarəsinin devrilməsi Azərbaycanın ictimai-siyasi həyatında da ciddi dəyişikliklərə səbəb olmuşdu. İstər çarizm dövründə hərbi mükəlləfiyyətə cəlb olunmasa da, yaşayışı daha da ağırlaşdıran mövcud vergilərə əlavə olaraq hərbi vergi verməli olan (236, s.226) Azərbaycan kəndliləri, istərsə də siyasi fəaliyyəti genişləndirmək üçün yeni imkanlar əldə etmiş Azərbaycan milli hərəkatının fəalları fevral inqilabının verəcəyi bəhrələrə böyük ümidlə baxırdılar. M.Ə.Rəsulzadə yazırdı: "1917-ci il inqilabı məhkum siniflərə hürriyyət, məhkum millətlərə də muxtariyyət verəcəkdi" (288, s.26). Onun fikrincə, Rusiyanın tərkibində yaşayan bütün xalqlar çarizm adlı jandarmın, despotizmin devrilməsi ilə ürəklərində bəslədiyi məqsədlərinə yetişmişlər.

Çoxları inanırdı ki, çarizmin devrilməsi ilə Petroqradda yaradılan Müvəqqəti hökumət I Dünya müharibəsinin Rusiya xalqlarına gətirdiyi bə-

laların, uzun illərdən bəri davam edən istismarın, milli zülmün aradan qaldırılması üçün ciddi addımlar atacaq, milli ucqarların həyatının yaxşılaşdırılması üçün konkret tədbirlər həyata keçirəcəkdir.

Doğrudur, Müvəqqəti hökumətin mövcudluğu Azərbaycan xalqına ümidində olduğu nəticələri vermədi, həyat şəraitində nəzərə çarpacaq bir keyfiyyət dəyişikliyi yaratmadı. Ancaq bununla bərabər çarizmin devrilməsi xalqın siyasi həyatında, milli hərəkatının genişlənməsində artan xətlə inkişaf edən fəallıqa səbəb oldu.

Çarizmin devrilməsi ilə az sonra onun Zaqafqaziyadakı idarəetmə orqanlarının fəaliyyətinə də son qoyuldu. Sonuncu rus çarı II Nikolayın əmisi böyük knyaz Nikolay Nikolayeviç tərəfindən idarə olunan Qafqaz canişinliyi (194, s.222) ləğv edilərək yerində Xüsusi İdarə Komitəsi yaradılmışdı. 1917-ci il mart ayının 9-da Müvəqqəti hökumət tərəfindən Zaqafqaziyanın idarə edilməsi üçün yaradılmış bu Komitəyə Dövlət Dumasının yerli üzvləri daxil edilmişdi. Xüsusi komitəyə V.Xarlamov rəhbərlik edirdi. Ondan başqa A.Çxenkeli, K.Abaşidze, M.Cəfərov və M.Papacanov da bu Komitənin tərkibinə daxil idilər (310, s.30)

Xüsusi Komitə Zaqafqaziyada güclü bir idarəetmə orqanı kimi formalaşa bilməsə də (302, s.31) o, yerlərdə milli tərkibli yerli idarəetmə orqanlarının təşkilini öz fəaliyyətində əsas tutmağa çalışırdı (286, s.70). Buna görə də ölkəni əvvəlki canişinlərin, qəza rəislərinin əvəzinə xalq tərəfindən seçilən komissiyalar idarə edirdi. Şəhərlərdə bələdiyyə idarələri xalqın nümayəndələrinin əlinə keçmişdi (194, s.222). Belə idarəçilik orqanları əsasən ictimai təşkilatların İcraiyyə Komitələrinin əlində cəmlənmişdi. Yelizavetpolda belə İcraiyyə Komitəsinə X.Xasməmmədov, Lənkəranda isə A.Talışinski rəhbərlik edirdi (235, s.7).

Fevral inqilabının siyasi həyata gətirdiyi canlanmanın nəticələrindən biri də bu oldu ki, Azərbaycanın müxtəlif şəhərlərində Müsəlman milli şuraları yaradıldı. Bu şuralar öz siyasi fəaliyyətini milli məqsədlər istiqamətində qurmağa çalışsalar da tərkibi və yetkinliyi e'tibarilə bir-birlərindən fərqlənirdilər. Onların arasında ən güclüsü və nüfuzlusu Bakı Müsəlman İctimai Təşkilatları Şurası idi. Həmin şura 1917-ci il mart ayının 29-da yaradılmışdı. Bu şuranın Müvəqqəti İcraiyyə Komitəsinin tərkibində Azərbaycan milli-azadlıq hərəkatının liderləri olan M.Ə.Rəsulzadə, F.Xoyski, A.Topçubaşov kimi şəxslər birləşmişdi. İcraiyyə Komitəsinə M.Hacınski sədrlik edirdi (235, s.8, 313, s.6). Bu ictimai təşkilatın yaradılmasında əsas məqsəd "müsəlman kütlələrini yaranmış vəziyyətin tarixi əhəmiyyəti ilə tanış etmək, milli-siyasi ideallarin izahı və yayılması üçün müvafiq təşkilatlar yaratmaq yolu ilə müsəlman ictimai qüvvələri birləşdirmək" (14, 6.02.1917) bəyan edilmişdi. Göstərilən məqsədlər istiqamətində fəaliyyətin genişlənməsi İctimai Təşkilatlar Şurasının Müvəqqəti İcraiyyə Komitəsi ətrafında birləşən milli qüvvələrin sayını daha da artırırdı. Komitənin ideyaları zəhmətkeş kütlələri arasında da geniş əks-səda tapırdı. Özünün ümummilli xətti ilə getdikcə kütləviliyini artıran Müsəlman İctimai Təşkilatları Şurası Bakıda siyasi qüvvələrin nisbətinin də dəyişməsinə ciddi tə'sir göstərirdi. Bu cəhət bolşeviklərin də böyük narahatçılığına səbəb olurdu. Çünki Müsəlman Şurasının bazasının genişlənməsi bolşeviklərin cəmiyyətə ictimai rəhbərlikdən sıxışdırılmasına səbəb ola bilərdi. (320, s.2). Görünür elə bunun nəticəsi idi ki, nə mart ayının əvvəllərində Bakı sovetinə keçirilən seçkilərdə, nə də aprel ayında keçirilən əlavə seçkilərdə bolşeviklər çoxluq qazanmağa müvəffəq ola bilməmişdilər (310, s.31; 235, s.9). Ona görə də Rusiya Sosial Demokrat Partiyasının Bakı Müvəqqəti Komitəsi özünün Bakı fəhlələrinə müraciətində onları Bakı bolşevikləri ətrafında birləşməyə, cəmiyyətdə normallaşmaqda olan yeni qüvvələrə qarşı vahid cəbhədə mübarizə aparmağa çağırırdı (2, s.8). Fevral inqilabından sonra Bakıdan əlavə Yelizavetpolda, Şamaxıda, Lənkəranda, Nuxada, Şuşada, Qubada, Naxçıvanda fəhlə və əsgər deputatları sovetləri meydana gəlsə də (261, s.6) onların da tərkibi sabit qalmadı və çox qısa müddətdən sonra bolşeviklər bu təşkilatlarda rəhbərliyi əldən verdilər. Bu orqanlarda bolşeviklərin öz mövqelərinin itirməsinin əsas səbəblərindən biri milli qüvvələrin kütlələr arasında apardığı işlərin genişlənməsi və onları siyasi həyata cəlb edə bilməsi idi (235, s.10).

Milli hərəkat fəallarının, o cümlədən onun aparıcı qüvvəsi olan və fevral inqilabından sonra leqal fəaliyyət imkanı tapmış "Müsavat" partiyasının xalqın milli hüquqlarının tə'min edilməsi yolunda irəli sürdüyü tələblər milli-siyasi ideallarin təcəssümü kimi cəmiyyətdə əməli surətdə müdafiə olunurdu. Özü də bu tələblər yalnız xalqın ağır yaşayışından doğan cari problemlərin həllinə deyil, eyni zamanda ümumilli mənafeləri əks etdirən strateji xarakterli vəzifələrin həllinə doğru istiqamətləndirilmişdi.

Bu baxımdan 1917-ci il aprel ayının 15-dən 20-nə qədər Bakıda keçirilmiş Qafqaz müsəlmanlarının qurultayının müzakirə etdiyi məsələlər və çıxardığı qərarlar Azərbaycan milli hərəkatındakı yeri ilə bərabər, milli tərkibli hərbi strukturların təşkili ideyasının həyata vəsiqə almasında da xüsusi əhəmiyyətə malikdir. Qurultayda hər şeydən əvvəl Rusiya xalqlarının ərazi-idarəçilik forması qızğın müzakirələrə səbəb oldu və bir çox çıxışlardan sonra Rusiyanın gələcək quruluşu barədə belə bir qərar qəbul edildi: "Qafqaziya müsəlman qurultayı milli-siyasi məqsədə aid məsələni müzakirə edərək müsəlman qövmlərinin mənafeyini ən ziyadə tə'min edən Rusiya şəkili - idarəsinin məhəlli federasion əsası üzərinə qurulu cümhüriyyət müctəmeyi-inam olduğunu qəbula qərar verir"(288, s.27).

Qurultayın işində iştirak edən bolşeviklər öz çıxışlarında Rusiyanın bölünməzliyini irəli sürsələr də (bax: 187, s.29) Rusiyanın federativ quruluşu və onun tərkibinə daxil olan müsəlman xalqlarına ərazi muxtariyyəti

verilməsi təklifi müdafiə olundu. Çünki milli hərəkatın liderləri şübhə etmirdilər ki, ərazi muxtariyyətinin əldə edilməsi gələcəkdə milli hüquqların tə'min edilməsi və milli azadlığın qazanılması yolunda böyük əhəmiyyətə malikdir.

Zaqafqaziya müsəlmanları üçün fəaliyyət xəttini müəyyənləşdirən qurultay Müvəqqəti hökuməti müdafiə etdiyini bildirdi və çıxarılan qərarların həyata keçirilməsində bu hökumətin əməli mövqe tutacağına ümid edən tədbir iştirakçıları bir sıra aktual və vacib məsələlər ətrafında da müzakirələr apardılar. Bu məsələlərdən biri də milli tərkibli hərbi strukturların yaradılması məsələsi idi. Qurultayda qərara alındı ki, Azərbaycanın səfərbərlik imkanlarını müəyyənləşdirmək üçün müsəlman əhalisinin siyahıya alınması aparılsın və bu tədbirin həyata keçirilməsi üçün qurultay tərəfindən xüsusi bir büro da yaradıldı. Müsəlman alaylarının təşkil edilməsi və onların silahlandarılması da bu büronun qarşısında dayanan başlıca vəzifə kimi qoyuldu (241, №.1-2, s.49; 274, s.55).

Milli hərəkatın fəalları milli qoşun hissələrinin yaradılmasını muxtariyyətin əldə edilməsinin və onun qorunub saxlanmasının vacib amillərindən biri hesab edirdilər. Qurultaydan bir müddət sonra Y.V.Çəmənzəminli özünün "Muxtariyyət nədir?" adlı məqaləsində yazırdı: "Vacib məsələlərimizdən biri də milli qoşundur. Milli qoşun düzəlsə, ölkəmizdəki başsızlığı dövrən aradan qaldırmaq mümükündür" (311, s.31). Başqa bir məqaləsində isə o, sayca Qafqazda üstünlük təşkil edərək, müəyyən maddi imkanlara malik olan azərbaycanlıların qoşun hissələri yaradılmasını dövrün tə'xirəsalınmaz vəzifələrindən biri kimi qiymətləndirirdi: "Rusiya millətləri hərə öz cəmiyyət və şuraları ilə idarə olunmağa üz qoyur, qoşun toplayırlar. Hər millət öz fərdini axtarıb tapır; əl-ələ verib camaatın halına qalır. Çünki milli himmətdən savayı özgəsi milləti bu dəhşətli zamanda müdafiə eləyə bilməz" (311, s.23).

Milli qoşun hissələrinin yaradılmasına icazə verilməsi barədə tələblər mərkəzə göndərilsə də Müvəqqəti hökumət onun yerinə yetirilməsindən çox uzaq idi. Xüsusən milli hərəkatları Rusiyanın parçalanması və separatizm kimi qiymətləndirən Kerenski (193, s.12) müsəlman qoşun hissələrinin təşkilinə razılıq verilməsini 1917-ci il sentyabr ayının sonuna kimi tə'xirə salmağı qərara aldı. (291, s.121). Ancaq Azərbaycanda milli qoşun hissələrinin yaradılacağı təqdirdə burada mərkəzdənqaçma qüvvələrinin daha da güclənəcəyindən qorxan Kerenski hökuməti öz və'dinə xilaf çıxdı və devrildiyi günə qədər bu məsələnin həllinə heç bir diqqət yetirmədi.

Milli qoşun hissələrinin yaradılmasına hökumət tərəfindən icazə verilməsə də bu istiqamətdə müəyyən işlərin görülməsi üçün yollar axtarıldı. Milli-azadlıq hərəkatının fəalları ilə bərabər bölgədə xidmət edən azərbaycanlı zabitlər də milli mənafelərin qorunması naminə bu məsələnin həllini lazımınca qiymətləndirərək özlərinin kömək və imkanlarını əsirgəmirdilər. Bu baxımdan sonralar Azərbaycan Ordusunda general-mayor rütbəsinə layiq görülmüş polkovnik Süleyman bəy Əfəndiyev azərbaycanlı gənclərin hərbi vərdişlər əldə etməsi üçün Gəncədə əhəmiyyətli işlər görmüşdü. 1917-ci ilin iyul ayında Gəncə şəhərinə xidməti e'zamiyyətə göndərilən polkovnik Süleyman bəy Əfəndiyev burada öz vəzifəsini yerinə yetirməklə bərabər Gəncə Müsəlman Milli Komitəsinin köməyi ilə şəhərdə hərbi kurs təşkil etdi və orada 150 nəfərə hərbi işin ilkin vərdışlərinin öyrədilməsinə başladı. Sonralar S. Əfəndiyevin ölümü ilə əlaqədar "Azərbaycan" qəzetinin çap etdiyi nekroloqda onun Gəncədəki fəaliyyəti ilə bağlı belə yazılmışdı: "O vaxt miralay (polkovnik) rütbəsində olan Süleyman bəy 1917-ci sənənin iyul ayında Gəncə şəhərinə təşrif gətirdi. Müəyyən bir vəzifə ilə Mavərayi - Qafqaz hökuməti tərəfindən e'zam edilmiş idi, vəzifəsi isə təşkil ediləcək süvari milis alayı üçün kiçik zabitlər yetişdirmək idi. Mərhum Gəncə şəhərinə varid olan kimi Gəncə Müsəlman Milli Komitəsinə təşrif gətirərək bəyanat verdi. Və Azərbaycan türklərinin qəvay əsgəriyyəsi olması və buna əşd ehtiyac xüsusunda izahat verərək əlavə etdi ki, əgər bu məsrəfi Gəncə Milli Komitəsi öz öhdəsinə götürərək qəvay əsgəriyyə təşkili əsasına ibtidar etmək arzusunda bulunarsa, məal məmnuniyyə bu xüsusda heç bir fədakarlıqdan çəkilməyəcəkdir. Milli komitə işə başladı. Yüz əlli nəfərlik gecə-gündüz olaraq bir məktəbi hərbiyyə güşadın qərar verdi. Bu miqdarı Gəncə vilayəti qəzaları arasında nüfuz e'tibarilə təqsim edərək namizədlər və onların məsrəflərini göndərmək xüsusunda cümlə qəzalarının milli komitələrinə müraciət etdi" (bax: 269, s.44).

Bu kurs vilayətə daxil olan bütün qəzaları əhatə etməli idi. Gəncə Müsəlman Milli Komitəsi qəzalardan göndəriləcək namizədlərin sayını müəyyənləşdirdikdən sonra bu barədə qəza Müsəlman komitələrinə mə'lumat verdi. Qəza müsəlman komitələri isə kursda təhsil alacaq namizədləri müəyyənləşdirməklə onların təhsil xərcini ödəməli idi. Ancaq bə'zi komitələr öz namizədlərini göndərsələr də təhsil xərcini ödəyə bilmədilər. Bu isə kursun fəaliyyətində müəyyən çətinliklər yaradırdı.

S. Əfəndiyev ortaya çıxan bu çətinliklərə baxmayaraq kursda öz işini davam etdirir və gənclərin hərbi biliklərə yiyələnməsində boynuna götürdüyü məs'uliyyəti layiqincə yerinə yetirirdi. Onun rəhbərlik etdiyi bu kiçik kursun üzvləri hərb işinin sirlərini öyrənməklə bərabər Gəncədə qanun-qaydanın yaradılmasında, anarxiyanın və özbaşınalıqların qarşısının alınmasında yaxından iştirak edirdilər (269, s.46)

Bununla belə ictimai əsasda yaradılmış olan kiçik bir kurs milli hərəkatın müəyyənləşdirmiş olduğu məqsədlərin həyata keçirilməsi, xalq kütlələrini ehtimal olunan təhlükə və təcavüzlərdən qorunması üçün kifayət deyildi. Müsəlman milli hissələrinin yaradılmasına göstərilən məqsədyönlü manelər haqlı narahatçılığı getdikcə artırırdı. Müsəlman silahlı struk-

turlarının təşkilinə əks getdiyi halda Müvəqqəti hökumətin Zaqafqaziya təmsilçisi olan Xüsusi Komitə Qafqaz cəbhəsinin qarşısının saxlanılması adı ilə gürcü milli qüvvələrinə milli hərbi strukturlar yaratmağa icazə vermişdi. Daşnak ideyalarına xidmət edən erməni milli qüvvələri isə artıq çoxdan mövcud idi (274, s.26). Bə'zi mə'lumatlara görə bu dövrdə Qafqazda rus ordusu tərkibində 150 min erməni xidmət keçmiş, Andronik və Nazerbekov kimilərinin rəhbərliyi altında 50 minə kimi erməni könüllüsü toplaşıb türk ordusuna qarşı döyüşlərdə iştirak etmişdi (189, s.231). Türklərin fiziki məhvini ümummilli vəzifə kimi qarşılarına qoymuş daşnak qüvvələrinin təcavüzünün azərbaycanlılara qarşı yeni bir vüs'ət alacağı təqdirdə onları qoruyacaq e'tibarlı qüvvə mövcud deyildi. Ona görə də bölgədə mövcud olan müxtəlif milli qüvvələrə müəyyən müqavimət göstərə biləcək silahlı strukturların yaradılması getdikcə daha geniş aktuallıq kəsb edirdi. Bu fikirlər 1917-ci il oktyabr ayının 24-də Yelizavetpola gəlmiş "Dikaya diviziyaya"daxil olmuş Tatar süvari alayının keçmiş komandiri Polovsovun şərəfinə keçirilmiş Müsəlman Milli Komitəsinin fövqəl'adə iclasında da səsləndi (286, s.89). İclasda çıxış edən komitə üzvləri milli hərbi qüvvələrin təşkil edilməsinin millət üçün xüsusi əhəmiyyətini qeyd edir və bu istiqamətdə qüvvələri birləşdirməyə çağırırdılar.

Həmin il noyabr ayının 5-də isə Yelizavetpolda Qafqaz müsəlman hərbçilərinin I qurultayı keçirildi. Burada da milli hərbi qüvvələrin yaradılması müzakirələrin əsas mövzusuna çevrildi. Hətta Qafqazda digər millətlərin öz milli qoşun hissələrini yaratmağa başladığı halda azərbaycanlıların milli tərkibli hərbi strukturlarının yaradılmasına hər vasitə ilə imkan verməyən Müvəqqəti hökumətin mürtəce mövqeyi ciddi tənqid atəşinə tutuldu. Ümumi fikir yekdilliyi ilə bu sahədəki boşluğun aradan qaldırılması üçün daha qətiyyətli və səmərəli hərəkət edilməsi müdafiə olundu (286, s.90).

Milli qoşun hissələrinin təşkili istiqamətində Bakıya nisbətən Gəncədə daha çox fəallıq duyulurdu. Bu da təsadüfi deyildi. Çünki Gəncə ilə müqayisədə Bakıda fəaliyyət göstərən digər siyasi qüvvələr kütlələr arasında xeyli nüfuza və tə'sir dairəsinə malik idilər. Bolşeviklər əgər Bakıda işləyən rus fəhlələri və burada xidmət edən rus əsgər və matrosları arasında özlərinə dayaq tapmışdılarsa, daşnaklar da erməni əhalisinin əksəriyyətinin iradəsinin ifadəçisi kimi çıxış edirdilər. "Müsavat" partiyasının və müsəlman təşkilatlarının fəaliyyətinə qarşı mübarizədə bu iki böyük siyasi qüvvənin məqsəd eyniliyi isə istər-istəməz Bakıda daha ehtiyatlı hərəkət etməyə sövq edirdi.

Ancaq bununla belə leqal fəaliyyətə başlamasından qısa müddət keçməsinə baxmayaraq "Müsavat" partiyası fəaliyyəti ilə kütlələr arasında özünə daha geniş dayaq tapıb Azərbaycanın aparıcı siyasi qüvvəsinə çevrildi. Oktyabr ayının 22-də Bakı Sovetinə keçirilən seçkilərin nəticələri də bunu sübut edirdi. Seçicilərin 40 faizi "Müsavat" partiyasına səs vermişdi ki, bu da bolşeviklərə və daşnaklara verilən səslərdən xeyli çox idi (bax: 191, s.11).

Bakı Sovetinə keçirilən seçkilərdən təxminən bir aydan bir qədər sonra Müəssislər Məclisinə keçirilən seçkilərdə isə "Müsavat" partiyası Azərbaycanda səslərin 90 %-ni toplamışdı (286, s.94). Bu faktın özü də müsavatçıların izlədiyi siyasi xəttə xalq tərəfindən bəslənilən münasibəti aydın göstərirdi. Müəssislər Məclisinə seçkilər Petroqradda bolşeviklərin Oktyabr üsyanından sonra baş versə də, onların dekretləri və bəyanatları kütlələr arasında geniş dayaq tapmamışdı və nəticədə seçkilərdə onların çox az seçici tərəfindən müdafiə olunduğu aydın oldu. .

Petroqradda yenidən hakimiyyətin dəyişməsi xəbəri Cənubi Qafqazda heç də birmə'nalı qarşılanmadı. Yaranmış vəziyyətin müzakirə edilməsi və çıxış yolu tapılması üçün noyabr ayının 8-11 arasında Tiflisdə fəaliyyəti sona çatan Xüsusi Komitənin təşəbbüsü ilə müşavirə keçirildi. Dörd gün davam edən müşavirədə Zaqafqaziyada olan idarə komissiyaları, milli və məhəlli quruluşlar, bələdiyyələr, fəhlə və həmkarlar ittifaqları, kəndli birlikləri, siyasi partiyalar cəbhədə olan ordu nümayəndələri, baş komandan və Xüsusi Komitə üzvləri iştirak edirdilər (194, s.223). Müşavirə iştirakçıları Oktyabr üsyanının qanuniliyini qəbul etmədilər. Onlar ölkədə hakimiyyət məsələsinin həll edilməsinə Müəssisələr Məclisinin qanuni səlahiyyətə malik olduğunu qeyd etdilər və Müəssisələr Məclisi çağırılan günədək Cənubi Qafqazda hakimiyyəti öz üzərinə götürəcək müvəqqəti orqan kimi Zaqafqaziya Komissarlığı yaradılmasını qərara aldılar. (6, s.7) Gürcü menşeviki E.P.Gegeçkori bu Komissarlığın sədri seçildi. Komissar vəzifələrinə isə A.Çxenkeli, D.Donskoy, Ş.Alekseev-Mesxiyev, M.Cəfərov, X.Məlikaslanov, A.Ter-Qazarov, A.Ohacanyan, X.Xasməmmədov tə'yin edildilər (6, s.8)

Zaqafqaziya komissarlığının Petroqraddakı bolşevik orqanlarına heç bir tabeçiliyi yox idi və müstəqil bir hakimiyyət orqanı kimi fəaliyyət göstərirdi. Yeni yaradılmış bir orqan kimi şübhəsiz ki, onun bütün strukturları tam işlək vəziyyətdə deyildi və onun idarəetmə mexanizmi formalaşmamışdı. Bununla belə, bu orqan Zaqafqaziya respublikalarının öz dövlət müstəqilliyini qazanması yolunda əhəmiyyətli bir addım oldu. Azərbaycanın milli qoşun hissələrinin təşkilinə başlanması da məhz Zaqafqaziya komissarlığı tərəfindən rəsmiləşdirildi və onun reallaşdırılmasına başlandı.

Zaqafqaziya komissarlığının təşkilindən dərhal sonra bölgənin hərbi-siyasi şəraitində yeni dəyişikliklər baş verdi ki, bu da bölgə xalqlarının həyatına, bölgədəki hərbi qüvvələrin yenidən qruplaşdırılmasına ciddi tə'sir göstərdi.

Petroqradda hakimiyyət dəyişikliyi xəbərini eşidəndən sonra Türkiyə tərəfi rus qoşunları ilə aparılan müharibənin dayandırılmasına tərəfdar ol-

duğunu bildirdi. Bu barədə təkliflər Petroqrada deyil Qafqaz cəbhəsinin komandanlığına göndərildi. Qafqaz cəbhəsinin komandanı general Prijevalski Türk qoşunları Qafqaz cəbhəsinin komandanına Ferik Vehib paşanın sülh bağlamaq təklifi haqqında noyabr ayının 21-də Zaqafqaziya komissarlığının növbəti iclasında mə'lumat verdi (6, s. 11). Bu mə'lumat Komissarlıq tərəfindən maraqla qarşılandı və müdafiə olundu. Nəticədə dekabr ayının 5-də (18-də) tərəflər arasında müqavilə imzalandı. Müqavilənin ikinci bəndinə əsasən imzalanan sənəd qüvvəyə mindiyi gündən Qafqaz və Türk cəbhəsinin bütün ərazilərində hər iki tərəfdən aparılan döyüşlər dayandırılmalı, qüvvələrin yerləşdiyi məntəqələrdə, habelə 10 verstlik zonada təyyarə uçuşlarının qarşısı alınmalı idi. Tərəflər atəşkəs ərzində qüvvələrin heç bir operativ və strateji qruplaşma və yerdəyişməsini aparmamalı və sülh sazişinə ciddi əməl etməli idilər (6, s.19)

Müqavilənin imzalanmasından bir gün sonra, yə'ni 1917-ci il dekabrın 6-da (19-da) Zaqafqaziya komissarlığı Bakıda və Dağıstanda yaranmış vəziyyəti müzakirə edərkən bolşevizmə qarşı mübarizənin kəskinləşdirilməsi zəruriliyini vurğuladı. Komissarlığın fikrinə görə bu istiqamətdə əsas tədbirlərdən biri qoşun hissələrinin milliləşdirilməsi və onların vasitəsilə bolşevizm qüvvələrinin qarşısına sədd yaradılması ola bilərdi. Komissarlığın iclasında qərara alındı ki, imkan daxilində Qafqaz ordusu tərxis olunsun, ayrı-ayrı hərbi hissələr isə milliləşdirilsin (282, s.100). Bununla da əslində Qafqaz ordusunun milli tərkibli birləşmələr zəminində yenidən qurulmasına qərar verildi. Qafqaz cəbhəsinin komissarı Donskoyun imzaladığı əmrdə bu məsələ tam həllini tapdı. Həmin əmrdə deyilirdi: "1) Ordu milli tərkibli nizami vahidlərdən təşkil olunur. 2) Erməni, gürcü, müsəlman, ukraynalı və başqalarından təşkil olunan döyüş hissələrindən başqa dərhal rus korpusu da yaradılsın. 3) Qafqaz ordusunun cəbhəsində xidmət etmək istəməyən əsgər və zabitlər müvafiq tə'yinat üçün öz məhəlli hərbi rəislərinin sərəncamına göndəriləcəklər" (286, s.124).

Həmin əmrlə Qafqaz ordusunun tərkibində ciddi struktur dəyişikliyi yaradıldı. Bu struktur dəyişikliyinə görə tərkibi ermənilərdən, gürcülərdən, azərbaycanlılardan və ruslardan ibarət olan korpuslar təşkil edilirdi. Milli tərkibli bu korpuslar operativ və təşkilati planda Zaqafqaziya Komissarlığına tabe olan Qafqaz cəbhəsinə daxil idilər. Korpusların təchizat və tə'minat məsələləri də Qafqaz komandanlığı tərəfindən həyata keçirilməli idi. Ancaq aydın idi ki, milli tərkibli hissələrin formalaşmasında Milli komitələr də kifayət qədər köməklik və qayğı göstərirdilər.

Elə həmin günlərdə Qafqaz cəbhəsinin komandanı general Prijevalski Bakıda olan hərbi hissələrin ləğvi barədə də əmr imzaladı. Ancaq əmrdə göstərilirdi ki, mövcud olan milli tərkibli bölmələr və qruplar ləğv edilmirlər (286, s.101). Bu bölmə və qruplar milli mənsubiyyəti üzrə hissələrin sərəncamına verilməli idilər.



Bütün bu görülən tədbirlərin nəticəsi kimi 1917-ci ilin dekabr ayında rus əsgərlərinin kütləvi surətdə tərxis edilməsi və Rusiyaya geri qayıtması başlandı. Vuruşmaqdan zinhara gəlmiş olan minlərlə rus əsgəri yaranan imkandan istifadə edib öz torpağına qayıtmağı üstün tutdu. Rus əsgərlərinin kütləvi surətdə tərxis edilməsi bolşevizmin real bazalarından birinin zəifləndilməsi kimi Zaqafqaziya komissarlığını qane edirdisə, bununla hərbi qüvvələr nisbətində meydana gələ biləcək nisbət bolşevikləri heç də tə'min etmirdi. Ona görə də onlar hər vasitə ilə Qafqaz cəbhəsinin dağılmasına, rus əsgərlərinin kütləvi surətdə vətənə qayıtmalarına mane olmağa çalışırdılar. Onların fikrincə "vahid Rusiya qoşunlarının buraxılması və milli korpusların yaradılması yalnız rus inqilabına vurulan zərbə deyildi, bu həm də Qafqaz xalqlarının mövcudluğunu sual altına qoyurdu" (286, s.101).

Qafqaz ordusunun bolşeviklər çoxluq təşkil edən diyar şurası əsgərlərə müraciət edərək xahiş edirdi ki, hamı birdən tərxis olunmasın. Çünki bununla Qafqaz cəbhəsi tamam boşalar. Müraciətdə o da bildirilirdi ki, Rusiya inqilabının taleyi indi əsgərlərin əlindədir (319, s. 72-73). Ona görə də əsgərlər bu məsələyə ciddi yanaşmağa çağırılırdı.

Ordunun dağılması əslində Zaqafqaziyada bolşevizmin başlıca dayaqlarının əldən verilməsi demək idi. Bunu bolşeviklər də yaxşı başa düşürdülər və mövqelərinin saxlanılması üçün orduda olan dayaqlarını qorumağa çalışırdılar. Bu istiqamətdə onlar müəyyən qədər öz məqsədlərinə nail ola bilirdilər. Əlbəttə, bu heç də səbəbsiz deyildi. Hələ Petroqradda silahlı çevriliş olan kimi, bolşeviklər dərhal bankları və hərbi arsenalları ələ keçirmişdilər. Aylarla məvacib almayan, aclıqdan zillət çəkən hərbçilərə bildirilirdi ki, pul almaq, ailəsini dolandırmaq imkanı əldə etmək istəyirsə bolşevik ordusuna yazılmalı, bolşevizm işi uğrunda mübarizə aparmalıdır. Maddi ehtiyac isə hərbçilərin çoxunun bolşeviklər tərəfinə keçməsinə gətirib çıxarırdı (209, s.237). O biri tərəfdən, aparılan təbliğat işləri də sözsüz ki, öz işini görürdü. Qafqaz ordusu əsgərlərinin milli hissələrin xofu ilə qorxudulması, ümumrus mənafelərinin qorunması naminə şovinist şüarlarla qıcıqlandırılması çoxdan arzusunda olduğu tərxisi əldə etmiş xeyli əsgər və zabitin bolşevikləşmiş hissələrdə qalması ilə nəticələnirdi.

Hərbçilər arasında bolşevikləşmənin zəifləməsinə yol verməmək üçün 1917-ci il dekabr ayının 10-dan 23-dək Tiflisdə Qafqaz ordusunun ikinci diyar qurultayı keçirildi (323, s.22). Qurultayın çağırılması ərəfəsində bolşeviklər müzakirə olunacaq məsələlər barədə arzusunda olduqları qərarların qəbul ediləcəyinə heç də əmin deyildilər. Ona görə də hələ noyabr ayının 30-da RSDF (b) P Qafqaz diyar komitəsi çağırılacaq qurultayla bağlı Qafqaz ordusunun əsgərlərinə müraciət etdi. Müraciətdə bildirilirdi ki, Qafqaz əsgərləri inqilabı və Rusiyanı məhv olmaqdan xilas etmək istəyirlərsə Leninin rəhbərliyi altında olan fəhlə-kəndli hökumətini

müdafiə etməli və inqilabi qərarların Qafqazda da həyata keçirilməsinə kömək göstərməlidirlər. Onun üçün də bolşeviklər əsgərləri qurultayda səslənəcək qeyri-bolşevik çıxışlara inanmamağa, rəhbər orqanlara bolşeviklərin daha çox seçilməsinə və Zaqafqaziya komissarlığının buraxılmasına nail olmağa çağırırdılar (2, s.210).

Əsgərlər arasında mövcud olan ovqatdan məharətlə istifadə edən bolşeviklər qurultayda çoxluq təşkil etməyə nail ola bildilər. Nümayəndələrin çox hissəsini, təxminən 160 nəfərini bolşeviklər və sol eserlər təşkil edirdilər (235, s.79). Ona görə müzakirə olunan məsələlərdə də bolşevik ruhu daha güclü idi. Qəbul olunmuş qərarda V.İ.Leninin rəhbərliyi altında Xalq Komissarları Sovetinin xətti bəyənilir, bolşevizmlə səsləşməyən hər cür fikir və hərəkətlərə qarşı mübarizə aparmağın vacibliyi təsdiqlənir, milli hərbi hissələrin təşkil edilməsinə, Zaqafqaziya komissarlığının mövcudluğuna qəti e'tiraz ifadə edilirdi. Qərarda o da ifadə olunurdu ki, bolşeviklər Müəssislər Məclisinin açılmasına tərəfdardırlar. Ancaq Müəssislər Məclisinin işi bolşeviklərin mövqeyi ilə səsləşməsə onda onun qərarları yerinə yetirilməyəcək və inqilab orqanlarının qərarları əsas tutulacaqdır (13, 03.01.1918).

Qurultayda Qafqaz ordusu diyar şurasına keçirilən seçkilər də qüvvələr nisbətini özündə əks etdirirdi. Şuranın tərkibinə daxil olan yüz nəfərdən 52-si bolşevik idi. Ona görə də dekabr ayının sonlarında şuranın icraiyyə orqanının rəhbərliyinə də başda Q.Korqanov (sədr) olmaqla bolşeviklər seçildilər (235, s.79).

Qafqaz ordusunda bolşevizmin tə'sirinin güclənə bilməsi Zaqafqaziya Komissarlığının rəhbərliyini, milli qüvvələri, bolşevizimə əks olan partiyaların fəallarını heç də qane etmirdi. Ona görə də Qafqaz ordusu diyar şurasının tərkibinə seçilmiş qeyri-bolşevik qüvvələr, bolşeviklərə nisbətən cəmi 2 səs fərqi ilə azlıqda qalmış 48 nümayəndə iclas keçirərək özlərini Qafqaz ordusunun səlahiyyətli diyar şurası e'lan etdilər. Onlar orduya rəhbərliyi də öz əllərində cəmləşdirdilər. (319, s.75). Belə olduqda Tiflisdə istədikləri kimi fəaliyyət göstərmək imkanından məhrum olan Qafqaz Komitəsinin Hərbi İnqilab Komitəsi adlı qurum Bakıya köçdü və burada Qırmızı ordu hissələrinin yaradılması işinə girişdi. Özünün iqtisadi inkişaf səviyyəsi, demoqrafik tərkibi e'tibarilə bu zaman Bakı bolşeviklərin geniş fəaliyyəti üçün Zaqafqaziyada yeganə böyük şəhər idi. Ona görə də Tiflisdən, Gürcüstanın və Azərbaycanın digər şəhərlərindən bolşevizm təəssübkeşləri Bakıya yığılmağa başladı. Onlar Bakı şəhərini Zaqafqaziyada milli hərəkatlara qarşı mübarizə mərkəzi hesab edir və burada həlledici hücumlara hazırlaşırdılar. 1917-ci il dekabrın 19-da Tiflisdə çağırılan fəhlə, əsgər və kəndli sovetlərinin II Qafqaz diyar qurultayında da uğursuzluğa düçar olduqdan sonra Zaqafqaziya bolşevizminin ağırlıq mərkəzi Bakı üzərinə düşdü (236, s.274). İstər Zaqafqaziya seçkili strukturlarında,



istərsə də Bakıdakı seçkili strukturlarda qanuni yolla üstünlük əldə edə bilməyən bolşeviklər zor tətbiq etməyə başladılar (286, s.94). Həmin zorun tətbiq olunması üçün zəruri olan qoşun hissələrinin formalaşdırılması isə artıq böyük sür'ətlə gedirdi. Bolşeviklər hərbi hissələrdə də siyasi orqanlar təşkil edir, əsgərləri hissələrin siyasiləşməsinə əks gedən zabitlərə qarşı qoyur və onların sıxışdırılaraq uzaqlaşdırılmasına nail olurdular. 1917-ci il hələ noyabrın 12-də Bakı Soveti Bakı qarnizonuna daxil olan qoşun hissələrinin komandir hey'ətinin demokratikləşdirilməsi və komandirlərin seçilməsi haqqında qərar qəbul etdi. Əsgər kütlələri dərhal Bakı sovetinin bu qərarına tərəfdar çıxdılar və nizamnamə borclarını yaddan çıxararaq hissə komandirlərinin münasib şəxslərlə əvəz edilməsi kampaniyasına girişdilər. Nəticədə 9, 18, 19 və 20-ci Qafqaz fəhlə taborlarının komandirləri yeniləri ilə dəyişdirildi. Noyabr ayının 28-də isə bu hissələrinin yenidən qurularaq vahid hissə şəklində təşkili və sonra da onun bolşevik orqanlarına tabe etdirilməsi barədə qərar qəbul edildi (223, s.70-71).

Qarnizon hissələrinin komandirliyinə münasib şəxslər yerləşdirildikdən sonra dekabr ayının 2-də həmin hissələrin müvəkkillərinin iclası keçirildi. Bu iclasda podporuçik Yefremov qarnizon rəisi, bolşevik Kleşşov Bakı şəhər komendantı seçildilər (223, s. 70).

Dekabr ayının 12-də Fəhlə və Əsgər Sovetləri İcraiyyə Komitəsinin nəzdində Hərbi İnqilab Komitəsi yaradıldı. İcraiyyə komitəsinin bu qurumun təşkili ilə bağlı qərarında bildirilirdi ki, Hərbi İnqilab Komitəsinə böyük səlahiyyətlər verilir və bu orqan Sovetlərin İcraiyyə Komitəsi ilə birlikdə şəhərdə qayda və qanunun yaradılmasını öz üzərinə götürür (13, 14.12.1917). Bu orqanın yaradılmasının səbəbləri barədə S.Şaumyan sonralar belə deyirdi: "Bizdə Sovet hakimiyyəti e'lan ediləndə biz mövcud burjua – iqtisadi quruluşun əsaslarına toxunmadıq. Bizim Sovet adlı hakimiyyətimiz mahiyyətcə sovet hakimiyyəti, iqtisadi siyasətinə görə isə burjua hakimiyyəti idi. Bu uyğunsuzluğun səbəbi bizim gücsüzlüyümüzdə idi. Bir tərəfdən iqtisadi cəhətdən güclü burjuaziya, bir tərəfdən də məngənəsində bütün müsəlman demokratiyası olan "Müsavat" partiyasının millətçi təbliğatı Sovet hakimiyyətinin düşmənlərini gücləndirmişdi və ona əsl proletar siyasəti yeritmək imkanı vermirdi... Bakı soveti üçün aydın idi ki, real hərbi qüvvəyə malik olmaqla o, proletar hakimiyyətini həqiqətə çevirə bilər. Bu məqsədlə də Sovet tərəfindən Hərbi İnqilab Komitəsi yaradıldı" (319, s.166).

Ətrafına topladığı silahlı bölmələrə dayaqlanaraq Hərbi İnqilab Komitəsi özünü şəhərdə yeganə hakimiyyət orqanı kimi aparır və bütün şəhər əhalisi üçün məcburi olan əmrlər qəbul edirdi. Dekabr ayının 14-də bütün əhali üçün məcburi e'lan edilən qərarda Hərbi İnqilab Komitəsi küçə və meydanlarda toplaşmağı, ondan xəbərsiz digər orqanların axtarış-

lar aparmasını, kütləvi şəkildə müraciətlər edilməsini qadağan edirdi. Qərara görə dekabr ayında imzalanmış şəxsi vəsiqələri olmadan heç bir əsgər küçəyə çıxa bilməzdi (2, s.24). Əsgərlərə aid edilən qadağalar heç şübhəsiz ki, milli qoşun hissələrinin əsgərlərinə qarşı çevrilmişdi və bu yolla bolşevik orqanları milli hıssələrin formalaşmasına qarşı apardığı mübarizəni qanuniləşdirməyə çalışırdı.

Dekabr ayının 21-də Bakı Sovetinin İcraiyyə Komitəsi Qırmızı qvardiyanın təşkil olunması barədə də qərar qəbul etdi və dərhal Qara şəhərdə və Balaxanıda ilk Qırmızı qvardiya dəstələri yaradıldı (215, s.223).

1918-ci il yanvar ayının elə ilk günlərindən Bakı Sovetinin İcraiyyə Komitəsi qərar qəbul etdi ki, yaradılmaqda olan bolşevik hissələrinin silahlandırılması üçün tərxis olunan hərbçilər Bakıdan keçərkən tərksilah edilsin. Bunun üçün Bakı və Biləcəri stansiyalarında, liman körpüsündə nəzarət təşkil edilsin. Yerli qarnizonun əsgər və zabitləri isə Bakı Sovetinin sərəncamına göndərilsin və sovet hissələrində xidmətlərini davam etdirməyə razı olacağı təqdirdə onlara silah verilsin (223, s.82).

Bakı bolşeviklərinin möhkəmlənməsi, onların ehtiyaclarının ödənilməsi üçün Rusiyanın Xalq Komissarları Soveti də öz köməyini əsirgəmirdi. Hələ 1917-ci il dekabr ayının 16-da RSFSR Xalq Komissarları Sovetinin iclasında Stalinin Qafqazdakı vəziyyət haqqındakı mə'ruzəsi dinlənildikdən sonra Bakı Sovetinin sədri S.Şaumyanın Qafqazın fövqəladə komissarı tə'yin edilməsi və onun sərəncamına 500 mın rubl göndərilməsi qərara alınmışdı (2, s.227).

Beləliklə, 1917-ci ilin sonundan başlayaraq Bakıda özünəməxsus hərbi-siyası şərait formalaşırdı və bu şərait Bakıda və bütünlükdə Azərbaycanda mövcud olan ictimai-siyasi şəraitə tə'sir göstərdiyi kimi, milli qoşun hissələrinin formalaşmasına da tə'sir göstərirdi. Zaqafqaziyanın inqilab mərkəzinə çevrilən Bakıda cəmləşən bolşeviklər bütün qüvvələrini sərf edərək burada möhkəmlənmək və niyyətlərinin məhv olmasına yol verməmək üçün hər cür vasitədən istifadə etməyə çalışırdılar. Mütləq əksəriyyəti qeyri-millətlərdən və tərkibində xeyli sayda erməni olan bolşeviklər xalqın adından bəyanatlar versələr də, Azərbaycanın milli mənafeyini əks etdirən qüvvələrin məhv edilməsi üçün qeyri-bolşevik ideologiyanın yolçusu olub Azərbaycan xalqını, onun milli qüvvələrini məhv etməkdə maraqlı olan partiya və hərəkatlarla əməkdaşlıq etməkdən belə çəkinmirdilər. S.Şaumyanın rəhbərliyi altında olan Bakı Soveti Azərbaycanın milli qoşun hissələrinin yaradılmasının əleyhinə olduğu halda özü qoşun hissələri təşkil edirdi, milli qoşun hissələrinin ləğv olunan hissələr hesabına təchiz edilməsinə qarşı barışmaz mövqe tutduğu halda Bakı Soveti qoşun hissələrinin cəbhədən qayıdan hissələrin hesabına təchiz edilməsi barədə qərar qəbul etmışdi. Müstəqil erməni dövlətinin yaradılması barədə Lenin və Stalinin imzaladığı 13 yanvar 1918-ci il tarixli dekreti alqışladığı və onun reallaşdırılması barədə göstəriş aldığı halda (220, s.282) S.Şaumyan



Rusiya müsəlmanlarının, o cümlədən Azərbaycan xalqının öz müqəddəratını müəyyənləşdirmək istəyini inqilabi Rusiyaya qarşı xəyanət kimi qiymətləndirirdi (313, s.16). Halbuki, Azərbaycanın milli müqəddəratının milli mənafelərə uyğun olaraq həll edilməsinə müəyyən bir ümid elə Lenin və Stalinin 1917-ci il noyabr ayının 17-də Şərqin və Rusiyanın müsəlman zəhmətkeşlərinə ünvanlandığı müraciət (2, s.204) yaratmışdı. S.Şaumyan və bolşevik adı altında onun ətrafına toplaşan erməni millətçiləri Azərbaycanda milli qüvvələrin, milli hərəkatın güclənməsinə, milli müqəddəratın milli mənafelərə uyğun olaraq həll edilməsinə çalışmasını bolşevizmin ifrat təmayülü ilə vəhdət şəklində birləşən daşnak idealogiyasının və onun ardıcıllarının taleyinə ən böyük təhlükə kimi qiymətləndirirdi. Azərbaycanda milli müqəddəratın həll olunmasına yol verilməməsini elə Azərbaycanda bolşevizmin qələbəsi kimi qəbul edirdilər. 1918-ci ilin yanvarında S.Şaumyan yazırdı: "Müsəlman burjaziyasının və mülkədarlarının öz müqəddəratını həll etməsi müsəlman xalqının öz müqəddəratını həll etməsi demək deyil...Rus demokratiyası buna yol verə bilməz"(319, s.83). S.Şaumyan bu fikrini M.Ə.Rəsulzadənin Bakı Sovetinin İcraiyyə Komitəsində söylədiyi bir nitqinə cavab olaraq yazmışdı və müsəlman burjaziyası və mülkədarları dedikdə o, Azərbaycan milli hərəkatının fəallarını nəzərdə tuturdu. Rus demokratiyası dedikdə heç şübhəsiz ki, S.Şaumyan təkcə rus bolşeviklərini deyil, Azərbaycanı qan çanağına çevirmək marağında olan mürəkkəb tərkibli bir qüvvəni nəzərdə tuturdu.

Ətrafına kifayət qədər qüvvə toplaya bilsə də 1917-ci ilin sonu və 1918-ci ilin əvvəlində Bakı soveti Bakı şəhərində tam hakimiyyətə malik deyildi. Qanuni hakimiyyət orqanı olan şəhər bələdiyyəsi öz fəaliyyətini davam etdirirdi. Şəhərin qeyri-azərbaycanlı əhalisi, əsasən də fəhlələr və əsgərlər Bakı sovetinin ardınca gedirdi, əhalinin digər hissəsi isə hakimiyyət orqanı kimi Bakı bələdiyyəsini tanıyırdı (289, s.30-31). Bu orqan dəfələrlə Bakı Covetinə müraciət etmiş, onları qanuni hakimiyyət orqanı olan bələdiyyənin nəzarəti altında fəaliyyət göstərməyə çağırmışdı (286, s.95).

1917-ci il dekabr ayının 15-də isə Bakı şəhər bələdiyyəsinin fövqəl'adə iclası çağırıldı. Burada Bakı Soveti İcraiyyə Komitəsinin və Hərbi İnqilab Komitəsinin tədbirlərinə qarşı ciddi e'tiraz ifadə edildi və yenidən hakimiyyətin qanuni orqanlarda cəmləşdirilməsinin zəruriliyi vurğulandı. İclas iştirakçıları haqlı olaraq bildirdilər ki, belə bir qanuni orqan şəhər bələdiyyəsi olduğu üçün hakimiyyət də ona məxsus olmalıdır. "Müsavat" partiyasının üzvləri mövcud şəraitdə vəziyyəti kəskinləşdirməmək üçün hətta koalisyon hökumətin yaradılmasına da razılığını bildirdilər. Bununla onlar ümid edirdilər ki, yaxın vaxtlarda çağırılacaq Müəssislər Məclisi ölkədə hakimiyyət məsələsini onsuz da nizama salacaqdır (235, s.83). Qanuni vasitələrin onların xeyrinə olmadığını bilən bolşeviklər isə zorakılıq və vətəndaş qırğınları yolu ilə qarşılarına qoyduqları məqsədə daha tez nail olacaqlarına ümid edirdilər.

Azərbaycanın milli qoşun hissələri belə bir mürəkkəb şəraitdə formalaşırdı və əslində bu mürəkkəb formalaşma prosesi bolşevizmə qarşı mübarizə ilə parallel olaraq aparılırdı. Hər addımda digər bir sıra çətinliklərlə bərabər bolşevizmlə və ona təəssübkeş olan ünsürlərin müqavimət ilə mübarizə aparmaq zərurəti ortaya çıxırdı.

Ancaq getdikcə daha geniş baza əldə edən "Müsavat" partiyası fəallarının və milli əhval-ruhiyyəli digər vətənpərvərlərin mübariz iradəsi və qətiyyəti bütün qüvvələri ortaya çıxan çətinliklərin aradan qaldırılmasına səfərbər edirdi. Milli qoşun hissələrinin yaradılması mövcud olan azsaylı milli hərbçilər tərəfindən də müdafiə olunurdu. Belə hərbçilərin Bakıda, Lənkəranda, Tiflisdə keçirilən yığıncaqlarında (310, s.38) milli qoşun hissələrinin təşkilinin zəruriliyi vurğulanmışdı.

Müsəlman Korpusunun yaradılması barədə dekret Zaqafqaziya komissarlığı tərəfindən 1917-ci il dekabr ayının 11-də qəbul edilmişdi (20, №1, 1998, s.86). Korpusları təşkil edən hissələrin formalaşdırılması isə bir qədər əvvəldən, yə'ni artıq noyabr ayından başlanmışdı. Doğrudur, gürcü və erməni silahlı qurumları başqa formada əvvəldən də mövcud idi və milli qoşun hissələrinin təşkili Zaqafqaziya komissarlığı tərəfindən rəsmiləşdiriləndə onlar yeni strukturlarda dərhal öz yerlərini tutdular. Yə'ni "müsəlman alayının təşkili mübahisə və münaqişə halında ikən gürcü və erməni alaylarının təşəkkülü haman tamam olub bitmişdi" (288, s.31)

Milli qoşun hissələrinin arasındakı əlaqə və münasibətləri nizamlamaq üçün millətlərin Hərbi Şurası təşkil edildi. Bu Şuraya yalnız azərbaycanlıların, gürcülərin və ermənilərin nümayəndələri daxil idilər (241, N. 1-2, s.62). Bundan başqa 1917-ci ilin sonlarında Tiflisdə "Qafqaz Müsəlmanlarının Hərbi Şurası" adlı bir qurum da mövcud idi. Həmin qurum heç şübhəsiz ki, müsəlman hissələrinin təşkilinə, tə'minat və təchizatına qayğı göstərməklə məşğul idi.

Eyni zamanda Tiflisdə rus korpusu da təşkil edilirdi. Yaradılmaqda olan rus korpusuna general Dratsenko, gürücü korpusuna general Axmeteli, erməni korpusuna isə general Nazarbekov komandirlik edirdi (322, s.188). Korpusların formalaşdırılnrasının bütün təşkilati işləri də onların rəhbərliyi altında aparılırdı.

Müsəlman Korpusunun komandiri isə general-leytenant Əliağa Şıxlinski tə'yin edildi. Çar ordusu tərkibində şərəfli zabit yolu keçmiş olan Ə.Şıxlinski 1917-ci ilin noyabrında bolşevikləşməkdə olan ordudan iste'faya çıxmağı üstün tutdu və elə həmin il dekabr ayının 2-də onun xidmətdən azad edilib ehtiyata keçirilməsi barədə əmr imzalandı (322, s.185). O dərhal da Qafqaza qayıtdı və burada qaynar ictimai proseslərin burulğanına düşdü. Belə bir təcrübəli və nüfuzlu general Müsəlman Korpusunun komandiri tə'yin olundu və milli qoşun hissələrinin formalaşdırılması ona tapşırıldı. Sovet rejiminin ən kəskin illərində yazdığı xatirələrində Ə.Şıxlinski Tiflisə qayıtması, Müsəlman Korpusuna komandir tə'yin edilməsi və milli qoşun hissələrinin vəziyyəti barədə çox ehtiyatla və çox ötəri qeydlər etmişdi. Ancaq Müsəlman Korpusunun mövcud olan çox kəsad arxivindən mə'lum olur ki, Ə.Şıxlınski milli qoşun hissələrinin yaradılmasını ürəkdən alqışlämış, ona tapşırılan çox çətin vəzifənin öhdəsindən gəlmək üçün yüksək milli və vətənpərvərlik keyfiyyətləri nümayiş etdirmiş, bu yolda özünün bütün təcrübə və bacarığından istifadə etmişdir. Öz xatirələrində general yazırdı: "... sonra Azərbaycan (müsəlman - M.S) korpusu təşkil etmək qərara alındı. Bu korpusa komanda etməyi mənə təklif etdilər. Mən xəstə olduğuma və müalicəyə gəldiyimə əsaslanaraq boyun qaçırdım. Buna baxmayaraq mənim orada olmadığım günlərdə Müsəlman Korpusu təşkil etmək və başqa bir adam tə'yin olunana qədər bu korpusa mənim müvəqqəti komandirlik etməyim haqqında əmr vermişdilər. Bu zaman mən Yelizavetpola (Gəncəyə) getmişdim. Tiflisə qayıtdıqda müvəqqəti olaraq mənə korpus komandanlığı həvalə olunduğu barədə əmri oxudum... Dekabrın 31-də mən öz qərargahımın ilk hey'əti ilə Gəncəyə getdim ki, orada hissələrin təşkil edilməsilə məşğul oldum"(322, s.188-189).

1917-ci ilin sonu, 1918 ci ilin əvvəllərində Müsəlman Korpusunun qərargahı Tiflisdə yerləşirdi, bütün təşkilati işlərə rəhbərlik də buradan edilirdi. Korpusun ştatı rus ordusunun ştatlarına uyğun olaraq təşkil edilmişdi. Bu günə gəlib çatmış *arxiv sənədlərinin araşdırılması göstərir ki,* Müsəlman Korpusunun qərargahında aşağıdakı strukturlar var idi:

Ümumi qərargah (179, v.23), korpus ləvazimat rəisinin xidməti (179, s.59), korpusun topçu müfəttişinin xidməti (178, v.3), korpusun istehkam rəisinin xidməti (178, v.3), ober-kvartirmeyster xidməti (179, v.53), növbətçi zabitin şö'bəsi (178, v.19), korpusun tibb xidməti və baytar həkiminin xidməti (178, v.17 )




**Müsəlman Korpusu qərargahının strukturu**

Bu strukturların tərkibi həddən artıq yığcam idi və bu yığcamlıq onların çevik fəaliyyətinə imkan yaradırdı. Məsələn, əsas strukturlardan *sayılan korpus topçu müfəttişinin idarəsinin ştatatı belə idi* (178, v.40)

| №.№ | Vəzifə | miqdarı | Rütbə kateqoriyası |
|---|---|---|---|
| 1. | Korpus topçu müfəttişi | 1 | general-leytenant |

| | | | |
|---|---|---|---|
| 2. | Tapşırıq zabitləri | 2 | 1-ştab zabiti, 1-ober-zabit |
| 3. | Topçu texniki | 1 | ştab zabiti |
| 4. | Kargüzar | 1 | mə'mur |

Korpusa daxil olan hissə və birləşmələrin ştatları da belə yığcam idi. Doğrudur, qərargahların bu yığcamlığı qoşun hissələrinin formalaşdırılmasında, tə'lim və tərbiyənin təşkilində çevik və operativ hərəkət etməyə imkan verirdi. Bununla belə mövcud olan obyektiv çətinliklər Müsəlman Korpusunun formalaşmasını xeyli mürəkkəbləşdirmişdi. Bu çətinliklərdən biri korpusun təchizat məsələsi idi. Özü də bu problemin elə bir sahəsi yox idi ki, orada vəziyyət azacıq da olsa yaxşı olaydı. Korpusun komandiri Ə.Şıxlinski sonralar haqlı olaraq belə yazırdı: "Bizim əlimizdə silah, cəbbəxana, ərzaq ehtiyatı, paltar və ayaqqabı yox idi" (322, s.189). Korpusun rəhbərliyi qoşun hissələrinin formalaşdırılması ilə bir vaxtda bu böyük problemin həllinə də nail olmalı idi. Sözsüz ki, Müsəlman milli şuraları da həmin istiqamətdə öz köməkliklərini əsirgəmirdilər. Məsələn, hələ Ə.Şıxlinski korpus komandiri tə'yin edilməzdən əvvəl Tiflis Müsəlman şurası milli qoşun hissələrinin təşkili üçün müəyyən qədər zəruri əşyalar toplamış və sonra onları korpus komandanlığına təhvil vermişdi (322, s.189). Müsəlman ictimai təşkilatlarının fəalları imkan daxilində bazardan da silah, sursat və digər əşyaları alaraq qoşun hissələrinə verirdilər (175, s.24).

Azərbaycanın milli qoşun hissələrinin yaradılmasına başlanması barədə 7 yanvar 1918-ci il tarixli nömrəsində "Açıq söz" qəzeti belə yazırdı: "Yanvarın üçündə Mərkəzi Müsəlman Zaqafqaziya Komitəsinin üzvü, Mərkəzi Komitə sədri Fətəli xan Xoyski müsəlman əsgəri dəstələri təşkilatı haqqında mə'ruzədə bulunmuşdur. Mə'ruzədən anlaşıldığına görə 1917-ci il dekabrın on birində Zaqafqaziya Komissarlığının Zaqafqaziya müsəlmanlarından nizami ordu təşkil etməsi qətnaməsi çıxarmışdır. Nizami ordu üçün lazımı qədər könüllü cəm edilməsi işi Qafqaziya Mərkəzi-Müsəlman Komitəsinə həvalə edilmişdir. Nizami ordu təşkil edildikdən sonra müsəlmanlardan alınan əsgəri vergının ləğv edilməsi haqqında Zaqafqaziya Komissarlığı tərəfindən dekret veriləcəkdir. Zaqafqaziya Komissarlığının bu qətnaməsinə binaən dekabrın 19-da beşinci və yeddinci Qafqaziya nişançı firqələrindən ibarət olan 6-cı ordu korpusunun Müsəlman nizami ordusuna əvəz edilməsi haqqında Qafqaziya cəbhəsi qoşunlarının baş komandanı tərəfindən əmrnamə verilmişdir. Həmin əsgər dəstələrini milliləşdirmək işlərinin nəzarəti general Əliağa Şıxlinskiyə həvalə edilmişdir. General Şıxlınski öz vəzifəsinin icrasına başlamışdır" (bax:269, s.160).

Milli qoşun hissələrinin təşkilində və təchizində Azərbaycan Milli burjuaziyasının nümayəndələri - H.Z.Tağıyev, M.Nağıyev və başqaları da iştirak edirdilər. Doğrudur, M.Ə.Rəsulzadə S.Şaumyanın ittihamlarına cavab verərkən bu şəxslərin milli qoşun hissələrinin təşkilində iştirak etmələrinin düzgün olmadığını bildirirdi (319, s.103). Ancaq şübhə etmək olmaz ki, M.Ə.Rəsulzadə bunu Azərbaycan milli burjuaziyasının tanınmış şəxslərini və xeyriyyəçilərini erməni millətçi ittihamlarından qorumaq üçün etmişdi. Çünki H.Z.Tağıyev, Ş.Əsədullyev kimi imkanlı şəxslərin övladları Müsəlman Korpusunun tərkibində xidmət etdikləri halda (295, s.51) onlar sözsüz ki, milli qoşun hissələrinin taleyinə laqeyid qalmazdılar. Ona görə də xalqın milli təəssübkeşləri çox sahələrdə olduğu kimi orduya qayğı sahəsində də yardımlarını əsirgəmirdilər.

H.Z.Tağıyevin milli qoşun hissələrində xidmət edən oğlu Məhəmməd də söhbətlərində təchizat məsələlərinin xeyli ağır olduğunu, yataq əşyalarının olmadığı üçün zabitlərin çoxunun başları altına yəhər qoyaraq yatdıqlarını bildirirdi (295, s.51).

Milli qoşun hissələrinin yaradılmasına başlanması vətənpərvərlik hissləri ilə alışıb yanan gənclərin hədsiz sevincinə və marağına səbəb olmuşdu. Xalqının, yurdunun ağır vəziyyətdə olduğunu anlayan belə gənclər hər vasitə ilə qoşun hissələrinin formalaşdırılmasına kömək etməyə çalışırdılar. Şahidlərin ifadəsinə görə, hətta başqa şəhərlərdə oxuyan azərbaycanlı tələbələrin də bir çoxu milli qoşun hissələrinə yazılmaq üçün Bakıya qayıdır və imkan daxilində özləri ilə silah gətirirdilər (17, 14.VI. 1992).

Bakıda təşkilinə başlanan qoşun bölmələrindən birinin üzvü Miroziz Seyidli xatirələrində həmin günləri belə təsvir edirdi: "Hacı Zeynalabdin kimi zənginlərdən para toplanıldı və İsmailiyyənin bir guşəsində könüllü əsgərlərin qeydiyyatına başlandı. İlk həftədə 50-60 könüllü yazıldı. Onların arasında yoldaşlarına örnək olmaq üçün mən də vardım." (17, 14.VI. 1992).

Könüllülərin toplanılması işinə süvari zabiti İsgəndərbəyli rəhbərlik edirdi. Qoşun bölməsinə yazılanlar arasında dağıstanlılar da vardı. Bakının Çəmbərənkənd məhəlləsində bir məktəb binasında könüllülər üçün qışla düzəldildi və dərhal da onların tə'liminə başlandı. Könüllülər isə gəlməkdə davam edirdi. Hacı Zeynalabdin Tağıyevin oğlu Məhəmməd də bu vaxt qoşun bölməsinə yazılmışdı. M.Seyidlinin yazdıqlarına görə sıravi könüllüləri toplamaq elə də çətin deyildi. Başlıca çətinlik zabitlərin tapılması sarıdan idi: "Zabit məsələsini həll etmək üçün polkovnik Tabasarinskinin rəhbərliyi altında Çəmbərkənddə bir hərbi məktəb quruldu və tələbə yoldaşlarımızın bir çoxu oraya yazıldı. Girişdiyimiz bu ciddi hazırlıq işləri Bakıda olan Sovdepin heç də xoşuna gəlmədi. Eyni zamanda ermənilərin də rus soldatları arasında bizə qarşı apardıqları şiddətli təbliğat aramızdakı gərginliyi bir qat daha da artırdı. Nəhayət, göz önündən çəkilməyə qərar verdik. Bizə ən uyğun yer kimi Lənkəran şəhərini seçdik. Və günlərin bir günü axşama yaxın Lənkəran 80 nəfərə qədər nizami əsgər kütləsinə sahib oldu" (17, 14.VI.1992).

M.Seyidli konkret olaraq təşkil etdikləri hissənin adını çəkməsə də faktların tutuşdurulmasından aydın olur ki, söhbət Müsəlman süvari divizionundan gedir. Lənkərana gəldikdən sonra divizionun şəxsi hey'əti silah və sursat tapılması barədə fikirləşib mümkün yolları arayırdılar. Yeganə çıxış yolu yalnız rus hissələrinin tərksilah edilməsi idi və bunun üçün əməliyyat hazırlanıb həyata keçirildi. Rus əsgərlərinin qışlalarına təşkil edilən hücumların birində 200-dən çox tüfəng, çoxlu patron, 11 pulemyot, yük arabaları, bir neçə əsgər mətbəxi və 40-a qədər minik atı ələ keçirildi (17, 14.VI.1992).

Təchizat çətinliklərinin həlli üçün əsas ümid Qafqazdakı rus ordusunun tərkisilah edilməsinə və onun ləvazımatının milli qoşun hissələrinə verilməsinə bağlanmışdı. 1917-ci il dekabr ayında Tiflis şəhərində yerləşən artilleriya anbarından Zaqafqaziya Komissarlığının tələbi ilə milli qoşun hissələri üçün silah və sursat buraxılmadıqda (293, s.32) qəti tədbirlərə əl atıldı. Tiflis şəhərində hərbi vəziyyət e'lan edildi və dekabr ayının 12-də artilleriya anbarı Zaqafqaziya Komissarlığının qüvvələri tərəfindən tutuldu (240, s.1/14). Bolşevik əhval-ruhiyyəli hissələr tərəfindən möhkəm qorunan bu anbarın tutulması qarnizonun bolşevikpərəst hissələrinin təchizat imkanlarına ciddi zərbə vurmaqla bərabər milli qoşun hissələrinin, o cümlədən müsəlman hissələrinin təchizatına da müəyyən bir baza yaratdı.

Zaqafqaziya Komissarlığı və milli şuralar silah, sursat və təchizat problemini lazımınca həll etmək üçün "Cəbhənin silahları Zaqafqaziyada saxlanılmalıdır" şüarı ilə çıxış edərək ləğv olunan hissələrin əmlakının Zaqafqaziyada saxlanılmasına çalışırdılar (292, s.69). Dövrün bu tələbinin həyata keçirilməsi üçün ermənilər, gürcülər və azərbaycanlılardan təşkil olunmuş Millətlərarası Hərbi Şura ilə Qafqaz cəbhəsi qoşunlarının Ümumi qərargahı bir sıra qərarlar qəbul etdilər və bu qərarlarla müəyyənləşdirildi ki, ləğv edilmiş hissələr öz əmlakını hansı hissələrə təhvil verməlidirlər. Məsələn, bu qarşılıqlı razılaşmaya əsasən Yelzavetpolda yerləşən 219 saylı alay özünün bütün əmlakını burada formalaşmaqda olan Tatar alayına təhvil verməli idi. Müvafiq əmr 1917-ci il dekabr ayının 14-də 217 -ci alaya çatdırılsa da bu alay əmlakı təhvil verməkdən imtina etdi (292, s.71). Ona görə də Gəncə Müsəlman Şurasının fəalları qətiyyət və güc tədbirləri həyata keçirərək həmin alayın ərzaq, ləvazimat anbarlarını ələ keçirib şəxsi hey'əti tərksilah olmağa məcbur etdilər (240, s. 1/15).

Zaqafqaziya Komissarlığının razılığı ilə Qafqaz cəbhəsinin ləğv olunmuş 5-ci və 7-ci diviziyalarının tərkibinə daxil olan hissələr də bölgəni tərk etdikcə öz əmlakını yaradılmaqda olan müsəlman hissələrinə təhvil verməli idilər. (223, s.78). Ancaq ləğv olunan hissələrin əksəriyyəti bir tərəfdən bolşevik təbliğatının, digər tərəfdən də şovinist hisslərin baş qaldırması nəticəsində heç də könüllü surətdə silah və əmlakını təhvil



vermək istəmirdilər. Belə hissələrin bə'zilərinə qarşı müəyyən hallarda mövcud qüvvələr daxilində güc tətbiq edilirdi. Məsələn, qoşun dəstəsi Müsəlman Şurasının fəalları ilə birlikdə Lənkəran qəzasında bolşevik tə'siri altında olan 4-cü və 7-ci sərhəd alaylarını tərksilah etdi (224, s.34). Elə həmin ay "Milyutin" gəmisində İrandan geri qayıdan rus əsgərləri milli qüvvələr və Prişibdən çağırılmış Kərimbəy Şaxtaxtinskinın rəhbərliyi altında olan Şahsevən dəstələri tərəfindən tərksilah olundular (223, s.78). Bu zaman rus silahlılarından 6 ədəd pulemyot, 3 min tüfəng, 85 min patron, 10 yeşik bomba ələ keçirildi (224, s.34). Yanvarın 15-də isə milli silahlı qüvvələrlə Şahsevən süvariləri Astara sovetinin 60 nəfərlik milis dəstəsini tərksilah edib əmlakını müsadirə etdi (224, s.35).

Rus qoşun hissələrinin çoxu isə silahı təhvil vermək istəmir, tərxis olunmalarına baxmayaraq əllərində olan silahla Rusiyaya qayıtmaq istəyirdilər. Yüklənib yola düşdükləri dəmir yolu eşelonlarında hətta ağır silahları belə özləri ilə aparırdılar. Gürcüstan və Azərbaycandan keçib şimala gedən hərbi eşelonların tərkibinin bə'zisi bolşeviklərin, əsgərlərin bir çoxu isə rus qoşunlarında olan çoxsaylı erməni döyüşçülərinin tə'siri ilə silahlarını Bakıda bolşeviklərə, ya da daşnak qüvvələrinə təhvil verirdilər. Daşnak millətçiləri əllərində olan pulla da rus hərbi eşelonlarından xeyli silah almışdılar. Beləliklə, cəbhədən qayıdan eşelonlar hesabına Azərbaycan milli hərəkatını qan içində boğmaq istəyənlər lazımınca silahlanırdılar. O biri tərəfdən isə cəbhədən geri qayıdan və görəcəyi işlər üçün heç bir məs'uliyyət daşımayacağını güman edən rus əsgərləri yol boyu yerləşən kəndləri talayır, əhalinin var-yoxunu silah gücünə əllərindən alırdılar. Bu talanlar zamanı xeyli müsəlman kəndi ziyan görmüşdü (310, s.39). Hərbi eşelonların silahla yerli hakimiyyət orqanlarının tələblərinə məhəl qoymadan çıxıb getməsi milli qoşun hissələrini, o cümlədən müsəlman qoşun hissələrini də maddi texniki bazadan məhrum edirdi. Ona görə Zaqafqaziya Komissarlığının və milli şuraların rəhbərləri Qafqazdan gedən hərbi eşelonların silahlarının təhvil verilməsindən ötrü qəti tədbirlərin həyata keçirilməsini lazım bildi. Çoxsaylı silahlı adamların hərəkət etdiyi eşelonların tərksilah edilməsinin xeyli təhlükəli olduğu üçün xüsusi hazırlıq işlərinin aparılmasına ciddi diqqət yetirilirdi. Bunun üçün ayrıca silahlı dəstələr hazırlanır, silahların harada qarşılanması dəqiqləşdirilirdi.

Hərbi eşelonların taleyinə bolşeviklər də biganə deyildilər və onlar çalışırdılar ki, Bakıya gəlib çatana qədər bu eşelonlara xətər yetirilməsin. Bununla bir tərəfdən onlar milli qüvvələrin silahlanmasına və güclənməsinə qarşı mübarizə aparır, o biri tərəfdən də eşelonlarda olan silahların bolşevik qüvvələrinin və milli hərəkata barışmaz mövqe tutan elementlərin əlinə düşməsinə cəhd göstərirdilər. Ona görə Qafqaz Ordusu Hərbi İnqilab Komitəsi xüsusi əmr də hazırlamışdı. Həmin əmrdə göstərilirdi ki,

hərbi eşelonlarda qoşun növlərinin və qisimlərinin qarışıq getməsinə riayət olunmalıdır. Nəticədə eşelonlarda həm atıcı silahların, həm topların və həm də digər silahların olması hücumlara qarşı müqavimət potensialını xeyli artırmış olardı. Eyni zamanda hərəkət zamanı və dayanacaqlarda eşelonların mühafizəsini gücləndirmək tələbləri irəli sürülürdü (34, v.40).

Rus hərbçilərinin ən böyük kütləvi tərksilah edilməsi hadisəsi 1918-ci il yanvar ayının birinci ongünlüyündə Şamxor stansiyası yaxınlağında baş verdi. Görünür hərbi eşelonlara milli qüvvələr tərəfindən əvvəllər ara-sıra tətbiq edilən güc tədbirləri qoşun hissələrinin xüsusi ehtiyatlılıqla hərəkət etməsinə səvq etmişdi. Bir neçə gün ərzində Şamxor ətrafında 10-dan artıq hərbi eşelon toplanmışdı ki, onlar da qatarların birgə mühafizəsi üçün daha səmərəli vasitələrə əl ata bilərdilər.

Bir-birinin ardınca hərəkət edən yaxşı silahlanmış hərbi eşelonların qarşısını saxlamaq, onların tərksilah olunmasını məcbur etmək çox böyük risq tələb edirdi. Ancaq formalaşmaqda olan hissələri təchiz etmək üçün başqa çıxış yolu da yox idi. Əslində əl atılan vasitə xalqın fiziki mövcudluğunun qorunması, milli mənafelərin qan içərisində boğulmasına yol verilməməsi üçün məcburiyyət üzündən həyata keçirilən bir tədbir idi. Özü də Şamxor stansiyası yaxınlığında hərbi eşelonların tərksilah edilməsi Zaqafqaziya Komissarlığının rəhbərliyi tərəfindən sanksiyalaşdırılsa da, elə gürcü menşeviklərinin tə'siri altında olan bu orqanın müsəlman qoşun hissələrinin formalaşmasına, təchizinə lazımi diqqət yetirməməsi milli qüvvələri də daha qətiyyətli hərəkət etmək məcburiyyəti qarşısında qoyurdu. Çünki gürcü menşevikləri, erməni daşnakları əllərində olan imkanlardan istifadə etməklə bərabər, həm də xarici havadarlarına arxalandıqları bir halda (194, s.220) müsəlman qoşun hissələri lazımi diqqət və köməkdən kənarda qalmışdılar. Şamxor stansiyası yaxınlığında hərbi eşelonların əsas təşkilatçılarından biri olan A.Səfikürdski bu məsələ ilə bağlı öz fikrini belə bildirirdi: "...Müsəlmanlar günahkar deyildirlər ki, komissarlıqla təmsil olunan hökumət öz borclarını yerinə yetirmədiyi bir halda zoraki yolla silah əldə etməyə məcburdurlar" (73, v.22).

Şamxor hadisələrinin başqa bir fəal iştirakçısı Haqverdiyev isə bildirirdi ki, hətta az miqdarda silah almaq üçün komissarlığın kandarını dabandan keçirsək də heç nə əldə edə bilmirdik (73, v.24).

Şamxor yaxınlığında hərbi eşelonların tərksilah edilməsinə razılıq verməklə Zaqafqaziya Komissarlığı çox güman ki, ona qarşı istiqamətlənmiş ittihamları bir qədər yumşaltmaq istəyirdi. Bu orqanın qərarı Millətlərarası Şura tərəfindən də bəyənilmiş və onun həyata keçirilməsi qoşunların qərargahında ətraflı müzakirə edilmişdi. Qafqaz cəbhəsi qoşunlarının komandirləri və qərərgahın rəhbərliyi iştirak etmişdi. Onların əldə etdiyi qərara görə hərbi eşelonların tərksilah edilməsi üçün aşağıdakı tərkibdə xüsusi bir dəstə yaradılmalı idi:



1) Gürcü milli korpusundan - 250 silah və 4 pulemyota malik olan könüllü bölmə və dağ - süvari taqımı.

2) Erməni milli korpusundan - 300 tüfəngə malik 2 piyada eskadron.

3) Müsəlman korpusundan - 300 qılınca malik 2 eskadron.

4) Rus korpusundan - 60 nəfər.

5) Hərbi daşımalar şö'bəsindən - zirehli qatar (292, s.72).

Hərbi müşavirə iştirakçıları hətta bu tərkibdə yaradılacaq qüvvənin hərbi eşelonların tərksilah edilməsi üçün kifayət olmadığını bildirsə də yanvarın 4-də Millətlərarası Şura təklif edirdi ki, yanvarın 5-i axşam və ya yanvarın 6-da səhər hərbi eşelonların tərksilah edilməsi üçün zirehli qatarla birlikdə aşağıdakı tərkibdə dəstə göndərilsin.

1) Ştab-rotmistr Abxazavanın rəhbərliyi altında 150 nəfər.

2) Rus korpusundan - 60 nəfər.

3) 50 nəfər müsəlman könüllüsü.

4) 50 nəfər erməni korpusundan (292, s.73).

Hərbi eşelonların tərksilah edilməsi üçün 300-dən bir qədər artıq silahlı dəstənin göndərilməsi qərara alınsa da, əslində daha az–100 nəfərlik bir dəstə və zirehli qatar göndərilmişdi (292, s.74).

Hərbi eşelonların tərksilah edilməsində Yelizavetpol Müsəlman Milli Komitəsinin fəalları da yaxından iştirak etmişdilər. Zaqafqaziya Komissarlığından alınan müvafiq teleqramdan sonra Müsəlman Milli Komitəsinin rəhbərliyi öz fəallarını toplayaraq Yelizavetpoldan Şamxor ətrafına göndərmişdi (296, s.57).

Müsəlman Milli Komitəsinin fəalları hərbi eşelonların dinc yolla tərksilah ediləcəyinə ümidlərini kəsməmişdilər. Danışıqların aparılması üçün müəyyən adamlar da seçilmişdi. Nəzərdə tutulmuşdu ki, hərbçilər öz silahlarını könüllü surətdə təhvil verəcəkləri təqdirdə onlar ərzaq və digər zəruri əşyalarla tə'min edilsinlər və yola salınsınlar (194, s.220).

Nəzərdə tutulan tədbirin həyata keçirilməsinə Yelizavetpol Müsəlman Milli Komitəsinin Rəfibəyovlar, A.Səfikürdski, X.Rüstəmbəyov tərəfindən rəhbərlik edilən fəallarından başqa Yelizavetpolda yerləşən və knyaz Maqalov tərəfindən komandirlik edilən Tatar süvari alayının silahlıları da cəlb edilmişdi (292, s.77).

Hadisələrin şahidlərinin mə'lumatına görə qarşı-qarşıya gələn qüvvələrin ilk üzləşməsi Yanvar ayının 6-da baş verdi. Həmin gün saat 11-də cəbhədən gələn bir eşelon Qarayazı stansiyasında dayandırıldı. Onlarla aparılan danışıqlardan sonra hərbçilər silahları təhvil verməyə razı oldular və silahla dolu olan vaqonu orada saxlayaraq yollarına davam etdilər (292, s.76).

Bə'zi mə'lumatlara görə dinc yolla tərksilah edilən ilk eşelonda gedən hərbçilər əslən Ukraynadan idilər. Silahlarını təhvil verdikdən sonra onla-

rın ərzaq və digər zoruri əşyalarla tə'min edilib yola salındılar (194, s.220).

Həmin gün Qarayazı stansiyasına başqa bir eşelon da gəlib çıxdı. Stansiyada eşelonu gözləyən qüvvələr tərksilahın dinc yolla davam edəcəyini güman edərək bu dəfə də danışıqlar apardılar və hərbçilərə silahı təhvil verməyi təklif etdilər. Eşelondakılar nəinki silahlarını verməkdən imtina etdilər, hətta əvvəlki eşelondan alınmış silahların da geri qaytarılmasını tələb etdilər. Hərbçilərin öz qərarlarında tə'kid etdiyini görəndə ştab-rotmistr Abxazava və knyaz Maqalov əvvəlki eşelondan alınmış silahlarla Müsəlman Milli Komitəsinin bir sıra üzvlərini silahlandırırdılar. Çünki onların qüvvəsi o qədər az idi ki, həmin qüvvə ilə yaxşı silahlanmış eşelonun qarşısını saxlamaq xeyli çətin idi. Eşelonların tərksilah edilməsinə erməni milli şurasından da qüvvə cəlb edilmişdi. Vəziyyət mürəkkəbləşəndə qərara alındı ki, hərbi eşelon Şamxora buraxılsın və orada danışıqlar davam etdirilsin. Eşelon irəli sürülən tələblə razılaşmayıb geri qayıdacağı təqdirdə Qarayazı stansiyasında dəmir yolu sökülməli və qatarın hərəkətinin qarşısı alınmalı idi (292, s.77).

Yanvarın 6-da göstərilən növbəti bir cəhd də nəticə vermədi. Eşelonla danışıq aparmağa gedən nümayəndə hey'əti rus hərbçiləri tərəfindən girov götürüldü. Eyni zamanda Abxazavadan tələb olundu ki, onun rəhbərliyi altında olan zirehli qatar tərksilah olunsun, bütün yollar açılsın və artıq çoxalmaqda olan hərbi eşelonların hərəkətinə imkan verilsin (292, v.78).

Yanvar ayının 7-də Tatar alayının komandiri Maqalov, ştab-rotmistr Abxazava və eşelon arasında danışıqlar davam etdirildi. Zaqafqaziya hökuməti də bir daha hərbi eşelonların tərksilah edilməsinin məqsədəuyğunluğunu bildirdi. Danışıqlar ayın 8-də, hətta 9-da da davam etdirildi. Bu vaxt artıq Akstafa ilə Dəllər stansiyaları arasında 10 hərbi eşelon cəmləşmişdi və onlar öz hərbi gücünə arxalanaraq yolların açılmasını və hərəkət üçün şərait yaradılmasını tələb edirdilər. Ancaq onlara qarşı dayanan qüvvələrin qətiyyətini gördükdə irəlidə olan eşelonlar özlərinin silahlarını təhvil verməyi qərara aldı (292, s.81). Hərbi eşelondan alınan topların birini A.Səfikürdski özü Yelizavetpola qədər müşayət etmişdi (296, s.57).

Sonrakı eşelonlar isə tərksilah olunmaqdan qəti imtina etdilər. Tatar alayının komandiri Maqalov bildirirdi ki, gündüz saat 2-də bütün eşelonların nümayəndələri Şamxor stansiyasına gəldilər və bizim qüvvələrimizi gördükdən sonra bir səslə razılaşdılar ki, öz yoldaşlarını silahı təhvil verməyə inandıracaqlar. Silahın təhvil verilməsi qaydası və şərtlərini öyrəndikdən sonra onlar geri qayıtdılar. Axşam saat 6-da isə xəbər göndərdilər ki, silahların təhvil verilməsi sabaha kimi tə'xirə salınmışdır (292, s.90).

Növbəti eşelonların da dinc yolla tərksilah ediləcəyinə bağlanan ümid özünü doğrultmadı. Eşelondakı hərbçilər qəti cavab vermələrini uzadaraq



güman edirdilər ki, arxadan yeni eşelonlar gələcək və onların köməyi ilə Şamxordan keçib gedəcəklər. Rus hərbçiləri qərara almışdılar ki, milli qüvvələrə qarşı silahlı müqavimət göstərilsin və onların əsas zərbə qüvvəsi olan zirehli qatar ələ keçirilib tərksilah edilsin (292, s.90).

Bu xəbər Zaqafqaziya komissarlığına çatanda N. Jordaniya eşelondakıların nümayəndələri ilə telefon əlaqəsi saxladı, onları planlaşdırdıqları təcavüzdən çəkindirməyə çalışdı. N.Jordaniya bildirirdi ki, rus hərbçilərinin danışıqlar üçün onların yanına göndərilmiş nümayəndələri girovdan xilas etməkdənsə dəmir yolunun qorunması üçün göndərilmiş zirehli qatarın tərksilah edilməsinə cəhd göstərilməsi faciəli nəticələrə gətirib çıxara bilər. Təklif olunurdu ki, girovlar azad edilsin və eşelonlar dinc şəkildə öz yollarına davam etsinlər. Belə olarsa zirehli qatar eşelonlara toxunmayaraq onları sağ-salamat buraxacaqdır. N.Jordaniya onu da əlavə edirdi ki, eşelonların sağ-salamat buraxılmasına zəmanət verilir və bu barədə zirehli qatarın rəhbərliyinə də müvafiq göstəriş veriləcəkdir (292, s.88-89).

Hərbi eşelonlar isə hər vəchlə zirehli qatarın tərksilah olunmasını tələb edir və bu qatarın yanından sağ-salamat keçib getməyin mümkün olmadığını bildirirdilər. Aparılan danışıqlar heç bir nəticə vermədi və bu ziddiyyət dərinləşərək silahlı konflikə gətirib çıxardı. İlk atəşin kim tərəfindən açıldığını söyləmək çətindir. Doğrudur, hadisədən dərhal sonra bolşevik mətbuatı bu barədə çox böyük səs-küy qaldırmış, silahlı toqquşma zamanı ortaya çıxan canlı itkilərin səbəbini milli qüvvələrin və Zaqafqaziya Komissarlığınının üstünə atmağa çalışmışdı (309, s.107-110). Ancaq N.Jordaniyanın hərbi eşelonların nümayəndələri ilə apardığı söhbətlərin məzmunu da göstərir ki, vəziyyətin kəskin xarakter almaması naminə rus hərbçilərinin sağ-salamat keçib getmələrinə imkan yaranmışdı. Rus hərbçiləri isə malik olduqları qüvvəyə arxalanaraq qarşı tərəfə öz iradələrini qəbul etdirməyə çalışmalarını da istisna etmək olmaz. Silahlı toqquşmada hər iki tərəfdən ölənlər və yaralananlar var idi. Zaqafqaziya Komissarlığınınm qüvvələri rus qoşunlarının atəş mövqelərini susdurmağa çalışdıqları halda, ruslar da əks tərəfi, hətta yaxınlıqdakı Azərbaycan kəndlərini ən müxtəlif silahlardan atəşə tutmuşdular. Döyüşün gedişində 3 hərbi eşelon, bir sərnişin qatarı və daha başqa bir qatar yandırılıb məhv edilmişdi. Zaqafqaziya Komisarlığına məxsus olan zirehli qatar da döyüşdə məhv edilmiş, Abxazava həlak olmuşdu (292,s.83).

İtkilərin daha da artmasına son qoymaq və vəziyyəti sabitləşdirmək üçün Zaqafqaziya Komiscarlığının üzvləri F.Xoyski, X.Xasməmmədov və X.Məlikaslanov azərbaycanlı əhaliyə müraciət etdilər (319, s.108). Bunun ardınca da Zaqafqaziya Komiscarlığınının xüsusi nümayəndə hey'əti hadisə yerinə gəldi. Nümayəndə hey'ətinə rəhbərlik edən Strelkovski Yelizavetpolda Tatar süvari alayının komandiri knyaz Maqalov, Rəfibəyovlar, Səfikürdski və başqa şəxslərlə görüşdü, konfliktin aradan qaldırılması

üçün onların fikrini öyrəndi. Səfikürdski və Haqverdiyev müsəlman qoşun hissələrinin təchiz edilməsi üçün hərbi eşelonların tərksilah edilməsinin zəruriliyini bir daha tə'kid etdilər. Danışıqlarda iştrak edən Rüstəmbəyov isə vəziyyətin qəlizləşməsinin qarşısını almaq naminə güzəştlı bir təklif irəli sürdü. Bu təklifə görə rus hərbçilərinin malik olduğu atıcı silahlarının yarısını özlərində saxlamasına razılıq bildirildi. Bir şərtlə ki, atıcı silahların ikinci yarısı, pulemyotlar və toplar milli qüvvələrə təhvil veriləydi (73, v.22-24). Hərbi təşkilatların nümayəndələri bununla razılaşmadılar və təhlükəsizliklərinə əmin olmadıqları üçün silahlarını təhvil verməyə qorxduqlarını bildirdilər. Danışıqlardan sonra belə bir təklif irəli sürüldü ki, hərbi eşelonlar bir səhra batareyasını atları və təchizatı ilə təhvil verə bilərlər. Yelizavetpol Müsəlman Milli Komitəsinin fəalları bu təklifə razı olmadılar. Onda Zaqafqazıya Komisarlığınının nümayəndəsi kapitan Strelkovski bildirdi ki, Müsəlman Milli Komitəsinin fəalları bu təkliflə razılaşarlarsa, onda o da öz tərəfindən Zaqafqaziya Komissarlığından bir dağ batareyasının müsəlman qoşun hissələrinə verilməsinə nail olacaqdır. Hərgah onun bu və'di yerinə yetirilməzsə o zaman Müsəlman Milli Komitəsinin fəalları gələcəkdə buradan keçən hərbi eşelonlarla istədikləri kimi rəftar edə bilərlər. Bu şərtlə irəli sürülən təklif barədə razılaşma Tatar süvari alayının komandiri Maqalov, A.Səfikürdski və komisarlığın nümayəndəsi kapitan Strelkovski tərəfindən imzalandı (73, v.23-27).

Hərbi eşelonların tərksilah edilməsində Tatar süvari alayı ilə bərabər polkovnik Süleyman bəy Əfəndiyevin komandirliyi altında olan 5-ci Yelizavetpol nişançı alayı da yaxından iştirak etmişdi (170, v.305). Bu alay da Müsəlman Korpusunun tərkibinə daxil idi.

Şamxor ətrafındakı tərksilah zamanı hərbi eşelonlardan 20 ədəd top, 70 ədəd pulemyot və 15000 tüfəng alındı (296, s.55).

Akstafa, Culfa və Xaçmaz ətrafında da hərbi eşelonların tərksilah olunmasına cəhdlər göstərilmişdi (282, s.223). Nəticədə bu yolla əldə edilən silahlar Müsəlman qoşun hissələrinin ehtiyacını qismən aradan qaldırsa da normal təchizat üçün hələ çox vəsait tələb olunurdu. Bu ehtiyac Müsəlman Korpusunun bütün mövcudiyyəti dövründə özünü göstərməkdə idi.

Müsəlman milli qoşun hissələrinin təşkilində qarşıya çıxan digər başlıca çətinliklərdən biri də kadr və səfərbərlik məsələsi idi. Xüsusən azərbaycanlı zabitlərin olmaması məsələni xeyli çətinləşdirirdi. Korpusun komandiri Ə.Şıxlinski bunu "çıxılmaz" bir vəziyyət kimi qiymətləndirirdi. "İş çox çətin idi. Deyə bilərəm ki, hətta çıxılmaz idi. Çünki Azərbaycan dilini bilən kifayət qədər zabit yox idi. Əsgərlər isə rus dilini əsla başa düşmürdülər.Bizim köhnə xidmət görmüş bir nəfər də olsun kiçik zabitimiz və əsgərimiz yox idi ki, yeni gələnlər bunları özlərinə nümünə götürsünlər" (322,s. 189). Ona görə də qoşun hissələrinin zabit kadrlarla



komplektləşdirilməsi üçün müxtəlif vasitələrə əl atılırdı. Milli qoşun hissələri üçün zabit kadrlarının ilk mənbəyi Qafqaz cəbhəsində xidmət edən azərbaycanlı və digər müsəlman zabitlər idilər. Bu zabitlər sayca elə də çox deyildilər. Ancaq korpusun komandanlığı bu kadrların sadiqliyini nəzərə alaraq onlardan səmərəli istifadə etməyə, komanda vəzifələrində yerləşdirməyə çalışırdı.

Mövcud olan mə'lumatlara görə Müsəlman Korpusunda türk zabitləri də xidmət edirdilər (29, v.74). Lakin onlar elə də çox deyildilər.

Müsəlman Korpusunun zabitlərinin böyük əksəriyyətini ruslar təşkil edirdilər. Onların sayı korpusun zabitlərinin ümumi sayının 65 %-nə çatırdı (292, s.142). Korpusda gürcü zabitləri olsa da təşkilati işlərin əsas hissəsi rus zabitlərinin üzərinə düşürdü. Korpusa rus zabitlərinin cəlb edilməsi həm könüllülük əsasında (297, s.4), həm də komanda üzrə aparılırdı. Qafqaz cəbhəsində ləğv edilən qoşun hissələrinin zabitləri istədikləri halda Qafqaz cəbhəsi qoşunları komandanlığının əmri ilə Müsəlman Korpusuna tə'yin edilirdilər. Müsəlman Korpusunda xidmət bütün zabitlər üçün əvvəlki xidmətin davamı sayılırdı və bundan irəli gələn bütün hüquqlar qorunurdu.

Zabitlərin xidməti çar Rusiyası dövründə qəbul edilmiş müvafiq sənədlər və qərarlar əsasında nizamlanırdı. Müsəlman Korpusu Zaqafqaziya Komissarlığına tabe olan Qafqaz cəbhəsi qoşunlarının tərkib hissəsi sayıldığı üçün onun zabitlərinin rütbələrinin artırılması da Zaqafqaziya Komissarlığı hökumətinin qərarı ilə həyata keçirilirdi (bax:178, v.32). Məsələn, podpolkovnik Qaytabaşı polkovnik rütbəsini Zaqafqaziya hökümətinin 246 saylı 18 mart 1918-ci il tarixli qərarı ilə almışdı. Zaqafqaziya hökumətinin qərarı ilə Müsəlman Korpusunun zabitləri arasında general rütbəsi alan da var idi. Bu korpusun qərargah rəisi Mençukov idi. Ona general rütbəsi 1918-ci il mart ayında verilmişdi (178, v.36). Müsəlman Korpusunun sıralarında bir neçə general xidmət etmişdir. General-leytenant Ə.Şıxlinski və general-mayor Mençukovdan başqa onların arasında general-mayor Talışinski (100, s.430) və general-mayor Ağausubov da (178, v.32) var idi.

Yaranmış vəziyyətdə rus ordusundan gələn zabitlər Müsəlman Korpusunun zabitlərlə komplektləşdirilməsinin əsas real bazası idi. Bununla belə, milli zabit kadrlarının hazırlanması sahəsində də müəyyən addımlar atılırdı. Bu məsələ həm müsəlman ictimai təşkilatlarının fəallarını, həm də korpusun komandanlığını ciddi narahat edirdi. Onun qismən həll edilməsi üçün Bakıda Kadet məktəbində müsəlman ictimai təşkilatlarının təşəbbüsü ilə milli zabit kadrlarının hazırlanmasına başlanmışdı (291, s.121). Bə'zi müəlliflər Bakıda Müsəlman Milli Şurası tərəfindən hərbi məktəbin təşkil edildiyini yazsalar da (230, s. 331; 222, s.41) bu müstəqil bir hərbi məktəb ola bilməzdi. Çünki ictimai təşkilat hərbi xidməti təşkil edən bir

orqan deyildi və bu təşkilatın hər hansı bir hərbi rütbə vermək səlahiyyəti də yox idi. Bu məktəb Müsəlman Korpusunun tabeliyində də deyildi. Ona görə ki, Müsəlman Korpusunun komandanlığı Bakıda bütün hərbi tələblərə cavab verəcək əsl hərbi məktəbi açmağı planlaşdırırdı. Mə'lumatların qıtlığı üzündən qəti fikir söyləmək mümkün olmasa da çox güman ki, sonsuz ehtiyacı nəzərə alaraq Müsəlman Milli Şurası ictimai əsaslarla, müəyyən hərbçiləri cəlb etməklə Kadet məktəbinin nəzdində könüllülərin hərb işinə öyrədilməsinə başlanmışdı. Həmin kursun sonrakı taleyi barədə də mə'lumat yox dərəcəsindədir. Yəqin ki, Bakıdakı mart hadisələri bu kursun fəaliyyətinə son qoymuşdu.

Qeyd edildiyi kimi, zabit kadrlarının hazırlanması üçün Müsəlman Korpusunun komandanlığı tərəfindən də Bakıda Milli hərbiyyə məktəbinin açılmasına cəhd göstərilmişdi. Korpusun komandiri Ə.Şıxlinski və qərargah rəisi polkovnik Mençukov 1918-ci il fevral ayının 6-da Qafqaz cəbhəsi qoşunlarının Baş komandanına göndərdiyi raportda milli kiçik zabitlərin çatışmaması ilə əlaqədar olaraq Bakıda 1-ci müsəlman diviziyasının nəzdində Milli hərbiyə məktəbinin açılmasına razılıq verilməsini xahiş edirdilər (180, v.2). Raportda qaldırılan məsələnin mahiyyəti üzrə Qafqaz cəbhəsi qoşunlarının baş komandanlığın razılığı alınmışdı. Ancaq təşkilatı məsələlərin uzanması və bölgədə baş verən hərbi siyasi proseslər nəticəsində Milli hərbiyyə məktəbinin fəaliyyətə başlaması xeyli ləngiməli olmuşdu. Məktəbin əsasnaməsində göstərilirdi ki, onun açılmasında əsas məqsəd zabit kadrların komplektləşdirilməsi, bölüklərə (rotalara) nizami xidməti, bölüyün işini və onun hesabatını aparmağı yaxşı bilən zabitlərin verilməsi idi (180, v.3).

Məktəbdə 18 yaşından aşağı və 25 yaşından yuxarı olmayan müsəlmanlar, çatışmadıqda isə Zaqafqaziya rusları təhsil ala bilərdilər. Məktəbdə oxumaq istəyənlərin ilkin savadı dörd illik və ya ona bərabər tutulan təhsil səviyyəsində olmalı idi.

Qəbul seçmə yolu ilə aparılmalı idi. Bura fiziki cəhətdən sağlam olanlar və həkim komisiyasını keçənlər, eyni zamanda həbsdə olmayan və cinayətə cəlb edilməyənlər ərizə verə bilərdilər. Məktəbdə təhsil müddəti 3 ay idi. Kursun sonunda imtahanlardan qənaətbəxş qiymət alanlar o biri kursa saxlanıla bilərdi. Eyni zamanda məktəb rəisinin vəsatəti və korpus komandirinin razılığı ilə yaxşı oxuyanlar vaxtından əvvəl imtahan verib məktəbi bitirə bilərdilər. Məktəbdə oxuyanlar "yunker" adlandırılmalı idilər. Onu müvəffəqiyyətlə başa vuranlara yeni zabit geyimi, paqon və başqa zəruri əşyaları almaq üçün əlli rubl pul, səfər təchizatı qılınc, revolver, durbin və nizamnamələr verilməli idi (180, v.3).

Milli hərbiyyə məktəbi 100 nəfər yunker üçün nəzərdə tutulmuşdu və qərara alınmışdı ki, onun təşkilati işləri Tiflisdə aparılsın və sonra Bakıya köçürülsün (180, v.6,11). 1918-ci il mart ayının 1-də poruçik Nəsirbəyov



Milli hərbiyyə məktəbinin (rusca olan arxiv sənədlərində bu məktəb - Musalmanskaya şkola podpraporşikov adlanır - M.S.) rəisi tə'yin edildi və elə həmin gündə məktəbin dəftərxanası fəaliyyətə başladı (180, v.15-16). Çox güman ki, məktəbin rəisi və dəftərxanası məktəbin daimi hey'ətini, müəllimlərini, kurs rəhbərlərini topladıqdan və tədris hazırlığını görüb qurtardıqdan sonra Bakıya köçməli və burada dərslərə başlamalı idi. Ancaq Bakıda 1918-ci ilin mart hadisələrindən sonra Milli hərbiyyə məktəbinin orada fəaliyyət göstərməsi üçün heç bir şərait qalmadı və onda qərara alındı ki, bu məktəb Yelizavetpolda yerləşdirilsin. Korpus komandirinin əmrinə müvafiq olaraq məktəbin daimi tərkibi dəftərxanası ilə birlikdə 1918-ci il aprel ayının 2-də Yelizavetpola gəlib dəmir yolu məktəbinin binasında yerləşdi (180, v.27). Aprel ayının 9-da isə məktəb şəhərə köçdü və Yelizavetpol Sənət məktəbinin binasında qərar tutdu (105, s.28).

Müsəlman Korpusunun qərargah rəisinin aprel ayının ortalarında imzaladığı əmrdən aydın olur ki, məktəbdə artıq təhsil almaq istəyənlərin toplanmasına başlanmışdı. Həmin əmrdə qeyd olunurdu ki, Hərbiyyə məktəbi dərhal bağlansın, onun zabitləri artıq polkovnik Maqalovun dəstəsində olan poruçik Nəsirbəyovun sərəncamına göndərilsin. Qərargah rəisi əmr edirdi ki, tələbələr məktəbdən azad olunsunlar və onların nəzərinə çatdırılsın ki, məktəb Bakı əməliyyatından sonra açılacaqdır (180, v.33).

Mə'lum olduğu kimi, 1918-ci ilin aprelində Bakı Sovetinin qoşunlarına qarşı Hacıqabula Zaqafqaziya Komissarlığının qoşun dəstəsi göndərilmişdi. Bu dəstəyə polkovnik Maqalov komandanlıq edirdi. Hacıqabul ətrafında gözlənilən döyüşün bolşevizmlə mübarizədə, bütünlükdə Azərbaycanın milli mənafelərinin qorunmasında mühüm əhəmiyyəti nəzərə alınaraq Milli hərbiyyə məktəbinin zabit hey'əti də bu dəstəyə cəlb edilmişdi. Korpusun qərargah rəisinin məktəbin müvəqəti bağlanması barəsindəki əmrində bildirilirdi ki, təhsil alanlardan kimsə könüllü istərsə onlar bu dəstəyə sanitar kimi cəlb oluna bilərlər (180, v.33).

Bakıda 1918-ci ilin Mart hadisələrinin nəticələri artıq fəaliyyətə başlamış ilk Müsəlman milli hərbiyyə məktəbinin müvəqqəti bağlanmasına gətirib çıxardı. Onun fəaliyyətinin bərpa olunması üçün münasib şərait bir də bir aydan sonra, təxminən 1918-ci il may ayının ortalarında yarandı. Məktəbin rəisi Nəsirbəyov korpusun qərargah rəisinə ünvanladığı raportunda bildirirdi ki, may ayının 10-da dəftərxana yenidən işə düşüb və beş gündən sonra dərslərə başlamaq olar (180, v.49).

May ayının 12-də isə məktəbin rəisi yazırdı ki, məktəbdə dərslərin başlanması tə'xirə salınır. Buna səbəb mebelin, zəruri inventarın, qab-qacağın olmaması və onların tapılıb məktəbə verilməsi üçün Müsəlman Milli Komitəsinin hələ də öz və'dlərinə əməl etməməsidir (180, v.48).

Beləliklə, göstərilən səbəblər üzündən fəaliyyəti ləngidilən Milli hərbiyyə məktəbinin tədris işinə başlaması Azərbaycan öz müstəqilliyini e'lan edənə kimi baş tutmadı.

Zabit kadrlarının böyük qıtlığının olmasına baxmayaraq xidmətini davam etdirənlərin düzgün yerləşdirilməsinə, onların öz vəzifələrinə böyük məs'uliyyətlə yanaşılmasına xüsusi diqqət yetirilirdi. Çətin şəraitdə öhdəsinə düşən borcları sədaqətlə yerinə yetirənləri korpusun komandanlığı mükafatlandırır və həvəsləndirir, tapşırılan işə biganəlik və laqeyidlik nümayiş etdirənlərə qarşı isə tələbkarlıq azaldılmırdı. Korpus komandiri general-leytenant Şıxlinskinin əmrlərində xidməti vəzifəsinin öhdəsindən gələnlərə təşəkkür e'lan edilməsinə təkrar-təkrar rast gəlmək mümkündür (bax: 180, v.34). 1918-ci il mart ayının 5-də imzaladığı 49 saylı əmrində general Şıxlinski Lənkəranda yerləşən süvari divizionun komandanlığının və zabitlərinin yorulmaz fəaliyyətini böyük bir sevinclə qeyd edirdi. Həmin əmrdə deyilirdi: "*Qısa müddət ərzində divizion komandiri vəzifəsini icra edən* ştabs-rotmistr Məlikbəyov, kornet Əsədullayev və digər zabitlər tərəfindən formalaşdırılan Müsəlman süvari divizionu indiki dövrün çox çətin bir vaxtında mənim və digər rəhbər şəxslərin köməyi olmadan uzun zaman müstəqil fəaliyyət göstərməli olmuşdur. Buna baxmayaraq divizion təşkil olunmuş, tə'lim almış, intizamlanmış və artıq Lənkəran qəzasının dinc əhalisini talanedici hücumlardan və anarxiyadan qorumaq üçün uğurlu işlər görmüşdür. Millət və Vətən naminə göstərilən bu yorulmaz fəaliyyətə görə xidmət adından divizion komandiri vəzifəsinin icraçısı ştabs-rotmistr Məlikbəyova, divizionun təşkilinin təşəbbüskarı kornet Əsədullayev və divizonun bütün zabitlərinə səmimi təşəkkürümü bildirirəm. Əsgərlərə və muzdlulara səmimi sağ olumu çatdırıram. Əminəm ki, divizionun gələcəkdə də tərkibinə daxil olduğu alayın döyüş şöhrətini qoruyacaqdır" (178, v.12).

Korpusun təkibində general Talışinski, general Y.Mençukov, polkovnik S.Əfəndiyev, polkovnik Tlexas, polkovnik Qaytabaşı, polkovnik Əmənulla Mirzə Qacar, polkovnik Hacıbəyli kimi öz işı və fəaliyyəti ilə xidmətdə nümunə olacaq zabitlər qulluq edirdilər. Məhz belə zabitlərin ardıcıl təşkilatçılıq işi ilə Müsəlman Korpusu az da olsa müəyyən nəticələrə nail olmuş və müstəqil Azərbaycan Cümhuriyyətinin ordusunun formalaşması üçün özül rolunu oynamışdı.

Rus zabitləri arasında da vəzifə borcuna sədaqətlə yanaşanlar, öz əsgəri şərəfini vicdanlı xidməti ilə qoruyanlar da az deyildi. Onlardan hətta korpusun hissələri tərkibində 1918-ci il aprel ayında Hacıqabul ətrafında bolşevik qoşunlarına qarşı döyüşdə həlak olanlar da var idi (123, v.15).

1918-ci ilin aprelində Türkiyə ilə Zaqafqaziya Seyminin qoşunları arasında yenidən müharibə başlayanda Müsəlman Korpusunun hissələri Türkiyəyə qarşı döyüşə girməkdən imtina etmişdi. Onda Rus Milli Şurası



qərara almışdı ki, Müsəlman Korpusunda xidmət edən bütün rus zabitləri geri çağırılsın. Korpusun qərargah rəisi Yevgeni Mençukov rus zabitlərinin geri çağırılacağı təqdirdə Müsəlman Korpusuna çox ciddi itki yetiriləcəyini hiss etdiyindən Rus Milli Şurasının bu qərarına qarşı çox kəskin mövqe tutmuşdu. Mençukova görə Hacıqabul ətrafındakı döyüşlərdə həlak olmuş rus zabitlərinin xatirəsinə azərbaycanlılar tərəfindən çox böyük ehtiram göstərildiyi halda rus Milli Şurasının belə hərəkətə yol verməsi heç də düzgün deyildi. O yazırdı: "Müsəlman ordu korpusu Zaqafqaziyanın vahid ordusunun tərkib hissəsidir. Vicdanlı rus zabitləri heç vaxt heç bir partiyaya və ictimai təşkilata xidmət etməmişlər və ümid edirəm ki, xidmət etməyəcəklər də... Biz özümüzü Zaqafqaziya Respublikasının xidmətində hesab edirik və onun mənafeyini qoruyuruq " (292, v.142).

Bununla belə, korpusun tərkibində xidməti və xidmətə münasibəti tənqid doğuran zabitlər də yox deyildi. Korpus komandirinin 79 saylı 29 mart 1918-ci il tarixli əmrindən aydın olur ki, bir sıra zabitlər Müsəlman Korpusuna yalnız maaş almaq üçün gəliblərmiş və ona görə də xidməti vəziyyətlərində bir qədər dəyişiklik yaranan kimi tərxis olunmağı qərara almışdılar. General Şıxlinski belə zabitlərə müraciətlə bildirirdi ki, korpusun qərargahı tərəfindən e'timad göstərilmiş bu şəxslər tərxis olunmaları ilə görülən işlərə vura biləcəkləri zərbəni götür-qoy etməleri və öz qərarlarına yenidən qiymət verməleri yaxşı olardı (178, v.34).

Korpus rəhbərliyi xidmətin tələblərinə müəyyən laqeydlik göstərən, nizam və intizama riayət etməyən zabitlərin isə bütünlükdə xidmətdən qovulmasını lazım bilirdi. 2-ci süvari alayının tərkibinə verilmiş Müsəlman süvari divizionunun zabitlərinə 1918-ci il mart ayının əvvəllərində korpus komandiri səmimi təşəkkür e'lan etmişdisə təxminən 20 gün sonra, mart ayının 22-də imzaladığı 73 saylı əmrində bu diviziondakı bir sıra kiçik zabitlərin özlərini nalayiq aparmasından, divizion komandanlığının əmrlərini yerinə yetirməməsindən ciddi narahat olduğunu bildirirdi. Əmrin 5-ci paraqrafında deyilirdi: "Müsəlman süvari divizionu (hazırda 2-ci süvari alayının 2-ci divizionu) üzrə əmrlərdən anlayıram ki, kiçik zabitlərin bə'ziləri öz xidməti vəzifələrinə kifayət qədər diqqətlə yanaşmırlar. Son zamanlar bölüklərdə (sotnya) müşahidə olunan özbaşınalıq bunun nəticəsidir. Divizion komandiri vəzifəsinin icraçısı tərəfindən intizam cəzalarına qədər qəbul olunmuş tədbirlərə baxmayaraq zabitlər tərəfindən xidmətə laqeyd münasibət davam edir. 2-ci süvarı alayının komandirinə əmr edirəm ki, divizionun bə'zı zabitlərinin bu dözülməz hərəkətlərinə ciddi diqqət yetirsin. Unter-zabit kadrları olmayan gənc orduda qanun-qayda tə'min edilməsi tamamilə zabitlərin üzərinə düşür. Yaşadığımız çətin vaxtda isə onların işi ikiqat artmalıdır. İşi bacarmayan, xüsusilə işləmək istəməyənlər bizə lazım deyildir. İndiki zamanda qoşunlarda zabit işinin əhəmiyyətini və müqəddəsliyini başa düşməyən şəxslərlə qərargahları

doldurmaqdansa daha yaxşı olar ki, az saylı zabitlərə malik olaq. Xidmətlə maskalananlar korpusdan uzaqlaşdırılmaq üçün təqdim edilsinlər" (178, d.28).

Çətin dövrün xüsusiyyətləri, orduların dağıdılıb yaradılması, hökumətlərin bir-birini əvəz etməsi, qanunçuluqda boşluqlar yaranması əqidəcə möhkəm olmayan bir-sıra zabitlərə öz tə'sirini göstərirdi. Belə zabitlər xidməti vəzifələrin icrasına laqeyd yanaşdıqları kimi, qoşun əmlakının qorunmasına da laqeyd yanaşır və bu əmlakı mənimsəməyə çalışırdılar. General Şıxlinski xidmətin tələblərinə əməl etməyən bütün zabitləri boyunlarına düşən vəzifələrin lazımılığını başa düşmüyə, öz xidmətləri ilə əsgərlərə nümunə olmağa çağırırdı (178, v.26).

Ə.Şıxlinskiyə görə Müsəlman Korpusunda xidmət edən hər bir zabit mə'nən təmiz olmalı, qətiyyət nümayiş etdirməli, həmişə düzgün mövqe tutmalı və öz mövqeyini açıq-açığına ifadə etməkdən çəkinməməli idi. Bu baxımdan korpus komandiri öz əmrlərinin birində ona anonim məktub göndərən zabitlərə çox kəskin cavab vermiş, onları cəsarətsizlikdə günahlandırmışdı. General Şıxlinski tələb edirdi ki, hər bir zabit müşahidə etdikləri barədə öz fikrini aydın bildirməlidir və öz fikirlərini yuxarı komandanlığa anonim şəkildə çatdırmamalıdır (178, v.26).

Müsəlman Korpusu komandanlığının diqqət mərkəzində dayanan əsaslı məsələlərdən biri də qoşun hissələrinə çağırışın təşkil edilməsi idi. Təxminən bir əsr boyu məqsədyönlü şəkildə xidmətdən yadırğadılmış olan və ordu deyəndə təsəvvüründə rus və daşnak orduları canlanan xalq kütlələri heç bir vəchlə övladlarını çağırışa vermək istəmirdilər. Bu ümummilli psixozu sındırmaq, azərbaycanlı gənclərin xidmətə cəlb edilməsini qaydaya salmaq Müsəlman milli təşkilatları kimi Müsəlman Korpusunun komandanlığı qarşısında da dayanan çox ciddi vəzifələrdən biri idi. Korpus komandiri Ə.Şıxlinski sonralar yazdığı xatirələrində real vəziyyəti çox dürüst əks etdirmişdi: "Tiflis Milli Müsəlman Şurasının topladığı başıpozuqlar gələcək korpusun əsgərləri adlandırılmışdı. Hələ mən gəlməzdən əvvəl Tiflis Şurası gələcək korpus üçün qəsb etdiyi bə'zi ləvazimatın qorunmasını bunlara tapşırmışdı. Əsgər adlanan bu adamlar şeyləri dərhal qarət etmişdilər... Orduya çağırış üçün siyahı deyən şey yox idi. Kənd yerlərində yaşayan azərbaycanlıların çoxunun yaş kağızı yox idi, çünki köhnə hökumət *bununla qətiyyən maraqlanmamışdı.* Heç olmasa könüllü yığmağa kömək edə biləcək pristav və qəza rəislərinə heç kəs qulaq asmırdı. Hamı qoşun və kömək istəyir, lakin heç kəs öz oğul və qardaşını əsgərliyə vermirdi. "Könüllülər" xidmət etməkdən artıq qarətlə məşğul olurdular... Korpusa daxil olmaq üçün gənclər tüfəng, güllə, yorğan-döşək alar-almaz gecə bütün şeyləri yığışdırıb evlərinə qaçırdılar, onları tutub yerinə qaytaracaq qüvvə yox idi"(322, s.188-189).



Bu qeydlər də bir daha göstərir ki, çağırış və səfərbərlik işinin təşkili korpusun yaradılması üçün necə böyük bir problem idi. Xüsusilə dövlət və hakimiyyət strukturlarının kifayət qədər möhkəmlənmədiyi, Azərbaycanın ideoloji cəbhələrə bölündüyü bir vaxt bu məsələ daha da mürəkkəbləşirdi. Eyni zamanda çağırılan gənclərin şüurunda bir çevriliş etmək, onlarda xidmətə əməli münasibət yaratmaq elə kütləvi çağırışın təşkili qədər çətin və ağır idi. Ona görə də yaradılmaqda olan hissələrin çoxu sıravi hey'ətlə kifayət qədər tə'min edilməmişdi və əsgərlər arasında fərarilik çox yayılmışdı (297, s.4-5). Xidmətə çağırılan gənclərin öz vəzifəsinə yararsız münasibətinə və xalq malına möhtəkircəsinə yanaşdığına görə korpus komandirinin əmri ilə bə'zən bütöv bir hissənin şəxsi hey'əti buraxılır və o yenidən komplektləşdirilirdi. 55 saylı 10 mart 1918-ci il tarixli və korpus komandiri ilə qərargah rəisi tərəfindən imzalanan əmrdə deyilirdi: "Korpus üzrə 6 saylı 12 yanvar və 39 saylı 28 fevral tarixli əmrlərlə yanvar ayının 1-dən 350 nəfərlik gənc əsgər komandası müsəlman istehkam taboruna verilmişdir. Ümidləri doğrultmayan bu komanda hərbi qüvvə kimi tamamilə yararsızdır. Çünki o, əsasən Vətəninin və millətinin müdafiəçisi kimi üzrinə düşən rolu anlamayan adamlardan təşkil olunmuşdur.

Müsəlman istehkam taborunun komandirinin 3 mart tarixli raportundan göründüyü kimi, komandada mə'nəvi tənəzzül elə bir həddə çatıb ki, adamlar əmrləri yerinə yetirmir və xidməti əmlakın oğurlanması və satışı ilə məşğul olurdular. Taborun mühafizəsi altında olan 49-cu hərbi xəstəxananın at təchizatı satılır və məhv edilirdi. Nəhayət, növbə atlara da çatmışdı". Korpus komandiri əmr edirdi ki, taborun bütün əskərləri tə'cili *surətdə buraxılsın (178, v. 18).*

Korpusun rəhbərliyi taborun yenidən komplektləşdirilməsini tələb edirdi və yeni toplanan komandanın xidmətə daha məs'uliyyətlə yanaşacaqlarına ümid bağlayırdı.

Mövcud olan bu böyük çətinliyə baxmayaraq korpusun hissələrinin komplektləşdirilməsində müəyyən işlər də görülürdü. Korpusun strukturu da göstərirdi ki, bu qədər hissələrin hətta naqis komplektləşdirilməsi belə çağırış işində müəyyən nəticələrə nail olmadan mümkün deyildi.

Musəlman Korpusuna ancaq Zaqafqaziyada yaşayan müsəlmanlar əsgəri xidmətə çağırıla bilərdi (178, v. 11). Əgər zabit hey'ətinin komplektləşdirilməsində digər millət və məzhəblərdən olan zabitlərin korpusda xidmətinə icazə verilirdisə, sıravi hey'ət ancaq müsəlmanlardan olmalı idi. Onun da demək olar ki, əsasını azərbaycanlılar təşkil edən Müsəlman Korpusunun tərkibində digər müsəlman dövlətlərinin, vətəndaşlarının da xidməti məlumdur. Məsələn, Əfqanıstan vətəndaşlarından bir neçə nəfər xidmət üçün korpus rəhbərliyinə müraciət etmiş və onların müraciəti müsbət həll olunmuşdu (179, v.57).

Millətin və xalqın mənafeyi naminə hərbi xidməti qəbul edənlər və ona böyük məs'uliyyətlə yanaşanlar da az deyildi. Məsələn, Yeni Bəyazid qəzasının sakini Rəşid bəy Şəmşəddinov öz təşəbbüsü və gücü ilə silahlı süvarilərdən ibarət bir dəstə toplamış və sonra da korpusun komandanlığına müraciət edərək hamılıqla Müsəlman Korpusunun tərkibində xidmət etmək istədiklərini bildirmişdilər. Bu təklif korpusun komandanlığı tərəfindən böyük məmnuniyyətlə qarşılanmış və bu dəstə 1-ci müsəlman süvari alayının tərkibinə verilmişdi. Ştabs-rotmistr Xan Naxçıvanski bu dəstənin komandiri tə'yin edilmiş və ona göstəriş verilmişdi ki, dərhal dəstə ilə tə'lim və tərbiyəni təşkil etsin, süvarilərə kəşfiyyat, mühafizə xidmətinin, atla və piyada döyüş aparmağın öyrədilməsinə başlasın. Korpus komandirinin 51 saylı 6 mart 1918-ci il tarixli əmrində daha sonra deyilirdi: "Korpusun formalaşdırılması işində göstərdiyi xidmətlərə görə vətəndaş Rəşid bəy Şəmşəddinova ürəkdən təşəkkür edirəm və onun ştabs-rotmistr Xan Naxçıvanskiyə köməkçi tə'yin edirəm. Eyni zamanda Rəşid bəy Şəmşəddinova praporşik rütbəsi verilməsi və 1-ci Müsəlman alayının siyahısına salınması barədə vəsatət qaldırıram" (178, v.15).

Əgər Erməni Milli Korpusunun tərkibində üç nişançı diviziya var idisə (310, s.37), Müsəlman Korpusunun tərkibində iki nişançı diviziya var idi (178, v.7). Erməni korpusu ilə müqayisədə Müsəlman Korpusunda iki diviziyanın yaradılması çox güman ki, çağırış və kadr məsələləri ilə bağlı idi. Diviziyalar dörd alaydan ibarət idi. Bundan başqa Müsəlman Korpusunun tərkibinə 1-ci və 2-ci topçu briqadaları, xüsusi müsəlman süvari briqadası, müsəlman istehkam taboru, musəlman süvari batareyası, müsəlman mortir və park diviziyonu, ikinci müsəlman mortir parkı və s. birləşmə və hissələr daxil idi (bax: 178, v.7,8).




**Müsəlman Korpusunun strukturu (bax:178, v.7-8)**



Diviziyalara daxil olan nişançı alayların nömrələri ardıcıllıqla müəyyənləşdirilmişdi. 1-ci nişançı diviziyaya 1, 2, 3, 4-cü nişançı alayları, 2-ci diviziyaya isə 5, 6, 7 və 8-ci alaylar daxil idi. Xüsusi süvari briqadasına daxil olan süvari alayları da ardıcıllıqla 1, 2 və 3-cü alaylar adlandırılmışdı.

Göstərilən struktur Müsəlman Korpusunun əsasını təşkil edirdi. Əldə edilmiş arxiv sənədləri belə bir strukturun mövcudluğundan xəbər verir. Nəzərə alınmalıdır ki, Müsəlman Korpusu yarandığı gündən Azərbaycanın müstəqilliyi e'lan edilən günədək formalaşma prosesi keçirmiş və bu prosesdə onun strukturunda müəyyən dəyişikliklərin olması da mümkündür. Lakin onun göstərilən əsaslı sturktur bazası son günə kimi saxlanılmışdı. Bundan başqa korpusa daxil olan hissələrin bə'zilərinin adlarında da dəyişikliklər baş vermişdir. Məsələn, 1918-ci ilin əvvəlində Müsəlman ehtiyat alayı kimi tanınan hissə 1918-ci ilin martında 1-ci müsəlman nişançı alayı adlandırılmışdı (164, v.107).

Arxiv sənədlərində və bə'zi tarixi ədəbiyyatda mövcud olan mə'lumatlar əsasında Müsəlman Korpusunun hissə və birləşmələrinin bir çoxunun komandirlərini də dəqiqləşdirmək mümkündür. Onlar aşağıdakılardır: 1-ci müsəlman nişançı diviziyasının komandiri – general-mayor Xəlil bəy Talışinski (136, v.19), 2-ci müsəlman nişançı diviziyasının komandiri - general-mayor Ağausubov (178, v.32), 1-ci müsəlman nişançı alayının komandiri – Əmənulla Mirzə Qacar (178, v.21), 2-ci müsəlman nişançı alayının komandiri – podpolkovik Məmmədov (178, v.21), 5-ci müsəlman nişançı alayının komandiri – polkovnik Süleyman bəy Əfəndiyev (178, v.3), 7-ci müsəlman nişançı alayının komandiri - polkovnik Əliisgəndərov (178, v.22), xüsusi müsəlman süvari briqadasının qərargah rəisi – podpolkovnik Həbib bəy Səlimov (178, v.28), 1-ci müsəlman süvari alayının komandiri – podpolkovnik Hacıbəyli (178, v.16), 2-ci Tatar süvari alayının komandiri – polkovnik. Maqalov (296, s.58), 3-cü Ləzgi süvari alayının komandiri – polkovnik Xosrov Mirzə Qacar (270, s.41), 2-ci müsəlman nişançı-topçu briqadasının komandiri - polkovnik Tlexaş (179, v.56).

Mövcud olan arxiv sənədlərindən aydın olur ki, hissələrdə hərbi tə'lim-tərbiyənin aparılmasına ciddi diqqət yetirilmişdir. Xidmətə cəlb edilmiş gənclərə hərbi hazırlığın ilkin vərdişlərini aşılamaq üçün hissələrdə tə'lim bölmələri var idi (178, v.18). Topçu hissələri üçün bacarıqlı mütəxəssislərin hazırlanması üçün Müsəlman tə'lim batareyası təşkil edilmiş və polkovnik Məmməd Mirzə Qulu Qacar onun komandiri tə'yin edilmişdi (178, s.39).

Korpus komandanlığı hərbi xidmət rejimində müəyyən dəyişikliklər apararaq onu müsəlman həyatının müəyyən tərəfləri ilə uyğunlaşdırmağa çalışmışdı. Məsələn, qərara alınmışdı ki, Müsəlman Korpusunun şəxsi hey'əti üçün istirahət günü - həftənin cümə günüdür və həmin gün hərbi hissələrdə heç bir dərs keçirilməməli, şəxsi hey'ətə istirahət verilməlidir (178, v.11).

Rus ordusunda işlədilən nizamnamələrin yenidən işlənməsi və onun Müsəlman Korpusundakı xidmət və məişət şəraitinə uyğunlaşdırılması da qərara alınmış və bunun üçün xüsusi komissiya təşkil edilmişdi. Komissiyanın rəhbəri korpusun hərbi məhkəməsinin sədri polkovnik Prixodko idi. Bu komissiyaya tapşırılmışdı ki, qısa müddət ərzində nizamnamələrə dəyişiklik edilməsinə baxsın və öz qənaətini korpus komandanlığına təqdim etsin (178, v.8). General Ə.Şıxlinskinin bu məsələ ilə bağlı imzaladığı 46 saylı 4 mart 1918-ci il tarixli əmrində daha sonra deyilirdi: "Aşağıdakı nizamnamələrə xüsusi diqqət yetirilsin:

1) *Daxili Xidmət Nizamnaməsi* – müsəlmanların məişətinə komplektləşdirmə şəraitinə, onların öz xalqına, xidmət xüsusiyyətlərinə uyğunlaşdırılmalı, xüsusilə gələcək əsgərlərin yaşadığımız dövrün çətin vaxtında aparılacaq tərbiyəsinə diqqət yetirilməli.

2) Sıra Nizamnaməsi – yenidən işlənərkən mənim "əlavə göstərişlərim" əsas tutulmalı.

3) İntizam Nizamnaməsi – rəhbər şəxslərin möhkəm hakimiyyətinin bərqərar edilməsinə, qoşunlara gələn kimi tabe olanlar arasında yüksək nüfuza malik olmalı olan unter-zabitlərin avtoritetinin artırılmasına diqqət yetirilməli.

4) Alay məhkəmələri haqqında əsasnamə – dövrün tələbinə və yaradılan qoşunların məişətinə uyğun olaraq yenidən işlənməli.

5) Qarnizon Nizamnaməsi – xidmət şəraiti və dövrün tələbinə uyğun yenidən işlənməli"(178, v.11).

Tə'lim-tərbiyənin aparılması zamanı intizamın möhkəmləndirilməsi qarşıya başlıca vəzifə kimi qoyulmuşdu. Bu məsələ görülən bütün işlərin mərkəzində dayanırdı və korpus rəhbərliyinin əmr və göstərişlərinə vaxtaşırı bu məsələlərə toxunulurdu. General-leytenant Ə.Şıxlinski əmrlərinin birində əsgərlər tərəfindən spirtli içkilər qəbul edilməsini dözülməz hal kimi sayır, dini və bəşəri qanunlarla qadağan edilmiş bu bəlanın müsəlman əsgərlər arasında rəvac tapmasına barışmaz münasibətini ifadə edirdi (178, v.26).

Qoşunlarda xidməti əmlakın mənimsənilməsini və talan edilməsini də korpusun rəhbərliyi hərbi qulluqçularda lazımi intizamın aşılanmaması ilə əlaqələndirirdi. Bu məsələnin həllinə nail olmaq üçün zabitlərdən və komanda hey'ətindən tələb olunurdu ki, praktiki dərslərə daha çox yer verilsin, tapşırılan vəzifələrin icrası vaxtaşırı yoxlanılsın, sədaqətli və e'tibarlı əsgərlərin xidməti təbliğ olunsun (178, v.35)

Beləliklə görülən işlər, qarşıya qoyulan real planlar və onların həyata keçirilməsi üçün atılan addımlar Müsəlman Korpusunun formalaşmasında müsbət dəyişikliklər yaratmaqda idi. Bu isə xalqın mənafeyinə zidd olan qüvvələri, ifrat bolşevik və daşnak elementlərini heç də razı salmırdı. Həmin qüvvələrin Azərbaycanın milli hərəkatına qarşı istiqamətlənmiş təcavüzkar fəaliyyətinin əsas zərbəsi də məhz milli qoşun hissələri



əleyhinə yönəldilmişdi. Xalqın gözlənilən faciələrdən qorunması, Vətənin bütövlüyünün tə'min edilməsi üçün e'tibarlı qüvvə olan milli qoşun hissələrinin formalaşmasına yol verməmək üçün hər cürə vasitələrə əl atılırdı. Bolşevik mətbuatında milli qoşun hissələri ən eybəcər ifadələrlə təsvir edilir və müsəlmanlar bu hissələrə daxil olmamağa çağırılırdı (13, 10.01.1918).

1918-ci il yanvar ayının 5-də çağırılmış Müəssislər Məclisinin bolşeviklər tərəfindən qanunsuzcasına buraxılmasından sonra (235, s.84) Zaqafqaziyada, xüsusilə Azərbaycanda qarşıdurma daha da kəskinləşdi. Azərbaycanın milli qüvvələrinin müəyyən ümid bəslədikləri Müəssislər Məclisinin qovulmasını təbii bir hal kimi qəbul edən Zaqafqaziya bolşevikləri bu bölgədə hər hansı qanuni idarəçilik orqanının yaradılmasını da çox ciddi narahatçılıqla qarşılayırdılar. Heç bir qanuni dövlət orqanında özünə yer tapa bilməyən bolşeviklər yeganə çıxış yolunu hakimiyyəti sovetlərə verilməsində görür və bölgədə yeni hakimiyyət orqanı ola biləcək Zaqafqaziya seyminin çağırılmasına öz münasibətlərini belə bildirirdilər: "Rusiyada yaranan indiki vəziyyətdə Zaqafqaziya seyminin çağırılması Zaqafqaziyanın faktiki olaraq Rusiyadan ayrılması, xalqın arzu və iradəsinin əksinə olaraq müstəqil dövlətin yaradılması deməkdir" (2, s.258). Zaqafqaziya bolşeviklərinin lideri S.Şaumyana görə isə *Zaqafqaziyada müstəqillik meyllərinin güclənməsi onu uçuruma yuvarlayır və bu uçurumdan Zaqafqaziya* xalqlarını milli qüvvələrin fəaliyyətinə son qoya biləcək Xalq Komissarları Soveti xilas edə bilərdi (bax: 244, s.87).

1918-ci il fevral ayının 10-da Zaqafqaziyadan Müəssislər Məclisinə seçilmiş deputatlardan təşkil edilmiş Zaqafqaziya seyminin çağırılmasını və Zaqafqaziyada milli qoşun hissələrinin mövcudluğunu S.Şaumyan bölgədə bolşevik ideyalarının həyata keçməsinə qarşı real təhlükə sayır və Qafqazda Sovet hakimiyyəti uğrunda mübarizənin yeni bir mərhələsini başlandığını vurğulayırdı. Rusiya bolşevik hökumətinin Müəssislər Məclisinə qarşı qanunsuz zorakılıq tətbiq etməsindən sonra Zaqafqaziyada müstəqillik meyllərinin daha da güclənməsi və bu meyllərin təmsilçisi olan qüvvələrin daha geniş xalq kütlələri tərəfindən müdafiə olunması ifrat bolşevik və daşnak ünsürlərində də əks meyllərin, zorakılıq meyllərinin güclənməsinə rəvac verirdi. Bu hal özünü milli qoşun hissələrində xidmət edən zabit və əsgərlərin tə'qib edilməsində göstərirdi. Həmin tə'qiblər Bakıda xüsusilə dözülməz xarakter almışdı. Şəhərə gələn, gedən hər bir zabit izlənilir, müsəlman ictimai təşkilatlarının binaları, dəmir yol stansiyası, poçt-teleqraf ciddi nəzarət altında saxlanılırdı (136, v.19).

1918-ci il fevral ayının 24-də Bakıda 1-ci müsəlman atıcı alayının təşkil edilməsi üçün general-mayor X.Talışinskinin rəhbərliyi ilə 1-ci nişançı diviziyasının bura gəlmiş qərargah zabitləri dərhal elə vağzaldaca həbs edilmişdilər (136, v.19). Bu xəbər kütlələr arasında çox böyük narazıçılığa səbəb oldu. Bolşeviklərin nümayəndələri yazırdılar ki, onların qarşısı-

na çıxmış Yelizavetpol əhalisi də Bakıda müsəlman qərargahının həbs edilməsinin, öz bəylərini və ağalarını devirmək üçün müsəlmanlar arasında Şaumyanın çağırışlarının yayılmasının, habelə müsəlmanlara qarşı qoyulmasına cəhd göstərilməsinin səbəblərini öyrənməyə çalışır, bu məsələlərə öz narahatçılıqlarını ifadə edirdilər (267, s.21). Xalqın narazılıqlarının geniş miqyas aldığını görəndə bolşeviklər general-mayor X.Talışinski ilə gələn müsəlman zabitləri həbsdən azad etdilər. Bolşeviklərin nümayəndələri iddia edirdilər ki, onlar xalqın tələblərinə görə deyil, yalnız siyasi mülahizələrə görə azad olundular (299, s.27). Rus zabitləri isə əlavə olaraq bir müddət həbsdə saxlanıldılar. Bəhanə də bu idi ki, müsəlman qərargahının həbsindən bir gün əvvəl Bakıya gələn qatarların birində bir erməni zabitinin öldürülməsinin səbəbləri barədə təhqiqat işləri aparılırmış (136, v.19) Əslində isə bolşeviklər Müsəlman Korpusunda xidmət edən rus zabitlərini ya bezikdirmək, ya da onları öz tərəflərinə cəlb etmək istəyirdilər.

General X.Talışinskinin rəhbərliyi altında Bakıya gələn zabitlər qrupu Müsəlman Xeyriyyə Cəmiyyətinin qərar tutduğu "İsmailiyyə" binasında fəaliyyətə başladılar. Onlar bu binanın zirzəmisində patron sexi açmaq istəyirdilər. Lakin sonradan həmin sex Səadət məktəbinin zirzəmisində açıldı (27, v.2).

Milli qoşun hissələrinin sursata olan ehtiyacını qismən ödəyə biləcək həmin sex qeyri-leqal şəkildə açılmışdı və bütünlükdə Bakıda milli qoşun bölmələrinin tam açıq şəkildə formalaşdırılması üçün lazımi şərait mövcud deyildi. Doğrudur, Bakı ətrafında bə'zi qoşun bölmələrinin təşkilinə nail olunmuşdu (27, v.18). Ancaq bu çox çətin şəraitdə baş verirdi və "İsmailiyyə"də yerləşən müsəlman qərargahı üzvlərinin hər bir addımı davamdar olaraq izlənilirdi.

Fevral ayının 24-də Bakı vağzalında müsəlman qərargahı həbs edilərkən təsadüfən salamat qalmış zabit Konstantin Konaplyov xatırlayırdı ki, sonradan o çox çətinliklə bolşevik xəfiyyələrinin diqqətindən yayınaraq özünü "İsmailiyyə"yə, general Talışinskiyə yetirmiş və ondan Tiflisə qayıdaraq vəziyyət barədə korpus komandiri Ə.Şıxlinskiyə mə'lumat vermək barədə tapşırıq almışdı. Dağıstanlıların köməyi ilə gizli yolla şəhərdən çıxan Konaplyov Puta stansiyasında qatara minib Tiflisə gəlmiş və birbaşa Ə.Şıxlınskinin evinə yollanaraq general X.Talışinskinin mə'lumatlarını ona çatdırmışdı (136, v.19).

Aldığı mə'lumatdan və Bakıdakı ictimai-siyasi vəziyyətlə ətraflı tanış olduqdan sonra general Şıxlinski korpusun hissələrinin dislokasiyasında müəyyən dəyişikliklər etməyi qərara aldı. Onun 58 saylı 11 mart 1918-ci il tarixli əmrində deyilirdi:

"Korpusun hissələrinin formalaşması üçün Bakıda və Qars vilayətində müvəqqəti olaraq yaranmış əlverişsiz şəraitlə və korpusun qərargahının



Yelizavetpola köçürülməsinin nəzərdə tutulması ilə əlaqədar olaraq əmr edirəm ki:

1) 1-ci müsəlman nişançı diviziyasının qərargahı Şamaxı şəhərinə köçsün.

2) 1-ci müsəlman nişançı alayı Şamaxı rayonunda formalaşdırılsın.

3) 2-ci müsəlman nişançı alayı Quba şəhərinə köçsün.

4) 1-ci müsəlman nişançı-topçu briqadasının divizionu və rəhbərliyi Yelizavetpola köçsün.

5) 6-cı müsəlman nişançı alayı İrəvan quberniyasında təşkil edilsin. Bunun üçün alayın qərargahı Naxçıvan şəhərinə köçürülsün və Ordubadda təşkil edilmiş dəstəni alayın tərkibinə qəbul etsin.

6) 7-ci müsəlman nişançı alayı Nuxa şəhərinə köçsün. Qars vilayətində bu alay üçün yaradılan komanda isə qərargahı Abbastumanda qalan 8-ci müsəlman nişançı alayının tərkibinə verilsin.

7) 2-ci müsəlman nişançı-topçu briqadasının 2-ci divizionu Naxçıvanda yaradılsın.

8) Müsəlman süvari-topçu batareyası Lənkəranda yaradılsın.

9) 2-ci süvari alayının qərargahı Ağdama köçürülsün.

10) Müsəlman istehkam taboru Tiflisdə deyil Yelizavetpolda yaradılsın.

11) Müvəqqəti Milli hərbiyyə məktəbi Bakıda deyil Yelizavetpolda açılsın.

12) Korpusun digər hissələri əvvəlcə müəyyənləşdirilən yerlərdə təşkil edilsin (178, v.23).

Yeni dislokasiya şəraitində korpusun hissələri arasında qırılmaz rabitənin saxlanılması üçün Ə.Şıxlinski bu əmrdə poçt əlaqələrinin yenidən qurulması barəsində də göstəriş vermişdi. Həmin göstərişə əsasən iki mərkəzi poçt yaradılmalı idi. Korpusun qərargahının Yelizavetpola köçməsi ilə həmin poçtlardan biri orada, korpusun qərargahı nəzdində, o biri isə Tiflisdə, xüsusi süvari briqadasının qərargahı nəzdində tə'sis edilməli idi. Korpusun poçt xidməti də əsasən bu iki məntəqə tərəfindən tənzimlənməli idi.

**Mərkəzi poçt məntəqələri**




**Müsəlman Korpusunun poçt rabitəsinin sxemi**

Yelizavetpolda yerləşən Mərkəzi poçtdan məktublar Yevlaxa, Kürdəmirə və Tiflisə göndərilməli və onlardan qəbul edilməli idi. Tiflisdə yerləşən Mərkəzi poçtdan isə məktublar xüsusi süvari briqadası vasitəsilə

İrəvana, Qarayazıya göndərilməli və oradan qəbul edilməli idi. Kürdəmirdə yerləşən məhəlli məntəqə 1-ci müsəlman nişançı diviziyasının qərargahına, 1-ci və 2-ci nişançı alaylarına, Yevlaxda yerləşən məntəqə Nuxa məntəqəsinə və 2-ci süvari alayına, 3-cü atıcı alayına, süvari batareyasına, Nuxada yerləşən məntəqə 7-ci nişançı alaya və 3-cü Ləzgi süvari alayına, İrəvanda yerləşən məntəqə isə 6-cı piyada alayına, 2-ci nişançı-topçu briqadasının 2-ci divizionuna, 1-ci müsəlman süvari alayının 2-ci divizionuna xidmət etməli idi. Bunlardan əlavə müəyyənləşdirilmişdi ki, 4-cü nişançı alayı ilə mortir divizionu bir başa Yelizavetpoldakı mərkəzi məntəqə ilə əlaqə saxlamalıdır (178, v.24).

Bu əmrin icrası yönümündə 1918-ci il mart ayının sonlarına yaxın Müsəlman Korpusunun qərargahı Yelizavetpol şəhərinə köçürüldü (178, v.34).

Bakı bolşeviklərinin Azərbaycan milli hərəkatına, milli qoşun hissələrinə qarşı başlıca təzyiq istiqamətlərindən biri də çox böyük sür'ət və inadkarlıqla Qırmızı ordu hissələrinin yaradılması idi. Günü-gündən güclənməkdə olan milli hərəkatın müqavimətini yalnız yaxşı təchiz və təşkil edilmiş silahlı dəstələrlə almaq olardı. Qanuni vasitələrin bolşeviklərin xeyrinə olmadığı bir vaxtda isə silahlı dəstələr qarşıya qoyulan məqsədə çatmaq üçün daha böyük aktuallıq kəsb edirdi. Bakı Sovetinin liderlərindən biri A.Caparidze də öz çıxışlarının birində bildirirdi ki, bizim real gücümüz – Qırmızı ordumuz olmalıdır ki, onun köməyi ilə bizim Sovet hakimiyyətinin bütün düşmənlərinə qarşı mübarizə aparaq (206, s.222). Belə silahlı dəstələrin təşkilinə Bakı bolşevikləri 1917-ci ilin sonlarında başlasalar da fəhlə-kəndli Qırmızı ordusu yaradılması barədə Sovet hökumətinin 15 yanvar 1918-ci il tarixli dekretindən sonra Bakıda nizami silahlı dəstələr yaradılması sahəsindəki iş daha da genişləndi (281, s.344). Elə həmin günlərdə Qafqaz ordusu hərbi inqilab komitəsinin sədri Q.Korqanov Qafqaz zəhmətkeşlərinə müraciət edib onları Qırmızı ordu sıralarına daxil olmağa çağırdı. Belə bir çağırışla Q.Korqanov Qafqaz cəbhəsindən qayıdan əsgərlərə də müraciət etdi. Onun fikrincə Sovet hökuməti qorunmayacağı təqdirdə əsgərlər nə torpaq görəcəklər, nə də azadlıq (2, s.257).

Bakı bolşevikləri qarşılarına qoyduqları ilkin vəzifələrdən birini Azərbaycanın milli hərəkatının, onun milli qoşun hissələrinin məhv edilməsinin pərdələnməsi naminə Qırmızı ordunun beynəlmiləl dəstəsinin yaradılmasını e'lan etmişdilər (281, s.344). Lakin bu beynəlmiləl dəstələr əsasən ruslardan və ermənilərdən təşkil edilirdi və azərbaycanlıların həmin dəstələrin tərkibinə yazılmasına hər vasitə ilə manеçilik göstərilirdi (267, s.21). Dəstəyə əsasən eserlərin və daşnakların tə'siri altında olan rusdilli əhali qəbul edilirdi. Həmin vaxtda Zaqafqaziya Komissarlığının 29 yanvar tarixli dekretinə əsasən Rus Milli Şurası isə rus milli korpusu üçün çağırış aparırdı



və bunun üçün Bakı şəhərində Rus Milli Şurasının toplanış məntəqəsi fəaliyyət göstərirdi (38, v.1). Nəzərə alınsa ki, bölgədə baş verən proseslərə loyal münasibət bəsləyən ruslar milli rus korpusuna yazılırdılar, onda şübhə etmək olmaz ki, Qırmızı orduya yazılan ruslar və rusdillilər ifrat mövqe ilə seçilən bolşevik-daşnak cütlüyünün cığırdaşı idilər. Qırmızı orduya və onun beynəlmiləl dəstəsinə çağırış işləri ilə Avakyanın məşğul olması da (266, s.53) bura cəlb edilmiş şəxslərin mə'nəvi keyfiyyətlərindən xəbər verirdi. Qırmızı qvardiyanın mərkəzi qərargahına da erməni A.Baqdasarov rəhbərlik edirdi (202, s.99). Azərbaycanın milli hərəkatının məhv edilməsində maraqlı olan belə şəxslərin rəhbərliyi altında görülən işlər nəticəsində 1918-ci ilin əvvəlində Qırmızı qvardiyanın sayı 3500 nəfərə çatmışdı (249, s.95).

Bakı rayonlarında Qırmızı qvardiya dəstələri yerli Sovetlərin ixtiyarında olub Mərkəzi Qərargaha tabe idi. Həmin dəstələr Mərkəzi Qərargahın qərarı ilə bu və ya digər məntəqəyə göndərilə bilərdilər (202, s.100). Dəstələrdə zabit kadrlarına olan ehtiyacın aradan qaldırılması üçün xüsusi zabit məktəbi yaradılmış və onun işinə rəhbərlik hərbi inqilab komitəsinin üzvü, praporşik Solntsevə tapşırılmışdı (320, s.13). Bu məktəbə Qırmızı qvardiya üzvlərinin ən e'tibarlıları cəlb olunaraq onların gələcək komandirlər kimi hazırlanması planlaşdırılırdı. 1917-ci ilin sonlarında Türkiyə cəbhəsindən tərxis olunub geri qayıdan əsgərlər Bakı Sovetinə bir zirehli qatar vermişdilər. Həmin zirehli qatar da Qırmızı qvardiyaya verilmiş və hey'əti rus əsgərlərindən komplektləşdirilmişdi (321, s.121). Qırmızı qvardiyanın təchiz və tə'min edilməsində Petroqrad hökumətinin köməyi də bolşeviklər üçün az əhəmiyyətə malik deyildi. RSFSR Xalq Komissarları Sovetinin qərarı ilə 1918-ci ilin fevral ayında Bakı Sovetinin sərəncamına 30 milyon 800 min rubl göndərilmişdi (321, s.95) və heç şübhəsiz ki, bu vəsaitin böyük bir hissəsi silahlı dəstələrin təşkilinə istiqamətləndirilmişdi. Bütün bu sə'ylərin nəticəsi idi ki, az müddət içərisində bolşevik-daşnak təəssübkeşlərindən ibarət "Qırmızı sosialist alayı", süvari bölüyü, yüngül batareya və digər bölmələr yaradıldı (281, s.345) Fevral ayında Bakı Soveti şəhərin Azadlıq meydanında bu silahlı dəstələrin paradını keçirib əhaliyə öz gücünü nümayiş etdirdi. Fevral ayının 24-də isə yenə həmin meydanda sərhəd alayının min nəfərədək döyüşçüsünün mitinqi təşkil olundu (244, s.225).

Azərbaycanın milli hərəkatı və milli qoşun bölmələri ilə mübarizənin arzu olunan nəticələrlə başa çatdırılması üçün Bakı Soveti Xəzər donanmasının da nəzarət altına alınmasına ciddi əhəmiyyət verirdi. Bu məsələ ilə bağlı Stalin də S.Şaumyana göndərdiyi teleqramda daha qətiyyətli hərəkət etməyə həvəsləndirir və həmin istiqamətdə Xalq Komissarları Sovetindən lazımi kömək çatdırılacağını bildirirdi (232, s.15)

Xəzər donanmasının nəzarət altına gətirilməsi məqsədilə hələ 1918-ci il yanvar ayının 21-də Bakı Soveti A.Caparidzenin sədrliyi altında donanma ilə qarşılıqlı münasibət məsələsinə baxdı (215. s.225), fevral ayının 23-də Bakı Sovetinin İcraiyyə Komitəsinin iclasında qərara alındı ki, donanma bolşeviklərin rəhbərliyi altına verilsin. Buna görə də donanmanın yenidən qurulması üçün xüsusi komissiya yaradıldı. Həmin komissiya şəxsi hey'əti əsasən ruslardan ibarət olan donanma içərisində geniş fəaliyyətə başladı. Aparılan təbliğat işləri ona gətirib çıxardı ki, hərbi dənizçilər özlərinin mart ayının 11-də keçirdikləri iclasında S.Şaumyanın mə'ruzəsini müzakirə edib bolşevik inqilabını qorumağa hazır olduqlarını bildirdilər (281, s.345). Bakı bolşeviklərinin lideri Xəzər donanmasının tezliklə nəzarət altına alınmasının vacibliyi barədə mart ayının əvvəllərində Moskvaya göndərdiyi məktubunda belə yazırdı: "Bizim üçün donanmanın tə'cili yenidən qurulması və gücləndirilməsi elə vacibdir ki,...gündə ona 5-6 saat vaxt sərf edirəm. Donanmasız biz bəlkə də davam gətirə bilməzdik" (16, N.4-51938, s.12).

S.Şaumyanın yazdığına görə 1918-ci ilin martında Bakıda təşkil edilmiş bolşevik qüvvələrinin sayı 6 min nəfər idi (2, s.348). Bu qüvvələrin ixtiyarında artıq iki ədəd zirehli qatar və bir ədəd zirehli avtomobil var idi. Zirehli qatarlarda 4 top və 8-9 ədəd pulemyot qoyulmuşdu (202, s.105). Həmin texnika bolşevik qüvvələrinin zərbə qüvvəsini xeyli artırmağa imkan verirdi. Nəticədə bolşeviklər 1918-ci ilin martında elə bir silahlı qüvvə yaratmışdırlar ki, həmin qüvvə ilə Bakıdakı Azərbaycan milli qüvvələrinə güclü zərbə vurub şəhərdəki idarəetmə orqanlarını ləğv edə və bütün hakimiyyəti öz əllərinə ala bilərdilər. Sovet Rusiyası ilə əlaqələri kəsilmiş olan Bakıda bolşeviklərin belə nəticələr əldə edə bilməsi V.Leninin də diqqətindən qaçmır və öz razılığını S.Şaumyana göndərdiyi teleqramda belə ifadə edirdi: "Əziz yoldaş Şaumyan! Sizin möhkəm və qəti siyasətiniz bizi çox sevindirir. Bacarıb həmin siyasəti indiki çox çətin vəziyyətin şübhəsiz tələb etdiyi çox ehtiyatlı bir diplomatiya ilə birləşdirin, onda biz qalib gələrik" (199, s.123).

Az sonra Şaumyanın rəhbərliyi altında Bakı bolşeviklərinin yeritdiyi siyasətin daha da möhkəmləndirilməsi üçün Moskvadan onların sərəncamına yeni hərbi kömək göndərilməsi qərara alındı. Bu qərara görə Moskva hərbi dairəsi Bakıya bir dəstə döyüşçü, 2 təyyarə, 2 zirehli avtomobil, 5 min tüfəng və s. göndərilməli idi (191, s.172).

Azərbaycan milli hərəkatına qarşı mübarizədə Bakı Sovetinə arxa və dayaq təkcə rusiya hökuməti deyildi. Onların Azərbaycanın milli qüvvələrinin məhv edilməsi üçün tə'sirli köməyinə ümid etdikləri real qüvvələrdən biri də Bakıda toplaşmış olan erməni-daşnak qüvvələri idi. Bir tərəfdən Bakıda və onun ətrafında olan ermənilərin səfərbər edilməsi, bir tərəfdən də cəbhədən tərxis olunan erməni əsgərlərinin cəlb olunması



nəticəsində 1918-ci ilin mart hadisələri ərəfəsində Bakıda xeyli erməni-daşnak qüvvəsi cəmləşmişdi. Yenə də elə S.Şaumyanın mə'lumatına görə onların sayı 3-4 min idi (2, s.348). Bu mə'lumat, qeyri-dəqiq də ola bilərdi. Erməni–daşnak qüvvələrinin qışda törətdikləri qırğın və faciələrin pərdələnməsi üçün S.Şaumyanın onların sayını xeyli azaltması şübhə doğura bilməz. Hər halda Bakıda planlaşdırılan qırğının arzu olunan nəticələrlə başa çatdırılması üçün belə qüvvələrin toplanması və təchiz edilməsi sahəsində fəal iş aparılırdı. Hadisələrin şahidi Suren Şaumyanın e'tiraflarından da aydın olur ki, Bakıda silahlı dəstələrin yaradılması sahəsində Erməni Milli Şurasının fəaliyyəti Müsəlman Milli Şurasının fəaliyyətini xeyli üstələyirdi. Türkiyə ilə Rusiya arasında müharibənin nizamlanmadığı bir vaxtda silahlı dəstələrin yaradılmasının türkpərəstlik kimi qiymətləndiriləcəyindən ehtiyat edən Müsəlman ictimai təşkilatlarının fəalları süstlük göstərdikləri halda, Erməni Milli Şurası bütün imkanları daxilində daşnak qüvvələrini yaratmaqda davam edirdilər (320, s.12). Rus ordusunda xidmət edən erməni əsgərlərindən istifadə edilməsinə çalışılması onların sə'ylərinin nəticələrini daha da artırırdı. Erməni Milli Şurası 1918-ci ilin martında cəbhədən qayıdan erməni əsgərlərinə müraciət göndərərək onları Bakıda erməni-daşnak qüvvələrinin sıralarında birləşməyə, silahını kimsəyə təhvil verməyərək özündə saxlamağa və yeri gələndə millətin mənafeyi naminə onu təcavüzkara qarşı işlədilməsinə hazır olmağa çağırırdı (266, s.54).

Doğrudur, sovet tarixşünaslığında erməni-daşnak qüvvələrinin Bakı qırğınının təşkilindəki rolunu danmağa, bolşeviklərə nisbətən onların "Müsavat"la bağlılığının daha sıx olmasına, hətta onların "Müsavat"la ilkin södələşmələri barədə mülahizələr yürütməyə çalışmışlar (320, s.13-14; 250, s.82). Ancaq gizli deyil ki, Bakı Sovetinin, onun yaratdığı qurumların erməni rəhbərləri ilə Erməni Milli Şurasının, daşnak fəallarının arasındakı yaxınlıq təkcə etnik bağlılıq deyildi. Qafqaz türkləriinin, Azərbaycan xalqının fiziki məhvinə çalışmaq, Bakıda ermənipərəst diktaturanın yaradılmasına nail olmaq bu qüvvələri cütlük şəklində birləşdirən strateji platforma idi. "Daşnaksütyun"un liderləri də gizlətmirdilər ki, erməni inqilabi "Daşnaksütyun" partiyası Bakıda Azərbaycanlıların hakimiyyətindən qorxaraq yerli bolşeviklərlə çox sıx əlaqəyə malik idilər və hətta onlara kömək edirdilər (248, s.20). Şübhəsiz ki, burada "yerli bolşeviklər" deyiləndə daha çox bolşevik pərdəsi ilə maskalanan Bakı Sovetinin erməni liderləri nəzərdə tutulurdu. Həmin qüvvələr birləşərək Bakını azərbaycanlılardan təmizləmək üçün ən ifrat vasitələrə əl atırdılar. Bu məqsədlə daşnak qüvvələrinin yaratmış olduğu silahlı dəstələr bolşeviklərin tam sərəncamına verilmişdi. Bunu S.Şaumyan özü də təsdiq edirdi (21, v. 6).

Azərbaycanın milli hərəkatı qüvvələrinə qarşı mübarizdə Bakı Sovetinin ən e'tibarlı dayağı Rusiya bolşevik hökuməti idi. Bu hökumətin

mövcudluğu üçün Bakı neftinin nə demək olduğunu bilən Rusiya bolşevik hökuməti liderləri Bakının sovetləşdirilməsi üçün bütün imkanlardan istifadə edirdilər. Lenin Bakıda fəaliyyət göstərən silahdaşlarına göndərdiyi tövsiyələrində belə yazırdı: "Bakı bizim üçün hər şeydir və onu müdafiə edib saxlamaq lazımdır" (bax:321, s.98). Mart hadisələri ərəfəsində Stalin S.Şaumyana göndərdiyi məktubunada da yazırdı ki, Bakını hərbi və maliyyə cəhətdən möhkəmlətmək lazımdır (bax:191, s.173). Bu şəxslərin bir-başa göstərişi ilə Bakı Soveti üçün silah, sursat, hərbi texnika və böyük maliyyə vəsaiti ayrılması isə bolşeviklər partiyasının Azərbaycanın milli qüvvələrinin məhvinə istiqamətlənmiş fəaliyyətinin əməli təcəssümü idi.

Azərbaycan milli qüvvələrinə güclü zərbə vurmaq, Bakıda şəriksiz hakimiyyətə nail olmaq üçün istər daşnak qüvvələri, istərsə də Bakı Soveti tərəfindən hazırlıq işləri xeyli əvvəldən başlamışdı. Mart hadisələrindən hələ 2-3 ay əvvəl Bakı erməniləri gizlətmirdilər ki, Rusiyada baş verənlər Bakıda da təkrarlanacaq və Bakıda tüğyan edəcək hadisələrin nəticələri Rusiyadakından da dəhşətli olacaqdır (50, v.17). Mart hadisələrindən təxminən 20 gün əvvəl isə daşnaklar artıq öz niyyətlərinin reallaşdırılmasına başlamışdılar. Belə ki, Ramanıda peyda olan erməni taborunun silahlıları adamları talan edir, onların var-yoxunu əllərindən alıb aparırdılar (51, v.6). Əhalini bu erməni soyğunçuluqlarından xilas etmək üçün isə heç bir tə'sirli tədbir həyata keçirilmirdi.

Bakı Sovetinin hazırlıq işləri də başlıca olaraq özünü silahlı qüvvələr yaratmaqda təcəssüm etdirirdi. Sovet hakimiyyətini e'lan etdiyi gündən Bakı Soveti şəhərdə şəriksiz hakimiyyətə nail olmağa çalışırdı. Ancaq qüvvələr nisbəti heç də onun xeyrinə deyildi. A.Mikoyan öz məqalələrinin birində bildirirdi ki, Bakıda milli şuraların olması,qanuni orqan olan şəhər bələdiyyəsinin mövcudluğu Bakı Sovetinə möhkəmlənmək imkanı vermirdi (12, 14.03.1923). Zorakı yolla hakimiyyətin ələ keçirilməsi, Bakının milli qüvvələrdən təmizlənməsi üçün zəruri olan silahlı dəstələrin formalaşdırılmasına isə müəyyən qədər vaxt lazım idi. Ona görə A.Caparidze bildirirdi ki, bizim bütün əvvəlki siyasətimiz vaxt qazanmağa yönəldilmişdi (206, s.225). S.Şaumyan isə fəxrlə bəyan edirdi ki, Qafqaz Ordusu hərbi inqilab komitəsi qazanılmış olan 2-3 aylıq vaxt ərzində yorulmaz bir fəaliyyət göstərdi və Bakıda real silihlı qüvvələr yaratdı (319, s.153).

Azərbaycanın milli qüvvələri ilə bərabər milli qoşun hissələrinə ağır zərbə vurması niyyəti 1918-ci il mart hadisələrinin törədilməsi səbəblərinin, həm də bu hadisənin başlanması üçün ortaya atılan bəhanənin mərkəzində dayanır. Bakıda şəriksiz hakimiyyətə malik olmaq üçün ilk növbədə burada milli hərəkatın dayağı olacaq milli qoşun hissələrinin formalaşıb möhkəmlənməsinə yol verməmək lazım idi. Ona görə də S.Şaumyan belə bir fikirlə heç cürə razılaşa bilmirdi ki, müsəlman millətçiləri



Bakını Azərbaycanın paytaxtına çevirməyi arzulayırlar (319, s.117). O, Bakıda milli qüvvələrin möhkəmlənəcəyi təqdirdə bu şəhərin və bütünlükdə Zaqafqaziyanın Rusiya üçün (eyni zamanda "Böyük Ermənistan" üçün) birdəfəlik itiriləcəyindən dəhşətə gəlirdi. Ona görə də S.Şaumyan Bakıda müsəlman qoşun hissələrinin hələ kifayət qədər möhkəmlənmədiyindən istifadə edərək qəti hərəkət etməyi lazım bilirdi. 1918-ci il mart ayının sonlarında Azərbaycanda və Bakı ətrafında yetişmiş olan obyektiv və subyektiv şərait də onları buna vadar edirdi.

Qeyd edildiyi kimi Müsəlman süvari divizionu Lənkəranda qanun-qaydanı bərqərar etmək üçün bolşevikləşmiş Lənkəran qarnizonunu tərksilah etmişdi. Bu işdə qarnizon rəisi polkovnik Baron Osten-Saken müsəlman qoşun hissəsinə yaxından kömək etmişdi (230, s.342). Müsəlman süvari divizionu Astaradan Bakıya yollanan bolşevik dəstəsini də tərksilah edərək (151, v.430) bölgədə bolşeviklərin nəzarətinə son qoymuşdu.

Mart ayının 14-də Müsəlman Korpusunun bölmələri Şamaxının bolşevikpərəst qarnizonunu tərksilah edərək silah və sursat anbarını ələ keçirmişdi (230, s.341).

Elə mart ayında da Dağıstan milli qüvvələri imam Nəcməddin Qotsinskinin rəhbərliyi altında Petrovsk (Mahaçqala) şəhərini bolşevik qüvvələrindən təmizləyərək burada milli hökumət qurmuşdular (267, s.22). Petrovsk şəhərindəki bolşevik qüvvələri tərksilah edilmişdilər.

Bundan başqa Zaqafqaziya Komissarlığından göndərilən zirehli qatar martın ortalarında Hacıqabul stansiyasına gəlmişdi. Bakı Sovetinin ixtiyarında olan zirehli qatar da bu istiqamətə hərəkət edərək milli qüvvələrin Bakıya doğru irəliləməsinə imkan vermək istəmirdi. Qarşı dayanan bu qüvvələr arasında bir neçə kiçik toqquşma da baş vermişdi (230, s.342).

Beləliklə, Bakı Soveti bir tərəfdən şimalla əlaqələrini itirmişdi, Rusiyadan kömək almaq imkanından məhrum olmuşdu. O biri tərəfdən isə taxıl bazası kimi baxılan Muğan da bolşevik qüvvələrindən təmizlənmişdi. Bu iki strateji dayaq olmadan Bakı Sovetinin mövcudluğunu düşünmək mümkün deyildi. Və nəhayət, milli qoşun hissələri Şamaxı və Hacıqabulda dayanaraq qərbə doğru uzanan yolları da Bakı Sovetinin üzərinə qapamışdı. Onların irəli hərəkət etməsi isə Bakının şəriksiz hakimiyyətinə can atan və buradan "öz tə'sirini və gücünü bütün Zaqafqaziyaya yaymaq " (2, s.317) istəyən S.Şaumyan və onun tərəfdarlarının mürtəce niyyətlərinə son qoya bilərdi. İfrat bolşevik və daşnak elementləri anlayırdılar ki, Bakını əllərində saxlamaq, onu bolşevikləşdirmək, erməniləşdirmək və azərbaycanlıların əlinə verməmək üçün yeganə şansları azərbaycanlılara "dərs" verməkdir. Onları iflas olmaqdan yalnız zorakılıq tədbirləri xilas edə bilərdi və mart ayının sonunda bu tədbirə əl atıldı. İdeoloji baxımdan Rusiya bolşevik hökuməti tərəfindən ilhamlandırılan Bakı ifrat bolşevik elementlərinin və onların əqidə cütlüyü olan daşnak qüv-

vələrinin Bakıda törətdikləri kütləvi qırğın əməlləri həqiqətdə onların siyasi ömrünü bir neçə ay da uzatdı. "Müsavat" partiyasının "Zaqafqaziyada ən güclü siyasi partiya"ya (319, s.166) və eyni zamanda bolşeviklərə qarşı ən gücülü siyasi rəqibə çevirildiyini böyük bir qorxu və nigarançılıq içində e'tiraf edən S.Şaumyan rəhbərlik etdiyi qırğınlardan sonra bir-neçə ay Bakının siyasi hakimiyyətini öz əllərində cəmləşdirə bildi.

Sovet tarixşünaslığında 1918-ci ilin mart ayının sonunda Bakıda tüğyan edən faciəli hadisələrin müsəlman milli qüvvələri tərəfindən planlaşdırıldığı və başlanıldığı barədə xeyli fikirlər mövcuddur (320, s.15; 255, s.25). Bu məsələnin mahiyyət e'tibarilə belə olmadığı artıq kimsədə şübhə doğurmur. Bakıda yetişmiş olan obyekitv və subyektiv şərait, eyni zamanda S.Şaumyanın söylədiyi e'tiraf bunu bir daha sübut edir. O bildirirdi ki, biz əlimizə düşən bəhanədən istifadə etdik və bütün cəbhə boyu hücuma başladıq (21, v.5). Bu məsələyə tam aydınlıq gətirilməsi üçün belə bir məqama da diqqət yetirmək lazımdır ki, doğrudandamı 1918-ci ilin mart ayının sonunda milli qüvvələr Bakını bolşevik və daşnak ünsürlərindən təmizləməyə hazır idi? Doğrudur, Azərbaycan milli qüvvələri Azərbaycanı Bakısız təsəvvür edə bilmirdilər. "Bakı türk milliyyətpərvərliyinin mərkəzi idi" (288, s.33). Onun yad qüvvələrdən təmizlənməsi, burada milli qüvvələrin təmsil olunduğu qanuni hakimiyyət orqanlarının yaradılması xalqın varlığından, milli mənafelərdən irəli gələn vəzifə idi. Həmin vəzifənin həyata keçirilməsi milli qüvvələrin qarşısında dayanan başlıca vəzifə idi. Lakin həmin vəzifənin reallaşdırılması mart ayının sonunda hələ mümkün deyildi. Çünki bunun üçün hələ kifayət qədər güc yox idi. S.Şaumyanın yuxarıdakı e'tiraflarının doğruluğuna inanmalı olsaq mart ayını sonlarında Bakıda 6 minlik bolşevik silahlı dəstələri, 4 minlik isə daşnak silahlı dəstələri mövcud idi. Bə'zi mənbələrdə Bakıdakı silahlı sovet qüvvələrinin hətta 7 mindən artıq olduğu göstərilir (186, s.44). Bura hələ Xəzər Hərbi donanmasının şəxsi hey'əti və onun güclü hərbi texnikası da əlavə olunmalıdır. Təkcə bolşevik və daşnak qüvvələrinin üzvləri neçə-neçə alayın şəxsi hey'əti qədər idi. Milli qüvvələr tərəfindən isə Bakıda 1-ci müsəlman nişançı alayının təşkilinə başlanmışdı. Bu işin sona çatdırılmasının xeyli çətin olduğu aydınlaşdıqda isə korpus komandirinin əmri ilə onun qərargahının Şamaxıya köçürülməsi qərara alınmışdı. Deməli, Bakıda hərbi qüvvələrin nisbətində bolşevik və daşnak cütlüyü ifrat üstünlüyə malik idi və belə bir vəziyyətdə milli qüvvələrin hər hansı bir güc tətbiqinə əl atacağına inanmaq heç cürə mümkün deyil. Məhz bu üstünlüyə əmin olduğundan Bakı fəhlə əsgər və matros deputatları soveti S.Şaumyanın mə'ruzəsinə qulaq asıb qərara gəlmişdi ki, Bakıdakı bütün milli hərbi hissələrin ləğv edilməsi və ya Bakıdan çıxarılması üçün bütün tədbirlər görülsün (37, v.6).



Qüvvələr nisbətində böyük üstünlüyə malik olan bolşevik-daşnak qüvvələri hücuma keçmək üçün vaxtında bir bəhanə yaratdılar və həmin bəhanədən məharətlə istifadə etdilər. Bu bəhanə "Evelina" gəmisində Lənkərana doğru hərəkət etmək istəyən milli qoşun bölmələrinin tərksilah edilməsi ilə bağlı idi (242, s.90). Heç şübhəsiz, "Evelina" gəmisi ilə bağlı olan hadisə ortaya çıxmasaydı bolşeviklər niyyətlərinə nail olmaq üçün başqa bir bəhanə axtarıb tapacaqdılar. Bununla belə, burada Müsəlman Korpusunun bölmələri ilə bağlı olan bir məqama diqqət yetirilməsi yaxşı olardı. Bu da ondan ibarətdir ki, "Evelina" gəmisinin tərksilah edilməsinə toxunarkən Müsəlman Korpusu bölmələrinin nə üçün bu gəmidə olması və onların hara getməsinin məqsədi ilə bağlı müxtəlif mülahizələr irəli sürürlər. Həmin məsələnin aydınlaşdırılması mart hadisələrinin başlanmasında milli qüvvələr üzərinə atılan ittihamların əsassızlığının anlaşılmasına kömək etmiş olardı.

Bə'zi mə'lumatlara görə Azərbaycanın milli qüvvələri Lənkəranda bolşeviklərə qarşı mübarizəni gücləndirmək üçün ora əlavə dəstələr göndərməyi qərara almışdılar. "Evelina" gəmisindəki silahlılar da bu dəstədən idi (242, s.90; 224, s.39; 235, s.105; 282, s.261). Bakı Soveti Lənkərandakı bolşevik qüvvələrinin əzilməsinə yol verməmək üçün Müsəlman Korpusunun "Evelina" gəmisinə yüklənmiş dəstəsini tərksilah etməyi qərara almışdı.

Bir mə'lumata görə isə H.Z.Tağıyevin oğlunun dəfn edilməsi bəhanəsi ilə Bakıda bolşevik hakimiyyətinə son qoymaq üçün Lənkərandan Müsəlman Korpusunun silahlı dəstəsi gəlmişdi (27, v.69). Bakı Soveti də bunun qarşısını alanda şəhərdə vətəndaş müharibəsi başlanmışdı.

Başqa bir mə'lumata görə isə "Dikaya diviziya"nın Lənkərandakı qoşun hissəsində xidmət edən H.Z.Tağıyevin oğlu Məhəmməd təsadüf nəticəsində ölmüşdü. Xidmət yoldaşları onu Bakıda dəfn edib geri qayıdanda Bakı Soveti onları tərksilah etməyə çalışmış və bu da mart hadisələrinin başlanmasına bir işarə olmuşdu (294, s.179). "Dikaya diviziya"nın Lənkəran qoşun hissəsi dedikdə müəllif heç şübhəsiz ki, Müsəlman süvari divizionunu nəzərdə tuturdu. Bakı qırğınının araşdırılmasına yer verilən bir tədqiqat əsərində də buna oxşar bir versiya üzərində dayanılır və Bakıya dəfnə gəlmiş silahlıların tərksilah edilməsi həmin vaxt yeganə müsəlman hərbi strukturu olan Lənkəran dəstəsinə vurulan ağır zərbə kimi qiymətləndirilir (bax: 266, s.54). Lakin baş verənlərin izlənilməsi və faktların tutuşdurulması bu söylənilənlərin həqiqəti tamamilə açıqlamamasını göstərir. Çünki nə Bakıda milli qoşun hissələri elə çox deyildi ki, Lənkərana əlavə kömək göndərilsin, ya Lənkəranda elə çox qüvvə yox idi ki, onun köməyi ilə Bakı bolşevik və daşnaklardan təmizlənsin. Özü də M.Tağıyevin dəfn mərasimində iştirak etmək üçün Bakıya Lənkərandan zabit Əsədullayev və cəmi 18 əsgər gəlmişdi (17.14.VI.1992. Bu ba-

xımdan H.Sultanovun söylədiyi versiya həqiqətə daha yaxındır. Onun yazdığına görə "Bakıda burjuaziya daim hakimiyyət ələ keçirməyə çalışırdı. O, əsgərlərə tə'lim keçməyə başladıqda bu daha aydın nəzərə çarpdı. Lakin qızıl qvardiyanın olması əsgərlərin tə'lim keçməsini çətinləşdirdi. Odur ki, onları uzaq rayona göndərmək qərara alındı. Bundan məqsəd həm onların sıralarını daha da artırmaq, həm də zəhmətkeş siniflə ən yaxın vaxtlarda başlıca mübarizə üçün möhkəm baza yaratmaq idi" (299, s.27). Müsəlman Korpusu komandirinin yuxarıda toxunulan əmrindən də aydın olur ki, Bakıdakı milli qoşun bölmələrinin yaranmış vəziyyətdə Bakıdan çıxarılması məqsədəuyğun bilinmişdi (bax:178, v.23). "Evelina" gəmisi ilə bağlı hadisənin şahidinin yazdıqlarına görə isə artıq bu işə başlanmışdı və həmin gəmidə Lənkəran süvari divizionun silahlı dəstəsinin hərəkəti ilə bərabər Bakıdakı müsəlman hərbi kursunun Lənkərana köçürülməsi nəzərdə tutulmuşdu (222, s.41). Bakı Soveti isə Bakıdakı qoşun hissələrinin şəhərdən çıxarılmasına nail olunması barəsində qərar qəbul etsə də (2, s.317) dinc şəkildə qoşun bölmələrinin Bakıdan uzaqlaşmasına yol vermədi. Çünki bolşeviklərin və onlarla silahdaş olan daşnakların məqsədi yaranmış bəhanədən istifadə edərək Azərbaycan milli qüvvələrinə, bütünlükdə azərbaycanlılara ağır bir zərbə vurmaq idi.

Beləliklə, mart ayının 29-da Bakıda vəziyyət xeyli dəyişdi. Axşam hava qaralandan sonra "Evelina" gəmisi 16-cı liman körpüsünə yan aldı. Gəmi lövbər salan kimi onun mühafizəsi təşkil edildi. Aşağıda 5 nəfər yunker postda dayanmışdı. Onlardan biri praporşik rütbəsində idi. Bundan xəbər tutan şəhərin Qırmızı qvardiya komendaturası gəminin yoxlanılması üçün silahlı qrup göndərdi. 4 nəfərlik bu qrup limana gələn kimi gəminin göyərtəsinə qalxmağa cəhd göstərdi. Postda dayanan yunkerlər icazəsiz gəmiyə qalxmaq istəyən silahlıların qarşısını kəsdilər. Səs-küyə gəmidən çıxan yasaul Qırmızı qvardiyaçıların sorğu-sualına cavab verərək bildirdi ki, o, müsəlman hərbi məktəbinin (hərbi kursunun -M.S.) komendantıdır və gəmi bu məktəbi Lənkərana köçürməlidir. Qvardiyaçılar bu məlumatı alan kimi qarnizon rəisi Avakyana xəbər çatdırdılar (222, s.41).

Gəminin kapitanı da verilən mə'lumatı təsdiqləyərək əlavə etdi ki, göyərtədə yüzdən artıq əsgər, yunker və zabit vardır. Onda "Evelina"nın hərəkətinin qarşısını almağa çalışan qvardiyaçıların sayı da artırıldı. Bu dəstə 90 nəfərə çatdırıldı. Bir qədərdən sonra Qabişevin və Koçarovun rəhbərliyi altında hərbi inqilab komitəsinin başqa bir dəstəsi limana gəldi. Onlar güc tətbiq edərək göyərtəyə qalxmağa sə'y göstərdilər. Göyərtədəki silahlılar qvardiyaçıların bu həyasızlığına qarşı lazımi cavab verdilər. Əvvəlcə gəmiyə qalxmaq istəyənlərin bir neçəsi suya atıldı. Qvardiyaçılar yenə əl çəkmədikdə onlara qarşı silah işlədildi. Atışmada qvardiyaçılardan 2 nəfər öldürüldü, 6 nəfər isə yaralandı (222, s.42).



Bundan sonra "Evelina" gəmisi limandan aralanıb hərəkətə başladı. Alınan xəbərdən bir-birinə dəyən Bakı Sovetinin liderləri, qarnizonun bolşevik rəhbərləri Müsəlman Korpusunun əsgər və zabitlərinin onlara tabe olmamasından qəzəbləndilər və bu hərbçilərə "dərs" vermək üçün tə'cili tədbirlər görməyə başladılar. Əvvəlcə "Göytəpə" keşikçi gəmisi "Evelina"nın ardınca göndərildi. Sonra "Evelina" gəmisinin geri qaytarılacağı təqdirdə onun göyərtəsindəkilərin sahilə çıxa bilməməsi üçün dənizkənarı bulvara silahlı dəstə göndərildi, başqa bir dəstəyə Parapet bağında yerləşərək 1-ci müsəlman nişançı diviziyasının qərargahı yerləşən "İsmailiyyə"ni nəzarət altına götürmək tapşırıldı. Başqa bir silahlı dəstə isə "Qafqaz və Merkuri" cəmiyyətinin limanında döyüşə hazır vəziyyətdə dayandı. Bununla da kifayətlənməyən bolşeviklər yaxşı silahlandırılmış 60 nəfərlik bir dəstəni Naberejni və Merkuri küçələrinin tininə göndərdilər. F.Solntsev və Q.Popovun rəhbərliyi altında olan başqa bir dəstə isə Petrov meydanında yerləşdirildi (222, s.43). Əmirovun partizan dəstəsi və digər Qırmızı qvardiya dəstələri də şəhərin müxtəlif nöqtələrində yerləşdirildilər (320, s.15).

Beləliklə, bolşeviklər təxminən 100 nəfərilik bir qüvvəni tərkisilah etmək üçün özlərinin bütün qüvvələrini səfərbər etdilər. Qırmızı qvardiya dəstələrinin fəaliyyətinə rəhbərlik əsasən erməni bolşeviklərə tapşırılmışdı. Onların arasında Avakyan, Əmirov, Martinyan, Əsriyans və başqaları var idi. "Evelina" gəmisinin qarşılanmasına hazırlıq görüldüyü bir vaxtda S.Şaumyan öz silahdaşı Əsriyansa və onun ətrafında toplaşanlara tapşırıq verdi ki, ciddi hazırlıq görüb işarəyə hazır olsunlar və onlar müsavatçıların qərargahına basqın edəcəklər (27, v.75). "Göytəpə" keşikçi gəmisinin hədələri ilə geri qaytarılan "Evelina" gəmisi 20-ci liman körpüsünə yan alan kimi qvardiyaçılar tərəfindən mühasirə olundu. Solntsev, Popov, Kvidçenko, Batmanov, Martikyan və başqaları Müsəlman Korpusunun əsgər və zabitlərindən tərksilah olunmağı tələb etdikdə gəmidəkilər "Müsavat" partiyasının rəhbərliyi ilə telefon əlaqəsinə girdilər və oradan tərksilah olmayaraq bütün dəstə ilə qərargaha gəlmək tapşırığı aldılar (222, s.43-44).

Təxminən gecə saat 1-də Müsəlman Korpusunun silahlı dəstəsi gəmidən düşərək İçərişəhərə doğru irəliləməyə başladı. Bu vaxt onlar üç tərəfdən qvardiyaçıların atəşləri ilə qarşılaşdılar. Müsəlman Korpusunun döyüşçüləri qvardiyaçıların müqavimətini qırmağın mümkün olmadığını gördükdə yenidən geri qayıdıb 20-ci liman körpüsündə daldalandılar. Qvardiyaçılar silah gücünə onları tərksilah etməyə çalışdılar. Atışma bütün gecəni davam etdi və yalnız səhər açılarkən müqavimət göstərməyin əbəs olduğu bilinəndə korpusun döyüşçüləri tərksilah olmağa razılıq verdilər (222, s.44).

Beləliklə, narahatçılıq içində yaşayan azərbaycanlı əhali tərəfindən Müsəlman Korpusun döyüşçülərinin əsasən ermənilər rəhbərlik edən qvardiyaçıların vasitəsilə zorla tərksilah edilməsi çox böyük qəzəblə qarşılandı. Mart ayının 30-da bütün gün ərzində azərbaycanlıların iştirakı ilə izdihamlı mitinqlər keçirildi və tərkibinin təxminən 90 faizi erməni olan Bakı Sovetinin İcraiyyə Komitəsi (266, s.61) tərəfindən azərbaycanlı əsgərlərin tərksilah olunması kəskin e'tiraza səbəb oldu.

"Eyni zamanda əsgərə qəsd edilməsini ordunun və xalqın şərəfinə qanlı təhqir" (Qarabəyov, 11, 16.07.1919) sayan Azərbaycan milli hərəkatının fəalları da iclas keçirib Bakı Sovetinin törətdiyi təxribata son qoyulmasını, Müsəlman Korpusunun döyüşçülərindən alınmış silahların geri qaytarılmasını tələb etdilər (299, s.27). Belə bir tələblə Bakı Sovetinin rəhbərlərinə də müraciət edildi və onlarla danışıqlar da apardılar. Mart ayının 30-da gündüz saat 2-də Nəriman Nərimanovun evində o özü, Şaumyan və M.Ə.Rəsulzadə görüşüb baş vermiş hadisə ilə bağlı danışıqlar apardılar. Həmin görüşün iştirakçısı olan H.Sultanov xatirələrində yazırdı ki, iki saatlıq danışıqlardan sonra "Hümmət" təşkilatı vasitəsilə həmin silahların geri qaytarılması qərara alındı. M.Ə.Rəsulzadə də buna razılıq verdi. Lakin iki saatdan sonra, axşam saat 6 radələrində Bazar küçəsində, Nikolayevski küçəsində, İçərişəhərdə və başqa yerlərdə atışma başlandı (299, s.28).

Bakıda 3 gün tüğyan edən qırğınların şahidlərindən birinin ifadəsinə görə həm müsəlmanlar, həm də daşnaklar silahların geri qaytarılması ilə bağlı danışqları diqqətlə izləyirdilər. Gərginliyin dinc yolla aradan qaldırıla bilmək ehtimalı ortaya çıxanda Şamaxı yolunda gizlənmiş ermənilər təxribata əl atdılar və bolşevik patrullarına güllə açdılar (266, s.62). Bu isə şəhərdə müsəlman əhalisinin qırılmasına başlamaq üçün bir işarə oldu. Elə həmin gecə S.Şaumyanın əmri ilə Əsriyansın silahlı dəstəsi müsavatçıların qərargahına basqın edib güclü atışmadan sonra oranı tutdu. Əsriyansın ifadəsinə görə, həmin qərargahda güllə və partladıcı maddələr hazırlanan xüsusi laboratoriya da var idi (27, v.75). Martın 30-da axşamdan xeyli keçmiş bütün şəhər qaynar qazana çevirildi Bakı Sovetinin silahlı dəstələri "İsmailiyyə"ni və İçərişəhəri mühasirəyə olaraq oradakı milli qoşun bölmələrini və müsavatçı silahlıları susdurmaqa çalışırdılar. Avakyanın təklifi ilə bir dəstə silahlı adam Dənizkənarı bulvar boyunca mövqelər tutub İçərişəhəri hədəf almışdı. Başqa bir çevik dəstə isə öz yerdəyişmələri ilə İçərişəhərdə mövqe tutmuş Azərbaycan qüvvələrinin diqqətini özünə cəlb etməklə "İsmailiyyə" və Qoşa Qala qapısı yaxınlığında vuruşan qvardiyaçıların işini yüngülləşdirməli idi (222, s.46). Burada isə "Metropol" mehmanxanasının (indiki Nizami adına ədəbiyyat muzeyinin - M.S.) damında və onunla Qoşa Qala qapıları arasındakı binanın damında qvardiyaçıların pulemyotları qurulmuşdu. Bu pulemyotlar "İsmailiyyə" binasını və İçərişəhərdə olan atəş mövqelərini hədəfə almışdılar (266, s.58).

Atəş bütün gecəni kəsilmədi və səhərisi, yə'ni martın 31-də xüsusilə geniş vüs'ət aldı. Bakıda milli qoşun bölmələri və silahlı dəstələr xeyli az olsa da faktların araşdırılması göstərir ki, günahsız azərbaycanlıların kütləvi surətdə qırğınının qarşısını almaq üçün onlar bolşevik-daşnak qüvvələrinə çox ciddi müqavimət göstərmişdilər. Məsələn, mart ayının 31-də milli qüvvələrin bir silahlı dəstəsi Yasamal istiqamətində qvardiyaçı dəstələrlə üzbəüz gəlmiş, onlarla döyüşə girməkdən çəkinməmişdi. Burada hətta qvardiyaçıların mühasirəyə alınması təhlükəsi yaranmışdı. Belə bir vaxtda Bakı Soveti ora zirehli avtomobillə bərabər əlavə dəstə göndərmiş və yalnız bu dəstə gələndən sonra milli qüvvələr geri çəkilmişdi (230, s.352).

Elə həmən gün milli qoşun bölməsi Suraxanıda olan qvardiyaçılar dəstəsini tərksilah etdi (286, s.147). Sonra isə həmin bölmə Əmircan və Bülbülədən keçib Sabunçu neft rayonuna doğru hərəkət etdi (202, s.107). Milli qoşunlardan olan başqa bir dəstə isə Bayıl-Bibiheybət istiqamətində gərgin döyüşlər aparırdı. Həmin bölmə hərbi-dəniz limanına xeyli yaxınlaşa bilmişdi (305, s.52). Lakin burada qvardiyaçıların müqavimətini qırmaq mümkün olmadı.

Döyüşlərin ən qaynar nöqtəsi Qoşa Qala qapısı və "İsmailiyyə" binaları ətrafında idi. Ətrafdakı binaların damlarında qoyulmuş pulemyotların aramsız atəşi altında milli qüvvələrin mövqelərinə hücum çəkən bolşevik dəstələrindən birinə A.Mikoyan özü rəhbərlik edirdi. Ancaq bu dəstələr də milli qüvvələrin atəş mövqelərini susdurmaqda hələlik aciz idilər (305, s.52). Belə olanda döyüşə yeni qüvvələr gətirildi. Fəhlə qırmızı qvardiyası, 1-ci Beynəlmiləl alayı, 36-cı Türküstan alayı Bakı Sovetinin əmri ilə döyüşə daxil edildi (186, s.47).

Bu qüvvələrin və Xəzər donanmasının şəxsi hey'ətinin döyüşə qoşulması ilə Bakı Soveti və daşnak cəbhəsi xeyli gücləndirildi. Donanmanın matros və zabitlərinin diqqətini şəhərdə baş verənlərin əsas mahiyyətindən yayındırmaq üçün onların arasında belə bir şayiə yayılmışdı ki, müsavatçı qüvvələr İçərişəhərdə rus əhalisini qırıb çatırlar. Həmin xəbəri eşidən matroslar bütün hərbi texnikalarını döyüş vəziyyətinə gətirdilər (266, s.58). Matroslardan 200 nəfərlik bir dəstə isə küçə döyüşlərində iştirak edirdi (202, s.107).

Bakıda döyüşlərə rəhbərlik etmək üçün hələ mart ayının 30-da bolşeviklər tərəfindən "Bakı şəhəri və onun rayonlarının inqilabi müdafiə komitəsi" yaradılmışdı. Bakının müdafiəsi üçün yaradılmış bu komitəyə bir nəfər də olsa azərbaycanlı daxil deyildi. Şəhərin ali hərbi-siyasi orqanı olan bu quruma rəhbərliyi yenə S.Şaumyan öz əlində cəmləşdirmişdi (13.11.04.1918)

Mart ayının 31-də İnqilabi Müdafiə Komitəsi iki dəfə bəyanatla çıxış etdi. Əgər birinci bəyanatda daha çox bu yeni orqanın məqsəd və vəzifələri, onun tərkibi barədə mə'lumat verilirdisə (2, s.327), ikinci bəyanatda bolşevik qüvvələrinin həyacanı duyulmaqda idi. Bakıda Sovet hakimiyyətinin təhlükədə olduğunu bildirərək əlində silah olanların hamısını "xalq düşmənlərinə" qarşı mübarizəyə (2, s.330) səsləməklə bolşeviklərin törətməkdə olduqları qırğınlardan pərdələnməyə çalışmalarını istisna etməklə milli qüvvələrin də onlara qarşı bütün gücü ilə mübarizə apardıqlarını nəzərdən qaçırmaq olmaz. Bolşeviklər piyada qüvvələrlə tezliklə qarşıya qoyulan məqsədə çatmağın mümkün olmadığını gördükdə Xəzər donanmasının güclü hərbi texnikasını işə saldılar. Ayın 31-də donanmaya məxsus olan hidrotəyyarə havaya qaldırıldı.

O, əvvəlcə buxta üzərində 2 dövrə vurub sonra milli qüvvələrin mövqelərinə tərəf uçdu. Hadisələrin şahidinin ifadəsinə görə bu təyyarə heç bir atəş açmadan geri qayıtdı (188, s.46).

Aprel ayının 1-də isə "Ərdəhan" gəmisinin toplarından şəhər atəşə tutuldu. Gəmilərin döyüşə qoşulmasının səbəbini İnqilabi Müdafiə Komitəsi belə əsaslandırırdı: "İnqilabi Müdafiə Komitəsi qarşısında belə sual dayanırdı – biz ya əlimizdə bomba hər bir ev uğrunda mübarizə aparmalı idik, ya da hərəkəti başqa vasitələrlə dayandırmalı idik. Səhər saat 10-da qərara alındı ki, qorxutmaq üçün toplardan bir neçə atəş açılsın (292, s.140). İnqilabı Müdafiə Komitəsinin gəmi texnikasından şəhərə atəş açılması barədə əmri gəmilərə matroslar Novak, Uvarov və Kuzminski çatdırdılar. Bu barədə göstərişi onlar İnqilabi Müdafiə Komitəsində A.Caparidzedən almışdılar (197, s.54). Atılan mərmilərin biri "İsmailiyyə" binasına, biri də İçərişəhərdəki çoxmərtəbəli yaşayış evlərindən birinə dəydi. Həmin evdə milli qüvvələrin atəş mövqeyi var idi (222, s.46). Ağır topların işə düşməsi gözlənilmədən başlayan döyüşlərin aparılması üçün lazımı hazırlıq görməyib əlaqəsiz şəkildə vuruşan milli qüvvələrin (286, s.145) müqavimətini tam qırdı. Saysız qırğınların qarşısının alınması üçün N.Nərimanovun təşəbbüsü ilə bolşeviklərlə milli qüvvələr arasında danışıqlar başlandı (286, s.147). Qarşıya qoyduqlarını əldə etdiklərinə əmin olan bolşeviklər milli qüvvələrə qarşı ultimatum irəli sürüb dərhal onun yerinə yetirilməsini tələb etdilər. İnqilabi Müdafiə Komitəsinin bu ultimatumunda aşağıdakı şərtlər var idi:

1. "Bakı fəhlə, əsgər və matros deputatları Sovetinin hakimiyyəti aşkar və danışıqsız olaraq qəbul edilsin və onun bütün sərəncamları yerinə yetirilsin.

2. Əksinqilabi "vəhşi diviziya" Bakı və onun rayonlarında saxlanıla bilməz. Digər müsəlman milli hissələri, habelə erməni milli qoşun hissələri ya Bakıdan çıxarılsın, ya da tamamilə fəhlə, əsgər və matros deputatları



Sovetinə tabe edilsin. Əhalinin bütün silahları fəhlə, əsgər və matros deputatları Sovetinin tam nəzarəti və qeydiyyatı altında olmalıdır.

3. Bakıdan Tiflisə və Bakıdan Petrovskə olan dəmir yolunun tə'cili açılmasını tələb edirik" (2, s.333).

Milli qüvvələrin bu ultimatumu qəbul etməkdən başqa bir çarəsi yox idi. Ancaq qərar heç də şəhərdəki qırğınları dayandırmamışdı. Erməni daşnak qüvvələri ən amansız şəkildə şəhərin müsəlman əhalisini qırıb çatmaqda davam edirdi. Erməni daşnakları kimsəyə rəhm etmir, qaçan qoca qadınları və uşaqları da güllələyirdilər (52, v.21). Onlar silahlı dəstələrlə məhəllə-məhəllə gəzib həm evləri, həm də idarələrin əşyalarını talan edir (52, v.10,13) qarşılarına çıxanları süngüdən keçirirdilər. Erməni cəlladları hətta bolşevik olan azərbaycanlılara da rəhm etmirdilər. Bildirirdilər ki, kimliyindən asılı olmayaraq, hansı əqidəyə və hansı partiyaya məxsus olmasına baxmayaraq müsəlman olan məhv edilməlidir (291, s.123). Onlar İrandan gəlmiş fars tacirlərini də müsəlman olduğu üçün öldürürdülər (50, v.5). Bir neçə gün ərzində şəhərin azərbaycanlı hissəsini viranəyə çevirib əhaliyə sonsuz divan tutan erməni daşnak dəstələrinə Stepan Lalayev, Xristafor Dildarov, Dövlətov, Ambarsum Melikov, və s. kimi insani keyfiyyətlərini itirmiş cəlladlar rəhbərlik edirdilər (51, v.2). Əllərinə düşmüş fürsətdən ifrat bolşevik və daşnak ünsürləri elə məharətlə istifadə etmişdilər ki, nail olduqları nəticələrə özləri də öz sevinclərini gizlədə bilmirdilər. S.Şaumyan fəxrlə bildirirdi ki, əldə olunmuş qələbə o qədər böyükdür ki, baş verənləri də kölgədə qoyur (bax: 266, s.52). Rusiya Xalq Komisarları Sovetinə göndərdiyi məktubunda isə Şaumyan erməni daşnak qüvvələrinin Bakıda sonsuz qırğın törətdiyinə öz münasibətini belə bildirirdi: "...Daşnakların da 3-4 min nəfərlik silahlı milli hissələri var idi ki, o da bizim sərəncamımızda idi. Məhz onların iştirakı *vətəndaş müharibəsinə milli qırğın xarakteri verdi*. Lakin onun qarşısını almaq mümkün olmadı. Biz bu işə şüurlu surətdə getdik." (2, s.348).

İfrat bolşevik və daşnak qüvvələrinin Bakıda azərbaycanlı əhaliyə qarşı törətdikləri kütləvi qırğın elə bir miqyas almışdı ki,bolşeviklərlə əlbir olub Azərbaycanın milli qüvvələrinə qarşı döyüşə atılmış 36-cı Türküstan alayının, Xəzər donanmasının, o cümlədən "Ərdəhan" və "Krasnovodsk" gəmisinin əsgər və zabitləri baş verənlərdən dəhşətə gəldilər və günahsız qırğınların dayandırılmasını tələb etdilər. Bakı Soveti İcraiyyə Komitəsinin sədri A.Caparidze də bu tələbə tərəfdar çıxdı.Hərbi gəmilərin şəxsi hey'əti bildirdi ki, şəhərdə azərbaycanlıların qırılmasına son qoyulmasa erməni məhəllələri toplardan atəşə tutulacaqdır (11, 30.03.1919). İnqilabi bolşevik şüarları ilə Bakı hadisələrini nə qədər pərdələməyə çalışsalar da həm S.Şaumyan (319, s.156), həm də digər bolşeviklər (13, *12.04.1918*) *şəhərdə müsəlman əhalisinin kütləvi* surətdə

qırılmağını e'tiraf etməyə məcbur olmuşdular. Ancaq bu e'tiraflar sözlərdən başqa bir şey deyildi. Sovet hakimiyyəti uğrunda mübarizə kimi qiymətləndirilən bu qırğınlar türk qoşunlarının Bakıya gəldiyi günə kimi davam etmişdi (50, v.24).

Hadisələrdən bir neçə gün sonra N.Nərimanov mətbuatda çıxış edərək baş verənlərin Sovet hakimiyyətini ləkələdiyini, onun üzərinə qara kölgə saldığını bildirir və S.Şamuyandan tə'cili tədbirlər görülməsini tələb edirdi (286, s.150).

Bütün bunların nəticəsində bir neçə gün ərzində Bakıda minlərlə azərbaycanlı öldürüldü. Onların dəqiq sayı barədə göstərilən rəqəmlər bir-birindən xeyli fərqlənir. Müxtəlif mənbə və tarixi ədəbiyyatda onların sayı - 7 min (1, s.107), 10 min (288, s.33), 10 mindən çox (194, s.231), 10 minlərlə (314, s.12), 14 min (257, s.92), 15 min (263, s.4; 8, 17.01.1991), 20 min (55, v.18), 30 min (266, s.66) göstərilir. Bir araşdırmada isə mart hadisələrini təhqiq edən istintaq komissiyasının materialları əsasən 11 min adamın öldürülməsi göstərilir (213, 22.05.1992). Müəllifin yazdığına görə, təkcə "Vulkan" cəmiyyətinin köhnə yanalma körpüsündə 6748 müsəlman meyidi qalaqlanmışdı. Bundan əlavə şəhər əhalisinin 400 milyon manatlıq daş-qaş əmlakı oğurlanmışdı, xeyli ictimai və şəxsi binalar dağıdılıb yandırılmışdı (213, 22.05.1992).

Mart qırğınından dərhal sonra Bakı və onun rayonlarının İnqilabi Müdafiə Komitəsi şəhər bələdiyyəsinin buraxıldığını e'lan etdi (66, v.121). Bununla da bolşeviklər Bakıda şəriksiz hakimiyyətə tam nail oldular. Bakıda baş verən hadisələr həm Azərbaycanın milli qüvvələri, həm də Zaqafqaziya hökumətinin gürcü nümayəndələri tərəfindən çox böyük həyəcan və narahatçılıqla qarşılandı. Bolşeviklərin kütləvi qırğın törətməklə hakimiyyəti ələ alması və yaranmış olan vəziyyətin sabitləşdirilməsi məsələsi 1918-ci il aprel ayının 2-də Zaqafqaziya seymində ciddi müzakirə edildi. Yollar naziri Məlikaslanovun Bakı şəhərində tüğyan edən hadisələr barədə verdiyi geniş mə'lumatdan sonra gürcü menşeviklərinin liderlərindən biri, Daxili İşlər naziri N.Ramişvili bildirirdi ki, Bakıda hakimiyyətin ələ keçirilməsi bütün Zaqafqaziyada hakimiyyətin ələ keçirilməsi üçün bolşevik planlarının həyata keçirilməsinin başlanğıcıdır (235, s.109). Ona görə də N.Ramişvili bolşevizmin Zaqafqaziyada genişlənməsinə yol verilməməsinə çağırırdı. İclasda çıxış edən "Müsəlman sosialist bloku"nun lideri A.Səfikürdskinin fikrincə Bakıda bolşeviklərin əl-qol aça bilmələrinin əsas səbəblərindən biri milli qoşun hissələrinin kifayət qədər silaha malik olmaması idi. O bunu Şamxorda hərbi eşelonların tərksilah edilməsində lazımi qətiyyətlilik göstərilməməsi və silah ehtiyatının artırılmaması ilə əlaqələndirirdi. A.Səfikürdski Zaqafqaziya hakimiyyətindən tələb edirdi ki, tə'cili surətdə özünümüdafiə və bolşevizmin ləğvi üçün ən qəti tədbirlər həyata keçirsin. Əks təqdirdə Səfikürdskiyə görə Müsəlman sosialist bloku özü bu müharibəyə qoşulacaq və bolşevik qüvvələrini məhv edəcəkdir (292, s.145).

M.Ə.Rəsulzadənin də Zaqafqaziya seymindəki çıxışı belə qətiyyəti ilə seçilirdi. Bolşeviklərin qanunsuz əməllərinə son qoyulması tələbləri onun da çıxışının əsas məzmununu təşkil edirdi. Məsələnin müzakirəsindən sonra seym Zaqafqaziya hökumətinə tapşırıq verdi ki, bolşevik çıxışlarının ləğv edilməsi barədə müvafiq tədbirlər həyata keçirsin. Həmin tapşırığın reallaşdırılması isə hökumət tərəfindən Hərbi Nazirliyə tapşırıldı. Bakının və onun ətrafının bolşeviklərdən təmizlənməsi üçün hərbi hissələr və xüsusi vəsaitlər ayrıldı (292, s.146).

Konkret olaraq Zaqafqaziya hökuməti Bakı bolşevikləri ilə mübarizə üçün 100 min rubl pul, piyada və süvari hissələri, iki təyyarə, zirehli qatar, çoxlu silah və sursat ayırmaq barədə göstəriş vermişdi. Bə'zi mə'lumatlara görə Azərbaycanın milli qüvvələri Şimali Qafqazın antibolşevik qüvvələrinin lideri ilə də danışıqlar apararaq öz hərəkətlərini nizamlamağa çalışmışdılar (235, s.109).

Dağıstanın milli qüvvələrinin lideri Qotsinski ilə aparılan danışıqlardan sonra razılaşdırılmış fəaliyyət planına görə üç istiqamətdən Bakı üzərinə hücum edilməsi nəzərdə tutulmuşdu. Şimaldan imam Qotsinskinin dəstəsi, Qərbdən isə Zaqafqaziya hökumətinin qüvvələri, Hacıqabul və Şamaxı istiqamətlərindən Müsəlmani Korpusunun bölmələri irəliləməli idi. Məsələn, mövcud olan mə'lumata görə, Hacıqabul ətrafındakı döyüşlərdə həm 7-ci Müsəlman nişançı alayının (160, v.27), həm də 8-ci Müsəlman nişançı alayının bölmələri (123, v.15) iştirak etmişdilər. Burada Müsəlman Korpusunun başqa bölmələri də iştirak edirdilər. Yeni açılmış olan Milli hərbiyyə məktəbinin bağlanaraq onun zabit hey'ətinin Hacıqabul cəbhəsinə göndərilməsi də (180, v.33) Müsəlman Korpusunun mövcud olan bütün imkanlarının səfərbər edilməsindən xəbər verir. Hacıqabula göndərilən dəstənin gürcü silahlı bölmələri də var idi və bu dəstəyə rəhbərlik knyaz Maqalova həvalə olunmuşdu. Sayı təxminən 2 min nəfərə çatan bu dəstənin keçirdiyi uğurlu döyüşdən sonra aprel ayının elə ilk günlərində Hacıqabul stansiyası tutuldu. Müsəlman Korpusunun komandiri general-leytenant Ə.Şıxlinski gürcü korpusu bölmələrinin bu döyüş zamanı göstərdiyi məharətləri öz əmrlərindən birində belə qiymətləndirirdi: "Bu döyüşdə gürcü korpusunun göstərdiyi böyük şücaəti dərin razılıq hissi ilə qarşılayıram. Qafqaz müsəlmanları, o cümlədən mənə həvalə olunan korpus bizim əzəli dostlarımız və bu günkü, döyüş dostlarımız olan qəhrəman gürcülərin qardaşlıq köməyini heç vaxt unutmayacaqdır" (292, s.146).

İsmayıl xan Ziyadxanovun rəhbərliyi altında olan 3 min nəfərlik başqa bir dəstə isə Şamaxı üzərinə hücuma keçdi. Əsasını Müsəlman Korpusunun süvariləri təşkil edən bu dəstə də uğurlu döyüş keçirib Şamaxı şəhərini tutdu (230, s.362). Həm Hacıqabulu, həm də Şamaxını tutan dəstələr burada

möhkəmləndikdən sonra Bakı üzərinə hücuma keçməli idilər. Həmin hücumun nəticəsi imam Qotsinskinin Şimaldan hərəkət edən dəstəsinin fəaliyyətindən çox asılı idi.

İmam Qotsinskidən hərbi kömək almaq üçün Azərbaycanın milli qüvvələrinin nümayəndələri Dağıstana gəlmişdilər. Temirxan Şurada azərbaycanlı nümayəndələrlə Dağıstanın milli qüvvələrinin görüşü keçirildi, Dağıstandan Azərbaycana kömək göndərilməsi məsələsi müzakirə olundu (309, s.276). Sonra bu məsələ Milli Komitənin vilayət icraiyyə komitəsinin geniş iclasında müzakirə olundu və Bakıya Azərbaycanın milli qüvvələrinin köməyinə hərbi qüvvə göndərilməsi qərara alındı (198, s.88). Həmin qərara görə Bakı üzərinə artilleriya və pulemyotlarla təchiz edilmiş iki alay və könüllü bölmələr göndərilməli idi. Bu barədə yerli qəzetlərdə də mə'lumatlar çap olunmuşdu. "Cəridatu Dağıstan" qəzeti həmin günlərdə öz nömrələrində bolşeviklərin Bakıda törətdikləri əməllər, Azərbaycan müsəlmanlarını kütləvi surətdə qırmaları barədə yazılar verərək dağıstanlıları məzhəb qardaşlarının köməyinə çağırırdı. Bakıda baş verənlərdən, bolşevik-daşnak elementlərinin günahsız azərbaycanlılara tutduqları divandan xəbərdar olandan sonra çoxları qardaş köməyinə hazır olduqlarını bildirdilər. Nəticədə imam Qotsinskinin dəstəsinə 1500 nəfərlik nizami hissələrdən başqa, 1000 nəfərlik könüllü toplandı (198, s.88-89).

İmam Qotsinskinin Bakı üzərinə göndərilən dəstəsinə polkovniklər D.Musaliyev və M.Cəfərov komandirlik edirdilər (198, s.88). Dəstənin qərargah rəisi isə rus generalı Lazarev idi (322, s.276). Bu dəstənin Bakıya doğru hərəkəti zamanı Qubada, Xaçmazda və Dəvəçidə mövcud olan milli qoşun hissələri və silahlılar ona qoşuldular (309, s.276). Aprelin 7-də bu dəstə artıq Xırdalanda döyüşqabağı mövqe tutmuşdu. Bakı ətrafında olarkən Müsəlman Korpusunun şəhərdən çıxmağa məcbur olmuş bə'zi bölmələri də imam Qotsinskinin dəstəsinə qoşuldu (239, s.91).

Üç istiqamətdə planlaşdırılan hücumların qarşısını almaq üçün Bakı bolşevikləri də ciddi hazırlıq görürdülər. Bakıda şəriksiz hakimiyyətin əldə edilməsindən ilhamlanan bolşevik fəalları mövcud olan bütün potensialı səfərbərliyə aldılar. Mart ayının sonları və aprel ayının əvvəlində Bakıda cəmləşmiş olan rus hərbçiləri Dağıstanın və Şimali Qafqazın antibolşevik qüvvələrin nəzarəti altında olduğunu görüb bütün silahlarını könüllü surətdə Bakı bolşeviklərinə təhvil verirdilər. Kifayət qədər silah və sursat əldə edən bolşeviklər bununla fəhlə dəstələrini silahlandırmaq imkanı qazandılar (320, s.16). Aprel ayının 2-də S.Şaumyan Saritsın Şurasına məktub göndərdi və oradan Bakıya tə'cili olaraq hidroaeroplan, döyüş aeroplanı və onlara zəruri olan təchizat əşyalarını göndərmələrini xahiş etdi. İmam Qotsinskinin dəstəsi ilə döyüş başlanana kimi bu texnika Bakıya çatdırıldı və onlar bu döyüşdə iştirak etdilər (199, s.293). Aprel ayının birinci yarısında Həştərxandan Bakıya çoxlu silah gətirildi (321,



s.100). Aprel ayının 6-da Bakı və onun rayonlarının İnqilabi Müdafiə Komitəsi Bakının varlı adamları üzərinə 50 milyon rubl təzminat qoydu ki, onlardan zorla alınacaq bu pulun əsas hissəsi Qırmızı ordunun təşkilinə istiqamətləndirilməli idi (13, 11.04.1918). Aprel ayının 8-də isə İnqilabi Müdafiə Komitəsi Bakı əhalisi arasında səfərbərlik e'lan etdi. Bununla əlaqədar imzalanmış əmrdə deyilirdi ki, Petrovskdan sonra Bakını işğal etməyə çalışan vəhşi ordudan xalq hakimiyyətini qorumaq üçün bütün hərbçilərin və silaha malik olanların səfərbərliyi keçirilir. Həmin şəxslər aprelin 9-dan 12-nə kimi tə'yin olunmuş yerlərə gəlib komandalara yazılmalı idilər. Qırmızı qvardiyanın da şəhərdə olan bütün bölmələri səfərbərliyə cəlb olmalı idilər (2, s.340).

İmam Qotsinskinin dəstəsinin Xırdalan ətrafında döyüş qabağı mövqe tutması Bakı bolşeviklərinin ciddi təşvişinə səbəb oldu. A.Caparidze bir neçə azərbaycanlı ilə Qotsinskinin qərargahına gəlib Bakı müsəlmanları adından onunla danışıq apararaq Bakının bolşevik hökumətinin tanınmasına cəhd göstərdilər. Dağıstanlı qüvvələrin qərargahında A.Caparidzenin rəhbərliyi altında olan adamlar Azərbaycan xalqının mənafeyini təmsil edəcək nümayəndə hey'əti kimi qəbul edilmədi (28, s.227).

Aprel ayının 7-də Bakının müdafiəsi üçün İnqilabi Müdafiə Komitəsi tərəfindən Xırdalan istiqamətində göndərilmiş olan zirehli avtomobil dağıstanlı qüvvələr tərəfindən top atəşinə tutuldu. Atışmanın başlandığı xəbərini eşidən kimi İnqilabi Müdafiə Komitəsi şəhər əhalisinə bəyanat qəbul etdi. Bu bəyanatda Bakı bolşevikləri yenidən sovet hakimiyyətinin təhlükədə olduğunu, Bakı ətrafında Zaqafqaziyanın taleyinin həll edildiyini vurğulayır və onların məğlub olacaqları təqdirdə şəhərdə orta əsrlər xanlığının, habelə türk ağalığının bərqərar ediləcəyi ilə camaatı qorxudurdular. Fəhlə-kəndli inqilabının təntənəsinə nail olunması üçün İnqilabi Müdafiə Komitəsi bütün qüvvələri döyüşə hazır olmağa çağırırdı (13, 09.04.1918).

İnqilabi Müdafiə Komitəsi sərəncamında olan bütün qüvvələri dərhal Bakının ətrafında yerləşdirdi. Əmirovun (ermənidir - M.S.) rəhbərliyi altında olan dəstə "Qurd qapısı"nda müdafiə mövqeləri tutdu. Başqa bir dəstə Qəhrəmanovun (ermənidir - M.S.) rəhbərliyi altında Xırdalan yaxınlığına göndərildi. Bu dəstə Palçıq vulkanı ilə Xırdalan stansiyası arasında müdafiə mövqeləri tutmalı idi (320, s.16). Xırdalan ətrafında matros Yelsovun komandanlığı altında Xəzər donanmasının da bir bölməsi vuruşurdu (197, s.56). Bolşevik qüvvələrinin 1-ci zirehli qatarı da bu döyüşə cəlb edilmişdi (230, s.364).

Bolşeviklər süvarilərdən ibarət çevik kəşfiyyat qrupu da düzəldərək Xırdalanla Sumqayıt stansiyası arasına yerləşdirmişdilər. Ancaq irəliyə çıxardılmış olan bu bölmə xüsusi bir fəaliyyət göstərə bilməyərək elə ilk döyüşdə geri çəkilmək məcburiyyətində qalmışdı (320, s.17).

Xırdalan ətrafında döyüşlər aprel ayının 8-10-nu arasında oldu. Bu döyüşlər çox gərgin şəkildə başlasa da sonradan imam Qotsinskinin dəstəsinin fəaliyyətində bir süstlük hiss olunmağa başladı. Bə'zi müəlliflər dağıstanlı qüvvələrin məğlub edildiyini yazırlar (305, s.57). Əslində onlar könüllü şəkildə döyüşdən çıxmış və Dağıstana üz tutmuşdular (320, s.17). Dağıstanlı qüvvələrin nə üçün belə etməsi barədə qəti fikir söyləmək çətindir. Ola bilsin ki, Bakı şəhəri üzərinə hücuma keçən bütün qüvvələrin birgə fəaliyyətinin nizamlanmasının qeyri-mümkün olduğu, ayrılıqda aparılan döyüşlərin isə gözlənilən nəticəni verəməyəcəyi aydın olduğu üçün dağıstanlılar geri qayıtmağı lazım bilmişdilər.

Hər halda Xırdalan istiqamətindən gözlənilən təhlükənin sovuşması Bakı bolşeviklərinə əsas diqqəti Hacıqabul üzərinə cəmləşdirmək imkanı verdi. İnqilabi Müdafiə Komitəsi Hacıqabul istiqamətində müsəlman və gürcü korpuslarının birləşmiş qüvvələrinin qarşısını saxlamağa çalışaraq digər məntəqələrə də hərbi qüvvələr göndərdi. Aprel ayının 12-də pulemyot və artilleriya ilə silahlanmış yeni bir dəstə Şamaxıdan geri çəkilməkdə olan bolşevik qüvvələrinin köməyinə göndərildi (2, s.348). Aprel ayının 14-də "Aleksandr Jander" gəmisinə yüklənmiş bolşevik dəstəsi Lənkərana gəlib çıxdı. Dəstədə atıcı silahlardan əlavə 2 top, 3 pulemyot var idi. Dəstənin tərkibində əlavə olaraq 40 nəfərlik xüsusi pulemyotçular bölməsi var idi ki, ona da erməni Arustamov rəhbərlik edirdi. Hələ mart hadisələrindən qabaq Lənkəranda Müsəlman Korpusunun süvari divizionu mövcud idi. Buradakı bolşevik qüvvələrini tərksilah edəndən sonra korpus komandiri 1918-ci il mart ayının 5-də həmin divizionun Hacıqabulda yerlşən 2-ci müsəlman süvari alayı ilə birləşdirilməsi barədə əmr vermişdi (178, v.12). Heç şübhəsiz ki, həmin divizionun köçürülməsinə başlanması Lənkəranda milli qüvvələrin zəifləməsinə səbəb olmalı idi. Bundan istifadə edən bolşevik silahlı bölmələri aprel ayının 14-də Lənkəran şəhəri üzərinə hücuma başladılar və aprel ayının 19-da şəhərə nəzarəti yenidən əllərinə aldılar (224, s.39).

Daha qızğın döyüşlər isə Hacıqabul ətrafında baş verdi. Maqalovun komandanlığı altında olan müsəlman və gürcü korpuslarının hissələri Hacıqabulu tutduqdan sonra bir neçə-gün onun ətrafında mövqe döyüşləri getdi. Birləşmiş milli qüvvələrin bölmələri sağ cinahdan hücuma keçərək düşmənin müdafiə xəttini yarmağa cəhd göstərdilər. Lakin onlar Duvannı ətrafında dayanan bolşevik silahlılarının müqavimətini qıra bilməyib geri çəkildi. Eyni zamanda bolşevik süvari bölmələri Hacıqabulu adlayıb milli qüvvələrin arxasına doğru hərəkət etməyə cəhd göstərdilər. Onların da bu cəhdi baş tutmadı və güclü müqavimətlə rastlaşdıqlarından geri çəkilmək məcburiyyətində qaldılar. Milli qüvvələrin mövqelərini dəqiqləşdirmək üçün bolşevik komandanlığı hidroplanlardan da istifadə edirdi (2, s.341).



Hacıqabul cəbhəsində qüvvə üstünlüyü yaratmaq üçün İnqilabi Müdafiə Komitəsi bura əlavə bölmələr göndərməyi planlaşdırırdı. İnqilabi Müdafiə üzrə qərargah rəisi olan Korqanovun mə'lumatlarında bildirilirdi ki, Hacıqabul ətrafında döyüşlərin davam etdiyi günlərdə Petrovsk şəhərinə Xəzər donanmasının güclü bir ekspedisiyası göndərilmişdir (12, 19.04. 1919). Həmin ekspedisiyanın tərkibinə daxil olan "Kazbek", "Anna Qukasova", "Vostok", "Parizyen" və "Dağıstan" nəqliyyat gəmiləri 36-cı Türküstan alayını öz göyərtəsinə alıb "Ərdəhan" keşikçi gəmisinin mühafizəsi və müşayəti ilə aprel ayının 19-da gəmilər müəyyən olunmuş nöqtəyə gəlib çıxdılar və Petrovsk şəhərinə hücum üçün döyüşqabağı mövqelər tutdular (252, s.254). Aprel ayının 20-də iki tərəfdən təşkil edilmiş hücum nəticəsində Petrovsk şəhəri tutuldu (198, s.91) və beləliklə şimala doğru uzanan yolları bolşeviklər öz nəzarəti altına ala bildilər. Petrovski şəhərinin tutulması Rusiya ilə yenidən əlaqələr yarada bilmək imkanı verirdi.

Xəzər donanmasının şəxsi hey'ətinin bir bölməsi də Hacıqabul istiqamətinə göndərilmişdi. Əlavə olaraq bura zirehli qatarın da gəlməsi bolşevik hissələrinin zərbə qüvvəsini xeyli artırdı (226, s.364-365). Burada cərəyan edən hadisələr Azərbaycanın milli hərəkatı fəallarının da ciddi nəzarəti altında idi. Qoşun hissələrinin ilkin uğurlarının qarşısının alınması, bir çox cəbhələrdə əks-nəticələrin ortaya çıxması, Hacıqabul ətrafında müsbət dəyişikliklərin yaranmaması onları xeyli narahat edirdi. Yaranmış vəziyyətdən çıxış yollarının tapılması məsələsi Zaqafqaziya hökumətinin 16 aprel 1918 -ci il tarixli iclasında müzakirə edildi. İclasın qəbul etdiyi qərarda milli qüvvələrin keçirdiyi narahatçılıqlar öz əksini tapmışdı. Bu qüvvələrin tə'kidi ilə hökumət Bakının tutulması işini yenidən Hərbi Nazirliyə və Daxili İşlər Nazirliyinə tapşırdı. Hökumətin qərarında qoşun hissələrinin tələb etdiyi əşyaların göndərilməsi barəsində də maddə var idi (286, s.155).

İki gündən sonra Zaqafqaziya hökuməti yenidən Bakı məsələsinin müzakirəsinə qayıtdı. F.Xoyski bildirirdi ki, Bakıda azərbaycanlıların qırılması məsələsi Yelizavetpol quberniyasının bütün məntəqələrində yerli əhali tərəfindən narhatçılıqla müzakirə olunmuş və qəbul olunmuş qərarlarda türk qoşunlarından kömək istənilməsi vurğulanmışdır. F.Xoyskiyə görə əgər Zaqafqaziya hökuməti Bakıda yaranmış vəziyyətin sabitləşdirilməsi və azərbaycanlı əhalini gözləyən təhlükənin aradan qaldırılması üçün tə'sirli tədbirlər görməzsə onda Yelizavetpol quberniyasının müsəlmanlarının qərarına qulaq asmaq lazım gələcəkdir. Xoyski onu da əlavə edirdi ki, aldığı mə'lumatlara görə bolşeviklər Hacıqabul istiqamətdə güclü döyüş planlaşdırırlar və ona görə də bu istiqamətdə görüləcək işlər sür'ətləndirilməlidir (286, s.155)

Zaqafqaziya hökumətinin azərbaycanlı üzvlərinin çıxış və tə'kidindən sonra bu məsələ ilə bağlı yeni bir qərar da qəbul edildi. Həmin qərarda

hökumət Hərbi Nazirliyə tapşırırdı ki, Bakının azad edilməsi üçün planlaşdırılmış hissələrinin hamısı dərhal yola salınsın. Eyni zamanda Bakı istiqamətinə alınan hissələrinin, artilleriyanın, təyyarənin göndərilməsi təklif olunurdu. Maliyyə nazirliyinə isə tapşırılırdı ki, Bakı dəstəsinin rəisi üçün ayrılmış puldan qalan 300 min rubl da onun sərəncamına göndərilsin (286, s.155).

Bununla belə göstərilən sə'ylərə baxmayaraq Maqalovun komandanlığı altında olan dəstə bolşevik qüvvələrinə qarşı mübarizədə ciddi bir üstünlük əldə edə bilmədi. Əksinə onların qarşısını aldıqdan sonra köməyə gəlmiş əlavə bölmələrlə birlikdə bolşevik qüvvələri aprelin 20-də güclü hücum təşkil etdilər və 4 saatlıq döyüşdən sonra Hacıqabulu öz əllərinə aldılar. Müsəlman və gürcü korpuslarının birləşmiş dəstəsi Hacıqabuldan geri çəkildi (212, s.365).

Hacıqabul ətrafında birləşmiş hərbi dəstənin uğursuzluğa düçar olması Bakının yaxın günlərdə bolşevik qüvvələrindən təmizlənəcəyi ümidini puça çıxardı. Bu barədə xəbər alınan kimi Zaqafqaziya seyminin müsəlman fraksiyasının üzvlərinin tə'cili iclası keçirildi. Həyəcan və narahatçılıq içində çıxış edənlərin hamısı Hacıqabul ətrafındakı hərbi uğursuzluğun baş verməsində gürcü menşeviklərini günahlandırdılar. Onların fikrincə, gürcü menşevikləri bu məsələdə heç də qətiyyətli mövqe tutmamışdılar. Zaqafqaziya hökumətində aparıcı rola malik olan gürcü menşevikləri bir tərəfdən bolşeviklərlə mübarizə aparmaq üçün hökumət qoşun hissələri göndərir və onların hər şeylə təhciz ediləcəyini və'd edirdisə, o biri tərəfdən də qoşun dəstəsi üçün təchizat göndərilməsini hər vasitə ilə ləngidirdi. Çıxış edənlər onu da əlavə edirdilər ki, polkovnik Maqalov hər gün həyəcan dolu teleqramlar göndərməsinə, zirehli qatar,toplar, mərmilər, pulemyotlar və patronlar göndərilməsini xahiş etməsinə baxmayaraq hökumət bunlara heç bir diqqət yetirmir və əməli bir iş də görmürdü (71, v.19).

Hacıqabulun tutulması barədə Əlet qoşun qrupunun komandirinin Bakı və onun rayonlarının İnqilabi Müdafiə Komitəsinə göndərdiyi mə'lumatda bildirirdi ki, polkovnik Maqalovun dəstəsinin sayı 2 minə çatırdı. Onun tərkibinə müsəlman süvari alayı, müsəlman nişançı alayı, pulemyot komandası ilə birlikdə gürcü tə'lim taborunun bir bölüyü, 4 ədəd top və 6 ədəd pulemyot daxil idi. Dəstəyə müsəlman, gürcü və rus zabitləri komandanlıq edirdi. Onlar bolşevik qoşunlarının hücumunun qarşısını ala bilməyib Tiflis istiqamətində geri çəkildilər (12, 21.04.1918).

Hacıqabul ətrafında döyüşlər getdiyi günlərdə, yə'ni aprel ayının 17-də bolşevik-daşnak qüvvələri Şamaxıda olan milli qoşun hissələrini də geri çəkilməyə məcbur etdilər (281, s.249). Bura göndərilmiş olan bolşevik-daşnak bölmələrinin başında Bakıda tüğyan edən qırğınların rəhbərlərindən olan T.Əmirov və S.Lalayev dururdular. S.Şaumyanın təklifi və tə'kidi ilə bu adamların sovet hakimiyyətini təmsil edən qüvvələrin rəhbəri tə'yin edilməsində məqsəd Şamaxıdakı milli qüvvələrə, bütünlükdə azərbaycanlı əhaliyə güclü zərbə vurmaq və orada bolşevik dayağını möhkəmlətmək idi. Azərbaycanlılara qənim kəsilən T.Əmirov, S.Lalayev kimiləri ətrafına topladıqları daşnak elementləri ilə S.Şaumyanın və ifrat bolşevik rəhbərliyinin e'timadını lazımınca "doğrultdular", Şamaxı əhalisinə qanlı divan tutdular. Bakı hadisələrini təkrar edən daşnak elementləri Şamaxının bütün müsəlman əhalisini süngüdən keçirdilər (1, s.277). Namusunun tapdalanmasına razı olmayan qadınlar qızlarının əlindən tutub yanan evlərin içinə girirdilər (316, s.19). Faciələrin miqyası hətta onun şahidi olan bə'zi ermənilərí də dəhşətə gətirirdi (bax: 27, v.76).

Hələ Şamaxıya çatmamış daşnak elementləri yolları üstündə olan 8 Azərbaycan kəndini viran qoymuşdular. Şamaxı ətrafında milli qoşun bölmələri şəhəri əhatə edən qoşunlara müqavimət göstərməyə çalışsa da gərgin döyüşlərdən sonra bolşevik qüvvələri Şamaxıya daxil ola bilmişdi. S.Lalayevin daşnak dəstəsi dərhal evlərə soxulmuş və məhəllələrə od vurmuşdu (27, s.76).

Yerli erməni əhalisi də S.Lalayevin dəstəsinə qoşulub talan və qətllərdə iştirak edirdi. Onlar qarşılarına çıxan bir nəfər də olsa azərbaycanlını sağ buraxmırdılar. Meyidlər bütün küçələrə səpələnib qalmışdı. Yaşayış evləri ilə bərabər Şamaxının qədim Cümə məscidi də yandırılmışdı (27, v.85).

Bakıda olduğu kimi Şamaxıda da daşnaklar tərəfindən törədilən faciələr elə geniş miqyas almışdı ki, bolşeviklər tərəfindən ora komissiya göndərilmişdi. Bu komissiyanın rə'yindən sonra hadisələri təhqiq etmək üçün Kojemyakonun rəhbərliyi altında Fövqəl'adə hərbi istintaq komissiyası yaradılmışdı. Fövqəl'adə komissiya müsəlman əhalisinə qarşı törədilən vəhşiliklərdə S.Lalayevi təqsirkar bilərək həbs etmişdi. Lakin S.Şaumyanın şəxsən işə qarışması nəticəsində əvvəlcə S.Lalayev həbsdən azad edilmiş, sonra isə Şamaxıdakı qırğınların törədilməsində erməni-daşnak elementlərini təqsirkar bilən Fövqəl'adə istintaq komissiyası ləğv edilmişdi (1, s.278-279).

Qırğın günlərində Şamaxı şəhəri yerlə-yeksan edilmiş, 80 Azərbaycan kəndi viran qoyulmuş, 15 min əhali ev-eşiyindən didərgin düşmüşdü (11, 23.03.1999).

Şamaxıda və onun ətrafında qırğınların tüğyan etdiyi günlərdə İnqilabi Müdafiə Komitəsinin tapşırığı ilə M.Əzizbəyov bir neçə nəfərlə ora yollandı. Şahidi olduqları ilə bağlı o, öz e'tirazını bildirəndə bütün dəstə ilə bərabər daşnaklar tərəfindən həbs edildi. M.Əzizbəyov bolşevik olduğunu və İnqilabi Müdafiə Komitəsi tərəfindən göndərildiyini iddia etsə də, daşnaklar bildirdilər ki, müsəlmandan olan bolşevikləri tanımaq istəmirlər. Daşnaklar M.Əzizbəyovu və onun yanındakıları güllələmək istəyirdilər. Yalnız Şamaxıya göndərilmiş qüvvələrdən olan sol təmayüllü

əsgərlərin müdaxiləsindən və tələbindən sonra ermənilər M.Əzizbəyovu və onun yanındakıları azad etdilər (30, v.1).

Aprel ayının 21-də Salyanda da Sovet hakimiyyəti e'lan edildi. M.Əzizbəyovun rəhbərliyi altına verilmiş olan bolşevik bölmələri demək olar heç bir müqavimətə rast gəlmədən Salyana daxil oldular (282, s.265).

Aprel ayının 23-də isə Quba şəhərində Sovet hakimiyyəti e'lan edildi. Həmin gün bura gələn bolşevik silahlı bölmələri şəhərin mərkəzi meydanında yerli bolşevik Mir Cəfər Bağırovun köməyi ilə Sovet hakimiyyətinin tanınması barədə əhaliyə ultimatum verdilər. Uzun çəkən söhbətlərdən, müzakirələrdən və danışıqlardan sonra camaat sovet hakimiyyətini tanıdığını bildirməli oldu (25, v.1).

Bir neçə gündən sonra ətraf kəndlərin ləzgi silahlıları Qubanı mühasirəyə alıb bolşeviklərin uzaqlaşmasını tələb etdilər. Bolşevik rəhbərliyi razı olmadıqda qarşı tərəflər arasında atışma başladı. Bolşevik qüvvələrinə bir top və pulemyotlarla silahlanmış əlavə kömək gəlsə də, onların müqaviməti çox sürmədi və şəhəri tərk etməli oldular. Şəhərdən çıxarkən həbsxanadan azad etdikləri erməniləri də özləri ilə apardılar (1, s.182).

Xəbər Bakıya çatanda bolşevik hökuməti Sovet hakimiyyətinin e'lan edilməsinin Bakı və Şamaxı təcrübəsini Qubaya da tətbiq etdi. Burada sovet hökuməti qurulması üçün daşnak elementlərindən ibarət böyük bir dəstə düzəldildi. Onun rəhbəri isə qatı millətçiliyi ilə tanınan daşnak Amazaps tə'yin edildi. Bu dəstə may ayının 1-də güclü top atəşlərindən sonra Qubaya daxil oldu və bununla da şəhərdə qırğınlar başladı. Ermənilər qarşılarına çıxan azərbaycanlıları öldürür, evləri yandırırdılar (1, s.183).

Qubada Sovet hökumətinin təmsilçisi olan Gelovaninin ifadələrinə görə Amazaspanın dəstəsi S.Şaumyanın arzusu ilə, başqa komissarlarla razılaşdırılmadan Qubaya cəza dəstəsi kimi göndərilmişdi. Dəstənin tərkibinə daxil olan 2 minədək adamın hamısı ermənilərdən ibarət idi. Bu faktı Amazasp özü də qubalılar qarşısındakı çıxışında e'tiraf edirdi. O açıqaçığına bildirirdi ki, bura qisas üçün gəlmişdir və Şamaxıda olduğu kimi Xəzər dənizindən Dağıstan sərhədlərinədək bütün kəndləri yerlə-yeksan etmək tapşırığı almışdır (1, s.185).

Beləliklə, silah gücünə və sonsuz faciələr hesabına Bakı bolşevikləri Bakıda və quberniyanın bir-sıra məntəqələrində sovet hakimiyyətini qurmağa müvəffəq oldular. Lakin heç də bununla kifayətlənmək fikrində deyildilər. Milli qoşun hissələrinin hələ xeyli zəif olmasından və Zaqafqaziya seymindəki fikir ixtilafından istifadə edərək qərbə doğru irəliləmək niyyətini bolşeviklər heç də gizlətmirdilər. Onların fikrincə, bir qədər qətiyyətlilik nümayiş etdirsəydilər 1918-ci ilin yazınadək daha böyük əraziləri öz tə'sir dairəsi altına ala bilərdilər. Şaumyan sonralar V.Leninə göndərdiyi məktubda belə yazırdı: "Biz Bakıdakı vətəndaş müharibəsindən sonra az bir qüvvə ilə ora (Gəncəyə - M.S.) yerimiş olsaydıq daha yaxşı olardı. O zaman vəziyyət xeyli əlverişli idi" (231, s.188).



Bakı bolşevikləri liderlərinin fikrincə, hələ 1918-ci ilin yanvarında Azərbaycanın milli qüvvələrinin cəmləşmiş olduğu Gəncəyə hücum etmək üçün yaxşı imkan var idi. Çünki o zaman Azərbaycanın milli qüvvələri çox zəif və qeyri-mütəşəkkil idi. Onların Türkiyə ilə elə bir əlaqəsi də yox idi. Cəbhədən qayıdıb Bakıda toplaşmış rus alayları isə Gəncəni almağa kömək edə bilərdi (231, s.188).

Bakı bolşevikləri münasib saydıqları imkanları əldən buraxmağa təəssüflənsələr də nəinki Gəncəni, hətta Tiflisi tutmaq və bütün Zaqafqaziyada Sovet hakimiyyəti e'lan etmək niyyətindən (231, s.189) əl çəkməmişdilər. Xüsusən 1918-ci il aprel ayının 22-də Zaqafqaziyanın müstəqil Demokratik Federativ Respublika e'lan edilməsindən sonra (310, s.68) bu istiqamətdə görüləcək işlərin sür'ətləndirilməsinə başlandı. Qarşıya qoyulan planın reallaşdırılması üçün Qırmızı ordunun gücləndirilməsinə xüsusi fikir verilirdi və bu məsələ 1918-ci il aprel ayının 25-də yaradılmış Bakı Xalq Komissarları Sovetinin qarşıya qoyduğu başlıca vəzifələrdən biri idi. Özünün 1 may 1918-ci il tarixli bəyanatında Bakı Xalq Komissarları Soveti e'lan edirdi ki, sovet hakimiyyətinin son təntənəsi və bu hakimiyyətin bütün Zaqafqaziyaya yayılması üçün qalibiyyətlə başlanmış vətəndaş müharibəsi davam etdirilməlidir. Bunun üçün isə hər şeydən əvvəl güclü Qırmızı orduya malik olmaq lazımdır (2, s.385).

Mə'lumdur ki, bolşevik ideologiyasının xidmətində dayanan silahlı dəstələrin yaradılmasına hələ xeyli əvvəldən başlanmışdı. Bir sıra hissələr komplektləşdirilmiş və onlar lazımi silah və texnika ilə təchiz edilmişdi. Aprel ayında isə Qafqaz Ordusu Hərbi İnqilab Komitəsi nizami Qafqaz Qırmızı ordusunun formalaşdırılmasına girişdi. Bu sahədə təşkilati işlərin gücləndirilməsi üçün Hərbi İnqilab Komitəsinin sədri Q.Korqanov hərbidəniz işləri komissarı sifəti ilə Bakı Xalq Komissarları Sovetinə daxil edildi (202, s.111)

İnqilabi Müdafiə Komitəsi tərəfindən e'lan olunmuş hərbi səfərbərlik 1918-ci ilin may ayında Bakı Xalq Komissarları Soveti tərəfindən daha 6 ay uzadıldı (231, s.176). Bu da Qırmızı Ordunun yeni hissə və bölmələrinin yaradılmasına imkan verdi. Yeni-yeni atıcı taborları, pulemyot bölmələri, dağ-atlı topçu bölmələri düzəldildi, texniki qoşun hissələri, hərbi texniki tabor, 1-ci Qırmızı dəmir yol texniki bölüyü təşkil olundu (230, s.404).

Bütün fəaliyyətləri ilə ifrat bolşevik ünsürlərinin niyyətlərini həyata keçirən daşnak silahlı hissələri də təşkilati cəhətdən Qafqaz Qırmızı ordusuna tabe etdirildi. Bu məqsədlə aprel ayının 19-da Bakı Soveti Erməni Milli Şurasını ləğv etmək, onun milli hissələrini isə Qırmızı orduya daxil etmək barədə qərar qəbul etdi (233, s.149). Aprelin 20-də isə Bakı və onun rayonlarının İnqilabi Müdafiə Komitəsi Erməni Milli Şurası qarşısında onun sərəncamında olan milli qoşun hissələrinin beynəlmiləl sovet hissələrinə qatılması barədə məsələ qaldırdı (2, s.361). İrəli sürülən

təklifi daşnak millətçi planlarının reallaşdırılması üçün daha münasib vasitə olduğunu anlayan Erməni Milli Şurasının liderləri dərhal bolşeviklərin tələbləri ilə razılaşdığını bildirdilər. Aprel ayının 26-da İnqilabi Müdafiə Komitəsi ilə Erməni Milli Şurasının birgə iclası oldu. İclasın qərarında deyilirdi.

"1. 2-ci erməni ehtiyat piyada alayı ləğv olunur. Onun bir hissəsi Amazaspın taboruna daxil olur, başqa hissəsi isə yaradılmaqda olan Qırmızı sovet taborlarına birləşdirilir.

2. Amazaspın taboru yenidən qurulur, tam şəkildə Sovet hakimiyyətinə tabe etdirilir və Qırmızı ordunun 16 və 17-ci taborları adı altında Qırmızı orduya daxil olur" (286, s.163).

Əsasını ruslar və ermənilər təşkil edən silahlı dəstələrin birləşdirilməsi nəticəsində 1918-ci il may ayının ortalarında Bakıda 18 min əsgər və zabitdən ibarət 19 atıcı tabor var idi. Bu hərbi hissələr 4 atıcı briqadada birləşdirilmişdi ki, onlar da birlikdə Qırmızı ordunun birinci Qafqaz korpusunu təşkil edirdilər (230, s.405). Korpusun komandanlığı erməni daşnak elementlərinin əlində idi. Onun komandiri Qazarov, qərargah rəisi isə Avetisov idi (233, s.148).

Bakıdakı Qırmızı ordunun bir neçə topçu batareyası, üç zirehli qatarı, 3 pulemyot komandası, 10-dan artıq təyyarəsi var idi (202, s.112).

Artilleriya batareyalarının sərəncamında 12 səhra, 3 dağ topu və 4 ədəd mortir var idi. Mərmilər sayca az olsa da güllə ehtiyatı təxminən 9 milyona çatırdı (239, s.105).

Silahlı qüvvələrin fəaliyyətinə rəhbərlik etmək üçün may ayının 24-də Alı Hərbi Şura yaradıldı. Bu orqan texniki ixtisaslar üzrə kadrların səfərbər edilməsinə, tə'limatçı məktəbində və topçu kursunda zabitlərin hazırlanmasına diqqəti artırdı (239, s.104).

Nəticədə Azərbaycanın müstəqilliyinin e'lan edilməsi ərəfəsində Bakı XKS say e'tibarilə böyük olan bir orduya malik idi. Doğrudur, bu ordunun əsasını bolşevikləşmiş ruslar, ermənilər təşkil edirdilər və onları bir-birinə vətən, torpaq təəssübü deyil, talan etmək, azərbaycanlıları qırmaq, çapıb-öldürmək niyyətləri, bir də fanatik ideyalar birləşdirirdi. Hadisələrin sonrakı gedişi də göstərdi ki, belə niyyətlər üzərində qurulan ordunun dayaqları möhkəm ola bilməz. Bununla belə, Qırmızı ordu 1918-ci ilin may ayında həm say, həm də təchizat baxımından milli qoşunlardan üstün idi və mövcud imkanlar Qırmızı ordunun qarşısının tə'sirli şəkildə alınması üçün bəs ola bilməzdi. Aprel ayında gedən döyüşlərdə Müsəlman Korpusunun hissələrinə həm maddi, həm də ciddi mə'nəvi zərbə vurulmuşdu. Həmin işlərin bərpa olunması üçün isə müəyyən vaxt lazım idi. Ona görə də Müsəlman Korpusunun komandiri, general-leytenant Ə.Şıxlinski e'tiraf edirdi ki, Azərbaycanın müstəqilliyinin e'lan edildiyi vaxt "mənim təşkil etdiyim hissələr yarımçıq halda" (322, s.190) idi.



## 2. XÜSUSİ AZƏRBAYCAN KORPUSU (QOLORDUSU)

Aprel ayında Hacıqabul ətrafındakı döyüşdə geri çəkilmək məcburiyyətində qalan müsəlman və gürcü korpuslarının birləşmiş dəstəsinin bölmələri 1918-ci il may ayının 21-də yenə də burada mövqe tutmuş bolşevik qüvvələri ilə döyüşə girdilər. Ancaq bolşeviklərin burada yerləşdirdikləri qüvvələr birləşmiş qoşun bölmələrinin bu hücumunun qarşısını da aldılar (2, s.414). Əsasən süvarilərdən olan milli qoşun bölmələri Hacıqabulda Qırmızı Ordunun piyada hissəsinin və artilleriyasının müqavimətini qıra bilməyərək əvvəlki mövqelərinə çəkildilər. Hərbi dəniz işləri üzrə komissar Q.Korqanov Xalq Komissarları Sovetində bu barədə etdiyi mə'ruzəsində Bakı ətrafında, o cümlədən Hacıqabulda milli qoşun hissələrinin növbəti hücumunun qarşısının alınmasına sevindiyini bildirsə də, bütünlükdə passiv müdafiədə dayanmağın qarşıya qoyulmuş məqsədlərə çatmaq üçün düzgün olmadığını vurğulayırdı. Onun sözlərinə görə, Ermənistanda və Gürcüstanda xalq kütlələri intizarla Qırmızı Ordunun yolunu gözləyirlər və əgər bu barədə qəti addım atılmasa türk qoşunları Azərbaycan ərazisində möhkəmlənərək Bakıya doğru hərəkətə başlayacaqlar (2, 415-419).

Bakı Xalq Komisarları Sovetının sədri S.Şaumyan da bu mövqedə dayanmaqla bərabər belə bir planın həyata keçirilməsinin ilhamçısı və təşkilatçısı idi. V.Lenin tərəfindən Zaqafqaziyanın fövqəl'adə komissarı tə'yin olunmuş S.Şaumyan Zaqafqaziyaya hakimliyin tezliklə ələ keçirilməsi üçün sür'ətlə irəli hərəkət etməyin zəruriliyini bildirirdi. Qarşıya qoyulan planların mahiyyətini inqilabi-bolşevik şüarlarla pərdələməyə çalışan S.Şaumyan milli hisslərindən güc alan niyyətlərinin reallaşdırılmasında ilk növbədə erməni-daşnak ünsürlərinə arxalanırdı. Ətrafına topladığı daşnak qoşun dəstələrinə dayaqlanmaqla bərabər, S. Şaumyan Yelizavetpolda, bu quberniyanın digər qəzalarında və Gürcüstanda yaşayan ermənilərin onunla həmfikir olacağına da şübhə etmirdi. O, Rusiya Xalq Komissarları Sovetinə göndərdiyi məktubunda gizlətmirdi ki, Yelizavetpola doğru irəliləməklə burada və sonra isə digər yerlərdə ermənilərin üsyanını qaldırmaq və bununla da Zaqafqaziya hökumətinin devrilməsinə nail olmaq lazımdır (2, s.145)

Həmin məqsədinə nail olmaq üçün S.Şaumyan və Q.Korqanov konkret plan hazırlamışdılar. Bu plana görə onlar L. Biçeraxovun İranda olan dəstəsi ilə bərabər iki istiqamətdən: Kürdəmir-Yevlax-Gəncə və Şamaxı-Göyçay-Kaxetiya-Tiflis istiqaməti ilə hücuma keçməli idilər (267, s.29).

Gəncəyə və oradan da Tiflisə doğru hücumunda S.Şaumyan eyni zamanda qaniçən cəllad Andranikin əməli fəaliyyətinə bel bağlayırdı. Qeyri-insani əməllərinə görə Türkiyə ordusundan qovulduqdan sonra Naxçıvan, Zəngəzur və b. qəzalarda silahsız azərbaycanlıların qırğınına rəvac

verən bu cəllad Bakıdakı Sovet hakimiyyətini tanımaqla Qafqazın yeni fövqəl'adə komissarının əmrini yerinə yetirməyə hazır olduğunu bildirirdi. Onun Zəngəzurdan Qarabağa, oradan da Yevlaxa doğru yürüşü isə S.Şaumyanın bütün planlarının reallaşmasına zəmin yaratmalı idi (207, s.19).

S.Şaumyanın silahdaşı və məsləkdaşı A.Amiryan da bütün diqqətin tezliklə Yelizavetpol üzərinə hücuma istiqamətləndirilməsinə çağırırdı. O, yazırdı: "Qafqazın Versalına hücum etmək əvəzinə, əksinqilabçıların bütün başçılarını tutub dustaq etmək əvəzinə biz onları toplaşmağa, möhkənlənməyə və əksinqilabi xarici düşmənlərimizlə ittifaqa girərək inqilab əleyhinə hücuma keçməsinə imkan verdik... İndi biz doğru yol tutmuşuq. Müdafiə deyil, necə olursa olsun hücuma keçmək, yenə və yenə təkrar edirəm ki, hücuma keçmək lazımdır. Bizim başqa çıxış yolumuz yoxdur" (231, s.189).

Bolşevik qüvvələrinin Yelizavetpola doğru irəliləməsi planı Rusiyanın bolşevik liderləri tərəfindən də hərtərəfli şəkildə dəstəklənirdi. Milli qoşun bölmələrinin may ayının 21-də Hacıqabula hücum etməsindən xəbər tutan Stalin S.Şaumyana göndərdiyi teleqramında bu məntəqənin "nəyin bahasına olursa-olsun qorunmasına" çağırırdı (2, s.426). Çünki bu məntəqənin itirilməsi bolşevizmin bütün Zaqafqaziyaya yayılması işinə ciddi bir zərbə ola bilərdi.

Bolşevik-daşnak təcavüzünün fəallaşması Azərbaycanda təkcə hərbi vəziyyətin kəskinləşməsi ilə deyil, həm də ictimai həyatda anarxiyanın, qanunsuzluqların və cinayətkarlıqların genişlənməsi ilə müşayiət olunurdu. Dərinləşən ictimai, siyasi, hərbi böhranın qarşısının alınması üçün Zaqafqaziya hökumətinin tə'sirli imkanlara malik olmaması əhalidə, ictimaiyyətdə və milli qüvvələrin fəallarında xaricin köməyindən, konkret olaraq Türkiyənin kömək və yardımından bəhrələnmək meylini daha da artırırdı. Xüsusilə 1918-ci ilin aprel ayında Hacıqabul ətrafındakı döyüşdə baş verən uğursuzluq milli qüvvələrdə belə bir əminlik yaratmışdı ki, Azərbaycanı bolşevik-daşnak zülmündən yalnız Türkiyənin hərbi yardımı xilas edə bilər (31, v.1).

İctimai, siyasi, iqtisadi və hərbi şərait mürəkkəbləşdikcə əhalinin daha geniş kütlələri bu fikrə şərik çıxır və eyni zamanda onun reallaşması üçün fəallıq göstərirdilər. Məsələn, 1918-ci il may ayının 13-də Yelizavetpol quberniyasının qəzalarından gələn nümayəndələr Zaqafqaziya seyminin türk fraksiyasının üzvləri ilə görüşmüş və onlardan mövcud bəlaların və ehtimal olunan fəlakətlərin aradan qaldırılması üçün Türkiyədən hərbi yardım alınmasının sür'ətləndirilməsini xahiş etmişdilər (310, s.74).

Yaranmış vəziyyətin ağırlığı, inkişaf etməkdə olan proseslərin perspektivi tə'sirli çıxış yolunun Türkiyənin hərbi köməyinə bel bağlanılmasında olduğuna şübhə yeri qoymurdu. "Müsavat" partiyasının liderlərindən olan N.Yusifbəyli bu məsələyə münasibətini belə bildirirdi: "Yalnız Azərbaycanı deyil, bütün Zaqafqaziyanı işğal edən böyük, dəhşətli anarxiyanı



biz öz qüvvəmizlə qaydaya sala bilmərik. Şərq tərəfdən bolşeviklərin bizim düşmənimizlə birləşərək hücum etməsi vəziyyəti daha da ağırlaşdırır və türk millətinə olduqca böyük müsibət və fəlakət gətirir. Vəziyyət belə olduğu halda bizə xarici bir qüvvənin müdaxiləsini istəməkdən başqa çarə qalmır. İstiqlaliyyətimizin qızğın tərəfdarı olmaqla bərabər, mən bu məsələ haqqında birinci olaraq danışmaq məcburiyyətindəyəm. Fəlakətin üzünə cəsarətlə baxmaq lazımdır. Çox fərəhli haldır ki, bizim işlərə müdaxilə edəcək xarici qüvvə bizimlə dost və qardaş olan Türkiyədir. Bəlkə bu, bizim qonşularımızın xoşuna gəlməyəcəkdir, lakin başqa çarəmiz yoxdur" (194, s.231).

Azərbaycanda cərəyan edən proseslər Türkiyənin özündə də narahatçılıqla izlənilirdi. Zaqafqaziyanın bütün müsəlmanlarını dərinləşməkdə olan anarxiya və bəlalardan xilas etmək üçün hələ 1918-ci ilin fevral ayında Türkiyənin Hərbiyyə naziri Ənvər Paşa 6-cı ordu komandanlığına "Dağıstan.Türküstan və Rusiyaya bağlı islam məmləkətlərinin möhtac olduğu yardımı yaxından yapmaq, yardım və təşkilatı idarə etmək" üzrə bir Qafqaz İslam Ordusu qurulması fikrini irəli sürmüş və fikrin həyata keçirilməsi üçün qardaşı Nuru bəylə Şövkət bəyin bölgəyə göndərilməsini məqsədəuyğun bilmişdi (302, s.101). Ancaq Zaqafqaziyada təkcə daxili siyasi qüvvələr deyil, bu bölgədə marağı olan beynəlxalq qüvvələr qarşı-qarşıya gəlmişdilər. Hətta I Dünya müharibəsində müttəfiq cəbhədə çıxış edən Almaniya ilə Türkiyə də Zaqafqaziyaya münasibətdə eyni mövqedə dayanmırdılar. Öz maraqlarının həyata keçirilməsi naminə Almaniya Türkiyənin Azərbaycana hərbi yardım göstərməsinə, Bakının azad edilməsində iştirakına heç də birmə'nalı yanaşmırdı. Əslində buradakı maraqlarına görə bu iki dövlət qarşı-qarşıya gəlməli olmuşdu (221, s.36).

Azərbaycana hər hansı bir hərbi yardımın göndərilməsi üçün Türkiyə ona qarşı yönəldilmiş olan xarici təzyiqlərin də müqavimətini qırmalı idi. Almaniya tərəfindən mövcud olan belə bir təzyiq və narahatçılığa son qoymaq və eyni zamanda Azərbaycanda gözlənilən köməyi həyata keçirmək üçün məsələnin başqa ölkələrdə qıcıq doğurmayacaq həlli yolu e'lan edildi. Bildirildi ki, Azərbaycanda türk hərbi mütəxəssislərinin və Azərbaycan könüllülərinin iştirakı ilə "İslam Ordusu" yaradılacaqdır (221, s.39). Nuru Paşa bu ordunun komandanı tə'yin edilməklə ona tapşırılmışdı ki, Azərbaycanın ordusunu yaratsın və bu ordu vasitəsilə Bakı şəhərinin bolşeviklərdən təmizlənməsini tə'min etsin (221, s.39).

Türkiyə qoşunlarının Baş komandanlığı Azərbaycanda hər biri üç piyada alayından ibarət olan üç diviziyanın daxil olduğu bir korpusun formalaşdırılmasını məqsədəuyğun bilirdi. Bu diviziyaların hər birinin təşkilinə kömək edəcək Türkiyə zabitlərindən ibarət üç qrupun yaradılması, bu qruplara daxil olacaq zabitlərin rütbələrinin dərhal bir pillə artırılması və maaşlarının da bir dəfə qaldırılması qərara alındı (195, s.553).

Nuru Paşa 1918-ci il fevral ayının sonunda təyyarə ilə Mosula gəldi. Mart ayının 25-də isə Azərbaycana göndərilmək üçün müəyyənləşdirilmiş 20-dək türk zabiti Mosula gəlib özlərini Nuru Paşaya təqdim etdilər. Aprel ayının 8-də bu he'yət Mosuldan hərəkət edib Rəvandüz, Savucbulaq, Təbriz yolu ilə Zəngəzura, oradan da Gəncəyə gəldi. May ayının 25-də Gəncəyə çatan Nuru Paşa burada öz qərərgahını yaratdı (195, s.553).

Gəncəyə yetişən kimi Nuru Paşa dərhal Müsəlman Korpusunun vəziyyəti, onun tərkibi, şəxsi hey'ətlə komplektləşdirilməsi səviyyəsi, hissələrin dislokasiyası ilə tanış oldu. Həmin tanışlıqdan sonra o belə bir qənaətə gəldi ki, bu qüvvə ilə Bakının bolşeviklərdən təmizlənməsi qeyri-mümkündür və bu barədə o, öz fikirlərini Türkiyə qoşunlarının Baş komandanlığına da çatdırdı. Nuru Paşa yazırdı : "Bolşeviklər Dağıstan və qüzey Qafqaziyanı tamamilə ələ keçirmək üzrədirlər. Hər yerdə ermənilərin təcavüzü artmaqdadır. Bakı sür'ətlə zəbt edilməzsə, buralarda durum daha da təhlükəli bir hal alacaqdır. Bakıya, müsəlmanlara yardıma gələn gürcü qüvvələrinə çəkilmək əmri verilib.

Müsəlmanların təşkil etməkdə olduğu korpusda əsgərdən çox zabit vardır. Korpusun şəxsi hey'əti 1000-ə qədərdir ki, bunun yarısı əsir türk əsgərləridir. Bakı məsələsinin yardımsız həlli mümkün deyildir. İngilislərin Bakını gücləndirdikləri güman edilir. Burada taxıl məhsulları ixrac olunacaq qədər çoxdur. Əhali türklərin gəlməsini səbirsizliklə gözləyir" (195, s.555).

Bu yazdıqları ilə Nuru Paşa da Azərbaycanda çox mürəkkəb bir vəziyyətin mövcud olduğunu təsdiqləyirdi. Məhz belə bir mürəkkəb vəziyyətdə Azərbaycan xalqının həyatında tarixi bir hadisə baş verdi. 1918-ci il may ayının 28-də fəaliyyətini dayandırmış Zaqafqaziya seyminin Azərbaycan fraksiyasının üzvlərindən təşkil edilmiş Milli Şura Azərbaycanın dövlət müstəqilliyini e'lan etdi. Milli Şura tərəfindən qəbul edilən və yeni dövlət quruculuğunun əsas istiqamətlərini müəyyənləşdirən "İstiqlal bəyannaməsi"ndə Azərbaycanın müstəqilliyinin qazanıldığı tarixi şərait belə təsvir olunurdu: "Böyük Rusiya inqilabi gedişində Rusiyada dövlət orqanizminin ayrı-ayrı hissələrinin dağılması və rus ordusunun Zaqafqaziyanı tərk etməsi ilə burada yeni siyasi vəziyyət yarandı. Taleləri öz ixtiyarına buraxılmış Zaqafqaziya xalqları Zaqafqaziya Xalqları Demokratik Federativ Respublikasını yaratdılar.Lakin siyasi hadisələrin sonrakı gedişində gürcü xalqı Zaqafqaziya Federativ Respublikasının tərkibindən çıxmağı və müstəqil Gürcüstan Demokratik Respublikası yaratmağı münasib bildi. Rusiya və Osmanlı imperiyası arasındakı müharibənin dayandırılması, eyni zamanda ölkə daxilindəki görünməmiş anarxiyanın ləğvi ilə bağlı olan Azərbaycanın mövcud siyasi durumu Azərbaycan xalqlarını düşdükləri ağır vəziyyətdən çıxartmaq üçün Şərqi və Cənubi Zaqafqaziyadan ibarət olan Azərbaycanın öz dövlət orqanizmini yaratmaq zərurətini qarşıya çıxarır" (185, s.245).



Dövlət müstəqilliyi e'lan edilərkən Milli Şuranın hakimiyyəti Azərbaycanın yalnız bir hissəsinə yayılırdı. Bakı və onun ətrafı isə bolşeviklərin hakimiyyəti altında idi. Bu parçalanmanı aradan qaldırmaq, Azərbaycanın ərazisində mövcud olan hər cürə anarxiyaya son qoymaq və bütünlükdə qazanılmış olan dövlət müstəqilliyini qorumaq üçün milli müdafiə qüvvələrinin möhkəmləndirilməsi yeni dövlət quruculuğunun aktual vəzifələrindən biri kimi qəbul edilmişdi. Ona görə də may ayının 28-də təsdiq edilmiş Azərbaycanın ilk hökumət kabinəsinin tərkibində hərbi nazir vəzifəsi də nəzərdə tutulmuş və bu vəzifə Xosrov bəy Sultanova həvalə olunmuşdu (185, s.246).

Yeni yaradılan nazirliyin qarşısında çox mühüm və mürəkkəb vəzifələr dayanırdı. Həmin vəzifələrin mühümlüyü tarixi şərait və zərurətlə bağlı idisə, mürəkkəbliyi müstəqil dövlətin hərbi strukturlarının yaradılması işində təcrübənin olmaması, vəsait və imkanların məhdudluğundan irəli gəlirdi. Müstəqilliyin e'lan edilməsi ilə Gürcüstan dövləti Azərbaycan ərazisində olan qoşun bölmələrini geri çağırmış (195, s.555), hissələrin Tiflisdən həyata keçirilən təchizatı dayandırılmışdı (179, v.62). Ona görə də Müsəlman Korpusunun formalaşdırılmasının davam etdirilməsi bütünlüklə yeni hökumətin üzərinə düşmüşdü.

Bu proses nə qədər ağır olsa belə Azərbaycanın dövlət müstəqilliyinin e'lan edilməsi və ordu yaradılmasının yeni keyfiyyətdə davam etdiriləcəyi Azərbaycanın milli hərbçiləri tərəfindən sevinclə qarşılanmışdı. Müsəlman Korpusunun komandiri, general-leytenant Ə.Şıxlinski 1918-ci il may ayının 28-də Azərbaycanın dövlət müstəqilliyinin e'lan olunmasını eşidən kimi dərhal yeni dövlətin Hərbi Nazirliyinin təşkil edilməsinin layihəsini hazırlamışdı. O, bu layihəyə lazımi sxemlər, zəruri qeydlər əlavə etmiş və bitkin bir sənəd kimi sonradan hökumətə göndərmişdi (20, № 1,1993 s.105-106).

Ə.Şıxlinskiyə görə Hərbi Nazirliyin strukturu ordunun təşkili, tə"lim və tərbiyəsi, təchizatı üçün zəruri olan bütün komponentləri özündə birləşdirməli idi. Bu prinsipi əsas götürərək general hazırladığı layihədə nazirliyin strukturunda 1) Dəftərxana, 2) Ərkani-hərb (Baş qərargah), 3) Ləvazimat idarəsi, 4) Topçu idarəsi, 5) Hərbi-texniki idarə, 6) Məhkəmə və tibbi xidmətlər nəzərdə tutulmuşdu. Bundan əlavə güman edilirdi ki, hərbi nazir vəzifəsinə mülki şəxs tə"yin edilərsə o öz yanında az saylı , lakin bacarıqlı şəxslərdən Hərbi Şura təşkil etməli və qoşunların təşkilini, tə'-lim və tərbiyəsini daimi nəzarət altında saxlamaq üçün öz müavinini tə"yin etməlidir (20, №1, 1993, s.105).

Layihəni hazırlamaqla bərabər general Ə. Şıxlinski göstərilən vəzifələrə kimlərin tə"yin oluna bilməsini də dəqiqləşdirmiş və həmin şəxslərin razılığını almışdı. O, nazirliyin Dəftərxanasının işinin təşkilinə xüsusi diqqət yetirir və bu işi təşkil etmək üçün Rusiya hərbi nazirliyində uzun müddət çalışmış Gençelmanın də"vət edilməsini məsləhət bilirdi.

Ordunun idarəetmə orqanlarının çevikliyinə, vəsaitlərin istifadə edilməsində qənaətcilliyə nail olmaq üçün Ə. Şıxlinski Müsəlman Korpusunun qərargah və idarələrinin şəxsi hey"ətinin ixtisar edilməsini və azad olmuş zabitlərin Hərbi Nazirliyin aparatının təşkilində istifadə edilməsini lazım bilirdi. O, döyüş keyfiyyətləri ilə seçilən Yapon ordusunu nümunə gətirərək göstərirdi ki, bu orduda heç vaxt korpus sistemindən istifadə olunmayıb. Ona görə Azərbaycanda da korpusun saxlanılmasına ehtiyac yoxdur və diviziyaları birbaşa hərbi nazirə, ya da onun köməkçisinə tabe etmək lazımdır. Zabit kadrlarının çatışmadığı üçün Ə.Şıxlinski yeni nazirliyin idarə və şö"bələrinin ştatını da mövcud imkanlara uyğun olaraq qurmağı məsləhət görürdü. (20, №1, 1993 s.106).

Bütün bu deyilənlər Hərbi Nazirliyin yaradılması üçün Ə.Şıxlinskinin hazırladığı birinci layihənin əsasını təşkil edirdi. Bundan başqa general ikinci bir lahiyə də hazırlamışdı. Həmin layihəyə görə Müsəlman Korpusunun komandiri hərbi nazirin müavini tə"yin edilməli və hərbi məsələlərlə bağlı hökumət orqanlarında aparılan bütün müzakirələrdə nazirlə birlikdə iştirak edərək həlledici səsə malik olmalı idi. Yə"ni Hərbi nazirin mülki şəxs olması ilə bağlı sırf hərbi xarakterli məsələlərin müzakirəsinin və icrasının ağırlıq mərkəzi əsasən korpusun komandanlığı üzərinə keçirilməli idi. Bununla bağlı olaraq bə"zi hərbi vəzifələrin, o cümlədən çağırış və səfərbərlik, təchizat məsələlərini öz üzərinə götürəcək ştatların Hərbi Nazirliyin aparatında deyil, korpusun qərargahında açılması təklif olunurdu (20, №1. 1993, s.106).

Ancaq Ə.Şıxlinski birinci layihəyə daha çox üstünlük verirdi. Bu layihənin tətbiq edilməsi böyük qıtlığı hiss olunan zabitlərin, çin dərəcəsi olan mə"murların səmərəli istifadəsinə, maliyyə vəsaitlərinin qənaətlə işlədilməsinə, *aralıq idarəetmə orqanlarının ləğvinə və bununla da bütün*lükdə idarəetmənin çevik xarakter almasına yol aça bilərdi.

General Ə.Şıxlinskinin hökumətə təqdim etdiyi layihələrin hər ikisi həyata keçirilməmiş qaldı. Ümumiyyətlə, çox qısa müddətdən sonra Hərbi Nazirlik də ləğv edildi. Türk generalı Nuru Paşa ilə Milli Şura arasındakı formalaşan münasibətlərin xüsusiyyətləri üzündən (32, v.22) 1918-ci il iyun ayının 17-də Milli Şura buraxılmış e"lan edildi və bu hökumət istefa verdi. Yenidən təşkil edilən hökumət kabinəsində isə hərbi nazir vəzifəsi yox idi. Beləliklə, müstəqil Azərbaycanın Hərbi Nazirliyinin yaradılması yalnız deklarativ xarakter daşıdı və onun təşkili istiqamətində əməli işə başlanılmadan bu dövlət strukturu ləğv edildi.

Hərbi Nazirliyin ləğv edilməsinə və beləliklə Ə.Şıxlinskinin hökumətə təqdim etdiyi layihənin həyata keçirilməməsinə, heç şübhəsiz ki, tarixi şərait də öz tə'sirini göstərirdi. Hökumətin sədri F.Xoyski sonralar parlamentdəki çıxışında bildirmişdi ki, bu vaxt Azərbaycanın öz ordusu yox dərəcəsində idi (11, 10.12. 1918). Hərbi böhran isə dərinləşməkdə davam edirdi. Ona görə də belə bir vaxtda Hərbi Nazirliyin formalaşdırılmasına



xeyli vaxt və vəsait ayrılması məqsədəuyğun bilinmirdi. O biri tərəfdən isə dövlət müstəqilliyi e'lan edildəndən sonra 1918-ci iyun ayının 4-də Batumda Azərbaycanla Türkiyə arasında dostluq müqaviləsi imzalandı. Həmin müqavilənini şərtlərinə əsasən Azərbaycan hökuməti Nuru Paşadan xahiş etdi ki, Azərbaycan Ordusunun təşkilinə rəhbərliyi öz üzərinə götürsün (178, v.45).

Müstəqil Azərbaycanın həyatında mühüm əhəmiyyətə malik olan bu müqavilə Azərbaycana türk hərbi qoşun hissələrinin göndərilməsinin mümkünlüyünü də nəzərdə tuturdu. Nuru Paşa Müsəlman Korpusunun vəziyyəti ilə tanışlıqdan sonra Türkiyə qoşunlarının Baş komandanlığına göndərdiyi məktubunda bildirmişdi ki, türk qoşun hissələri Azərbaycana gəlməsə burada genişlənən bolşevik təcavüzünün qarşısını almaq mümkün olmayacaqdır. Bu qoşun hissələrinin Azərbaycana göndərilməsi hüquqi cəhətdən məhz iyunun 4-də iki dövlət arasında imzalanan müqavilədə təsbit edildi.

Bu məsələ ilə bağlı müqavilənin dördüncü maddəsində göstərilirdi ki, dinclik və asayişi möhkəmləndirmək, ölkənin təhlükəsizliyini tə'min etmək üçün əgər ehtiyac olarsa Osmanlı hökuməti Azərbaycan respublikasına hərbi yardım göstərməyi öz üzərinə götürür (310, s.90).

İyun ayının 4-də imzalanan müqavilədən sonra Türkiyənin Şərq Ordular Qrupu komandanı Vəhib Paşa Nuru Paşanın Qafqaz İslam Ordusunu gücləndirmək haqqında təkliflərini həyata keçirmək üçün hüquqi imkan əldə etdi və 5-ci diviziyaya Azərbaycana yola düşmək barədə göstəriş verildi. Həmin vaxt 5-ci diviziyanın tərkibinə 9-cu,10-cu və 13-cü Qafqaz piyada alayları 2-ci süvari alayı, iki diviziondan ibarət olan bir topçu alayı, istehkam, rabitə, tibb hissələri və səyyar qospital daxil idi (195, s.555-556). Diviziyanın komandiri general Mürsəl Paşa idi (239, s.108).




**5-ci diviziyanın strukturu**

Azərbaycana getmək göstərişi alan kimi diviziyanın hissələri dərhal hərəkətə başladılar. Diviziyanın hissələrinin hərəkətinin *mühafizəsini* təşkil etmək və Gürcüstan ərazisindən alman qoşunlarının ehtimal oluna biləcək hücumunun qarşısını almaq üçün iyun ayının 6-da mayor Zehni bəyin komandanlığı altında olan 2-ci süvari alayı Qazax və Gəncə arasında mövqe tutdu. Ondan sonra mayor Cəmil Cahid bəyin komandanlığı altında olan 9-cu Qafqaz alayı Azərbaycan ərazisinə daxil oldu. İki tabor, bir pulemyot bölüyü və iki dağ topundan ibarət olan bu alay iyunun 4-də Cələloğludan hərəkət edərək, iyunun 7-də Qazaxa, 9-da isə Gəncəyə çatdı (195, s.556).

Sonra diviziyanın qalan hissə və bölmələri iki qrupa bölünərək Gəncəyə doğru hərəkətə başladı. Bu qruplara aşağıdakı hissə və bölmələr daxil idi (194, s.236):

| I qrup | II qrup |
|---|---|
| Diviziya qərargahı | 13 Qafqaz alayı |
| Onuncu Qafqaz alayı | Güclü dağ topçu divizionu |
| Doqquzuncu Qafqaz alayına mənsub 26-cı tabor | Səhiyyə bölüyü |
| Dağ topçu divizionu | 24-cü səyyar qospitalı |
| İstehkam bölüyü | Səyyar mətbəx taqımı |
| Teleqraf taqımı | |
| Orkestr bölüyü | |
| Cəmi: 147 zabit, 2812 əsgər, 698 heyvan | Cəmi: 110 zabit, 2763 əsgər, 668 heyvan |

Hər iki qrup Cələloğlu-Sadaxlı-Kərəmli-Aslanbəyli-Qazax marşrutu ilə hərəkət edirdi. Birinci qrup iyunun 11-də, ikinci qrup isə iyunun 12-də Qazaxa çatdı (194, s.236-237). Qazaxa çatan kimi qruplar dəmir yolu vasitəsilə Gəncəyə göndərildilər (195, s.556).

Bə'zi türk mənbələrində 5-ci diviziyanın şəxsi hey'ətinin sayı 6 min, Azərbaycan hissələrinin şəxsi hey'ətinin sayı 10-12 min göstərilir (221, s.40). Ancaq yuxarıdakı rəqəmlərin cəmlənməsi və 9-cu alayla 2-ci süvari alayının əlavə edilməsi 5-ci diviziyanın sayının 7 mindən az olmadığını güman etməyə əsas verir. Azərbaycanlı hərbçilərin sayına gəldikdə isə yenə yuxarıda göstərilən rəqəm şübhə doğurur. Əgər azərbaycanlılardan ibarət 10-12 *min hərbi qulluqçu* olsaydı, onda Müsəlman Korpusu komplektləşdirilmiş olardı. Əslində isə belə deyildi. Nuru Paşa Müsəlman Korpusunun vəziyyəti ilə tanışlıqdan sonra Türkiyəyə göndərdiyi məktubunda bu korpusun tərkibində cəmi 1000 nəfərin olduğunu göstərirdi (195, s.555). Onların sırasında hələ türk əsirləri də var idi. Heç şübhəsiz ki, bu rəqəm də düz deyildi. Ola bilsin ki, vəziyyətin acınacaqlı olduğunu qabartmaq üçün Nuru Paşa azərbaycanlıların sayını azaltmışdı. Çünki 1918-ci ilin aprelində Hacıqabul ətrafındakı döyüşdə müsəlman və gürcü korpuslarının 2 min nəfərinin birləşmiş dəstəsi (235, s.109) iştirak edirdi ki, onun da əksər hissəsini azərbaycanlılar təşkil edirdi. Müsəlman Korpusunun qoşunları isə yalnız Hacıqabul ətrafında olan bölmələrdən ibarət deyildi. Keyfiyyət göstəricilərinə toxunmadan həmin vaxt *Müsəlman* Korpusunun ümumi sayının ən azı 4-5 min nəfər olmasını güman etmək olar. Doğrudur, türk qoşunlarının Azərbaycana gəlməsi ilə hərbi həyatda da bir fəallaşma duyulmağa başladı, orduya könüllü yazılanların sayı xeyli artdı (194, s.237). Bununla belə, bir neçə günün ərzində 5-6 alayın birlikdə şəxsi hey'ətinin sayına bərabər könüllülərin toplandığı heç də inandırıcı deyil. İngilis kəşfiyyatının mə'lumatına görə 1918-ci il iyunun ayının ortalarında Qafqaz İslam Ordusunun tərkibində cəmi 12 min adam var *idi* (259, s.96). Fərz olunan qüvvələr nisbəti əsas tutulsa bu mə'lumat həqiqətə daha yaxındır.

Türk qoşunlarının Azərbaycana gəlməsi ilə Qırmızı Ordu ilə döyüşlərin yeni bir mərhələsi başlandı. Buna görə də əsas diqqət cəbhəyə yönəldildiyindən qoşunların yenidən qurulması, onların tə'lim-tərbiyəsinin gücləndirilməsi çağırış və təchizat işlərinin yaxşılaşdırılması döyüşlərin aparılması ilə bir vaxtda həyata keçirməli olurdu. Mövcud şəraitin ağır olmasına baxmayaraq bu istiqamətdə də müəyyən işlər görülmüşdü.

İyun ayının əvvəlində Müsəlman Korpusunun Milli hərbiyyə məktəbi nəhayət ki, fəaliyyətə başladı. Məktəbə qəbul norması 100 nəfər olsa da, orada oxumaq istəyən azərbaycanlıların sayı xeyli çox idi (180, v.67, 69). Tə'lim prosesinə Gəncədə olan türk hərbi qüvvələrindən ən yaxşı zabitlər cəlb edilmişdilər. Məktəbin təchiz edilməsində, tədris prosesinin təşkilində də türk zabitlərinin böyük xidmətləri var idi (11, 11.11.1918). Milli hərbiyyə məktəbinə türk zabiti Atif bəy rəhbərlik edirdi (11, 7.11.1918).

Döyüş hazırlığının təkminləşdirilməsinə də müəyyən diqqət yetirilirdi. Lakin bolşevik qüvvələri Gəncə üzərinə hücuma keçdiyindən qoşun hissələrində döyüş hazırlığına kifayət qədər vaxt ayırmaq mümkün deyildi. Buna görə də lazımi döyüş hazırlığı görmədən cəbhəyə göndərilmiş azərbaycanlılar arasında türklərə nisbətən daha çox itki olurdu (194, s.237).

Çağırış və səfərbərlik sahəsində görülən işlərdə də nəzərə çarpacaq irəliləyiş yaranmışdı. Əvvəlcə *hökumətin qərarı ilə* çağırışçılar üçün yaş senzi 19 yaşa salındı və 19 yaşı tamam olan hər bir azərbaycanlı hərbi xidmətə çağırılmalı idi (96, v.17). Sonra isə 1894, 1895, 1896, 1897, 1898 və 1899-cu illərdə doğulmuş və İslam dininə mənsub olan gənclərin xidmətə çağırılması barədə qərar qəbul edildi (96, v.20). Çağırış-səfərbərlik işinin təşkili, siyahıların tərtib edilməsi, əyintilərin qarşısının

alınması üçün hökumət Daxili İşlər Nazirliyinin sərəncamına 5 min rubl vəsait ayırdı (11, 11.19.1918). Hökumətin qərarı ilə Yelizavetpol Əxzi-əsgər idarəsi Azərbaycan Əxzi-əsgər idarəsi adlandırıldı və bu idarə Daxili İşlər Nazirliyinə tabe etdirildi (96, v.20).

Dövlətin iqtisadi imkanlarının məhdud olmasına baxmayaraq Azərbaycan hökuməti türk qoşun hissələrinin təchizatını qismən öz üzərinə götürdü. Hökumətin 21 iyun 1918-ci il tarixli qərarında bildirilirdi ki, hərbi hissələrin və türk qoşun hissələrinin iaşə tə'minatı bir ay müddətində bütünlüklə dövlət xəzinəsi hesabına ödənilsin (121, v.3). Mə'lumdur ki, bu dövrdə Türkiyə dövləti də maliyyə çətinlikləri ilə qarşılaşmışdı və buna görə qoşunların təchizinə vəsait ayırmaq üçün elə də böyük imkan yox idi (310, s.101). Qoşunların ərzaqla təchizatı sonradan da Azərbaycandan ödənilmiş və ərzaq ehtiyatlarının toplanmasında türk hərbi bölmələri də iştirak etmişdi (60, v.121).

Bütün qoşunların ərzaq təchizatı ilə tə'min edilməsi əkinçilik nazirinə tapşırılmışdı. Bu çətin məsələnin həlli üçün əhalidən toplanan vergilər də artırılmışdı. Hökumətin razılığı ilə Qafqaz İslam Ordusunun ərzaq ehtiyatının ödənilməsi üçün kəndlilər bağlardan, heyvandarlıqdan aldığı məhsulun onda birini orduya verməli idilər. Erməni əhalisi tərəfindən tərk edilmiş torpaq sahələrində becərilən məhsulun isə yarısı ordunun hesabına keçirilməli idi. Bundan başqa döyüş səfərlərinin hazırlanması zamanı kəndlərdən at, araba, furqon və digər əşyalar toplanırdı. Kənd əhalisinin heç də hamısının bu tələbləri eyni səviyyədə ödəmək imkanı olmadığı üçün bə'zən müəyyən narazılıqlar da ortaya çıxırdı (214, s.78).

1918-ci il iyun ayının 26-da hökumətin qərarı ilə Müsəlman Korpusu "Xüsusi Azərbaycan Korpusu" adlandırıldı (96, v.12). Hökumətin həmin tarixli başqa bir qərarı ilə isə Xüsusi Azərbaycan Korpusunun (qələrdusunun) qərargahının ştatında qismən dəyişiklik edildi və korpus komandirinin yanında diviziya rəisi səlahiyyətində xüsusi tapşırıqlar üçün general vəzifəsi tə'sis edildi (96, v.13).

Azərbaycan qoşunları, bütünlükdə Qafqaz İslam Ordusu üçün korpus sistemi saxlanılmaqda davam edirdi. İyun ayının 21-də hökumət Nazirlər Şurasının sədrinə və xarici işlər nazirinə tapşırdı ki, Qafqaz İslam Ordusunun baş komandanı Nuru Paşa ilə əlaqə yaradaraq hökumətin tərkibində Hərbi Nazirliyin yaradılması və onun fəaliyyətinin təşkili barədə məsələ müzakirə etsin. Müzakirələr zamanı hökumətlə Qafqaz İslam Ordusu arasında əlaqələrin yaradılması üçün Hərbi Nazirliyin və ya onu əvəz edəcək hər hansı bir orqanın təşkilinin məqsədəuyğunluğu nəzərdən keçirilməli idi (214, s.77).

Bu qərarın qəbulundan qısa müddət keçdikdən sonra Azərbaycan hökumətinin tərkibində hərbi işlər üzrə baş müvəkkil vəzifəsinin tə'sis edilməsindən (151, v.174) güman etmək olar ki, Hərbi Nazirliyin yaradıl-



ması məqsədəuyğun bilinməmiş və qoşunların struktur forması da elə bir dəyişiklik edilmədən saxlanılmışdı.

Türkiyədən gələn qoşun birləşmələri və hissələri də təşkilati baxımdan Xüsusi Azərbaycan Korpusunun tərkibinə daxil idi. Bu məsələ korpus komandiri Ə.Şıxlinskinin əmrində də təsbit olunmuşdur. Korpus komandirinin 27 iyun 1918-ci il tarixli, 189 saylı əmrində göstərilir ki, 5-ci türk diviziyası 3-cü nişançı diviziya adı altında Xüsusi Azərbaycan Korpusunun tərkibinə daxil edilmişdir. (178, s.45). Azərbaycan Korpusunun tərkibində mə'lumdur ki, əvvəldən iki diviziya var idi. Struktur dəyişikliyindən sonra 5-ci türk diviziyası bu korpusun 3-cü diviziyasına çevrildi. Bütün qoşunlara komandanlığı isə Nuru Paşanın rəhbərliyi altında olan Qafqaz İslam Ordusunun qərargahı edirdi.

Xüsusi Azərbaycan Korpusu da təşkilati planda bu qərargaha tabe idi. Daha doğrusu, Qafqaz İslam Ordusunun qərargahı tərəfindən rəhbərlik edilən bütün qoşun hissələri struktur vahidi kimi Xüsusi Azərbaycan Korpusunun tərkibində cəmləşdirilmişdi.

Azərbaycan korpusu komandirinin yuxarıdakı əmrinin 3-cü paraqrafında göstərilirdi ki, Nuru Paşanın əmri ilə Qafqaz İslam Ordusunun baş həkimi, qoşunların Azərbaycan dəmir yolu ilə daşınması idarəsinin rəisi, Yelezavetpol komendantı da Ə.Şıxlinskinin sərəncamına verilmişdir. Buna müvafiq olaraq Ə.Şıxlinski tibb xidmətinin təşkili ilə bağlı olan baş həkim İbrahim Xaku bəyə aşağıdakıları tapşırırdı:

1. "Xəstələrin və yaralıların evakuasiyasının təşkili
2. Korpusun hissələrinin səhiyyə vəziyyətinin ümumi nəzarət altında saxlanılması" (178, s.45).

Tibb xidmətinin təşkili, tibb bölmələrinin və məntəqələrinin vəziyyəti, habelə xəstələrin və yaralıların vəziyyəti, miqdarı barədə diviziyalardan hər gün həm korpusun həkiminə, həm də baş həkimə mə'lumat verilməli, baş həkim isə bütün mə'lumatları ümumiləşdirərək korpus komandirinə mə'ruzə etməli idi (178, v.45).

Bolşevik qüvvələrinin Gəncəyə doğru hücumu artıq başladığı üçün korpus komandiri tibb xidmətinin lazımınca təşkilinə xüsusi fikir verirdi. Onun əmri ilə 115 saylı sanitar qatarı baş həkimin sərəncamına keçirilmişdi.Bundan başqa döyüş rayonlarındakı yaralı və xəstələrin müalicəsi üçün baş həkimin göstərişi ilə Ucar stansiyasında 100 nəfərlik xəstəxana açılmışdı. Döyüş şəraitindən irəli gələn belə bir xəstəxana Yelezavetpol stansiyasında da açılmışdı. 300 nəfər üçün nəzərdə tutulan bu xəstəxanadan başqa Yelizavetpol şəhərində 200 nəfərlik bir xəstəxana da mövcud idi ki, ondan da hərbi zərurət üçün istifadə edilə bilərdi (178, v.45).

Müsəlman Korpusu Xüsusi Azərbaycan Korpusu adlandırılan kimi korpus komandirinin əmri ilə hissələrdə və hərbi müəssisələrdə yeni möhürlərin tətbiq edilməsi barədə əmr verildi. Müsəlman Korpusunun

hissələrinin möhürləri rus qoşunlarının möhürləri şəklində idi. Möhürün ortasında ikibaşlı qartal şəkli var idi, onun dövrəsinə isə rus dilində hissəsinin adı ilə nömrəsi yazılırdı (179, v.68).

Azərbaycan korpusunun hissələri və müəssisələri üçün nəzərdə tutulan möhür isə gümüş manatlıq ölçüsündə idi. Onun ortasında səkkizguşəli ulduz və aypara var idi. İti ucluqları yuxarıya doğru yönəldilmiş aypara maili şəklində olmalı idi. Möhürün yuxarı kənarı boyunca hissənin adı və sayı həm rusca, həm də azərbaycanca yazılmalı idi (178, v.44).

Azərbaycan korpusunun tərkibində yeni keyfiyyət dəyişikliyinin meydana gəlməsi və güclənməsi, onun türk hərbi yardımına dayaqlanması Bakı Xalq Komissarları Sovetinin rəhbərliyinin ciddi təşvişinə səbəb olmaya bilməzdi. Bütün Zaqafqaziyanı Sovetlərin bayrağı altında gətirmək istəyən S.Şaumyan və onun məsləkdaşları yaxşı anlayırdılar ki, Qafqaz İslam Ordusunun əl-qol açması bolşeviklərin niyyətlərinin reallaşmasına imkan verməyəcəkdir. Ona görə də Bakı XKS rəhbərliyi Rusiya bolşevik hökumətinin hərbi yardımına dayaqlanaraq mövcud bütün qüvvələri səfərbərliyə alıb qəti hücuma keçməyi və bununla da hərbi təşəbbüsü ələ keçirməyi qərarlaşdırdı.

S.Şaumyan başlanan hücumun bolşeviklər üçün uğurla nəticələnəcəyinə dərindən əmin idi. 1918-ci il iyun ayının əvvəllərində V.Leninə göndərdiyi məktubunda bildirirdi ki, biz özümüzü çox möhkəm hesab edirik (318, s.8). Görünür elə bunun üçün idi ki, Bakı bolşeviklərinin lideri Yevlaxa çatıb Kür çayı boyunca müdafiə mövqeləri tutmağı kifayət saymır, buradan Yelizavetpol və sonra da Tiflis üzrinə hücum etməyi planlaşdırırdı (282, s.300).

Malik olduqları hərbi qüvvələr də buna imkan verirdi. Qafqaz Qırmızı Ordusunun ixtiyarında olan qüvvələr nə sayca, nə də təchizat baxımından Qafqaz İslam Ordusundan heç də geri qalmırdı. Bununla belə, Qırmızı Ordunun gücləndirilməsi davam etdirilirdi. 1918-ci il may ayının sonu, iyun ayının əvvəllərində Qafqaz Qırmızı Ordusunun 19-cu və 20-ci taborlarının tə'cili təşkilinə başlanmışdı. 19-cu taborun əsasını Petrovsk şəhərini işğal etmiş bolşevik qüvvələri təşkil etməli idi. Eyni zamanda xüsusi hücum bölüyünə və Dəmir bölüyə könüllülər toplanırdı. Mühəndis və texniki bölmələrin sür'ətlə komplektləşdirilməsi üzərində də iş aparılmaqda idi (305, s.94).

Davam etdirilən bu işlərin nəticəsində iyun ayının ortalarında Qafqaz Qırmızı Ordusunun artıq 25 taboru var idi. Bu taborlar dörd nişançı briqadada birləşdirilmişdi ki, həmin briqadalar da Qırmızı Ordunun 1-ci Qafqaz korpusunu təşkil edirdi (305, s.98).

Qırmızı Ordunun sayı 18 minə çatdırılmışdı. Onun da 60-70 faizini erməni qüvvələri təşkil edirdi (202, s.114).



Qafqaz Qırmızı Ordusunun möhkəmləndirilməsi üçün Rusiya tərəfindən göstərilən hərbi yardımların da ardı-arası kəsilmirdi. 1918-ci il iyun ayının elə ilk günlərində Rusiyadan 12 ədəd dörd düyməlik top, onun ekipajı və təchizatı yüklənmiş eşelon Bakıya yola salınmışdı. Tula silah zavodundan isə xeyli sayda pulemyot, tüfəng və patron göndərilmişdi (4, s.39).

Dəniz işləri üzrə Rusiya Xalq Komissarlığı Soveti Xəzər Hərbi Donanmasının gücləndirilməsi üçün üç keşikçi gəmisi və üç minadaşıyan gəmi ayırıb onları e'tibarlı şəxsi hey'ətlə komplektləşdirmişdi (4, s.38,40).

İyun ayının sonlarına yaxın Ter-Qabrielyan Rusiyadan 4 ədəd zirehli avtomobil, 13 ədəd təyyarə və çoxlu silah, sursat, təchizat gətirdi (2, s.518). Elə həmin günlərdə Rusiya Hərbi İnqilabi Şurasına göndərdiyi xahişnamədə Bakı Xalq Komissarları Soveti 1-ci Qafqaz Qırmızı Korpusunun ehtiyacları üçün 2-3 diviziyanın, 6 ədəd təyyarənin, 6 ədəd zirehli avtomobilin, 180 pulemyotun, bir neçə topun, 180 milyon tüfəng patronunun, 25 min nəfərlik geyim komplektinin və s. ayrılmasının zəruriliyi vurğulanırdı (305, s.103).

Canlı və texniki qüvvələr artdıqca Qafqaz Qırmızı Ordusunun rəhbərliyi mühəndis-istehkam işlərinin gücləndirilməsinə də xüsusi fikir verirdi. Hərbi və dəniz işləri üzrə komissar Q.Korqanovun əmri ilə 1918-ci il iyun ayının 3-də xüsusi mühəndis-tikinti idarəsinin və onun sərəncamında olan 5 tikinti dəstəsinin, 4 fəhlə artelinin təşkilinə başlanmışdı (63, v.16).

Nəhayət, kifayət qədər qüvvə və ehtiyat yaradıldıqdan sonra Bakı XKS hərbi və dəniz işləri üzrə komissar Q.Korqanov 1918-ci il iyun ayının 4-də 1-ci Qafqaz Qırmızı Korpusunun Zaqafqaziya dəmir yolu boyunca Hacıqabuldan qərbə doğru hücuma keçməsi barədə 8 saylı əmr imzaladı. Həmin əmrə müvafiq olaraq Qırmızı Ordunun hissələrinin hücumu iyun ayının 6-da başlanmalı idi. Qoşunların döyüş fəaliyyətinə ümumi rəhbərliyi komissar Q.Korqanov və onun yanında yaradılmış Hərbi Şura öz üzərinə götürürdü (63, v.6).

Döyüş şəraitində qoşunların idarə edilməsini nizamlayacaq bu əmrlə briqada komandirləri yanında qırmızı komissarlar da tə'yin edilmişdi. 1-ci briqadanın komissarı A.Quloyan, 2-ci briqadanın komissarı Ter-Sarkisov, 3-cü briqadanın komandiri A.Qabişev, artilleriya rəisi yanında isə komissar T.Şaumyan təsdiq edilmişdi (63, v.7). Yə'ni qoşun hissələrinin komissarlarının əsasən ermənilərdən tə'yin edilməsi onun milli etnik tərkibinə və izlədiyi niyyətlərin mahiyyətinə tamamilə müvafiq idi. Hərəkətə başlamazdan əvvəl, iyun ayının 6-da Q.Korqanovun korpusun əsgər və zabitlərinə ünvanlanmış müraciət xarakterli əmri də başlanan hücumun nəyə xidmət etdiyini açıq göstərirdi. Həmin əmrdə deyilirdi: "Yoldaş 1-ci Qafqaz Qızıl Korpusunun əsgərləri! Sizin üzərinizə Zaqafqaziyada əksinqilaba birinci güclü zərbə endirmək, milliyyətindən asılı olmayaraq bütün

fəhlə və kəndliləri birləşdirib üsyana qaldıran bir qüvvə olmaq kimi çox böyük bir vəzifə düşür. Qələbə çalmaqla siz Qafqaz xalqlarını məhv olmaqdan xilas edəcəksiniz. siz neft sənayesi mərkəzi Bakını bütün Sovet Respublikası üçün xilas edəcəksiniz... Sizə Şimali Qafqazdan və Rusiyadan mümkün olan bütün kömək gəlir və gələcəkdir" (2, s.508).

Bakı-Tiflis dəmir yolu boyunca hərəkət etməli olan Qafqaz Qırmızı Korpusunun əsas qüvvələri Hacıqabul stansiyasına cəmləşdiriləndən sonra iyun ayının 10-da buradan hücuma başlandı (2. s.508). S.Şaumyanın özünün e'tiraf etdiyinə görə, Yelizavetpol üzərinə göndərilən bu qüvvələrin sayı 12-13 min nəfər idi (2, s.518).

Birinci Qafqaz Qırmızı korpusunun əsas qüvvələri hücuma keçəndə onların qarşısında hələlik Müsəlman Korpusunun azsaylı bölmələri dayanmışdı. Bu bölmələrə polkovnik Maqalov rəhbərlik edirdi və onun qərargahı Ucarda yerləşirdi. Qarşıda isə onun kiçik bir qüvvəsi var idi. Bu qüvvə Kürdəmir ətrafında idi və ona polkovnik Qlebov komandirlik edirdi. Polkovnik Qlebovun ixtiyarında bir neçə top da var idi (231, s.190).

Polkovnik Qlebovun azsaylı hərbi qüvvəsi Qafqaz Qırmızı Korpusunun əsas qüvvələrinin qarşısını almağa kifayət deyildi. Türkiyədən gələn hərbi qüvvələr isə hələ heç Gəncə ətrafına bütünlüklə toplaşa bilməmişdilər və ona görə Qafqaz Qırmızı Korpusunun ilk zərbəsini Müsəlman Korpusunun onsuz da elə bir gücü olmayan bölmələri dəf etməli idi.

İyun ayının 11-də Qırmızı Ordu hissələri Sığırlı stansiyasında olan azsaylı milli qoşun bölmələrinin üzrinə hücum etdilər. Toplardan atılan atəş bolşeviklərin zirehli qatarının hərəkətini dayandırmağa qadir deyildi. Ona görə də Qırmızı Ordu ciddi bir müqavimətə rast gəlmədən iyunun 11-də axşam saat 9-da Sığırlı stansiyasını işğal etdi (2, s.507).

Milli qoşun hissələrinin xeyli zəif olduğunu görən Qırmızı Korpusun komandanlığı iyunun 12-də hücumu davam etdirdi. Kürdəmir ətrafında baş verən növbəti döyüşdə bolşevik qüvvələrinin uğuru ilə sona çatdı. Müsəlman Korpusunun süvariləri müqavimət göstərməyə cəhd etsələr də düşmən xeyli güclü idi. Ona görə Kürdəmir kəndi və stansiyası da bolşevik qüvvələrinin əlinə keçdi (13, 15.06.1918).

Kürdəmir ətrafındakı döyüşdən sonra hər iki tərəf öz qüvvələrinin yenidən qruplaşdırdı. Gəncədən Müsəlman Korpusunun zirehli qatarı polkovnik Maqalovun sərəncamına göndərildi (305, s.110). İyunun 13-14-də isə bura qatarla türk qoşun hissələri gəldi. Həmin hissələr Ucar, Müsüslü və Bərgüşad stansiyalarından döyüş mövqelərinə göndərildilər. Türk qoşunlarının bir dəstəsi Göyçay istiqamətinə göndərildi. Burada onlar Şamaxı istiqamətindən hücum edən sovet qoşunlarının qarşısını kəsməli idi (230, s.472).

Bütünlükdə Müsəlman Korpusunun qüvvələri ilə türk qoşun hissələri üç dəstədə qruplaşdırıldılar. Əsas dəstə Bakı-Tiflis dəmir yolu boyunca



hərəkət etməli idi. Bir dəstə Şimalda, Göyçay-Şamaxı və Bakı xətti boyunca döyüş aparmaq, bir dəstə isə cənuba Muğana doğru irəliləmək vəzifəsi almışdı (305, s.110).

Kürdəmiri tutduqdan sonra Q.Korqanov öz qərərgahını buraya köçürdü. 2-ci briqadanın hissələri də bu istiqamətdə cəmləşdirildi. Qafqaz Qırmızı Ordusunun 1-ci və 3-cü briqadaları isə sağ cinaha yerləşdırildi. Onlar Qaraməryəm kəndi ətrafında döyüşqabağı mövqe tutdular (305, s.110).

Qarşı dayanan tərəflər arasındakı növbəti döyüş iyun ayının 16-da Qaraməryəm ətrafında oldu. Səhər saat 9-da Amazaspın komandır olduğu briqadanın qarşıda mövqe tutmuş taboru Müsəlman Korpusunun bölmələri üzərinə hücuma keçdi. Bu vaxt türk qoşun hissələri hələ gəlib həmin məntəqəyə çatmamışdılar. Bolşevik mənbələrində olan mə'lumatlara görə Müsəlman Korpusunun qüvvələri 2 min nəfər idi. 7 saat davam edən bu döyüşdən sonra milli qoşun hissələri geri çəkilmək məcburiyyətində qalmışdılar (2. s.514).

Bu istiqamətdə göndərilmiş olan türk qoşunlarının 10-cu Qafqaz alayı da Göyçaya elə həmin gün gəlib çatmışdı. Bir dağ batareyası ilə qüvvətləndirilmiş olan bu alay səhərisi gün. yə'ni iyunun 17-də dərhal Qaraməryəm kəndi istiqamətinə yola salındı (195, s.558).

İyun ayının 18-də Qaraməryəm ətrafında daha bir döyüş baş verdı. Həmin döyüşdə artıq türk qoşunlarının 10-cu alayı da iştirak edirdi. Əvvəlcə üstünlük də elə onların əlində idi. Saat 12-də başlanan döyüşdə Qafqaz İslam Ordusunun hissələri düşmənin sol cinahını xeyli sıxışdıraraq 20 verst irəliləyə bilmişdilər (2, s.514). Lakin döyüşün təşkilində yol verilən səhvlər tezliklə hərbi təşəbbüsün əldən verilməsi ilə nəticələndi. Sovet qoşunlarının 16-cı və 17-ci taborları sol cinahla irəliləməyə çalışan süvarilərin qarşısını kəsməklə bərabər onları güclü atəş altına saldılar (305, s.111). Düşmən mövqelərinin dərinliklərinə doğru irəliləmiş olan türk süvariləri cinahlarda e'tibarlı mühafizəni tə'min edə bilmədikləri üçün elə ilk döyüşdə çox ciddi itkilərə yol verdilər. Qafqaz İslam Ordusunun 28-ci taboru iki ədəd dağ topu, 200-dən artıq döyüşçü itirdi (195, s.558). Q.Korqanovun və S.Şaumyanın Moskvaya göndərdikləri teleqramda Qafqaz İslam Ordusunun itkisinin 500 nəfər olduğu göstərilirdi. Sovet qoşunlarının əlinə 1 ədəd pulemyot və digər hərbi təchizat da keçmişdi (2, s.514).

İyun ayının 18-də Qaraməryəm ətrafında olanda döyüşün nəticələri Qafqaz İslam Ordusunun komandanlığına da çox ağır tə'sir bağışlamışdı. Bunu Türkiyənin 5-ci Qafqaz diviziyasının qərargah rəisi podpolkovnik Rüştü də e'tiraf edirdi (239, s.112). Qaraməryəm ətrafındakı döyüşün nəticələrindən xəbər tutan kimi Nuru Paşa, Əlağa Şıxlinski və 5-ci diviziyanın komandiri dərhal Göyçaya yola düşdülər (195, s.558-559).

İyun ayının 18-də Müsüslü yaxınlığında da Türk-Azərbaycan və bolşevik qoşunları arasında döyüş baş verdi. Qafqaz Qırmızı Ordusu 21-ci taborunun 2 bölüyü döyüş tapşırığını yerinə yetirərkən Türk-Azərbaycan döyüşçüləri ilə qarşı-qarşıya gəldilər. Sovet qoşunlarının döyüşçüləri heç bir müqavimət göstərə bilməyərək öz mövqelərini tərk etmək məcburiyyətində qaldılar. Gəncəyə doğru dayanmadan irəliləyəcəklərinə əmin olan sovet komandirləri əsgərlərin geri çəkilməsini xəyanət kimi qiymətləndirdilər və onlar tərksilah edilərək tribunala verildilər (239, s.114).

Qırmızı Ordu döyüşçülərinin döyüş mövqeyindən geri çəkilməsi ilə bağlı bu yeganə fakt deyildi. Baxmayaraq ki cəbhədə təşəbbüs Qafqaz Qırmızı Ordusunun əlində idi, bə'zi bölmələr çox güman ki, strateji planda uğursuzluğa düçar olacaqlarını anlayır və cəbhədən uzaqlaşmağa çalışırdılar. Qafqaz Qırmızı Ordusunun 7-ci taborunun bir bölüyü də döyüş tapşırığını yerinə yetirməkdən imtina etmiş və bunun üçün tərksilah edilərək Bakıya göndərilmişdi (2, s.524).

Qaraməryəm ətrafındakı ağır döyüşdən sonra bir neçə gün sakitlik yarandı. Bu sakitlikdən hər iki tərəf öz planlarına uyğun olaraq istifadə etməyə çalışırdı. Qırmızı Ordu irəli hərəkət etdikcə Sovet qüvvələri Azərbaycan kəndlərinə daxil olur, əhalidəki bütün silahları yığışdırırdılar. (61, s.10). Camaatı Türk-Azərbaycan qoşunları əleyhinə qaldırmaq üçün onların arasında Bakıdan gəlmiş xüsusi təbliğat dəstəsi fəaliyyət göstərirdi. Həmin təbliğat dəstəsinə F.Solntsev rəhbərlik edirdi (13, 2.07.1918).

Qırmızı Ordunun nəzarət sahəsinə düşən kəndlərdə Sovet hakimiyyəti e'lan edilir, orada bolşevik orqanları yaradılırdı. İyun ayının 22-də Kürdəmir ətrafındakı 12 kənddə sovet təşkil edilmiş və bu sovetlərin güc dayağı olan qırmızı milli dəstələr formalaşdırılmışdı (13, 2.07.1918).

Bolşeviklər yaranmış sakitlikdən həm də qoşunların təchizatı üçün istifadə edirdilər. Sovet Rusiyasından alınan silahlar və texnika dərhal cəbhə xəttinə yola salınırdı (230, s.475).

Qırmızı Ordunun canlı qüvvələrinin bərpası və yeni hissələrin komplektləşdirilməsi üçün iyun ayının 24-də Bakı XKS tərəfindən 1893-1897-ci illərdə anadan olanların çağırışı e'lan edildi (260, s.79). İyun ayının 21-də 1-ci Dəmir dəstənin komissarı müraciətlə əhalini bu dəstəyə yazılmağa çağırırdı (11, 21.06.1918). İyun ayının 22-də isə Bakı Sovetinin İcraiyyə Komitəsi yeni Sovet taborunun təşkili üçün Bakı rayonlarının bolşevik fəallarına çağırış qəbul etdi (11, 23.06.1918).

Qaraməryəm ətrafındakı döyüşün nəticələri Qafqaz İslam Ordusunun komandanlığı tərəfindən də ciddi təhlil olundu, vəziyyətin düzəldilməsi üçün yollar arandı, hissələrin idarə edilməsini gücləndirmək üçün iyun ayının 20-də 5-ci diviziyanın bütün qərargahı Göyçaya köçürüldü. Son döyüşdəki uğursuzluqdan sonra şəxsi hey'ət arasında əhval-ruhiyyənin aşağı olması ilə bərabər sursat çatışmazlığı da hiss olunmaqda idi (195, s.559). Bu da ondan irəli gəlirdi ki, türk qoşunlarında olan topların mərmiləri Türkiyədən gətirilməli idi. Azərbaycan hissələrinin sərəncamında olan topların mərmilərindən türk toplarında istifadə edilməsi mümkün deyildi (194, s.238).

İyun ayının 21-də 5-ci diviziyanın komandiri, Nuru Paşanın adına yazdığı raportda növbəti döyüşə hazırlaşmaq üçün ən əvvəl məhz sursat və mərmi ehtiyaclarının ödənilməsinin zəruriliyini bildirirdi. Həmin raportla tanış olduqdan sonra Nuru Paşa 5-ci diviziyanın komandirinə aşağıdakı məzmunda əmr göndərdi: "Bütün ümid 5-ci Qafqaz diviziyanın bolşevik qüvvələrini məğlub etməsindədir. Zaman daha artıq gözləməyə müsaid deyil. Geridən təzə qüvvə gələcəyinə dair bir işarə də yoxdur. Diviziyanın geridə qalan qüvvələri 1918-ci il iyunun 23-24-də toplanış məntəqəsinə yetişə biləcəkdir. İyunun 26-na qədər toplanan könüllülər də diviziyaya göndəriləcəklər. 1918-ci il iyunun 27-və ya 28-də hücum edilə bilər. Buna görə də hazırlıq görülməlidir" (195, s.559).

Nuru Paşa şübhə etmirdi ki, ilk uğursuzluğa baxmayaraq Türk-Azərbaycan qoşunları mövcud imkanları tam səfərbərliyə almaqla hərbi təşəbbüsü ələ keçirə bilər. Ona görə də o, əlavə köməyin göndərilməsinin zəruriliyini istisna etmədən yeni döyüşə hazırlaşmaq üçün əmr verdi.

Cəbhə xəttində baş verənlər Azərbaycan hökumətini də ciddi narahat etməkdə idi və ona görə də Qafqaz İslam Ordusunun gücləndirilməsi üçün mövcud imkanlardan istifadə edilməsinə cəhd göstərilirdi. Xarici işlər naziri İstanbulda səfərdə olan "Müsavat" nümayəndə hey'ətinin rəhbəri M.Ə.Rəsulzadəyə baş verən döyüşlərin nəticələrinin hələlik ümidverici olmadığını çatdırmaqla Türkiyədən Azərbaycana əlavə bir diviziyanın göndərilməsinə nail olunmasının və bunun üçün müvafiq işin aparılmasının məqsədəuyğunluğunu vurğulayırdı (230, s.476).

Sovet tarixşünaslığında Qaraməryəm döyüşündən dərhal sonra Türk-Azərbaycan qoşunlarına əlavə qüvvələr gətirildiyi və onların sayının 15 min nəfərə çatdırıldığı iddia edilsə də (230, s.477; 305, s.117), əslində burada elə bir dəyişiklik baş verməmişdi. Çünki Türkiyədən hərəkət edən qüvvələrin yalnız iyunun axırına gəlib çatacağı gözlənilirdi. İyun ayının 21-də Göyçay ətrafında mövqe tutmuş 5-ci diviziyanın qüvvələri aşağıdakılardan ibarət idi: 225 zabit, 5277 əsgər, 4342 tüfəng, 36 pulemyot, 14 dağ topu, 1939 heyvan. Burada döyüşən Azərbaycan qüvvələri isə belə idi: 30 zabit, 727 əsgər, 605 tüfəng, 21 pulemyot və 6 top (195, s.560).

Dəmir yolu boyunca yerləşmiş Cənub dəstəsinin tərkibi isə belə idi: 4-cü piyada alayı (Azərbaycan alayı), 1-ci və 2-ci taborlar, iki süvari bölüyü, iki qrup dağ və səhra topları. Bu dəstəyə verilən səhra topçu taqımı öküzlərlə daşınırdı. Ona görə də onların şosse yoldan kənara aparılması bə'zən müəyyən çətinliklərlə müşayiət olunurdu. Dəstəyə Həbib bəy Səlimov rəhbərlik edirdi (194, s.238).

Dəmir yolu boyunca Qafqaz Qırmızı Ordusunun qüvvələri Müsüslü stansıyası yaxınlığında dayanmışdı. Dəmir yolunun hər iki tərəfi keçilməz bataqlıq olduğundan və bunun müdafiə üçün yaxşı imkan yaratdığından Qırmızı Ordunun əsas qüvvələri Şimal cəbhəsində yerləşdirilmişdi. Türk-Azərbaycan qoşunlarının da əsas qüvvələrinin bu istiqamətdə yerləşdirilməsindən aydın idi ki, yaxın günlərdə əsas döyüşlər də məhz burada baş verəcəkdir. Şamaxı-Göyçay yolu boyunca Qırmızı Ordunun 3-cü briqadası və 2-ci briqadanın bir hissəsi mövqe tutmuşdu. Onlardan bir qədər şimalda isə 4-cü briqadanın hissələri mövqe tutaraq Dağıstan sarıdan gələ biləcək müsəlman qüvvələrinin yolunu kəsmişdilər (2, s.524).

İyun ayının 28-nə planlaşdırılan hücumla Türk-Azərbaycan qoşunları əvvəlki uğursuzluğun əvəzini çıxmaq və irəli hərəkət etməklə təşəbbüsü əllərinə almaq istəyirdilərsə, növbəti döyüş üçün bolşeviklər qarşılarına daha böyük vəzifələr qoymuşdular. Nəzərdə tutulmuşdu ki, Türk-Azərbaycan qoşunlarına əsas zərbə şimal istiqamətindən vurulsun. Qırmızı Ordunun qüvvələri sağ cinahdan Qafqaz İslam Ordusu hissələrini əhatə etməklə dəmir yoluna çıxmağı, buradakı hissələrə də zərbə vurub Kür çayı boyunca müdafiə mövqeləri tutmağı planlaşdırırdılar. Hərbi və dəniz işləri üzrə Bakı komissarının müavini B.Şeboldayevin fikrincə, Kür üzərindəki körpüyə nəzarət etməklə möhkəm müdafiə xətti yaratmaq olardı. Çünki Kür çayı boyunca bataqlıq sahələrdən keçə bilməyən Türk-Azərbaycan qoşunlarının qarşısını burada e'tibarlı şəkildə kəsmək olardı. Bununla bərabər, B.Şeboldayev gizlətmirdi ki, arxada da müdafiə xətləri yaradılmaqdadır. Bu müdafiə xətlərinin biri Hacıqabul-Ağsu arasındakı dağlardan keçməli, o biri isə Bakı şəhərini əhatə edən hündürlüklər boyunca qurulmalı idi. Hər iki xətdə yenicə yaradılmış plan mühəndis-tikinti hissələri müdafiə işləri aparırdılar (2, s.524-525).

Qırmızı Ordunun komandanlığı Türk-Azərbaycan qoşunlarının iyunun 28-də hücuma hazırlaşdığından xəbər tutan kimi onları qabaqlamağı qərara aldı. İyun ayının 27-də Sovetlərin 3 taboru əvvəldən də planlaşdırıldığı kimi, cəbhənin sağ cinahından Göyçayla Qaraməryəm arasında şosse yolunun şimal tərəfində yerləşən 10-cu Qafqaz alayının şimal tərəfindən adlayaraq ona arxadan zərbə vurmağa cəhd göstərdi (195, s.560). Bu qəfil başlanan hücuma bolşevik qüvvələrindən 6-7 tabor, 11 ədəd top və 12-14 pulemyot cəlb edilmişdi (305, s.117). Həmin qüvvələr sür'ətli hücumla Türk-Azərbaycan qoşunlarını çaş-baş salıb irimiqyaslı döyüş üçün uğurlu zəmin yaratmağa cəhd göstərsələr də, qarşıya qoyulan məqsədə nail ola bilmədilər. İslam Ordusu cəbhəsində həyata keçirilən operativ tədbirlər düşmənin qarşısını kəsməyə imkan verdi. 5-ci Qafqaz diviziyasının ehtiyat qüvvəsi olan 25-ci taborun və 2-ci süvari alayının döyüşə cəlb edilməsi ilə bolşevik qüvvələri öz əvvəlki mövqelərinə çəkilmək məcburiyyətində qaldılar (195, s.560).



İyun ayının 28-dəki sakitlikdən sonra iyunun 29-da döyüşlər yenidən başladı. Həmin döyüşdə Azərbaycan bölmələri ilə 10 və 13-cü alaylar cəbhənin mərkəzində, 2-ci süvari alayı isə düşmənin sol cinahında mövqe tutmalı idi. 2-ci süvari alayına Qırmızı Ordu qüvvələrini sol cinahdan adlayıb onlara arxadan zərbə endirmək tapşırığı verilmişdi (195, s.560). Səhər tezdən başlanan döyüşdə mövqe dəyişikliyini də məhz bu süvari alayı yaratdı. Alay süvarilərinin sür'ətlə sovet qüvvələrinin sol cinahına çıxması və onları əhatəyə almaq təhlükəsi buradakı Qırmızı Ordu hissələrinin geri çəkilməsi ilə nəticələndi. Onların geri çəkilməsi isə cəbhənin digər sahələrindəki bolşevik qüvvələrinin fəaliyyətinə tə'sir göstərdi. Nəticədə Qaraməryəmin qərb tərəfi Qafqaz İslam Ordusu hissələrinin əlinə keçdi (66, v.18; 196, s.561).

Döyüş hər iki tərəf üçün ağır hava şəraitində keçirdi. Hədsiz yüksək olan istilər hərbçilərin susuzluqdan əziyyət çəkməsinə səbəb olurdu. Türk-Azərbaycan qoşunları bu çətinliyə daha yaxşı dözüm göstərdilər və nəticədə döyüşlərin getdiyi müddətdə ilk dəfə nəzərəçarpacaq üstünlük əldə edildi.

İyun ayının 30-u Qırmızı Ordu hissələrinin qəfil hücumu ilə başladı. Səhər tezdən saat 6.15-də Əmirovun (ermənidir – M.S) komandanlığı altında əsasən ermənilərdən təşkil edilmiş olan 100 nəfərlik bir dəstə 2 topun və 2 pulemyotun müşayiəti ilə şimal tərəfdən, Pezovənd kəndindən Göyçay üzərinə hücuma keçdilər. Qəfil şəkildə və sür'ətlə həyata keçirilmiş bu hücumla bolşevik qüvvələri Göyçaya daxil ola bildilər. Erməni əsgərlərin top atəşləri, talanları camaat arasında çaxnaşmaya səbəb oldu. Erməni-daşnak qırğınlarından canını qurtarmağa çalışan əhalinin çoxu hər şeyini ataraq Ucara doğru üz tutdu (195, s.561).

Qırmızı Ordu qüvvələrinin belə sür'ətlə manevr edəcəyi Türk-Azərbaycan qüvvələrinin komandanlığı üçün çox gözlənilməz və təhlükəli olmuşdu. Əmirovun dəstəsinin Göyçayda qalması Türk-Azərbaycan qoşunlarının mühasirəyə düşmək qorxusu yaradırdı. Qüvvələr kifayət qədər olmadığı üçün cəbhənin digər nöqtələrindəki hissələrin və bölmələrin Göyçay istiqamətinə atılması isə məqsədəuyğun bilinmirdi. Çünki bu, Sovet qüvvələrinin bütün cəbhə boyu hücuma keçməsi və Türk-Azərbaycan qoşunlarına çox ciddi zərbə vurulması ilə nəticələnə bilərdi.

Qafqaz İslam Ordusu komandanlığının qərarı ilə Azərbaycan könüllü süvariləri bölməsi, 5-ci diviziyanın ehtiyat qüvvəsi olan 25-ci piyada taboru bir top taqımı ilə Göyçaya göndərildi. Eyni zamanda Nuru Paşa əmr etdi ki, Qafqaz İslam Ordusunun qərargah rəisi Nazim bəy Gəncədəki 27-ci piyada taborunun iki bölüyünü qatar vasitəsilə dərhal Göyçaya çatdırsın. Nazim bəy həmin gün bu piyada bölükləri ilə Ağdaşa gəldi və buradan faytonlarla piyada bölüklərini və Ağdaşa toplanmış olan könüllüləri Göyçaya göndərdi. Bu könüllülər həm süvarilərdən, həm də piyada-

lardan ibarət idi. Vəziyyətin çox ağır nəticələrə gətirib çıxara biləcəyindən ehtiyat edən Türk-Azərbaycan qoşunları komandanlığı nəhayətdə hətta 10-cu Qafqaz alayının da Qaraməryəm xəttindən çıxardılıb Göyçaya göndərilməsi üçün əmr verdi. Ancaq bu alay Göyçaya çatana kimi orada cəmlənmiş olan qüvvələr Əmirovun dəstəsini geri çəkilməyə məcbur etdilər. Döyüşün gedişində Sovet qüvvələrindən 2 ədəd top və 2 ədəd pulemyot ələ keçirildi. Veysəlli kəndinə qədər gəlib çıxmış olan 10-cu alay isə yenidən Qaraməryəmə göndərildi (195, s.561).

Göyçayı tutmaqla Qafqaz İslam Ordusunun arxasına keçməyə cəhd göstərən bolşevik qüvvələri geri atıldıqdan sonra əsas diqqət Qaraməryəmin şərqində olan mövqelərin *tutulmasına istiqamətləndirildi. Bəyənilmiş* plana görə Türk-Azərbaycan qoşun hissələri Qaraməryəmin şərq tərəfindən sür'ətli hücuma keçib İncə, Ərəbmehdibəy, Padar kəndləri istiqamətində irəliləməli və sovet qüvvələrinin geriyə çəkilmək yolunu kəsməli idi.

10-cu, 13-cü alayların qətiyyəti bu planı müəyyən qədər həyata keçirməyə, Qaraməryəmin şərq tərəfini nəzarət altına almağa imkan verdi. Nəticədə Türk-Azərbaycan qoşunlarını mühasirə etmək istəyən Qafqaz Qırmızı Ordusunun hissələrinin mühasirəyə düşmək təhlükəsi yarandı. Gərgin döyüşlər Qırmızı Ordunun hissələrinə ciddi itkilər verdi və onlar Bakıdan yenicə gəlib çıxmış *olan zirehli avtomobillərin köməyi ilə məhv* olmaq təhlükəsindən nicat tapdılar (16, N 3-4, 1938, s.19-20).

Beləliklə, Göyçay və Qaraməryəm ətrafında iyunun 27-30 arasında davam edən döyüşlər Qafqaz Qırmızı Ordusu hissələrinin məğlubiyyəti ilə başa çatdı və bu hissələr Ağsuya tərəf sıxışdırıldı. Bu uğursuzluqla barışa bilməyən sovet qüvvələri cəbhədəki əvvəlki mövqelərini bərpa etmək üçün yeni bir cəhdə əl atdılar. Əmirovun komandanlığı altında olan bu dəstə cəbhənin şimal hüdudları boyunca hərəkət edib bir də Göyçayı tutdu. Ancaq Əmirovun dəstəsinin bu cəhdi artıq cəbhədəki vəziyyəti bolşeviklərin xeyrinə dəyişdirməyə qadir deyildi və qısa müddətdən sonra həmin dəstə Göyçaydan vurulub çıxarıldı *(305, s.119)*.

Göyçay-Qaraməryəm ətrafındakı döyüşlər cəbhədə dönüş nöqtəsinin başlanğıcını qoydu. Qafqaz Qırmızı Ordusunun hücumları dayandırıldı və onlar dərin müdafiəyə çəkildilər. Bolşevik qüvvələri bu döyüşdən sonra bir daha hərbi təşəbbüsü ələ ala bilmədilər. Döyüşlərə uğursuzluqla başlayan Türk-Azərbaycan qoşunları isə Göyçay-Qaraməryəm döyüşü ilə müdafiədən hücuma keçdilər və hərbi təşəbbüsü birdəfəlik öz əllərində cəmləşdirdilər. Sovet tarixşünaslığında Türk-Azərbaycan qoşunlarının Göyçay-Qaraməryəm ətrafındakı uğuru onların say üstünlüyünə malik olması ilə əlaqələndirilsə də (305, s.119), döyüşdə hansı hissələrin iştirak etməsi və onların say tərkibinin nəzərdən keçirilməsi Göyçay-Qaraməryəm ətrafındakı döyüşlərdə Türk-Azərbaycan qoşunlarının say üstünlü-



*yünə malik olmadığını sübut edir. Əksinə* sovet qüvvələrinin tərəfində olan say üstünlüyünü azaltmaq üçün azərbaycanlıların könüllü bölmələri təşkil edilir və birbaşa cəbhəyə göndərilirdi.

Qafqaz İslam Ordusu komandanlığının qoşunların möhkəmləndirilməsi üçün əlavə qüvvələr göndərilməsi barədə xahişlərinə uyğun olaraq iyun ayının 30-da 38-ci alay Azərbaycana yola salındı. Həmin alaya aşağıdakı qüvvələr daxil idi: 60 zabit, 2475 əsgər, 2092 tüfəng, 16 dəzgahlı pulemyot, 4 güclü dağ topu, 1 güclü dağ batareyası (194, s.237). İyul ayının ilk günlərində isə Üçüncü ordunun ehtiyatında olan 350 nəfərlik dəstə Azərbaycana gəldi (194, s.237).

*Türkiyədən gələn yeni qüvvələr Qafqaz İslam Ordusu hissələrinin* xüsusən ilk döyüşlərdə daha çox mə'ruz qaldığı itkiləri bərpa etməklə bərabər qoşunların zərbə qüdrətini daha da artırmalı idi. Həmin qüvvələr isə Azərbaycana Göyçay-Qaraməryəm döyüşündən sonra gəlib çıxmışdı.

Göyçay-Qaraməryəm döyüşünün nəticələrinin səbəbi hər şeydən əvvəl tərəflərin qarşılarına qoyduğu vəzifələrin xarakteri ilə bağlıdır. Cəbhənin bir tərəfində Azərbaycanı bolşevik bayrağı altına gətirmək istəyən və qeyri-azərbaycanlılardan təşkil edilən bolşevik-daşnak qüvvələri dayanırdısa, digər tərəfində Azərbaycanı bolşevik-daşnak talanlarından, Bakı, Şamaxı, Quba qırğınlarının təkrarlanmasından qorumağa çalışan Azərbaycanın mil*li qüvvələri və onların müttəfiqləri olan türk hərbi qüvvələri dayanmışdı*lar. Azərbaycanı bolşevik-daşnak hökmranlığından azad etmək istəyi Azərbaycanın əhalisini vahid məqsəd ətrafında səfərbər olmağa sövq etdi və bu yekdillik güclü bir sədd kimi bolşevik-daşnak qoşunlarının qarşısında dayandı.

O biri tərəfdən döyüşün gedişi göstərdi ki, Türk-Azərbaycan qoşunları hərbi keyfiyyətləri baxımından heç də bolşevik-daşnak qüvvələrindən geri qalmır. Döyüşün təşkilinin, idarə edilməsinin əsaslandırılması, operativliyi, vəziyyətə uyğun olaraq vəzifələrin vaxtında dəqiqləşdirilməsi, müdafiə ilə hücumun düzgün əlaqələndirilməsi, atəş vasitələrindən səmərəli *istifadə edilməsi əldə edilən hərbi uğurun əsas səbəbləri idi. Döyüşdə* Azərbaycan qüvvələri də çox fəal iştirak edirdi. Bir çox milli zabitlərin yüksək komandirlik bacarığı türk zabitlərinin də nəzərindən qaçmırdı (194, s.237).

Göyçay-Qaraməryəm yaxınlığındakı döyüşün başlandığı gün, yəni iyunun 27-də cəbhənin cənub səmtində də Sovet qoşunları ilə Türk-Azərbaycan qoşunları arasında döyüş getdi. Həmin döyüşlər əvvəlcə Cavad qəzasının Qarabucaq və Surra kəndləri ətrafında baş verdi. Səhər saat 10-da yeni təşkil edilmiş Sovet dəstəsinin qüvvələri türk -Azərbaycan qoşunlarının nəzarəti altında olan Surra kəndi üzrinə hərəkət etdilər. Burada tərəflər arasında iki saatlıq döyüş baş verdi. Sovet dəstəsini *Kür çayı ilə* bura gəlmiş hərbi gəmilərin artilleriyası da müdafiə edirdi. Ona görə də

Türk-Azərbaycan qoşun bölmələri güclü müqavimət göstərə bilməyərək geri çəkilmək məcburiyyətində qaldılar (13, 2.07.1918).

Ertəsi gün səhər tezdən saat 4-də Surra ilə Qarabucaq kəndləri arasında döyüş yenidən qızışdı. Bu dəfə də Kür çayında dayanan hərbi gəmilərin aramsız top atəşləri Türk-Azərbaycan qoşunlarını öz mövqelərini tərk etməyə məcbur etdi. Onlar geri çəkilərkən Ərəbqardaşbəyli kəndi yaxınlığında yeni mövqelər tutub sovet dəstəsinin qarşısını kəsməyə cəhd göstərdilər. Lakin bu cəhd də nəticə vermədi (13, 2.07.1918).

Burada döyüşən sovet dəstəsinin tərkibində 2 mindən çox piyada, 12 pulemyot və altı ədəd top var idi. Dəstə eyni zamanda Kür çayından 2 hərbi gəmi və bir nəqliyyat gəmisi ilə müşayiət olunurdu (195, s. 564). Ancaq Muğanın bolşevik komissarı bu qüvvə ilə də kifayətlənmir, bölgənin rus əhalisi arasında səfərbərlik keçirərək qüvvələrin sayını 6 min nəfərə çatdırmağı planlaşdırırdı. Bu qədər qüvvənin silahlandırılması üçün zəruri olan silah və sursatı isə komissar Bakıdan istəyirdi. (2, s. 534). Lənkəran-Muğan zonasının nəzarət altında saxlanması bolşeviklər üçün strateji əhəmiyyətə malik idi. Çünki burada artıq xeyli taxıl toplanmışdı. Həmin taxılın qorunması və sonra da Bakıya çatdırılması şəhər əhalisinin çörəklə tə'min edilməsinin əsas yollarından biri idi. Muğanın komissarı səfərbərlik keçirilməsini və yaradılan qüvvələrə Bakının xüsusi qayğı göstərməsinin zəruriliyini məhz bu məsələ ilə bağlayırdı (2, s. 534).

Surra-Qarabucaq kəndləri ətrafında baş verən döyüş də Türk-Azərbaycan qoşunlarının Muğana gəlməsinin qarşısının alınmasına xidmət edirdi. Həmin döyüşün uğursuz nəticəsi barədə xəbər alandan sonra Cavad dəstəsinin komandiri bolşevik qüvvələrinə qarşı bir piyada bölüyü, bir pulemyot taqımı və bir dağ topundan ibarət qrup göndərdi. Salyan ətrafındakı bu qrup buradakı Türk-Azərbaycan qoşun bölmələri ilə birləşərək bolşevik qüvvələrinə qarşı döyüşə girdi. İyul ayının 2-də bolşevik qüvvələri Türk-Azərbaycan qoşun bölmələrinin hücumunu dəf edə bilməyərək Bakıya doğru geri çəkildilər. Türk mənbələrinə görə bu döyüşdə bolşevik qüvvələri 600-ə qədər itki verdi (195, s. 565).

Bolşevik qüvvələrinin əsasını təşkil edən daşnak elementləri Salyan zonasında da özbaşınalıqlar edir, dinc əhaliyə divan tuturdular.

Məsələn, buradakı 5-ci Qırmızı taborun birinci bölüyünün komandiri Danilov əhalini güllələyə basmış, kəndləri talan etmişdi. O, Cavad qəzasının Xıllı kəndinin əhalisi üzərinə 150 min rubl təzminat qoymuş və kəndlilərdən zorla 30 min rublu birdəfəlik yığmışdı. Türk-Azərbaycan qoşun bölmələrinin uğurlu hücumundan sonra isə Danilov talanla topladığı sərvəti də götürərək Bakıya qaçmışdı (230, s. 483).

Sadəcə say üstünlüyü yaratmaq hesabına cəbhədə ciddi keyfiyyət dəyişikliklərinin baş verəcəyini güman edən Bakı bolşevikləri iyunun son günlərində və iyulun əvvəlində bir sıra tədbirlər həyata keçirdilər.



Moskvadan alınmış olan zirehli avtomobillər dəstəsi cəbhəyə yenicə gətirilmişdi və onlar hələ tam şəkildə döyüşdə iştirak etməmişdilər. Bu zirehli texnikaya böyük ümidlər bağlanılırdı. İyulun ilk günlərində Bakı Qırmızı Tə'limatçılar məktəbinin şəxsi hey'əti də cəbhəyə gətirilmişdi (250, s. 120).

İyun ayının 30-da Bakı Xalq Komissarları Soveti 1893-1897-ci illərdə anadan olmuş gənclərin səfərbərliyini e'lan etdi. Əmrə görə Bakı şəhərində müvəqqəti və ya daimi yaşayan həmin təvəllüdlü gənclər səfərbərliyə cəlb edilməli idi. Səfərbərlikdən yayınanlara qarşı ciddi cəza tədbirlərinin tətbiq ediləcəyi bildirilirdi (13, 30.06.1918).

Xəzər hərbi donanmasının komplektləşdirilməsi məqsədi ilə iyul ayının əvvəlində 1900-1917-ci illərdə xidmət etmiş dənizçilərin səfərbərliyi e'lan edildi. Bakı Xalq Komissarları Sovetinin müvafiq direktivində bu səfərbərliyin məcburi olduğu bildirilirdi (4, s.43). Cəlb olunacaq dənizçilərin əsasında yeni dəniz taborunun yaradılması planlaşdırılırdı (13, 6.07.1918). Bakı şəhəri və onun rayonlarının komendantı B.Avakyan əhalini e'lan olunmuş səfərbərliklərdən yayınmamağa, Qırmızı Ordu sıralarına yazılmağa çağırırdı. Onun çağırışında bu tədbirlərin həyata keçirilməsinə mane olanlara qarşı ciddi tədbirlərin tətbiq ediləcəyi vurğulanırdı (13, 6.07.1918).

İyul ayının 7-də isə Bakı Xalq Komissarları Soveti bütün Zaqafqaziya xalqlarına müraciət qəbul edərək onları əldə silah Türk-Azərbaycan qoşunlarına qarşı mübarizə aparmağa, bolşeviklərin qırmızı bayrağı altında toplanmağa, fəhlə və kəndli hakimiyyətini bərqərar etməyə çağırdı (2, s.546).

Bu tədbirləri həyata keçirməklə bərabər cəbhədə təşəbbüsün yenidən ələ alınması üçün Bakı bolşevik liderləri başlıca ümidi polkovnik L.Biçeraxovun dəstəsinə bağlayırdılar. Rusiyanın İran ərazisindəki qoşunlarının tərkibində vuruşan kazak dəstəsinin rəhbəri L.Biçeraxov hələ iyun ayında bolşeviklərlə əlaqə yaradaraq onun dəstəsinin Qafqaz Qırmızı Ordusuna qatılmasına razı olduğunu bildirmişdi (2, s.508). Bu heç də o demək deyildi ki, L.Biçeraxovun bolşeviklərə qarşı xüsusi bir hüsn-rəğbəti var idi. Rus şovinizmi ruhunda tərbiyələnmiş zabitlərin tipik nümayəndəsi olan L.Biçeraxovu bolşeviklərə yaxınlaşdıran əsas cəhət onların hər ikisinin keçmiş imperiyanın ucqarlarında yaranan milli, müstəqil respublikaların mövcudluğuna qarşı barışmaz mövqedə dayanmaları idi. Əslində isə L.Biçeraxov bolşeviklərlə müəyyən münasibətlər yaratmaqda məqsədi Cənubi Qafqaza gəlmək və buradan da dəstəsi ilə birlikdə Şimali Qafqaza yollanmaq idi (209, s.146).

L.Biçeraxov bolşeviklərə e'tibar etmədiyi kimi, bolşeviklər də ona qarşı xüsusi bir sədaqət göstərmirdilər. Təklifinin razılıqla qarşılanması üçün L.Biçeraxov parçalanmaqda olan Rusiyanın ancaq bolşeviklər tərəfindən

birləşdiriləcəyinə inandığını bildirirdi (209, s.146). Tezliklə bütün Zaqafqaziyada Sovet hakimiyyətini bərqərar etmək və Azərbaycana gələn türk qoşunlarını əzmək istəyi bolşeviklərdə L.Biçeraxovun təklifinə əməli maraq yaratdı. Bakı Xalq Komissarları Soveti L.Biçeraxovun Qırmızı Ordu hissələri ilə birlikdə Türk-Azərbaycan qoşunlarına qarşı vuruşmaq təklifinə razılıq verdi və onun qarşısında belə bir tələb qoydu ki, Bakıda Sovet hakimiyyətini qeyd-şərtsiz tanımalı, Bakı XKS-nin işlərinə qarışmamalı və fəaliyyətinin Bakı Xalq Komissarları Sovetinin hərbi orqanları tərəfindən nəzarət altında saxlanılmasına razı olmalıdır (202, s.120).

İrəli sürülən tələblərə razılığını bildirən L.Biçeraxovun dəstəsi iyun ayının ortalarında Bakıya doğru üz tutdu. Ancaq İran ərazisində İran qoşunları ilə qarşı-qarşıya gəlməsi, onlarla döyüşə girməsi (2, s.508) L.Biçeraxovun əvvəldən planlaşdırdığı kimi təxminən iyunun 20-də Bakıya çatmasına imkan vermədi.

Dəstəsində 1500 nəfər Kuban və Terek kazakı olan Biçeraxova (202, s.120) bolşevik cəbhəsinə komandanlıq etmək təklif olunmuşdu. Ona görə də Azərbaycana çatan kimi L.Biçeraxov dərhal cəbhəyə yollanmalı və bütün döyüşlərə rəhbərliyi öz üzərinə götürməli idi. Bununla belə, L.Biçeraxov gəmi ilə birbaşa Bakıya gəlməyə ürək etmirdi. O ehtiyatlanırdı ki, dəstəsi ilə Bakıya gəldiyi təqdirdə bolşeviklər tərəfindən tərksilah edilə bilər. Buna görə də L.Biçeraxov qərara aldı ki, Bakıda deyil Ələtdə quruya çıxsın və buradan da cəbhəyə yollansın (209, s.147).

İngilis generalı Denstervil L.Biçeraxovun Azərbaycana yollanmasından yazarkən göstərirdi ki, iyul ayının 1-də türk qoşunları hələ Kür çayını keçməmişdilər və ona görə L.Biçeraxov Kür çayı üzərindəki körpünü tutaraq onların hərəkətini çətinləşdirmək istəyirdi (209, s.148).

Türk-Azərbaycan qoşunlarının hərəkəti və dayandıqları mövqe barədə ingilis generalının yazdıqları reallığı əks etdirmir. Ancaq Biçeraxovun Kür körpüsünü tutmaq planları haqqında dedikləri həqiqətdən heç də uzaq deyildi. L.Biçeraxov sonralar özü də bildirirdi ki, Bakının Rusiya tərkibində e'tibarlı şəkildə saxlanılması üçün Azərbaycanın Yevlaxadək olan ərazisi tutulmalı idi (64, v.29).

İyul ayının 1-də Biçeraxov dəstəsi ilə İranda gəmilərə yükləndilər. Dəstənin tərkibində 5 ingilis zabiti və 4 zirehli avtomobil də var idi (209, s.148,164). İyulun 2-də isə L.Biçeraxov artıq S.Şaumyanla cəbhə xəttində idi. Buradakı vəziyyətlə ötəri tanışlıqdan sonra L.Biçeraxov xahiş etdi ki, bir həftə ərzində cəbhəyə əlavə 2 min nəfər göndərilsin (64, v.88).

Belə bir qüvvənin göndəriləcəyini və'd edən S.Şaumyan Bakıya qayıdan kimi e'lan olunmuş səfərbərliyin gedişi ilə maraqlandı. Mə'lum oldu ki, bu tədbirin nəticələri heç də ürəkaçan deyildir. Bir neçə gün ərzində nəzərdə tutulan kontingentin yalnız 30 faizi xidmətə cəlb edilmişdi. Buna



görə də şəhərdə tə'cili silahlı reydlər keçirildi və müəyyən sayda adam tutularaq hissələrə göndərildi (71, v.1).

İyul ayının 6-da L.Biçeraxov döyüşən ordunun komandanı e'lan edildi və sağ cinaha göndərildi. Cəbhənin mərkəzi hissəsinin və sol cinahın komandanlığı isə Q.Korqanovun üzərində qaldı (71, v.1).

Beləliklə, Göyçay-Qaraməryəm döyüşündən sonra hər iki tərəf növbəti döyüşlərə ciddi hazırlıq görmüşdü. Türk-Azərbaycan qoşunları Müsüslünün şərqi və Ağsu-Qaraməryəm xətti boyunca mövqe tutmuşdular. Qafqaz İslam Ordusunun komandanlığı yaxın vaxtlarda Şamaxının azad edilməsini əsas vəzifələrdən biri kimi qarşıya qoymuşdu. Bu məntəqəyə Bakının üzərinə hərəkət üçün əsas dayaq məntəqəsi kimi baxılırdı. Ancaq Şamaxıya çatmazdan qabaq İslam Ordusu komandanlığı Kürdəmir-Ağsu xəttinə çıxmağı planlaşdırırdı (195, s.565).

Nuru Paşa Şamaxı üzərinə hücumun müvəffəqiyyətlə başa çatdırılması üçün Qarabağdakı erməni silahlı dəstələrinin fəaliyyətinin məhdudlaşdırılması və Culfa-Ordubad üzərindən Şuşaya silahlı dəstə göndərilməsinin məqsədəuyğunluğu barədə Türkiyənin Şərq ordular qrupu komandanlığına xahiş göndərmişdi. (305, s.120; 195 s. 565).

Türk mənbələrinə görə Kürdəmirin qərbində və Ağsu xəttində mövqe tutan Qırmızı Ordu hissələrinin 7000 nəfərlik qüvvəsi, 20-yə qədər topu və bir zirehli qatarı var idi.

İyul ayının 2-də Göyçay-Qaraməryəm istiqamətindəki Türk-Azərbaycan qoşunları hücuma keçərək Göyçayın şərqində yerləşən Beydərkənd və Əmirvan kəndlərini də azad etdilər (305, s.120). Səhərisi gün isə Göyçay dəstəsi erməni kəndi olan Çanaqbulaq kəndini bolşevik qüvvələrindən azad etdi (195, s. 565).

İyul ayının 5-də Türk-Azərbaycan qoşunları hücumu daha geniş miqyasda davam etdirdilər. Bu hücum zamanı hissələr qarşısında aşağıdakı vəzifələr dayanmışdı: 13-cü Qafqaz alayı onun sərəncamına verilmiş türk süvari alayı və Azərbaycan bölmələri ilə birlikdə Kürdəmir-Ağsu yoluna çıxaraq şərqə doğru hərəkətini davam etdirməli və Kürdəmirin tutulmasına zəmin yaratmalı idi. 10-cu Qafqaz alayı isə onun əməliyyat tabeçiliyinə verilmiş Azərbaycan bölmələri ilə Ağsunun şimal məntəqələrindən Gürcüvan kəndinə doğru irəliləyərək Şamaxı-Ağsu yolunu kəsməli idi. Döyüşə rəhbərlik etmək üçün Nuru Paşa da Ağsu cəbhəsinə gəlmişdi (195, s.565)

İyun ayının 6-da davam etdirilən hücum uğurla nəticələndi. 13-cü Qafqaz alayı onun tabeçiliyinə verilmiş bölmələrlə Ağsuya daxil oldu. 10-cu Qafqaz alayı isə Gürcüvan kəndini tutdu. Bu döyüşlərin gedişində bir səhra topu, bir sursat arabası, 5 ədəd pulemyot, çoxlu silah, güllə və digər hərbi ləvazimat ələ keçirildi (195, s. 566).

İyul ayının 7-də döyüşlərin ağırlıq mərkəzi Kürdəmir ətrafına keçirildi. Ancaq bu istiqamətdəki döyüşlərin başlanğıcı heç də Türk-Azərbaycan

qoşunları üçün sevindirici olmadı. Əsas qüvvələr Ağsu cəbhəsində cəmləşdiyindən Kürdəmir ətrafında olan qüvvələr L.Biçeraxovun dəstəsi və zirehli avtomobilləri ilə gücləndirilmiş Qırmızı Ordunun müqavimətini qırmağa bəs etmədi. Müsüslü dəstəsi qərbdən dəmir yolu xətti boyunca, Həsənbəy dəstəsi isə şimaldan Kürdəmirə doğru irəliləməli idi. Həsənbəy dəstəsinə qarşı 7 top və 7 pulemyotla müşayiət olunan 800 nəfərlik qüvvə çıxarıldı. Həsənbəy dəstəsinin tərkibində 46-cı piyada taboru, 2-ci süvari alayının bölmələri, Müsüslü dəstəsinin tərkibində isə 60-cı piyada taboru və Tatar süvari alayının bölmələri var idi (195, s.566).

Səhər tezdən başlanan döyüş 12 saat davam etdi. Türk-Azərbaycan qoşunlarının bütün cəhdləri bir nəticə vermədi. Yalnız Kürdəmirin cənubundan süvari bölmələri irəli çıxa bilsələr də, tezliklə onların da hərəkəti dayandırıldı. Döyüşün gedişində Türk-Azərbaycan qoşunları xeyli itki verdi. Onlar tərəfindən başlanan hücumu dəf edən Qafqaz Qırmızı Ordusunun birinci briqadası Ağsu istiqamətində əks-hücuma keçdi (12.9.07.1918).

Buradakı qüvvələr həmin ərazidə yaradılmış sovet taboru ilə möhkəmləndirilmişdi. 1-ci Qafqaz Qırmızı korpusunun 1-ci briqadasının önündə qırmızı Tə'limatçılar məktəbinin dəstəsi və Moskvadan gətirilmiş zirehli avtomobillər irəliləyirdi. Onların birgə sə'yindən sonra oradakı Türk-Azərbaycan qoşun bölmələri dağlara doğru geri çəkilməli oldu (305, s.121).

Bolşevik qüvvələrinin hücumunun genişlənməsinə yol verməmək və onların müqavimətini qıraraq Kürdəmiri ələ keçirmək üçün Türk-Azərbaycan qoşunlarında yenidən qruplaşma aparıldı. 13-cü Qafqaz alayı tabeçiliyinə verilmiş qüvvələr Kürdəmir cəbhəsinə yönəldildi. Həsənbəy dəstəsi də 13-cü Qafqaz alayı komandirinin tabeçiliyinə verildi. Müsüslü dəstəsi isə yenə mərkəzdə hərəkət edərək bolşeviklərin əsas zərbəsinin 13-cü alay üzərinə çevrilməsinə mane olmalı idi. 10-cu alay isə Şamaxıya doğru hərəkətini davam etdirməli idi (195, s.567).

İyulun 8-də Kürdəmir ətrafında başlanan döyüş bütün günü davam etdi və gecədən xeyli keçəndən sonra səngidi. Türk-Azərbaycan qoşunları döyüşün gedişində ciddi bir mövqe dəyişikliyinə nail ola bilmədilər.

Ağsu ətrafındakı döyüşdə isə Qafqaz Qırmızı Korpusunun hissələri uğurları bir qədər də genişləndirdilər. Gürcüvan kəndi yenidən bolşevik qüvvələrinin əlinə keçdi. Buradakı döyüşdə Şamaxı ermənilərindən təşkil edilmiş yığma tabor fəal iştirak edirdi. 800 nəfərdən ibarət olan həmin tabora Qazarov rəhbərlik edirdi (2, s.553).

Meysarı və Mədrəsə kəndləri ətrafındakı döyüş xüsusilə gərgin keçdi. Şamaxı ermənilərindən təşkil edilən taborla birlikdə Qırmızı Ordu qüvvələri Türk-Azərbaycan qoşun bölmələrini Meysarı kəndindən sıxışdırıb Muğanlı kəndinə yaxınlaşdılar (305, s.121). 10-cu Qafqaz alayının 29-cu



taborunun sursatı qurtardığından xeyli geri çəkilməyə məcbur oldu və hava qaralanda Şərədil dağında mövqe tutdu (195, s.567).

İyulun 10-da döyüşlər davam etdirildi. Həmin gün əsas hadisələr Kürdəmir ətrafında cərəyan edirdi. Burada 13-cü Qafqaz türk alayı ilə podpolkovnik Həbib bəy Səlimovun komandanlığı altında olan Müsüslü dəstəsi bolşevik qüvvələri üzərinə hücuma keçdi. 1000 nəfər piyadası və 6 pulemyotu olan bolşevik bölmələri Müsüslü dəstəsinin hərəkətinin qarşısını ala bildi. Eyni zamanda Qırmızı Ordu qüvvələri 13-cü türk alayının sağ qanadına zərbə vurmağa cəhd göstərdi. Bunun üçün Müsüslü dəstəsinin qarşısında olan qüvvələrin bir hissəsi də bu istiqamətə gətirildi. Alayın sağ qanadında vuruşan 60-cı tabor bolşevik qüvvələrinin hücumunu dəf etdi və onların irəliləməsinə imkan vermədi. Müsüslü dəstəsi isə qarşıda dayanan bolşevik qüvvələrinin zəifləməsindən istifadə edərək yenidən hücuma keçdi və saat 13.55-də Qırmızı Ordunun mövqelərini ələ keçirdi. Müsüslü dəstəsinin bu uğuru bolşevik qüvvələrini çaş-baş saldı və nəticədə təşəbbüsü ələ alan 13-cü alayın bölmələri Kürdəmirin sağındakı bağlaradək, alaya verilmiş süvari bölmələri isə Kürdəmirin şərq tərəfinə qədər irəliləyə bildi. Saat 17.00-da 13-cü alayın sağ qanadı ilə Müsüslü dəstəsinin sol qanadı hücumu genişləndirərək Kürdəmirin qərbində birləşdilər. Havalar qaralana qədər şimaldan 13-cü alay və ona verilmiş bölmələr, cənubdan isə Müsüslü dəstəsi hücumu davam etdirdilər və bolşevik qüvvələrini geri ataraq Kürdəmirin şərqində görüşdülər. İyulun 10-dan 11-nə keçən gecəni Türk-Azərbaycan qoşunları azad edilmiş Kürdəmirin şərqində keçirdilər (195, s.569).

Kürdəmir ətrafındakı döyüşün gedişində Müsüslü dəstəsinin tərkibində olan 1-ci Tatar süvari alayının komandanlığı ikinci bölüyə tapşırıq vermişdi ki, bolşevik qüvvələrinin arxasına keçib onlara zərbə vursun. İkinci bölüyün süvariləri dərhal bu tapşırığın icrasına yollandılar Kürdəmir azad ediləndə bu bölük cənub istiqamətindən stansiyaya yaxınlaşırdı. Türk-Azərbaycan qoşunlarının hissələri arasında əlaqələrdə müəyyən gərginlik yarandığından şimaldan stansiyaya yaxınlaşan hissələr ikinci bölüyün süvarilərini bolşevik süvariləri güman edib güclü atəşə tutdular. Bu vaxt 13-cü alay və ona verilmiş bölmələrdən ibarət olan dəstədən yunker Qasımov kəşfiyyata yollandı və vəziyyəti öyrəndikdən sonra xəbər gətirdi ki, cənubdan irəliləyən süvarilər heç də bolşevik süvariləri deyilmiş (164, v.3).

Kürdəmir ətrafındakı döyüşdən sonra Qırmızı Ordu qüvvələri Kərrar stansiyasına çəkilib burada yeni müdafiə mövqeləri tutmuşdular (2, s.556). Bu qüvvələrin geri çəkilməsi zirehli avtomobillər tərəfindən himayə olunurdu. Türk-Azərbaycan qoşun bölmələri zirehli avtomobilləri mühasirəyə almağa cəhd göstərdilər. Əgər sonradan Qırmızı Ordunun piyada bölmələri yetişməsəydi zirehli avtomobillərin mühasirədən çıxması da çox çətinləşəcəkdi (305, s.121).

Kürdəmirin azad edilməsi hərbi təşəbbüsün Türk-Azərbaycan qoşunlarının əlində daha da möhkəmlənməsinə kömək etdi. Qırmızı Ordunun vəziyyəti isə pisləşməkdə davam edirdi. Bunu iyulun 13-də V.Leninə göndərdiyi teleqramında S.Şaumyan da e'tiraf edirdi. Bakı bolşeviklərinin lideri V.Leninə çatdırırdı ki, Rusiyadan ciddi kömək gəlməsə vəziyyəti düzəltmək mümkün olmayacaqdır. V.Lenin isə elə həmin gün Dəniz İşləri Üzrə Xalq Komissarlığına göndərdiyi məktubunda tə'kidlə xahiş edirdi ki, Xəzər dənizinə hərbi gəmilərin çatdırılması sür'ətləndirilsin (2, s.557).

Ağsu cəbhəsində də Qırmızı Ordu hissələrinin irəliləməsinin qarşısı alındı. Qüvvə və sursat azlığı üzündən qətiyyətli hücuma keçə bilməyən Türk-Azərbaycan qoşun hissələri Şərədil dağlarında müdafiə olunaraq bolşevik qüvvələrinin bütün hücumlarını dəf etdilər. İyulun 10-12-si arasında bu sahədə gedən döyüşlərdə ciddi bir mövqe dəyişikliyi baş vermədi (2, s.559).

İyul ayının 12-də Kərrar stansiyasının tutulması üçün döyüşlər davam etdirildi. Bu stansiyaya hücum bir tabor, bir süvari bölüyü və toplardan təşkil edilmiş Müsüslü dəstəsinə tapşırıldı. Podpolkovnik Həbib bəy Səlimovun komandanlığı altında hücuma atılan bu dəstə iyulun 12-də Kərrar stansiyasını tuta bilmədi. Bolşevik qüvvələrinin müqaviməti çox ciddi idi. Xüsusən Kərrar ətrafındakı ərazilər düzənlik və meşəsiz olduğundan Qırmızı Ordunun zirehli qatarı H.Səlimovun dəstəsinin stansiyaya yaxınlaşmasına imkan vermirdi. İyul ayının 13-də 13-cü Qafqaz türk alayı da ona verilmiş bölmələrlə birlikdə hücuma qoşuldu. Lakin həmin gün də göstərilən cəhd heç bir nəticə vermədi. İyulun 14-də isə Türk-Azərbaycan qoşunlarının göstərdiyi növbəti cəhd Kərrar stansiyasının bolşevik qüvvələrindən azad edilməsi ilə nəticələndi (195, s.568).

İyul ayının 14-də S.Şaumyan yenidən cəbhə bölgəsinə gəldi, Kərrar stansiyası ətrafında Qırmızı Ordu hissələrinin vəziyyəti ilə tanış oldu. L.Biçeraxov yenə də sovet qüvvələri üçün pisləşməkdə olan vəziyyətin qarşısının alınması üçün əlavə hərbi hissə və bölmələrin təşkil edilərək cəbhəyə göndərilməsini xahiş etdi. S.Şaumyan bu xahişə əməl olunacağına söz verib geri qayıtdı. (64, v. 88). Sonra S.Şaumyan Bakı Sovetinin fövqəl'adə iclasında cəbhədə vəziyyətin onların xeyrinə olmadığını bir daha təsdiqlədi, tə'cili tədbirlər görülməsinin zəruriliyini vurğuladı (239, s.119). Ancaq hərbi təşəbbüsün artıq Türk-Azərbaycan qoşunlarının əlindən alınmasının heç də asan olmadığı çoxları üçün aydın idi. Kürdəmir-Kərrar ətrafındakı döyüşlərdən sonra bunu L.Biçeraxov da başa düşmüşdü. Xüsusən Qırmızı Ordu döyüşçüləri arasında intizamın çox aşağı olması, özbaşınalıq və məs'uliyyətsizlik Biçeraxovun kazak dəstəsi ilə bolşevik-daşnak qüvvələri arasında gərginliyi xeyli artırmışdı. Bu məsələ ilə bağlı ingilis generalı Denstervill öz xatirələrində belə bir hadisəni təsvir edirdi: "Bir dəfə Biçeraxov öz kazaklarının bir eskadronuna əmr etdi ki,



zirehli avtomobilin müşayiəti ilə kəşfiyyata yollansınlar. Bu dəstə körpülərdən birinin üzərindən keçib kəşfiyyata getdi. Onlar gedən vaxt körpü Qırmızı Ordunun əlində idi. Qayıdanda isə gördülər ki, körpü Türk-Azərbaycan qoşunları tərəfindən tutulub. Kazak süvariləri öz əsas dəstələri ilə birləşmək üçün döyüşə girdilər. Gərgin keçən bu döyüşdə onlar çoxlu itki verərək özlərinə yol açа bildilər. Zirehli maşın isə Türk-Azərbaycan qoşunlarının əlində qaldı. Qırmızı Ordu əsgərləri tərəfindən ağır vəziyyətə salınan və heç bir kömək almayan kazak süvarilərində bu hadisədən sonra bolşevik qüvvələrinə qarşı narazılıq xeyli artmışdı" (209, s.174).

Bununla belə, L.Biçeraxov Türk-Azərbaycan qoşunlarının qarşısını kəsmək üçün Bakıdan kömək göstəriləcəyinə ümidini kəsmirdi. O, tə'kid edirdi ki, Bakıda toplanmış olan çağırışçılar dərhal cəbhə xəttinə göndərilsin. Bura gətirilən yeni qüvvələrin bir hissəsini L.Biçeraxov ön xəttə göndərmək, bir hissəsini isə Hacıqabulda saxlayaraq ehtiyat yaratmaq istəyirdi (22, v.3).

Qırmızı Ordu hissələrinə qarşı aparılan mübarizənin daha çox səmərəliliyinə nail olmaq və Bakıya doğru hərəkəti sür'ətləndirmək məqsədi ilə Qafqaz İslam Ordusu komandanlığı Türk-Azərbaycan qoşun hissələrini yenidən qruplaşdırdı. Bu qruplaşmanın aparılmasını şərtləndirən əsas amil ondan ibarət idi ki, Göyçay-Şamaxı şosse yolu və Tiflis-Bakı dəmir yolu ilə irəlilədikcə qoşun hissələri bir-birindən məsafəcə daha da uzaqlaşırdılar. Belə olanda onları çevik idarə etmək, sür'ətli manevrlər apramaq xeyli çətinləşirdi. Ona görə də qərara alındı ki, Türk-Azərbaycan qoşun hissələrindən iki taktiki qrup yaradılsın. Dəmir yolu xətti boyunca hərəkət edən qrup Cənub qrupu adlandırıldı. Bu qrupun komandanı podpolkovnik Həbib bəy Səlimov idi. Qrupa əsasını Azərbaycan hissələri təşkil edən Müsüslü dəstəsi və Azərbaycana yenicə gəlmiş 38-ci türk piyada alayının 2-ci taboru daxil idi. Göyçay-Şamaxı-Bakı şosse yolu ilə irəliləyəcək qrup isə Şimal qrupu adlandırılırdı. Bu qrupa 10-cu və 13-cü Qafqaz türk alayları daxil idi. Qrupun komandanı 10-cu türk alayının komandiri podpolkovnik Osman bəy, onun yerinə, yə'ni 10-cu alayın komandirliyinə isə 38-ci türk alayının komandiri podpolkovnik Səlim bəy tə'yin edildi. 38-ci türk alayının 3-cü taboru Gəncədə saxlanıldı, 1-ci taboru isə 5-ci Qafqaz diviziyasının (Xüsusi Azərbaycan Korpusunun 3-cü diviziyasının - M.S.) ehtiyat qüvvəsi kimi saxlanıldı. Taborları paylandığı üçün alayın özü ləğv edildi. Diviziyanın komandanlığı isə Şərq cəbhəsi komandanlığı adlandırıldı (195, s.568-569).

İyun ayının 15-16-da bu qruplaşdırma başa çatdı. Kərrar stansiyası ətrafında döyüşlər getdiyi günlərdə Salyan ətrafında da bolşevik qüvvələri ilə Türk-Azərbaycan qoşun bölmələri arasında döyüş baş verdi. Burada Qırmızı Ordunun 3-cü və 5-ci taborlarından təşkil edilmiş dəstə mövqe tutmuşdu. Dəstənin komandiri öz daşnak fəaliyyəti ilə bölgədə qəzəb

doğuran Ter-Avakimov idi (305, s.124). Bu dəstəyə qarşı isə türk zabiti Ramazan bəyin komandanlığı altında 35-40 nəfərlik kiçik bir bölmə mövqe tutmuşdu. Bu bölmənin 2 "Maksim" pulemyotu və 2 topu var idi. Ramazan bəyə azərbaycanlı zabit Sultan Hüseynzadə kömək edirdi. Döyüşün başlanması ərəfəsində Sərxan Şirvanlının rəhbərliyi altında yerlilərdən ibarət könüllülər dəstəsi də bolşeviklərə qarşı mübarizəyə qoşuldular (30, v.64).

Türk mənbələrinə görə Qırmızı Ordu dəstəsinin tərkibində 50 süvari, 400 piyada, 12 pulemyot, 2 top və 2 gəmi var idi (195, s.569).

Əlavə olaraq 100 nəfər salyanlının qoşulduğu türk-azərbaycanlı dəstəsi Salyanın kənarında olan Qaraqaşlı kəndini tutub müdafiə mövqeləri yaratmışdı. Qırmızı Ordu dəstəsi burada onların üzərinə hücuma keçdi.

Qarşı duran tərəflər arasında döyüşlər 3 gün davam etdi. Qırmızı Ordu dəstəsi Salyanı güclü top atəşinə tutub orada güclü dağıntılar yaratmaqla bərabər 3-4 dəfə Türk-Azərbaycan silahlılarının mövqelərinə hücuma keçdilər. Ancaq hər dəfə böyük itkilər verərək geri çəkildilər (30, v.64).

Çox böyük üstünlüyə malik olmasına baxmayaraq Bakı qüvvələri döyüşlərin 4-cü günü Salyandan geri çəkildilər. Türk-Azərbaycan döyüşçülərinin müqavimətini qırmağa qadir olmadığını görən dəstə komandiri Ter-Avakimov əsasən ermənilərdən təşkil olunmuş 3-cü tabora döyüş mövqelərini tərk etmək əmri verdi. Törətdikləri fəlakətlərin haqlı cəzasını alacağından qorxan daşnak elementləri xəstələri, yaralıları, silah və təchizatı ataraq canlarının xilas edilməsinin hayına qaldılar (305, s.124).

Döyüşdə Türk-Azərbaycan mübarizlərindən 12 nəfər şəhid oldu, 20 nəfər isə yaralandı. Səhərisi gün köməyə yetən türk qoşun bölməsinin yardımı ilə Xilli kəndi üzərinə hücum başlandı. Bu kənd də bolşevik-daşnak qüvvələrindən azad edildi. Geriyə qaçan Qırmızı Ordu bölmələri Bankədə toplaşmışdılar. Ciddi hazırlıq görüləndən sonra Türk-Azərbaycan qoşun bölmələri və könüllü dəstələri iyul ayının axırlarında Bankə üzərinə hücuma keçdilər. Qırmızı Ordu bölmələri böyük sür'ət və dəqiqliklə həyata keçirilən bu hücumun qarşısını ala bilmədilər. Onlardan sağ qalanları çoxlu hərbi ləvazimatı qoyaraq gəmilərlə Bakıya qaçdılar (30, v.64).

Kür çayının mənsəbi bolşevik qüvvələrindən azad edildi. Sovet hərbi gəmilərinin Kür çayı ilə yuxarıya doğru irəliləməsinin qarşısının alınması üçün onun mənsəbində bir neçə gəmi və barj batırıldı. Əlavə olaraq Bankədə 2 pulemyot və bir topla təchiz edilmiş bir bölük piyada saxlanıldı. Bolşevik qüvvələrindən 4 pulemyot, 63 tüfəng, 100 sandıq patron, mərmi və digər ləvazimat hərbi qənimət kimi ələ keçirildi (195, s.569).

Türk-Azərbaycan qoşunlarının uğurları genişləndikcə Qırmızı Ordu hissələrinin məğlubiyyətini bolşevik liderləri müxtəlif səbəblərlə, o cümlədən daşnakların satqınlığı və müqavimət göstərmədən vaxtından qabaq geri çəkilməsi ilə bağlayırdılar (2, s.582, 587). Salyan-Bankə ətrafındakı



döyüşlərin nəticələri bu amillə bağlandığı kimi, Şamaxı ətrafındakı böyük məğlubiyyət də daşnak qüvvələrinin e'tibarsızlığı ilə əlaqələndirilirdi. Amma əslində Azərbaycanın bolşevik-daşnak qüvvələrindən təmizlənməsində çox böyük əhəmiyyəti olan bu uğurun qazanılması Şərq cəbhəsi komandanlığının həyata keçirdiyi əsaslandırılmış hücumun məntiqi nəticəsi idi.

İyulun 19-da başlanan bu hücumda Şimal qrupunun hissə və bölmələri qarşısında aşağıdakı vəzifələr qoyulmuşdu: 10-cu Qafqaz türk alayı şose boyunca hücuma keçərkən 13-cü Qafqaz türk alayı Şamaxının cənubundan Göylər kəndi istiqamətində hərəkət edərək Qırmızı Ordu qüvvələrinin sol qanadını adlayıb arxasında mövqe tutmağa çalışmalı idi. 38-ci piyada alayının ehtiyatda saxlanılan 1-ci taboru və 2-ci türk süvari alayı Ağsuda dayanmalı, Kərrar ətrafındakı Qırmızı Ordu hissələri Şamaxı ətrafına kömək göndərmək istədikdə Cənub qrupu döyüşə qoşulmalı və bunun qarşısını almalı idilər. (195, s.570).

İyul ayının 19-da başlanan hücumun qarşısının saxlanmasının elə də asan olmadığını görən Qırmız Ordu hissələri saat 16.35-də Şamaxı istiqamətində geri çəkilməyə başladı. Sovet qüvvələrinin geri çəkilməsi ilə bağlı olaraq onların arxasına keçməli olan 13-cü Qafqaz türk alayı hərəkət marşrutunu dəyişdi və Mədrəsə kəndinə doğru istiqamət götürdü. Ayın 19-da və 20-də bütün gecəni və gündüzü leysan yağışlar yağsa da Şimal qrupu Qırmızı Ordu hissələrini izləməkdə davam etdi (195, s.570).

İyulun 20-də Mədrəsə kəndinə gəlmiş qüvvələr Acıdərə hündürlüyündən keçərək Mərəzəyə çıxmağa və bolşevik qüvvələrinin yolunu kəsməyə cəhd göstərirdi. Şamaxı dəstəsinin komandiri Qazarovun verdiyi mə'lumata görə bu istiqamətdə hərəkət edən 13-cü alayın sərəncamında beş ədəd top var idi. Mərəzənin tutulacağı təqdirdə çox ağır vəziyyətə düşəcəyini hiss edən Qırmızı hissələrin komandirləri heç Şamaxıda dayanmayaraq yalnız geriyə çəkilmək barədə fikirləşirdilər (2, s.573).

Bakı bolşeviklərinin liderlərindən olan və Şamaxı istiqamətindəki 3-cü briqadanın komissarı tə'yin edilmiş A.Mikoyan Şimal qrupunun hücumunun qarşısının alınmamasında və mühüm strateji əhəmiyyət kəsb edən Şamaxının əldən verilməsində 3-cü briqadanın komandiri Amazaspı günahlandırırdı (239, s.119). Bu daşnak komandirin Şamaxı istiqamətində başlanan elə ilk döyüşlərdən sonra biabırcasına geriyə üz tutması onun "siqlətli" daşnak döyüşçülərinin də geriyə üz çevirməsinə səbəb oldu. İyul ayının 21-də səhər tezdən Şimal qrupu Şamaxıya daxil oldu və burada düşmən tərəfindən atılmış 1 topu, 2 pulemyotu, 1 zirehli avtomobili ələ keçirdi (195, s.570).

Təlaş və qorxu içində olan Qırmızı Ordu hissələri iyulun 22-də geri çəkilməkdə davam edirdi. Bakı bolşeviklərinin nümayəndələri qoşun bölmələrini, yerli qeyri-azərbaycanlı əhalini səfərbər edərək Şimal qrupunun

hücumunun qarşısını almağa çalışsalar da bir nəticəyə nail ola bilmədilər (305, s.125). Ayın 22-də Şamaxı istiqamətində olan Qırmızı Ordu hissələri Cəngidən 6 verst geri çəkilərək şosse yolu boyu müdafiə mövqeləri tutdular. Dəmir yolu boyunca yerləşən qoşun hissələri isə Hacıqabula doğru geri çəkilirdilər. Hissələrin tərkibində fərarilik çox böyük miqyas almışdı. Qoşunların tənəzzülü günü-gündən dərinləşirdi. Əsgər və zabitlər arasında Türk-Azərbaycan qoşunlarının qarşısının alınması üçün ingilis *qoşunlarının* də'vət edilməsi əhval-ruhiyyəsi güclənirdi (2, s.579).

İyul ayının 22-si gecəsini Cənub qrupu Sığırlı stansiyasında keçirdi (195, s.571).

İyul ayının sonuna qədər döyüşlər bir qədər səngidi. Doğrudur, bu müddət ərzində qüvvələrin mövqelərində bə'zi dəyişikliklər baş verdi. İyulun 26-da Cənub qrupu Qarasu stansiyasını, iyulun 27-də isə Hacıqabul stansiyasını tutdu (195, s.572). Bakı şəhərinə hücumun təşkili üçün başlıca dayaq məntəqələri ələ keçirilmişdi. Tənəzzüldən yaxa qurtara bilməyən Qırmızı Ordu geri qaçmaqda davam edirdi. Bu orduda hakim olan bolşevik-daşnak ideologiyasının böhranı və süqutu Bakı Xalq Komissarları Sovetini də süqut dərəcəsinə çatdırmışdı. Bu bolşevik qurumunu və onu təmsil edən bolşevikləri süqut etməkdən yalnız cəbhədə dönüşün yaradılması, Türk-Azərbaycan qoşunlarının hücumunun qarşısının alınması xilas edə bilərdi. S.Şaumyanın ətrafına topladığı və dayaqlandığı erməni-daşnak qüvvələri bunun öhdəsindən gələ bilmədilər.Türk-Azərbaycan qoşunlarının güclü zərbəsi ilə onlar parçalanıb nicat üçün Bakıya qaçdılar.

S.Şaumyanın L.Biçeraxova bağladığı ümidlər də özünü doğrultmadı. Əslində heç doğrulda da bilməzdi. Çünki L.Biçeraxovun tutduğu yolun strateji puçluğu aydın idi. Onun sərəncamına verilmiş Qırmızı Ordu hissələri isə mə'nəvi tənəzzül içində olan, şəxsi və fərdi niyyətləri ilə istiqamətlənən elementlərdən ibarət idi. Hadisələrin mənzərəsi də bunu təsdiq etdi. Azərbaycana yollanarkən ingilislərdən 180 milyon rubl pul alaraq 15 gün ərzində burada 10 minlik ordu toplayacağına söz versə də (195, s.571), L.Biçeraxovun xidmətə çağırış səsinə yalnız 600-ə qədər adam toplaşdı (64, v.88). Böyük və'dlərlə Azərbaycana yollanan L.Biçeraxov cəbhəyə komandanlıq etdiyi müddət ərzində bir dəfə də olsa qələbə sevincini duymadı. Böyük sür'ətlə özünü Kürdəmirə çatdırdığı kimi, böyük sür'ətlə də oradan geriyə qaçdı. Bacarıqsızlığını, azərbaycanlı zabit, podpolkovnik Həbib bəy Səlimovun komandanlığı altında olan Cənub qrupunun hücumlarının qarşısını almağa qüdrəti çatmadığını görəndə L.Biçeraxov cəbhə komandanı vəzifəsindən əl çəkdiyini söyləyib, bu vəzifəni erməni Avetisova həvalə etdiyini bildirdi. Bununla belə o, özünün və dəstəsinin cəbhədə qaldığını və Bakının qorunmasında iştirak edəcəyini söylədi (64, v.88,89).



İyulun 22-də Avetisov artıq müvəqqəti olaraq cəbhə komandanının vəzifəsinin icrasına başlamışdı (2, s.579).

Yaxınlaşan süqutdan xilas olmaq üçün əsas ümid yeri isə Rusiyadan gələn kömək idi. Zorakı yolla hakimiyyətə gələn Bakı Xalq Komissarları Sovetinin ömrünün uzadılmasının da yalnız zorakılıqla mümkün olacağına şübhə etməyən Rusiya bolşevik hökuməti iyulun 2-ci yarısından e'tibarən Bakıya hərbi yardımı xeyli artırmışdı. V.İ.Leninin göstəriş və tapşırıqlarından sonra xeyli silah, hərbi sursat və bir neçə döyüşçü dəstəsi, o cümlədən Petrovun komandanlığı altında 780 nəfərlik yaxşı silahlanmış Sovet qoşun dəstəsi Ukrayna cəbhəsindən Bakıya göndərilmişdi. 100-200 nəfərlik kazak atlı dəstəsindən, 6 topçu batareyadan, Baltik və Qara dənizçilər rotasından və süvari kəşfiyyatçılar dəstəsindən ibarət olan Petrovun qoşun hissəsi Bakını Türk-Azərbaycan qoşunlarının hücumundan qorumalı idi (2, s.567).

Bakını azərbaycanlılardan qorumaq üçün Azərbaycana göndərilmiş Petrovun dəstəsi Sovet qoşunlarının intizamlı və döyüşkən bir dəstəsi kimi təqdim edilsə də, əslində bu dəstənin rəhbəri də, onun üzvləri də xislətı e'tibarı ilə daşnaklardan heç də geri qalmırdılar. Çünki bu dəstə Voronej quberniyasında olarkən elə böyük talanlarla, özbaşınalıqlarla məşğul olmuşdu ki, yerli əhali elliklə V.Leninə xəbər göndərib onları bu dəstənin cəngindən xilas etməyi xahiş etmişdi (65, v.22). V.Lenin və onun ətrafındakılar isə Azərbaycanı, Azərbaycanın milli qüvvələrinə qarşı mübarizəni bu dəstə üçün ən yaxşı fəaliyyət meydanı bilib ora yolladılar.

İyulun 19-da dəstə ilə Bakıya çatan Petrov Bakı rayonunun hərbi ko*missarı tə'yin edilmiş və o bu vəzifədə* Rusiyanın fəhlə və kəndlilərinə müraciət imzalamışdı. Petrov rus fəhlələrini və kəndlilərini silaha sarılmağa, Bakıya gəlməyə və burada Sovet Rusiyası uğrunda mübarizə aparmağa çağırırdı (26, v.1).

Ancaq S.Şaumyan başa düşürdü ki, təkcə Petrovun dəstəsi Türk-Azərbaycan qoşunlarının uğurlu hücumlarının qarşısını kəsməyə kifayət deyildir. Buna görə də iyulun 20-də V.Leninə göndərdiyi teleqramda vəziyyətin çox ciddi olduğunu və Bakıya hərbi yardımın gücləndirilməsinin zəruri olduğunu bildirirdi (2, s.569).

Bu teleqramdan sonra Rusiyadan yenə xeyli hərbi silah, sursat və texnika alındı (230, s.507-508). Lakin bunlar da bolşeviklərin keçirdiyi böhranı aradan qaldırmadı. İyulun 25-də Şamaxı yolu üzərində olan Qırmızı Ordu hissələrinin Bakıya qədər geri çəkilməsi (2, s.598) şəhərdəki vahimə və təlaşı daha da artırdı. Bolşeviklərin acizliyi, gücsüzlüyü onların nüfuzunu xeyli aşağı saldı. Azərbaycan xalqına qarşı faciələr, qırğınlar törətmiş daşnaklar, sabit əqidəsi olmayan eserlər, vəziyyətə görə eser və bolşeviklərə tərəf meyl edən qüvvələr Bakının azad edilməsinə yol verməmək üçün ingilis qoşunlarını Azərbaycana çağırmağı qərarlaşdırdılar.

İyul ayının 25-də çağırılmış Bakı Sovetinin fövqəl'adə iclasında bolşeviklər siyasi cəhətdən də ağır məğlubiyyətə mə'ruz qaldılar. Onların bütün sə'ylərinə baxmayaraq sağ eserlər, daşnaklar və menşeviklər ingilis qoşunlarının Bakıya də'vət edilməsi lehinə səs verdilər (320, s.50). S.Şaumyan və digər komissarlar bu məğlubiyyətdən sonra vəzifələrindən iste'fa verdiklərini bildirsələr də cəbhədəki böhranın qarşısının alına biləcəyinə ümidlərini hələ də kəsməmişdilər. Bu ümidin arxasında isə Rusiyadan gələ biləcək hərbi kömək dayanırdı. İste'fa e'lan edilən günün sabahısı S.Şaumyan yenə V.Leninə teleqram göndərdi. Ondan tə'kidlə xahiş etdi ki, tə'cili olaraq Bakıya nizami hərbi hissələr göndərilsin. Çünki Bakını yalnız bu yolla qorumaq olardı (24, v.3). Ona görə də onlar hakimiyyəti təhvil verməmişdilər (320, s.51). Hələ kifayət qədər gücə malik olduqlarını nümayiş etdirmək üçün iyulun 28-də Bakıda bolşeviklər Q.Petrovun dəstəsinin, qırmızı Tə'limatçılar məktəbi şəxsi hey'ətinin, Xəzər Hərbi Donanması bölmələrinin, ayrı-ayrı qırmızı bölmələrin mitinq-toplantısını keçirdilər (202, s.121). İyulun 28-də Bakı XKS 1883-1892-ci illərdə anadan olanların məcburi səfərbərliyini də e'lan etdi (2, s. 607). Lakin iyulun 30-da Türk-Azərbaycan qoşun hissələri Şamaxı-Bakı yolu ilə xeyli irəliləyib Biləcəriyə yaxınlaşanda (65, v.5) mə'lum oldu ki, nə cəbhədəki böhranı aradan qaldırmaq mümkündür, nə də bolşeviklərin Bakının siyasi qüvvələri və əhalisi arasında nüfuzunu .

İyul ayının 30-da Bakıya doğru irəliləyən Şimal qrupu əvvəlcə Atbatan adlanan məntəqənin cənubunda Qırmızı Ordunun bir tabor piyada, 200 nəfərlik süvarı qüvvəsi ilə rastlaşdı ki, onların da ixtiyarında 2 top və 3 zirehli avtomobil var idi. Saat 12. 30-da Şimal qrupu sür'ətli hücumla Bakı Soveti qoşunlarının mövqelərini ələ keçirdi. Qorxudan pərən-pərən olan Sovet bölmələri hətta Qobu kəndi yaxınlığında əvvəldən düzəldilmiş müdafiə səngərlərində də mövqe tutmadılar. Onların bir hissəsi qaçıb Bakıya, digər bir hissəsi isə Sumqayıta getdi (195, s.573).

İyulun 30-da Şimal qrupuna nisbətən Cənub qrupu Bakıdan xeyli aralı idi. Bunun səbəbi onunla bağlı idi ki, Qırmızı Ordu dəstələri geri çəkildikcə bütün körpüləri xarab edirdilər. Türk mənbələrinə görə Müsüslüdən sonra Cənub qrupunun yolu üzərində irili-xırdalı 22 körpü xarab edilmişdi (195, s.573). Həmin körpülərin bərpa edilməsi isə xeyli vaxtın itirilməsinə səbəb olurdu. Bununla belə Cənub qrupu da irəliləməkdə davam edirdi. Ələtdə dayanan sovet qüvvələri qaçıb dağılmışdılar (2, s.616). Eyni zamanda L.Biçeraxov öz dəstəsini Cənub qrupunun qarşısından çəkərək 1 nömrəli zirehli qatarla birlikdə Biləcəriyə doğru üz tutdu (231, s.234). Bakı-Tiflis dəmir yolu boyunca döyüşlərin taleyinin artıq həll edildiyini anlayan L.Biçeraxov Biləcəri stansiyası ilə dəniz arasında elə bir mövqe tutdu ki, vəziyyət mürəkkəbləşən kimi dərhal qatarla Şimala doğru yola düşsün. İngilis generalı Denstervil bunu bolşeviklərin L.Biçeraxova xəyanət etməsi, onu heç nə ilə təchiz etməməsi, hətta türklərə təslim etmək istəmələri ilə əlaqələndirirdi (209, s.175). Bolşeviklərdən sonra hakimiyyətə gəlmiş qüvvələr də Biçeraxova qarşı xəyanət işlədildiyini, İrandan çağırılmasına baxmayaraq heç bir köməklə qarşılaşmadığını və Türk-Azərbaycan qüvvələrinə qarşı uğurla vuruşmaq üçün zəmin yaradılmadığını bildirirdilər (65, v.3).



L.Biçeraxovun dəstəsi Hacıqabul-Bakı dəmir yolundan çəkilib Rusiyaya qaçmaq üçün çıxış mövqelərini tutduqdan sonra Cənub qrupunun qarşısında olan azsaylı Sovet qüvvələri Heybət stansiyasında müdafiə mövqelərini tutdular. Bu qüvvələrin zirehli qatarı da var idi. Şərq cəbhəsi komandanlığı Cənub qrupuna göstəriş verdi ki, sür'ətli hərəkətlə Heybət stansiyasını tutsun və buradan iyulun 31-də Bakı üzərinə təşkil ediləcək hücumda iştirak etsin. Şərq cəbhəsi komandanlığı Bakı üzərinə hücum təşkil etməmişdən əvvəl Biləcəri-Sumqayıt istiqamətindən gözlənilə biləcək təhlükəni aradan qaldırmaq üçün burada da xüsusi bir dəstə yerləşdirməyi qərara aldı. Həmin dəstəyə 38-ci alayın ehtiyatda dayanan 1-ci taboru, 2-ci süvari türk alayının bir bölüyü, bir topçu taqımı daxil idi (15,s.573-574). Şərq cəbhəsi komandanlığının qərargahı Qobu kəndində yerləşirdi. Cəbhədə qüvvələr nisbətindən xəbərdar olan Şərq cəbhəsi komandanlığı iyulun 31-də Bakı üzərinə uğurlu hücum təşkil olunacağına ümid edirdi. Bolşevik mənbələrinin verdiyi mə'lumata görə, 32 verst uzunluğunda olan cəbhə xəttində cəmi 400 döyüşçü qalmışdı. Sovet qüvvələrinin komandanı Avetisov isə az qüvvə ilə müdafiə olunmaq mümkün olmadığı üçün ağ bayraq qaldırıb danışıqlar aparmağı təklif edirdi (2, s.617). Doğrudur, Bakı XKS devrildikdən sonra Avetisov bayraq qaldırmaq fikrini söyləmədiyini bildirirdi. Onun sözlərinə görə, türklərin Qafqazdan qovulması həyatının əsas mə'nası idi və buna görə də bolşeviklərdən fərqli olaraq türklərə qarşı mübarizəni davam etdirirdi (65, v.6). İyul ayının 30-dan 31-nə keçən gecə bolşeviklər öz hakimiyyətlərini qoruyub saxlamaq üçün sonuncu dəfə cəhd göstərdilər. Hələ gecə ikən Xalq Komissarları Soveti şəhərdə olan bütün hissələri və silahlıları cəbhəyə yollamağa çağırdı, fəhlələrə müraciət qəbul etdi ki, silahlanıb şəhəri "qorusunlar". Ermənilərdən ibarət olan hissələrin komandirlərindən tələb olundu ki, heç olmasa sülh danışıqları başlanana kimi öz hissələrini cəbhə xəttinə yollasınlar. Elə gecə ikən onlar 1300 nəfərdən ibarət olan 16-cı və 18-ci taborların cəbhə xəttinə çıxarılacaqlarına söz verdilər. "Daşnaksütun" partiyasının rəhbərləri isə iyulun 31-də cəbhəyə 1000 nəfərlik qüvvə çıxarılacağını və'd etdilər (2, s.617).

Bolşevik mənbələrində mövcud olan mə'lumata görə, iyulun 31-də ehtimal olunan qədər qüvvə toplanmadı. Cəbhə xəttinə yalnız 16-cı tabordan 320 nəfər gəlib çıxdı (2, s.617). Hər halda cəbhə xəttində olan Sovet qüvvələri azacıq da olsa möhkəmlənmək imkanı əldə etdilər.

Türk-Azərbaycan qoşunlarının Şimal qrupu iyulun 31-nə keçən gecə hücuma keçdi və saat 3.30-da Heybət stansiyasından təxminən 2 kilometr şimala olan yüksəkliyi tutdu. Davam etdirilən döyüşlərdən sonra saat 8.00-da Xırdalan da azad edildi. Sovet qüvvələri dəmir yolu xəttinə kimi geri çəkilərək burada əvvəldən hazırlanmış səngərlərdə mövqe tutdular. Heybət stansiyası ilə Hacıhəsən kəndi ətrafında gedən döyüşlərdə Şimal qrupu tutduğu yüksəkliyi əldən versə də, axşama yaxın onu yenidən ələ keçirdi. Qırmızı ordunun qurıda və gəmilərdə yerləşdirdikləri toplar bu döyüşlərdə Sovet hissələrini yaxından himayə edirdi. İyulun 31-i gecəsini Şimal qrupu həmin yüksəklik ətrafında keçirdi. Həmin gün şimal istiqamətinə göndərilmiş olan ehtiyat qüvvələr Sumqayıt stansiyasını ələ keçirdi və Bakının şimalla olan əlaqələrini kəsdi. Cənub qrupu isə müəyyənləşdirilmiş məntəqəyə gəlib çıxa bilməmişdi. Yolların xarablığı ilə bərabər susuzluqdan da çətinlik çəkən Cənub qrupu iyulun 31-də Ağbulaq stasiyasında idi. Döyüşlərin gedişində Şərq cəbhəsi komandanlığı həlledici döyüşlər ərəfəsində yeni ehtiyat qüvvələr yaratmağı qərara aldı. 38-ci türk piyada alayının 2-ci taborundan, Xüsusi Azərbaycan Korpusunun Ləzgi süvari alayından və 2 dağ topundan ibarət olan bu qüvvələr iyulun 31-də Xırdalan ətrafına toplaşdılar. Onlara cəbhənin ehtiyatı kimi Güzdək ətrafında yerləşmək tapşırıldı (195, s.575).

Beləliklə, iyulun 31-də cəbhədə bolşeviklərin xeyrinə heç bir dəyişiklik baş vermədi. Əksinə, bir vaxt dayaqlandıqları erməni hərbçiləri Avetisov, Qazarov, Amazasp və digərləri haqlı cəzadan canlarını qurtarmaq üçün Bakı komissarlarından Türk-Azərbaycan qoşunları ilə danışığa başlanmasını tə'kid edirdilər. Hər şeydən çarəsi üzülən Bakı komissarları belə bir şəraitdə hakimiyyətdən əl çəkdiklərini bildirdilər. Avqustun 1-də Bakıda hakimiyyət eserlərin, menşeviklərin və daşnakların əlinə keçdi. Onlar "Sentrokaspi və Sovetin Müvəqqəti İcraiyyə Komitəsi Rəyasət Hey'ətinin diktaturası" adlı hakimiyyət orqanının yaradıldığını e'lan etdilər (235, s.152). Bu hakimiyyət orqanında əsas vəzifələri erməni-daşnak elementləri tutmuşdular ki, onların da hansı mürtəce mövqedə dayandıqlarını təsəvvür etmək heç də çətin deyildi.

Hakimiyyət "Sentrokaspi Diktaturası"na keçəndən sonra bolşeviklərə tabe olan qüvvələr Petrovski meydanına toplandı və burada onların qərargahı yaradıldı. Həmin qüvvələrə Q.Popovun 19-cu alayı, Q.Petrovun dəstəsinin qalıqları, bolşevik hərbi drujinası, silahlı fəhlə qrupları və s. daxil idi. "Sentrokaspi Diktaturası"na tabe olmayan bu qüvvələrin bir neçə topu, zirehli avtomobilləri var idi (202, s.122).

"Sentrokaspi Diktaturası" üzvləri Bakının mühasirədə olduğu vaxt hakimiyyətə gəlsə də, onun Türk-Azərbaycan qoşunları tərəfindən tutulmasına yol verilməsini heç cür qəbul etmirdilər. Türk-Azərbaycan qoşunlarına, Azərbaycanın milli qüvvələrinə nifrət "Sentrokaspi" liderləri ilə bolşeviklər arasında yaxınlıq yaradan başlıca təmas nöqtələrindən biri idi. Bu iki qüvvə arasında qarşıdurmanı kəskinləşdirən də elə Türk-Azərbaycan qoşunlarının Bakıya yaxınlaşması oldu. "Sentrokaspi" liderləri Bakı komissarlarını Qırmızı Ordunu dağıtmaqda və beləliklə də Türk-Azərbaycan qoşunlarının Bakıya yaxınlaşmasına imkan verməkdə ittihamlandırırdılar. Onların fikrincə, Korqanov və digər bolşevik strateqləri heç kəsin məsləhətinə qulaq asmadan cinayətkar qərarlar qəbul edir və bununla da ordunun mütləq tənəzzülünü yaxınlaşdırırdılar. Nəticədə, nizamdan çıxmış, tənəzzülə mə'ruz qalmış, ovqatı korlanmış Qırmızı Ordu qısa müddət ərzində Kürdəmirdən Bakıya qədər geri çəkilməli olmuşdu (65, v.1). Vəziyyətdən çıxış yolunu isə onlar ingilis qoşunlarının Bakıya çağırılmasında görürdülər. Erməni Milli Şurasının və daşnak liderlərinin tə'kidi ilə "Sentrokaspi Diktaturası" hakimiyyəti əlinə aldığı andan ingilislərin Bakıya gəlməsinin sür'ətləndirilməsi üçün yollar aramağa başladı. Əslində son aylar ərzində Erməni Milli Şurası ilə daşnak elementləri İranda olan ingilis qoşunları komandanı general Denstervil ilə əlaqələr yaradıb Bakıya qoşun çıxarılması məsələsini dəfələrlə müzakirə etmişdilər (310, s.113). "Sentrokaspi Diktaturası" ilə razılığa gəlinmiş, bu məsələnin texniki icrası üçün lazımi işlər görülmüşdü.

Bakı komissarları hakimiyyəti təhvil verən kimi şəhərdən qaçmağa cəhd göstərdilər. Ancaq onların olduğu gəmi Xəzər donanmasının gəmiləri tərəfindən Bakıya qaytarıldı. Komissarlar həbs olunsalar da Petrovun və Əmirovun (ermənidir -M.S) dəstələrinin sə'yi ilə həbsdən azad edildilər (64, v.2).

Yeni hakimiyyət orqanının sərəncamına keçmiş hərbi hissələr "Qafqaz Qırmızı Döyüşən Ordusu" adlandırıldı (64, v.23) və polkovnik L.Biçeraxov onun baş komandanı tə'yin edildi (64, v.2). Bu barədə L.Biçeraxova da xəbər göndərildi.

Avqustun 1-də Şimal qrupu Bakı üzərinə hücumu davam etdirdi. Onun zərbə qüvvəsi dəmir yolu boyunca hündürlüklərdə mövqe tutmuş döyüşən Qırmız Ordu bölmələrinə qarşı istiqamətlənmişdi. Gərgin döyüşün gedişində Şimal qrupu saat 14.30-da Qurd qapısındakı ən yüksək hündürlüyü ələ keçirdi. Bu hündürlükdə 13-cü Qafqaz türk alayının döyüşçüləri mövqe tutdular. Həmin mövqelər çox böyük əhəmiyyətə malik olduğu üçün "Sentrokaspi Diktaturası"nın quru və gəmi toplarının güclü atəşinə mə'ruz qaldı. 10-cu alayın bölmələri 13-cü alayın sol qanadı ilə təmasda döyüşürdü. Bu alay Bakıya doğru xeyli irəliləyə bilmişdi. Cənub qrupu isə hələ Heybətə gəlib çıxmamışdı. Susuzluq bu qrupun şəxsi hey'ətini tamamilə əldən salmışdı. Ona görə H.Səlimov arxadan su gətirilib çatdırılmayınca hərəkətin qeyri-mümkün olduğunu bildirirdi. Belə olan halda Şərq cəbhəsi komandanlığı Bakıdakı qüvvələrin möhkəmlənməsinə yol ver-

məmək üçün Cənub qrupunun yetişməsini gözləmədən hücumu davam etdirməyi qərara almışdı (195, s.575).

Avqustun 1-də axşam Türk-Azərbaycan qoşun hissələri aşağıdakı xətt üzrə mövqe tutmuşdular. Cənub qrupu Ələtdə idi. 13-cü və 10-cü Qafqaz türk alayları Qurd qapısı dağı və Hacıhəsən kəndi xəttində yerləşmişdilər. 60-cı piyada taboru Xırdalan yaxınlığında, 38-ci piyada alayının 1-ci taboru ilə 2-ci türk süvari alayı bir səhra topu taqımı ilə Sumqayıt stansiyasında, cəbhənin ehtiyatını təşkil edən 38-ci piyada alayının 2-ci taboru ilə Azərbaycan Korpusunun Ləzgi süvari alayı Güzdəkdə dayanmışdılar. Avqustun 2-də Şimal qrupunun bütün hissə və bölmələrinə Bakı üzərinə hücumu davam etdirmək, Cənub qrupuna isə Heybət stansiyasına qəlib çatmaq tapşırığı verilmişdi (195, s.576).

Avqustun 2-də davam etdirilən hücum ciddi bir mövqe dəyişikliyinə səbəb olmadı. Şimal qrupunun sol qanadı bir qədər irəli hərəkət etsə də top mərmilərinin və sursatın qıtlığı təşəbbüsün genişləndirilməsinə imkan vermirdi. "Sentrokaspi Diktaturası" isə bütün qüvvələrini səfərbərliyə alaraq ingilis qoşunları gələnə kimi şəhəri qorumağa çalışırdı. Hətta cəbhə xəttindən geri qaçanların qarşısının alınması üçün cəza dəstələri təşkil edilmişdi (195, s.576).

Gündəlik döyüşlərdən sonra meydana gələn yorğunluq, maddi və canlı itkilər Türk-Azərbaycan qoşunlarının döyüşkənliyinə öz tə'sirini göstərməkdə idi. Qafqaz İslam Ordusunun komandanı qoşunların gücləndirilməsi və Bakının azad edilməsinin sür'ətləndirilməsi üçün Türkiyənin Şərq ordular qrupu komandanlığına müraciət edərək 56-cı piyada alayının da Azərbaycana göndərilməsini xahiş etdi. Ancaq şimaldan L.Biçeraxovun, İrandan isə ingilis qoşunlarının Bakı üzərinə gəlməsi xəbəri alınandan sonra Nuru Paşa 56-cı piyada alayının daxil olduğu 15-ci piyada diviziyasının bütünlüklə Azərbaycana göndərilməsi barədə vəsatət qaldırdı. (195, s.576).

Avqustun 3-də "Sentrokaspi Diktaturası"nın əsasını ermənilər təşkil edən hissə və bölmələrinin hücuma keçəcəyi gözlənilirdi. Lakin hücuma keçmək əvəzinə Erməni Milli Şurası Şərq cəbhəsi komandanlığına xəbər göndərib danışıqlar aparmaq niyyətində olduğunu bildirdi (240, s.1/44).

Şərq cəbhəsi komandanlığı elə həmin günə danışığa girmək təklifini rədd etdi və döyüşən Qırmızı Ordunun Biləcəridə dayanan bölmələri vasitəsilə bu ordunun baş komandanına və Erməni Milli Şurasının sədrinə məktublar göndərdi. Məktubların biri rus, biri isə türk dilində yazılmışdı. Məktubda deyilirdi:

"Cənab Bakıdakı Erməni Milli Şurasının sədri!

Şübhəsiz Sizə aydındır ki, Bakı şəhəri ətrafında türk qoşunu döyüşür. Əgər siz şəhəri döyüşsüz təslim etməyə razı olsanız milliyətindən və məzhəbindən asılı olmayaraq hamının hüquqlarının qorunmasına zəmanət



veriləcəkdir. Xüsusilə, siz ermənilərə onda icazə və zəmanət veriləcəkdir ki, arzuladığınız halda maneəsiz Bakıdan Ermənistana gedə biləsiniz. Əgər şəhər təslim edilməsə, o, onsuz da alınacaqdır və həmin vaxt axıdılan qanların və yetirilən ziyanların məs'uliyyəti sizin üzərinizdə qalacaqdır. Şəhəri təslim etməyə hazırsınızsa onda xahiş edirəm ki, dərhal nümayəndəniz vasitəsilə cavab göndərin... Osmanlı Ordusu Şərq cəbhəsi komandanı Mürsəl" (11, 15.09.1919).

Erməni Milli Şurasının və "Daşnaksütun" partiyasının fəalları bu məktuba cavab vermədilər və Türk-Azərbaycan qoşunlarına qarşı mübarizəni davam etdirməyi qərara aldılar.

Avqust ayının 3-də L.Biçeraxovun "Sentrokaspi Diktaturası"na teleqramı alındı. Onun Bakıya doğru irəliləməsi ilə bağlı olan bu teleqram "Sentrokaspi Diktaturası" liderlərini, daşnak elementlərini o qədər sevindirmişdi ki, Biçraxovun bildirdikləri rus və erməni dilində böyük vərəqlərdə çap olunub şəhərdə yayılmışdı. L.Biçeraxov həmin teleqramla Bakının yeni hakimiyyət orqanına çatdırırdı ki, şimal istiqamətində Türk-Azərbaycan qoşunları üzərinə hücuma keçir və Bakını qoruyan Qırmızı Ordunun hissələri ilə birləşəcəyi gün çox da uzaqda deyil (45, v.1)

Yeni qüvvələrin gəlməsi xəbəri ilə bir vaxtda – avqustun 3-də "Sentrokaspi Diktaturası" səfərbərliklə əlaqədar şəhər əhalisinə müraciət qəbul etdi. Bakı şəhəri və onun rayonlarının səfərbərlik üzrə komissarı R.Bekzadyan və onun katibi Qukasyan tərəfindən imzalanan bu müraciətdə bütün ev, zavod və mə'dən komitələrindən avqustun 3-ü axşam saat 6-dək qeydiyyatda olan kişi əhalisinin siyahılarının təqdim etmələri tələb olunurdu. Əks təqdirdə cəza tədbirlərinin tətbiq ediləcəyi bildirilirdi.

Avqustun 4-də polkovnik Stoksun komandanlığı altında İrandakı ingilis qoşunlarının ilk dəstəsi Bakıya gəldi (229, s.28).

Alınan hərbi yardımlar "Sentrokaspi Diktaturası"nın döyüş imkanlarını artırmaqla bərabər ümidverici əhval-ruhiyyə də yaratmışdı. Heç şübhəsiz ki, bu əhval-ruhiyyə döyüşən Qırmızı Ordunun fəaliyyətində, Türk-Azərbaycan qoşunlarına qarşı müqavimətində bir canlanma oyatmışdı ki, bu da sonrakı döyüşlərdə müəyyən qədər özünü hiss etdirirdi. Ona görə avqustun 4-də davam etdirilən döyüşlər Türk-Azərbaycan qoşunlarına yeni uğur gətirmədi. Əslində son bir neçə gün ərzində davam edən döyüşlərin gözlənilən nəticəni verməməsi eyni zamanda Şərq cəbhəsi komandanlığının çevik taktika işlədə bilməməsi ilə də bağlı idi. Qurd qapısı hündürlüyü tutulandan sonra Şərq cəbhəsi komandanlığı bütün diqqəti bura cəmləşdirib "Sentrokaspi" ordusunun müqavimətinin də buradan yarılmasına çalışırdı. Həmin nöqtə şəhərə ən yaxın nöqtə olub qısa müddət ərzində Bakıya aparan yolun başlanğıcı olsa da, bura Bakıdakı qüvvələrin toplarının tə'sir dairəsində idi. Həm də gəmi topları aramsız olaraq oranı atəşə tutur və Şimal qrupunun hissə və bölmələrinin irəliləməsinə imkan vermirdi.

Şəhərə şimal tərəfdən hücum edilməsini isə Şərq cəbhəsi komandanlığı lazım bilmirdi. Qərar da onunla əsaslandırılırdı ki, Qurd qapısı ətrafındakı qüvvələrin Bakının şimalına gətirilməsi xeyli vaxt aparacaqdı. Cənub qrupunun da şəhər ətrafına yetişə bilməməsi Şimal qrupunun fəaliyyətinin səmərəliliyini müəyyən dərəcədə azaldırdı. Dəmir yolunun dağıdılmış hissələrinin tə'mirinin ləngiməsi ilə bağlı olaraq Cənub qrupu avqustun 4-də axşama yaxın Puta stansiyasına gəlib çıxdı (195, s.578).

Şərq cəbhəsi komandanlığı avqustun 5-də hücumu davam etdirməyi qərara aldı. Həmin hücumun həyata keçirilməsi üçün qruplar qarşısına aşağıdakı vəzifələr qoyulmuşdu. Səhər saat 4-də başlanan hücumla Şimal qrupu nəhayət, Qurd qapısı istiqamətindən Bakıya girməli, Bayıl burnunda yerləşdirilmiş topla limandakı gəmiləri atəşə tutmaqla onların fəaliyyətini neytrallaşdırmalı idi. Cənub qrupu isə Puta stansiyası ilə dəniz arasındakı ərazilərin mühafizəsini tə'min etməli və lazım gələrdisə hücuma qoşulan Şimal qrupunun fəaliyyətini qüvvətləndirməli idi. Bu planın icrasına başlamazdan əvvəl 13-cü Qafqaz türk alayının 4, 30 və 46-cı taborları Qurd qapısındakı yüksəklikdə idilər. Alayın sərəncamında 17 top var idi. 38-ci piyada alayının 2-ci taboru isə 13-cü alayın ehtiyat qüvvəsi kimi saxlanılmışdı. Hücumun taleyi əsasən 13-cü alayın hərəkət istiqamətində həll ediləcəyindən Şimal qrupunun 25, 26 və 29-cu taborlarından ibarət olan ehtiyatı da bu alayın sağ qanadında yerləşdirilmişdi. Həmin sahəyə 19-cu süvari bölüyü də gətirilmişdi. Şimal qrupunun 10-cu alayı isə 13-cü alayın sol qanadında, Xırdalandan olan ərazidə yerləşmişdi. 38-ci alayın 1-ci taboru 10-cu alayın ehtiyatına verilmişdi və bu alayın hücumu 8 top vasitəsilə himayə olunmalı idi (195, s.578).

Şimal qrupunun bir dəstəsi də Xırdalanla Masazır arasında mövqe tutmuşdu. Bu dəstəyə 2-ci süvari alayının bir bölüyü, Azərbaycan Korpusunun süvari alayı, Ləzgi süvari alayının bir bölüyü (bu alayın başqa bir bölüyü Maştağa ətrafında idi - M.S.) Azərbaycan Korpusundan bir piyada bölüyü və bir atıcı bölük daxil idi. Dəstəyə mayor Zehni bəy komandanlıq edirdi. Sumqayıt stansiyasında isə 38-ci piyada alayının 1-ci taborunun bir bölüyü, Azərbaycan könüllülərindən ibarət bir süvari taqımı və bir pulemyot taqımı dayanmışdı. Bakının qərbində dayanan Cənub qrupuna bir piyada bölüyü, diviziyanın istehkam bölüyü, bir süvari taqımı, 2 rus topu və bir zirehli qatar daxil idi (195, s.579).

38-ci alayın Gəncədə saxlanılmış natamam 3-cü taboru Şamaxı yolu ilə, 9-cu piyada alayının 27-ci taboru isə qatarla Bakı ətrafına göndərilmişdi.

Avqustun 5-də saat 4.25-də Bakı şəhəri üzərinə növbəti hücum başlandı. Böyük sür'ət və qızğınlıqla genişlənən döyüşün ilk anları Türk-Azərbaycan qoşunları üçün uğurlu oldu. Güclü zərbəyə davam gətirə bilməyən "Sentrokaspi" qüvvələri geri çəkildi. Tezliklə Bayıl ələ keçirildi



və birləşmiş qoşunlar həm Bibiheybətə, həm də Qurd qapısından şəhərə doğru xeyli irəlilədilər (239, s.131).

Türk-Azərbaycan qoşunlarının mövqelərindəki irəliləyiş əsasən piyada hissə və bölmələrinin sə'yi ilə əldə edilmişdi. Qrupun sərəncamında olan topların kifayət qədər mərmisi olmadığı üçün piyadaların sür'ətlə irəliləyişini tə'min etmək mümkün olmadı. Hətta bir sıra toplar mərmi çatışmazlığı üzündən atəş mövqelərindən çıxarılaraq geriyə aparılmışdı. Bu isə səhərdən uğurla başlanan döyüşün sonrakı nəticəsinə öz tə'sirini göstərdi.

Türk-Azərbaycan qoşunlarının Bakı üzərinə uğurla başlanan hücumu "Sentrokaspi Diktaturası"nın daşnak fəalları ilə yanaşı bolşevikləri və keçmiş komissarları da böyük təşvişə salmışdı. Şəhərin alınacağı təqdirdə haqq divanı qarşısında durmalı olacaqlarından qorxan keçmiş komissarlar da sərəncamlarında olan qüvvələrdən istifadə etmək qərarına gəldilər. S.Şaumyanın təklifi ilə Petrov gəmilərdən bir batareyanı düşürüb şəhər meydanlarından birində döyüş vəziyyətinə gətirdi. Topların atəşini nizamlamaq üçün batareya komandiri şəxsən avtomobilə oturub Bayıla simli rabitə xətti çəkdi. Onun komandası ilə atılan mərmilər Türk-Azərbaycan qoşunlarının ən gur nöqtələrinə düşdü. Onların böyük itki verərək geri çəkilməsi döyüşən Qırmızı Ordunun piyadalarını da ruhlandırdı və onlar da irəli atıldılar. Nəticədə Türk-Azərbaycan qoşunları səhərki mövqelərini də itirərək şəhərdən xeyli aralı düşdülər (320, s.55). Şimal qrupunun hissə və bölmələri həm Bibiheybəti, həm də Qurd qapısında neçə gün ərzində saxladıqları mövqeləri tərk etdilər (2, s.626). Şərq cəbhəsinin qərargah rəisi podpolkovnik Rüşdü sonralar öz xatirələrində bu döyüşlə bağlı belə yazırdı: "Düşmən gücləndirilmiş top, pulemyot və silah atəşi altında əks-hücuma keçdi və 10-cu və 13-cü alayları geri çəkilməyə məcbur etdi. İtki xeyli çox idi. Düşmən atəşinin susdurulması üçün topçu bölmələrinin mərmisi yox idi. Əgər düşmən geri çəkilən hissələri tə'qib etsəydi onda yəqin ki, Heybət-Biləcəri sahəsi də təhlükəyə mə'ruz qalardı." Beləliklə, 1918-ci il avqustun 5-də Şimal qrupunun hücumu düşmən tərəfindən dəf edildi (bax:239, s.131-132).

Bakıdakı qüvvələrin güclənən təzyiqi altında 10-cu alay da əvvəlki mövqelərinə çəkilməli oldu. Şimal qrupunun hissə və bölmələri Heybət-Biləcəri dəmir yolunun qərb tərəfində mövqe tutdular. Döyüşün gedişində qrupun verdiyi itkilər aşağıdakı sayda idi: - 9 zabit, 139 əsgər şəhid olmuş, 19 zabit və 144 əsgər yaralanmışdı. 3 ədəd pulemyot və 547 tüfəng sıradan çıxmışdı (195, s.580).

Avqustun 6-da Qafqaz İslam Ordusunun qərargah rəisi Nazim bəy Qobuya gəlib Şərq cəbhəsi hissələrinin vəziyyəti ilə tanış oldu. Bu tanışlıq onda heç də ürəkaçan ovqat yaratmadı. 5-ci Qafqaz diviziyasının (Xüsusi Azərbaycan Korpusunun tərkibində 3 saylı diviziya idi - M.S.) şəxsi

hey'ətinin yarısının itirildiyini və xəstələndiyini görən qərargah rəisi yuxarı komandanlıq qarşısında 15-ci türk diviziyasının bütünlüklə Bakı ətəklərinə göndərilməsi barədə təklif qaldırdı. Onun təklifinə top mərmilərinin göndərilməsi də daxil idi (195, s.581).

Həmin günlərdə Tiflisdə olan Türkiyənin Şərq ordular qrupunun komandanı Bakı ətrafındakı qoşunların vəziyyətini və qaldırılan təklifləri nəzərdən keçirdikdən sonra Azərbaycana iki yeni piyada alayının göndərilməsinin məqsədəuyğunluğunu təsdiqlədi. Nuru Paşa isə Bakı üzərinə uğurlu hücumun həyata keçirilməsi üçün 5000 nəfərlik piyada qüvvələrinin, iki səhra batareyasının, 4 ağır batareyanın, bir təyyarə dəstəsinin, bir telefon bölüyünün, 28000 atım mərminin, 20 ədəd nəqliyyat avtomobilinin göndərilməsini lazım bilirdi (195, s. 580-581).

Avqustun 5-də aparılan döyüşdə Türk-Azərbaycan qoşunlarına qarşı L.Biçeraxovun qoşunlarından olan bir nümunəvi tabor da iştirak edirdi. Həmin tabor əsasən Bakının və Muğanın rus əhalisindən təşkil edilmişdi. Təxminən ay yarım ərzində Bakı ətrafında Türk-Azərbaycan qoşunlarına qarşı vuruşan bu tabor qısa müddət ərzində nümunəvi alaya, sonra da nümunəvi briqadaya çevrilmişdi. Bakı tutulandan sonra bu hissə Petrovska çəkilmiş və sonradan ingilislərin ikinci gəlişi ilə Bakıya qayıtmışdı (35, v.11).

L.Biçeraxov özü də Bakı ətrafında gedən döyüşlərdə iştirak edirdi. Lakin Türk-Azərbaycan qoşunlarının geri oturdulmasında L.Biçeraxovun dəstəsinin elə bir rolu yox idi. 5 avqust döyüşündən az sonra o, Bakı ətrafını tərk etdi və yenidən Petrovska qayıtdı. Bakı ətrafındakı qoşunların baş komandanı tə'yin edilmiş L.Biçeraxovun Bakıya girmədən yenidən Petrovska qayıtmasının səbəbləri barədə qəti fikir söyləmək çətindir. "Sentrokaspi Diktaturası"nın rəhbərlərinə göndərdiyi teleqramında özü belə deyirdi ki, Bakını qoruyub saxlamaq üçün gərək heç olmasa Yevlaxa qədər olan ərazi nəzarət altında saxlansın. Ona görə də Petrovska qayıdır ki, Kuban və Terek vilayətlərindən yeni kazak qüvvələri toplasın və böyük bir ordu ilə yenidən Bakıya gələrək Yelizavetpola doğru hücuma başlasın (64, v.29).

L.Biçeraxovdan sonra Bakı ətrafındakı qoşunların komandanı Avetisov tə'yin edildi və özünün elə ilk əmrlərindən birində avqustun 5-də aparılan döyüşün nəticələrini təhlil edərək L.Biçeraxovun dəstəsinə, Xəzər donanmasına, Aviasiya məktəbinə, Kuban təyyarə dəstəsinə, ordunun təchizat rəisinə, tibbi şö'bəyə, döyüşdə iştirak edən hissələrin təşkilinə kömək göstərən bütün partiyaların fəallarına minnətdarlığını çatdırırdı (64, v.23).

Avqustun 5-də olan döyüşdən sonra təxminən 10 gün cəbhədə nisbi sakitlik yarandı. Həmin vaxt ərzində hər iki tərəf növbəti döyüşlər üçün ciddi hazırlıq işləri aparır və cəbhədə təşəbbüsün ələ alınması üçün xüsusi bir sə'y göstərirdi. "Sentrokaspi Diktaturası"nın əsas ümid bağladığı ingilis qoşunlarının rəhbəri general Denstervil və onun qərargahı avqust ayı-



nın 17-də Bakıya gəldi (229, s.28). 39-cu piyada briqadasının hissələrindən təşkil edilmiş bu dəstəyə Denstervilin özünün yazdığına görə 1000-ə yaxın əsgər və zabit, bir neçə top və zirehli avtomobil daxil idi (209, s.262). "Sentrokaspi Diktaturası"nın rəhbərləri cəbhənin ingilislərə tabe etdirilməyəcəyini, yalnız onların nümayəndələrinin cəbhə qərargahına daxil etdiriləcəyini bildirsələr də (64, v.24), əslində ingilislərin gəlməsi ilə Bakının qorunmasının təşkili onların nəzarəti altında keçdi. Cəbhə xəttinin ən vacib nöqtələrinə ingilis bölmələri yerləşdirildi. Müdafiə xəttinin sol cinahı Şimali Stafford alayına tapşırıldı. Bu alayın 100 nəfərlik bir dəstəsi cəbhə xəttinin mərkəzində yerləşdirildi və orada mövqe tutmuş olan "Sentrokaspi" qoşunlarının bir taboru cəbhənin başqa nöqtəsinə dəyişdirildi (209, s.195).

Türk-Azərbaycan qoşunlarının hücumlarının qarşısının səmərəli şəkildə alınması üçün general Denstervil "Sentrokaspi" qoşunlarının yenidən qurulmasının zəruriliyini vurğulayırdı. Əsasını ermənilərin təşkil etdiyi və 22 taborda birləşdirilən bu qoşunun əsgər və zabitləri ingilislərin Bakıya gəlməsindən sonra vaxtlarının çoxunu istirahətdə keçirir, istədikləri vaxt istədikləri yerə gəlib-gedirdilər. Bu isə ingilis qoşunlarının rəhbərliyini heç də tə'min etmirdi. General Denstervilə görə yerli qoşunlar e'tibarsız silahlı dəstələr idi və onlara heç də arxayın olmaq olmazdı. Bütün müdafiə xəttini qorumağa isə ingilislərin imkanı yox idi. Ona görə də cəbhənin ən vacib sahələrinin qorunmasını ingilislər öz üzərlərinə götürmüşdülər. Cəbhənin sol cinahından başqa Qurd qapısı yüksəkliyi də Şimali Stafford alayının nəzarəti altında idi. Bundan başqa bu alayın kiçik bir dəstəsi Palçıq vulkanı yaxınlığına göndərilmişdi. Palçıq vulkanı istiqamətinə yerli qoşun hissələri arasında ən yaxşı hissələrdən sayılan 2 tabor da göndərilmişdi. Bu taborlar Biləcəriyə yaxın sahədə yerləşdirilmişdi. General Denstervilin yazdığına görə, həyəcan siqnalı baş verən kimi bu taborlar qaçıb dağılmışdı (209, s.197,203).

Sonradan Bakıya gələn Vervik və Uorçester taborları məhz bu istiqamətə göndərilərək oranın müdafiəsi gücləndirilmişdi. Ön xətdəki qoşunlara rəhbərlik polkovnik Keyvorta, bütün briqadaya rəhbərlik isə polkovnik Faviele həvalə olunmuşdu (209, s.203).

Döyüş xəttinin şəhərə yaxın olması ingilisləri çox narahat edirdi. Türk-Azərbaycan qoşunları elə bir xətdə mövqe tutmuşdular ki, oradan topla şəhərin mühüm obyektlərini atəşə tutmaq olardı. Şəhərin müdafiəsinin möhkəmləndirilməsi üçün ingilislər Türk-Azərbaycan qoşunlarını heç olmasa top atəşlərinin şəhəri tuta bilməyəcəyi sahəyə qədər uzaqlaşdırmağı lazım bilirdilər. Çünki müdafiədə dayanmasına baxmayaraq Şərq cəbhəsi komandanlığı tutulan mövqelərin qorunmasına, habelə boş qalan sahələrin nəzarət altına alınmasına xüsusi diqqət yetirirdi. General Denstervil də yazırdı ki, Türk-Azərbaycan qoşunlarının xırda silahlı dəs-

tələri, habelə azərbaycanlılardan ibarət kiçik süvari partizan dəstələri Bakının şimal və şərq ətrafında xüsusi fəallıq göstərir və buradakı mövqeləri ələ keçirirdilər (209, s.203).

Belə döyüşlərin biri avqust ayının 17-də Balaxanı kəndinin şimal-qərbindəki yüksəklik ətrafında baş vermişdi. Həmin gün Tatar süvari alayının bir bölüyünə tapşırıq verilmişdi ki, göstərilən yerdə qərar tutan düşmən qüvvələrini qovaraq bu mövqeni ələ keçirsin. Döyüş başlanmamışdan əvvəl kornet Gülməmmədov kəşfiyyata göndərildi. O, düşmənin arxasına keçdi və onun mövqeyini atəşə tutdu. Tezliklə bütün süvari bölüyü kornet Gülməmmədovun köməyinə gəldi və birlikdə düşmən mövqeyi üzərinə hücum davam etdirildi. Gülməmmədov cinahdan da düşməni atəşə tutdu. Hətta burada əlbəyaxa döyüşlər də baş verdi. Müqavimətı qırılan düşmən qaçmaq məcburiyyətində qaldı. Onlardan bir zabit, bir həkim, 49 əsgər əsir və 3 ədəd pulemyot qənimət götürüldü (151, v.45).

Avqust ayının ortalarında Bakının siyasi həyatı da xeyli mürəkkəbləşmişdi. Keçmiş Bakı komissarları ilə "Sentrokaspi Diktaturası"nın rəhbərləri və fəalları arasında ziddiyyət özünün ən yüksək nöqtəsinə çatmışdı ki, heç şübhəsiz bu da "Sentrokaspi Diktaturası"nın əsas diqqətinin cəbhəyə yönəldilməsinə mane olur və Türk-Azərbaycan qoşunlarına da hazırlıq işlərinin nisbətən dinc şəraitdə aparılmasına müəyyən zəmin yaradırdı. Hakimiyyəti itirmiş olan keçmiş Bakı komissarları daha çox başlarını götürüb qaçmaq barədə düşünür və qanunsuz yolla ələ etdikləri xeyli sərvəti, sərəncamlarında olan çoxlu hərbi texnikanı, silah və sursatı da özləri ilə aparmaq istəyirdilər. "Sentrokaspi Diktaturası" isə bununla razı deyildi. Bakı diktatorları onlardan tələb edirdilər ki, hakimiyyətdə olduqları dövrdə gördükləri işlər, xüsusən maliyyə vəsaitlərinin xərclənməsi barədə hesabat təqdim etsinlər və sərəncamlarında olan hərbi mülkiyyəti təhvil versinlər (65, v.14).

Hələ iyulun 31-də qaçmağa cəhd göstərən keçmiş komissarlar geri qaytarıldıqdan sonra avqustun 3-də S.Şaumyan məsləkdaşı Ter-Qabrielyanla ikilikdə keçmiş silahdaşlarını ataraq yenidən qaçmağa cəhd göstərdi (65, v.8). Ancaq bu dəfə də onlar "Sentrokaspi"nin gəmiləri tərəfindən saxlanılaraq geri qaytarıldılar. Növbəti qaçmaq cəhdindən sonra "Sentrokaspi" rəhbərləri keçmiş komissarlara və onların silahdaşlarına bildirdilər ki, əgər fəaliyyətləri barədə hesabat təqdim etsələr və əllərindəki silah və hərbi texnikanı təhvil versələr onların Bakıdan getməsinə e'tiraz etməzlər. Keçmiş komissarlar buna razı oldular və hətta Petrov yazılı intizam verdi ki, ixtiyarında olan bütün silahı, hərbi texnikanı və digər ləvazimatı təhvil verəcəkdir (65, v.16). "Sentrokaspi" rəhbərləri isə əvəzində istədikləri vaxt keçmiş komissarlarla hərəkət üçün 10 paraxod ayıracağını və'd etdi (65, v.14).



Keçmiş Bakı komissarları verdikləri və'də əməl etmədən avqustun 13-də gecə zorla 19 paraxoda yüklənərək onları Həştərxana tərəf üzməyə məcbur etdilər (64, v. 4,12). Bu mə'lumatı alan kimi "Sentrokaspi Diktaturası" bəyanatla çıxış etdi. Həmin bəyanatda deyilirdi: "Polkovnik Petrov verdiyi sözü kobud şəkildə pozdu. Onunla birlikdə rəzil qəsbkarlar, soyğunçular, bütün keçmiş xalq komissarları və vəzifəli şəxslər də özləri ilə böyük miqdarda xalq pulu götürüb Bakı proletarlarının haqlı qəzəbindən qaçdılar" (65, v.14). Lakin tezliklə keçmiş Bakı komissarları həbs edilərək əks-inqilabla mübarizə üzrə fövqəl'adə komissiyanın istintaqına verildilər (64, v.14).

Avqust ayında döyüşlərin səngidiyi vaxt Rusiya və İngiltərə ilə bərabər Almaniyanın da Bakı ilə bağlı fəallığı xeyli artmışdı. Almanlar qorxurdular ki, Bakı nefti onların əlindən birdəfəlik çıxa bilər. hələ avqust ayının 4-də general Rudendorf Ənvər Paşanı hədələmişdi ki, əgər Bakı ətrafında döyüşlər dayandırılmasa, onda Osmanlı qoşunlarının baş komandanlığında olan alman zabitləri geri çağırılacaqdır. Bir müddət sonra Bakı ətrafında döyüşlərin səngiməsini almanlar razılıq hissi ilə qarşıladılar və Bakı neftindən bəhrələnmək üçün yollar aramağa başladılar (291, s.132).

Bunun üçün almanlar türklərin özləri ilə dil tapmağa çalışdılar. Onlar Türkiyə tərəfinə təklif etdilər ki, Tiflisdə olan bir alman taboru da Bakı ətrafına göndərilsin və bu tabor da Türk-Azərbaycan qoşunları ilə birlikdə Bakı üzərində hücumda iştirak etsin. Almanlar əvvəlcə yalnız türklərin Bakıya doğru irəliləməsindən narahat idilər, sonradan ingilislərin Bakıya qoşun çıxarmasını eşidəndə onların qayğıları daha da artdı. Ona görə də onlar türklərin Bakıya irəliləməsinin qarşısının alınmasını qətiyyətlə tələb etmirdilər (291, s.135). Əksinə, hətta onlarla birlikdə döyüş aparılmasının mümkünlüyü təklifini irəli sürdülər. Ancaq həm Nuru Paşa, həm də Ənvər Paşa alman taborunun Bakıya gəlməsini və onun Türk-Azərbaycan qoşunları ilə birlikdə Bakı üzərinə hücumda iştirak etməsinin mümkün olmadığını bildirdilər (195, s.584).

Almanlar Bakı neftinə yol tapmaq üçün Rusiyanın bolşevik hökuməti ilə də gizli danışıqlar aparırdı. Həmin danışıqların nəticəsi kimi 1918-ci il avqust ayının 27-də Almaniya ilə Sovet Rusiyası arasında Brest müqaviləsinə əlavə saziş imzalandı. Sazişdə tərəflərin Bakıya və Bakı neftinə olan qarşılıqlı razılaşmaları da öz əksini tapmışdı. Bununla bağlı 14-cü maddədə deyilirdi: "Almaniya Qafqazda Gürcüstanın hüdudlarından kənarda hərbi əməliyyatlarda hər hansı üçüncü bir dövlətə heç bir yardım göstərməyəcəkdir. O, tə'sir göstərəcəkdir ki, Qafqazda üçüncü dövlətin hərbi qüvvələri Kür çayının mənsəbindən Petropavlovsk kəndinə qədər, Şamaxı qəzasının sərhədləri boyunca Əyrioba kəndinə qədər, Bakı, Şamaxı və Quba qəzaları sərhədləri boyunca Bakı qəzasının şimal sərhədlərində dənizə qədər olan ərazilərə keçməsin. Rusiya Bakı vilayətində neft çıxarılması və istehsalını bütün imkanları daxilində artıracaqdır, hər ay çıxarılan

neftin dörddə bir hissəsini, lakin yaxın vaxtlarda razılaşdırılacaq müəyyən miqdardan az olmamaq şərtilə Almaniyaya verəcəkdir" (310, s.119).

Almaniya ilə Rusiya arasındakı saziş imzalananda Bakı ətrafında döyüşlər yenidən canlanmışdı. Bu döyüşlər başlanana qədər Qafqaz İslam Ordusu da müəyyən hazırlıq tədbirləri həyata keçirə bilmişdi. Avqust ayının 13-də 107-ci Qafqaz türk alayı Azərbaycana gəldi. Alayın tərkibində 1200 canlı qüvvə və 12 pulemyot var idi. Bununla bərabər avqustun 27-də qərara alındı ki, 15-ci türk piyada diviziyası da Qafqaz İslam Ordusunun sərəncamına göndərilsin. Bakı ətrafındakı qüvvələri xeyli möhkəmləndirə biləcək bu diviziyanın tərkibində 56-cı və 106-cı piyada alayları, bir dağ topları divizionu, bir dağ qaubitsa divizionu, bir obus (qaubitsa) divizionu və diviziyanın köməkçi hissə və bölmələri var idi. Artıq Azərbaycanda olan 38-ci piyada alayı, bir dağ topu batareyası da bu diviziyadan idi. 106-cı piyada alayı isə bu diviziyaya 16-cı Qafqaz diviziyasından alınıb verilmişdi (195, s.582).

Nəzərdə tutulan qüvvələr Azərbaycana yetişəndən sonra Türkiyənin Şərq ordular qrupunun komandanı Xəlil Paşa da Bakı ətrafına gəlməli və şəhər üzərinə həlledici döyüşlərin gedişi ilə tanış olmalı idi. Bütün qüvvələrin yetişməsi ilə başlanacaq həlledici döyüşlər sentyabrın 11-nə planlaşdırılırdı (195, s.582).

Bakı üzərinə həlledici hücuma başlamazdan əvvəl Qafqaz Şimal Ordusu komandanlığı bir sıra əhəmiyyətli məntəqələrin ələ keçirilməsini qərara aldı. Bunlar 311, 364 rəqəmli yüksəkliklər və Digah kəndi idi. Komandanlığın əmri ilə göstərilən məntəqələr 13-cü Qafqaz alayı və ona verilmiş olan Azərbaycan bölmələri ilə alınmalı idi (195, s.582).

Həmin məntəqələrin tutulması üçün 13-cü Qafqaz alayı həm avqustun 26-da, həm də avqustun 31-də hücuma keçdi. Avqustun 26-da baş verən birinci hücum üzərində general Denstervill də öz xatirələrində ətraflı dayanmışdır. Kəsad faktların tutuşdurulması göstərir ki, həmin gün gedən döyüş Palçıq vulkanı ətrafında olmuşdur. İngilislərin 39-cu briqadasının komandiri polkovnik Faviel həmin döyüş barədə general Denstervilə aşağıdakı yazılı mə'lumatı göndərmişdi:

"Türklərin hücumu. 26 avqust 1918-ci il.

Palçıq vulkanı sahəsi Şimali Stafford alayının "D" bölüyü tərəfindən qorunurdu. Ona kapitan Sparrau komandirlik edirdi. Palçıq vulkanının cənub-qərbində düşmənin hərəkəti qeydə alındı. O sol cinahında süvari dəstəsi olmaqla dörd düzxətli zəncir şəklində hücum edirdi. Hücum edənlərin qüvvəsi təxminən min nəfər idi. Hücum çox qızğın keçirdi və bizim mövqelərimizə tuşlanmış ağır və yüngül artilleriyanın atəşləri ilə himayə olunurdu. Bizim pulemyot və tüfəng atəşlərimiz zəncirvari hərəkət edən bölmələrin qarşısını xeyli saxladı. 1-ci post üzərinə beş dəfə hücum oldu. Beşinci hücumla bu sahənin müdafiəçiləri səngərlərdən uzaqlaşdırıldılar.



Gündüz saat birin yarısında düşmən Palçıq vulkanının sağ cinahına çıxmağa müvəffəq olaraq ora pulemyot yerləşdirdi. Onlar ikinci və üçüncü postları cinahdan atəşə tutdular. Bu vaxt biz düşmənin sol cinahımıza istiqamətlənmiş hücumunun qarşısını aldıq. Saat 2-nin yarısında 2-ci və 3-cü postlar düşmən tərəfindən tutuldu. Bu döyüşdə yalnız 6 nəfər xilas ola bildi. Bütün zabitlər sıradan çıxarılmışdı. Zabitlərlə birlikdə biz 80 nəfər itirdik. Saat 1.30-da Bakıdan yük avtomobillərində göndərilmiş Şimali Stafford alayından 60 nəfər, Varvik taborundan mayor Leyin rəhbərliyi altında 70 nəfərlik kömək çox gec gəlib çıxdı ki, vəziyyəti də düzəldə bilsin. Mayor Leyin əmri ilə əlavə kömək kimi saat 3.00-da 9-cu Lorçester alayından göndərilən bir bölük bizim yanımıza 3.30-da gəlib çatdı. Təsvir olunan döyüşdən əlavə düşmən Binəqədi kəndinin şimalındakı yüksəklik üzərinə də hücum etdi. Bu yüksəklik erməni taboru tərəfindən qorunurdu.Palçıq vulkanına hücum zamanı Şimali Stafford alayının bir bölüyü Binəqədi kəndinə göndərildi ki,oradakı erməni taboruna kömək etsin. Həmin bölük saat 12.15-də ora çatanda qoşunlardan heç kimi tapmadı və özü yüksəkliyə qalxmağa başladı. Bölük yüksəkliyə qalxandan sonra əks tərəfdən (şimaldan) ora 250 türk əsgərinin irəlilədiyini gördü. Avanqardda olan əsgərlər dərhal yüksəkliyin təpəsinin bir qədər aşağıdan keçən səngərlərinə girib tüfəng və Lyus pulemyotlarından güclü atəş açdılar. Düşmən böyük itki ilə geri qovuldu" (209.s.234).

Binəqədi yaxınlığındakı yüksəklik ətrafında hər hansı bir kəşfiyyat aparmadan hakim nöqtəyə qalxmaq cəhdi Türk-Azərbaycan qoşun bölmələrinə xeyli itki ilə başa gəldi. Ancaq qarşıya qoyulan tapşırığı yerinə yetirmək üçün bir müddətdən sonra yüksəklik üzərinə yeni bir hücum təşkil edildi. Ancaq hakim nöqtədə möhkəmlənmiş olan ingilislər sayca elə də çox olmayan Türk-Azərbaycan döyüşçülərinin irəliləməsinə imkan verməSdilər (209, s.235).

Palçıq vulkanı mövqelərindən geri çəkilən ingilislər Binəqədi kəndinin şimalından Biləcəri stansiyasına gedən xətt üzrə mövqe tutdular. Bu xətt üzrə iki yerdə müdafiə postu qurulmuşdu. Palçıq vulkanının şərqindəki neft buruqları Varvik taborunun bir bölüyü ilə qorunurdu. Şimali Stafford alayının bir bölüyü isə bir qədər cənubda, Biləcəri stansiyası yaxınlığında postda dayanmışdı. Biləcəri yaxınlığında ehtiyat qüvvə təşkil etməli olan iki tabor isə ayın 26-da bura gəlib çıxmışdı. Həmin qüvvələrin qorxaqlığını, nizamsızlığını vurğulayaraq general Denstervil qeyd edirdi ki, ingilis bölmələri olmasaydı avqustun 26-da Türk-Azərbaycan qoşunları Bakıya girə bilərdilər (209,s.235).

107-ci piyada alayı Bakı ətrafına gəlib çatdıqdan sonra Qafqaz İslam Ordusu komandanlığı buradakı qüvvələri yenidən qruplaşdırdı. Cənub qrupu Puta ilə Ələt stansiyaları arasında idi və ona komandirlik podpolkovnik Həlim Pertev bəyə tapşırılmışdı. Qrupun tərkibində olan 4-cü Azərbaycan

nışançı alayının 4-cü taboru ilə Ağdaş süvari bölüyü Ələtdə, 4-cü Azərbaycan nişançı alayının 1-ci taboru isə Puta ilə Ələt arasında dayanmışdı. Yeni yaradılmış Qərb qrupu Xırdalanla Puta stansiyası arasında yerləşdirilmişdi. Ona polkovnik Cəmil Cahid komandirlik edirdi. Qərargahı Qobuda olan bu qrupa 9-cu və 10-cu Qafqaz alayları daxil idi. Şimal qrupu isə Xırdalandan başlayaraq Bakının şimal ətəklərində mövqe tutmuşdu. Ona polkovnik Osman bəy komandirlik edirdi. Qərərgahı Masazırda olan bu qrupa 13-cü və 107-ci Qafqaz alayları, 38-ci piyada alayı, 2-ci türk süvari alayı və Tatar süvari alayı daxil idi (195, s.583).

Bu qruplaşma avqustun 26-da aparılmışdı və yeni qüvvələrin gəlişi ilə qrupların tərkibində bə"zi dəyişikliklərin aparılacağı istisna edilmirdi. Həlledici hücumlar 15-ci diviziyanın hissələrinin Bakı ətrafına yetişməsindən sonra başlanmalı idi. Həmin vaxta qədər isə əlverişli hücumqabağı mövqelərin ələ keçirilməsi üçün Qafqaz İslam Ordusunun bölmələri avqust ayının son günlərində fəal döyüşlər aparırdı (209, s.238).

Avqustun 26-da Türk-Azərbaycan qoşun bölmələri ilə ingilis bölmələri arasında baş verən döyüşdən sonra "Sentrokaspi Diktaturası" qoşunlarının komandanlığı fəallaşan Türk-Azərbaycan qoşun bölmələrinə qarşı əks-hücumlara keçmək barədə müfəssəl bir əmr hazırladı. Bu əmrdə "Sentrokaspi"nin qoşunları "Bakı və onun rayonlarının ordusu və donanması" adlandırılırdı. Həmin döyüş əmri qarşı-qarşıya dayanan tərəflərin mövqelərini, Türk-Azərbaycan qoşunlarına müqavimət göstərən "Sentrokaspi" ordusunun tərkibini və keyfiyyətini, onların qarşılarına qoyulan vəzifələri öyrənmək baxımından maraqlıdır. Əmrdən aydın olur ki, əks-hücumların Qafqaz İslam Ordusunun Şimal qrupunun fəaliyyət sahəsində aparılması planlaşdırılırdı (bax:35, v.8-10).

Avqust ayının 26-da saat 16-da imzalanan bu əmrdə göstərilirdi ki, Türk-Azərbaycan qoşunları artıq Novxanı, Goradil, Pirşağı, Kürdəxanı və Fatmai kəndlərini tutmuşlar. Fatmai kəndində topçu batareyası yerləşdirilmişdi. Maştağa kəndində, Hökməli kəndində və habelə Şabandağ yüksəkliyindəki mövqelər möhkəmləndirilirdi. Zihil dağı ətəyində simli maneələr aşkar edilmişdi. Qoşunların komandanı əmr edirdi ki, planlaşdırılan hücumla Fatmaı, Göradil və Pirşağı kəndləri ələ keçirilsin. Buradakı göllərlə dəniz sahili arasında mövqelər möhkəmləndiriləndən sonra hücum davam etdirilsin və Novxanı kəndi də ələ keçirilsin. Bu tapşırığın həyata keçirilməsi üçün əməliyyat rayonu döyüş sahələrinə bölünmüş, onların qüvvələri və vəzifələri müəyyənləşdirilmişdi.

Podpolkovnik Stepanovun rəhbərlik etdiyi sağ döyüş sahəsinin piyada qüvvələrinə Biçeraxovun dəstəsinin nümunəvi alayının 2 bölüyü, ingilis qoşunlarının bir bölüyü, Qafqaz Ordusu ("Sentrokaspi Diktaturası"nın sərəncamında olan ordu nəzərdə tutulur. -M.S.) 3-cü taborunun 4 bölüyü, 4-cü taborunun 4 bölüyü, 5-ci taborunun 4 bölüyü və bir yığma bölük,



topçu qüvvələrinə isə hərəsində iki top olmaqla qaubitsa batareyasının, 5-ci batareyanın, dağ batareyasının hər birindən bir taqım, 6 topu olan ingilis batareyası və bir ədəd zirehli avtomobil daxil idi. Bu döyüş sahəsinə süvari bölmələr də verilmişdi.

Sağ döyüş sahəsi avqustun 27-də Fatmai, Goradil və Pirşağı kəndləri üzərinə hücuma keçməli və bu kəndləri ələ keçirəndən sonra oradakı göllərlə dəniz arasında möhkəmlənməli idi. Hücumdan əvvəl güclü artilleriya hazırlığı aparılmalı idi. Fatmai kəndi tutulan kimi Maştağa dəstəsinə xəbər verilməli və bu dəstə Maştağa kəndindəki Türk-Azərbaycan qoşun bölmələrinin Novxanı kəndinə doğru geri çəkilməsinin qarşısını almalı idi. Fatmai kəndinin tutulması xəbərini eşidən kimi Maştağa dəstəsi Maştağa kəndindəki qüvvələrə təslim olmaları üçün ultimatum göndərməli və onlar üçün verilmiş yarım saat bitəndən sonra hücuma keçib kəndi tutmalı idi.

Ştab-kapitan Firzadyanın komandirlik etdiyi Maştağa dəstəsinə 20-ci taborun 7 pulemyotu olan 4 bölüyü, 7-ci taborun 2 bölüyü, Keşlə dəstəsinin bir bölüyü, 6-cı səhra batareyasının 4 topu, ingilis qoşunlarının 3 pulemyotu, 2 zirehli avtomobil və bir süvari bölüyü daxil idi.

Hücum üçün ümumi ehtiyat qüvvəsi müəyyənləşdirilmişdi. Bura Biçeraxovun dəstəsinin bir alayı, hər biri 4 bölükdən ibarət olan 10-cu və 15-ci taborlar daxil idi. Biçeraxovun dəstəsindən olan alayla 15-ci tabor Erməniкənddə, 10-cu tabor isə Sağ döyüş sahəsinin sağ cinahının arxasında, Biləcəri stansiyası yaxınlığında dayanmalı idi.

Türk-Azərbaycan qoşun hissələri Sağ döyüş sahəsinin qarşısında qoyulan vəzifələrin icrasına mane olmaq üçün cəbhənin digər nöqtələrində hücuma keçərdilərsə, onlara müqavimət göstərmək üçün üç döyüş sahəsi də yaradılmışdı. 1-ci, 2-ci və 3-cü döyüş sahələri qarşılıqlı fəaliyyət göstərilməsi üçün zəruri əlaqələr yaradaraq ümumi döyüş tapşırığının icrasına zəmin yaratmalı idi.

1-ci döyüş sahəsinə Biçeraxovun 1-ci alayından 1 bölük, 19-cu tabordan 2 bölük, 5-ci tabordan 1 bölük, 22-ci tabordan 2 bölük, partiya dəstəsindən 1 bölük, ingilis qoşunlarından 1 bölük, 2-ci batareyadan 4 top, Klin taqımından 2 top, Dəniz təyyarə məktəbindən 4 pulemyot daxil idi. Polkovnik Qazarovun komandirlik etdiyi 2-ci və 3-cü döyüş sahələrinə isə 4-cü, 5-ci, 16-cı, 17-ci, 18-ci, 21-ci taborlar, Biçeraxovun dəstəsindən bir nümunəvi tabor, Dəmir dəstə, bir bölük, 4-cü batareyadan 4 top, 5-ci batareyadan 2 top daxil idi.

Bunlardan başqa ayrıca topçu döyüş sahəsi də yaradılmışdı. Bura daxil olan 8 top, habelə dəniz hidrotəyyarə divizionu və Kuban təyyarə divizionu Türk-Azərbaycan qoşunlarının Xırdalan yaxınlığında, Şabandağ, Atəşgah yüksəkliklərində, Saray və Novxanı kəndlərində olan toplarını susdurmalı idi. "Göy təpə" hərbi gəmisi də döyüşün aparılmasına cəlb olunmuşdu. Bu

gəmi şəhərdən hərəkət edərək Pirşağı və Goradil kəndləri yaxınlığında sağlə yan almalı, bu kəndləri, habelə Novxanı kəndini toplardan atəşə tutmalı idi (bax: 35, v.8-10).

"Sentrokaspi Diktaturası" ordusunun avqustun 27-nə planlaşdırdığı hücumun taleyi barədə fikir söyləmək çətindir. Mövcud arxiv sənədlərində, türk mənbələrində və general Denstervilin xatirələrində bu barədə heç bir qeyd yoxdur. Avqustun axırlarında cərəyan edən hadisələrdən danışarkən general Denstervil avqustun 26-da və 31-də baş verən döyüşlər üzərində dayanır. Avqustun 27-nə planlaşdırılan və ingilis qoşunlarının da cəlb edilməsi nəzərdə tutulan bu iri miqyaslı hücum keçirilmiş olsaydı heç, şübhəsiz ki, general Denstervil onu diqqətdən kənara qoymazdı. Ona görə də güman etmək olar ki, "Sentrokaspi" ordusu qərargahının əmrlə rəsmiləşdirdiyi bu hücum elə sənəd üzərində də qalmışdı.

Bakı şəhəri üzərinə həlledici hücum ərəfəsində əlverişli döyüş mövqelərinin ələ keçirilməsi üçün Türk-Azərbaycan qoşunlarının bir sıra bölmələri avqustun 31-də xüsusi fəallıq göstərdilər. Həmin gün döyüşlər başlıca olaraq Binəqədi yüksəklikləri ətrafında cərəyan edirdi. Bu yüksəkliklər ingilis qoşunlarının Şimali Stafford alayının 80 nəfərlik 7-ci bölüyü tərkibində müdafiə olunurdu. Səhər saat 6-da bu yüksəkliklərin qərb ətəklərinə 500-dək türk və Azərbaycan döyüşçüsü cəmlənmişdi. Türk-Azərbaycan qoşun bölmələrinin ehtimal olunan hücumunun qarşısının alınması üçün Varvık taborunun Digah kəndi yaxınlığında olan bir bölüyü ehtiyat qüvvə kimi Binəqədi neft mə"dənlərinin mərkəzində yerləşdirildi.Eyni zamanda polkovnik Faviel polkovnik Qazarovdan xahiş etdi ki, zirehli qatarı Biləcəri stansiyasına gətirsin və onu Palçıq vulkanına doğru hərəkət etdirməklə Türk-Azərbaycan qoşun bölmələrini qorxutsun. Səhər saat 6-da Türk-Azərbaycan qoşun bölmələri topların və pulemyotların güclü atəşi ilə hücuma keçdilər.Hava hələ qaranlıq ikən türk və Azərbaycan pulemyotçuları ingilislərin mövqelərinə xeyli yaxınlaşa bilmişdilər. Ona görə də aramsız cinah atəşlərindən sonra ingilislərin səngərləri tutuldu. Sonra türk və Azərbaycan toplarının və pulemyotlarının atəşləri Binəqədi yüksəklikləri üzərində cəmləşdirildi. Saat 8.30-da buradakı ingilis əsgərləri itgi verərək sağ cinaha çəkilməli oldular. Binəqədi yüksəklikləri Türk-Azərbaycan qoşun bölmələrinin əlinə keçdi. Hücumu davam etdirən birləşmiş qoşun bölmələri ingilislərin Varvik taborunun bölmələrinə də güclü zərbə endirdi. Bu bölmələr mühasirə olmaq təhlükəsi ilə qarşılaşanda geri çəkildilər. Nəticədə ingilis bölmələri Biləcəri, Binəqədi kəndlərinin şərqi və Digah kəndləri arasındakı xətt üzrə mövqe tutdular. Ancaq həmin mövqelərdə dayanmaq onlar üçün böyük təhlükə törədirdi. Ona görə də qərara alındı ki, ingilis bölmələri bir qədər də geri çəkilsin. Beləliklə avqustun 31-də axşam ingilis bölmələri Biləcəriyə gələn dəmir



yolu və Dərnəgülün qərb tərəfi xətti üzrə müdafiə mövqeləri tutdular (209, s.239-240).

"Sentrokaspi" qoşunları bu döyüşdə elə bir fəaliyyət göstərə bilmədilər. Atəşlər qızışan kimi yaxınlıqdakı taborun şəxsi hey'əti pərən-pərən olub qaçmağa başladı (209, s.240).

Avqustun 31-də keçirilən uğurlu hücumda Türk-Azərbaycan qoşunlarının əlinə 6 pulemyot, xarab olmuş bir səhra topu, yük arabaları, 38 mətbəx arabası, xeyli patron və mərmi keçdi (195,s.582). Döyüşün başlıca nəticəsi isə o oldu ki, strateji əhəmiyyətə malik olan bir neçə məntəqə ələ keçirildi, ingilis qüvvələri ilə "Sentrokaspi" hissələri Bakıya doğru sıxışdırıldı.Hərbi təşəbbüs yenidən Türk-Azərbaycan qoşunlarının əlinə keçməyə başladı.

Sentyabrın 1-də Türk-Azərbaycan qoşun bölmələri nəzarət sahəsini bir qədər də genişləndirdilər. Binəqədi kəndi tamamilə ələ keçiriləndən sonra hücumlar Balaxanı və Zabrat kəndləri istiqamətində davam etdirildi (239, s.146).

Türk-Azərbaycan qoşunlarının fəallaşması həm "Sentrokaspı Diktaturası"nı, həm də ingilis qoşunlarının rəhbərliyini bərk qorxuya salmışdı. Yaranmış vəziyyət avqustun 31-də "Sentrokaspi"nin hərbi şurasında müzakirə edildi.Sentyabrın 1-də isə ingilis komandanlığı mövcud qüvvələrlə Bakının müdafiəsinin qeyri-mümkün olduğunu bildirdi. Azsaylı ingilis qoşun bölmələri güclü hücumlar qarşısında aciz idi.Yerli qüvvələr isə hərbi baxımdan elə böyük əhəmiyyət kəsb etmirdi. Silah altına alınmış adamlar heç bir nizama və intizama riayyət etmirdilər. Buna görə də "Sentrokaspi" liderləri, erməni-daşnak elementləri çıxış yolunu necə olursa-olsun ingilis qoşunlarının Bakıda qalmasına və bura əlavə qoşun hissələrinin gətirilməsinə nail olmaqda görürdülər. General Denstervildən tələb olunurdu ki, Bakının qorunması üçün İran və Bağdaddakı ingilis qoşunlarından əlavə kömək gətirilsin (209, c.251).

Bakının tezliklə Türk-Azərbaycan qoşunları tərəfindən azad ediləcəyinə şübhə etməyən general Denstervil sərəncamında olan qoşun bölmələrini gəmilərə yükləyib uzaqlaşdırmağa da ürək etmirdi. Bu gəmilərin "Sentrokaspi"nin gəmiləri tərəfindən gülləyə tutulmayacağına kimsə zəmanət verə bilməzdi (239, s.146). Ona görə də ingilis qoşunları sentyabr ayının əvvəlində əslində iki cəbhə arasında qalmışdılar. Bir tərəfdən Türk-Azərbaycan qoşunları onları sıxışdırırdısa, digər tərəfdən də "Sentrokaspi" hökuməti onların getməsinə razı deyildi və Bakıdan yola düşəcəkləri təqdirdə bu hökumətin təxribatları ilə qarşılaşa bilərdilər.

Çarəsiz qalan ingilis komandanlığı yerli qoşunların möhkəmləndirilməsi və bununla da dərinləşməkdə olan hərbi böhranın qarşısının alınması üçün yeni bir cəhd göstərdi. "Sentrokaspi" qüvvələrinin yenidən qurulması üçün layihə hazırlandı və bu hökumətin hərbi nazirinə təqdim edildi. Hərbi hissələrin

tə'lim-tərbiyəsi nəzarət altına götürüldü. General Denstervil yazırdı ki, "Sentrokaspi" hissələrinin tə'lim-tərbiyəsində bir həftə ərzində xeyli müsbət keyfiyyət dəyişikliyi yarandı. Lakin intizam əvvəlki kimi qalmaqda davam edirdi (209, s.255-257).

General Denstervili həm də o sevindirirdi ki, onların ixtiyarında iki rus hərbi təyyarəsi, iki ingilis təyyarəsi və altı ədəd zirehli avtomobil var idi. Türk-Azərbaycan qoşunlarında təyyarə olmadığı halda Bakıdakı qüvvələrin təyyarələri ilə döyüşün gedişində müəyyən üstünlüklər əldə etmək mümkün idi (209, s.257).

Sentyabr ayının 1-ci ongünlüyü Bakı ətrafında nisbətən sakit keçdi. Kəşfiyyat xarakterli bə'zi tapşırıqların icrası istisna olmaqla Türk-Azərbaycan qoşunları həlledici hücuma hazırlaşırdılar. Bu hücum isə 15-ci diviziyanın Bakı ətrafına gəlib çatmasından sonra başlamalı idi.

Tərkibində 5541 əsgər və 191 zabit olan 15-ci diviziya sentyabr ayının 8-də Bakı cəbhəsinə yetişdi. Növbəti həlledici hücuma rəhbərlik etmək üçün Qafqaz İslam ordusunun komandanı Nuru Paşa da sentyabrın 10-da Bakı ətrafına gəldi (195, s.585).

Xüsusi Azərbaycan Korpusunun komandiri general-leytenant Ə.Şıxlinskinin Bakının azad olunmasında fəal iştirak etməsi ilə bağlı olan yazılara görə (11, 17.09.1919) təsdiq etmək olar ki, Nuru Paşa ilə bərabər o da Bakı ətrafına gəlmişdi.

15-ci piyada diviziyası yetişdikdən sonra Bakı ətrafındakı Türk-Azərbaycan qoşunları sentyabrın 10-da yenidən qruplaşdırıldı. Şimal və Qərb qrupları ləğv edildi, hissələr birbaşa diviziyaların komandirlərinin iradəsi altında döyüşə hazırlaşmaq əmri aldılar.

Bakı üzərinə həlledici hücumun əsas zərbə qüvvəsini 5-ci Qafqaz diviziyası təşkil etməli idi. General Mürsəl Paşanın komandanlığı altında olan bu diviziyaya 9-cu, 10-cu, 13-cü Qafqaz piyada alayları, 56-cı piyada alayı, 33 toplu topçu alayı və köməkçi hissələr daxil idi. Polkovnik Süleyman İzzət bəyin komandirliyi altında olan 15-ci diviziyaya isə 38-ci piyada alayı, 106-cı Qafqaz alayı, 12 toplu topçu alayı və köməkçi hissələr də daxil idi (195, s.585).

Türk mənbələri dəqiq mə'lumat verməsə də, gizli deyil ki, 5-ci və 15-ci diviziyaların fəaliyyət sahələrində Xüsusi Azərbaycan Korpusunun Tatar süvari alayı ilə Ləzgi süvari alayı da Bakının azad edilməsində fəal mübarizə aparmışlar. Hələ sentyabr ayının 3-də Ləzgi süvari alayı 3-cü eskadronunun 1-ci taqımı yunker Cavarxan Ansoxskinin rəhbərliyi altında Hövsan kəndini qoruyurdu. Düşmən iki bölük piyada, bir eskadron süvari, 3 pulemyot və iki topla bu kənd üzərinə hücuma keçəndə Ləzgi süvari alayının döyüşçüləri onlara mətanətlə sinə gərdilər və əlavə kömək yetənə qədər 4 saatlıq müdafiə döyüşü apardılar. Mövcud olan bə'zi mə'lumatlar sübut edir ki, Bakı üzərinə həlledici hücum zamanı Ləzgi süvari



alayı Hövsan-Zığ-Qaraşəhər istiqamətində şəhərə doğru irəliləmişdilər (164, v.139).

Tatar süvari alayı da Bakının şimal-şərqindən şəhər üzrinə hücumda iştirak etmişdi. Sentyabr ayının 13-də bu alayın döyüşçüsü Qasımov, Zığ istiqamətində düşmən səngərlərinə girmiş və həyatını təhlükə qarşısında qoyaraq Adınsov adlı düşmən zabitinin əsir götürmüşdü. Mühəndis-istehkam mütəxəssisi olan həmin zabitin "Sentrokaspi" və ingilis qoşunlarının mövqeləri barədə verdiyi mə'lumatlar Qafqaz İslam Ordusunun komandanlığı tərəfindən hücum planı hazırlananda nəzərə alınmışdı (123, v.20).

Cənub qrupu isə olduğu kimi saxlanılmış və ona polkovnik Cəmil Cahid bəy komandir tə'yin edilmişdi. Bu qrupa xüsusi Azərbaycan Korpusunun 4-cü nişançı alayı, Azərbaycan könüllülərindən ibarət 3 süvari bölüyü və iki dağ topu daxil idi (195, s.585).

Bakı şəhəri üzərinə hücum sentyabrın 14-ü gecə saat 2-də artilleriya hazırlığı ilə başlamalı idi. Hava işıqlanana kimi 5-ci diviziyanın hissələri irəli hərəkət edib düşmənin ön mövqelərini ələ keçirməli idi. Hücum planına görə, döyüşlərin əsas ağırlığı 5-ci diviziyanın sol cinahına düşməli idi. Zirehli qatar 5-ci diviziyanın hücumunu himayə etməli idi. Səhər açılana kimi bu qatar Heybət stansiyasına gəlib Qurd qapısı yüksəkliklərindəki düşmən bölmələrinin atəşini öz üzərinə götürməklə 5-ci diviziyanın sağ cinahını təhlükədən qorumalı idi. Salyan dəstəsi də 5-ci diviziyanın əməliyyat rəhbərliyinə verilmişdi. Ələt-Puta arasında yerləşən həmin dəstə həm dəmir yolu daşımalarının, həm də 5-ci diviziyanın cinahının təhlükəsizliyini qorumalı idi (195, s.586).

15-ci diviziya Bakının şimal və şimal-şərq istiqamətində qərar tutmuşdu. Hücum günü onun tərkibində 38-ci alay və əməliyyat rəhbərliyinə verilmiş Azərbaycan süvari bölmələri döyüşməli idi. Diviziyanın 106-cı alayı 107-ci Qafqaz alayı ilə birlikdə Qafqaz İslam Ordusunun ehtiyat qüvvəsini təşkil etməli və Hökmalı kəndində yerləşməli, 15-ci diviziyanın əməliyyat rəhbərliyi altında olan hissələr ilə Biləcəri, Balaxanı, Suraxanı, Əhmədli yaşayış məntəqələri istiqamətindən hücuma keçməli, başlıcası isə düşmən qüvvələrinin müəyyən hissəsini özünə tərəf cəlb etməklə 5-ci diviziyanın sür'ətli və uğurlu hücumuna zəmin yaratmalı idi (195, s.586).

Bunlardan başqa, Zehni bəyin və Tofiq bəyin rəhbərliyi altında iki çevik dəstə də yaradılmışdı. Əsasını Azərbaycan döyüşçüləri təşkil edən bu dəstələr müvafiq olaraq Hövsan-Əhmədli və Maştağa-Balaxanı istiqamətlərindən döyüşə qoşulmalı və Bakıya doğru irəliləməli idilər. Qafqaz İslam Ordusunun və 5-ci Qafqaz diviziyasının qərargahları Güzdəkdə, 15-ci piyada diviziyasının qərargahı Binəqədidə yerləşirdi (195, s.586).

Qafqaz İslam Ordusu komandanlığı həlledici hücum ərəfəsində kəşfiyyat işlərini davam etdirərək düşmənin mövqeləri və qüvvələri barədə mə'-

lumat toplayırdılar. Həmin mə'lumatlara görə düşmən qüvvələrinin Heybət, Biləcəri, Balaxanı ətrafında toplandığı ehtimal olunurdu. Bundan əlavə L.Biçeraxovdan da kömək gəlməsi barədə mə'lumat alınmışdı (195, s.587).

Bu mə'lumatı general Denstervil də təsdiq edirdi. Onun yazdığına görə, 10 ədəd pulemyotla bərabər 500 nəfərlik bir qüvvə Biçeraxov tərəfindən Bakıya göndərilmişdi (209, s.258).

Bakı üzərinə gözlənilən həlledici hücumu dəf etmək üçün ingilis qoşunlarının komandanlığı da hazırlıq işlərini davam etdirməkdə idi. Polkovnik Raulinson Türk-Azərbaycan qoşunlarına arxadan zərbə endirmək barədə plan tərtib etmişdi və bu plan general Denstervil tərəfində də bəyənilmişdi. Həmin plana görə, polkovnik Raulinson Lənkərana gəlməli, burada yerli rus əhalisindən olan qoşun bölmələri ilə birlikdə avtomobillərdə Muğan səhrasının şimalına hərəkət etməli və Türk-Azərbaycan qoşunlarının əsas təchizat arteriyası olan dəmir yolu xəttini, dəmir yolu körpülərini dağıtmalı, bununla da Türk-Azərbaycan qoşunlarını təchizat sarıdan çətin vəziyyətə salmalı idi (209, s.258).

Ancaq general Denstervil sentyabrın 12-də Türk-Azərbaycan qoşunlarının sentyabrın 14-də hucuma keçəcəyi barədə kəşfiyyat mə'lumatı alandan sonra (209, s.257) sentyabrın 13-də yola düşməyə hazırlaşan polkovnik Raulinsonun Lənkərana getməsinə lüzum görmədi.

Həlledici hücum ərəfəsində Bakı şəhərində çox mürəkkəb bir əvqat hökm sürürdü. Şəhərin müsəlman əhalisi Türk-Azərbaycan qoşunlarının gəlişini səbirsizliklə gözləyirdilərsə, eser, menşevik və daşnak fəalları, Erməni Milli Şurasının üzvləri qorxu və təlaş içində idilər. Əhalinin əhval-ruhiyyəsini qaldırmaq üçün məqsədyönlü şəkildə təbliğat aparılır, şəhəri mühasirə edən Türk-Azərbaycan qoşunlarının yalnız bir alay yarımdan ibarət olduğu və onların da tezliklə məğlub ediləcəyi barədə bəyanatlar verilirdi. Əhali kütləvi surətdə səfərbərlik adı altında kazarmalara doldurulur, səngərlərə göndərilirdi. Az qala küçəyə çıxan hər bir adam, o cümlədən xəstələr, qocalar yeniyetmələr, şikəstlər, hətta əlini, ayağını, bir gözünü itirənlər belə "Sentrokaspi" ordusuna qatılırdı. Yerli rus əhalisinin nümayəndələri erməni-daşnak elementləri tərəfindən onların Türk-Azərbaycan qoşunlarına qarşı səngərlərə göndərilməsini heç də hamılıqla razılıqla qarşılamırdılar (11, 15.09.1919).

Zorla səfərbərliyə alınmış təkqollu Bakı vətəndaşlarından biri xatırlayırdı ki, "Sentrokaspi" ordusunun siyahılarına görə 72 min adam xidmətə cəlb edilmişdi. Onlardan 30 mini "ölü canlar" idi, rüşvət verərək canlarını qurtarmışdılar. 40 min nəfərə silah paylanmışdı ki, onlardan da yalnız 3-5 min nəfəri cəbhə xəttinə yollanmışdı. Müxtəlif adlar altında dəstələr yaradılmışdı. Məsələn, hüquqşünasların dəstəsi, artistlərin dəstəsi, dükançıların dəstəsi və s. Ştata görə 26 piyada taboru, bir neçə divizion, topçu briqadası, xeyli süvari və s. qüvvələr var idi (11, 15.09.1919).



Belə yararsız qüvvələrlə birlikdə vuruşmalı olan ingilis qoşunları Bakının müdafiəsinin heç də bütün ağırlığını öz üzrinə götürmək fikrində deyildi. Qoşunların komandanlığı bildirirdi ki, ingilislər daha çox tə'limatçı rolunu oynamalı, zəruri canlı qüvvəni isə yerli hökumət verməlidir (11, 15.09.1919).

Sentyabrın 14-də Bakı üzərinə həlledici hücum ərəfəsində ingilis və "Sentrokaspi" qoşunlarının müdafiə mövqeləri aşağıdakı kimi idi (bax: 209, s.260-261). Sol cinahda, Bibiheybət mə'dənləri önündəki yüksəkliklərdə 7-ci Şimali Stafford alayının 60 nəfərlik "A" bölüyü dayanmışdı. Təxminən 100 nəfərdən ibarət olan bir erməni taboru bu istiqamətdə ehtiyyat qüvvə kimi saxlanmışdı. Qurd qapısı yüksəkliklərində 2 pulemyotu olan rus dəstəsi mövqe tutmuşdu. Şimali Stafford alayının 100 nəfərlik bir bölməsi "A" bölüyünün dayandığı istiqamətə ehtiyyat qüvvə kimi göndərilmişdi. Qurd qapısı yüksəkliklərinin şimal tərəfində, 800 addımlıq sahədə Şimali Stafford alayının "B" bölüyü dayanmışdı. Hacı Həsən kəndi ilə üzbəüz səngərlərə qoyulmuş erməni hissələri bu bölüklə yan-yana idi. Həmin sahəyə bir qaubitsa batareyası və bir üçdüyməlik top gətirilmişdi. Bakıdan 1,5 mil aralı olan Ağ ev yaxınlığında bir erməni taboru ehtiyat qüvvə kimi saxlanmışdı. Cəbhənin sol cinahının qərargahı da burada yerləşirdi. Ona polkovnik Veqsuraba rəhbərlik edirdi. Sol cinahın sol qanadı da artilleriya ilə möhkəmləndirilmişdi. Ora üçdüyməlik iki ədəd qaubitsa göndərilmişdi. Sağ cinah polkovnik Qazarovun rəhbərliyi altında idi. Bu cinahın başlanğıcı olan Hacı Həsən kəndindən Biləcəriyə kimi Biçeraxovun dəstəsindən 600 nəfərlik bir qüvvə qoruyurdu. Biləcəri stansiyası I orçester taborunun 2 bölüyünün nəzarəti altında idi. Biləcəridən Dornəgülə qədər olan sahədə isə bu taborun digər qüvvəsi dayanmışdı. Dornəgül gölünün cənub tərəfinin müdafiəsi bir erməni taboruna, bu gölün şərq tərəfi isə ingilis qoşunlarının 4 ədəd pulemyotu olan pulemyot komandasına tapşırılmışdı. Bu müdafiə xəttinə Şimali Stafford alayının 50 nəfərlik bir bölüyü ehtiyat qüvvə kimi verilmişdi. Bakı-Binəqədi yolundan 2 mil şərqə tərəf, 39-cu ingilis briqadasının qərargahının yerləşdiyi binanın yaxınlığında isə Varvik taborunun 100 nəfərlik bir bölüyü ehtiyatda saxlanmışdı. Sağ cinah səhra artilleriyasının 8-ci batareyası və bir qaubitsa batareyası ilə möhkəmləndirilmişdi. 2 ədəd ingilis zirehli avtomobili Biləcəridə, 3-ü isə şəhərdə ehtiyatda dayanmışdı. Sağ cinahın sağ qanadını 500 nəfər ermənidən ibarət erməni dəstəsi üçdüyməlik top batareyası, 3 ədəd rus zirehli avtomobili və bir eskadron süvarı ilə qorumalı idi. Onlar bu istiqamətdən Suraxanı tərəfdən daim fəaliyyətdə olan türk və Azərbaycan süvarilərinin qarşısını almalı idilər. Bunlardan başqa, bir sıra yerli silahlı bölmələr də var idi ki, onlar heç bir əmrə tabe olmaq istəmir və istədikləri istiqamətə hərəkət edirdilər.

"Sentrokaspi" ordusuna general Dokuçayev, ingilis qoşunlarına isə polkovnik Keyvort komandanlıq edirdi. Müdafiə işlərinə ümumi nəzarət isə "Sentrokaspı Diktaturası"nın hərbi naziri Baqratuni ilə ingilis generalı Densterv il tərəfindən həyata keçirilirdi (bax: 209, s.260-261).

Bakı şəhəri üzərinə hücum sentiyabrın 13-dən 14-nə keçən gecə saat 01.00-da başladı. 5-ci Qafqaz diviziyasının 9-cu Qafqaz alayı Bakı-Şubanı yolunun cənubundan, 56-cı piyada alayı isə bu yolun şimalından şəhərə doğru hərəkət etmək əmri aldı. Saat 03.30-da düşmənin ilk mövqeləri artıq ələ keçirilmişdi (195, s.587).

Ancaq nədənsə 5-ci diviziyanın topları çox süst fəaliyyət göstərirdi. Qoşun hissələri hücuma keçib əlverişli mövqelər tutsalar da, toplar əvvəlki mövqelərində qalmışdılar və onların piyadaların ələ keçirdiyi əlverişli mövqedə yerləşdirilməməsi hücumun sür'ətlə davam etdirilməsinə yol vermədi (195, s.587; 209, s.263).

5-ci diviziyanın fəaliyyət sahəsində artilleriyanın süstlük göstərməsindən ingilis və "Sentrokaspi" qoşunlarının komandanlığı istifadə edərək ilk zərbə almış hərbi hissələri yenidən qruplaşdırdı. Sol cinahda ingilis bölmələri bir qədər geri çəkilsələr də həmin yüksəkliyi əllərində saxladılar. Bir bölük Türk-Azərbaycan qoşunlarına qarşı göndərildi. Eyni zamanda polkovnik Keyvort türk bölmələrinin irəlilədiyi sahələrə əlavə qüvvə gətirdi. Saat 08.00-da ingilislər qruplaşmanı başa çatdırdılar. Bu qruplaşma türk bölmələrini tutduğu mövqelərdən çıxara bilməsə də sol cinahdan onların irəliləməsinin qarşısı alındı (209, s.264).

Hücumun başlanması ilə "Sentrokaspi" qoşunları arasında bir vəlvələ düşmüşdü. Taborların çoxu qaçıb dağılmışdı. General Dokuçayev böyük çətinliklərdən sonra onların bir qismini bir yerə toplayıb əks-hücum əmri verdi. Yerli qüvvələr iki dəfə əks-hücuma keçməyə cəhd göstərsələr də Qurd qapısı istiqamətində türk bölmələrini səhər tutduqları mövqelərdən çıxara bilmədilər (209, s.264).

5-ci Qafqaz diviziyasının əməliyyat rəhbərliyində olan 106-cı Qafqaz alayı demək olar ki, ehtiyat qüvvə kimi saxlanılmışdı. Digər dörd alay isə hücuma qoşulmuşdu. Bu alaylar sağdan sola cəbhə xətti boyu belə düzülmüşdülər: 10-cu alay, sonra 56-cı alay, sonra 9-cu alay və nəhayət, 13-cü alay. Döyüşlərin gedişində 13-cü Qafqaz alayının döyüşçüləri 3 ədəd, 56-cı piyada alayının döyüşçüləri isə 5 ədəd pulemyot ələ keçirmişdi (195, s.587-588).

15-ci piyada diviziyası isə artilleriya hazırlığından sonra səhər tezdən saat 04.00-da hücuma keçdi. 38-ci piyada alayı düşmən mövqelərinə sarı bir qədər irəliləyə bilsə də çox güclü müqavimətlə rastlaşdı. Xüsusilə alayın sağ qanadı aramsız atəşə mə'ruz qalmışdı (195, s.588). Bu istiqamətdə polkovnik Favielin komandirliyi altında Varvik və Uorçester taborları müdafiə mövqeləri tutmuşdular. İngilis taborları 2 ədəd təyyarə, 6 ədəd zirehli avtomobillə himayə olunurdu ki, bunlar da hissələrin atəş qüdrətini xeyli artırmışdı (209, s.265).



38-ci alayın sağ qanadı ilə 5-ci Qafqaz diviziyasının sol qanadı arasında bir boşluq yaranmışdı. İngilis qoşunları bundan istifadə edərək şimal istiqamətində daha güclü müdafiə mövqeləri yarada bilmişdilər. Bu boşluğu aradan qaldırmaq üçün Qafqaz İslam Ordusu komandanlığı ehtiyatda saxladığı 107-ci Qafqaz alayını Hacı Həsən kəndindən Biləcəriyə doğru döyüşə qoşmağı qərara aldı. Ancaq ingilis bölmələri ixtiyarlarında olan hərbi texnika ilə e'tibarlı müdafiə mövqeləri tutduğundan 107-ci Qafqaz alayı çox da irəli hərəkət edə bilmədi (195, s.588).

Günortadan sonra 15-ci piyada diviziyasının toplarının atəşinin Biləcəri üzərində cəmləşdirilməsi 38-ci piyada alayına xeyli irəliləməyə və Biləcəri yüksəkliklərini ələ keçirməyə imkan verdi. Davam etdirilən hücum axşama yaxın Ermənikəndə hakim olan yüksəkliklərin də tutulması ilə nəticələndi. 15-ci piyada diviziyasının komandanlığı şimaldan hücumu gücləndirmək tapşırığı almış 107-ci Qafqaz alayının komandanlığı ilə rabitə yaratdıqdan sonra bu alay da 38-ci alayın sağ cinahında döyüşlərə qoşuldu (195, s.588).

İngilis qoşunları tərəfindən sentyabrın 14-də Türk-Azərbaycan qoşunlarına qarşı müəyyən müqavimət göstərilsə də, Bakının taleyinin həll olunduğunu artıq onlarda da şübhə doğurmurdu. Buna görə ayın 15-də səhər tezdən onlar daha çox gəmilərlə Ənzəliyə çəkilmək məsələsinin həlli ilə məşğul idilər.

Qafqaz İslam Ordusunun komandanlığı qərarlaşdırmışdı ki, sentyabrın 15-də Bakı şəhərinə hücum artilleriya hazırlığı ilə davam etdirilsin. Bundan sonra 5-ci Qafqaz diviziyası sol qanadı Ermənikənddən keçmək şərti ilə şəhərə daxil olub onun qərb hissəsini ingilis-erməni silahlılarından təmizləməli idi. Şəhər tutulandan sonra orada qayda-qanunun yaradılması üçün bir piyada alayı və iki dağ top batareyası saxlanılmalı, diviziyanın qalan hissələri isə geri çəkilərək Xırdalan ətrafında toplanmalı idi. 15-ci piyada diviziyası isə sağ cinahı Ermənikəddən keçməklə şimal və şimal-şərq istiqamətindən hərəkət edib Qara şəhəri ələ keçirməli və qayda-qanunun bərpası üçün burada bir piyada alayı və bir dağ top batareyası saxlamalı idi. Qalan qüvvələr Bakının kənarında cəmləşdirilməli idi (195, s.589).

Artilleriya hazırlığı ayın 15-də səhər saat 05.30-da başladı. Bir saatdan sonra isə 5-ci Qafqaz diviziyasının alayları hücuma keçdilər (195, s.589). Bu hücum elə bir sür'ətlə başladı ki, Bakı şəhərini qorumaq istəyən silahlılar müqavimət göstərmək deyil, yalnız canlarını qurtarmaq barədə düşünürdülər (11, 25.09.1918). Qısa müddətdən sonra 13-cü, 9-cu və 56-cı alaylar şəhərin kənarına yetişdilər. İndi onların zabit və əsgərləri şəhər daxilində, limanında nələr baş verdiyini öz gözləri ilə izləyə bilirdilər.

15-ci piyada diviziyasının 38-ci piyada alayı və onun sağ cinahına göndərilmiş 107-ci Qafqaz alayı da səhər tezdən şəhər üzərinə hücumu davam etdirdilər. Saat 06.30-da 38-ci alay artıq Ermənikəndi tutaraq 2-si uzaqvuran olan 8 ədəd səhra topu, 2 ədəd dağ topu və 2 ədəd təyyarə ələ keçirdi (195, s.590).

Saat 08.30-da isə 38-ci alay və Azərbaycan könüllü süvarilərindən olan Zehni bəyin dəstəsi Əhmədlini və Qara şəhərin hakim yüksəkliklərini ələ keçirdilər. Təxminən saat 15.00-da 38-ci piyada alayı Qara şəhərə daxil oldu və burada şəhərin azərbaycanlı əhalisi tərəfindən böyük sevinc və səmimiyyətlə qarşılandı.

Sentyabrın 15-də gündüz Bakıda İran, Amerika, İsveç, Danimarka konsullarının vasitəsilə şəhərin hakimiyyət orqanları və 5-ci Qafqaz diviziyasının komandanlığı arasında danışıqlar aparıldı və şəhər orqanlarının nümayəndələri qarşısında qeyd-şərtsiz Bakını təslim etmək tələbi qoyuldu (238a, s.121). Sentyabrın 15-də günortadan sonra Türk-Azərbaycan qoşunları Bakı şəhərini ingilis, "Sentrokaspi", daşnak elementlərindən büsbütün təmizlədi.

"Azərbaycan" qəzeti özünün 15 sentyabr 1919-cu il tarixli baş məqaləsində Bakı şəhərinin bir il əvvəl azad edilməsi ilə bağlı belə yazırdı: "Əgər mayın 28-ni biz müstəqilliyimizin rəsmi e'lan edilməsi günü sayırıqsa, sentyabrın 15-də Azərbaycan qoşunlarının və Azərbaycan hökumətinin Bakıya daxil olmasını müstəqilliyin həqiqətən əldə edilməsi, dövlətçiliyin başlıca əsaslarının və özülünün qoyulması günü hesab edə bilərik.

Bu gün bolşevik-daşnak qüvvələri tərəfindən təkcə Azərbaycanın və digər Zaqafqaziya respublikalarının müstəqilliyi əleyhinə deyil, həm də Zaqafqaziyanın türk xalqlarının fiziki mövcudluğuna qarşı yönəldilmiş xətərnak təhlükənin ləğv edildiyi gündür" (11, 15.09.1919).

Sentyabrın 16-da şəhər Bakı ətrafında 5-ci Qafqaz diviziyasının və 15-ci piyada diviziyasının rəsmi-keçidi oldu. Rəsmi keçidi qəbul edən Şərq ordular qrupunun komandanı Xəlil Paşa türk döyüşçülərinə Bakı şəhərinin bolşevik-eser-daşnak əsarətindən xilas edilməsi üçün göstərdikləri şücaətə görə öz minnətdarlığını bildirdi (195, s.591).

Azərbaycan xalqının imdadına yetmiş olan türk qoşunlarının qətiyyətli mübarizəsi, vəzifə borclarına sədaqətlə yanaşması nəticəsində Bakı şəhəri işğaldan azad edildi. Şəhər əhalisi türk qoşunlarının fədakar mübarizəsini sevinc və ruh yüksəkliyi ilə qarşıladı. Azərbaycanın azadlığı, Bakı şəhərinin işğaldan qurtulması yolunda şəhid olmuş türk əsgərlərini və zabitlərini böyük ehtiramla yad etdi. Onların öz canlarını qardaş xalqın yolunda fəda etmələri azərbaycanlıların minnətdarlıqla andığı tarixi xatirədir. Təkcə Bakı şəhərinin azad edilməsi zamanı türk hərbçilərindən 800-1000 nəfər şəhid olmuşdu. Avqust ayı ərzində 1130 türk hərbçisi şəhid olmuşdu ki, onlardan 30 nəfəri zabit idi (238 a, s.121).



Bakı şəhərinin əllərindən çıxması ilə barışa bilməyən erməni daşnak elementləri evləri yandırır, qarşılarına çıxan azərbaycanlıları öldürür, talanlar törədirdilər. Bu isə həm azərbaycanlı əhalidə, həm də şəhərə girmiş azərbaycanlı döyüşçülərdə əks-reaksiya yaradırdı. Nəticədə, şəhərdəki erməni məhəllələri, erməni binaları azərbaycanlıların basqınlarına mə'ruz qalırdı. Kütləvi anarxiyaya çevrilə biləcək bu hərəkətlərin qarşısının alınması üçün Qafqaz İslam Ordusunun komandanlığı tərəfindən çox qətiyyətli tədbirlər həyata keçirilirdi. Soyğunçuluqda, talanlarda, digər cinayət əməllərində təqsirləndirilən 100-dən çox adam güllələndi və dar ağacından asıldı. Həyata keçirilən sərt tədbirlər tezliklə şəhərdə sakitliyin yaranmasını tə'min etdi (11, 25.09.1918).

Bakı şəhərində əmniyyət və asayişin bərqərar edilməsi üçün digər tədbirlər də həyata keçirilirdi. Sentyabrın 18-də Qafqaz İslam Ordusunun komandanı Nuru Paşa Bakı şəhərinin əhalisinə əmrnamə imzaladı. Həmin əmrnamədə bildirilirdi ki, axşam saat 6-ya kimi milliyyətindən asılı olmayaraq hamı silahı təhvil verməlidir. Silahı təhvil verməyənlərə qarşı ölüm cəzasının tətbiq olunacağı bəyan edilirdi (39a, v.1).

Həmin gün Azərbaycan hökumətinin sədri F.Xoyski də şəhər əhalisinə müraciət etdi. O, əhaliyə çatdırırdı ki, ölkə paytaxtında günahsız insanların haqq və hüququna təcavüz edilməsinə Azərbaycan hökuməti yol verməyəcəkdir. Bunun üçün ən qətiyyətli cəzaların tətbiqindən belə çəkinməyəcəyi şəhər əhalisinin nəzərinə çatdırılırdı (39, v.1)

Şəhərin idarəetmə orqanlarının işini nizamlamaq, normal rejimi tə'min etmək və qanun pozğunluqlarının qarşısını almaq üçün Cəmil Cahid bəy Bakı şəhərinin komandanı (41, v.1), Nazim bəy isə Bakı şəhərinin komendantı tə'yin edilmişdilər (40, v.1).

Bakı şəhərinin azad edilməsi Azərbaycanın ictimai-siyasi, iqtisadi və mə'nəvi həyatında çox mühüm əhəmiyyətə malik idi. Azərbaycanın milli qoşun hissələrinin, başlıcası isə onların və bütün Azərbaycan xalqının imdadına yetişmiş olan türk qoşun hissələrinin əvəzsiz kömək və yardımları Azərbaycanın mərkəzi şəhərini onun özünə qaytardı. Müstəqil Azərbaycanın bütün mərkəzi dövlət orqanları dərhal Bakıya köçdü və yeni cəmiyyətin qurulmasına başladı.

Bakı şəhəri azad edildəndən sonra Qafqaz İslam Ordusu komandanlığı dərhal Qarabağa qoşun hissələri göndərməyi və orada da erməni-daşnak elementlərinin azğınlıqlarına son qoymağı qərara aldı. Daşnak xislətli ermənilər tərəfindən aparılan təxribatçılıq fəaliyyəti bu bölgənin parçalanıb Azərbaycandan ayrılmasına və etnik erməni məntəqəsinə çevrilməsinə istiqamətlənmişdi.

Azərbaycan öz müstəqilliyini e'lan edən kimi Qarabağ ermənilərı öz separatçılıq fəaliyyətlərini daha da genişləndirdilər. Doğrudur, ilk əvvəl Şuşada yaradılan idarəetmə orqanına həm erməni, həm də azərbaycanlıların milli komitələrindən bərabər sayda nümayəndələr daxil edilmişdi. Bu idarəetmə orqanı iyul ayının ikinci yarısına kimi fəaliyyət göstərdi (49, v.38).

Ancaq sonra ermənilər azərbaycanlıların Qarabağın idarə edilməsində iştirak etmələri ilə barışa bilmədilər və müştərək idarəetmə orqanı qatı millətçi ermənilərin təzyiqi ilə ləğv edildi. 1918-ci ilin avqust ayında Şuşada ermənilər qurultay çağırdılar. Həmin qurultayda 7 nəfərlik bir orqan seçib onu Qarabağ hökuməti adlandırdılar və bütün hakimiyyətin ona verilməsini tələb etdilər (49, v.39; 302, s.105).

Erməni milli komitəsinin fəallarından təşkil edilən bu oyuncaq qurumun da bütün fəaliyyəti azərbaycanlıların fiziki məhvinə, onların ata-baba məskənlərindən sıxışdırılıb çıxarılmasına istiqamətlənmişdi. Erməni millətçiləri azərbaycanlıları məcbur etmək istəyirdilər ki, Qarabağı Azərbaycandan ayrı qurum kimi tanısınlar. Bu məqsədə nail olmaq üçün ermənilər silahlı dəstələr yaradır, azərbaycanlıları təcrid etməyə çalışırdılar. Əsgərana, Ağdama və Qaryaginə gedən yollar kəsilməklə azərbaycanlıların Aran Qarabağla əlaqələri qarşısına çəpər çəkilmişdi. Erməni millətçiləri planlaşdırmışdılar ki, payızın və qışın gəlməsi və yaşayışın çətinləşməsi, ehtiyacların artması ilə bağlı azərbaycanlılara təzyiqi gücləndirsinlər, onları Qarabağ erməni qurumunu tanımağa məcbur etsinlər (11, 21.10.1918).

Çətin şəraitdə yaşayan Azərbaycan hökumətinin kömək və yardımından uzaq düşən Qarabağ azərbaycanlıları kənardan olan müdaxilələrlə qızışdırılan erməni millətçilərinin təcavüzlərinə, təzyiqlərinə mərdliklə sinə gərir və hətta bu təzyiqlərin qarşısını almaq, özlərinin dinc yaşayışını qorumaq üçün qətiyyətli tədbirlərə də əl atırdılar. Şuşada azərbaycanlılardan ibarət könüllü müdafiə dəstəsi yaradılmışdı. 15 yaşından 60 yaşadək sağlam kişilərin hamısı qeydiyyata alınmışdı. 45 yaşınadək olanlar isə ehtiyata yazılırdılar. Şəhərdə 14 komitə yaradılmışdı. Bu komitələr silah və sursat üçün pul toplayır, sahələr üzrə siyahıları tərtib edirdilər. Varlıdan yoxsula hamı silahlanırdı. Yaşayış məhəllələrinin kənarı ilə səngərlər və xəndəklər qazılır, erməni məhəllələrinə yaxın olan evlər müdafiə üçün möhkəmləndirilirdi. Səngərlərdə gecə-gündüz keşik çəkilirdi və keşikçilərin növbəsi xüsusi patrullar tərəfindən yoxlanılırdı. Şuşada xüsusi hərbi kurs yaradılmışdı. Şəhərdə olan zabitlər bu kursda gənclərə süvari və piyadalar üçün ən zəruri bilikləri verirdilər. Kursda məşğələ keçən 50 nəfər gənc hər gün səhər saat 9-dan 12-yə qədər, günortadan sonra isə 4-dən 6-ya qədər məşğul olurdu (11, 23.10.1918).

Üçmıx dağında və şəhər ətrafındakı digər yüksəkliklərdə də azərbaycanlıların səngərləri vardı. Hakim yüksəkliklərdən olan bu səngərlər



Şuşa ilə ətraf kəndlərin əlaqələrinin təhlükəsizliyini tə'min etməyə imkan verirdi (11, 23.10.1918).

Özünümüdafiə xarakteri daşıyan bu tədbirlərlə bütünlükdə Qarabağda güclənməkdə olan millətçi separatçılığın, milli zülmün qarşısını tamamilə almaq mümkün deyildi. Ona görə də Bakı əməliyyatı başa çatandan bir neçə gün sonra Qarabağa da qoşun hissələri göndərilməsi qərara alındı. Bunun üçün xüsusi dəstə yaradıldı və həmin dəstənin tərkibinə 9-cu və 106-cı Qafqaz alayları daxil edildi. Dəstənin komandiri isə Cəmil Cahid bəy tə'yin olundu (302, s.106).

Qarabağ dəstəsi sentyabrın 25-də Qarabağ torpağına daxil oldu. Həm dəstənin, həm də Qafqaz İslam Ordusunun qərargahı Ağdamda yerləşdi (302, s.106). Erməni millətçiləri türk qoşunlarının Qarabağa gəlməsi ilə barışa bilmirdilər. Yaxın günlərdə bütün niyyətlərinin puç olacağını anlayan millətçilər sentyabrın sonlarında növbəti qurultay çağırıb bir daha Azərbaycan hökumətini tanımadıqlarını bildirdilər. Oktyabrın 1-də Nuru Paşa da Ağdama gəldi (302, s.109).. Nuru Paşa və Cəmil Cahid bəy özünü müstəqil erməni xalq hökuməti adlandıran quruma ultimatum göndərib tə'cili surətdə tərksilah olunmalarını tələb etdilər. Türk mənbələrində bu ultimatumdan sonra ermənilərə bir gün, (302, s.108), Azərbaycan mənbələrində isə 3 gün (46, v.116) və 5 gün (11, 1.11.1918) möhlət verildiyi bildirilir.

Türk qoşunlarının ultimatumunu alandan sonra ermənilər Qarabağda özlərinin üçüncü qurultayını çağırdılar. Tərksilah olunmaq və Azərbaycan hökumətini tanımaq məsələsi burada çox ciddi müzakirə olundu. 78 nəfər çıxış etdi. Ancaq heç kəs Azərbaycan hökumətini tanımağa razı olmadı (47, v.50). Ultimatumun müddəti bitəndən sonra Ağdamdan Şuşa ermənilərinə xəbər çatdırıldı ki, 36 saatdan sonra təslim olmasalar türk qoşunlarının hücumu başlayacaqdır. Çarəsiz qalan ermənilər bir ədəd əldəqayırma top, bir ədəd pulemyot, 80 ədəd tüfəng toplayıb tərksilah olunduqlarını və Azərbaycan hökumətini tanıdıqlarını bildirdilər (11, 1.11.1918).

Bununla belə, türk qoşunları Şuşaya doğru irəliləyəndə Xramord, Xanabad, Daşbaşı, Aranzəmin, Kətik, Ağbulaq, Qarakənd, Əsgəran ətrafında erməni silahlı dəstələri onlara müqavimət göstərdi (11, 1.11.1918). Bu müqavimətləri qırdıqdan sonra türk qoşunları oktyabrın 8-də Şuşaya daxil oldu. Qoşun bölmələri azərbaycanlı əhali tərəfindən böyük sevinc və qonaqpərvərliklə qarşılaşdı (302, s.108).

Bakı şəhərinin azad edilməsi, Azərbaycan hökumətinin bura köçməsi və dövlət işlərinin nizamlanmasına başlandığı bir vaxtda ordunun təkmilləşdirilməsi və möhkəmlənməsi üçün də daha müsaid bir zəmin yarandı. 1918-ci il oktyabr ayının 6-da müəyyən dəyişikliklərdən sonra hökumətin tərkibində hərbi işlər üzrə baş müvəkkillik öz fəaliyyətini yenə də davam

etdirirdi (274, s.87). Bu orqanın dəftərxanası "Metropol" mehmanxanasında yerləşdirilmişdi (9, 14.10.1918).

Mövcud imkanlar daxilində qoşun hissələrinin maddi-texniki təchizinə, komplektləşdirilməsinə və tə'lim-tərbiyəsinə diqqət gücləndirildi. Döyüşlərin başa çatdırılması ilə bu işlərə daha çox vaxt sərf etmək imkanı əldə edilmişdi.

Bakı üzərinə hücum uğurla başa çatdırıldıqdan sonra düşməndən çoxlu sayda silah, sursat və texnika hərbi qənimət götürülmüşdü ki, bu da qoşun hissələrinin təchizini yaxşılaşdırmağa kömək edərdi. Lakin qənimət alınan topların çoxlarının detalları çıxarılmış və onlar xarab edilmişdi. Bu detalların tapılması və təhvil verilməsi üçün qəzetlərdə bildirişlər çap olunmuş və hər bir detal üçün mükafat ayrıldığı yazılmışdı. Məsələn, topun durbini üçün 2 min rubl, topun qəməsi üçün 1 min rubl mükafat ayrılmışdı (9, 9.10.1918).

Diqqət mərkəzində dayanan başlıca məsələlərdən biri də çağırış və səfərbərlik məsələsi idi. Bu iş Qafqaz İslam Ordusunun Əxzi-əsgər rəyasətinin nəzarəti altında aparılırdı. Bə'zi hallarda xalqın milli xüsusiyyətlərini, dövrün və şəraitin tələblərini, ümumvətəndaşlıq borclarını nəzərə almadan aparılan bu iş müəyyən nöqsan və çatışmazlıqlarla müşayiət olunsa da (bu barədə müvafiq fəsildə danışılacaqdır), qoşun hissələrinin komplektləşdirilməsində hiss olunacaq addımlar da atılmışdı. Bakının azad edilməsi, Türk-Azərbaycan qoşunlarının müzəffər yürüşləri gənclərin müəyyən qismində vətənpərvərlik hisslərini xeyli coşdurmuşdu və onlar könüllü surətdə xidmətə yazılırdılar. Qafqaz İslam Ordusunun Əxzi-əsgər rəyasəti bununla bağlı hətta qəzetdə mə'lumat vermiş və xidmətə yollanmaq üçün kənd və şəhərlərdə müvafiq orqanlara müraciət edənlərin artmasından məmnun olduğunu bildirmişdi (9, 20.10.1918).

Qoşun hissələrində xüsusi peşələrə olan ehtiyacı ödəmək üçün 19 yaşından 24 yaşına kimi olan bütün çəkməçilər, nəccarlar, dülgərlər, dəmirçilər, xəyyatlar, nalbəndlər, bərbərlər, dənizçilər və s. məcburi surətdə xidmətə cəlb olunurdular. Bu və ya digər peşələrə sahib olan 25-30 yaş arasındakı vətəndaşlar isə könüllü surətdə xidmətə yazıla bilərdilər (11, 23.10.1918).

Azərbaycanda hərbi xidmətə çağırışın hüquqi əsaslarının müəyyənləşdirilməsi üçün 1918-ci il oktyabr ayının 11-də "Azərbaycan hökumətinin əsgəri mükəlləfiyyətinin müvəqqəti qanunu" qüvvəyə mindi. Bu qanun Azərbaycan hökumətinin hərbi qanunvericilik sahəsində qəbul etdiyi ilk böyük sənədlərdən biri idi və heç şübhəsiz ki, həmin dövrdə əhali arasında bu işin nizamlanmasında müəyyən əhəmiyyətə malik idi (bax:9, 11.10.1918).

Müvəqqəti qanuna görə Azərbaycanın bütün vətəndaşları qanunun tələbləri çərçivəsində hərbi mükəlləfiyyəti keçməli idi. 18 yaşından e'tibarən gənclər artıq hərbi mükəlləfiyyətçi idilər. Ancaq 18 və 19 yaşlı gənclər xidmətqabağı ehtiyatda sayılırdılar. Bu kontingent 2-ci dərəcəli ehtiyat adlanırdı və onlar yalnız müharibə dövründə xidmətə çağırılırdılar. Sülh dövründə isə həqiqi xidmət 20 yaşından başlanırdı. Piyada və nəqliyyat qoşunlarında xidmət 2 il, digər qoşunlarda isə 3 il müəyyənləşdirmişdi. Həqiqi hərbi xidmət qurtardıqdan sonra keçmiş əsgərlər üçün 1-ci dərəcəli ehtiyatda xidmət piyadalar üçün 40 yaşına, digər qoşunlardan olanlar üçün isə 38 yaşınadək davam etməli idi.

Müvəqqəti qanunun böyük bir bloku çağırışdan möhlət və güzəştlərə həsr edilmişdi. Həmin blokda konkret olaraq göstərilirdi ki, kimlərə ailə vəziyyətinə, səhhətinə, tutduğu vəzifələrə görə möhlət və güzəşt verilə bilər.

Müvəqqəti qanunla qəzalarda Əxzi-əsgər məclisinə qəzanın vəzifəli şəxsləri daxil olmalı, şəhər və qəzalarda çağırış işləri bu məclislərin nəzarəti altında aparılmalı idi. Çağırışla bağlı ortaya çıxan suallara da ilk növbədə bu məclisdə baxılmalı idi.

Əxzi-əsgər şö'bələrinin nəzdində həkim-müayinə komissiyaları da təşkil edilməli idi. Bu komissiya çağırışçıları müayinə etməli, onların xidmətə yararlılığını müəyyənləşdirməli idi. Çağırışçıların hansı qoşun növünə göndərilməsi üçün həkim komissiyasının qərarı nəzərə alınmalı idi. Çağırışçı və ya onun valideynləri həkim komissiyasının qərarı ilə razılaşmadıqda 2 nəfərdən az olmayaraq başqa bir həkim komissiyasının tə'yin edilməsini tə'yin etmək hüququna malik idi (bax:9, 11.10.1918).

1918-ci ilin oktyabrında Gəncədəki Milli hərbiyyə məktəbinin ilk buraxılışı oldu. Bu hadisə Azərbaycanın ordu hissələrinin milli zabit kadrlarla tə'min edilməsində tarixi əhəmiyyətə malik idi. Azərbaycanın ilk milli hərbi məktəbinin ilk buraxılışı təntənəli şəkildə qeyd edildi. Bu münasibətlə oktyabr ayının 26-da Qafqaz İslam Ordusunun komandanı Nuru Paşanın atası Hacı Əhməd Paşa, xüsusi Azərbaycan Korpusunun komandiri general-leytenant Ə.Şıxlinski, Qafqaz İslam Ordusunun qərargah rəisi Nazim bəy, təhsil naziri N.Yusifbəyli və b. Gəncəyə gəldilər (11, 7.11.1918).

Milli hərbiyyə məktəbində nəzərdə tutulan tədris müddəti 4 aydan artıq çəkmişdi. Məktəbdə oxuyanlar müvəffəqiyyətlə buraxılış imtahanları verəcəyi təqdirdə qoşunlara göndərilməli və 6 aydan sonra onlara zabit rütbəsi verilməli idi.

Oktyabrın 27-də yunkerlər şəhər kənarındakı tə'lim meydanında buraxılış imtahanı verməli idilər. Burada imtahanın keçirilməsi üçün xəndəklər, səngərlər qazılmış, sün'i, maneələr yaradılmış, zəruri olan əşya və cisimlər yerli-yerində səhmana salınmışdı. Səhər tezdən Bakıdan gələn qonaqlar tə'lim meydanına daxil oldular. Məktəbin ilk buraxılışını sevinclə qarşılayan xeyli şəhər əhalisi də bura toplaşmışdı. Azərbaycan korpusunun komandiri Ə.Şıxlinski nizami sırada düzülmüş yunkerlərlə salam-

laşdıqdan sonra buraxılış imtahanı başladı. Yunkerlər aşağıdakı proqram üzrə imtahan verməli idilər:

1. Komandır və rəislərə özünü təqdim etmə qaydaları;
2. Yerində sıra tə'limi;
3. Hərbi fəaliyyət zamanı fəaliyyətin çevikliyi;
4. Süngü döyüşü;
5. Müxtəlif məsafələrə atış, nişangah;
6. Düşmən hücumunun dəf edilməsi;
7. Bomba atmaq;
8. Hərbi gimnastika;
9. Səngərlərdən qumbara atmaq;
10. Fitil qoyulmuş qumbaraların yaxınlaşan düşmənə tərəf atılması;
11. Simli maneələrin bomba və qayçılarla məhv edilməsi;
12. Pulemyotlu dəstələrin məhv edilməsi, səngərlərin döyüş vəziyyətinə gətirilməsi;
13. Atış komandaları;
14. Komandaya görə işarə vermə;
15. Hissələrin səngərlərdə və açıq sahədə yerləşməsi;
16. Silahın sökülməsi və yığılması;
17. Raport vermə qaydaları;
18. Manevr etmə (11, 7.11.1918).

İmtahana digər proqram və fənlər üzrə də suallar salınmışdı. Səhər saat 8-də başlayan imtahan günorta saat 2-yə kimi davam etdi. Bütün müdavimlər buraxılış imtahanlarını müvəffəqiyyətlə verdilər. Günortadan sonra şəhər rəhbərliyinin bu münasibətlə təşkil etdiyi ziyafətdə Milli hərbiyyə məktəbinin ilk buraxılışında türk zabitlərinin böyük zəhməti minnətdarlıqla qeyd olundu (11, 11.11.1918).

1918-ci il oktyabrın 30-da Türkiyə Mudros müqaviləsini imzalamaqla müttəfiqi Almaniya ilə birlikdə Birinci dünya müharibəsində məğlub olduğunu və müttəfiqlərin irəli sürdüyü şərtləri qəbul etməyi öz üzərinə götürdü. Həmin müqavilənin 11-ci maddəsinə görə Türkiyə qoşunları Qafqazdan və Cənubi Azərbaycandan çıxarılmalı idi (194, s.246). Bu tədbirin həyata keçirilməsi üçün çox qısa vaxt ayrılmışdı. İngilislərin Şimali İrandakı qoşunlarının komandanı general V.Tomson tələb edirdi ki, 1918-ci il noyabrın 17-də, səhər saat 10-a kimi bütün Azərbaycan türk qoşunlarından təmizlənməlidir (310, s.147).

Bu tələbə əsasən noyabr ayının əvvəllərindən türk qoşunlarının Azərbaycandan çıxarılmasına başlandı. Noyabr ayının 10-da Bakı ictimai iclasının yay binasında Nuru Paşanın yola salınması şərəfinə ziyafət verildi. İclasda Azərbaycan hökumətinin sədri F.Xoyski, "Müsavat" partiyasının lideri M.Ə.Rəsulzadə çıxış edərək Nuru Paşanın və onun komandanlıq etdiyi türk qoşunlarının Azərbaycanda icra etdikləri xidməti təşəkkür və minnətdarlıqla xatırladılar.

Türk qoşunlarının getməsilə müstəqil Azərbaycan Respublikasının Ordusunun qurulmasının da ilk mərhələsi başa çatdı.



x x x

Beləliklə, xalqın mənafelərinin keşiyində dura biləcək milli qoşun hissələrinin yaradılması üçün irəli sürülən tələblər 1917-ci ilin sonlarından e'tibarən həyata keçirilməyə başladı. Bu tələblər əvvəllər də irəli sürülsə də, nə çar Rusiyası, nə də onun devirilməsindən sonra hakimiyyətə gələn müvəqqəti hökumət azərbaycanlılardan ibarət milli qoşun hissələrinin təşkilinə imkan vermirdilər. Yalnız Rusiyada bolşevik üsyanından sonra Zaqafqaziyada yaranan bölgə hökuməti Şərq cəbhəsindən kütləvi surətdə tərxis olunan rus qoşunlarını əvəz etmək üçün milli qoşun korpuslarının təşkili barədə qərar qəbul etdi. Müsəlman Korpusunun təşkili çox çətin bir şəraitdə keçirdi. Nə müvafiq kadrlar var idi, nə də silah və təchizat. Bir tərəfdən də Bakıda xüsusi gücə və nüfuza malik olan bolşevik təşkilatları erməni-daşnak elementləri ilə bir cəbhədə Müsəlman Korpusunun hissələrinin təşkilinə hər vasitə ilə mane olurdular. Korpusun zabitləri tə'qib olunur və onların təmsil etdikləri qoşun əleyhinə təbliğat aparılırdı. Milli müsəlman komitələri tərəfindən himayə olunan Müsəlman Korpusu hissələrinin təchizi üçün əsas mənbə cəbhəni tərk edib gedən rus qoşunlarının tərksilah edilməsi idi ki, bu da çox vaxt güclü müqavimətlə qarşılanırdı.

Müsəlman Korpusunun hissələri müstəqil milli ordunun hissələri sayıla bilməz. Çünki bu korpus Zaqafqaziya hökumətinin güc strukturlarının tərkib hissəsi idi. Bununla belə, Azərbaycanın istiqlaliyyəti e'lan ediləndən sonra Müsəlman Korpusu müstəqil Azərbaycan dövlətinin təşkil olunacaq müstəqil ordusunun özülünü təşkil etdi. Ancaq təşkilinə başlanan müstəqil ordu Azərbaycan hökumətinin səlahiyyətlərini Azərbaycanın bütün ərazisində qorumağa, respublikanın paytaxtı Bakı şəhərini bolşevik-daşnak elementlərindən təmizləməyə hələ qadir deyildi. Buna görə də Azərbaycan hökuməti imzaladığı dostluq müqaviləsi əsasında Türkiyədən hərbi yardım istədi. Azərbaycana gələn türk qoşunları milli qoşun hissələri ilə birgə bolşevik-daşnak qüvvələrinə qarşı mübarizə aparmaqla bərabər həm də Azərbaycan Ordusunun formalaşmasına rəhbərlik edirdi. Bolşevik qüvvələrinə qarşı gərgin döyüşlər getdiyi bir vaxtda Azərbaycanın ordu hissələrinin möhkəmləndirilməsi üçün müəyyən addımlar da atılırdı. Qoşunların təchizi, komplektləşdirmənin aparılması, milli zabit kadrlarının hazırlanması istiqamətində konkret işlər görülsə də, türk qoşunları respublikanı tərk edən zaman Azərbaycan Ordusu hələ Azərbaycanın müstəqilliyini qorumağa qadir olan bir qüvvə kimi formalaşmamışdı. Ancaq artıq mövcud olan özül belə bir qüvvə kimi ordunun formalaşması üçün əhəmiyyətli baza ola bilərdi.

# İKİNCİ FƏSİL

## ORDU QURUCULUĞUNUN YENİ MƏRHƏLƏSİ

1918-ci ilin noyabrından Azərbaycanda ordu quruculuğunun yeni mərhələsi başlanır. Türk qoşunları Azərbaycanı tərk etdikdən sonra respublikanın istiqlaliyyətinin qorunması bütünlüklə dövlət orqanlarının öz üzərinə düşdü. Belə vaxtda ölkənin zəruri hərbi keyfiyyətlərə malik olan güclü ordusunun formalaşdırılması tarixi əhəmiyyət kəsb edirdi. Həmin tarixi missiyanın həyata keçirilməsi üçün Azərbaycan hökumətinin yenicə yaradılmış olan Hərbi Nazirliyinin rəhbərliyinin qarşısında qoşunların təşkili, onların məqsədyönlü strukturunun müəyyənləşdirilməsi, ordu quruculuğunun bütün sahələrinin düzgün idarə edilməsi, təchizat və tə'minat ehtiyaclarının reallaşdırılması kimi mühüm vəzifələr dururdu.

Ordu cəmiyyətin bir parçası olduğu üçün onun idarə edilməsi və ona rəhbərlik də ilk növbədə cəmiyyətə rəhbərliyin, dövlət quruculuğunun tərkib hissəsidir (275, s.7). Qlobal miqyasda ordu quruculuğunda gözlənilən uğurun əldə edilməsi silahlı qüvvələr üzərinə qoyulan vəzifələrin aydınlığı, bütövlüyü və düzgün dərk edilməsi ilə bağlıdır (255a, s.17). Ordu quruculuğu qarşısında qoyulan vəzifələr bütünlükdə dövlət quruculuğu ilə vəhdət təşkil etməsə, bu mürəkkəb *prosesin səmərəli şəkildə istiqamətlən*dirilməsi də xeyli çətinləşə bilər. Ona görə də dövlətin hərbi siyasətini formalaşdırıb onun icrasına rəhbərlik edən hərbi-siyasi orqanların təşkili, bu orqanların fəaliyyətinin nizamlanması ordu quruculuğunun yeni mərhələsində həll edilməli olan aktual vəzifələrdən biri idi.

Dövlətin, onun hərbi-siyasi orqanlarının ordu quruculuğu sahəsində müəyyənləşdirdiyi vəzifələrin icra keyfiyyəti isə orduya rəhbərlik edən idarəetmə orqanlarının yetkinliyi, onların işinin təşkili səviyyəsi ilə şərtlənir. Bu orqanların çevik olması, biri digərini təkrarlamaması, qarşıya qoyulan vəzifələrin icrası üçün bütün imkanları operativ şəkildə səfərbər edə bilmək qabiliyyəti möhkəm ordunun ayrılmaz tərəflərindən biridir. Qoşunların strukturunun müəyyənləşdirilməsində də onların səmərəli idarəedilməsi tələbi əsas kimi götürülməsə, ayrı-ayrı komandirlərin və rəislərin cəhdləri nəticəsiz qalmış olar. Dövrün və şəraitin tələbi ilə rəhbərliyin ən səmərəli forma və metodunu özündə birləşdirən strukturların müəyyənləşdirilməsi (200, s.399) ordunun formalaşdırılmasında, daimi döyüş hazırlığı



vəziyyətində saxlanılmasında, müharibə şəraitində məqsədyönlü idarə edilməsində mühüm əhəmiyyətə malikdir. Bu məsələlər Azərbaycanın ordu quruculuğu üçün də böyük aktuallıq kəsb edirdi. Çünki bir əsrlik müddət ərzində Azərbaycan müstəqil ordu quruculuğu təcrübəsinə malik deyildi. Milli zabit kadrları isə çar ordusunda yetişmişdilər. Həmin ordunun təcrübəsinin mexaniki şəkildə Azərbaycana köçürülməsi gözlənilən nəticəni verə bilməzdi Azərbaycanın Hərbi Nazirliyinin rəhbərliyi bu məsələni vaxtında və daha məqsədəuyğun şəkildə həll etməli idi.

Ordunun strkturu müəyyənləşdirilərkən ilk növbədə onun say tərkibi əsas götürülür. Qoşunların hansı sayda və kəmiyyətdə olması isə ölkənin iqtisadi qüdrətindən birbaşa asılıdır (212, s.106). Çünki ordu sadəcə olaraq hərbi mükəlləfiyyətlilər toplusu deyil. Ordunun sıralarına çağırılan hər bir adam təchiz və tə'min edilməli, əsgəri vərdişlərə yiyələnməsi üçün xeyli xərc tələb edən tə'lim-tərbiyə prosesini keçməlidir. Ordunun döyüşkənliyi, zərbə qüdrəti, müdafiə qabiliyyəti də onun silah və texnika ilə necə tə'min edilməsi ilə şərtlənir. Bundan irəli gələn vəzifələrin həlli isə hərbi rəhbərliklə ölkə rəhbərliyinin qarşılıqlı və uzlaşdırılmış fəaliyyətini tələb edirdi.

### *1. ORDUNUN TƏŞKİLİ STRUKTURU VƏ İDARƏETMƏ ORQANLARI*

Azərbaycanın istiqlaliyyətinin e'lan olunduğu tarixi şərait, onun qərar tutduğu bölgədə cərəyan edən proseslər xalqın müstəqilliyinə real dayaq ola biləcək ordunun formalaşdırılmasını tələb edirdi.

Ordunun yenidən qurulmasını canlandırmaq, onun formalaşdırılmasını tarixi dövrün təcrübələri səviyyəsinə qaldırmaq üçün 1918-ci il oktyabrın 23-də respublika hökumətinin iclasında Hərbi Nazirliyin bərpa edilməsi qərara alındı (205, s.28). Nazirlər Şurasının qərarına uyğun olaraq noyabrın 7-də Hərbi Nazirlik tə'sis edildi. Nazir vəzifəsini Nazirlər Şurasının sədri F.Xoyski öz üzərinə götürdü (205, s.28). Nazir müavini vəzifəsinə isə 1918-ci ilin oktyabrından Azərbaycanın dövlət orqanlarında işləyən (181, s.60) tam artilleriya generalı Səməd bəy Mehmandarov tə'yin edildi və ona Hərbi Nazirliyi formalaşdırmaq həvalə olundu (183, s.27). Elə həmin gün də S.Mehmandarov Hərbi Nazirlik üzrə özünün 1 saylı əmrini imzaladı. Bu əmrdə deyilirdi: "Azərbaycan Respublikası Nazirlər Şurasının qərarı ilə mən hərbi nazirin müavini tə'yin edilmişəm ki, bu barədə Hərbi Nazirliyə e'lan edirəm. Vəzifələrimin icrasına başlarkən mənim görməli olduğum o böyük işin bütün ciddiliyini, mürəkkəbliyini və çətinliyini yaxşı anlayıram. Ancaq bu iş görülməlidir və Hərbi Nazirliyin qarşısına *çıxan bütün çətinlikləri birgə səmimi fəaliyyət* və vəzifəyə təmiz münasibət bəslənildiyi halda aradan qaldırmaq mümkündür.

Döyüşkən ordunun yaradılmasının uğuru bütünlüklə bu işin düzgün qoyuluşundan asılıdır. *Hamını birgə, səmimi fəaliyyətə də'vət etməklə mən* bütün səviyyələrdə olan rəislərin əsas diqqətinin qoşunlarda tə'lim və tərbiyəyə, onlarda möhkəm intizamın aşılanmasına, işə məs'uliyyət və məhəbbət hisslərinin, xidməti mülkiyyətə marağın oyadılmasına qanun-qaydaya riayət edilməsinə və nəhayət, tabeçilikdə olanlara qayğıkeş və mehriban münasibət göstərilməsinə çağırıram. Yalnız bu keyfiyyətlərin varlığı ordunun yaradılmasını, gənc respublika tərəfindən ona böyük xərclər çəkilməsini doğrulda bilər və belə bir ordunun yaradılması üçün mən heç bir çətinlikdən çəkinməyəcəyəm. Qoşunların bütün tə'minat və təchizatının vaxtında ödənməsi mənim daimi diqqətim altında olacaqdır" (11, 18.11.1918).

General S.Mehmandarov elə ilk əmrində bütün gücünü, bacarığını gənc respublikanın dayağı olacaq ordunun qorunmasına yönəldilməsinə, orduda xidmətə gələnlərin imkanlarının yalnız bu məqsədə səfərbər edilməsinə çalışacağını bildirirdi. Vətənpərvərlik ehtirası və yanğısı ilə vəzifəsinin icrasına başlayan S.Mehmandarov Azərbaycanın müstəqilliyinin müdafiəsi, ölkə daxilində mövcud olan anarxiyanın qarşısının alınması üçün güclü ordunun formalaşdırılmasını yeni keyfiyyətdə fəaliyyətini əsas məqsədi sayır və rəhbərlik etdiyi qoşunlarda bu məqsədin müqəddəsliyinə dərin inam aşılamağa çalışırdı. Azərbaycan süvari diviziyasının rəisinə ünvanladığı əmrində S.Mehmandarov yazırdı: "Sizə mə'lum edirəm ki, Azərbaycan qoşunları heç bir təcavüzkar məqsəd güdmür. O yalnız dövlət sərhəddinin müdafiəsi, dövlət daxilində qanun və qaydanın qorunması, mümkün olacaq anarxiyanın aradan qaldırılması, bandaların soyğunçu basqınlarına son qoyulması məqsədilə yaradılmış və yaradılmaqdadır. Elə edin ki, bütün bu deyilənlər təkcə rəislərə deyil, hətta hər bir əsgərə də mə'lum olsun" (173, v.23).

Hökumətin sədri və bir müddət hərbi nazir vəzifəsini öz üzərinə götürmüş Fətəli xan Xoyski də ölkənin ərazi bütövlüyünü qorumağa qadir olan ordunun formalaşdırılmasını qarşıya qoyulan başlıca vəzifələrdən biri sayır, belə bir ordunun yaradılması üçün hökumət tərəfindən dərhal lazımi işlərin görülməsinə başlanacağını bildirirdi (60, v.46).

General S.Mehmandarov ilk növbədə Hərbi Nazirliyin özünün aparatının yaradılmasına və onun vasitəsilə də ordunun qurulmasına və idarə edilməsinə çalışırdı. Yeni vəzifəyə tə'yin ediləndən təxminən bir həftə sonra, noyabrın 15-də ordunun Ümumi qərargahı (Главный штаб) tə'sis edildi. Onun tərkibi aşağıdakı şö'bələrdən ibarət idi: Ləvazimat şö'bəsi, Mühəndis şö'bəsi, növbətçi generalın şö'bəsi, general-kvartirmeysterin şö'bəsi, Topçu şö'bəsi, Tibb şö'bəsi, Hərbi təhsil şö'bəsi və Nəzarət şö'bəsi (183, s.27).



Noyabrın 15-də imzalanmış əmrlə polkovnik H.Səlimov–Ümumi qərargahın və Dəftərxananın rəisi, polkovnik Qaytabaşı – növbətçi general, polkovnik Seyfulla Mirzə – Ləvazimat şö'bəsinin rəisi, general-mayor Tlexas – Topçu şö'bəsinin rəisi, general-mayor Usubov – Hərbi təhsil şö'bəsinin rəisi və qoşunlarda atıcılıq işinin müfəttişi vəzifələrinə tə'yin edildilər (103, v.302).




**Hərbi Nazirliyin aparatının strukturu. Noyabr, 1918-ci il.**

Ancaq Hərbi Nazirliyin təşkilinin elə ilk günlərindən respublikada meydana gələn hərbi-siyasi vəziyyət onsuz da mürəkkəb proses olan ordu quruculuğunu daha da çətinləşdirirdi. Mudros müqaviləsinin şərtlərinə görə müttəfiq dövlətlər adından Bakıya gəlməli olan ingilis qoşunlarının komandanı general V.Tomson hələ Azərbaycana qədəm qoymamışdan əvvəl tələb edirdi ki, noyabrın 17-dək türk qoşunları kimi Azərbaycan qoşunları da Bakı şəhərini tərk etsinlər (310, s.147).

Noyabrın 17-də gəmi ilə Bakıya gələn general V. Tomson dərhal bəyanat verdi. O, Bakının general-qubernatoru vəzifəsini öz üzərinə götürməklə şəhərdə hərbi vəziyyət e'lan etdi (43, v.1).

Sonrakı bir neçə gün ərzində general Tomson verdiyi əmrlərlə Bakıda rejimi xeyli kəskinləşdirdi. Noyabrın 19-da imzalanan əmrlə Bakıda hər hansı bir şəxsin odlu və soyuq silah gəzdirməsi qəti qadağan olunurdu. Bu tələbə riayət etməyənləri çox ciddi cəzalar gözləyirdi (11, 22.11.1918). Noyabrın 24-də qüvvəyə minən əmrə görə isə İçərişəhərdə və şəhərin qərb hissəsində hərbçilərin hərəkət etməsi qəti qadağan edilirdi (11, 24.11.1918).

Belə bir şəraitdə fəaliyyət göstərmək mümkün olmadığı üçün 1918-ci il noyabrın 22-də Hərbi Nazirlik Gəncəyə köçdü (103, v.302). İngilis

qoşunlarının komandanlığı Bakıdan kənarda Hərbi Nazirliyin fəaliyyət göstərməsinə e'tiraz etmirdi (310, s.147).

Gəncədə Hərbi Nazirliyin aparatı Böyük bəy Ağasiyev adlı birisinin evində yerləşdi. Bu ev kərpicdən tikilmiş, damı dəmirlə örtülmüş, böyük zirzəmisi olan bir ev idi. (166, v.7). Həmin evdə əvvəllər Azərbaycana gəlmiş türk qoşunlarının komandanlığı yerləşibmiş (166, v.9).

Hərbi Nazirliyin aparatı ilə birlikdə xüsusi Azərbaycan Korpusunun qərargahı da Gəncəyə köçmüşdü (166, v.13). Hərbi Nazirlik yaradılandan sonra Azərbaycan Korpusu da bir struktur vahidi kimi mövcudluğunu davam etdirirdi. Ancaq korpusun komandiri Ə. Şıxlinski belə bir strukturun mövcudluğuna heç bir lüzum görmürdü və S.Mehmandarov qarşısında dərhal onun ləğv edilməsi barədə təklif qaldırmışdı (20, No 1, 1993, s. 106).

General-leytenant Ə. Şıxlinskinin hərbi savadına və təcrübəsinə böyük hörmətlə yanaşan S. Mehmandarov onun ordu quruculuğuna daha fəal cəlb edilməsi üçün Nazirlər Şurasınan sədri qarşısında vəsatət qaldırdı. Noyabrın 25-də hökumətin sədrinin adına yazdığı məktubunda S. Mehmandarov az olan milli zabit kadrlarından səmərəli istifadə edilməsinin vacibliyini vurğulayır və Ə. Şıxlinskinin hərbi nazirin ikinci müavini tə'yin edilməsini təklif edirdi. S. Mehmandarov təklifini onunla əsaslandırırdı ki, qoşun hissələrinin yoxlanması üçün e'zamiyyətə yollananda Ə. Şıxlinski onu Gəncədə əvəz edə bilərdi. Eyni zamanda S. Mehmandarov bütün texniki hissələrə və təhsil müəssisələrinə rəhbərliyin Ə. Şıxlinskiyə tapşırılmasını məqsədəuyğun bilirdi. (160, v. 152).

Qoşun hissələrinin vəziyyəti ilə şəxsən tanış olmaq, onların döyüş keyfiyyətləri barədə birbaşa mə'lumat əldə etmək üçün S.Mehmandarov dərhal xidməti e'zamiyyətə yollandı. Onun qoşun hissələri ilə tanışlığı 1918-ci il noyabrın 27-dən dekabrın 3-nə qədər davam etdi (bax:86, v.6-7).

Noyabrın 27-də S. Mehmandarov əvvəlcə Gəncə ətrafındakı Birinci Tatar süvari alayında oldu. Polkovnik Hacıbəylinskinin komandir olduğu bu alayın vəziyyəti S. Mehmandarovu razı salmadı. Onun fikrincə hissənin təşkili, şəxsi hey'ətin və canlı qüvvənin hazırlıq səviyyəsi lazımi tələblərə cavab vermirdi (86, v.6).

Dekabrın 2-də o, Ağdamda polkovnik Süleyman bəy Əfəndiyevin komandir olduğu 2-ci Qarabağ süvari alayında oldu. Nazir müavini alayda tə'lim-tərbiyənin, təchizatın təşkil edilməsinin bütün tələblərə cavab verməməsini qeyd etsə də, şəxsi hey'ətin hərbi görkəm almasından, gümrah görünməsindən razı qaldığını bildirdi (86, v.6). S.Mehmandarovu daha çox bu alayın üçüncü bölüyündə gördükləri sevindirirdi. Zabit hey'ətinin tapşırılan vəzifəyə məs'uliyyətlə yanaşmasının nəticəsi kimi bölükdə əsgəri nizamın olması, şəxsi hey'ətin gümrah və çevik olması, xoş tə'sir bağışlaması onu razı saldı. Bölükdə xidmətin yaxşı təşkil edilməsinə görə S. Mehmandarov komandir, poruçik Sadıqova öz minnətdarlığını bildirdi (86, v. 7).

Dekabrın 3-də S. Mehmandarov Ağdamda 4-cü və 5-ci dağ batareyalarında oldu. Burada da digər hissələr və bütünlükdə ordu üçün xarakterik olan çatışmazlıqlarla rastlaşdı (118, v.7). Gəncəyə qayıdan kimi S. Mehmandarov bütün gördüklərini və şahidi olduqlarını əmrlə rəsmiləşdirdi və həmin əmrdə mövcud olan nöqsanların aradan qaldırılması üçün öz tövsiyələrini də açıqladı.

1918-ci il dekabrın 23-də imzaladığı əmrində S. Mehmandarov xidmətə çağırılmış olan bütün şəxslərin dərhal Azərbaycan Respublikasına sədaqət andı içməsinin təşkil edilməsini tələb etdi (86, v. 37).

Hissələrdə andiçmə mərasimləri təntənəli şəkildə keçirilirdi. Bunun üçün xüsusi hazırlıq görülür, andiçmə mərasiminin günü əvvəlcədən e'lan edilirdi. Tədbir böyük meydanlarda və adətən hissənin məscidinin ətrafında keçirilirdi. Çünki hissənin mollası müqəddəs Qur'an kitabı ilə birlikdə bu tədbirlərin əsas iştirakçısı olurdu. Hissənin bölmələri meydanda sıraya düzülürdülər. Bə'zən geri qaytarılmış fərarilər də ayrıca sıraya düzülür və bu tədbirin keçirilməsi ilə onlara müəyyən tə'sir göstərilirdi. Andiçmə siyahıları əvvəldən tərtib edilirdi. Tədbirin başlanmasından əvvəl zabitlər və komandirlər, habelə hissənin mollası bir daha əsgərlərlə söhbət aparır, qəbul edilən andın məs'uliyyəti, ona əməl edilməməsinin günahları barədə mə'lumat verirdilər. Andiçmə mərasimi hissənin rəsmi keçidi ilə başa çatırdı (108, v. 26).

1918-ci il dekabrın 15-də bütün türk qoşunları Azərbaycan ərazisindən çıxarıldı. Həmin vaxta qədər Xüsusi Azərbaycan Korpusu əməliyyat baxımından Qafqaz İslam Ordusuna tabe idi. Azərbaycanın Hərbi Nazirliyinin fəaliyyətinin ilkin dövrünə toxunan sənədlər sübut edir ki, yeni ordunun yaradılması çox böyük zəhmət və təşkilatçılıq işi bahasına başa gəlirdi. Zəruri olan şeylər çatışmırdı. Belə olan şəraitdə hər şeyin qənaətlə işlədilməsi, hər şeydən düzgün istifadə edilməsi tələb olunurdu (103, v.302).

Başlıca diqqət isə Xüsusi Azərbaycan Korpusunun hissə və birləşmələrinin yenidən qurulmasına yetirilirdi. Şəxsi hey'ətin azlığı üzündən əmrlə rəsmiləşdirilmiş olan bütün hissələrin və birləşmələrin saxlanılmasına ehtiyac duyulmurdu. Məsələn, 1918-ci ilin dekabrında bir piyada diviziya və bir süvari diviziyasının təşkili, komplektləşdirilməsi, təchiz və tə'min edilməsi bütün işlərin mərkəzində dayanırdı. 1918-ci il dekabrın 20-də süvari diviziyasının rəisi, general-mayor Şahzadə Feyzulla Mirzə Qacar və 1-ci Tatar süvari alayının komandiri polkovnik Hacıbəylinski xidmətdən azad olunmaları barədə ərizə verdilər. Diviziyanın və alayın təşkilində boşdayanmaya yol verməmək üçün dərhal onlara yeni komandirlər tə'yin edildi. Süvari diviziyasının rəisi vəzifəsinə 2-ci süvari alayının komandiri polkovnik S. Əfəndiyev, 2-ci süvari alayının komandiri və-

zifəsinə polkovnik D. Yadigarov, 1-ci süvari alayının komandiri vəzifəsinə isə polkovnik Ağalarov tə'yin edildilər (173, v.35).

Ancaq bir neçə gündən sonra Şahzadə Feyzulla Mirzə Qacar öz vəzifəsini davam etdirmək arzusunda olduğunu bildirdi. Belə olanda onun yerinə tə'yin olunmuş polkovnik S.Əfəndiyev əvvəlki vəzifəsinə deyil, Hərbi Nazirliyə gətirildi və nazirliyin tapşırıq generalı vəzifəsinə tə'yin edildi (86, v. 41).

Qeyd olunmalıdır ki, polkovnik Süleyman bəy Əfəndiyevin savadı, təşkilatçılıq qabiliyyəti, hərbi xidmətə məs'uliyyəti, sonsuz vətənpərvərliyi Hərbi Nazirliyin rəhbərliyi tərəfindən yüksək qiymətləndirildi və o, Azərbaycan Ordusunun zabitləri arasından ilk dəfə olaraq general-mayor rütbəsi almağa təqdim olundu. Hərbi Nazirliyin qaldırdığı vəsatət əsasında Nazirlər Şurasının 29 dekabr 1918-ci il tarixli qərarı ilə ona general-mayor rütbəsi verildi (136, v.39). Bir neçə gündən sonra S.Mehmandarovun əmri ilə S.Əfəndiyev yenidən qoşunlara göndərildi. 1918-ci il yanvarın 1-də ona 1-ci piyada diviziyası rəisinin müavini, yanvarın 7-də həmin diviziyanın rəisi vəzifəsi həvalə olundu (155, v. 18). Yanvarın 14-də isə o, diviziya rəisi vəzifəsinə tə'yin edildi (112, v. 15).

Bütünlükdə 1918-ci ilin sonu və 1919-cu ilin əvvəllərində Hərbi Nazirliyin rəhbərliyində və strukturunda da qismən dəyişiklik edildi ki, bu da ordunun qurulması işinə tə'sirsiz ötüşmədi. Nazirlər Şurasının 25 dekabr 1918-ci il tarixli qərarı ilə tam artilleriya generalı Səməd bəy Mehmandarov hərbi nazir, 29 dekabr tarixli qərarı ilə isə general-leytenant Şıxlinski hərbi nazirin müavini tə'yin edildilər (113, v. 2). 1918-ci il 27 dekabr tarixli 38 saylı əmrini S.Mehmandarov ilk dəfə hərbi nazir kimi imzalamışdı.

1918-ci il 31 dekabr tarixli 40 saylı əmrlə Ümumi qərargahın tərkibində olan Topçu şö'bəsinin bazasında Topçu İdarəsi yaradıldı. Bu idarə Ümumi qərargahın tərkibindən çıxarılaraq birbaşa hərbi nazirə tabe edildi. Həmin əmrdə göstərilirdi ki, Topçu idarəsinin rəisi korpusun tərkibinə daxil olmayan bütün topçu hissələrinin, müəssisələrinin rəisidir. Korpusun topçu hissələri üçün isə o, müfəttişdir. Bu hissələrdə tə'lim-tərbiyənin hansı vəziyyətdə olmasını nəzarət altında saxlamaqla vaxtaşırı hərbi nazirə bu barədə mə'lumat verməlidir. Topçu İdarəsi iki bölmədən təşkil olunmuşdu. 1-ci bölmə – texniki bölmə, 2-ci bölmə isə müfəttiş bölməsi idi. Onlara Topçu İdarəsi rəisinin texniki hissə üzrə və müfəttiş hissəsi üzrə müavinləri rəhbərlik edirdi. Texniki bölmə Azərbaycan Ordusunun bütün nizami hissələrinin topçu texnikası, sursatı və ləvazimatı ilə təchiz olunması, silah və sursatın, bütünlükdə topçu əmlakının mühafizəsi və qorunması ilə məşğul olmalı və bunun üçün lazımi metodiki göstərişləri də hazırlamalı idi. Müfəttiş bölməsi isə topçu hissələrinin və bölmələrinin



döyüş hazırlığı ilə məşğul olmalı və bunun üçün zoruri olan tə'limatları, habelə metodiki sənədləri hazırlamalı idi. (135, v.6).

Bir müddətdən sonra Ümumi qərargahın tərkibindəki İstehkam şö'bəsi də İstehkam İdarəsinə çevrildi və hərbi nazirə tabe edildi (107, v.55). Yeri gəlmişkən qeyd etmək lazımdır ki, bu strukturun arxiv sənədlərində olan günc möhürlərində azərbaycanca adı həm şö'bə, həm də idarə üçün "Ümumordu istehkamat müfəttişliyi riyasəti" kimi göstərilmişdir (137, v.4; 176, v.96). Əgər "начальник инженерного отдела" ifadəsinin də "Ümumordu istehkamat müfəttişliyi riyasəti" kimi tərcümə edildiyini nəzərə alsaq (137, v.4), onda aydın olar ki, burada müəyyən qarışıqlığa yol verilmişdir. Struktur dəyişikliyi baş verdikdən sonra şö'bə və idarənin eyni ad altında tanınması heç də doğru deyildi.

İstehkam İdarəsi də iki şö'bədən təşkil edilmişdi: istehkam və kvartira şö'bələrindən. İstehkam şö'bəsi – idarənin şəxsi hey'ətinin, ordunun bütün istehkam qoşunlarının, hərbi hissələrin istehkam ləvazimatı ilə tə'mın edilməsi, qala və mövqe tikililərinin layihələşdirilməsi və icrası, eyni zamanda yolların, körpülərin, maneələrin və digər istehkam qurğularının layihələşdirilməsi və qurulması ilə məşğul olmalı idi. Kvartira şö'bəsi isə yeni qışlaların və bütünlükdə Hərbi Nazirliyin binalarının tikintisi, yenidən qurulması və tə'miri, mövcud su xətlərinin bərpası və yenilərinin tikilməsi, Hərbi Nazirliyin idarələri, müəssisələri və hissələri üçün binaların kirayə edilməsi, qoşunların yanacaqla və işıqlandırıcı əşyalarla tə'min edilməsi, tüstü borularının təmizlənməsinin təşkili ilə məşğul olmalı idi. İstehkam idarəsi rəisinin hüquq və səlahiyyətləri rus ordusundakı dairə qoşunları istehkam idarəsi rəisinin və müavinlərinin hüquq və səlahiyyətinə bərabər tutulmalı idi. (89, v.23).

Topçu İdarəsinin, İstehkam İdarəsinin, topçu və istehkam anbarlarının, digər texniki hissələrin fəaliyyətinə nəzarət hərbi nazirin müavini Ə. Şıxlinskiyə həvalə edilmişdi. O eyni zamanda hərbi təhsil müəssisələrinin işinə də rəhbərlik etməli idi (139, v.42).

Nazirliyin bütün idarələrinin xidmətlərinin fəaliyyəti nazirin özünün də ciddi nəzarəti altında idi. Təsdiq edilmiş əmrə əsasən idarə, şö'bə və xidmət rəislərinin nazirin qəbuluna gəlməsi günləri müəyyənləşdirilmişdi. Həmin günlərdə müvafiq vəzifəli şəxslər lazım olan sənədləri imzalanmağa təqdim edir, ortaya çıxan sualları müzakirə edir, eyni zamanda nazir xidmətin təşkili barədə maraqlandığı mə'lumatları əldə edirdi. Hər hansı məsələ ortaya çıxanda isə vəzifəli şəxslər cədvəllə müəyyənləşdirilmiş günü gözləmədən nazirin qəbuluna yollana bilərdi (103, v.55).

İdarə, şö'bə və xidmətlərin fəaliyyətinin sənədləşməsi üçün də bə'zi qaydalar müəyyənləşdirilmişdi. Əgər əvvəllər bütün əmrlər Hərbi Nazirlik üzrə verilirdisə, sonradan bu əmrlərin təkrarlanmasına yol verməmək üçün hər xidmət üzrə müvafiq strukturda hazırlanması və nazirin imzasına təq-

dim olunması müəyyənləşdirildi. Məsələn, əmrlər Ümumi qərargah üzrə, nazirliyin dəftərxanası üzrə, Topçu İdarəsi üzrə, İstehkam İdarəsi üzrə, Tibb hissəsi üzrə və s. xidmətlər üzrə verilirdi. Nazirliyin strukturunda sonradan yaranan yeni, müstəqil xidmətlər üzrə sinifləşdirilən əmrlər bütün hissələrə, hərbi müəssisələrə, təhsil ocaqlarına göndərilirdi (146, v.5).

Bütünlükdə Hərbi Nazirliyin rəhbərliyi orduda xidmətin təşkilinin hüquqi əsasda nizamlanmasına xüsusi diqqət yetirirdi. Qısa müddət ərzində Azərbaycan Ordusunun yeni qanunvericilik bazasının yaradılması mümkün olmadığı üçün hərbi nazirin 1919-cu ildə imzaladığı əmrlə 1917-ci il yanvar ayının 1-dək keçmiş Rusiya imperiyasında qəbul edilmiş hərbi qanunvaricilik aktları qüvvədə saxlanılırdı (107, v.33). Azərbaycan Ordusunda xidmət rejimi əsasən həmin qanunvericilik üzərində qurulmalı idi. Ancaq bu qanunvericilik aktlarının Azərbaycan Ordusunda xidmətin bu və ya digər tərəfləri ilə uyğun gəlməyən tərəfləri ləğv edilir və nazirin əmri ilə həmin məqamlar təkmilləşdirilir, ya da yenisi ilə əvəz edilirdi. Məsələn, nazir hələ 1918-ci il dekabrın 27-də 34 saylı əmri ilə hərbi qulluqçular arasında salamlaşmanın Azərbaycan dilində və azərbaycanlılar arasındakı salamlaşma ən'ənələrinə uyğun olaraq aparılmasını tələb edirdi. Yə'ni salamlaşan şəxs "salam" deməli, qarşı tərəf isə "əleyküm salam" deyə cavab verməli idi. Həmin əmrin layihəsində salamın "salam əleyküm" kimi verilməsi nəzərdə tutulmuşdu. Ancaq, S.Mehmandarov öz əli ilə ifadənin ikinci hissəsinin üzərindən xətt çəkərək onun daha yığcam olmasını məqsədəuyğun bilmişdi. Əsgəri tərifləyərkən və ya ona minnətdarlıq bildirərkən "mərhəba" deyilməli, əsgər isə cavabında "çox sağ ol" deməli idi. (86, v.42).

Hərbi qulluqçuların geyim formasında dəyişikliklər edilməsi və onun Azərbaycan Ordusuna uyğunlaşdırılması üçün xüsusi komissiya yaradılmışdı. Komissiyanın işinə general-leytenant Ə.Şıxlinski sədrlik edirdi (124, v.50). Komissiyanın qəbul etdiyi geyim forması tətbiq edilməzdən əvvəl hərbi nazir əmri ilə mövcud geyim formasında qismən dəyişiklik etdi. Bu dəyşiklik əsasən baş geyimlərinə aid idi. Nazır tələb edirdi ki, yeni geyim layihələrinə görə bütün fəsillərdə baş geyimi papaq nəzərdə tutulduğu üçün furajkalar istifadədən götürülsün və papaqlardan istifadə edilsin. Furajkaların papaqla əvəz edilməsi üçün nazir bir ay vaxt ayırmışdı (107, v.22).

Ə.Şıxlinskinin sədrliyi ilə xüsusi komissiyanın hazırladığı geyim forması Azərbaycan Ordusu üzrə 1919-cu il yanvarın 11-dən rəsmiləşdirilmişdi. Bu geyim forması aşağıdakı kimi idi:

A) Baş geyimi – piyada üçün sarı-qəhvəyi rəngli papaq. Papağın üstü də bu rəngdə, ancaq baftasız olmalı idı. Süvarilər, topçular, istehkam qoşunları və qərargahları üçün qara rəngli papaq müəyyənləşdirilmişdi. Papağın üstü də qara rəngdə, özü də baftasız olmalı idı. Papağın üst hissəsinin rəngi 1-ci süvari alayında – ağ, 2-ci süvari alayında-göy, 3-cü süvari alayında – qırmızı, 4-cü süvarı alayında (yaradılsaydı – M.S.) – narıncı olmalı idi. Generallar və qərargah zabitləri piyadaların işlətdiyi papaqdan istifadə etməli idi. Zabitlər və əsgərlər üçün eyni papaq müəyyənləşdirilmişdi.

B) Frenç (əsgəri pencək). Azərbaycan zabitlərinin əksəriyyətinin istifadə etdiyi frençlər geyim forması kimi saxlanılırdı. Bu frençlər xaki rəngində olub sümükdən düymələrə malik idi. Frençin boyunluğu dik idi. Əsgərlər üçün Qafqaz nümunəli köynəklər tətbiq edilməli idi. İstifadədə olan frenç və kitellərin geyilməsinə icazə verilirdi. Bütün qoşun növlərindən olan zabitlər sıradan kənarda çərkəzi paltar geyinə bilərdilər.

V) Şalvar. Müsəlman Korpusunda istifadə edilən və boz-göy rəngdə bafta lampası olan şalvarların geyilməsi qəbul edilirdi. Əsgərlər bafta yerinə qayışdan istifadə etməli idilər. Səfərbərliyin başlanması ilə süvarilərdən başqa hamı xaki rəngli şalvar geyməli idi. Sıradan kənarda uzun şalvar geyilməsinə icazə verilirdi.

Q) Sırada zabitlər uzunboğaz çəkmədə olmalı idilər. Qısaboğaz çəkmələrin də qunc (ketr) ilə birlikdə geyilməsinə icazə verilirdi. Əsgərlər də uzunboğaz çəkmə və ya müvəqqəti hal kimi çarıq-patava geyməli idilər.

D) Palto. Yaxalığının kənarında ilmələri olan, qoşun növünə görə yaxalıq nişanı taxılan boz mahuddan tikilmiş palto nümunələri istifadədə saxlanılırdı. Paltoların düymələrinin mövcud nümunələri dəyişiklik aparılana qədər qüvvədə qalırdı. Yaxalıq nişanları hissələrə görə müxtəlif rəngdə idi. Əsgərlər üçün əsgər mahudundan tikilmiş şinellər təsdiq edilmişdi.

E) Başlıq. Ancaq süvarilər üçün müəyyənləşdirilmişdi. Onlar papaqlarının üst rəngində olan başlıq geyinməli idilər.

J) Zabitlər xidməti vəzifəni icra edərkən, əsgərlər isə həmişə üstündə dəmir lövhəcik olmayan qurşaq kəməri taxmalı idilər. Süvarilər üçün kazak kəmərləri qəbul edilmişdi. Əsgər sırada silahla duranda revolveri də üstündən asmalı idı. Qılıncların Qafqaz nümunəsi istifadə edilməli idi. Bu qılınclar həm sırada, həm də sıradan kənarda daşınmalı idı. Nəsildən qalmış qılıncların daşınmasına icazə verilirdi. Əsgərlərdən yalnız süvarı qoşunlarda xidmət edənlər qılınc daşıya bilərdilər. Topçu qoşunlarında isə yalnız səlahiyyəti olan əsgərlərə qılınc daşımağa icazə verilirdi. Xəncər həm süvari qoşunda, həm də topçu qoşunlarında istifadə edilməli idi.

Z) Çiyin nişanələri, paqonlar. Mövcud olan göy haşiyəli paqonlar saxlanılırdı. Süvari və istehkam qoşunlarında paqonun baftası gümüşü, piyada, topçu və köməkçi qoşun hissələri üçün qızılı rəngdə saxlanılmışdı. Paqonların üzərində "Azərbaycan" (ərəb əlifbası ilə) sözü yazılmalı idı.

D) Orduda xidmət edən mə'murlar da xüsusi forma geyinməli və paqon gəzdirməli idilər. Onların da paqonları göy haşiyə ilə əhatələnməli və üzərinə "Azərbaycan" sözü yazılmalı idi.

E) Vəzifəsinə görə minik atı ayrılmış zabitlər malımıza malik ola bilərdilər, süvarilərə, mə'murlara və hərbi həkimlərə malmız daşımaq qadağan edilirdi.

K) Səlahiyyətli şəxslərə mövcud nümunəli yəhərlər, topçu qoşunlarında və bir sıra zabitlərin vəzifəsinə görə malik olduğu atlarda süvari yəhərləri istifadə edilməli idi (bax:107, v.50-51).

1919-cu ilin əvvəllərində Azərbaycan Ordusu hissələrinin adlarında da qismən dəyişikliklər edildi. Hərbi nazirin 6 yanvar 1919-cu il tarixli 11 saylı əmri ilə Şuşa və Ağdamda dayanan piyada alayı - "Cavanşir piyada alayı", Qazax və Gəncədə yerləşən Qazax alayı - "Gəncə piyada alayı", Hacıqabulda yerləşən piyada alayı - "Bakı alayı", Zaqataladakı tabor isə "Əlahiddə Zaqatala taboru adlandırılırdı (148, v.419).

1919-cu ilin əvvəllərində Azərbaycan Ordusunun döyüş hissələri əsasən adları çəkilən bu piyada alaylarından, süvari alaylarından və topçu hissələrindən ibarət idi. Ancaq yeni-yeni döyüş hissələrinin yaradılması üçün böyük iş aparılırdı. 1919-cu ilin yanvar ayında Gəncədə olan tə"lim taboru ləğv edildi və o, Gəncə alayının 2-ci taboruna çevrildi (152, v. 18). Elə həmin ilin yanvar ayında bir zirehli qatarın şəxsi hey"əti komplektləşdirilmişdi (152, v. 22). Nazirlər Şurasının 22 yanvar 1919-cu il tarixli qərarı ilə Xüsusi Azərbaycan Korpusunun qərargahı ləğv edilərək onun zabitləri Hərbi Nazirliyin aparatına cəlb edildi, bir çoxu isə qoşunlarda xidmətin təşkilinə göndərildi(122, v. 22).

Bir sıra hərbi xəstəxanaların, 1-ci topçu briqadasının hissələrinin formalaşdırılması da davam etməkdə idi. Hərbi nazir S.Mehmandarov 1919-cu ilin əvvəllərində Ə.Şıxlinskiyə göstəriş vermişdi ki, dərhal ağır topçu divizionunun təşkilinə başlansın və bu zaman başlıca diqqət qaubitsa batareyasının təşkilinə istiqamətləndirilsin (107, v.16).

Qoşunların sayının artması ilə onların tə"min və təchiz edilməsi işləri də xeyli artmışdı. Bu işlərin öhdəsindən bütövlüklə və vaxtında gəlinməsi üçün Ümumi Qərargahın tərkibində olan Ləvazimat şöbəsi 1919-cu ilin əvvəllərində Ləvazimat İdarəsinə çevrilərək birbaşa hərbi nazirin tabeçiliyinə keçmişdi (121, v.43).

1919-cu il yanvarın 10-da Hərbi Nazirlikdə Müvəqqəti Hərbi Şura yaradıldı. Hərbi Şuranın Əsasnaməsi və daimi tərkibi təsdiq edilənə kimi Müvəqqəti Hərbi Şura hərbi qanunvericilik və hərbi idarəetmə sahəsində mühüm məsələlərin müzakirə edilməsi və müvafiq qərar qəbul edilməsi ilə məşğul olmalı idi. Onun tərkibinə piyada və süvari diviziyalarının rəisləri, Ümumi qərargahın rəisi, Topçu, Ləvazimat və İstehkam idarələrinin rəisləri, general-kvartirmeyster, növbətçi general və tapşırıq generalı daxil idi.



Hərbi Şuranın iclasları hərbi nazirin, ya da onun müavininin sədrliyi altında keçməli idi. Hərbi xəstə xidmətinin, Hərbi baytar müdiriyyətinin və Hərbi məhkəmə xidmətinin rəisləri onların xidmətlərinə aid olan məsələlərin müzakirəsi zamanı müvəqqəti Hərbi Şuranın iclaslarına də"vət edilə bilərdi (135, v. 19).

Müəyyən dəyişikliklər aparıldıqdan sonra 1919-cu il martın birinci yarısında Hərbi Nazirliyin aparatının strukturu aşağıdakı şəkildə idi (121, v. 43):




Nazirliyin ilkin təşkilində Ümumi qərargahın tərkibinə daxil olan bir sıra xidmətlərin fəaliyyət sahələri genişləndiyi üçün onların strukturu da təkmilləşdirilmiş və müstəqil struktur kimi birbaşa nazirə tabe edilmişdi.

1919-cu ilin mart ayının birinci yarısına kimi Azərbaycan Ordusunun hansı idarəetmə orqanlarının, hərbi hissələrinin, idarə, müəssisə və təhsil ocaqlarının yaradıldığını, onların harada yerləşdiyini və mart ayının əvvəlində onlara kimlər tərəfindən rəhbərlik edildiyini aşağıdakı siyahıda görmək mümkündür (Siyahı ilə əlaqədar bax: 121, v.43-44).

| № | İdarə, hissə və təşkilatın adı | Rəhbər şəxs | Yerləşdiyi ərazi |
|---|---|---|---|
| 1. | Ümumi qərargah | general-mayor Həbib bəy Səlimov | Gəncə |
| | a) general-kvartirmeysterin idarəsi | vəzifəni müvəqqəti icra edən polkovnik Vasili Nikolayeviç Sokolov | Gəncə |
| | b) növbətçi generalın idarəsi | vəzifəni müvəqqəti icra edən polkovnik Həmid bəy Qaytabaşı | Gəncə |

| | | | |
|---|---|---|---|
| | v) Hərbi Nazirliyin Dəftərxanası | polkovnik İvan Aleksandroviç Mixaylov | Gəncə |
| | q) komendant | polkovnik Sergey İliç İvanov | Gəncə |
| | d) nəşriyyat | polkovnik Georgi İvanoviç Lısyakov | Gəncə |
| | e) Hərbi topoqrafiya şö'bəsi | vəzifəni müvəqqəti icra edən kapitan Aleksandr Fyodoroviç Ledomski | Gəncə |
| 2 | Topçu İdarəsi | general-mayor Murad Gəray Tlexas | Gəncə |
| 3 | İstehkam İdarəsi | polkovnik Nikolay Dmitriyeviç Savkin | Gəncə |
| 4 | Ləvazimat İdarəsi | polkovnik Yevgeni Vasilyeviç Serebrennikov | Gəncə |
| 5 | Hərbi xəstə hissəsi | Qriqori Dmitriyeviç Qabayev | Gəncə |
| 6 | Hərbi baytar müdiriyyəti | Mixail Qavriloviç Yermonski | Gəncə |
| 7 | Hərbi ədliyyə hissəsi | podpolkovnik Vladimir Viktoroviç Samborski | Gəncə |
| 8 | Azərbaycan hərbi məhkəməsi | general-mayor Vasili İvanoviç Dubrovski | Gəncə |
| 9 | Azərbaycan Ordu livası riyasəti | polkovnik Aleksandr İvanoviç Klimentyev | Gəncə |
| 10 | Hərbi daşınmalar idarəsi | polkovnik Konstantin Pavloviç Mixaylovski | Gəncə |
| 11 | Praporşiklər məktəbi | polkovnik Şirin bəy Kəsəmənski | Gəncə |
| 12 | İstehkam məktəbi | polkovnik Boris Konstantinoviç Bekov | Gəncə |
| 13 | Komendatura | podpolkovnik David Konstantinoviç Abatsiyev | Gəncə |
| 14 | Gəncə əsgər xəstəxanası | Yermolayev | Gəncə |
| 15 | Topçu cəbbəxanaları | kapitan İlyas bəy Ququşov | Kürdəmir |
| | | podpolkovnik Mehdi bəy Sultanov | Ləki |
| 16 | Zirehli qatar | ştabs-rotmistr Əli bəy Əliyev | Gəncə |
| 17 | 1-ci diviziyanın (firqənin) qərargahı | polkovnik Cavad bəy Şıxlinski | Xankəndi |
| 18 | 1-ci Cavanşir piyada alayı | polkovnik Nuh bəy Sofiyev | I tabor-Şuşa, II,III taborlar Xankəndi |
| 19 | 2-ci Bakı piyada alayı | polkovnik Məmməd bəy Məmmədov | Qusar |
| 20 | 3-cü Gəncə piyada alayı | polkovnik Seyfulla Mirzə Şahzadə Qacar | I tabor-Qazax, II, III taborlar Gəncə |
| 21 | Süvari diviziya qərargahı | general-mayor Şahzadə Feyzulla Mirzə Qacar | Gəncə |
| 22 | 1-ci Tatar süvari alayı | polkovnik Fəhrab bəy Ağalarov | Gəncə |
| 23 | 2-ci Qarabağ süvari alayı | polkovnik Davud bəy Yadigarov | Xankəndi |
| 24 | 1-ci topçu briqadası | polkovnik Məmməd Mirzə Qacar | Gəncə |
| 25 | 1-ci yüngül topçu divizionu | polkovnik Vladimir Samsonoviç Xarkeviç | Gəncə |
| 26 | 2-ci dağ topçu divizionu | podpolkovnik Nikolay İosifoviç Novruzov | Xankəndi |
| 27 | Əlahiddə Zaqatala taboru | podpolkovnik Əhməd bəy Dibirov | Zaqatala |
| 28 | Əlahiddə Nuxa bölüyü | ştabs-rotmistr Abakarilov | Nuxa |
| 29 | Nazirlər Şurası nəzdində mühafizə bölüyü | ştabs-rotmistr Ehsan xan Naxçıvanski | Bakı |

Bunlardan başqa Gəncədə, Bakıda, Qubada, Nuxada, Salyanda, Göyçayda, Şuşada hərbi rəislərin idarələri yaradılmış, Gəncə stansiyasında, Poylu stansiyasında, Yevlax stansiyasında və Hacıqabul stansiyasında hərbi komendantlar tə'yin edilmişdi. Şəhərlərdə yaradılmış olan hərbi rəislərin idarələrinin fəaliyyətini bütünlükdə səfərbərlik işinə rəhbərlik edən Azərbaycan Ordu livası rəyasəti nizamlayırdı.

1919-cu ilin martında Azərbaycan Ordusunun idarəetmə orqanlarında mühüm bir keyfiyyət dəyişikliyi meydana gəldi. Hərbi nazirin əmri ilə mart ayının 26-da Ərkani-hərb (Генеральный штаб) tə'sis edildi və onun təsdiq edilməsi barədə vəsatət qaldırıldı. Bununla bağlı hərbi nazir S.Mehmandarovun imzaladığı məktubda göstərilirdi ki, qoşun hissələrinin tə'lim-tərbiyəsi, ordunun müharibəyə hazırlaşdırılması ilə gündəlik cari məsələlərin, təsərrüfat problemlərinin bir orqanda - Ümumi qərargahda birləşdirilməsi gözlənilən nəticəni vermir. Ordu böyüdükcə onun təsərrüfat məsələləri, təchizat və tə'minat qayğıları da artır. Onların həlli xeyli vaxt apardığından ordunun təşkili, döyüş hazırlığının lazımi səviyyədə aparılması üçün kifayət qədər vaxt ayırmaq imkanı olmur. Belə bir boşluğun aradan qaldırılması üçün Ərkani-hərbin tə'sis edilməsi hərbi nazir tərəfindən məqsədəuyğun sayılırdı. Onun fikrincə, belə bir strukturun indiyə kimi yaradılmamasına səbəb müvafiq hazırlıqlı kadrın olmaması idi.

S.Mehmandarov məktubunda əlavə edirdi ki, general-leytenant, təcrübəli hərbçi, üç müharibə iştirakçısı Məmməd bəy Sulkeviçin Azərbaycana gəlişi ilə belə bir strukturun yaradılmasına imkan yaranmışdır. Yaxın gələcəkdə Krımdan daha bir çox savadlı və təcrübəli zabitlərin Azərbaycana gəlməsi bu strukturun işini yüksək səviyyədə qurmağa imkan verərdi. Nazirin mülahizələrinə görə, bu struktur səfərbərliyin e'lan edildiyi vaxt dərhal Ümumordu qərargahına çevrilərək döyüş şəraitində qoşunların idarə edilməsini öz üzərinə götürə bilərdi. Ümumi qərargah isə öz yerində qalıb arxa xidmətinin təşkili, təchizat və tə'minat məsələlərinin həlli ilə məşğul olmalı idi.

Hərbi nazir onu da bildirirdi ki, Ərkani-hərblə Ümumi qərargah biri digərindən üstün olan struktur deyillər və səlahiyyətlərinə görə onlar bir-birinə bərabərdirlər. Səlahiyyət dairələrinin düzgün bölüşdürülməsi isə onlara biri digərinə mane olmadan səmərəli fəaliyyət göstərməyə zəmin yaradacaqdır.

Nazirlər Şurasına göndərdiyi məktubunda S.Mehmandarov Ərkani-hərbin nəzərdə tutulan strukturu barədə də mə'lumat verirdi. Onun tərkibi iki şö'bədən ibarət olmalı idi. General-kvartirmeyster şö'bəsi müharibəyə hazırlıq planlarının işlənməsi, toplanış məntəqəsinin seçilməsi, onların hər cəhətdən hazırlanması və səfərbərlik planının tərtib edilməsi ilə məşğul olan əməliyyat-səfərbərlik bölməsindən, xaricdəki kəşfiyyat agenturası vasitəsilə ehtimal olunan düşmən haqqında mə'lumat toplamaq, ölkə daxilindəki casuslarla mübarizə aparmaq işi ilə məşğul olan kəşfiyyat bölməsindən və ordunun təşkili, yerləşməsi və qoşunların tə'lim-tərbiyəsini işləyib hazırlayan nizami bölmədən ibarət olmalı idi. Ərkani-hərbin tərkibinə daxil olan hərbi topoqrafiya şö'bəsi isə qoşunları və qərargahları hərbi xəritələrlə tə'min etməli, yeni planların çəkilişi və yeni xəritələrin tərtibi ilə məşğul olmalı idi.

Hərbi daşımalar idarəsinin də Ərkani-hərbin tərkibinə keçirilməsi nəzərdə tutulmuşdu. Bu şö'bə dəmir yollarını və digər yolları hərbi məqsədlər üçün hazırlamalı və arxada cəbhənin bütün zəruri ləvazimatla təchiz edilməsini və daşınmasını tə'min etməli idi (bax:102, v.3).

General-leytenant M.Sulkeviç hərbi nazirin adına yazdığı arayışda göstərirdi ki, belə bir struktur hazırda həm Rusiya ordusunda, həm də bir sıra Avropa ölkələrinin ordularında mövcuddur və həmin strukturlar ordunun müharibəyə hazırlaşması işini lazımınca həyata keçirirlər (102, v.5).

Hərbi nazirin 28 mart 1919-cu il tarixli 157 saylı əmri ilə Ərkani-hərb martın 26-dan yaradılmış hesab edilirdi (89, v.12). Başqa bir əmrlə isə M.Sulkeviç martın 19-dan Ərkani-hərb rəisi vəzifəsinin icrasına başlamış hesab edilir və general-kvartirmeyster şö'bəsi, hərbi topoqrafiya şö'bəsi, rabitə xidməti Ümumi qərargahın tərkibindən alınıb Ərkani-hərbə verilirdi. Hərbi Daşınmalar idarəsi də Ərkani-hərbə tabe etdirilirdi (88, v.31).

Martın 31-də Hərbi Nazirliyin rəhbərliyi Nazirlər Şurası qarşısında Ümumi qərargahın növbətçi-generalının şö'bəsinin, Ərkani-hərbin general-kvartirmeyster şö'bəsinin, habelə Hərbi topoqrafiya şö'bəsinin ştatlarının artırılması barədə vəsatət qaldırdı. Həmin ştatların artırılması gənc Azərbaycan Ordusunda quruculuq işlərinin genişlənməsi, hissələrin sayının artması və bununla bağlı adları çəkilən şö'bələrin üzərinə düşən vəzifələrin həcminin artması ilə əlaqələndirilirdi. Görüləcək işlərin həcmi bir neçə dəfə artsa da onu icra edəcək şəxslərin sayının artmaması quruculuq işinin sür'ətinə və keyfiyyətinə əks - tə'sir göstərirdi. Hərbi Nazirliyin qaldırdığı məsələnin düzgünlüyü və doğruluğu qəbul edildiyindən bir müddətdən sonra adları çəkilən şö'bələrin ştatları genişləndirildi (103, v.303).

General-leytenant M.Sulkeviç Ərkani-hərbin rəisi tə'yin edildikdən sonra ordu hissələrinin formalaşması daha ahəngdar xarakter aldı. 2-ci Bakı piyada alayının formalaşdırılması sür'ətləndirildi (143, v.4), 3-cü Şəki süvari alayının təşkili tezliklə başa çatdırıldı. Praporşiklər məktəbinin rəisi, podpolkovnik Kəsəmənski 2-ci Bakı piyada alayının, podpolkovnik Xosrov Mirzə Qacar isə 3-cü Şəki süvari alayının komandiri tə'yin olundular və 1919-cu il aprel ayının əvvəllərində bu zabitlərin hər ikisi polkovnik rütbəsinə layiq görüldülər (152, v.186,221). M.Sulkeviç hissə komandirlərindən dönə-dönə tələb edirdi ki, onlar hər cür siyasətbazlıqdan uzaq olsunlar, yalnız vəzifə borclarının icrası, həvalə olunan hərbi hissələrin formalaşdırılması ilə məşğul olsunlar və onlara birbaşa aidiyyəti olmayan məsələlər barədə Nazirliyin rəhbərliyi qarşısında heç bir məsələ qaldırmasınlar (144, v.49).




**1919-cu il mart ayının 2-ci yarısında**
**Hərbi Nazirliyin aparatının strukturu**

Belə tövsiyələr bir çox komandirlər tərəfindən işgüzarcasına qarşılanır və onlara tapşırılan vəzifənin icrasına daha məs'uliyyətlə yanaşırdılar. Sədaqət və vicdanla görülən iş isə Hərbi Nazirliyin rəhbərliyinin diqqətindən kənarda qalmırdı.

1919-cu il aprelin əvvəlində hərbi nazirin müavini general-leytenant Ə.Şıxlinski Əlahiddə Zaqatala taborunda xidmətin təşkili ilə tanış oldu və orada gördüklərindən böyük qürur hissi keçirdi. Hərbi nazir S.Mehmandarovun adına yazdığı raportda Ə.Şıxlinski obyektiv çətinliklərin mövcudluğu şəraitində Zaqatala taborunda xidmətin çox böyük məs'uliyyət və vətəndaşlıq hissləri ilə təşkil olunduğunu qeyd edir, görülən işlərin mahiyyəti və məzmunu barədə nazirə mə'lumat verirdi. Rastlaşdığı bir sıra nöqsanlara toxunmaqla bərabər Ə.Şıxlinski yazırdı ki, gördüklərim tabor komandiri podpolkovnik Dibirovun və onun gənc silahdaşlarının sonsuz sə'ylərinin və işə vicdanlı münasibətinin nəticəsidir. Nazir müavini onu da əlavə edirdi ki, indiki zamanın ağır şəraitinə baxmayaraq taborda mümkün olan hər şey edilmişdir (89, v.63).

Ə.Şıxlinskinin hesabatı ilə tanış olduqdan sonra S.Mehmandarov dərhal teleqrafla tabor komandiri Dibirova öz minnətdarlığını və təşəkkürünü çatdırdı. Bu yoxlamanın nəticələri ilə bağlı imzaladığı əmrində nazir gös-



tərirdi ki, zabitlərin çoxunun qeyri-peşəkar olmasına baxmayaraq digər hissələrlə müqayisədə Zaqatala taboru daha yaxşı vəziyyətdədir. Bunu nazir tabor komandiri Ə.Dibirovun vicdanlı xidməti ilə, onun öz zabitlərinə qarşı atalıq qayğısı göstərməsi, düzgün tə'sir edə bilməsi, gənc zabitlərin öz bacarıqlarını əsirgəməməsi və komandirin tapşırıqlarına diqqətlə yanaşması ilə əlaqələndirirdi (89, v.78).

Hərbi nazir Zaqatala taborunun komandirinin xidmətlərini sadəcə qeyd etməklə kifayətlənmədi və yoxlamanın nəticələri barədə mə'lumat alan kimi dərhal onu polkovnik rütbəsinə təqdim etdi. Aprelin əvvəllərində Dibirov Nazirlər Şurasının qərarı ilə polkovnik rütbəsinə layiq görüldü (89, v.83).

Ancaq qoşun hissələrinin heç də hamısında vəziyyət belə deyildi və yoxlamalardan sonra ortaya çıxan laqeydlik hallarına, habelə nöqsanlara qarşı hərbi nazir S.Mehmandarov barışmaz mövqe tuturdu. Zaqatala taborunun yoxlanmasından az sonra onun göstərişi ilə tapşırıq generalı, general-mayor Usubov Qusara yollanmış və 2-ci Bakı piyada alayının vəziyyəti ilə tanış olmuşdu. Hacıqabulda formalaşdırılan bu alay bir müddətdən sonra Qusara köçürülmüşdü. Alayın komandiri polkovnik M.Məmmədov vaxtaşırı Hərbi Nazirliyə göndərdiyi raportlarda tə'lim-tərbiyə prosesinin, dərslərin mütəmadi olaraq aparılmasından, qarşıya qoyulan vəzifələri sə'ylə yerinə yetirməyə çalışmaları haqqında yazmasından S.Mehmandarov belə bir qənaətə gəlmişdi ki, bu hissə tam döyüş hazırlığı vəziyyətindədir. Bakıda qoşun hissələri yerləşdirilməsi məsələsi ortaya çıxanda bu alayın bir taborunun şəhərə gətirilməsi qərara alındı. Hərbi nazir 700 nəfərlik bir taborun göndərilməsi barədə polkovnik M.Məmmədova əmr verdi. Həmin taborun hazırlanması üçün general Usubov da Qusara göndərildi. Onun Qusara gəlməsindən sonra aydın oldu ki, vəziyyət heç də raportlarda göstərilən şəkildə deyilmiş. Alayın şəxsi hey'əti tam deyil. Hər taborda yaxşı halda 350 nəfər adam vardı. Alayın sanitar vəziyyəti, tə'minat səviyyəsi acınacaqlı səviyyədə idi. Xüsusən iaşə və ərzaq təchizatı ən aşağı me'yarlara belə cavab vermirdi. S.Mehmandarov çox böyük təşvişlə qeyd edirdi ki, alayın rəhbərliyinin günahı üzündən şəxsi hey'ət türklərin vaxtında olduğu kimi ancaq un şorbası,çörək yerinə isə xəmir kütü yeyirlər. Nəticədə həm fərarilik, həm də xəstəlik geniş miqyas almışdı. Dərhal tə'yin edilən yoxlama komissiyasının Qusara gəlməsi ilə müəyyən şeylərin üstünün açılacağından qorxan alay xəzinadarı praporşik (mülazim) Məmmədov odlu silahla özünü öldürmüşdü.

Həm alay komandiri polkovnik M.Məmmədovun,həm də onun müavini polkovnik Kançelinin xidməti vəzifələrinin icrasında göstərdikləri məs'uliyyətsizliyə və laqeydliyə görə S.Mehmandarov onların hər ikisini Azərbaycan Ordusu sıralarından xaric etdi (152, v 207).

1-ci və 3-cü piyada alaylarında da dərhal xidmətin təşkili yoxlanıldı. S.Mehmandarov özü də şəxsən bu tanışlıq işində iştirak edirdi. Ancaq həmin alaylarda alınan təəssürat da hərbi naziri qane etmədi. Bunu o, aprelin 21-də imzaladığı 211 saylı əmrində də xüsusi qeyd edirdi. Nazir göstərirdi ki, ümumiyyətlə, hər üç piyada alayında xidmətin təşkili və qoşunların idarə edilməsi çox pis vəziyyətdədir. Vəziyyətin düzəldilməsi üçün S. Mehmandarov artıq bə'zi addımların atıldığını bildirirdi. Polkovnik Kosomonskinin 2-ci piyada alayına komandir tə'yin edilməsi də bu məqsəddən irəli gəlirdi. Elə ilk gündən xidmətin düzgün təşkili və nalayiq şəxslərin alaydan uzaqlaşdırılması üçün Kosomonskinin gördüyü işlər nazir tərəfindən razılıqla qarşılanırdı. S.Mehmandarov piyada alaylarında vəziyyətin yaxşılaşdırılması üçün piyada diviziyasına yenicə komandir tə'yin edilmiş polkovnik Şıxlinskiyə də böyük ümidlər bağlayırdı. Onun fikrincə, Şıxlinskinin savadı, təcrübəsi, insanlarla davranış tərzi və nəhayət, vətənpərvərliyi buna zəmindir (152, v.216).

1919-cu il aprelin əvvəllərində müttəfiq dövlətlərin hərbi komandanlığı Bakıda da Azərbaycan Ordusunun azsaylı qoşun kontingentinin yerləşdirilməsinə icazə verdi. Martın 31-də hərbi nazirin əmri ilə Bakı şəhərində yerləşəcək hissə və bölmələr dəqiqləşdirildi. Həmin qüvvələrə bir piyada taboru, 400 nəfərlik süvari və bir topçu batareyası daxil idi. Bütün bu qüvvələrə 1-ci Tatar süvari alayının komandiri polkovnik Ağalarov rəhbərlik edirdi. Polkovnik Ağalarova eyni zamanda Bakı qarnizonunun rəisi vəzifəsi həvalə olunmuşdu. Aprelin 5-də həmin qüvvələr Bakıya daxil oldu və Salyan kazarmalarında yerləşdirildi. Bakıya Azərbaycan qoşun hissələrinin daxil olması münasibətilə Hərbi nazir S.Mehmandarov da Bakıya gəlmişdi. Şəhər əhalisi Azərbaycan Ordusunun qoşun hissələrini çox böyük təntənə ilə qarşıladı. Çoxları inana bilmirdi ki, qısa müddət ərzində Azərbaycan özünün mübariz qoşun hissələrini formalaşdıra bilmişdir (152, v.164; 11. 5.05.1919)

Azərbaycan Ordusunun hissələrini qarşılayan şəhər camaatının izdihamlı mitinqi keçirildi. Həmin mitinqdə H.Z.Tağıyev çıxış edərək belə bir ordunun yaradılması münasibətilə S. Mehmandarovu təbrik etdi və öz sevincini bildirdi (77, v. 33).

Hərbi nazirin qərarı ilə 2-ci Bakı piyada alayının 2-ci taborunun bazasında yeni bir alayın yaradılmasına başlandı. Eyni zamanda Əlahiddə Zaqatala taborunun da alaya çevrilməsi üçün qərar qəbul edildi. Burada iş daha tez başa çatdırıldı. Taborun rəhbərliyinin sə'yləri tezliklə özünün müsbət nəticəsini verdi. Hərbi nazirin 1 iyun 1919-cu il tarixli 275 saylı əmri ilə Əlahiddə Zaqatala taboru 4-cü Zaqatala alayı adlandırıldı və 1-ci piyada diviziyasının tərkibinə daxil edildi. Polkovnik Ə.Dibirov alayın komandiri vəzifəsində saxlanıldı.






**4-cü Zaqatala alayının strukturu**

Bakıda yaradılmasına başlanılan alayın formalaşdırılması isə iyun ayının axırlarına başa çatdı. Hərbi nazirin 25 iyun 1919-cu il tarixli 311 saylı əmri ilə Bakıda yaradılan yeni alay 5-ci Bakı piyada alayı adlandırıldı. Əvvəlcə mövcud olan 2-ci Bakı alayının isə adı dəyişdirilib 2-ci Quba alayı adlandırıldı. Hərbi nazirin yanında tapşırıq üzrə ştabs-zabit, podpolkovnik İsrafilov yeni yaradılan 5-ci Bakı alayının komandiri tə'yin edildi və onun qarşısında alayın tam təşkilini tezliklə başa çatdırmaq vəzifəsi qoyuldu. Bu alayın qərargahı Bakıda yerləşməli idi (153, v.4-5).

Elə 1919-cu il iyunun 25-də Azərbaycan hökumətinin daha üç zabiti general-mayor rütbəsinə layiq görüldü. Həmin zabitlər Həmid bəy Qaytabaşı, Cavad bəy Şıxlinski və 1-ci topçu briqadasının komandiri Məmməd Mirzə Qacar idilər. Cavad bəy Şıxlinski 1-ci piyada diviziyasının komandiri kimi öz gərgin fəaliyyəti ilə Hərbi Nazirliyin rəhbərliyinin rəğbətini qazanmışdı. Elə general-mayor rütbəsi almaq ərəfəsində nazirliyin vəzifəli şəxsləri tərəfindən aparılan yoxlama tanışlıqdan sonra 1-ci piyada diviziyasının komandiri Cavad bəy Şıxlinskinin, o cümlədən 1-ci Cavanşir piyada alayının komandiri polkovnik Sofiyevin, 2-ci Qarabağ süvari alayının komandiri polkovnik Yadigarovun, 2-ci dağ-topçu divizionunun komandiri podpolkovnik Novruzovun xidmətləri bir daha təqdir olunmuş və onlara nazir tərəfindən təşəkkür e'lan edilmişdi (153, v.7,19).

Hərbi nazirin təşəkkürü ilə mükafatlandırılan polkovnik Yadigarov həmin günlərdə 1-ci süvari diviziyası komandirinin müavini tə'yin edildi. Süvari diviziyasının komandirliyinə isə Yadigarovun tə'yinatından təxminən bir neçə gün əvvəl 1-ci Tatar süvari alayının komandiri polkovnik Novruzov tə'yin edilmişdi. İki alay komandirinin yüksək vəzifəyə irəli çəkilməsi bir neçə hissədə komandir hey'ətinin yerdəyişməsi ilə nəticələndi. 1-ci Tatar süvari alayının komandiri vəzifəsinə 1-ci Cavanşir piyada alayının komandiri polkovnik Sofiyev tə'yin edildi. Cavanşir piyada alayının komandanlığı isə polkovnik Levestama tapşırıldı. Polkovnik Yadigarovun yerinə 2-ci Qarabağ süvari alayının komandiri polkovnik Tuqanov tə'yin edildi (153, v.47).

Bu tə'yinatların və yerdəyişmələrin aparılmasına müəyyən mə'nada həm də süvari diviziyasının komandiri vəzifəsinin icraçısı, diviziyanın qərargah rəisi general-mayor Amaşukelinin öz xahişinə görə xidmətdən getmək arzusu olmuşdu. 1919-cu ilin əvvəllərində Azərbaycan Ordusunda xidmətə başlayan general Amaşukeli bir neçə ay diviziyanın komandiri vəzifəsini icra etmiş, sədaqətli xidmətilə diviziyanın möhkəmlənməsinə xeyli kömək göstərmişdi. Onun xidmətdən azad edilməsi ilə bağlı əmrində S.Mehmandarov qeyd edirdi ki, general Amaşukeli işgüzarlığı, ardıcıllığı və məs'uliyyəti ilə fərqlənirdi. Buna görə də hərbi nazir Amaşukelidən ayrılmağına həm təəssüf edir, həm də faydalı xidmətlərinə görə ona öz təşəkkürünü bildirirdi (153,v.47).




**1919-cu ilin iyul ayında Azərbaycanın döyüş birləşmələri və hissələrinin strukturu**

1919-cu ilin iyun və iyul aylarında 4-cü Zaqatala piyada alayının və 5-ci Bakı alayının təşkilindən sonra qoşunların idarə edilməsində yeni strukturun, yə'ni 2-ci piyada diviziyasının təşkil edilməsi zərurəti yarandı. Bu barədə 1919-cu il iyulun 14-də hərbi nazir 328 saylı müvafiq əmrini imzaladı. Həmin əmrdə yaradılmış 5 piyada alayından iki piyada diviziyasının təşkil edilməsi məqsədəuyğun bilinirdi.




**1919-cu il iyul ayının birinci yarısında piyada diviziyalarının strukturu**

Hərbi nazirin 14 iyul 1919-cu il tarixli əmrinə əsasən Zaqatala və Quba alaylarının nömrələri dəyişdirildi. Zaqatala alayı 2-ci piyada alayı, Quba alayı isə 4-cü piyada alayı adlandırıldı. 1-ci piyada diviziyasının tərkibinə 1-ci Cavanşir piyada alayı, 2-ci Zaqatala piyada alayı və 3-cü Gəncə piyada alayı daxil edildi. 2-ci piyada diviziyasının tərkibinə isə 4-cü Quba və 5-ci Bakı piyada alayları daxil edildi. 1-ci piyada diviziyasının qərargahı Bakıda tə'sis edildi. 1-ci piyada diviziyasının komandiri general-mayor C.Şıxlinski idi. 2-ci piyada diviziyasının komandiri isə Hərbi Nazirliyin tapşırıq generalı, general-mayor Usubov tə'yin edildi (90, v.36).

Avqust ayında artıq 6-cı piyada alayının da təşkili başa çatdırılmışdı. Bu alay Göyçay alayı adlandırılıb 2-ci piyada diviziyasının tərkibinə daxil edilmişdi (153, v.66).

Piyada diviziyalarının hər birinin tərkibi üç alaydan ibarət nəzərdə tutulmuşdu. Alayların hər biri 3 minədək şəxsi hey'ətdən ibarət olmalı idi. Hər alay 3 tabordan, hər tabor isə dörd piyada bölüyündən və bir pulemyot bölüyündən təşkil edilməli idi. Hər pulemyot bölüyünün tərkibində 8 pulemyot var idi. Bundan başqa, alaylarda bir süvari kəşf bölüyü, bir piyada kəşf bölüyü, bir istehkam bölüyü, bir rabitə-telefon bölüyü və bir qeyri-nizami bölük var idi. Taborun şəxsi hey'ətinin sayı 1000 nəfər idi (262).




**Piyada alayının strukturu**

Süvari diviziyası da üç alaydan təşkil edilmişdi. Həm diviziya, həm də alayın qərargahının ştatında xeyli az adam var idi. Bu da həmin şəxslərdən daha çevik və səmərəli iş tələb edirdi. Süvari diviziyasının qərargahı diviziya komandirindən (rütbə kateqoriyası – general-leytenant və ya general-mayor), diviziya komandirinin müavinindən (general-mayor), qərargah rəisindən (polkovnik), baş yavərdən (podpolkovnik və ya rotmistr), ləvazimat zabitindən, süvari- istehkam xidmətinin rəisindən və mülki şəxs olan diviziya hakimindən ibarət idi (161,v.172).




**Süvari diviziyasının strukturu**

Süvari alayının qərargahı isə alay komandirindən (rütbə kateqoriyası–polkovnik), üç nəfər qərargah zabitindən (rütbə kateqoriyası–podpolkovnik, həmin zabitlərdən biri nizami xidmət üzrə, biri təsərrüfat hissəsi üzrə idi, biri isə kiçik qərargah zabiti idi), bölük komandirlərindən (rotmistr, ştabs-rotmistr, süvari bölüyü komandiri, bir pulemyot bölüyü komandiri), alay yavərindən (ştabs-rotmistr və ya rotmistr), alay yavərinin rabitə xidməti üzrə köməkçisindən, tə'lim komandasının rəisindən (ştabs-rotmistr və ya rotmistr), köməkçi və kiçik zabitlərdən ibarət idi. Bunlardan başqa alayın qərargahında mülki şəxslərdən ibarət bir həkim, bir baytar həkimi, təsərrüfat üzrə kargüzar, xəzinədar, kvartirmeyster, silah ustası və molla da var idi. Hər süvari bölüyü 288 süvaridən və 20 piyadadan ibarət idi. Pulemyot bölüyündə 48 adam, rabitə komandasında 40 adam var idi. Bütünlükdə süvari alayında 28 zabit, 7 nəfər mə'mur, 680 əsgər və 29 muzdlu sıravi var idi (161, v.174-175).

Piyada alaylarının say tərkibi hamısında eyni deyildi. Onların bə'zilərində çox cüz'i fərqlər mövcud idi. Məsələn, 1-ci Cavanşir alayının ştat tərkibi belə idi: qərargah zabiti – 6 nəfər, baş zabit – 55 nəfər, həkim – 4 nəfər, mə'murlar – 6 nəfər, molla – 1 nəfər, onbaşı – 18 nəfər, çavuş – 296 nəfər, sıravi – 2303 nəfər. Əlavə olaraq alayın qeyri-nizami komandasında 1 nəfər onbaşı, 49 nəfər çavuş və 146 nəfər sıravi var idi. Alayda 239 yük atı olmalı idi (115, v.120). 2-ci Zaqatala piyada alayının ştat tərkibi isə belə idi: qərargah zabiti – 6 nəfər, baş zabit – 55 nəfər, həkimlər – 4 nəfər, mə'murlar – 6 nəfər, molla 2 – nəfər, onbaşı – 18 nəfər, çavuş – 259 nəfər, sıravi – 2303 nəfər. Qeyri-nizami komandada isə 219 nəfər sıravi olmalı idi. Əlavə olaraq alayın ştatında 85 baş nizami at və 121 baş yük atı nəzərdə tutulmuşdu (115, v.140).

1919-cu ilin yayında və payızında Azərbaycan Ordusu hissələrinin formalaşdırılması böyük sür'ətlə davam etdirilirdi. Bu dövr qoşun hissələrinin yaradılmasında ən məhsuldar dövr sayıla bilər. Tarixi şərait, bir tərəfdən Denikin qoşunlarının hücum təhlükəsi, digər tərəfdən də millətçi-erməni qoşun dəstələrinin və könüllülərinin Zəngəzur və Qarabağda xeyli



fəallaşması Azərbaycandan öz ərazilərinin silahlı müdafiəsinə daim hazır olmağı tələb edirdi. Şimaldan gözlənilən Denikin təhlükəsinin qarşısını almaq üçün nazirin əmri ilə Xaçmaz dəstəsi yaradıldı. Onun tərkibinə Quba alayı, 3-cü Gəncə piyada alayının bir taboru, 1-ci Tatar süvari alayı, 1-ci topçu briqadasının 2-ci divizionu, İstehkam məktəbi və dəstənin qərargahı daxil idi (153, v.25). Bu dəstə 2-ci piyada diviziyasının təşkilindən azacıq əvvəl yaradılmış və general-mayor Usubov onun rəisi tə'yin edilmişdi (156, v.1). General-kvartirmeyster vəzifəsinin müvəqqəti icraçısı podpolkovnik Zeynalov isə dəstənin müvəqqəti qərargah rəisi tə'yin edilmişdi. Sonradan Zeynalov tamamilə bu ştat vəzifəsinə keçirildi (152, v.23). Yeri gəlmişkən qeyd etmək lazımdır ki, podpolkovnik Zeynalovdan sonra general-kvartirmeyster vəzifəsinə polkovnik Karqaleteli tə'yin edilmiş və o, müstəqil Azərbaycan Ordusunun mövcudluğunun son gününədək bu vəzifəni icra etmişdi.

General-mayor Usubovun 2-ci piyada diviziyasının komandiri tə'yin edilməsi ilə bağlı olaraq Xaçmaz dəstəsinin komandiri polkovnik Kosəmonski tə'yin edildi. Usubova göstəriş verildi ki, dəstəni polkovnik Kosəmonskiyə təhvil verib Bakıya qayıtsın və yeni vəzifənin icrasına başlasın. Xaçmaz dəstəsindəki 1-ci Tatar süvari alayından başqa digər hissələr polkovnik Kosəmonskinin əməliyyat rəhbərliyinə verildi (152, v.47).

Polkovnik Kosəmonski yeni vəzifənin icrasına bütün gücü ilə girişə bilməsi üçün Quba piyada alayının komandiri vəzifəsindən azad edildi və həmin vəzifənin icrası podpolkovnik Quqışova həvalə edildi. Nazirin müvafiq əmrində qeyd edilirdi ki, polkovnik Kosəmonski yeni vəzifənin icrası ilə bərabər Quba alayının təşkilinin başa çatdırılmasını da xüsusi nəzarət altında saxlamalıdır (152, v.27).

1919-cu ilin iyun ayının son günləri və iyulun əvvəllərində Hərbi Nazirliyin rəhbər orqanları Bakıya köçürüldü. Nazirin müvafiq əmri ilə idarə, şö'bə və xidmətlərin Bakıya köçürülməsi üçün iki eşelon ayrıldı. Birinci eşelonla iyunun 28-də Ləvazimat İdarəsi, İstehkam İdarəsi, Hərbi xəstə hissəsi, Hərbi baytar hissəsi və Azərbaycan Hərbi məhkəməsi yola düşməli və səhərisi gün onlar Bakıya çataraq əvvəlcədən müəyyənləşdirilmiş binalarda yerləşməli idilər. İyulun 1-də yola düşəcək ikinci eşelon isə Ümumi qərargahı, Ərkani-hərbi, Azərbaycan Ordu livası riyasətinin dəftərxanasını, nəşriyyatı və avtomobil hissəsini Bakıya köçürməli idi (94, v.60).

Hərbi Nazirliyin aparatı, Ümumi qərargah və Ərkani-hərb Bakıda Krasnovodsk və Merkuri küçələrinin (indiki S.Vurğun küçəsi və Azərbaycan prospektinin) kəsişməsində olan binada yerləşdirildi (167, v.20a).

1919-cu ilin iyul-avqust aylarında Əlahiddə qaubitsa batareyasının, Süvari-dağ batareyasının, 1-ci topçu briqadasının, 6-cı dağ batareyasının, 2-ci topçu briqadasının, 2-ci yüngül və 1-ci dağ batareyasının təşkili davam etdirilirdi (162, v.90).

Avqust ayında Lənkəranda anarxiya və özbaşınalıqları aradan qaldırmaq, orada Azərbaycan hökumətinin hakimiyyətini bərqərar etmək üçün xüsusi Lənkəran dəstəsi təşkil edildi (138, v.86). Bu dəstə ona verilən tapşırıqları icra edib başa çatdırdıqdan sonra elə avqust ayında Lənkəranda köməkçi (ehtiyat) piyada taborunun təşkil edilməsi qərara alındı. Kapitan Rəfibəyov bu taborun komandiri tə'yin edildi, tabor özü isə 2-ci piyada diviziyasının tərkibinə daxil edildi (152, v. 66).

1919-cu ilin avqust ayındı 6-cı Göyçay piyada alayının da təşkilinə başlandı. Bakının Bayıl hissəsində yerləşməli olan bu alayın komandiri vəzifəsinə polkovnik Əfəndiyev tə'yin edildi və alayın formalaşdırılması ona tapşırıldı (152, v. 66).

Şimaldan gözlənilən təhlükənin qarşısının alınmasına hazır olmaq üçün 1919-cu il iyul ayının 1-də Azərbaycan parlamenti xüsusi könüllü dəstələrin də yaradılması barədə qərar qəbul etdi. Bu dəstələrin təşkilində əsas məqsəd silah tutmağı bacaran əhalinin müharibəyə hazırlaşdırılması idi. (129, v.23). Bu dəstələr Bakının Sabunçu, Mərkəz, Balaxanı, Zabrat, Suraxanı, Hilə, Aşağı Bibiheybət, Yuxarı Bibiheybət, Qara şəhər, Ağ şəhər, Tağıyev fabriki, Binəqədi, Maştağa və Nardaran yaşayış məntəqələrini əhatə edirdi (279). Bir müddət sonra "Azərbaycan Respublikasının könüllü taboru haqqında" əsasnamə də təsdiq edildi. Həmin əsasnaməyə görə gönüllü tabor Azərbaycan Respublikası hökumətinin dövlət quruluşunu müdafiə etmək və bu işdə yardım göstərmək üçün Vətəninə xidmət etmək arzusunda olan respublika vətəndaşlarından könüllü şəkildə yarana bilərdi. Həmin tabor aşağıdakı kontingentdən komplektləşdirilirdi: a) 17 yaşından 50 yaşınadək fiziki cəhətdən sağlam, b) istintaqa cəlb edilməmiş və siyasi cəhətdən e'tibarlı, v) hərbi mükəlləfiyyəti keçmiş və keçməmiş olan vətəndaşlar bu tabora daxil ola bilərdi. Əsasnamədə o da göstərilirdi ki, könüllü tabor üzvləri xidmətin təşkili zamanı Azərbaycan Ordusunda qəbul olunmuş nizam və intizam tələblərinə riayət etməlidirlər (20, № 1, 1996, s. 92).

Hərbi hissələrin və obyektlərin Bakıda çoxalması, habelə Bakının ölkənin paytaxtı kimi yeri və əhəmiyyəti nəzərə alınaraq 1919-cu il avqust ayının əvvəlində burada komendatura tə'sis edildi. Təsdiq edilmiş müvəqqəti ştata görə komendaturanın tərkibində Bakı şəhər komendantı (rütbə kateqoriyası general-leytenant və ya general-mayor), komendantın müavini (polkovnik), baş yavər (kapitan), kiçik yavər(baş zabit), qauptvaxtda xidmət etmək üçün beş əsgər, bir neçə kargüzar və zabit olmalı idi (152, v.54). Bu xidmətin dərhal və keyfiyyətlə təşkili üçün ehtiyatda olan general-mayor Firudin bəy Vəzirov həqiqi hərbi xidmətə qəbul edildi və Bakı şəhərinin komendantı tə'yin edildi. Bakı şəhər qarnizonunun rəisi vəzifəsinin müvəqqəti icrası da ona həvalə olundu. Ona qədər şəhər komendantı



olmuş polkovnik Vəzirov səlahiyyətləri genişləndirilmiş olan yeni Bakı şəhər komendantının müavini vəzifəsində saxlanıldı (153, v.50).

Bir neçə gündən sonra, yə'ni avqust ayının 16-da qərargahı Bakıda yerləşən 2-ci piyada diviziyasının komandiri Usubov Bakı qarnizonunun rəisi tə'yin edildi və general F.Vəzirov bu vəzifədən azad edilərək ona yalnız Bakıda komendant xidmətinin təşkili tapşırıldı (153, v.55).

16 avqust 1919-cu il tarixli 359 saylı əmrində hərbi nazir general Usubovun Bakı şəhər qarnizonunun rəisi tə'yin edilməsini bildirməklə həm də İstehkam İdarəsinin rəisi polkovnik Savkinin öz xahişi əsasında xidmətdən azad olduğunu e'lan edərək vicdanlı işinə görə ona minnətdarlıq və təşəkkürünü çatdırırdı.

Təxminən iki həftəlik bir müddətdə şimal sərhəddində və Bakı ətrafında istehkam işlərinin genişlənməsi ilə fəaliyyəti xüsusi əhəmiyyət kəsb edən İstehkam İdarəsinə mülki mühəndis Zübair bəy Temirxanov rəhbərlik etdi, avqustun axırında isə bu vəzifəyə general-leytenant Tarxanov tə'yin edildi. Azərbaycan Ordusunda xidmətə qəbul edilən bu təcrübəli general avqustun 25-dən İstehkam İdarəsinin rəisi vəzifəsinin icrasına başladı (153, v.61, 75).

Qusar ətrafında olan 1-ci Tatar süvari alayının komandiri polkovnik Sofiyevə Qusar qarnizonunun rəisi vəzifəsi, polkovnik Ağalarova isə Bakı hərbi limanının komendantı vəzifəsi həvalə olundu (153, v.66,71).

Ölkənin müdafiəsinin gücləndirilməsi ilə bağlı genişlənən hər cür mühəndis-istehkam işlərinə ümumi rəhbərlik general-kvartirmeystr polkovnik Karqaleteliyə tapşırıldı (153, v.59).

1919-cu ilin avqustunda Hərbi Nazirliyin idarəetmə orqanlarının strukturlarında da bir sıra dəyişikliklər edildi. 2-ci zirehli qatarın təşkili başa çatdırıldıqdan sonra həm 1-ci, həm də 2-ci zirehli qatarlar Ümumi qərargahın tabeçiliyindən çıxarıldı və onlar Ərkani-hərbin General-kvartimeyster şö'bəsinə tabe etdirildi. Həmin qatarlar müəyyən vəzifənin icrası üçün bu və ya digər dəstənin tərkibinə verildikdə əməliyyat baxımından onlar bu dəstənin komandanlığına tabe olmalı idilər (152, v.59).

Ümumi qərargahın tərkibinə daxil olan bə'zi digər strukturların da tabeçilik əlaqələrində müəyyən dəyişikliklər edildi. Hərbi nazirin 17 avqust 1919-cu il tarixli 368 saylı əmrinə əsasən Hərbi Nazirliyin Dəftərxanası, Praporşiklər məktəbi, Avtomobil hissəsi, o cümlədən artıq yuxarıda xatırlanan zirehli qatarlar Ümumi qərargahın tabeçiliyindən çıxarıldı. Nazirliyin Dəftərxanası birbaşa nazirin özünə, Praporşiklər məktəbi ilə zirehli qatarlar Ərkani-hərb rəisinə, Avtomobil hissəsi isə İstehkam İdarəsinin rəisinə tabe etdirildi. Bu dəyişiklikdən sonra Ümumi qərargahın tərkibində Növbətçi generalın idarəsi və Azərbaycan Ordu livası rəyasəti qaldı (90, v.85).

1919-cu ilin yayında ali hərbi və hərbi-siyasi orqanların təkmilləşdirilməsi və onların fəaliyyətinin dövrü, tələbləri səviyyəsində qurulması üçün bə'zı qərarlar qəbul edildi. Hərbi sahədə dövlət əhəmiyyətli qərarların çevik şəkildə qəbul edilməsinə nail olmaq və bu istiqamətdə görülən işləri mərkəzləşdirmək üçün hökumətin qərarı ilə 1919-cu il iyunun 9-da dövlətin müdafiəsinin təşkili sahəsində xüsusı orqan olan Dövlət Müdafiə Komitəsi yaradıldı. Tutduğu vəzifəyə görə bu orqanın tərkibinə beş nəfər daxil edilmişdi: Nazirlər Şurasının sədri, hərbi nazir, xarıci işlər naziri, ədliyyə naziri və yollar naziri. Dövlət Müdafiə Komitəsinin iclaslarının keçirilməsi üçün xüsusi ardıcıllıq müəyyən edilməmişdi. Zərurət yarandıqca bu orqan iclasa yığışıb ortaya çıxan sual və məsələləri həll etməli və qəbul edilən qərarların icrasını təşkil etməli idi. Dövlət Müdafiə Komitəsinin iclası onun üzvlərindən üç nəfərinin iştirak etdiyi təqdirdə səlahiyyətli idi. Iclasa Nazirlər Şurasının sədri rəhbərlik edirdi. İclasın işində iştirak edə bilmədiyi təqdirdə o, müzakirələrə sədrlik etməyi komitənin istənilən üzvündən birinə tapşıra bilərdi (105, v.32).

Hərbı Nazirlıyin rəhbərliyi Hərbi Şuranın fəaliyyətinin təkmilləşdirilməsi ilə bağlı da bir sıra təkliflər irəli sürdü. Hələ 1919-cu ilin mart ayında Hərbı nazirin müavini hərbi Şuranın fəaliyyətini təhlil edərkən bir sıra təkliflərin həyata keçirilməsini vacib bilmişdi. Onun fikrinə görə, Hərbi Şuraya daxil olan vəzifəli şəxslər həddən artıq gərgin işləyirlər və bunun üçün də müstəqil vəzifələrinin icrası onlardan çox vaxt tələb edirdi. Nəticədə onlar Hərbi Şuranın işinə kifayət qədər vaxt ayıra bilmirdilər. Digər tərəfdən də bu və ya digər vəzifəli şəxsin xidmət sahəsinə yaxın olan məsələlərin müzakirəsi zamanı onlar özləri və rəhbərlik etdikləri xidmət sahələri üçün daha maraqlı olan mövqedə dayanırdılar. Ona görə də Ə.Şıxlınski hərbi nazirdən xahiş edirdi ki, bir sıra təkliflərin həyata keçirilməsi üçün Nazirlər Şurası qarşısında vəsatət qaldırsın. Həmin təkliflərin mahiyyəti bundan ibarət idi ki. Hərbi Şura Ali Hərbi orqan kimi heç bır digər vəzifəsi olmayan təcrübəli hərbçilərdən təşkil edilsin. Bu hərbçilər Hərbi Şuranın üzvü kimi yalnız Hərbi Şuranın fəaliyyətinin təşkili ilə məşğul olmalı və kənar heç bir işə cəlb edilməməlidirlər. Belə olduqda Hərbi Şura daha səmərəli fəaliyyət göstərər və müzakirə edilən məsələlər barədə heç kəs maraqlı mövqe tutmazdı. Hərbi Nazirlıyin yüksək vəzifəli şəxslərini isə Ə.Şıxlinski Hərbi Şuranın iclasına məşvərətçi səslə də'vət etməyi məqsədəuyğun bilirdi. General Ə.Şıxlinski Hərbi Şuranın daimi ştatlı üzvlərinin 4 il müddətinə tə'yin edilməsi təklıfini irəli sürürdü. Onun fikrincə, həmin müddət qurtarandan sonra kimlərin vaxtının uzadılması barədə hərbi nazir özü hökumət qarşısında vəsatət qaldırmalı idi (97, v.158).

1919-cu ilin avqustun 18-də Ə.Şıxlinski Hərbı Şuranın fəaliyyəti ilə bağlı hərbi nazirə yeni bir mə'ruzə hazırladı. General Ə.Şıxlinskı həmin mə'ruzədə də hərbi Şuranın fəaliyyətinin heç də günün tələbləri səviyyəsində qurulmadığını bildirirdi. Onun fikrincə, hərbi qanunvericiliyin təkmilləşdirilməsi və hərbi təsərrüfatın idarə edilməsi, habelə hərbi xidmətin təşkili sahəsində zəruri qərarların qəbul edilməsi ilə bağlı məsələlər Hərbi Şurada müzakirə edilsə də bu xarakterli məsələlərin böyük bir hissəsi şəxsən nazirin özü qarşısında qaldırılır və bununla da onun əlavə yüklənməsinə yol açırdı. Halbuki, Ə.Şıxlinskiyə görə Hərbi Şuranın işi yaxşı qurulduğu təqdirdə bu məsələlər orada müzakirə olunar və səlahiyyətli qərarlar qəbul edilə bilərdi. Nəticədə, hərbi nazir də bə'zən ona aid olmayan məsələlərin həllinə xeyli vaxt ayırmazdı (97, v.160).

Ə.Şıxlinski mövcud olan nöqsanları aradan qaldırmaq üçün Hərbi Şuranın fəaliyyətinə diqqətin artırılmasını, bu strukturun çevik və işlək bir orqana çevrilməsini zəruri bilirdi. Bunun üçün o, maliyyə və təsərrüfat məsələləri ilə bağlı olan məsələlərin müzakirə edilməsində daha doğru qərarların qəbul edilməsi ilə bağlı müvafiq mülki nazirliklərin nümayəndələrinin də Hərbi Şuranın tərkibinə daxil edilməsini təklif edirdi (97, v.160).

Hərbi Şuranın fəaliyyətinin təkmilləşdirilməsi ilə bağlı hərbi nazir S.Mehmandarov da raportla Nazirlər Şurasının sədrinə müraciət etdi. O bildirirdi ki, öz daxili rejimi olan, xüsusi fəaliyyətində ayrıca hərbı qanunvericiliyə dayaqlanan ordu müstəqil və bütöv bir orqanizmdir. Ordu eyni zamanda dövlətin büdcəsinin ən böyük məsrəfçisidir. Ona görə də istər xüsusi qanunvericilik bazasının təkmilləşdirilməsi, istərsə də külli maliyyə məsrəflərini tələb edən təsərrüfat həyatının düzgün qurulması səlahiyyətli orqanın mövcudluğunu tələb edir ki, Hərbi Şura belə bir orqan olmalıdır. Nazir mə'lumat verirdi ki, Rusiya ordusunun Hərbi Şurası hərbi xidmətin müxtəlif sahələrində uzun illik təcrübəsi olan şəxslərdən təşkil edilir və onlar bu vaxt başqa vəzifələrdən azad edilirdilər (101a, v.38).

Hərbi Şuranın bu cür təşkilinin onun fəaliyyətinin səmərəliliyini xeyli artırdığını e'tiraf etməklə bərabər, hərbi nazir S.Mehmandarov həmin variantın Azərbaycanda tətbiqinin qeyri-mümkün olduğunu da inkar etmirdi. Onun fikrincə, bir tərəfdən Azərbaycanda təcrübəli zabitlər çox az idi və onlar da ordunun bu və ya digər sahəsində çox məs'uliyyətli və lazımlı vəzifələr tutmuşdular, o biri tərəfdən də bir neçə yüksək rütbəli zabitin ştatla Hərbi Şuraya təsdiq edilməsi əlavə maliyyə xərcləri tələb edirdi. Ona görə də nazir Hərbi Şuranın fəaliyyətinin ictimai əsaslarla qurulmasını məqsədəuyğun bilirdi. Ancaq S.Mehmandarov Nazirlər Şurasından xahiş edirdi ki, bu orqanın işinin təşkili üçün lazımi vəzifəli şəxslərin tə'yin edilməsi barədə ona səlahiyyət verilsin. Hərbi nazir həmçinin maliyyə və təsərrüfat məsələlərinin müzakirəsi zamanı müvafiq nazirliklərin nümayəndələrinin də Hərbi Şuranın işinə cəlb edilməsinə razılıq verilməsini xahiş edirdi (101a, v.38).

Yeni təkliflərlə bağlı Hərbi Şuranın yeni Əsasnaməsinin layihəsi hazırlandı və təsdiq üçün Nazirlər Şurasına göndərildi. Bu layihəyə görə şuranın tərkibi sədr və üzvlərdən ibarət idi. Adətən şuranın iclaslarına nazir müavini sədrlik edir, xüsusi hallarda isə hərbi nazir özü şuranın iclasına sədrlik edirdi. Şuranın üzvlüyünə aşağıdakı şəxslər təklif olunurdular: Ümumi qərargahın rəisi, Ərkani-hərbin rəisi, Bakıda yerləşən piyada və süvari diviziyaların komandirləri, Topçu İdarəsinin rəisi, İstehkam və Ləvazimat idarələrinin rəisləri. Hərbi ədliyyə, Hərbi xəstə və Hərbi baytar hissələrinin rəisləri onların xidmət sahəsinə aid olan məsələlər müzakirə edildikdə həlledici səslə Şuranın iclasında iştirak edə bilərdilər. Maliyyə məsələlərinin müzakirəsində Dövlət Nəzarət orqanının nümayəndəsi də həlledici səs alırdı. Digər məsələlərin müzakirəsinə Maliyyə və Ticarət nazirliklərinin nümayəndələri, habelə qoşunların birləşmə, hissə, idarə və müəssisə rəhbərləri Şuraya də'vət oluna bilərdi. Şura öz fəaliyyətində Rusiya qoşunlarının hərbi dairələrinin şuralarının əsasnaməsini rəhbər tutmalı idi. Bu əsasnamələrin Azərbaycan qanunvericiliyinə zidd gələn maddələri qüvvədən düşmüş hesab edilirdi. Hərbi Şuranın fəaliyyətinin sənədləşdirilməsi nazirliyin Dəftərxanasına tapşırılırdı (101a, v.40).

Hərbi Şura ilə bağlı bir qədər irəli gedib qeyd etmək lazımdır ki, 1920-ci ilin əvvəllərində Hərbi Şuranın yeni tərkibi təsdiq edildi. Həm də nazirin əmri ilə iki Hərbi Şura yaradılmışdı: Kiçik Hərbi Şura, Böyük Hərbi Şura. Kiçik Hərbi Şura hərbi nazirin sədrliyi altında yaradılırdı və onun tərkibinə nazirin müavini, Ümumi qərargahın rəisi, Ərkani-hərbin rəisi, Bakı istehkamat hissəsinin rəisi daxil idilər. Böyük Hərbi Şura isə hərbi nazirin müavininin sədrliyi altında yaradılırdı və tərkibinə Ümumi qərargah rəisi, Bakı İstehkamat hissəsinin rəisi, Ərkani-hərbin rəisi, qərargahları Bakıda yerləşən piyada və süvari diviziyalarının komandirləri, Topçu, İstehkam və Ləvazimat idarələrinin rəisləri, Hərbi ədliyyə, Hərbi xəstə və Hərbi baytar hissələrinin rəisləri daxil idilər. Dövlət nəzarət orqanının nümayəndəsi də Böyük Hərbi Şuranın iclasında iştirak etməli idi (147, v.124).

1919-cu il sentyabr ayının əvvəllində Hərbi Nazirliyin rəhbərliyi Topçu İdarəsinin səlahiyyətlərinin genişləndirilməsi barədə Nazirlər Şurası qarşısında məsələ qaldırdı. Bununla əlaqədar hazırlanan məktubda göstərilirdi ki, nazirliyin bir çox idarələri, o cümlədən Topçu İdarəsi ordunun yaranma dövründə mövcud olan işin həcminə uyğun olaraq yaradılmışdı. Son zamanlar isə bu işin həcmi xeyli genişləndirilmişdir və ona görə də idarələr, o cümlədən də Topçu İdarəsi əsasən yalnız təchizat məsələlər ilə məşğul olmaq imkanı tapır. Halbuki bu idarə orada olan topçu hissə və bölmələrinə bütün sahələrdə rəhbərlik etməli, həmin hissələrdə xidmətin, tə'lim və tərbiyənin təşkili, onların zəruri əmlakla tə'min edilməsi sahəsində hərbi nazirin qarşısında birbaşa məs'uliyyət daşımalıdır. Topçu hissələrində texniki-taktiki hazırlığı yaxşılaşdırmaq, nizami xidməti təkmilləşdirmək üçün



hərbi nazirlik Topçu İdarəsinin strukturunda qismən dəyişiklik etməyi və səlahiyyətlərini genişləndirərək onu Baş Topçu İdarəsi adlandırmağı təklif edirdi (101a, v.6).

Baş Topçu İdarəsinin yeni strukturu hazırlanarkən onun əlavə xərclər məsrəfinə yol verməməsi də nəzərə alınmışdı. Nazirlər Şurasına göndərilən məktubda göstərilirdi ki, yeni struktur tətbiq ediləcəyi halda əvvəlki strukturla ayda cəmi 1300 manat əlavə xərc lazım olacaqdır (101a, v.6).

Baş Topçu İdarəsinin əsasnaməsində deyilirdi ki, bu orqan: 1) Topçu İdarəsinin sərəncamında olan əmlakın, texniki vəsaitlərin bölüşdürülməsi ilə; 2) ordunun topçu əmlakı ilə ümumi tə'min edilməsi ilə; 3) ordunun bütün topçu hissə və bölmələrinin texnikasının idarə edilməsi ilə; 4) rəhbər sənədlərin və xüsusi göstərişlərin hazırlanması ilə; 5) texniki hey'ətin ümumi qeydiyyatı, bölüşdürülməsi ilə; 6) hərbi nazirin göstərişinə əsasən ordunun texniki təchizatının, topçu hissələrin isə həm nizami, həm də texniki planda təchizatının yoxlanması ilə məşğul olur. Baş Topçu İdarəsinin rəisi topçu hissələrin texniki hazırlığı və ordunun topçu əmlakı ilə təchiz edilməsi məsələlərinə məs'uliyyət daşımalı idi. O, yuxarıdan heç bir göstəriş gözləmədən hərbi hissələri və birləşmələri təsdiq olunmuş ştata uyğun olaraq bütün texniki vasitələrlə təchiz etməli və ya bu məsələnin həlli üçün yollar aramalı idi. Bütünlüklə topçu hissələrində xidmətin hərtərəfli təşkili, həmin hissələrin daimi döyüş hazırlığı vəziyyətində olması məs'uliyyəti Baş Topçu İdarəsinin üzərində idi (101a, v.9).

1919-cu ilin sentyabrın 13-də hərbi nazir Baş Topçu İdarəsinin yeni ştatını təsdiq etdi (101a, v. 14). Həmin ştata görə Baş Topçu İdarəsinin strukturu aşağıdakı vəzifələrindən təşkil olunmuşdu: idarə rəisi, idarə rəisinin texniki hissə üzrə müavini, qoşunlarda silahların hazırlıq vəziyyətini yoxlamağa məs'ul olan qərargah zabiti, nizami hissə üzrə baş yavər, tapşırıqlar üçün baş zabit, topçu detallarının təchizatı bölməsinin müdiri (mülki), sursat, odlu və soyuq silahlarla təchizat üzrə məs'ul şəxs (mülki), təsərrüfat hissəsinin müdiri, silah texniki. Bunlardan başqa idarənin ştatında bir neçə katib, çapar, mehtər və sürücü də var idi (101a, v.47).

Hərbi Nazirliyin rəhbərliyi eyni zamanda Hərbi Xəstə hissəsinin strukturunun genişləndirilməsi barədə Nazirlər Şurasının qarşısında vəsatət qaldırdı. Hərbi nazir bu məsələ ilə bağlı göndərdiyi raportunda xahiş edirdi ki, Nazirlər Şurasının qərarı qəbul edilənədək ona əlavə tibb kadrlarının xidmətə cəlb edilməsinə icazə verilsin (101a, v. 15). Nazirlər Şurasının rəhbərliyi hərbi nazirin bu məsələ ilə bağlı qaldırdığı vəsatəti də məqsədəuyğun sayaraq təklif olunan yeni ştat layihəsini təsdiq etdi (101a, v. 17).

1919-cu ilin payızında təşkil edilən ən böyük əhəmiyyətli hərbi strukturlardan biri Bakı istehkamat hissəsi (Бакинский укрепленный район) idi. Tarixi ədəbiyyatda bu ifadə "Bakı möhkəmləndirilmiş rayonu" kimi tərcümə edilsə də, bu strukturun sənədləşmələrində o, Azərbaycan dilin-

də "Bakı istehkamat hissəsi" adlandırılmışdır (bax: 177, v.83). Bu strukturun yaradılmasında başlıca məqsəd şimaldan, xüsusən dənizdən ehtimal olunan Denikin təhlükəsinin qarşısını almaq və bütünlüklə Bakının e'tibarlı müdafiəsini təşkil etmək idi. İngilis qoşunları 1919-cu ilin yayında Bakını tərk edərkən hərbi donanmanı Denikin qoşunlarının sərəncamına verdikdən sonra Bakı şəhəri dəniz tərəfindən tamamilə müdafiəsiz qalmışdı. Hərbi nazir S. Mehmandarov 1919-cu il sentyabrın 13-də Dövlət Müdafiə Komitəsinin sədrinə yazdığı raportunda Bakı şəhərinin müdafiəsinin təşkili istiqamətində görülməkdə olan işlər barədə mə'lumat verməklə bərabər onu da əlavə edirdi ki, planlaşdırılan işləri əlaqələndirmək və Bakının mühafizəsi ilə bağlı bütün qayğıları bir əldə mərkəzləşdirmək üçün Bakı İstehkamat Hissəsinin rəisi (начальник Бакинского укреплённого района) vəzifəsini tə'sis etmək lazımdır (129, v. 26).

Hərbi nazirin raportu elə həmin gün də Dövlət Müdafiə Komitəsinin iclasında müzakirə edilmiş və nazirin qaldırdığı vəsatətin məqsədəuyğunluğu barədə qərar qəbul edilmişdi. Qərarda Bakı İstehkamat Hissəsinin rəisi vəzifəsini tə'sis etmək, bu vəzifəni şəhərin hərbi general-qubernatoru vəzifəsi ilə birləşdirmək, Bakı şəhər rəisliyi ərazisini ona tabe etmək öz əksini tapmışdı (101, s. 53).

Hərbi nazirin 13 sentyabr 1919-cu il tarixli 405 saylı əmrində göstərilirdi ki, Bakı İstehkamat Hissəsinin rəisi hərbi nazirin təqdimatı əsasında Nazirlər Şurası sədrinin əmri ilə tə'yin edilir. İstehkamat hissəsi öz strateji əhəmiyyətinə görə birinci dərəcəli qalaya bərabər tutulurdu. Onun hüdudları Qızılburundan Ələtə qədər müəyyənləşdirilmişdi. Bakı İstehkamat Hissəsini rəisi vəzifəsinin səlahiyyətləri korpus komandirinin səlahiyyətləri səviyyəsində idi və Bakı qarnizonunun birbaşa hərbi nazirin özünə tabe olan hissələrdən başqa digər bütün hissələri, idarə, təşkilat və müəssisələri İstehkamat hissəsinin rəisinə tabe olmalı idi. Bakının hərbi limanı, orada mövcud olan üzən obyektlər, Nizovaya liman korpusundan tutmuş Ələt stansiyasına qədər sahil boyunca yerləşdirilmiş toplar da istehkamat hissəsinə tabe etdirilirdi. İstehkamat hissəsinin öz bayrağı olmalı idi. Həmin bayraq Bayıl burnunda, radiostansiyasının yanında qaldırılmalı və onun mühafizəsi tə'min edilməsi idi (90, v.125).

1919-cu il sentyabrın 9-da Topçu İdarəsinin rəisi, general-mayor M. Tlexas Bakı İstehkamat Hissəsinin rəisi tə'yin edilmiş və ona tapşırılmışdı ki, Ərkani-hərblə birlikdə istehkamat hissəsinin (rayonunun) ştat layihəsini hazırlasın (152, v. 85).

Bakı İstehkamat Hissəsini təsdiq edilmiş ştatında da sayca çox adam yox idi. Bu ştatlarda dayanan şəxslər Bakı qarnizonunun hissələri tərəfindən Bakı ətrafında aparılacaq işlərə rəhbərlik etməli və onu nəzarət altında saxlamalı idi. Qərargahdan başqa İstehkamat hissəsində (rayonunda) Topçu



İdarəsi, İstehkam İdarəsi, Ləvazimat İdarəsi, Hərbi Xəstə İdarəsi, Rabitə qrupu və Katerlər qrupu var idi. (90, v. 126).




**Bakı İstehkam Hissəsinin strukturu**

1919-cu il sentyabrında Ümumi qərargahın növbətçi generalının, Ərkani-hərbin general-kvartirmeysterinin, topoqrafiya şö'bəsi rəisinin səlahiyyətləri də genişləndirildi və onların hüquq və səlahiyyətləri diviziya komandirinin hüquq və səlahiyyətlərinə bərabər tutuldu (152, v. 167).

Elə sentyabr ayında da Bakı hərbi limanının, təyyarə dəstəsinin, zirehli avtomobillər taqımının, mövqe batareyasının ştatlarının hazırlanmasına başlandı (100, v. 8).

Senyabrın 14-dən təyyarə dəstəsinin və zirehli avtomobillər dəstəsinin, sentyabrın 24-dən mövqe batareyasının, oktyabrın 1-dən isə "Astarabad" hərbi gəmisinin ştatları qüvvədə sayıldı (92, v. 59).

6-cı Göyçay piyada alayının formalaşdırılması da böyük sür'ətlə aparılırdı. Qışlaların çatışmaması, geyim, ərzaq çətinlikləri olmasına baxmayaraq 1919-cu il oktyabrın sonuna qədər alayın təşkili demək olar ki, başa çatdırılmışdı (163, v. 58).

Formalaşma prosesinin necə getməsi barədə hissə komandirləri mütəmadi olaraq hesabat verirdilər. Həmin hesabatlar həm diviziya komandirinə, həm Ümumi qərargaha, həm də Ərkani-hərbə göndərilirdi. Hissə komandirləri komplektləşmənin, silah və texnika ilə təchizatın vəziyyəti, işlək silahların miqdarı, xarab silahların bərpası, şəxsi hey'ətin əhval-ruhiyyəsi, ərzaq, geyim və tibb vəziyyəti, tə'lim-tərbiyənin gedişi, fərariliyin vəziyyəti, qoşunların yerləşdirilməsi və sənədləşmənin aparılması barədə yuxarı orqanlara mə'lumat verməli idilər. Bütün bu məsələri özündə birləşdirən xüsusi hesabat forması hazırlanmışdı ki, onların öyrənilməsi rəhbər orqanlara formalaşma prosesini daimi nəzarət altında saxlamaq imkanı verirdi. (163, v. 45-46).

Noyabr ayında Xaçmaz dəstəsi ləğv edildi. Hərbi nazirin müvafiq əmrində göstərilirdi ki, ləğv edilmiş Xaçmaz dəstəsinin yerinə Quba dəstəsi yaradılır və polkovnik Kosəmənski bu dəstənin komandiri tə'yin edilir. Quba qəzasında olan bütün hissələr bu dəstənin tərkibinə daxil edilir-

di. Polkovnik Kəsəmənski eyni zamanda Qusar qarnizonunun rəisi təyin edilirdi (152, v. 212).

Qarşıya müəyyən çətinliklər çıxmasına baxmayaraq mövcud olan imkanlar ordunun sıralarını genişləndirməyə imkan verirdi. Buna görə qərara alındı ki, Lənkəran köməkçi (ehtiyat) taboru da alaya çevrilsin. Taborda bu genişləndirmə işinə lazımi hazırlıq görülməsi üçün Ümumi qərargahın rəisi general-mayor H.Səlimov həmin taborun komandiri kapitan Rəfibəyova məktub göndərərək başlıca olaraq hansı məsələlərə diqqət yetirilməsini açıqlayırdı. Onun yazdıqlarına görə yaradılması planlaşdırılan alay başqa alaylardın fərqli olaraq dörd tabordan ibarət nəzərdə tutulmuşdu. General H. Səlimov tələb edirdi ki: 1) Lənkaran taborunun 4 bölüyündəki şəxsi hey'-ət siyahıda bölüşdürülsün və 16 bölüyə paylansın. Bölüşdürülən şəxsi hey'ətin siyahısı tutulsun ki, lazım olan vaxt onları yeni bölüklər üzrə qruplaşdırmaq mümkün olsun; 2) bölüklərin komandiri və digər komandir vəzifələrinə hələlik tə'lim komandasında olan kiçik rütbəli şəxslər tə'yin edilsin; 3) taborların komandiri vəzifəsini müvəqqəti icra edə biləcək şəxslər müəyyənləşdirilsin; 4) planlaşdırılan şəxsi hey'ətin ümumi sayı üçün heç olmasa yay geyimi, yatacaq əşyaları alınsın və ehtiyat saxlanılsın; 5) şəxsi hey'ətin yerləşdirilməsi üçün zəruri olan binalar müəyyənləşdirilsin və onların əsgər qışlası üçün uyğunlaşdırılması planı hazırlansın; 6) xəbər verilsin ki, alayın bütün şəxsi hey'əti üçün Lənkəranda qış gödəkçələri sifariş etmək mümkündürmü və əgər mümkünsə, hansı qiymətə; 7) hazırda mövcud olan kadrlarla mütəmadi dərslər aparılsın (163, v.102).

Lənkəran taborunun alaya çevirilməsinə başlanması ərəfəsində Şamaxı şəhər Duması şəhər başçısı A.Hüseynbəyovun sədrliyi altında iclas keçirib Azərbaycan Ordusunun yaradılan hissələrindən birinə "Şirvan" adı verilməsi barədə müvafiq orqanlar qarşısında vəsatət qaldırılması haqqında məsələ müzakirə etdi. Milli qoşun hissələrinin təşkilinə öz yardım və himayəsini göstərmək istəyən duma üzvlərinin qəbul etdikləri qərarda deyilirdi ki, hələ inqilabdan əvvəl "Şirvan" adı altında iki alay mövcud olmuşdur və həmin alaylar öz şücaəti ilə Qafqazda ad çıxarmışdılar. Bu alaylar dünya müharibəsində də öz hünərlərini göstərmişdilər. Qərarda daha sonra deyilirdi ki, hazırda həyat şəraiti böyük işgəncələrlə qarşılaşmış Şirvan üçün əvvəlkindən tam fərqlidir. Şamaxı şəhərinin və qəzanın əhalisi 1918-ci il mart hadisələri zamanı böyük qurbanlar vermiş və əhalisinin yarıdan çoxunu itirərək bizim respublikamızın təşkilinə və onun möhkəmlənməsinə zəmin yaratmışdı. Sonuncu çağırış və səfərbərlik zamanı Şamaxı qəzası Azərbaycan Ordusuna 2 mindən çox gənc əsgər vermişdir. Həmin gənclər Vətəni sədaqətlə qorumağa və lazım gələrsə onun yolunda qurban getməyə həmişə hazırdırlar. Şamaxı şəhər Duması əsgəri ən'ənələri bərpa etmək, qəza əhalisinin arzu və istəklərini həyata keçirmək məqsədilə Bakı qubernatorluğundan xahiş edirdi ki, qaldırılan məsələnin həllində və Azərbaycan Ordusu hissələrindən birinə "Şirvan" adı verilməsində mümkün köməkliyi göstərsin (163, v.40-41).



Şamaxı şəhər Dumasının qaldırdığı təklif Daxili İşlər Nazirliyinin xəttilə Hərbi Nazirliyə daxil oldu. Hərbi Nazirliyin rəhbərliyi bu təklifi müdafiə edərək Lənkəran köməkçi (ehtiyat) taborunun bazasında yaradılacaq 7-ci alaya "7-ci Şirvan alayı" adı verməyi qərara aldı (163, v.125, 127, 138).

1919-cu ilin sonlarında Bakı İstehkamat Hissəsinin müdafiə taboru yaradıldı, süvari, piyada alaylarının, əlahiddə taborlarının və hərbi məktəbin döyüş bayraqlarının təsviri təsdiq edildi, qoşunların rəhbərliyində bir sıra dəyişikliklər həyata keçirildi.

Bakı İstehkamat Hissəsinin əlahiddə taboru istehkam-qalanın müdafiəsinin möhkəmləndirilməsi üçün nəzərdə tutulmuşdu. Onun tərkibində 4 piyada bölüyü, bir pulemyot bölüyü, tə'lim bölüyü, rabitə komandası və qeyri-nizami komanda var idi. Şəxsi hey'ətin tərkibi isə 30 zabitdən, 7 mə'murdan, bir molladan və 1073 əsgərdən ibarət idi (92, v.65).

Piyada və süvari alayları, əlahiddə taborlar və hərbi məktəb üçün döyüş bayraqlarının təsviri 1919-cu il dekabrın 8-də e'lan edildi (91, v.154). Bayraqların biri digərindən fərqlənmirdi. Adları çəkilən bütün hissələr üçün eyni təsvirli döyüş bayrağı təsdiq edilmişdi. Bayrağın təsvirinin layihəsinin hazırlanması hərbi topoqrafiya şö'bəsinə tapşırılmışdı və həmin layihə hazırlanarkən milli simvolların istifadəsinə, milli ən'ənələrlə bağlı olan müəyyən elementlərin nəzərə alınmasına xüsusi diqqət yetirilməli idi.

Döyüş Bayrağı – parça, lent, ucluq, ağac və dəstəkdən ibarət idi. Parça gümüşü saçaqlarla tamamlanan, kənarlarına gümüşdən naxış vurulmuş mavi rəngli ştof ipəkdən və atlasdan ibarət idi. Bayrağın o biri ucunun naxışı görünməsin deyə parça iki qat bükülmüşdü. Yuxarı sol küncündə gümüşü saplarla səkkizguşəli ulduz və aypara çəkilmişdi. Bayrağın qırağı ilə işlənmiş naxış Şərqin böyük sərkərdəsi Teymurləngin Səmərqənd şəhərindəki qəbrinin üzərində olan təsvirdən götürülmüşdü və Azərbaycan Ordusu hissələrinin Döyüş Bayrağında Şərqin qəhrəmanlıq ən'ənələrinə sadıqliyi təcəssüm etdirirdi. Bayrağın bir üzündə ərəb əlifbası ilə "Azərbaycan" sözü, o biri üzündə isə "Qur'an"dan ayə -"Nəsrı min allah və Fəthi qərib" (Allahdan kömək olarsa qələbə bizimlədir) yazılmışdı. Bayrağın lentləri 15 santimetr enində yaşıl və qırmızı rəngli parçadan hazırlanmışdı və ucluqları 10 santimetr uzunluğunda saçaqlarla tamamlanmışdı. Qırmızı lentin üzərində gümüşü saplarla içində 7 ox olan ox qabı, nizə və iki yay işlənmişdi. Yaşıl lentin üzərində də gümüşü saplarla içində 7 ox olan ox qabı, iki yay, boncuq və Teymurləngin nizəsinin rəsmi işlənmişdi. Lentlər bayraq ağacının yuxarısına düyünlənirdi. Bayrağın ucluğu 5

hissədən ibarət idi: konus, silindr, kürə (şar), kəsik ellipsoid və nizə. Bayraq ağacı 2,6 metr uzunluğunda və 3,7 santimetr diametrində olmalı idi. Dəstək – gümüşü silindrdən ibarət olub bayrağın aşağı qurtaracağında ağaca geydirilirdi. Dəstəyin aşağı və yuxarı qurtaracağı 2,5 millimetrlik qızılı haşiyə ilə əhatə edilmişdi. Daha sonra 1,5 millimetr enində qızıl haşiyə ilə tamamlanan mavi mina vardı. Qızıl haşiyələrin arasında yuxarı künclərdə Azərbaycan ulduzları nəqş olunmuş, aşağı künclərdə isə qızıldan ayparalı altun ziqzaq, daha sonra bayrağın rəngləri ilə boyadılmış, kürəciklərlə bəzədilmiş qabarıq gümüşü halqalar keçirdi. Dəstəyin gümüşü hissəsində bayrağın məxsus olduğu hissənin adı və həmin hissənin yaranma tarixi həkk olunurdu (bax: şəkil 6).

Döyüş Bayrağının təsvirinin e'lan olunması ilə bağlı əmrdə deyilirdi ki, təsdiq olunmuş eskizlərin əsasında indiki dövrdə xalqın milli şüurunun inkişafı, məscid və kitablarda, habelə böyük Teymurləng və onun davamçıları tərəfindən inşa edilmiş tikililərdə əks olunan qədim me'marlıq nişanələri dayanmışdır ki, onlar indi də Azərbaycan xalqı üçün əzizdir (91, v.157).

Bakı İstehkamat Hissəsində xidməti yüksək səviyyədə təşkil etmək, qarşıya qoyulan vəzifələrə layiqincə nail olmaq üçün general-mayor Tlexas Baş Topçu İdarəsinin rəisi vəzifəsindən azad edildi və ona imkan verildi ki, bütün diqqəti Bakının müdafiəsinin möhkəmləndirilməsi ilə bağlı olan məsələlər üzərində cəmləşdirsin. Baş Topçu İdarəsi rəisi vəzifəsinə isə 1-ci topçu briqadasının komandiri general-mayor Məmməd Mirzə Qacar tə'yin edildi. Hərbi məktəbin rəisi polkovnik Şıxlinski 1-ci topçu briqadasının komandiri tə'yin edildi (153, v.221).

1919-cu ilin sonlarında 8-ci Ağdaş piyada alayının (150, v.29) və Zəngəzurda kürd əhalisindən ibarət xüsusi hərbi hissələrin formalaşdırılmasına başlanması planlaşdırılırdı (155, v.14).

Bütün bu təşkilati işləri həyata keçirməklə Hərbi Nazirlik 1919-cu ilin sonunadək Azərbaycan Ordusunun şəxsi hey'ətinin sayını 20 min nəfərə, ordudakı atların sayını isə 5 min başa çatdırmağı nəzərdə tuturdu. 1920-ci il üçün davam etdiriləcək təşkilati işlər ordunun sayını daha da artırmalı və onu 40 min nəfərə çatdırmalı idi. Nəzərdə tutlmuşdu ki, ilin sonunadək atların sayı 10 min baş olacaqdır (97, v.129).

Ordunun sayının il ərzində iki dəfə artırılmasına nail olmaq üçün 1920-ci ilin elə ilk günlərindən çox geniş quruculuq işlərinin aparılması planlaşdırıldı. Tərtib edilmiş fəaliyyət planına görə il ərzində aşağıdakı hissələr yaradılmalı idi: 1) 9-cu piyada alayı, 2) 9-cu piyada alayının yaradılması ilə 3-cü piyada diviziyasının qərargahı təşkil edilməli, 7-ci Şirvan, 8-ci Ağdaş və 9-cu piyada alayları bu diviziyaya tabe etdirilməli idi; 3) 4-cü süvari alayı; 4) iki qaubitsa batareyası; 5) qaubitsa divizionunun qərargahı;



6) bir dağ-süvari batareyası; 7) dağ-süvari divizionunun qərargahı; 8) üç batareyadan ibarət yüngül səhra divizionu və onun qərargahı; 9) hər biri bir bölük həcmində olan dörd məhəlli komanda və hər biri yarım bölükdən ibarət olan üç məhəlli komanda. Bu məhəlli komandalar səfərbərlik idarələrinin yanında yaradılmalı və çağırışçıların xidmət yerinə çatdırılması ilə məşğul olmalı idi (122, v.24).

1919-cu ilin yayından e'tibarən əvvəlcə Qarabağda, sonra Lənkəranda, sonra isə Zəngəzurda hərbi şəraitin kəskinləşməsinə, Qarabağ və Zəngəzurdakı şəraitin səngiməməsinə baxmayaraq Hərbi Nazirliyin rəhbərliyi quruculuq işindəki ahəngdarlığı saxlamağa çalışırdı. 1920-ci ilin elə ilk günündən 3-cü zirehli qatarın komplektləşdirilməsinə başlandı (149, v.19; 148, v.66). Ştata görə onun şəxsi hey'əti 3 baş çavuşdan, 18 çavuşdan, 27 kiçik çavuşdan, 66 onbaşıdan, 228 sıravidən, 3 katibdən, 3 feldşerdən, 9 paravozçudan, 9 konduktordan, 6 dəmir yolu ustasından, 6 mühafizəçidən və 9 ustadan ibarət idi (149, v.60).

1920-ci il yanvarın 1-də 1-ci Tatar süvari alayının rotmistri Sultanov kürd süvari divizionunun komandiri tə'yin edildi (92, v.16). Bu onu göstərirdi ki, kürd süvari divizionu artıq təşkil edilmişdi.

Zəngəzurun əhalisinə qarşı genişlənən erməni təcavüzünün qarşısının alınması üçün kürd əhalisindən təşkil edilən və Azərbaycan Ordusunun tərkibində rəsmiləşdirilən təkcə süvari divizionu deyildi. Kürd əhalisindən həm kürd nişançı taboru və həm də kürd süvari divizionu formalaşdırıldı (106, v.2).




**Kürd nişançı taborunun strukturu**

Kürd nişançı taborunun tərkibində dörd piyada bölüyü, bir pulemyot bölüyü və bir qeyri-nizami bölük var idi. Onun şəxsi hey'əti 1074 nəfər nizami əsgərdən, 103 qeyri-nizami əsgərdən (cəmi-1177 əsgər), 39 zabitdən və 9 mülki mə'murdan ibarət idi. Bu struktur dinc dövr üçün nəzərdə tutulmuşdu. Müharibə başlanacağı təqdirdə kürd nişançı taboru 4 taborlu nişançı alayına çevrilməli idi (106, 1-5).

Kürd süvari divizionu isə iki bölükdən və tə'lim komandasından ibarət idi. Süvari divizionunun komandirinin səlahiyyətləri əlahiddə tabor komandirinin səlahiyyətlərinə, onun müavininin səlahiyyətləri isə nizami taborun (qeyri-əlahiddə) komandirinin səlahiyyətlərinə bərabər tutulurdu. Süvari divizionunun şəxsi hey'əti 14 zabitdən, 391 nizami əsgərdən, 59 qeyri-nizami əsgərdən (cəmi 450 əsgər) ibarət idi. Divizionun ştatında 426 at var idi (106, v.3-4).

1920-ci il yanvarın 19-da Dövlət Müdafiə Komitəsi "Kürdlərin hərbi xidməti haqqında Əsasnamə" qəbul etdi (106, v.67) və kürdlərin hərbi xidmət keçməsinin hüquqi bazası yaradıldı. Həmin əsasnamədə deyilirdi ki, Qarabağın kürd əhalisi hərbi xidməti əsasən Zəngəzur qəzasında yerləşən hərbi hissələrdə keçməlidirlər. Burada çağırışçı kontingenti çox olduğu təqdirdə onlar başqa hissələrə də göndərilə bilərdi. Dinc şəraitdə kürd əhalisindən dörd bölüklü kürd nişançı taboru və iki bölüklü kürd süvari divizionu yaradılmalı idi. Kürd nişançı taboru 1-ci piyada diviziyasının tərkibinə daxil edilirdi. Bu hissələrdə də xidmət digər hissələrdəki kimi iki illik idi. Kürd hissələri üçün zabit kadrları digər hissələrdən seçilməli və vəzifələrə hərbi nazirin əmri ilə tə'yin edilməli idi. Kürd zabitlərinin hazırlanması üçün isə hərbi məktəbin tərkibində qısa müddətli kürd kursları açılmışdı. Xidmətə çağırılan kürd hissəyə öz paltarında, silahı, təchizatı və atı ilə gəlməli idi. Onların hansı paltarda gəlməsi, hansı təchizatları gətirməsi hərbi nazirin təsdiq etdiyi siyahı ilə müəyyənləşdirilirdi. Çağırışçıların özləri ilə gətirdikləri paltarın, təchizatın yaxşı vəziyyətdə saxlanılması və onların tə'miri üçün hərbi nazirin əmri ilə təsdiq edilmiş həcmdə maliyyə vəsaiti ayrılırdı. Silahın tə'miri, patron təchizatı, hərbi qulluqçuların iaşəsi, yataq əşyaları ilə tə'min olunması xidməti xərclərin hesabına həyata keçirilirdi. Əsgərlərin əşyaları və atları xidmət zamanı sıradan çıxdıqları halda onlar hökumət hesabına əvəz edilirdi (106, v.67-68).

1920-ci il istər Azərbaycan xalqının, istərsə də Azərbaycan Ordusunun həyatında çox mürəkkəb bir il idi. Azərbaycan Ordusunun rəhbərliyi bu il üçün böyük tədbirlər planı müəyyənləşdirib onun həlli ilə məşğul olsa da, 1920-ci ilin aprelində baş verən bolşevik işğalı onu yarımçıq qoydu. İlin dörd ayı ərzində görülən işlər də çox mürəkkəb bir şəraitdə həyata keçirilirdi Erməni təcavüzü praktiki olaraq ilin əvvəlindən ara vermirdi. Mart ayının üçüncü ongünlüyündən isə bu təcavüz açıq müharibəyə çevrildi. Ona görə də 1920-ci ildə ordu quruculuğu, onun möhkəmləndirilməsi və sıralarının genişləndirilməsi üçün nisbətən münasib şərait ilk üç ayda mövcud oldu. Bu üç ayın birinci ayını da S.Mehmandarov xidmətdə olmamışdı. Xəstəliyi ilə bağlı hərbi nazir bütünlükdə ordunu tərk etmək fikrində olduğunu bildirsə də (72, v.127), 1920-ci il fevral ayının əvvəllərində öz vəzifəsinin icrasına qayıtdı. Heç şübhəsiz ki, bu fakt özü də ordunun quruculuq prosesinə öz tə'sirini göstərməyə bilməzdi. Bütün bunlara görə 1920-ci ilin ilk bir neçə ayı ərzində ordunun qurulması prosesinin 1919-cu ilə xas sür'ətinin saxlandığını iddia etmək olmaz.

1920-ci ildə çağırış-səfərbərlik kampaniyasını 1920-ci il martın 15-dən başlamaq planlaşdırılmışdı (147, v.150). Yeni çağırış kampaniyasının uğurlu keçirilməsi ordunun say tərkibinin artırılmasına, yeni hərbi hissələrin yaradılmasına imkan verə bilərdi. Lakin 1920-ci il martın 20-dən



erməni qoşunlarının Qarabağda kütləvi hücumu qarşıya qoyulan bir sıra vəzifələrin həyata keçirilməsinə mane oldu. Belə bir şəraitdə yeni hərbi hissələrin yaradılmasından daha çox, mövcud hissələrin canlı itkilərinin bərpa edilməsi böyük aktuallıq kəsb edirdi. Bütünlükdə 1920-ci ilin ilk bir neçə ayı daha çox ordunun idarəetmə strukturlarının təkmilləşdirilməsinə cəhd göstərilməsi ilə xarakterikdir. Bu da hər şeydən əvvəl idarəetmə strukturlarının fəaliyyətinin səmərəliliyinin artırılması ilə, onlarda yaranan bürokratik ünsürlərin aradan qaldırılması ilə bağlı idi. Hərbi nazirin 1920-ci ilin 14 fevral tarixli 99 saylı əmri bu baxımdan səciyyəvidir. Orduda mövcud olan nöqsanlı hallara toxunaraq o bildirirdi: "Ordu hissələrinin, idarələrinin və müəssisələrinin çoxunun yaradılmasından artıq bir ildən çox keçmişdir. Qoşun hissələrinin həyatını normal hala salmaq üçün bu müddət tamamilə kifayətdir. Təəssüf ki, həqiqətdə mən bunu görmürəm". (106, v.86).

Hərbi nazirin başlıca iradı qoşun hissələrinin iaşə və ərzaqla tə'minatında yol verilən laqeydlik və biganəliklərlə bağlı idi. O, hissələrdə şəxsi hey'ətin ərzaq sarıdan korluq çəkməsini obyektiv çətinliklə deyil, Ləvazimat İdarəsinin bu xidməti təşkil edə bilməməsi, bu xidmətin təşkilinə məs'ul olan orqanların öz işləkliyini itirməsi ilə bağlayırdı. Nazirin fikrincə, Ləvazimat İdarəsi və onun diviziyalardakı nümayəndələri sənədləşmə aparmaqla işlərini bitmiş hesab edir və məs'uliyyət daşıdıqları işin əhatəli təşkilinə maraq göstərmirdilər. Buna görə də S.Mehmandarov bu xidmət sahəsinin yenidən qurulmasının, bürokratik əngələ çevrilən artıq elementlərin ixtisar edilməsinin zəruriliyini vurğulayırdı (106, v.86). Heç şübhəsiz ki, 1920-ci ilin fevral ayında idarəetmə strukturlarında əsaslı yenidənqurmaya başlanmasında hərbi nazirin Ləvazimat İdarəsinin fəaliyyətindən aldığı təəssüratı da öz rolunu oynamışdı.

Hərbi nazirin 1920-ci il 17 fevral tarixli 105 saylı əmri ilə Ərkanihərb (Qeneralmy ştab) rəisi general-leytenant M.Sulkeviç Azərbaycan Ordusu sıralarından tərxis edildiyi və onun vəzifəsinin müvəqqəti icrasının Bakı İstehkamat Hissəsinin rəisi general-mayor H.Səlimova həvalə olunduğu bildirilirdi. Elə həmin əmrlə Azərbaycan Ordusu Qərargahının yenidən qurulması barədə komissiya yaradıldığı e'lan edilirdi. General-mayor H.Səlimov bu komissiyanın sədri, general-mayor Qaytabaşı və polkovnik Karqaleteli bu komissiyanın üzvləri tə'yin olunmuşdular. Hərbi nazir əmrdə xüsusi olaraq vurğulayırdı ki, komissiya sayca az, lakin işlək keyfiyyətlərə malik olan bir qərargahın layihəsini yaratmağa çalışmalıdır (106, v.95).

Həmin əmrin digər bir paraqrafı ilə hərbi nazir ordunun Baş təchizat rəisi vəzifəsinin tə'sis edilməsi üçün işçi komissiyasının tərkibini təsdiq etmişdi. Bu komissiyaya da general-mayor H.Səlimov başçılıq edirdi. Komissiyanın üzvləri isə nazirliyin idarə rəisləri və general-kvartirmeyster polkov-

nik Karqaleteli idilər. Nazir komissiyaya tövsiyə edirdi ki, bu məsələyə ciddi yanaşılsın, ətraflı təhlil aparılsın və müəyyən müddət keçəndən sonra təsdiq edilmiş strukturun yenidən baxılmasına zərurət yaranmasın (106, v.95).

General H.Səlimov ona Ərkani-hərbin rəisi vəzifəsinin həvalə edilməsi və nazirliyin idarəetmə strukturlarının təkmilləşdirilməsi barədə layihələrin hazırlanması kimi məs'uliyyətli işin tapşırılması ilə əlaqədar olaraq 1920-ci il fevralın 17-də Bakı İstehkamat Hissəsinin rəisi vəzifəsindən azad edildi və həmin vəzifəyə 2-ci piyada diviziyasının komandiri general-mayor Usubov tə'yin edildi. General Usubov həm də özünün ilkin vəzifəsində saxlanılırdı (106, v.95).

1920-ci ilin fevralında general H.Səlimovun sədrliyi altında yaradılan hər iki komissiyanın iclası oldu və hazırlanmış layihələr müzakirə edildi. Fevralın 21-də olan iclasda ordunun qərargahının yenidən qurulmasına baxıldı. Mə'ruzə ilə çıxış edən general H.Səlimov bildirdi ki, yeni layihə hazırlanarkən aşağıdakı dəyişikliklər nəzərdə tutulmuşdur: Ümumi qərargahın növbətçi generalının idarəsində əvvəlki dörd bölmənin yerinə üç bölmə planlaşdırılmışdır. Ümumi qərargahın və Ərkani-hərbin jurnal xidməti birləşdirilmişdir. Azərbaycan Ordu Livası rəyasəti ləğv edilmiş və həmin idarənin funksiyası genaral-kvartirmeysterin idarəsində olan səfərbərlik bölməsinə verilmişdir. General-kvartirmeyster idarəsində 6 bölmənin yerinə 4 bölmə layihələndirilmiş və idarənin əməkdaşlarının sayı 9 nəfər azaldılmışdır. Hərbi topoqrafiya şö'bəsində zabitlərin biri ixtisara salınmışdır. Hərbi Nazirliyin dəftərxanasında yeni ştata görə zabitlərin sayı iki nəfər azaldılmışdır. Bir nəfər katib də ixtisara salınmışdır. Əvəzində yeni qərargahda tapşırıq generalı vəzifəsi tə'sis edilmiş və bütün bölmə rəislərinin kateqoriyası bir pillə qaldırılaraq alay komandirinin hüquq və səlahiyyətlərinə bərabər tutulmuşdur. Bundan başqa, general H.Səlimovun sözlərinə görə, növbətçi generalın idarəsində sənədləşmə işləri üzrə iki yeni ştat açılmışdır. Bu da iki qərargahın birləşdirilməsi ilə sənədləşmə işlərinin artacağına görə edilmişdir (113, v.1).

General H.Səlimovun sədrliyi altında hazırlanan bu layihə Nazirlər Şurasına təqdim edildi və orada bəyənildikdin sonra 1920-ci il martın 1-dən onun tətbiqinə başlandı. Bu barədə hərbi nazirin əmri 1920-ci il martın 2-də imzalandı. Əmrə görə Azərbaycan Ordusunun Ümumi qərargahı və Ərkani-hərbi bir qərargahda birləşdirildi və bu yeni struktur "Azərbaycan Ordusunun Ümumi Qərargahı" adlandırıldı(rusca "штаб Азербайджанской Армии" adlandırılan bu struktur dövrün hərbi sənədləşməsində Azərbaycan dilində "Azərbaycan ordusunun qərargahı ümumisi" kimi tərcümə edilmişdir. Bax: 167, v.38). General-mayor Həbib bəy Səlimov Azərbaycan Ordusu Ümumi Qərargahının rəisi tə'yin edildi və qərargahın formalaşdırılması ona tapşırıldı (106, v.108).



Sonuncu struktur dəyişikliyindən sonra Hərbi Nazirliyin aparatının ştat tərkibi belə idi(158,v.109):

| Sıra № si | Vəzifə | Sayı | Rütbə kateqoriyası | Vəzifə kateqoriyası |
|---|---|---|---|---|
| 1. | Hərbi nazir | 1 | tam general və ya general-leytenat | |
| 2. | Hərbi nazirin yanında tapşırıq generalı | 2 | general | diviziya komandirinin müavini |
| 3. | Hərbi nazirin yanında tapşırıq üzrə qərargah zabiti | 2 | qərargah zabiti | alay komandirinin müavini |
| 4. | Hərbi nazirin yanında tapşırıq üzrə baş zabit | 2 | baş zabit | bölük komandiri |
| 5. | Yavər | 1 | | bölük komandiri |
| 6. | Hərbi nazirin müavini | 1 | general, general-leytenant | |
| 7. | Nazir müavininin yavəri | 1 | | bölük komandiri |
| 8. | Ordunun ümumi qərargah rəisi | 1 | general-leytenant (general-mayor) | |
| 9. | Ümumordu qərargah rəisinin yavəri | 1 | | bölük komandiri |
| 10. | Ümumordu qərargahının tapşırıq və e'zamiyyət generalı | 1 | general | alay komandiri |
| 11. | Baş molla | 1 | mülki | - |

Bu cədvəldə vəzifəli şəxslərin qarşısında göstərilən vəzifə kateqoriyası belə başa düşülməlidir: Azərbaycan Ordusunda xidmət edən zabitlərin maaşlarını və maliyyə tə'minatlarını müəyyənləşdirmək üçün vəzifə kateqoriyalarının siyahısı hazırlanmışdı. Bütün vəzifələr bu siyahıda yox idi. Bu siyahıya nazir, onun müavini, Ümumordu qərargahı rəisi, korpus, diviziya, alay, tabor, bölük və s. komandirləri və onların müavinləri daxil idilər.

Adları həmin siyahıya düşməyən vəzifələr isə səlahiyyətlərinə görə həmin vəzifələrdən birinə bərabər tutulur və bu vəzifədə xidmət edənlər həmin vəzifə kateqoriyasına uyğun olaraq maaş alırdılar. Məsələn, Ümumi qərargahın tapşırıq və e'zamiyyət generalı rütbə kateqoriyası general olmasına baxmayaraq, onun vəzifə kateqoriyası alay komandiri vəzifəsinə bərabər tutulurdu, general olsa da alay komandiri səviyyəsində maliyyə tə'minatına malik idi.

Ümumordu qərargahının strukturu isə belə idi: 1. Növbətçi generalın idarəsi: a) ümumi bölmədən, b) təftiş bölməsindən, v) pensiya bölməsindən q)qeyri-nizami bölükdən, d) nəşriyyatdan ibarət idi; 2. General-kvartirmeystrin idarəsi: a) əməliyyat-kəşfiyyat bölməsindən, b) səfərbərlik bölməsindən və məhəlli qoşunlar şö'bəsindən, v) hərbi əlaqələr (daşınmalar) bölməsindən, q) nizami və ümumi bölmədən, d) rabitə komandasından ibarət idi: 3. Hərbi topoqrafiya şö'bəsi: a) xəritəçəkmə bölməsindən və b) ambardan ibarət idi; 4. Hərbi ədliyyə hissəsi; 5. Hərbi Nazirliyin Dəftərxanası: a) qanunvericilik – kodifikasiya bölməsindən; b) maliyyə bölməsindən ibadət idi (106, v.109-112).




**Azərbaycan Ordusu Ümumi Qərargahının strukturu**



Hərbi Nazirliyin aparatı da daxil olmaqla Ümumi qərargahın ştatında 11 general, 33 qərargah zabiti, 25 baş zabit, 18 mə'mur, 270 əsgər, 16 at və 26 nəqliyyat vasitəsi var idi (106, v 112).

Ordunun təchizat rəisi vəzifəsinin tə'sis edilməsi və təchizat strukturlarının yenidən qurulması üçün yaradılmış komissiyasının son iclasında da komissiyasının sədri, general H. Səlimov mə'ruzə ilə çıxış etdi. O bildirdi ki, yeni struktur dəyişiklikləri aparılarkən işlək və çevik bir orqanın yaradılması üçün hərbi nazirin tövsiyələri əsas tutulmuşdur. Əvvəlki strukturla müqayisədə müəyyən ixtisarlar aparılmış və yeni yaradılan vəzifələrə təcrübəli şəxslər təklif olunmuşdur. H. Səlimovun mə'ruzəsindən sonra qərara alındı ki, diviziyaların qərargahlarında olan ləvazimat (təchizat) zabitlərinin ştatı ləğv edilsin. Çünki bu ştat artıq bir elementə çevrilmişdi və onları tutan zabitlərin fəaliyyəti lazımi bir səmərə ilə müşayiət olunmurdu. H. Səlimovun təklifi ilə Ləvazimat və Topçu idarələri rəislərinin iki müavinindən biri də ixtisara düşürdü. Ləvazimat İdarəsində S. Mehmandarovun tövsiyəsindən sonra üçüncü qərargah zabiti vəzifəsi artırılmışdı. Həmin üç qərargah zabitindən biri Gəncədə yerləşməli, Gəncə və onun ətrafında olan hissələrin təchizatını nəzarət altında saxlamalı, ikinci zabit Bakıda yerləşməli və burada həmin işi görməli, üçüncü zabit isə Ləvazimat İdarəsinin özündə olmalı idi (100, v.1).

General H.Səlimovun təqdim etdiyi layihəyə görə təchizat strukturları birləşdirilərək Ordunun Təchizat rəisinin idarəsi yaradılmalı idi. Ona tabe olan idarələr isə baş idarə olmaq səlahiyyətlərini itirirdi. Ordunun Təchizat rəisi idarəsinə aşağıdakı idarələr daxil idi: 1) Ləvazimat İdarəsi, 2) ordunun İstehkam Təchizatı İdarəsi, 3) ordunun Topçu Təchizatı İdarəsi, 3) ordunun Hərbi Xəstə Hissəsi rəisi İdarəsi, 5) ordunun Hərbi Baytar Hissəsi rəisi İdarəsi (100, v.1).




**Azərbaycan Ordusu Təchizat Rəisi İdarəsinin strukturu**

Ordunun təchizat rəisinin idarəsinin strukturu 1920-ci il martın 15-dən tətbiq edilməyə başladı. Hərbi nazirin müvafiq əmri ilə general-mayor

Şahzadə Məmməd Mirzə Qacar Azərbaycan Ordusunun təchizat rəisi tə'yin edildi. Diviziyaların qərargahlarında ixtisara düşən təchizat zabitlərindən ordunun təchizat rəisinin Dəftərxanası komplektləşdirilməli idi (106, v.133).

1919-cu ilin sonu 1920-ci ilin əvvəlində Azərbaycan Ordusunun bir neçə hərbi gəmisi də var idi. Mə'lumdur ki, ingilis qoşunları Bakıya gələn kimi Xəzər donanmasını ələ keçirmiş və Bakını tərk etdikdə isə bu donanmanı Denikinin sərəncamına vermişdi. Denikin və onun ətrafındakılar Xəzər donanmasının Azərbaycanın səlahiyyətlərinə verilməsinə hər vasitə ilə mane olurdular. (Bu barədə aşığıda daha ətraflı danışılacaqdır). Ona görə də Azərbaycan müstəqilliyinin e'lan edilməsinin ilk günündən özünün donanmasını yaratmaq imkanına malik deyildi. 1919-cu ilin sonu və 1920-ci ilin əvvəllərində Azərbaycan donanmasında "Qars" və "Ərdahan" hərbi gəmiləri və "Astrabad", "Araz", "Nargin" və s. köməkçi gəmiləri var idi (205, s.30).

Mövcud olan mə'lumatlara görə, 1920-ci ilin aprelində, bolşevik işğalı ərəfəsində Azərbaycan Ordusunun şəxsi hey'ətinin sayı 30 min nəfərə yaxın idi. (205, v.30). Bu şəxsi hey'ət əsasən iki piyada diviziyada birləşmiş olan 1-ci Cavanşir, 2-ci Zaqatala, 3-cü Gəncə, 4-cü Quba, 5-ci Bakı, 6-cı Göyçay, 7-ci Şirvan, 8-ci Ağdaş piyada alaylarında, Süvari diviziyasında birləşmiş olan 1-ci Tatar, 2-ci Qarabağ, 3-cü Şəki süvari alaylarında və iki topçu briqadasında cəmlənmişdi.




**Topçu briqadasının döyüş strukturu**

Bolşevik qoşunlarının işğalı ərəfəsində adları çəkilən bu nizami birləşmə və hissələrdən əlavə Azərbaycan Ordusunun tərkibində aşağıdakı idarə, müəssisə, təşkilat, hissə və bölmələr var idi (bax: 147, v.70-71):

- ordu qərargahı;
- hərbi nazirin Dəftərxanası;
- Bakı komendaturası və hərbi qaupvaxt;



- Gəncə komendaturası;
- xaricdəki hərbi nümayəndəliklər;
- Hərbi məktəb;
- Bakı, Gəncə, Biləcəri, Xaçmaz, Yevlax, Ağstafa, Poylu və Kürdəmir dəmir yolu stansiyalarının komendaturaları;
- ordunun Təchizat rəisi İdarəsinin Dəftərxanası;
- ordunun Topçu Təchizatı İdarəsi;
- zirehli qatarlar (üç ədəd);
- topçu diviziomı;
- əlahiddə batareya;
- hərbi zavod;
- Ləki topçu cəbbəxanası;
- Gəncə anbarlar şö'bəsi;
- ordunun İstehkam Təchizat İdarəsi;
- Hərbi dəmir yolu məktəbi;
- İstehkam taboru;
- İstehkam məktəbi;
- Bakı, Gəncə, Qusar və Xankəndi iş icraçıları qrupu;
- istehkam anbarı;
- avtokomanda;
- radiostansiya;
- Sürücülər məktəbi;
- Bakı İstehakamat Hissəsi;
- Gəncə İstehkamat Hissəsi;
- hərbi liman;
- hərbi gəmilər;
- zirehli avtomobillər taqımı;
- təyyarə dəstəsi;
- ordunun Ləvazimat İdarəsi;
- iaşə anbarı;
- album (paltar) anbarı;
- dəriaşılayan zavod;
- geyim və çəkmə e'malatxanası;
- ordunun Hərbi Xəstə Hissəsi rəisi İdarəsi;
- ordunun Hərbi Baytar Hissəsi rəisi İdarəsi;
- hərbi qospital;
- əsgəri xəstəxanalar (lazaretlər);
- hərbi aptek anbarı;
- hərbi feldşer məktəbi;
- baytar xəstəxanası (nalbənd e'malatxanası və baytar məktəbi ilə birlikdə);
- Hərbi məhkəmə;

- Prokuror nəzarəti;
- Hərbi Ədliyyə İdarəsi;
- Hərbi müstəntiqlər qrupu;
- əlahiddə tabor;
- məhəlli komandalar;
- Mühafizə bölüyü;
- Kürd nişançı taboru;
- Kürd süvari divizionu;

Şimal sərhədlərinin müdafiəsinin gücləndirilməsi üçün yaradılmış olan Quba dəstəsi hərbi nazirin 11 yanvar 1920-ci il tarixli 24 saylı əmri ilə ləğv edilmişdi (92, v.29).

1920-ci il Novruz bayramı ərəfəsində Qarabağda erməni qoşunlarının başladığı geniş miqyaslı hücumlar bir qədər səngidikdən sonra aprelin 8-də hərbi nazır S.Mehmandarov yenidən öz vəzifəsindən istefa verdiyini bildirdi. Onun 8 aprel 1920-ci il tarixli 197 saylı əmrində deyilirdi: "Aprelin 6-da mən səhhətimin xarablaşmasına görə ehtiyata tərxis olunmağım üçün raport vermişəm. Bunu Hərbi Nazirliyə e'lan edərək, hərbi nazirin müavini, tam artilleriya generalı Şıxlinskiyə təklif edirəm ki, qanuni əsaslarla Hərbi Nazirliyin müvəqqəti idarəsinə başlasın. Yeni hərbi nazir tə'yin edilənə qədər məni xəstə saysınlar".

General Ə.Şıxlinski xidməti e'zamiyyətdə olduğu üçün aprelin 6-7-də nazır vəzifəsini müvəqqəti olaraq general Usubov icra etdi (106, v.166). Şıxlinski e'zamiyyətdən aprelin 8-də qayıtdı və həmin gündən də nazir vəzifəsinin icrasına başladı.

S. Mehmandarovun iste'fasının doğrudan da səhhətinin xarablaşması ilə bağlı olduğunu iddia etmək çətindir. Belə olsaydı, o, yəqin ki, səhhətinin müalicəsi ilə məşğul olub geri qayıdardı. Qəti söyləmək mümkün olmasa da, çox güman ki, onu narahat edən başqa məsələlər var idi və iste'fa verməsi də digər səbəblərdən irəli gəlirdi. Bununla belə, verdiyi raportuna baxmayaraq respublikada baş verən proseslərə, Azərbaycanın müstəqilliyinə qarşı güclənən təhlükələrə biganə qala bilməyən S. Mehmandarov aprelin 24-də yenidən hərbi nazir vəzifəsinin icrasına başladı (106, v.185). O əvvəlki işgüzarlıq və qətiyyətlə bu məs'ul vəzifədəki fəaliyyətini davam etdirdi. Bunu onun bir neçə gün ərzində imzaladığı əmrlərdən də görmək mümkündür. Lakin təəssüf ki, S. Mehmandarov bu vəzifədə xidmətini uzun müddət davam etdirə bilmədi. Aprelin 27-də gecə Azərbaycan parlamentı hakimiyyəti təhvil verdi. Bu zaman parlament kommunistlərin qarşısında bir sıra şərtlər qoydu ki, həmin şərtlər arasında Azərbaycan Ordusunun saxlanacağı şərti də var idi (313, v.77).

Aprelin 28-i S. Mehmandarovun sonuncu xidmət günü idi və həmin gün o özünün iki sonuncu əmrini imzaladı. 237 saylı əmrində o bildirirdi: "Azərbaycan parlamentinin qərarı ilə sovet hakimiyyəti tanınmışdır. Bunu e'lan etməklə əmr edirəm:

1) Bütün hissələrdə, qərargahlarda, idarələrdə, təşkilat və müəssisələrdə yeni hakimiyyətə təhvil verilənədək işi əvvəlki kimi davam etdirməli;

2) Hərbi Nazirliyin sərəncamında yüz milyonlarla qiymətində əmlak, ərzaq ehtiyatı, pul, silah, sursat olduğu üçün onların israfına, yanlış və qanunsuz məsrəfinə təkcə buna yol verənlər deyil, həm də Hərbi Nazirliyin hissələrində, idarələrində, təşkilat və müəssisələrində qanun-qaydaya və təsərrüfat fəaliyyətinin düzgün aparılmasına cavabdeh olanlar məs'uliyyət daşıyırlar" (147, v.287).

238 saylı sonuncu əmrində S. Mehmandarov yazırdı: "Bu gün mən öz vəzifəmi sovet hakimiyyəti tərəfindən yeni tə'yin edilmiş hərbi və dəniz komissarı Çingiz İldırıma təhvil verdim. Bunu e'lan edib salamatlaşan zaman mən bütün əziz xidmət yoldaşlarıma sədaqətli və cəsur xidmətlərinə görə öz səmimi minnətdarlığımı bildirirəm. Şübhə etmirəm ki, onlar yeni hakimiyyət dövründə də hamımız üçün əziz olan Azərbaycan naminə vicdan və sədaqətlə xidmət edəcəklər.

Salamat qalın, böyükdən tutmuş kiçik əsgərə qədər sizin hamınıza ürəkdən, bütün səmimiyyətimlə həm işdə, həm də ailə həyatında hər cürə əmin-amanlıq, müvəffəqiyyət və xoşbəxtlik arzu edirəm.

Allah amanında. Hərbi nazir, tam artilleriya generalı S.Mehmandarov" (147, v.288).

## 2. *ORDUNUN TƏCHİZAT VƏ TƏ'MİNATI*

Qoşunların maddi-texniki təchizatının həlli Azərbaycan hökumətinin, Hərbi Nazirliyin rəhbərliyinin daim diqqət mərkəzində dayanan başlıca məsələlərindən biri idi. Ordunun inkişaf səviyyəsini, taktiki imkanlarını və döyüşkənliyini müəyyənləşdirən həlledici amil kimi bu problem bütün mövcudluğu dövründə Azərbaycan Ordusunun formalaşma prosesinin mürəkkəb sahələrindən birini təşkil edirdi. Əslində bu problemin nə vaxtsa arzu olunan səviyyədə həll edildiyindən də danışmaq olmazdı. Ancaq mövcud olan ehtiyatların israfsız və səmərəli şəkildə istifadə edilməsi ordunun qoşun hissələrini lazımi döyüş hazırlığı səviyyəsində saxlamağa imkan verirdi.

Azərbaycan hökuməti bu məsələyə xüsusi bir qayğı ilə yanaşırdı. Nazirlər Şurasının ilk sədri F.Xoyski parlamentdəki çıxışlarından birində bildirirdi ki, respublikanın ərazi bütövlüyünü qorumağa qadir olan ordu zəruri olan hər şeylə–silah, təchizat və ərzaqla tə'min edilməlidir. Hökumət dərhal bu işlərə başlamalıdır. (60, v. 46).

Şübhəsiz ki, Azərbaycan hökuməti dərhal ordunun qurulması və onun təchiz edilməsi sahəsində zəruri tədbirlərin həyata keçirilməsinə başladı. Lakin bu işlər respublikanın imkanları daxilində həyata keçirilə bilərdi.

Vətəndaş müharibəsi, Azərbaycanın, xüsusən də Bakının təsərrüfat həyatının bərbad vəziyyətə salınması ölkənin maddi imkanlarının da xeyli məhdud olmasını şərtləndirirdi.

Digər tərəfdən, respublikada hərbi infrastrukturanın olmaması hərbi xərclərin daha da artırılmasını tələb edirdi. Çar Rusiyası Azərbaycandan əsgər çağırmamaqla bərabər burada hərbi infrastrukturanın inkişafına da fikir vermirdi. Çünki coğrafi baxımdan həmin dövrdə Azərbaycan elə də vacıb əhəmiyyət kəsb etmirdi. Azərbaycanın sərhəd olduğu İrandan heç bir hərbi təhlükə gözlənilmədiyi üçün bu istiqamətdə hərbi qüvvələrin yerləşdirilməsinə və bunun üçün də zəruri olan tikililərin, yolların hazırlanmasına elə bir diqqət yetirilmirdi. Bu baxımdan Ermənistanla Gürcüstan daha əlverişli vəziyyətdə idilər. Türkiyənin hərbi potensialından ehtiyat edən Çar Rusiyası onun sərhədi boyunca, Ermənistan və Gürcüstanda daha çox qoşun saxlayırdı. Bu qoşunların yerləşdirilməsi və xidmət edilməsi üçün qışlalar, xidməti binalar, anbarlar tikmiş, strateji əhəmiyyətli yollar çəkilmişdi. Qafqaz Ordusunun əsas qüvvələri də Gürcüstan və Ermənistanda yerləşdirilmişdi. Ona görə də Azərbaycandan fərqli olaraq müstəqilliklərini e'lan etdikdən sonra Gürcüstan və Ermənistanda yaradılan ordunun yerləşdirilməsində, onların silah və sursatla tə'min edilməsində elə bir çətinlik olmadı (102, v. 6).

Azərbaycanda olan azsaylı qışlalar, anbarlar, e,malatxanalar isə hələ vətəndaş müharibəsi dövründə çox böyük dağıntılara mə'ruz qalmışdı. Onların bərpa edilməsi və yenilərinin tikilməsi onsuz da kasad olan maddi imkanlarda əlavə bir gərginlik yaradacaqdı.

Türk qoşunları respublikanı tərk edəndən sonra Azərbaycana qalan hərbi miras acınacaqlı vəziyyətdə idi. Xüsusi Azərbaycan Korpusunun maddi-texniki təchizat baxımından hansı səviyyədə olduğunu o vaxt hələ polkovnik olan Həbib Səlimov Nazirlər Şurasına göndərdiyi raportunda belə təsvir edirdi: "Atlar pis vəziyyətdədir, 2 aydır ki, maaş yoxdur. Toplar var, ancaq onu çəkən atlar yoxdur, pal-paltar həddən artıq azdır, əsgərlər acından ölür, nə qədər "un şorbası" yemək olar! Yeməksiz, geyimsiz ordu olarmı? "(161, v. 1).

H. Səlimov sonra da yazırdı ki, indi günün şüarı "hər şey ordu üçün" olmalıdır. Onun fikrincə, ilk növbədə yığcam bir korpus formalaşdırılmalı və bunun üçün heç nə əsirgənilməməlidir. H.Səlimov möhkəm ordu qurulması üçün nə lazım olması barədə Napoleonun sözlərini misal gətirirdi: "Müharibə üçün üç şey lazımdır: 1) pul, 2) pul, 3) pul".

H. Səlimov şübhə etmirdi ki, ordu yedizdirilməli, geyindirilməlidir. Çünki ac və çılpaq ordu bolşevizmin başlıca mənbəyidir. Onun sözlərinə görə, türk qoşunlarının Azərbaycanı tərk etməsi ərəfəsində müəyyən sakitlik mövcud olsa da, bu, nisbi hal idi. Bir tərəfdən erməni təcavüzkarları, digər tərəfdən də şimaldan olan təhlükə hər an reallaşa bilərdi. Belə



bir vaxtda çətin vəziyyətə düşməmək üçün, ordunun möhkəmləndirilməsi üçün tə"cili tədbirlərin görülməsi lazım idi. H.Səlimov həmin tə'cili tədbirlər sırasına ilk növbədə qoşunların maddi-texniki təchizatının möhkəmləndirilməsini daxil edirdi. O, eyni zamanda təchizat sistemində dəyişikliklər aparılmasının zəruriliyini vurğulayırdı. Bütün qoşunlar üçün ərzaq növləri bir mərkəzi anbardan buraxıldığı üçün bu, müəyyən gecikmələrə, fasilələrə səbəb olurdu. Digər təchizat sahəsində də belə köhnəlmiş sistem qalmaqda davam edirdi. H.Səlimov təklif edirdi ki, bu köhnə sistemə son qoymaq, korpusun, diviziyaların və hissələrin təchizat anbarlarını yaratmaq və orada ehtiyat toplamaq lazımdır.Məyyən əşyaların bazardan nəğd pulla alınmasına icazə verilməsi də H. Səlimovun irəli sürdüyü təkliflər sırasına daxil idi. Yə'ni o, təchizat və tə'minatın həm mərkəzləşdirilmiş şəkildə aparılmasının , həm də cari məsələlərin yerlərdə həll edilməsinin və beləliklə, qarışıq sistem tətbiq edilməməsi tərəfdarı idi (94, v. 1).

H. Səlimov öz raportunu belə bir cümlə ilə bitirirdi: "Yaşamaq istəyiriksə yaratmalıyıq". Il yarım ərzində Azərbaycan Ordusunda görülən işlər bu ordunun rəhbərliyində dayanan vətənpərvər zabitlərin həqiqətdə çox böyük yaradıcılıq işi idi. Çünki Azərbaycanın ordu hissələrini qərar tutduğu vəziyyətdən çıxarıb döyüşkən bir qüvvəyə çevirmək yalnız yaradıcı təşəbbüskarlığın, qətiyyətin, ardıcıllığın, sədaqətli xidmətin nəticəsində mümkün idi.

1919-cu il fevralın 25-də hərbi nazir S. Mehmandarov Azərbaycan parlamentində özünün proqram xarakterli çıxışında da türk qoşunlarının getməsindən sonra Azərbaycan ordu hissələrində vəziyyətin çox ağır olduğunu bildirirdi: "Mən Hacıqabula getdim, Ləki və Kürdəmirdə oldum, Ağdamda hər şeylə tanış oldum... Təəssüf ki, hər yerdə biri digərindən kədərli olan mənzərələrin şahidi oldum. İnsanların görkəmi heç də yaxşı deyildi, tutqun və qəmli idi, pis geyinmişdilər, deməyə ehtiyac yoxdur ki, yeməkləri çox pis idi. Onun dadına baxanda kiçik ət qırıntıları və kələm yarpaqları üzən qaynamış suyu gördüm. Otaqlar rütubətli idi, heç bir taxt və yataq əşyaları yox idi. Pəncərələrin çoxu şüşəsiz idi. Bundan başqa aydın oldu ki, çoxlu at çatışmır. Gördüyüm atlar isə at deyildi, üstünə dəri çəkilmiş sümüklər idi. Atların 70 faizi qoturlu idi" (58, v. 4-5).

Azərbaycandan yola düşməzdən əvvəl sonuncu görüşləri zamanı Nuru Paşa özü də S.Mehmandarova ordudakı vəziyyətin təchizat və tə'minat baxımından xeyli ağır olduğunu e'tiraf edirdi:"Nuru Paşa Azərbaycandan gedərkən özü mənim yanıma gəldikdə boynuna aldı ki, əsgərlik barəsində Azərbaycan fəna bir hala qoyulmuşdur" (20, 4-5, 1994, s.107).

1918-ci ilin noyabrında ingilis qoşunlarının Bakıya daxil olması ilə Hərbi Nazirliyin və Azərbaycan qoşunlarının Bakını tərk etməsi həm də buradakı hərbi tikililərdən istifadə etmək imkanının itirilməsi demək idi. Yuxarıda göstərildiyi kimi hətta Hərbi Nazirliyin özünün aparatı birmərtəbəli və böyük

imkanları olmayan bir evdə yerləşdirilmişdi (166, v.7). Hərbi Nazirliyin rəhbər hey'əti, bütünlükdə zabitlər isə çox da münasib olmayan yaşayış binalarında yerləşdirilmişdilər. Hələ Xüsusi Azərbaycan Koropusunun komandiri vəzifəsini icra edən Ə.Şıxlinski ordunun Ümumi qərargah rəisi Həbib bəy Səlimova göndərdiyi qeydində xahiş edirdi ki, onun yaşayış şəraitinin yaxşılaşdırılması imkanını yaddan çıxarmasın. Ə.Şıxlinski narahatçılıqla bildirirdi ki, "indiki rütübətli mənzildə mən 2-3 həftə yaşasam burada ölərəm" (166, v. 13).

Çar Rusiyası ordusundan qalmış olan hərbi tikililər əsasən böyük şəhərlərdə tikilmişdi. Çünki bu böyük şəhərlər özləri Rusiya üçün ucqar təşkil edirdi. Azərbaycanın özünün ucqarlarında qoşunlar demək olar ki, yox dərəcəsində idi. Yeni şəraitdə isə müstəqil Azərbaycan Ordusunun əsasən ucqar məntəqələrdə, Qarabağ ətrafında, şimal sərhəd boyunca yerləşdirilməsi zərurəti ortaya çıxmışdı. Həmin ərazilərdə hərbi tikililər olmadığı üçün şübhəsiz ki, qoşun hissələri uyğunlaşdırılmış binalarda yerləşdirilə bilərdilər. Havaların soyuması isə vəziyyəti xüsusilə mürəkkəbləşdirirdi.

Ona görə də Hərbi Nazirliyin rəhbərliyi ilk növbədə bu məsələlərin həllinə ciddi diqqət yetirirdi. Vəziyyətin heç olmasa müəyyən qədər yaxşılaşdırılması üçün bir sıra tədbirlər həyata keçirilirdi. Tikinti-bərpa işlərinin aparılması üçün dərhal 300 min rubl vəsait ayrıldı. Nazirin göstərişi ilə bu vəsait ilk növbədə tikinti materiallarının alınmasına, taxtlar düzəldilməsinə, qapı və pəncərələrin möhkəmləndirilməsinə, otaqların və binaların qızdırılmasına istiqamətləndirildi. S.Mehmandarovun mə'lumatına görə kifayət qədər sobalar əldə edilmişdi və ona görə onlardan da yaxşı istifadə edilməsinə cəhd göstərildi (58, v. 6).

Hərbi nazir S.Mehmandarov hərbi hissələrlə elə ilk tanışlıqdan qoşunların yerləşdirilməsi vəziyyətini də diqqətdən kənarda saxlamırdı. 1918-ci il noyabrın 27-də 1-ci Tatar süvari alayında olarkən hərbi nazir qışlaların vəziyyətindən heç də razı qalmadı. Otaqlar darısqal və çirkli idi.Atların tövlələri də ən adi tələblərə cavab vermirdi. Dekabrın 2-də isə nazir 2-ci Qarabağ süvari alayının vəziyyəti ilə tanış oldu. Onun fikrincə, qışlalar qənaətbəxş olsa da at tövlələri qaranlıq və bərbad vəziyyətdə idi. 4-cü və 5-ci dağ topçu batareyalarında gördükləri də naziri qane etmədi. 4-cü batareyada üstüörtülü park olmadığı üçün toplar açıq havada, qarın, yağışın altında saxlanılırdı. Ağdam şərab zavodunun həyətində yerləşmiş olan 5-ci dağ topu batareyasının isə qışlaları yaşayış üçün xeyli narahat idi (86, v. 6-7).

2-ci Qarabağ süvari alayında qışlaların yaxşı vəziyyətdə olmadığını alay komandiri S.Əfəndiyev də e'tiraf edirdi. Daxili əmrlərindən birində polkovnik S.Əfəndiyev qışlaların natəmiz saxlandığını və onun yaşayış üçün narahat olmasını, zabitlərin öz vəzifələrinə məs'uliyyətlə yanaşmadığını qeyd edirdi (173, v.16).



S.Əfəndiyev 1-ci piyada diviziyasının komandiri kimi də bir sıra əmrlərində qoşunların vəziyyətinə toxunmuşdu. 12 yanvar 1919-cu ildə hissələrlə əyani tanışlıqdan sonra imzaladığı əmrdə Şuşadakı qoşunların vəziyyətinin yaxşı olduğunu, Əsgəran taborunun vəziyyətinin isə heç də yaxşı olmadığını, şəxsi hey'ətə sabun və yatacaq dəyişiyinin verilmədiyini qeyd edirdi. 6 fevral 1919-cu il tarixli əmrində S.Əfəndiyev yenidən Əsgərandakı qoşun bölmələrinin yerləşdirilməsinə qayıdır, xüsusən döyüş postlarında onlar üçün ən adi şəraitin belə yaradılmadığını qeyd edirdi. Diviziya komandiri təəccübünü gizlətmirdi ki, ətrafda çoxlu meşəlik olmasına baxmayaraq əsgərlərin yatması üçün normal taxtlar düzəldilməyib, postlar təchiz edilməyib və təmiz saxlanılmır (155, v.21, 43).

Ağdam qarnizonunun ağır şəraitdə yaşaması barədə parlament üzvləri ilə birlikdə burada olmuş daxili işlər nazirinin müavini general Ağabəyov da öz hesabatında hökumətə mə'lumat vermişdi. Onun müşahidələrinə görə, qarnizonun hissələri çox namünasib yerləşdirilmişdi. Binalar çatışmadığından eyni hissənin bölmələri bir-birindən xeyli aralı olan tikililərdə qərar tutmuş, yataq əşyaları çatmadığından çox vaxt elə yerdəcə yatırdılar. Yorğan-döşək az idi. Münasib xəstəxana binası olmadığına görə müxtəlif xarakterli xəstələr bir yerdə müalicə olunurdu. Əsgəranda qoşun bölmələrinin yaşadığı bina daxmadan başqa bir şey deyildi. Bu bina normal yaşayış imkanlardan xeyli uzaq, dar və çirkli idi, yandırılan ocağın tüstüsü hər tərəfi bürüyüdü, axşam otaqların işıqlandırılması üçün lampa yox idi. Zabitlərin yaşadığı otaqlar da əsgər qışlasından heç nə ilə fərqlənmirdi. General Ağabəyov fikrini onunla yekunlaşdırırdı ki, Ağdamda qoşunların münasib qışlaları yoxdur" (297, s. 23-24).

1919-cu il yanvarın 1-də hərbi nazir Hacıqabulda yerləşən 2-ci Bakı piyada alayının formalaşması, onun yerləşməsi vəziyyəti ilə tanış oldu. S.Mehmandarovun həmin tanışlıqla bağlı imzaladığı əmrdən aydın olurdu ki, mövcud olan tikililərdən necə istifadə edilməsi komandir və zabitlərin işgüzarlığından, şəxsi hey'ətə hansı qayğı ilə yanaşmasından da çox asılı idi. Əgər birinci taborda şəxsi hey'ətin yerləşdirilməsi lazımi tələblərə cavab vermirdisə, otaqlar çirkli və soyuq idisə, eyni zamanda yatacaq əşyaları yox idisə, ikinci taborda qışlalar təmiz və səliqəli, otaqlar işıqlı və isti idi. Bir sözlə, tabor komandirinin işgüzarlığı və qayğıkeşliyi dərhal hiss olunurdu (107, v.8).

Vaxtilə rus qoşunlarının yaşamış olduğu qışla və tikililərdə, habelə qışla yerinə istifadə edilən şəxsi binalarda yaşayış üçün zəruri olan müəyyən əmlak saxlanılmışdı. Hərbi hissələr şəhəri tərk edərkən otaqlardakı taxtlar, çarpayılar, şkaflar və digər mebel təhvil verilmişdi. Bu qışlaları təhvil alan Azərbaycan Ordusunun bə'zi hissə və bölmələri təhvil alınan binalara və mebelə qarşı hədsiz ehtiyatsızlıqla yanaşır və onların sıradan çıxmasının aradan qaldırılması üçün heç nə etmirdilər. Hərbi nazir S.Mehmandarov

1919-cu ilin əvvəllərində bu məsələ ilə bağlı xüsusi əmr imzalamış, komandir və zabitləri xidməti mülkiyyətə qayğı göstərməyə çağırmışdı (107, v.21).

14 fevral 1919-cu il tarixli 74 saylı əmrində isə hərbi nazir hərbi obyektlərdə qoşun hissələri tərəfindən tikinti və bərpa işlərinin aparılması qaydasını müəyyən etdi. Ətrafda yerləşmiş olan qoşun hissələrinin tikililərində bərpa işlərinin müstəqimən İstehkam İdarəsi tərəfindən aparılması imkanı olmadığı üçün onların icrasının yerlərdə həyata keçirilməsinə icazə verilirdi. Bunun üçün qoşun hissələrinin komandirləri görülən işlərin həcmini, ona sərf olunacaq maliyyə vəsaitinin miqdarını müəyyənləşdirib İstehkam İdarəsinə bildirməli və sonra həmin vəsaiti almalı idi. Qoşunlarda alınan maliyyə vəsaiti İstehkam İdarəsinin rəisinin möhrü ilə möhürlənmiş və surğuclanmış kitabda mədaxil edilməli idi. Nəzərdə tutulan işlər qurtardıqdan sonra Ümumi qərargahın və İstehkam İdarəsinin zabitlərindən təşkil edilmiş komissiya onu yoxlamalı və ayrılan maliyyə vəsaitinə uyğunluğu barədə akt tərtib etməli idi (107, v.21).

Tikinti və bərpa işlərinin aparılmasında israfçılığa, ayrı-ayrı zabitlərin maliyyə vəsaitlərinin bu və ya digər yolla mənimsənilməsinə yol verməmək üçün çox vaxt müsabiqələr keçirilirdi. İstehkam İdarəsi görüləsi işin həcminin "Azərbaycan" qəzeti vasitəsilə e'lan edir və icraçı təşkilatları əməkdaşlığa cəlb edirdi. Lakin bu üsul səmərəli və əlverişli üsul deyildi. Çünki hədsiz bahalaşma şəraitində tərtib edilən smetalar bir aydan sonra müəyyənləşdirilən smetaya uyğunluq təşkil etmirdi. Əşyaların bahalaşması nəticəsində icraçılar ziyanla işləməli olurdular ki, bu da onlara sərf etmirdi. Ona görə keçirilən müsabiqələrə bə'zən heç kim gəlmirdi. Bu isə nazirliyin sifarişlərinin ləngiməsinə səbəb olurdu. İstehkam İdarəsinin rəisi hərbi nazir qarşısında tikinti işlərinin hərbi hissələrin özləri tərəfindən təsərrüfat müqavilələri əsasında aparılmasının məqsədəuyğunluğu barədə vəsatət qaldırmışdı. Verilən təklifə görə hərbi hissələr yerlərdə icraçı orqanlarla cari qiymətlər əsasında müqavilə bağlayıb nazirliyin iş icraçıları qruplarının nəzarəti altında onu həyata keçirə bilərdilər (98, v. 63).

Mövcud olan çətinliklərə baxmayaraq güclü ordunun formalaşdırılması üçün vacib olan hərbi infrastrukturanın yaradılması və onların lazımi səviyyədə saxlanması həm Hərbi Nazirliyin, həm də hökümətin daimi nəzarəti altında idi. Mə'lumdur ki, Azərbaycan hökuməti 1919-cü ilin aprelində hərbi nazirin təqdimatından sonra ordunun formalaşdırılması üçün 1919-cu ildə büdcədən ayrılan vəsaitin miqdarını təsdiq etdi. Bu vəsait 399, 4 milyon rubl olub dövlət büdcəsinin 27,7 faizini təşkil edirdi (297, s. 65). Həmin vəsaitin böyük bir hissəsi məhz hərbi infrastrukturanın yaradılmasına, bərpasına və yaxşı vəziyyətdə saxlanılmasına sərf edilməli idi. Bunu S. Mehmandarovun təqdim olunan smeta ilə bağlı Nazirlər Şurasına göndərdiyi tə'liqəsindən də aydın görmək mümkündür. Nazir ilk



növbədə hərbi infrakstruktura baxımından Azərbaycanın qonşu respublikalarla müqayisədə daha mürəkkəb vəziyyətdə olduğunu vurğulayırdı. (133, v.6). Qoşunların yerləşdirilməsi, hərbi infrastrukturanın yaradılması, binaların qışa hazırlığı və digər bu kimi məsələlər həm 1919, həm də 1920-ci ildə dəfələrlə Dövlət Müdafiə Komitəsinin müzakirəsinə çıxarılmış və burada maliyyə vəsaiti ayrılması, bu və ya digər dövlət orqanlarına müvafiq tapşırıqlar verilməsi barədə qərarlar qəbul edilmişdi (161, v.1,4,9).

Nəticədə qoşunların yerləşdirilməsi və hərbi infrastrukturlarının yaradılması üçün xeyli işlər görmək mümkün olmuşdu. 1920-ci ildə Azərbaycan Ordusunun birləşmə, hissə, idarə, müəssisə və təşkilatlarının sayı da hərbi infrastrukturanın yaradılması baxımından nəzərəçarpacaq işlərin görüldüyünü sübut edirdi.

Qısa müddətdən sonra elə Ağdam qarnizonunun vəziyyətində xeyli dəyişiklik yarandı. Həm 1-ci Cavanşir piyada alayında, həm də 2-ci Qarabağ süvari alayında otaqlar təmiz və səliqəli idi, binalar müəyyən bərpa işləri tələb etsələr də, yaşayış yeri üçün sahmana salınmışdı. Taxtlar və çarpayılar çatışmadığı üçün xüsusi hörmə çarpayılar düzəldilmişdi və əsgərlərin istifadəsinə verilmişdi (153, v.12). 2-ci süvari Qarabağ alayının hər bölüyünün öz at tövləsi var idi. Cavanşir piyada alayında isə silah e'malatxanası, açılmış və onların hər biri üçün bina ayrılmışdı (94, v.11,12).

Şəxsi hey'ətin yerləşdirilməsi üçün Lənkəran köməkçi taborunda xeyli işlər görülmüşdü. Qışlalardan başqa e'malatxanalar da yaxşı qurulmuş və münasib binalarda yerləşdirilmişdi. Taborda hətta dəmirçixana və çörəkbişirmə sexi də açılmışdı. Taborun yerləşdirilməsində, qışla və köməkçi binaların yaxşı təchiz edilməsində, bütünlükdə hissənin formalaşdırılmasında göstərdiyi təşəbbüskarlıq və işgüzarlığa görə hissə komandiri kapitan S.Rəfibəyov hərbi nazirin təşəkkürünü almışdı (168, v.61).

Qoşunların ərzaq ehtiyatının toplanması üçün Hacıqabulda, Gəncədə və Ağdamda iaşə anbarları yaradılmışdı (20, N 4-5, 1994, s.107). Lənkəranki topçu cəbbəxanası sıxlıq yaratdığı üçün Kürdəmirdə 2-ci topçu cəbbəxanası açılmış və bunun üçün müvafiq bina təchiz edilmişdi (176, v.53). Hissələrin çoxunda əsgər xəstəxanaları açılmış və həmin xəstəxanalar münasib binalarla təchiz edilmişdi. (153, v.172; 147, v.118).

Hətta Gəncə qarnizonu iclasının da öz xüsusi binası var idi ki, burada həm qarnizon iclasları və qarnizon miqyasında tədbirlər keçirilir, həm də zabitlər xidmətdən sonra istirahət edirdilər. Qarnizon iclası binasının bu tədbirlərin keçirilməsinə hazırlanması üçün Ləvazimat İdarəsindən tələb olunan qədər maliyyə vəsaiti ayrılmışdı (153, v. 6).

Ümumi qərargah rəisi general H. Səlimov 1919-cu il iyunun 7-də Cavanşir alayının Şuşada yerləşən taborunun yaşayış şəraitindən ümumən qane olduğunu bildirirdi. Generalın iradları onunla bağlı idi ki, şəxsi hey'ətin heç də hamısında odeyal və ağ örtüklər çatmırdı, samanın yoxlu-

ğu üzündən döşəklər vaxtlı-vaxtında doldurulmurdu. Ancaq tabor üçün ayrılan bina heç də pis deyildi. 1919-cu ilin birinci yarım ilini Şuşa taboru şəxsi binalarda yaşamışdı. Bu da bir sıra problemləri asanlaşdırmışdı. 1919-cu ilı iyununda tabor əsgər qışlalarına köçməyə başlamışdı. Bu binalar yalnız kiçik bərpa işləri tələb edirdi. H. Səlimovun yazdıqlarına görə, qarşıya çıxan başlıca çətinlik binaların qızdırılmasına lazım olan odunun alınması üçün maliyyə vəsaitinin buraxılmaması idi (153, v. 13).

İyunun 6-da 2-ci dağ topçu divizionunda gördüklərini general H. Səlimov öz hesabatında böyük razılıqla təsvir edirdi. Divizionun bütün binaları ə'la vəziyyətdə idi, əsgərlər taxtların üzərində yatırdı, bütün balışlar təzəcə doldurulmuşdu, əsgərlərin hamısının odeyalı və döşəkağı var idi. (153, v. 14).

Hərbı binaların qızdırılması üçün bütün hissələrə pul ayrılmışdı. Hər bir binanın qızdırılmasına zəruri olan odunun, kerosinin və mazutun norması müəyyənləşdirilmiş və müxtəlif məntəqələrdə onların qiyməti müxtəlif olduğu üçün real bazar qiymətlərinə uyğun gələn qiymət cədvəli təsdiq edilmişdi. Hissələr həmin cədvələ uyğun olaraq ayrılmış pul əsasında bu yanacağı ala bilərdilər. 1920-ci ilin yanvar, aprel ayları üçün həmin qiymət cədvəli aşağıdakı şəkildə təsdiq edilmişdi (bax: 106, v.78).

| Yaşayaş məntəqəsinin adı | 3 girdinlik normal odun növü | | kerosin | mazut |
|---|---|---|---|---|
| | rubl | qəpik | (1 pudu* ) | (1 pudu) |
| Bakı | 1175 | | 18 | 9 |
| Gəncə | 1238 | | 40 | 18 |
| Lənkəran | 900 | | 50 | 20 |
| Şuşa | 720 | | 60 | 35 |
| Xankəndi | 720 | | 60 | 35 |
| Qusar | 337 | 50 | 30 | 15 |
| Quba | 337 | 50 | 30 | 15 |
| Qaryagin | 2044 | | 120 | - |
| Nuxa | 1550 | | 100 | - |
| Göyçay | 560 | | 40 | - |
| Ləki | 200 | | 40 | - |
| Qazax | 530 | | 50 | - |
| Kürdəmır | 560 | | 40 | - |
| Zaqatala | 480 | | 120 | - |
| Şamaxı | 480 | | 80 | - |

* 1 pud = 16,38 kq.



Əsgər xəstəxanalarının qızdırılmasına vəsait ayrılmasına xüsusi diqqət yetirilirdı. Bununla bağlı hərbi nazir ayrıca bir əmr imzalamışdı. Həmin əmrlə əsgər xəstəxanalarının qızdırılması üçün zəruri olan yanacağın normaları müəyyənləşdirilmişdi. Əsgər xəstəxanaları üçün ayrılmış olan binalar oktyabrın 1-dən aprelin 1-nə kimi qızdırılmalı idi. Otaqlarda olan hər bir peç üçün 3 girdinli ağacdan 12 verşok* odun ayrılmalı idi. Xəstəxanaların mətbəxlərində istifadə edilməsi üçün ayda bir sajen yandırıla bilərdi. Mətbəx peçi il boyu işlədiyindən bu norma hər ay üçün təsdiq edilmişdi. Bundan başqa xəstəxanaların çörək sexi, hamamı, camaşırxanası üçün də odun normaları müəyyənləşdirilmişdi (106, v.102).

İşlədiləcək yanacaq normaları və onların qiymətləri müəyyənləşdirilərkən böyük məsrəflərə yol verilməməsi nəzərə alınmışdı. Bununla yanaşı, Hərbı Nazirlik şəxsı hey'ətin sağlamlığına ziyan gətirə biləcək lüzumsuz qənaət edilməsini də düzgün saymırdı. Mövsümün sonunda hissələr həm yanacaq üçün ayrılmış pulun xərclənməsi barədə hesabat vermeli, onu əsaslandırmalı, həm də qənaət edildiyi təqdirdə onun nəyin hesabına olduğu haqda izahat verilməli idı (106, v.102).

Zabitlərin mənzil və yaşayış şəraiti ilə tə'min edilməsi də müəyyən sənədlərlə nizamlanırdı. Mənzilləri olmayan zabitlər hökumət hesabına yaşayış sahələri ilə tə'min edilməli idilər. Bunun üçün də normativlər mövcud idi. Qüvvədə olan qanunvericiliyə görə vəzifəsindən və ailə vəziyyətindən asılı olaraq zabitlərə ayırılmalı olan yaşayış sahələrinin ölçüləri də müxtəlif idi. Bunu aşağıdakı cədvəldən də görmək olar (bax: 98, v.140).

| Vəzifə | Otaqların sayı | Otaqların sahəsi kv/sajen** |
|---|---|---|
| Hərbi nazir | 8 | 52 |
| Hərbi nazirin müavini | 7 | 45,5 |
| Qərargah rəisi | 6 | 39 |
| Generallar (ailəli) | 5 | 32,5 |
| Generallar (subay) | 4 | 26 |
| Qərargah zabitləri, alay komandirləri (ailəli) | 4 | 26 |
| Qərargah zabitləri, alay komandirləri (subay | 3 | 19 |
| Digər qərargah zabitləri (ailəli) | 3 | 19 |
| Digər qərargah zabitləri (subay) | 2 | 13 |

* 1 verşok = 4,45 sm.

** 1 sajen = 2,3 m.

| | | |
|---|---|---|
| Baş zabitlər, bölük komandirləri (ailəli) | 2 | 13 |
| Baş zabitlər, bölük komandirləri (subay) | 1 | 6,5 |

Digər zabitlər cədvəldə göstərilən vəzifə kateqoriyalarına müvafiq olaraq tə'min edilirdilər.

Zabitlərin yaşayış sahələrinin qızdırılması, odun və yanacaq alınması, mənzillərin normal səviyyədə saxlanması üçün hər ay xüsusi vəsait ayrılır və vəzifə kateqoriyalarına müvafiq olaraq maaşa əlavə edilirdi. Respublikadakı bahalanma ilə əlaqədar bu malıyyə vəsaitinin miqdarında da dəyişikliklər edilmişdi. Məsələn, 1919-cu ilin əvvəlində zabitlərə yaşayış sahələrinin qızdırılması üçün verilən vəsait 1919-cu ilin sonunda üç dəfə qaldırılmışdı. Aşağıdakı cədvəldə bu artım miqdarı göstərilmişdi (98, v.133).

| Vəzifə | 1919-cu ilin əvvəlində | 1919-cu ilin dekabrında |
|---|---|---|
| Hərbi nazir | 7200 rubl | 21600 rubl |
| Hərbi nazirin müavini | 3600 | 10800 |
| Qərargah rəisi | 3300 | 9900 |
| Diviziya komandiri | 3300 | 9900 |
| Diviziya komandirinin müavini | 3000 | 9000 |
| Nazirliyin Dəftərxanasının rəisi | 3000 | 9000 |
| Alay komandiri | 3000 | 9000 |
| Alay komandirinin müavini | 2700 | 8100 |
| Tabor komandiri | 2100 | 6300 |
| Ştabs-kapitan | 1800 | 5400 |
| Poruçik | 1800 | 5400 |
| Podporuçik, praporşik | 1800 | 5400 |

**Yaşayış sahələrinin qızdırılması üçün ayrılan aylıq vəsaitin miqdarı**

Digər zabitlər müvafiq vəzifələrə uyğun tutulurdu.

Bütün bunlar heç də o demək deyil ki, Azərbaycan Ordusu üçün hərbi infrastrukturların yaradılması, qoşunların, köməkçi xidmətlərin yerləşdirilməsi üçün binaların tikilməsi, kirayəyə götürülməsi, bütün zabitlərin yaşayış sahəsi ilə tə'min edilməsi tam ödənilmişdi. Obyektiv imkanlarla şərtlənən müəyyən çətinliklər qalmaqda davam edirdi. Məsələn, 1919-cu ilin yayında süvari diviziyasında hərbi binalar çatışmadığı üçün bir sıra bölmələrin formalaşdırılması da ləngiyirdi (161, v.181). 1919-cu ilin no-



yabrında Gəncə piyada alayının hissə və bölmələri şəhərin müxtəlif hissələrində, kirayə edilmiş binalarda yerləşdirilmişdi. Alayın birinci taborunun 11 və 12-ci bölüklərinin binaları isə, ümumiyyətlə, olmadığından onlar karvansarada məskunlaşmışdılar (163, v.58). 6-cı Göyçay piyada alayının hissə və bölmələrinin bə'ziləri Bayılda donanma qışlalarında yerləşdirilsələr də, bütünlükdə alayın ixtiyarına verilmiş binalar zəruri tələblərə cavab vermirdi (163, v.45). 1920-ci ilin martında Tərtərdəki qoşun bölmələrinin yaşayış şəraiti hələ də pis vəziyyətdə idi. Ayrılan bina namünasib idi. Əsgərlərin çoxu quru yerdə yatırdı. (95, v.24).

1920-ci ilin yanvarında hərbi nazirin əmri ilə növbətçi general, polkovnik Jilyayev Bakı əsgər xəstəxanasına yollanmış, xəstəxananın rahatlığı, xəstələrin yaşayış vəziyyəti ilə tanış olmuşdu. Həmin əmrin yerinə yetirilməsi ilə bağlı yazdığı hesabatında polkovnik Jilyayev göstərirdi ki, xəstəxananın qəbul otağı xeyli kiçikdir, hamam həddən artıq çirklidir, pəncərələrin qarşısına yuyulmamış qablar qalaqlanmışdı. Polkovnik Jilyayev xəstələrin ərzaqla tə'minatında rast gəldiyi qüsurlara da toxunurdu. Bu hesabatla bağlı nazirin imzaladığı müvafiq əmrdə əsgər xəstəxanalarının baş həkimlərindən, qarnizon rəislərindən ciddi tələb olunurdu ki, xəstəxanaların sanitar rejiminə nail olsunlar, ən adi yaşayış normalarına əməl etsinlər. Əmrdə göstərilirdi ki, heç bir bəhanə qəbul edilməyəcəkdir, irəli sürülən tələblərin icrasının qeyri-mümkün olması barədə söylənilən izahatlara qulaq asılmayacaqdır (92, v.49).

Bütünlükdə qoşun hissələrinin şəxsi hey'ətinin tibb xidməti ilə tə'min edilməsi Azərbaycan Ordusunun formalaşmasında böyük əhəmiyyətə malik idi. Bu məsələ həm tibb obyektlərinin yerləşdirilməsini, onlar üçün sanitar tələblərə cavab verən tikililərin ayrılmasını, həm də ümumiyyətlə, hərbi tibb xidmətinin təşkilini, şəxsi hey'ətin yararlı tibb xidməti və qayğısı ilə tə'min edilməsini özündə birləşdirirdi. Məsələnin vacibliyi və aktuallığı onunla şərtlənirdi ki, Azərbaycanın tibb şöbələri, milli kadrları az idi, əhalinin tibbi savadı xeyli aşağı idi. Ağır yaşayış şəraiti, sanitar normalarına əməl edilməməsi və bunun nəzarət altında saxlanmaması müxtəlif xəstəliklərin, o cümlədən yoluxucu xəstəliklərin geniş yayılmasına yol açırdı. Belə xəstəliklər, şübhəsiz ki, hərbi hissələrə də sirayət edir, hissələrin döyüş hazırlığı səviyyəsinə ciddi tə'sir göstərirdi.

1919-cu ilin əvvəllərində qoşun hissələrində səpmə yatalaq xəstəliyi geniş yayılmışdı. Xüsusən Ağdam qarnizonunda bu xəstəlik çox böyük miqyas almışdı. 1-ci piyada diviziyasının komandiri general S.Əfəndiyev az qala hər gün səpmə yatalağı yoluxma və bu xəstəliyin müalicəsi barədə hərbi nazirə mə'lumat göndərir, qəti tədbirlərin görülməsini tələb edirdi. Məsələn, 1919-cu il yanvarın 21-də Ağdam qarnizonunun əsgər xəstəxanasında 110 nəfər xəstə var idi. Onlardan 2-si səpmə yatalağı, 8-i qarın yatalağı, 8-i dizenteriya kimi yoluxucu xəstəliyə tutulmuşdu. Gün

ərzində xəstələrdən biri ölmüşdü. Yanvarın 23-də xəstələrin sayı 204-ə çatmışdı. Onlardan 119-u əsgər xəstəxanasında, digərləri isə xüsusi otaqlarda yerləşdirilmişdi. Gün ərzində 4 xəstə ölmüşdü (150, v.36,39). Yanvarın 24-də isə xəstələrin sayı 215 nəfərə çatmış və gün ərzində yenə 4 xəstə ölmüşdü. Xəstəliyin belə təhlükəli miqyas almasında S.Əfəndiyev ilk növbədə həkim Sulakovu təqsirləndirirdi. Diviziya komandirinin fikrincə, həkim Sulakov öz vəzifəsinə məs'uliyyətsizcəsinə yanaşaraq epidemiyanın qarşısının alınması üçün ciddi bir iş görmür və dərman ayrılması barədə mərkəzi orqanlara sifariş göndərməklə fəaliyyətini bitmiş hesab edirdi. Hətta xəstələrlə görüşməyə ehtiyat edən bu həkimin biganəliyi və laqeydliyi isə xəstələrin sayının artması ilə müşayiət olunurdu. Ona görə də diviziya komandiri S.Əfəndiyev Hərbi Nazirliyə göndərdiyi raportunda Sulakovun vəzifəsindən azad edilməsi və onun yerinə milli kadrın tə'yin olunması barədə məsələ qaldırmışdı (150, v.40,42).

Ömrünün işgüzar dövrünü yaşayan general-mayor S.Əfəndiyev də Ağdamda səpmə yatalağına yoluxdu və onun həyatını bu xəstəlikdən xilas etmək mümkün olmadı.

Yeri gəlmişkən qeyd olunmalıdır ki, milli kadrlar çatışmadığından Azərbaycan Ordusuna qeyri-milli tibb kadrları da qəbul edilirdi və onların heç də hamısı öz vəzifə borcunun icrasına Ağdam qarnizonunun həkimi Sulakov kimi yanaşmırdı. Hərbi nazir öz əmrlərindən birində Xankəndindəki əsgər xəstəxanasının həkimi Kutsevin fədakar zəhmətini xüsusi qeyd edirdi. Bu həkim qarnizonda yoluxucu xəstəliklərin yayılmasının qarşısını almaq üçün bütün bacarığını sərf edir, yorulmadan çalışırdı. Hətta özü də səpmə yatalağa yoluxan zaman daha çox ondan kömək gözləyən xəstələrin qayğısı ilə yaşayırdı. Həmin təmənnasız xidmətlərinə görə hərbi nazir Kutsevin həmişə dərin ehtiramla xatırlanacağını bildirirdi (153, v.17).

Hərbi hissələrdə malyariya xəstəliyinin yayılması da qeydə alınmışdı. Həmin xəstəliyin epidemiyasının əsas mərkəzlərindən biri Lənkəran ətrafında idi. Ona görə Lənkəran köməkçi (ehtiyat) taborunun şəxsi hey'əti arasında da bu xəstəliyə yoluxanların sayı çox idi (163, v.35). Sonuncu vəzifəsi 2-ci piyada diviziyasının komandir müavini olan polkovnik Kosəmonski də malyariyaya yoluxması nəticəsində vəfat etmişdir (92, v.23).

Havanın soyuması, yaşayış şəraitinin lazımi tələblərə cavab verməməsi, sanitariya normalarının gözlənilməməsi ilə genişlənən xəstəliklərin qarşısının alınması üçün Hərbi Nazirliyin rəhbərliyi ilk növbədə hərbi müalicə ocaqlarının açılmasına və onların lazımi kadr və avadanlıqla təchiz edilməsinə ciddi əhəmiyyət verirdi. 1918-ci il dekabrın 14-də Gəncə praporşiklər məktəbinin 10 nəfərlik tibbi qəbul otağı, 1918-ci il dekabrın 15-də Hacıqabulda yerləşən 2-ci Bakı alayının 60 nəfərlik əsgər xəstəxanası, 1919-cu il yanvarın 1-də 1-ci piyada Cavanşir alayının 60 nəfərlik əsgər xəstəxanası, 2-ci Qarabağ süvari alayının 20 nəfərlik müayinə otağı,



1919-cu il fevralın 4-də Əlahiddə Zaqatala taborunun 20 nəfərlik əsgər xəstəxanası açıldı (153, v.172).

1919-cu və 1920-ci illər ərzində qoşun hissələrində və qarnizonda müalicə ocaqlarının sayı daha da artırıldı. Əvvəlcə əsgəri xəstəxanaların bə'ziləri ləğv edilib birləşdirildi, ya da onların sahəsi genişləndirildi. Məsələn, 1919-cu ilin yayında 1-ci Cavanşir piyada alayının nəzdindəki 60 nəfərlik əsgər xəstəxanası və 2-ci Qarabağ süvari alayının nəzdindəki 20 nəfərlik müalicə otağı ləğv edildi. Bu müalicə ocaqları Xankəndi əsgəri xəstəxanasına qatıldı (153, v.172). Ancaq mə'lumdur ki, bu alayların müalicə ocaqları sonradan yenə bərpa olundu. 1919-cu il noyabrın 8-də Lənkəran köməkçi taborunda 30 nəfərlik əsgəri xəstəxana açıldı. 30 nəfərlik əsgəri xəstəxana noyabr ayında həm də 3-cü Gəncə piyada alayının nəzdində açıldı. Gəncədəki əsgəri xəstəxananın xəstələrlə dolduğu və əlavə xəstə qəbul edə bilmək imkanı olmadığı üçün üçüncü alayda yeni əsgər xəstəxanasının açılması məqsədəuyğun bilinmişdi (153, v.214).

Bundan başqa, hərbi nazirin əmri ilə 1919-cu il noyabrın 24-də Şuşada 5 nəfər zabit və 100 nəfər əsgər üçün nəzərdə tutulmuş 105 nəfərlik əsgər xəstəxanası, 1920-ci il yanvarın 1-də Bakı şəhərində 5-ci Bakı piyada alayının əsgər xəstəxanası, 1920-ci il yanvarın 13-də Xankəndində 2-ci Qarabağ süvari alayının 30 nəfərlik müayinə otağı, 1920-ci il fevralın 1-də Xankəndində 1-ci Cavnşir piyada alayının 30 nəfərlik müayinə otağı açıldı (153, v.214; 106, v.87).

Hərbi nazirin əmri ilə bütün qarnizonlarda sanitar komissiyaları yaradıldı. Bu komissiyaların tərkibinə bir həkim, bir kiçik həkim və bir zabit daxil edilmişdi. Həmin komissiyalar həftədə iki dəfə qarnizonun şəhərciyində reyd keçirməli, qarnizonun binalarını, hərbi obyektləri, şəxsi hey'ətin paltarlarını, gigiyena vəziyyətini, yeməyin bişirilməsini yoxlamalı idilər (152, v.58).

Hərbi nazirin mə'ruzəsindən sonra 1919-cu ilin sonlarında Dövlət Müdafiə Komitəsi əsgər xəstəxanalarının lazımi dərman ləvazimatı ilə tə'min edilməsi üçün 2 milyon 200 min rubl vəsait ayırdı (99, v.2). Eyni zamanda əsgəri tibb müəssisələrinin fəaliyyətinə və bütünlükdə qoşunlarda tibb xidmətinin təşkilinə, şəxsi hey'ətin tibb xidməti ilə tə'min edilməsinə rəhbərlik edən hərbi xəstə hissəsinin ştatlarının və səlahiyyətlərinin genişləndirilməsi və onun idarəyə çevrilməsi barədə hökumət qarşısında məsələ qaldırıldı. Hökumətin razılığı ilə Hərbi Xəstə hissəsi Hərbi Xəstə İdarəsinə çevrildi (101a; v.15).

Tibbi xidmətin vəziyyətini yaxşılaşdırmaq üçün əsgər xəstəxanalarının ştatları da artırılmışdı (153, v.161). 1920-ci ilin yanvarından isə əsgər xəstəxanalarında işləyən feldşerlərin maaşı qaldırılmışdı (93, v.2).

Azərbaycan Ordusundakı bütün tibb ştatları mülki vəzifələr idi. Hətta xəstə hissəsinin və sonradan isə idarəsinin müdiri də mülki şəxs idi. Tibb

kadrları ya könüllülük, ya da səfərbərlik əsasında xidmətə cəlb edilirdilər. Uzun müddət Hərbi Xəstə hissəsinə, bu hissənin səlahiyyətləri genişləndirildikdən sonra isə Hərbi Xəstə İdarəsinə rəhbərlik edən həkim Bahadır bəy Qayıbov da səfərbərlik yolu ilə Azərbaycan Ordusuna çağırılmış və 1919-cu ilin iyun ayında ona tibb xidmətinə rəhbərlik etmək tapşırılmışdı (152, v.27).

Azərbaycan Ordusuna çağırılan həkimlərə mə'mur çini verilirdi. Bu həkimlər xüsusi forma geyinməli idilər ki, onu da dövlətdən ayrılan vəsaitin hesabına əldə edirdilər (153, v.145).

Lakin bir səfərbərlik yolu ilə tibb kadrlarına, xüsusilə kiçik sanitar hey'ətinə və feldşerlərə olan ehtiyacı ödəmək mümkün deyildi. Hərbi nazir 1919-cu ilin ilk aylarında Gəncə əsgər xəstəxanasının vəziyyəti ilə tanış olduqdan sonra dərhal ora hərbi hissələrdən 26 nəfər əsgərin gətirilməsi və onlardan sanitar kimi istifadə edilməsi barədə əmr verdi (152, v.98).

Sanitar hey'ətinə bütün əsgər xəstəxanalarında ehtiyac olduğu üçün nazir bu məsələnin ümumordu miqyasında həll edilməsi barəsində əmr verdi. 15 fevral 1919-cu il tarixli 78 saylı həmin əmrdə göstərilirdi ki, hərbi müalicə müəssisələrinin təcrübəli kiçik sanitar hey'əti ilə tə'min edilməsi üçün bütün hissələrdə 2 aylıq sanitar kursları açılmalı, bu kurslar üçün xüsusi proqram hazırlanmalı və hissə həkimləri tərəfindən tədris edilməli idi. Əmrə əsasən hər hissədən könüllülük əsasında 12 nəfər seçilməli və hissə komandirləri tərəfindən günün müəyyən edilmiş vaxtında onlar tibbi məşğələlər keçməli idilər (139, v.97).

Feldşer kadrlarının hazırlanması üçün orduda xüsusi məktəb açılmışdı. Belə bir məktəbin açılmasının təşəbbüskarı 1-ci Cavanşir alayının Şuşa şəhərində yerləşən birinci taborunun muzdlu xidmətçisi, həkim Mehmandarov olmuşdu. O, orduda azərbaycanlı tibb kadrlarına böyük ehtiyac olduğunu gördükdən sonra komanda üzrə hərbi nazirin qarşısında Feldşer məktəbinin açılması məsələsini qaldırmışdı. Hərbi Nazirliyin rəhbərliyi həkim Mehmandarovun təklifini böyük razılıqla qarşıladı. Xüsusilə ona görə ki, bu məktəbdə təhsilin Azərbaycan dilində aparılacağı bildirilirdi. Bu, özlüyündə böyük təşkilatçılıq işi tələb edirdi. Çünki tibb kadrları ancaq rus dilində təhsil almışdılar. Azərbaycan dilində heç bir dərslik və proqram yox idi. Azərbaycan əsgərlərinin rusca təhsil alması isə xeyli çətin idi. Azərbaycan dilində dərsliklərin, tədris materiallarının hazırlanmaması üzündən Şuşadakı Feldşer məktəbinin açılışı geciksə də nəhayət, bu məktəb işə başladı. Hərbi feldşer məktəbi 40 nəfər üçün nəzərdə tutulmuşdu və təhsil altı ay müddətində davam etməli idi (112, v.6).

Məktəbin tədris proqramına anatomiya, fiziologiya, cərrahiyyə, zöhrəvi xəstəliklər, göz xəstəlikləri, daxili xəstəliklər üzrə kursların keçilməsi və xəstələrə qulluq qaydalarının öyrədilməsi daxil idi (101a, v.29).



Hərbi nazirin əmri ilə Hərbi Feldşer məktəbinin fəaliyyətinə əlavə həkimlər də cəlb olunmuşdular. Bunlar həkim Ağayev və həkim Ağakişibəyov idi. Məktəbin əsasnaməsinə görə ora savadlı və Azərbaycan dilində danışmağı bacaran əsgərlər qəbul edilirdilər. Məktəbə daxil olmazdan əvvəl arzu edənlər sıra xidmətinin illik proqramını başa vurmalı idilər. Məktəbin bütün fəaliyyəti Hərbi Nazirliyin vəsaiti hesabına təşkil edilirdi və bu təhsil ocağı birbaşa Hərbi Xəstə idarəsinə tabe idi. Təhsil müddətinin sonunda müdavimlər imtahan verməli idilər. İmtahanı müvvəffəqiyyətlə verənlər bölük feldşeri hüqüqu alırdılar. Onlar sonradan əlavə imtahan verib tibb feldşeri hüququ əldə edə bilərdilər. Məktəbi qurtaranlar Azərbaycan Ordusunun hərbi qulluqçuları hesab edilirdilər və başqa hərbçilər kimi onlar da iki il xidmət etməyə borclu idilər (167, v.9).

Orduda tibbi müalicə şəbəkəsinin genişlənməsi və onun lazımi kadrlarla təchiz edilməsi üçün əhəmiyyətli işlər görülsə də bu orqanların fəaliyyəti, bütünlükdə qoşunlarda sanitar vəziyyət Hərbi Nazirliyin ciddi nəzarəti altında saxlanılırdı. Xidmətin ilk aylarında səhhəti korlanmış olan əsgərlər qısamüddətli mə'zuniyyətə buraxılırdılar ki, onlar evdə daha yaxşı qayğı ilə əhatə olunsunlar və tezliklə sağalıb xidmətə qayıtsınlar. Ancaq bu, heç də həmişə gözlənilən nəticəni vermirdi. Ona görə də nazir belə bir praktikaya son qoyulması barədə əmr verdi. Nazirin fikrincə, bu, əsgərlərdə hərbi əhval-ruhiyyənin formalaşmasına, xidməti vəzifələrinə məs'uliyyət aşılanmasına pis tə'sir etməklə bərabər, onların səhhətinin bərpasına lazımi kömək göstərmirdi. Nazir qısamüddətli mə'zuniyyətlər verilməsinin əvəzində səhhəti korlanmış və zəifləmiş əsgərlər üçün xüsusi komandaların yaradılmasını məqsədəuyğun bilirdi. Hər 150 nəfər üçün nəzərdə tutulan belə komandaların aşağıdakı məntəqələrdə yaradılması barədə göstəriş verildi: 1) Xankəndində, 1-ci Cavanşir piyada alayının nəzdində – Qarabağ general-qubernatorluğunda yerləşən qoşun hissələri üçün; 2) Qusarda, 2-ci Bakı piyada alayının nəzdinə – Bakı rayonunun hissələri üçün; 3) Nuxa şəhərində, 4-cü Zaqatala piyada alayının Nuxadakı bölüyünün nəzdində – Zaqatala ətrafındakı qoşun hissələri üçün; 4) Hacıkənddə, Praporşiklər məktəbinin nəzdində – Gəncə ətrafında yerləşən qoşun hissələri üçün. Bu komandaların formalaşdırılması adları çəkilən hissələrin komandirlərinə tapşırıldı (152, v.304).

Səhhəti zəif olanalar üçün yaradılan komandalar tibb obyektlərindən kənarda, boş qışlalarda və ya münasib bina və çadırlarda yerləşdirilməli idi. Komandaların komplektləşdirilməsi hərbi həkimlərin müayinəsi və qərarı ilə həyata keçirilirdi. Hissənin və ya əsgərlərin müalicə olunduğu xəstəxananın həkiminin qərarı ilə kimlərin səhhəti zəif olanlar üçün komandaya göndərilməsi müəyyənləşdirilir, bu barədə müvafiq hissə komandirinə mə'lumat verilirdi. Hissə komandirinin əmri ilə rəsmiləşdiriləndən sonra səhhəti zəif olan yaxınlıqdakı komandaya göndərildi. Həmin ko-

mandalar yerləşdikləri əraziyə görə Qusar, Nuxa, Hacıkənd və Xankəndi komandaları adlandırılırdı. Bu komandalar üçün yüngül xidmət rejimi müəyyənləşdirilmişdi. Əsgərlər vaxtaşırı həkimlər tərəfindən müayinə edilirdilər. Müalicə müddəti bitdikdən sonra əsgərlər yenidən həkim müayinəsindən keçir, onların nizami xidmətə yararlı olub-olmadığı müəyyənləşdirilirdi. Həkimlərin qərarından sonra əsgərlər ya nizami hissələrə, ya da köməkçi hissələrə göndərilirdi (152, v.304).

Təkcə səhhəti zəifləyənlər üçün olan komandalarda deyil, bütün qoşun hissələrində sanitar-gigiyena normalarına riayət edilməsi daimi nəzarət və qayğı altında idi. Xəstəliklərin çoxalması ilə döyüş hazırlığının zəifləməsinin qarşısını almaq üçün hərbi nazir də müvafiq əmrlər imzalayırdı. 1919-cu il iyunun 5-də nazirin imzaladığı 281 saylı əmr havaların hədsiz qızması ilə mədə-bağırsaq xəstəliklərinin, dizentiriya və xoleranın yayılması təhlükəsinin qarşısının alınmasına yönəldilmişdi. Nazir tələb edirdi ki, 1) bütün bölüklərdə, komandalarda, bölmələrdə qaynadılmış su saxlanması üçün xüsusi baklar düzəldilsin, onların qapaqları qıfılla bağlansın, yanına fincan qoyulsun və əsgərlər lazım olarsa ancaq qaynadılmış su içsinlər; 2) hansı hissənin ki, yaxınlığında su xətləri və mənbələri yoxdur, uzaqdan suyun daşınması üçün arbalar üzərində bərkidilmiş çəlləklərdən istifadə edilsin. Gətirilən su hissələrdə xüsusi çəlləklərdə saxlanılsın, onların gigiyena normaları qorunsun; 3) ləvazimat xidmətinin anbarlarında saxlanılan ehtiyatlar imkan verirsə bütün əsgərlər su qabları, çay içmək üçün fincanlar, çörək saxlamaq üçün torbalarla təchiz edilsin; 4) əsgərlərə çiy su içmək qadağan edilsin; 5) hər hansı zərurət üçün şəhər kanallarından və arxlarından su götürülməsinə icazə verilməsin; 6) bütün bölüklərdə, komandalarda əlüzyuyanlar qoyulsun və ondan istifadə edilməsinə nəzarət gücləndirilsin. Xüsusilə mətbəx əlüzyuyan, təmiz dəsmal və sabunla təchiz edilsin; 7) hissələrin həkimləri savadlı tərcüməçilərin vasitəsilə şəxsi hey'ətlə söhbətlər aparsın; səhhətin qorunması, xüsusilə xolerava xəstəliyinin profilaktikası barədə onlara lazımi məsləhət verilsin, 8) binalarda, həyətlərdə ayaq yollarında təmizliyin qorunması üçün ən qəti tədbirlər görülsün, ayaq yolları və zibil toplanan yerlər vaxtı-vaxtında dezinfeksiya edilsin, 9) bütün ərzaq növlərinin keyfiyyətinə, onların mühafizəsinə və milçəklərdən qorunmasına ciddi fikir verilsin (152, v.301).

Nazirin bu əmrdə irəli sürdüyü tələblər görünür hər yerdə lazımi şəkildə icra edilmədiyindən kütləvi xəstəliklərin qarşısını tamamilə almaq mümkün olmamışdı. Yuxarıdakı mə'lumatlardan görünürdü ki, bə'zi qarnizonlarda vəziyyət müəyyən qədər yaxşı olsa da bə'zi hissələrin əsgər xəstəxanalarında heç yer də çatmırdı. Ona görə də 1919-cu ilin noyabr ayında hərbi nazir profilaktik tədbirlərin gücləndirilməsi ilə bağlı yeni bir əmr imzaladı. Həmin əmrdə də yoluxucu xəstəliklərin qarşısının alınması üçün sanitar-gigiyenik tədbirlərin həyata keçirilməsinin zəruriliyi vurğulanırdı. Sanitar-gigiyenik tədbirlər içərisində nazir əsasən otaqlarda, yaşayış sahələrində təmizliyin saxlanmasına, əsgərlərin üst-başının yaxşı olmasına, başlıca yoluxma mənbəyi olan sudan düzgün istifadə edilməsinə, əsgərlərin lazımsız yerə, şəhərə buraxılmamasına, buna ehtiyac olduqda isə onların yerli əhali ilə az təmasda olmasına və s. məsələlərə ciddi diqqət yetirilməsini xüsusilə vurğulayırdı (153, v.212).

Müvafiq əmrləri imzalamaqdan əlavə hərbi nazir özü şəxsən əsgər xəstəxanalarında olur, onların vəziyyəti barədə ətraflı mə'lumat əldə edirdi. 1919-cu il yanvarın 19-da o, Gəncə dəmiryol stansiyasında baraklarda yerləşən 210 yerlik əsgər xəstəxanasında olmuş və gördüklərindən heç də razı qalmamışdı. Nazirin bildirdiyinə görə xəstələrin otaqları pis vəziyyətdə idi, qapı və pəncərələr möhkəmləndirilməmişdi, otaqlar çox soyuq idi. 275 nəfər üçün cəmi bir vanna var idi. Nazir tələb edirdi ki, vanna otağı ən azı üçə çatdırılmalı idi ki, yoluxucu xəstələrlə zöhrəvi xəstəliyə tutulanlar ayrıca vanna otaqlarında yuyunsunlar. Xəstəxananın həyət-bacası çox çirkli idi, səliqə və sahmana heç bir diqqət yetirilmirdi. Xəstəxanada keçinənlər 4-5 gün dəfn edilməmiş qalırdılar. Dəfn mərasimlərinin keçirilməsi üçün xəstəxanada molla yox idi. S.Mehmandarov Ümumi qərargahın rəisinə tapşırırdı ki, dərhal xəstəxanaya molla tə'yin etsin (152, v.32).

Sanitarların xəstəxanada öz vəzifələrini layiqincə yerinə yetirməməsi, xəstələr üçün bişirilən yeməklərin ən adi tələblərə cavab verməməsi, xəstələrə lazımi qayğı göstərilməməsi də hərbi nazirin ciddi narahatçılığına səbəb olmuşdu. Vəzifə borcunu tələb olunan səviyyədə yerinə yetirmədiyinə, məs'uliyyətsizlik və laqeydlik nümayiş etdirdiyinə görə əsgər xəstəxanasının baş həkimi Şpakovski və xəstəxananın təsərrüfat müdiri dərhal hərbi nazir tərəfindən tutduqları vəzifədən uzaqlaşdırıldılar. Bir neçə gündən sonra isə hərbi xəstə hissəsinin müdiri Sulakov da öz vəzifəsindən uzaqlaşdırıldı. Bununla bağlı imzaladığı müvafiq əmrdə hərbi nazir göstərirdi ki, vəzifədə olduğu iki ay müddətində Sulakov tam fəaliyyətsizlik göstərmiş və tibb xidmətlərinin təşkilində tam yararsızlığını nümayiş etdirmişdir (152, v.32,33).

Əsgər xəstəxanalarında tibbi xidmətin təşkili zamanı azərbaycanlı sanitarlardan az istifadə edilməsi, rus və erməni sanitarlarının işə daha çox qəbul edilməsi də hərbi nazirin narahatçılığına səbəb olmuşdu. Ona görə də o, Hərbi Xəstə hissəsinin müdirindən tələb edirdi ki, əsgər xəstəxanalarına daha çox azərbaycanlı sanitarları qəbul etsinlər və azərbaycanlı xəstə əsgərlərin xidmətində də məhz azərbaycanlı sanitarlar dayansınlar. Eyni zamanda nazir xəstələrə qarşı qayğı və səmimiyyətin artırılmasını tələb edirdi (153, v.258).

Hərbi nazir xəstəliklərin qarşısının alınması üçün şəxsi hey'ətin həm geyimlərinin, həm də yeməyinin yaxşılaşdırılmasını tələb edirdi (153, v.254;

152, v.32). Onun fikrincə, soyuq havada isti paltara malik olmayan və doyunca yedizdirilməyən əsgər həm də fərarilik etmək məcburiyyətində qalırdı (86, v.7). Ancaq hərbi nazir ordunun şəxsi hey'ətinin yemək və paltarla tə'min edilməsinə sadəcə məişət qayğısı kimi baxmır, onu hərbi xidmətin təşkilinin vacib sahələrindən biri sayırdı. 1919-cu il fevralın 25-də parlamentdəki çıxışında da S.Mehmandarov xidmətin təşkilinin bu sahəsi üzərində daha çox dayanmışdı. Onun qoşunlarda iaşənin təşkili barədə fikirləri yuxarıda göstərilmişdi. Bu qənaəti o, şəxsən hərbi hissələri gəzdikdən sonra əldə etmişdi. O, şəxsi hey'ətin məişətinin təşkilində elə bir səviyyəyə nail olmaq istəyirdi ki, xidmətə yeni gələn əsgər heç bir korluq çəkməsin, ev yaşayışı üçün darıxmasın və xidmətin çətinliklərini asanlıqla yaşasın. Əsgərin xidmətə bağlılığı isə ilk növbədə geyim və iaşədən başlayırdı. Müəyyən imkanların olmasına baxmayaraq iaşənin təşkilində subyektiv çətinliklər yaradılmasına qarşı həm hərbi nazir, həm də onun müavini Ə.Şıxlinski barışmaz mövqe tuturdu. Hərbi nazirin ardınca Ə.Şıxlinski də nazir müavini tə'yin olunan kimi dərhal hissələrlə şəxsən tanışlığa başladı. Əgər Zaqatalada xidmətin qurulması, iaşənin yaxşı təşkili, yeməklərin ə'la səviyyədə olması onu razı salmışdısa (89, v.61), 1919-cu il yanvarın əvvəllərində Gəncə Milli hərbiyyə məktəbində, Topçu diviziyonunda iaşənin təşkili onu heç də razı salmadı. Burada əsgərlərə səhər-axşam eyni yemək bişirilib verilir, menyunun müxtəlif olmasına diqqət yetirilmirdi. Nazirin imzaladığı müvafiq əmrlə tələb olunurdu ki, əsgərlərə verilən şəkərin və çayın miqdarı artırılsın, onlara həmişə adət etdikləri milli yeməklər bişirilib verilsin (86, v.5).

Bu fikrini nazir Parlamentdəki çıxışında da xüsusi vurğulayırdı. O bildirirdi ki, türk qoşunları Azərbaycanı tərk edərkən kifayət qədər ərzaq ehtiyatı saxlamışlar. Bu ehtiyatlar qoşunların iaşəsini gücləndirməyə imkan verirdi. Ərzaq normalarının artırılması barədə nazir xüsusi bir əmr imzalamışdı. Bundan sonra o, tələb edirdi ki, yad ölkələrin mədəniyyətinə mənsub olan yeməklərin bişirilməsinə son qoyulsun, qoşunlara bozbaş, dolma kimi yeməklər, həftədə bir dəfədən az olmayaraq plov verilsin. Nazir bildirirdi ki, şəkər və qənd normalarının artırılması əsgərlərə səhər və axşam qaynar çay içmək imkanı verirdi. Yoluxucu xəstəliklərin epidemiyası yayılanda isə nazir çay və şəkər normasını daha da artırmışdı ki, əsgərlər bütün gün ərzində çiy su içməsinlər, özlərini qaynar çayla tə'min edə bilsinlər (58, v.6).

1919-cu ilin əvvəlindən şəxsi hey'ət üçün ərzaq normaları aşağıdakı şəkildə müəyyənləşdirilmişdi. Hər bir adam üçün gündəlik ət norması 3/4 funt miqdarında tə'yin edilirdi. Onun da 2/4 funtu nahar yeməyinə 1/4 funtu isə axşam yeməyinə ayrılmalı idi. Bişirilən yeməyə qatılmaq üçün göy-göyərti, duz, istiot və digər ədviyyat da ayrılmışdı. Şəkər norması adambaşına 6 zolotnik, çay isə 0,5 zolotnik həcmində müəyyənləşdirilmişdi. Çörək



adambaşına 2,25 funt miqdarında olmalı idi. Əsgərlər üçün müəyyənləşdirilmiş bu payok bütün generallara, zabitlərə, müharibə dövrünün mə'murlarına da verilməli idi. Ancaq onlar üçün çay və şəkər artırılmış normada müəyyənləşdirilmişdi. Generallar 15 funt şəkər, 1,5 funt çay, qərargah zabitləri 10 funt şəkər, 1 funt çay, baş zabitlər 5 funt şəkər, 0,5 funt çay, mə'murlar isə 3 funt şəkər, 0,25 zolotnik çay ala bilərdilər (116, v.1).

Hərbi nazirin əmri ilə Azərbaycan Ordusu üzrə həm isti yemək bişirilməsi üçün norma, həm də bütünlükdə iaşə norması və onların qiymətləri təsdiq edilmişdi. İsti yemək hazırlanması üçün norma və qiymət aşağıdakı şəkildə müəyyənləşdirilmişdi (bax:106, v.36);

| Ərzağın adı | Ərzağın miqdarı | Gəncə, Bakı, Zaqatala quberniyalarında | | Bakı şəhərində | | Qeyd |
|---|---|---|---|---|---|---|
| | | rubl | qəpik | rubl | qəpik | |
| ət | 0,75 funt* | 8 | 57,00 | 12 | 11,00 | |
| duz | 11 zolot** | - | 17,19 | - | 12,89 | |
| təzə göyərti | 60 zolot. | 1 | 87,50 | 2 | 18,80 | |
| quru göyərti | 4 zolot. | 1 | 87,50 | 2 | 18,80 | |
| yağlar | 10 zolot. | 3 | 82,00 | 4 | 51,00 | |
| un | 4 zolot. | - | 31,25 | - | 32,29 | |
| istiot | 1/6 zolot. | - | 2,08 | - | 2,08 | |
| **Ümumi məbləğ** | **-** | **14** | **77,02** | **19** | **28,06** | |
| **Yuvarlaqlaşdırılmış məbləğ** | **-** | **15** | **-** | **19** | **-** | |

**İsti yemək hazırlanması üçün müəyyənləşdirilmiş ərzağın qiyməti cədvəli**

İsti yemək üçün müəyyənləşdirilmiş ərzaq bütünlükdə gündəlik iaşə normasının tərkibinə daxil idi. Gündəlik iaşə norması və onun qiyməti isə aşağıdakı şəkildə müəyyənləşdirilmişdi (106, v.37):

| Ərzağın adı | Ərzağın miqdarı | Ərzağın qiyməti | |
|---|---|---|---|
| | | rubl | qəpik |
| ət | 0,75 funt | 8 | 57.00 |

* 1 funt = 409,5 qr.
** 1 zolotnik = 4,260 qr.

| | | | |
|---|---|---|---|
| duz | 11 zolot. | - | 17.19 |
| təzə göyərti | 60 zolot. | 1 | 87.50 |
| quru göyərti | 4 zolot. | 1 | 87.50 |
| yağlar | 10 zolot. | 3 | 82.00 |
| un | 4 zolot. | - | 31.25 |
| istiot | 1/6 zolot. | - | 2.08 |
| çörək | 2 funt | 10 | - |
| yarma | 24 zolot. | 2 | 75.00 |
| şəkər | 6 zolot. | 2 | 50.00 |
| çay | 0,5 zolot. | - | 78.12 |
| **Ümumi məbləğ** | - | **30** | **80,14** |
| **Yuvarlaqlaşdırılmış məbləğ** | - | **31** | - |

**İaşə normasına daxil olan ərzaq növlərinin miqdarı və qiymətinin cədvəli**

Ordunun ərzaqla tə'minatına Ləvazimat İdarəsi birbaşa məs'uliyyət daşıyırdı. Bu xidmətin təşkili üçün türk qoşunlarının Azərbaycanda olduğu vaxtla müqayisədə müəyyən dəyişikliklər edilmişdi. Yuxarıda göstərildiyi kimi qoşunların ərzaqla tə'minatının təşkili üçün Gəncə, Ağdam və Hacıqabulda ərzaq anbarları yaradılmış və hansı hissənin hansı anbardan təchiz edilməsi müəyyənləşdirilmişdi. Ərzağın alınmasında, toplanmasında hissələrə də müəyyən səlahiyyətlər verilmişdi. Yerlərdə ərzaq ancaq təsdiq edilmiş qiymətlər çərçivəsində alına bilərdi. Ancaq qiymətlərin bahalanması ilə bağlı bu heç də həmişə mümkün olmurdu.

Ərzaq ehtiyatlarının toplanması ilə əsasən Ləvazimat İdarəsi məşğul olurdu. Qoşunların sayının artması ilə Ləvazimat İdarəsi ərzaq anbarının sayını da artırmışdı. Sonradan Bakıda, Zaqatalada, Xankəndində, Qusar və Lənkəranda da ərzaq anbarları yaradılmışdı. Qarnizonların hər birinin öz ərzaq anbarı var idi. Əlavə maliyyə xərclərinə yol verilməməsi üçün ərzağın alınması da müsabiqə yolu ilə keçirilirdi. Müsabiqələrin keçirilməsi üçün əvvəldən e'lanlar verilirdi. Bu e'lanlarda böyük partiyalarda un, taxıl, arpa, preslənmiş və preslənməmiş ot, saman, çay, şəkər, duz, sabun və s. əşyaların tədarükünə imkanı olanlar müsabiqəyə də'vət edilirdilər. Müsabiqədə iştirak edənlər tələb olunan əşyaları hansı qiymətə, hansı şərtlərlə sata bilmələri haqqında ətraflı mə'lumat hazırlayıb ağzı bağlı zərflərdə müsabiqəni keçirən komissiyaya təqdim etməli idilər. İcraçı şəxslər satacaqları əşyaları yuxarıda adları çəkilən ərzaq anbarlarından birinə təqdim edə bilərdilər (120, v. 20).

Ordu üçün alınan ərzaq əşyaların hansı keyfiyyətdə olmasının normaları da müəyyənləşdirilmişdi. Ərzaqlar istər Ləvazimat İdarəsi tərəfindən



bazardan alınanda, istərsə də müsabiqə yolu ilə tədarük ediləndə həmin keyfiyyət normaları gözlənilməli idi. Həmin keyfiyyət normaları aşağıdakı şəkildə təsdiq edilmişdi.

Buğda – dənələri dolu, quru, təmiz, qabığı nazik, içərisi ağ və parazitsiz olmalı idi. Bütün buğdalar eyni ölçüdə, eyni formada, açıq parlaq rəngdə olmalı idi. Oval şəklində olan dənlərə üstünlük verilirdi. Belə dənlərin kraxmalı çox olurdu. Ölçülərinə görə dənlər üç yerə bölünməli idi – böyük, orta və kiçik. Buğdanın nəmliyi 13-19 faiz arasında olmalı idi.

Un - quru buğdadan döyülməli, təzə qoxuya və dada malik olmalı, nəmliyi 13,5 faizdən yuxarı qalxmamalı idi. Turş və acı tama malik un keyfiyyətsiz sayılırdı. Unun qatışığı da müəyyən ölçüdə olmalı idi. 12 nömrəli ələklə ələnəndə unda heç bir qatışıq və çöküntü qalmamalı idi. 20 nömrəli ələklə ələnəndə isə keyfiyyətli ununun 3,5 faiz çöküntüsü qala bilərdi.

Qurudulmuş çörək (suxarı) - yaxşı qurudulmalı, yaxşı keyfiyyətə malik olan undan hazırlanmalı idi.

Qreçka yarmasının nəmliyi 13,5 faiz olmalı, yaxşı təmizlənməli idi. Onun daxilində əlavə qatışıqlar 0,5 faizindən, yetişməmiş dənlər isə 1 faizdən artıq olmamalı idi.

Ət - 2-10 yaşında olan və ağırlığı ən azı 6 pud olan, yeni kəsilən heyvanlardan hazırlanmalı ili. Arıq heyvanların əti keyfiyyətsiz sayılırdı. Kəsilən ət baytar həkimi tərəfindən yoxlanılmalı və onun möhürü vurulmalı idi. Şəxsi hey'ətə xüsusi halda soyuducuda saxlanmış ət verilə bilərdi. Bu vaxt onun kəsilmə müddəti üç həftədən artıq olmamalı idi. Buzlaşdırılmış ət isə 6 aydan artıq saxlanmamalı idi. Qoyun əti - 5 yaşından yuxarı olmayan və diri çəkisi 1 pud 2 funtdan az olmayan, orta köklükdə olan qoyunlardan hazırlanmalı idi.

Kələm - möhkəm, sıx, şaxta vurmamış, göy və çürümüş yarpaqlardan təmizlənmiş və ləkəsiz görkəmdə olmalı idi.

Kartof - nazik qabıqlı, üstü hamar, çürüməmiş, cücərməmiş, ləkəsiz yemək sortundan olmalı idi. Kəsilən kartofun daxili ağ və ya sarı olmalı idı.

Soğan - möhkəm, qatları sıx, şirəli, çürüməmiş olmalı idi. Şaxta vurmuş və üzərində qara ləkələri olan soğanlar keyfiyyətsiz sayılırdı. Kəsilən soğanın daxili ağ, özü isə kəskin soğan qoxusuna malik olmalı idi.

Qənd – kəllə və ya qıçalanmış şəkildə ola bilərdi. Kəllə qənd ağ kristal şəklində olub azacıq göyümtül rəngə çalmalı idi. Üstündə heç bir ləkəsi olmamalı idi. Qıçılanmış qəndin 60-70 dənəsi bir funtu təşkil etməli idi. Qaçalanmış qəndin içində ufantı və qırıntı 1,5 faizdən artıq olmamalı idi.

Çay – açıq və preslənmiş formada ola bilərdi. Onlar üç qat kağıza bükülməli, qatışıqsız olmalı, qara rəngə çalmalı idi (bax: 120, v.1-13).

Atlar üçün tədarük olunan yemin də keyfiyyət göstəriciləri müəyyən edilmişdi və yem ehtiyatı toplanarkən həmin göstəricilər əsas tutulmalı idi (120, v. 13-14).

Tədarük olunan ərzağın, ot və ələfin istifadəsində qanunsuzluğa, artıq məsrəflərə yol verməmək üçün 1919-cü ilin aprel ayında onların mühafizəsi və daşınması zamanı yol veriləcək itkilərin norması da müəyyənləşdirilmişdi. Nazirin müvafiq əmri ilə təsdiq olunmuş bu normativləri aşan itkilər üçün cavabdeh şəxslər məs'uliyyət daşıyırdılar (bax 89, v.41-42).

| Əşyaların adı | Anbarda saxlanılan zaman %-lə | Dəmir yolu və su ilə daşınan zaman %-lə | Şosse və torpaq yolu ilə daşınan zaman %-lə |
|---|---|---|---|
| çörək | 0,25 | 1,5 | 2,0 |
| qurudulmuş çörək | 0,25 | 0,75 | 1,0 |
| yarma | 0,5 | 0,8 | 1,0 |
| darı yarması | 0,75 | 1,25 | 1,5 |
| un | 0,65 | 0,5 | 1,0 |
| çay | 0,1 | 0,25 | 0,25 |
| qiçalanmış qənd | 0,1 | 0,25 | 0,4 |
| şəkər tozu | 0,5 | 0,8 | 1,0 |
| duzlu sala | 0,25 | 0,5 | 0,75 |
| kərə yağı | 0,5 | 0,5 | 1,0 |
| düyü | 0,5 | 0,8 | 1,0 |
| makaron | 0,25 | 0,5 | 1,0 |
| duzlu kələm | 0,7 | 0,5 | 0,75 |
| duz | 0,4 | 1,0 | 1,5 |
| istiot | 0,3 | 0,25 | 0,5 |
| soğan | 0,25 | 0,5 | 0,75 |
| arpa | 0,8 | 0,8 | 1,0 |
| arpa və döyülmüş qarğıdalı | 0,8 | 0,8 | 1,0 |
| preslənmiş ot | 1,5 | 1,5 | 2,0 |
| preslənmiş saman | 1,5 | 3,0 | 5,0 |
| sabun | 1,0 | 0,25 | 0,5 |

**Ərzaq və yem əşyalarının saxlanması və daşınması zamanı yol veriləbiləcək itkilərin miqdarı cədvəli**



Hərbi Nazirliyin ərzaq ehtiyatı təkcə pulla alınan əşyalar hesabına yaradılmırdı. Azərbaycan hökuməti özünün 19 avqust 1919-cu il tarixli qərarı ilə Əkinçilik Nazirliyinə tapşırdı ki, Quba, Göyçay, Cavad, Nuxa və Ərəş qəzalarında kirayəyə verilmiş torpaqlardan kirayə haqqı kimi hökumətə alınan bütün natural məhsullar Hərbi Nazirliyin ərzaq anbarlarına verilsin (105, v. 51). Bu məhsullar ehtiyacın bir hissəsini ödəyirdi, ərzağın əsas hissəsi isə bazardan alınmaqda idi. Hökumət tərəfindən 1919-cu il üçün həmin il aprel ayının 9-da təsdiq etdiyi hərbi xərclərin smetası (105, v.19) bu bahalaşma ilə tam şəkildə ayaqlaşa bilmirdi. O biri tərəfdən, 1919-cu ilin yayında və payızında çoxsaylı qoşun hissələrinin yaradılması ərzaq ehtiyatının xeyli artırılmasını tələb edirdi. Ona görə də icraçılarla bağlanmış müqavilələr də tezliklə öz gücünü itirir, heç kəs köhnə qiymətlər əsasında malını satmaq istəmirdi. Bu məsələ 1919-cu ilin noyabr ayında Hərbi Şuranın iclasında xüsusi olaraq müzakirə edilmişdi. İclasın kedişində aydın olur ki, ərzaq ehtiyatı yaradılması üçün hələ havalar soyumamışdan müəyyən tədbirlər görülmüşdü. Podrad təşkilatlarla bir pud taxılı 145 rubla, arpanı 60 rubla və otu 20 rubla almaq üçün müqavilələr imzalanmış, hətta avans da verilmişdi. Lakin sonra qiymətlər bahalaşdığı üçün sahibkarlar müqavilə şərtlərinə əməl etmədilər və Hərbi Nazirliyə çox az miqdarda ərzaq verdilər. Məsələnin həllinə nail olmaq üçün yerlərə xüsusi komissiyalar göndərildi. Ancaq bu komissiyalar da yaranmış vəziyyətdən çıxış yolu tapa bilmədilər. Yalnız Zaqatala və Xankəndində 7 min pud taxıl və arpa alınmışdı. Lənkəranda isə həddən artıq az məhsul satın alınmışdı (98, v.69).

Toplanan 7 min puddan bir qədər artıq taxıl və yoncanın hərbi ehtiyatları nə qədər ödəyə biləcəyini təsəvvür etmək üçün nəzərdə tutulan tədarük planına nəzər yetirmək lazımdır: taxıl - 570 min pud, düyü - 78 min 750 pud, ot - 45 min pud, yonca - 450 min pud və s. (97, v.129).

Ərzaq tədarükü üçün müəyyənləşdirilmiş xərclərin vaxtında ayrılması və Hərbi Nazirliyin hesabına keçirilməsində də fasiləlik yaranmışdı ki, bu da ərzaq ehtiyatının vaxtında toplanmasına mane olurdu (97, v.130).

Bazarda daimi bahalaşma getdiyi üçün Ləvazimat İdarəsinin e'lan etdiyi alqı-satqı müsabiqələri də baş tutmurdu. 1919-cu ilin payızı, 1920-ci ilin əvvəlləri e'lan olunmuş müsabiqələrin demək olar ki, heç biri baş tutmamışdı. Sahibkarların heç biri əvvəldən bağlanmış qiymətlər əsasında məhsul satmaq istəmirdilər. Ona görə ordunun Ləvazimat İdarəsinin rəisi də Hərbi Nazirliyin rəhbərliyi qarşısında vəsatət qaldırmışdı ki, müsabiqələrin keçirilməsinə son qoyulsun, xüsusi komissiyalar təşkil edilsin və həmin komissiyalar bazardan lazım olan ərzağı alsın və sonra da onu aktlaşdırsınlar (120, v.25-40).

Böyük miqdarda ərzaq ehtiyatlarının alınması üçün sahibkarlarla müqavilə bağlanması bə'zən başqa səbəblərə görə də özünü doğrultmurdu.

Məsələn, bir sıra hissələrə sahibkarlar müqavilə şərtlərinə uyğun gəlməyən aşağı sortlu ət gətirirdilər. Hərbi nazir 1920-ci il 5 yanvar tarixli 13 saylı əmrində belə halların qarşısının alınmasını qətiyyətlə tələb edirdi. O tə'kid edirdi ki, hissələrə gətirilən ət məhsulları baytar həkimi tərəfindən yoxlansın və lazımi tələblərə cavab vermədikdə geri qaytarılsın. Eyni zamanda ətı tədarük edən sahibkar məcbur edilsin ki, öz hesabına bazardan yaxşı ət alıb hissəyə gətirsin (92, v. 17).

Mövcud olan obyektiv çətinliklər ordunun iaşə tə'minatına da öz tə'sirini göstərirdi. 1919-cu ilin oktyabr və noyabr aylarında bütün hissələrdə, xüsusilə də Qarabağda olan hissələrdə bu sahədə bir gərginlik yaranmışdı. (119, v.17).

Bu gərginliyi müəyyən qədər səngitmək üçün Hərbi Şuranın iclaslarında ət əvəzinə əskərlərə xaricdə istehsal olunmuş konservlərin alınıb-verilməsi təklifləri də irəli sürülürdü (97, v.25). Ancaq elə Hərbi Şuranın iclaslarında o da vurğulanırdı ki, konserv alınmasına son qoymaq lazımdır. Çünki əsgərlər konserv yemirdilər (97, v.6).

Ordunun ərzaq tə'minatında yaranmış gərginlikdən bir çoxları sui-istifadə etməyə çalışırdılar. Hərbi Nazirliyin rəhbərliyinin əldə etdiyi mə'lumatlara görə, ayrı-ayrı məs'uliyyətsiz şəxslər qoşun üçün nəzərdə tutulan qəndi və şəkəri hissədən çıxararaq kənara satır, ya da digər lazımi əşyalara dəyişirdilər. Hərbi nazirin 23 iyun 1919-cu il tarixli 317 saylı əmrində göstərilirdi ki, ordunun özündə hazırda böyük ehtiyac duyulan bu ərzağın satılması və ya dəyişdirilməsi yolverilməzdir və buna son qoyulmalıdır. Əmrdə inanılması mümkün olmayan bu bəlanın aradan qaldırılması üçün hissə komandirləri tərəfindən müvafiq tədbirlərin görülməsinin zəruriliyi vurğulanırdı. Əmrdə o da təsdiqlənirdi ki, Hərbi Nazirlik tərəfindən də müvafiq komissiyalar yaradılacaq və ərzağın saxlanılması yoxlanılacaqdır (90, v.20).

Qoşunlar üçün ayrılmış ərzağın istifadəsində yol verilən başqa bir neqativ halla şəxsən Hərbi nazir S. Mehmandarov özü rastlaşmışdı. Azərbaycanın qoşun dəstələrinin Lənkəran ətrafında keçirdiyi əməliyyatdan sonra S. Mehmandarov bura gəlmiş və Lənkəran köməkçi (ehtiyat) taborunda xidmətin təşkili ilə yaxından tanış olmuşdu. Əsgərlərin iaşəsi ilə maraqlananda aydın olmuşdu ki, hissə komandiri ştabs-kapitan Əliyevin əmri ilə 341 nəfərlik yemək üçün 4 pud 10,5 ət yerinə qənaət məqsədilə 2 pud 5 funt ət ayrılmışdı. Bu fakt naziri çox təəccübləndirmiş və bununla bağlı 1919-cu il 14 sentyabr tarixli 407 saylı xüsusi əmr imzalamışdı. Nazir tə'kidlə bildirirdi ki, ərzaq tə'minatında yaranan gərginlik heç də o demək deyildir ki, yersiz və lüzumsuz qənaət edilməlidir. S. Mehmandarov tələb edirdi ki, əsgərin mə'dəsi hesabına heç bir qənaətə yol verilməməlidir. Əsgər üçün ayrılan ərzaq bütünlüklə əsgərə çatdırılmalıdır (134, v. 121).



Yaranmış gərginlikdən hökumətin köməyi olmadan çıxmaq olmazdı və bu kömək də imkan daxilində ardıcıl olaraq göstərilirdi. Əsgər və zabitlərin tə'minatı ilə bağlı məsələlərə həm hökumətin iclasında baxıldı (106, v. 85), həm də Hərbi Şuranın iclaslarında bu məsələlərlə bağlı bir sıra müvafiq qərarlar çıxarıldı. 1920-ci ilin fevral-mart aylarında ərzaq və iaşə tə'minatı ilə bağlı hərbi nazirin müvafiq əmrləri imzalandı. Hökumətlə razılaşdırıldıqdan sonra qoşunlar üçün ərzaq əşyalarının yeni satınalma qiymətləri təsdiq edildi. Bu satınalma qiymətləri respublikanın müxtəlif bölgələrində bazar qiymətləri nəzərə alaraq müəyyənləşdirilmişdi (106, v.158).

Ərzaq məhsullarının bahalaşması ilə əlaqədar olaraq əsgərlərin gündəlik iaşə normasına daxil olan ərzağın qiymətində də dəyişiklik edildi və gündəlik iaşə üçün ayrılan pulun miqdarı xeyli artırıldı. İsti yemək hazırlanması üçün ayrılan ərzağın miqdarı və qiyməti aşağıdakı şəkildə təsdiq edilmişdi (bax: 106, v. 158):

| Ərzağın adı | Ərzağın gündəlik miqdarı | Bakıdakı qiymətlər | | Gəncədəki qiymətlər | | Digər bölgələrdəki qiymətlər | |
|---|---|---|---|---|---|---|---|
| | | rubl | qəpik | rubl | qəpik | rubl | qəpik |
| ət | 0,75 funt | 18 | 21 | 18 | 21 | 16 | 93 |
| duz | 11 zol | - | 57 | - | 57 | - | 57 |
| təzə göyərti | 60 zol | 6 | 06 | 5 | 56 | 5 | 56 |
| quru göyərti | 4 zol | 6 | 06 | 5 | 56 | 5 | 56 |
| yağlar | 10 zol | 10 | 95 | 10 | 28 | 9 | 24 |
| un | 4 zol | - | 53 | - | 50 | - | 50 |
| istiot | 16/1 zol. | - | 34 | - | 34 | - | 34 |
| ümumi məbləğ | - | 40 | 76 | 35 | 46 | 33 | 14 |
| yuvarlaqlaşdırılmış məbləğ | - | 40 | - | 35 | - | 33 | - |

**Kündəlik isti yeməyin hazırlanması üçün ayrılan ərzağın miqdarı və qiymət cədvəli**

Bütünlükdə hərbi qulluqçuların gündəlik iaşə normasına daxil olan ərzağın miqdarı və qiyməti aşağıdakı kimi təsdiq edilmişdi (bax: 106, v. 159):

| Ərzağın adı | Ərzağın miqdarı | Ərzağın qiyməti | |
|---|---|---|---|
| | | rubl | qəpik |
| ət | 0,75 funt | 16 | 93 |

| | | | |
|---|---|---|---|
| duz | 11 zol | - | 57 |
| təzə göyərti | 60 zol | 5 | 56 |
| quru göyərti | 4 zol | 5 | 56 |
| yağlar | 10 zol | 9 | 24 |
| un | 4 zol | - | 50 |
| istiot | 16/1 zol | - | 34 |
| çörək | 2 funt | 24 | 30 |
| qənd | 6 zol | 9 | - |
| yarma | 24 zol | 4 | 85 |
| çay | 0,5 zol | 1 | 82 |
| ümumi məbləğ | - | 73 | 31 |
| yuvarlaqlaşdırılmış məbləğ | - | 73 | - |

**Gündəlik iaşə normasına daxil olan ərzağın miqdarı və qiymət cədvəli**

Novruz bayramının gəlişi münasibətilə Hərbi nazirin əmrinə əsasən əsgərlərə xüsusi bayram yeməyi hazırlanırdı. Bu yeməklər üçün buraxılan ərzağın miqdarı artırılır və xüsusi hazırlanan bu yeməklə əsgərlərdə bayram əhval-ruhiyyəsinin yaradılmasına sə'y göstərilirdi (94, v.27).

Normal xidmət şəraitinin yaradılması üçün əsgərlərin imkan daxilində mümkün olan hər şeylə tə'min edilməsi, qayğı altına götürülməsi, onların yaxşı yedizdirilməsi, əsgərin ziyanına hər hansı bir qənaətə yol verilməməsi üçün zəruri tədbirləri həyata keçirən Hərbi Nazirliyin rəhbərliyi ordunun aparıcı qüvvəsi olan zabitlərin həyat şəraitinin yaxşılaşdırılmasını, onları ehtiyaclardan xilas edəcək maliyyə vəsaiti ilə tə'min edilməsini də diqqətdən kənarda qoymurdu. Zabit zəhmətinin gərginliyinə yaxşı bələd olan nazir S. Mehmandarov, eləcə də onun müavini bu insanların şərəfini həmişə yüksək tutmağa çalışmış və onların məişət problemlərinə də böyük qayğı ilə yanaşmışdılar. Bu baxımdan hərbi qulluqçuların xidmət maaşları ilə vaxtında tə'min edilməsi, onun real həyat səviyyəsinə uyğun qəbul edilməsi sahəsində nazirliyin rəhbərliyinin tutduğu mövqə daha xarakterikdir. Məsələn, belə bir fakt mə'lumdur ki, zabit hey'ətinin maaşının verilməsi gecikdiriləndə Hərbi Nazirliyin rəhbərliyi dərhal Nazirlər Şurasının qarşısında məsələ qaldırmışdı. Nazirlər Şurası isə Hərbi Nazirliyin rəhbərliyinin qaldırdığı məsələ ilə razılaşıb mövcud olan çətinliklərə baxmayaraq zabit hey'ətinin maaşlarının vaxtında ödənməsi üçün Maliyyə Nazirliyinə göstəriş vermişdi. Növbəti ayda isə Nazirlər Şurasının göstərişi ilə zabit hey'ətinin maaşları vaxtından hətta 15 gün əvvəl ödəndi və Hərbi Nazirliyə xəbər göndərildi ki, həmin vəsait alınıb zabitlərə paylansın (93, v. 21,35).



General S. Mehmandarov Hərbi Nazirliyin fəaliyyətə başlanmasının elə ilk günlərindən zabitlərin maaşlarının artırılması məsələsini qaldırdı. Bu məsələnin zəruriliyini, o, parlamentdə çıxış edərkən belə əsaslandırdı: 1) cəbhədə olmuş bütün zabitlər istisnasız olaraq özlərinin əmlakının, geyiminin, baqajının böyük bir hissəsini itirmişlər. Onlar bu əşyaları ömürləri boyu qazanmışdılar və indi onu bərpa etmək mümkün deyil. Mümkün olsa da indi bir manatlıq əşyaya 30-40 manat xərcləməlidirlər; 2) fövqəl'adə bahalıq əhali üçün ağırdır, zabitlər üçün isə xüsusilə ağırdır. Çünki onların çoxu evlərindən çox-çox uzaqda xidmət edirlər, ya da tez-tez e'zamiyyətlərdə olurlar; 3) zabit əsgərləri tərbiyə etməli və onları ölümə aparmağı bacarmalıdır. Onun üçün zabit əsgərlərin qarşısında nüfuza malik olmalıdır. Bu isə onun fərdi keyfiyyətləri nəticəsində mümkündür. Bunun üçün zabit özünün xarici görkəmi ilə də hörmət qazanmalıdır. Zabit həmişə nümunəvi qaydada geyinməlidir. İndiki zamanda isə onun geyimi və təchizatı çox böyük pul tələb edir; 4) Azərbaycanın təcrübəli zabitlərə çox böyük ehtiyacı var. Ona görə başqa millətlərdən olan, o cümlədən rus ordusunda xidmət etmiş şəxsləri də'vət etmək lazım gəlir. Yeni yaradılan ordu üçün ciddi seçmə aparmaq lazımdır. Heç vaxt əsgəri xidmət keçməmiş xalqdan təşkil edilmiş orduda çavuşlarsız keçinmək mümkün deyil və çox iste'dadlı zabitlərə ehtiyac vardır. İste'dadlı zabitlər isə özlərinə hər yerdə yaxşı maaşlı iş tapa biləcəklərindən onları yüksək maaşla maraqlandırmaq lazımdır; 5) Keçmiş müsəlman ordusunun ştatları ilə tə'yin edilmiş və 5 ay ərzində zabitlərə verilmiş maaş o vaxt çox görünsə də indi zabitlərin ən zəruri ehtiyaclarını güclə ödəyir. Qiymətlərin daimi artması üzündən bu maaşların azaldılması deyil, onun qaldırılması haqqında danışmaq məcburiyyətindəyik; 6) Çox da böyük vəsait almayan şəxslərin maaşının azaldılması, heç şübhəsiz, onun işinin keyfiyyətinə əks-tə'sir göstərəcəkdir; 7) Zabitlərin xidməti təkcə müharibə dövründə deyil, həm də sülh dövründə ağır şəraitdə keçir. Primitiv şəraitdə, əsasən gözdən-qulaqdan uzaqda yaşayan zabitlər tez-tez açıq havada, qar və yağış altında gecələməli olur. Vətən uğrunda səhhətlərini, bə'zən hətta canlarını belə əsirgəmirlər (58, v.2-3).

Zabitlərdən başqa əsgər hey'əti üçün də aylıq məvacib müəyyənləşdirilmişdi. Azərbaycan hökumətinin qərarına əsasən 1918-ci il dekabrın 1-dən əsgər hey'əti üçün aşağıdakı miqdarda məvacib verilməsi qüvvəyə mindi: sıravı–50 rubl, yefreytor–60 rubl, kiçik çavuş–70 rubl, böyük çavuş–90 rubl, onbaşı–120 rubl (86, v. 25).

Bundan başqa əsgərlər üçün ayda üç rubl təsərrüfat pulu da verilirdi (92, v. 55). Bu pul əsgərlərin geyimlərinin bərpası və digər kiçik məişət xərcləri üçün nəzərdə tutulmuşdu.

İqtisadi çətinliklərlə bağlı həyat şəraitinin ağırlaşması, qiymətlərin bahalaşması 1919-cu il ərzində də davam etdi. Həmin ilin yayında Hərbi Nazirliyin rəhbərliyi həm əsgər hey'əti, həm də zabit hey'əti üçün məvacib-

lərin yenidən artırılması məsələsini qaldırdı. Hərbi Şura özünün 16 iyun 1919-cu il tarixli iclasında əsgərlər üçün aylıq məvacibi aşağıdakı şəkildə təsdiq etdi: sıravi–100 rubl, yefreytor–110 rubl, kiçik çavuş–130 rubl, böyük çavuş–150 rubl, onbaşı–200 rubl (97, v.70).

Hərbi nazir S. Mehmandarov əsgərlərin həyat şəraitinin yaxşılaşdırılması üçün onlara ayrılan məvacibin artırılmasına lazımi əhəmiyyət verirdi. Hərbi nazir əsgər maaşının artırılmasını həm də ilk dəfə hərbi xidmət keçməyə başlayan azərbaycanlıların qarşılaşdıqları çətinliklərin həlli üçün bir vasitə kimi görürdü. Həyat və məişət problemlərinin qismən həll edilməsi isə fərariliyin də qarşısının alınmasına gömək edə bilərdi.

Hərbi Şuranın əsgər maaşlarının artırılması barədə 16 iyun 1919-cu il tarixli qərarından sonra S. Mehmandarov imzaladığı xüsusi əmrində əsgər məvaciblərinin bir qədər də artırılacağı barədə vəsatət qaldıraçağı haqda mə'lumat verirdi. Nazir bildirirdi ki, əsgərin yaşayışı dövlət hesabına tə'min edilsə də, onlar həmişə tütün, kibrit, iynə, sap almaq ehtiyacı ilə qarşılaşırlar. Buna görə onlara verilən məvacib də artırılmalıdır. S.Mehmandarov onu da əlavə edirdi ki, əsgər məvaciblərinin yeni norması barədə verdiyi təklif başqa ölkələrlə müqayisədə az olsa da, bu artım dövlət xəzinəsinə ayda 1 milyon 200 min rubla başa gələcəkdir. Hərbi Şuranın qərarı əsasında hazırlanmış əmr layihəsi üzərində S.Mehmandarov öz əli ilə düzəlişlər edərək əsgər məvaciblərinin aşağıdakı şəkildə olmasını məqsədəuyğun bilmişdi: sıravi–100 rubl, yefreytor–120 rubl, kiçik çavuş–140 rubl, böyük çavuş–180 rubl və onbaşı–240 rubl (97, v.7a).

Hərbi nazir S.Mehmandarovun bu təklifi dövlət orqanlarında da müdafiə olundu və müvafiq qərar qəbul edildi.

Dövlət Müdafiə Komitəsi özünün 28 iyun 1919-cu il tarixli qərarı ilə Hərbi nazirin təklifini təsdiq etdi və əsgərlərin bə'zi kateqoriyalarının məvacibinin daha da artırılmasını məqsədəuyğun saydı.

Həmin ilin avqust ayında isə Azərbaycan hökuməti zabitlərin, hakimlərin, çinovniklərin maaşının qaldırılması barədə qərar qəbul etdi və təsdiq üçün həmin qərarı Parlamentə göndərdi (103, v.45).

Həmin təkliflə əsasən zabitlərin maaşı aşağıdakı şəkildə təsdiq edildi (bax:153, v. 108-109):

| Vəzifə kateqoriyaları | Məvacib (rubl) | İaşə pulu (rubl) | Mənzil-kommunal pulu (rubl) |
|---|---|---|---|
| Hərbi nazir | 2470 | 7180 | 600 |
| Hərbi nazirin müavini | 2470 | 4880 | 300 |
| Ümumi qərargah və Ərkani hərb rəisləri: general-leytenant | 1950 | 4275 | 275 |
| Ümumi qərargah və Ərkani hərb rəisləri: general-mayor | 1560 | 4265 | 275 |
| Diviziya komandiri: general-leytenant | 1960 | 3850 | 275 |
| Diviziya komandiri: general-mayor | 1560 | 3840 | 275 |
| diviziya komandirinin müavini: general-mayor | 1560 | 3320 | 250 |
| diviziya komandirinin müavini: polkovnik | 1430 | 3320 | 250 |
| dəftərxana rəisi: polkovnik | 1430 | 3320 | 250 |
| alay komandiri:polkovnik | 1430 | 3120 | 250 |
| alay komandiri:podpolkovnik | 1170 | 3120 | 250 |
| alay komandirinin müavini: polkovnik | 1430 | 2575 | 225 |
| alay komandirinin müavini: podpolkovnik | 1170 | 2575 | 225 |
| tabor komandiri, podpolkovnik | 1170 | 2530 | 200 |
| tabor komandiri: kapitan | 910 | 2530 | 200 |
| bölük komandiri: kapitan | 910 | 2235 | 175 |
| baş zabit: kapitan | 910 | 1740 | 175 |
| ştabs-kapitan | 780 | 1690 | 150 |
| podporuçik | 520 | 1610 | 150 |
| praporşik | 390 | 1460 | 150 |



Azərbaycan hökumətinin qərarı ilə istisna hal kimi Ərkani-hərbin rəisi general-leytenant M.Sulkeviçin maaşı hərbi nazirin müavininin aylıq maaşına bərabər tutulurdu. Bu qərar M.Sulkeviçin keçdiyi şərəfli xidmət yolunu nəzərə alaraq hərbi nazir S.Mehmandarovun Nazirlər Şurası qarşısında qaldırdığı vəsatətdən sonra qəbul edilmişdi (153, v.109).

Hərbi Şuranın 16 iyun 1919-cu il tarixli iclasında belə bir məsələ də qaldırılırdı ki, əsgəri şücaətinə görə Georgi ordeni və medalı ilə təltif edilmiş zabitlərə bu orden və medalların dərəcələrinə görə məvacib artımı verilsin. Müzakirələrdən sonra Georgi ordeni və medalı almış zabitlərin məvaciblərinin aşağıdakı miqdarda artırılması qərara alındı: Georgi xaçına görə: 4-cü dərəcə üçün–3 rubl, 3-cü dərəcə üçün–5 rubl, 2-ci dərəcə üçün–8 rubl, 1-ci dərəcə üçün–10 rubl, Georgi medalına görə: 4-cü dərəcə üçün–1 rubl, 3-cü dərəcə üçün–1,5 rubl, 2-ci dərəcə üçün–2 rubl, 1-ci dərəcə üçün–3 rubl (97, v.70)

Hərbi Nazirliyin rəhbərliyi bu və ya digər obyektiv tələblər üzündən Azərbaycan Ordusunda xidmətini başa vuranların da yaşayış şəraitinin yaxşılaşdırılmasına qayğı göstərməyə çalışırdı. Məsələn, 1919-cu ilin iyununda S.Mehmandarov Azərbaycan hökuməti qarşısında iki nəfər əlilə

xüsusi yardım göstərməsi barədə məsələ qaldırdı (103, v.35). Xidməti vəzifəsinin icrası zamanı vəfat etmiş şəxslərin ailələrinə qayğı göstərilməsi üçün Hərbi Nazirliyin fondundan dəfələrlə maddi yardım ayrılmışdı (92, v.230; 160, v.193).

Azərbaycan Ordusunda xidmət edən hərbi qulluqçuların sosial qayğısını gücləndirmək üçün hərbi nazir tərəfindən pensiya və birdəfəlik müavinətlərin verilməsini nizamlayan xüsusi sənəd də qəbul edildi. Bu sənədə görə Azərbaycan Ordusunda xidmət edən hərbi qulluqçular pensiya almaq hüququ əldə etmək üçün Azərbaycan vətəndaşlığını qəbul etməli və Azərbaycan Respublikasına sədaqət andı içməli idilər. Pensiya almalı olan vətəndaşlar iki qrupa bölünürdülər. Birinci qrupa Azərbaycan və Zaqafqaziyadan olan müsəlmanlar, ikinci qrupa isə digər ərazilərdən olan müsəlmanlar və məzhəbindən asılı olmayaraq bütün digər hərbi qulluqçular daxil idilər. Birinci qrupa daxil olan hərbi qulluqçular Azərbaycan Ordusu sıralarında ən azı bir il xidmət etməli idilər. Eyni zamanda onlar obyektiv səbəblər nəzərə alınmazsa, 50 yaşından tez pensiyaya çıxa bilməzdilər. Hərbi nazir, general-mayor Tlexasın da istisna kimi birinci qrupa daxil edilməsini məqsədəuyğun bilirdi. Onun fikrincə, general Tlexas bu hüququ Azərbaycan xalqı qarşısında göstərdiyi təmənnasız və sədaqətli xidmətləri ilə qazanmışdı. O, Müsəlman Korpusunun yarandığı ilk günlərdən, 1918-ci il yanvarın 1-dən milli qoşun hissələrinin tərkibində xidmət edirdi (96, v.27).

Azərbaycan Ordusu sıralarında xidmət edən hərbi qulluqçu digər dövlətlərin ərazisində dövlət qulluğuna götürülürdüsə, o, Azərbaycanın pensiyasından məhrum edilirdi. Hərbi qulluqçu digər dövlətin ordusunda xidmət etsəydi, onda hərbi pensiyadan məhrum olurdu. Milliyyətindən və məzhəbindən asılı olmayaraq hər hansı Azərbaycan vətəndaşı bu qərar qəbul edilənədək Azərbaycan Ordusunda deyil, Rusiya ordusunda xidmət etmiş və hazırda Azərbaycan vətəndaşlığını qəbul etmişdisə, onda o, 100 faiz artırılmaqla Azərbaycan pensiyasını ala bilərdi. 1918-ci il martın 23-dən sentyabrın 15-dək Bakı şəhəri rayonunda hərbi əməliyyatlarda iştirak etmiş nizami hissələrin tərkibindən bir günlük xidmət iki günə, arxa hissələrdə isə iki günlük xidmət üç günə hesablanırdı. Bu güzəştlər pensiyalar hesablanarkən nəzərə alınmalı idi (96, v.28).

Zabitlərə, orduda işləyən mə'murlara, həkimlərə, mollalara ildə bir dəfə məvacibi saxlanılmaqla bir aylıq mə'zuniyyət verilirdi. Həmin şəxslərin arzusu ilə onlar iki ilin mə'zuniyyətini birləşdirərək iki ildə bir dəfə iki ay müddətində mə'zuniyyət götürmək səlahiyyətinə malik idilər. Mə'zuniyyətdən vaxtında qayıtmadıqda gecikmiş günlərin məvacibi kəsilməli idi. (116, v.2). Görünür, bir çox zabitlər bu hüquqlarından sui-istifadə etmiş və mə'zuniyyətdən xeyli gec qayıtmışdılar. Ona görə də hərbi nazirin 12 yanvar 1919-cu il tarixli əmrində göstərilirdi ki, mə'zuniyyətdən bir gün gecikən zabitin bütün mə'zuniyyət dövrü üçün məvacibi kəsiləcəkdir (94, v.7).

Əsgərlər də ildə bir dəfə bir ay müddətində mə'zuniyyət almaq hüququndan istifadə edə bilərdilər (116, v.2).

Hərbi Nazirliyin rəhbərliyi və şəxsən hərbi nazirin özü hissələrdə olarkən subyektiv səbəblər üzündən məvaciblərin gecikdirilməsi, maliyyə vəsaitlərindən düzgün istifadə edilməməsi hallarına rast gəlir və belə faktlara qarşı barışmaz mövqe tuturdular. Məsələn, 2-ci Bakı piyada alayında maliyyə *pozğunluqlarına yol verdiyinə görə Nazirlikdən göndərilən komissıyanın* müəyyən faktları üzə çıxaracağından qorxan xəzinədarın özünü öldürməsi barədə yuxarıda danışılmışdı. Hərbi nazir Yevlaxda olarakən bura Topçu briqadasından e'zamiyyətə gəlmiş 2 zabitlə rastlaşmış və onlara e'zamiyyət pulu verilmədiyi aydınlaşdırılmışdı. Pulları olmadığı üçün yükləri necə aparmaq barədə düşünən zabitlərə nazir öz cibindən pul vermiş və yüklərin tezliklə hissəyə çatdırılmasını tapşırmışdı. Nazir bu fakta qarşı öz narazılığını ifadə edərək bildirirdi ki, hissələrdən e'zamiyyət xərclərini almayan zabitlər qatarlarda, şəxsi avtomobil və faytonlarda havayı getmək məcburiyyətində qalırdılar ki, bu da çox zaman mülki əhalinin haqlı narazılığı ilə qarşılanırdı (148, v.403).

Şuşada isə nazir tabor komandirinin hissəyə ərzaq alınması üçün şəxsi adamlardan borc götürdüyünün şahidi olmuş və xidmətin təşkilində belə səhlənkarlığa yol verilməsinin acınacaqlı hal olduğunu vurğulamışdı (148, v.404).

Nazirin tapşırığı ilə növbətçi general, polkovnik Jilyayev Bakıdakı əsgər xəstəxanasında olarkən burada xəstə yatanların bir çoxunun 2-3 ay məvacib almadığını üzə çıxarmışdı. Polkovnik Jilyayevin hesabatı əsasında hazırlanmış əmrdə nazir cavabdeh şəxslərdən tə'cili tədbirlər görməyi, xəstə əsgərlərin məvaciblərinin dərhal çatdırılmasını tələb etmişdi (92, v.48).

1920-ci ilin yanvarında bahalaşma ilə əlaqədar olaraq əsgərlərə təsərrüfat işləri üçün ayrılan aylıq pul (məvacibindən əlavə) 3 rubldan 10 rubla çatdırıldı (92, v.55). Əsgər xəstəxanalarında yatan əsgərlər üçün isə bu pul 12 manat miqdarında təsdiq edildi (93, v.29). Bahalanma ilə əlaqədar olaraq xəstəxanada yatan hərbi qulluqçulara verilən gündəlik iaşə üçün ayrılan pulun miqdarı da artırıldı. Əsgərlər üçün bu 55 rubl, zabitlər üçün isə 82,5 rubl oldu (93, v.29).

Ölkədə gedən hədsiz bahalaşma, yaşayış şəraitinin çətinləşməsi, alınan məvacibin ən adi ehtiyacları ödəməməsi 1920-ci ilin əvvəllərində zabitləri yenidən dözülməz məhrumiyyətlərə məhkum etmişdi. Hərbi Nazirliyin rəhbərliyi dərhal hökumətə müraciət edib hərbi qulluqçuların məvaciblərinin yaşayış minimumlarına uyğunlaşdırılması barədə qərarlar qəbul olunmasını xahiş etdi. 1920-ci il yanvarın 31-də hərbi nazirin Nazirlər Şurası sədrinin adına göndərdiyi məktubda deyilirdi: "Həyatın bahalanması

üzündən hərbi qulluqçular çox çətin və böhranlı vəziyyətdədirlər, çoxları böyük borc içindədir və öz ailələrinə maddi kömək göstərmək imkanına malik deyildirlər. Hətta paltarlarını tə'mir etməyə və doyunca yeməyə pulları çatmır.

Bütünlüklə özünü xidmətə həsr edən hərbi qulluqçuların digər idarələrin işçiləri kimi boş vaxtlarında kənarda qazanmaq imkanları yoxdur. Bundan başqa, öz geyim formalarını və şərəflərini qorumağa çalışaraq onlar həmişə şax geyinməlidirlər. Əsgəri xidmət hərbi qulluqçudan bütün qüvvəsini sərf etməyi tələb edir. Bu isə o vaxt mümkündür ki, o, ailəsinin ən zəruri şeylərə ehtiyac duymadığına əmin olacaqdır". (101, v.13).

Məktubda hərbi qulluqçuların məvacibinin 80 faiz artırılması və həmin artımın 1919-cu il oktyabrın 1-dən hesablanması xahiş olunurdu ki, zabitlər öz borclarını ödəyə bilsin (101, v.13).

1920-ci il martın 11-də parlament hərbi qulluqçuların məvaciblərinin 80 faiz artırılması barədə təklifi qəbul etdi. Azərbaycan Ordusu zabitlərinin vəzifə kateqoriyaları üzrə məvacibləri aşağıdakı şəkildə təsdiq edildi (bax:147, v.197).

| Vəzifə kateqoriyası | Məvacib | iaşə pulu | mənzil-kommunal pulu | məcmu (rub) |
|---|---|---|---|---|
| Hərbi nazir | 3705 | 10770 | 600 | 16675 |
| Hərbi nazirin müavini | 4446 | 9504 | 300 | 15250 |
| korpus komandiri: general-leytenant | 4410 | 9360 | 300 | 14070 |
| general-mayor | 4336 | 8732 | 300 | 13368 |
| qərargah rəisi-Ərkani-hərb: general-leytenant | 3510 | 7695 | 275 | 11480 |
| general-mayor | 2808 | 7677 | 275 | 10760 |
| diviziya komandiri: general-leytenant | 3510 | 6930 | 275 | 10715 |
| diviziya komandiri: general-mayor | 2808 | 6912 | 275 | 9995 |
| diviziya komandirinin müavini: general-mayor | 2808 | 5976 | 250 | 9034 |
| diviziya komandirinin müavini: polkovnik | 2574 | 5976 | 250 | 8800 |
| alay komandiri: polkovnik | 2574 | 5616 | 250 | 8440 |
| alay komandiri: podpolkovik | 2106 | 5616 | 250 | 7972 |
| alay komandirinin müavini: polkovnik | 2574 | 4635 | 225 | 7434 |
| alay komandirinin müavini:podpolkovnik | 2106 | 4635 | 225 | 6966 |
| tabor komandiri: podpolkovnik | 2106 | 4554 | 200 | 6860 |
| tabor komandiri: kapitan | 1638 | 4554 | 200 | 6392 |
| bölük komandiri: kapitan | 1638 | 4023 | 175 | 5836 |
| baş zabit: kapitan | 1638 | 3132 | 175 | 4945 |
| ştabs-kapitan | 1404 | 3042 | 150 | 4596 |
| poruçik | 1170 | 2934 | 150 | 4254 |
| podporuçik | 936 | 2898 | 150 | 3984 |
| praporşik | 702 | 2628 | 150 | 3480 |



Azərbaycan Ordusunun formalaşdırılmasına başlanmasının elə ilk günlərindən Hərbi Nazirliyin rəhbərliyinin qarşısında dayanan həlli vacib problemlərdən biri də şəxsi hey'ətin əsgəri geyimlə tə'min edilməsi idi. Hərbi nazir S.Mehmandarov e'tiraf edirdi ki, bu məsələ də bütün ağırlığı ilə qarşımızda dayanır (58, v.6). Yaxınlaşan qış ərəfəsində şəxsi hey'ətin isti paltarı, şineli, gödəkçəsi demək olar ki, yox idi. Azacıq paltar ehtiyatı isə sayı artmaqda olan ordunun ehtiyaclarını ödəməyə qabil deyildi. Mövcud olan keyfiyyətsiz geyim ehtiyatları uzun müddətli istifadəyə davam gətirmirdi. Bir tərəfdən də davam edən fərarilik pal-paltara olan ehtiyacı daha da artırırdı. Hissəyə gələn çağırışçıların bə'ziləri paltarı alan kimi dərhal qaçır və ona verilmiş paltarı da özü ilə aparırdı (297, s.42)

1918-ci ilin sonlarında geyim baxımından hissələrin bir çoxu acınacaqlı vəziyyətdə idi və bunu hissələrin vəziyyəti ilə tanış olan hökumət nümayəndələri də gizlətmirdilər. Məsələn, Ağdamda yerləşən hissələrin kiçik çinli hərbçilərinin çox azının xidməti paltarı var idi. Çoxları isə cır-cındıra bürünmüşdü. Belə paltar nəinki geyim formasının tələblərinə cavab vermir, heç onu geyinənləri soyuqdan belə qoruya bilmirdi. Qazax piyada alayının (sonralar 3-cü Gəncə piyada alayı adlandırıldı -M.S) Ağdamda olan bir bölüyünün əsgərləri xidməti şinel əvəzinə evlərindən gətirdikləri cırıq odeyallara bürünürdülər. Bir çoxlarının heç buna da imkanı yox idi. Çoxları əllərinə keçən cırıq çuval və kisələrlə soyuqdan qorunurdu. Ayaqqabısı olmadığından sırada ayaqyalın dayananlar da vardı (297, s.23). Ordunun formalaşmasının ilk aylarında belə çətinlik bir çox hissələr üçün xarakterik idi.

1918-ci ilin noyabrında 2-ci Qarabağ süvari alayının komandiri hissədaxili əmrində 3-cü bölükdə şəxsi hey'ətin geyiminin vəziyyətindən razı qalmadığını bildirirdi (173, v.16).

Hərbi nazir S.Mehmandarov 5-ci dağ topçu batareyasında olarkən əsgərlərin çoxunun pal-paltarının olmadığı barədə mə'lumat almışdı (86, v.7). Qarabağda olan hissələrdə 1919-cu ilin əvvəllərində pal-paltarla tə'minat elə böhranlı bir hal almışdı ki, Qarabağ general-qubernatoru Hərbi Nazirlikdən müəyyən müddət ərzində çağırışın dayandırılmasını xahiş etmişdi. Çünki xidmətə çağırılanların paltarla tə'min edilməsi onların valideynləri arasında da ciddi narazılıqlara səbəb olurdu. Ümumi qərargah rəisi H.Səlimov Qarabağ general-qubernatoruna verdiyi cavabında bildirirdi ki, deyilənlər doğru olsa da çağırışı dayandırmaq olmaz. Çağırışın dayandırılması qoşun hissələrinin formalaşdırılmasına əks tə'sir göstərə bilər. Məsələnin həlli yoluna gəlincə isə qərargah rəisi yazırdı ki, bu sahədə lazım olan tədbirlər həyata keçirilməkdədir (56, v.33).

Doğrudur, hissələrin heç də hamısında vəziyyət belə böhranlı hal almamışdı. Məsələn, hələ 1918-ci il dekabrın 2-də hərbi nazir S.Mehmandarov 2-ci Qarabağ süvari alayına gələndə şahid olmuşdu ki, bölmələrin çoxunun şəxsi hey'əti isti paltara malikdir. Əsgərlərin gödəkçəsi, papağı, pambıq şalvarı vardır. Onların müəyyən hissəsi çəkmə geyinmişdi (86, v.6). Bununla belə, ümumordu miqyasında vəziyyət xeyli mürəkkəb idi. Mövcud olan gərginliyi aradan qaldırmaq üçün S.Mehmandarov dərhal Gürcüstanın hərbi nazirinə məktub yazıb kömək göstərilməsini xahiş etdi. Nazir bildirirdi ki, Gürcüstanda hərbi paltar çoxdur və Gürcüstan Hərbi Nazirliyinin bu paltarı satmaq imkanı da vardır. Lakin bəslənilən ümid özünü doğrultmadı və Gürcüstandan müsbət cavab alınmadı (58, v.7). Ona görə də daxili imkanların səfərbərliyə alınması üçün tədbirlər görüldü. Əvvəlcə şəxsi hey'ətin paltarla tə'minat norması müəyyənləşdirildi. Hərbi nazirin 1 yanvar 1919-cu il tarixli, 1 saylı əmri ilə hər bir əsgərə 1 ədəd papaq, 1 ədəd sırıqlı, 2 ədəd köynək, 2 ədəd alt paltarı, 2 ədəd əl-üz dəsmalı, 2 ədəd əl dəsmalı, 2 ədəd corab və ya ayaq sarğısı verilməsi qərarlaşdırıldı (88, v.1). Bütünlükdə isə əsgərlərin geyim normasına aşağıdakı əşyalar daxil idi: köynək, papaq, yun corab, yun əlcək, mahud gödəkçə, mahud şalvar, mahud yay şalvarı, mahud yay gödəkçəsi, şinel, tulup, çəkmə, qurşaq kəməri, silah kəməri, patronqabı, asma çanta, ehtiyat patron çantası, əşya kisəsi və s. (147, v.5).

1919-cu ilin əvvəlində nazirliyin çox az miqdarda geyim ehtiyatı var idi. Hərbi Nazirlik üzrə 1 yanvar 1919-cu il tarixli əmrdə həmin məhdud ehtiyatın aşağıdakı şəkildə paylanması barədə göstəriş verilmişdi. Mövcud olan 500 ədəd ləzgi şalı iki süvari alayı arasında bərabər sayda bölünməli idi. Şinel, mahud köynək və isti şalvarların piyada və topçu hissələrinə, şəxsi hey'ətin kəmiyyətinə müvafiq olaraq bölünməsi lazım bilinirdi. Şinelin olmaması və mahud köynəyin çatışmaması ucbatından mövcud olan gödəkçələr də paylanmalı idi. Ayaqqabı ehtiyatı isə demək olar ki, yox idi. Nazirliyin anbarında olan azacıq dəri və ayaqqabı altlıqları Hərbi nazirin əmri ilə ayaqqabı və ya çarıq tikilməsi üçün əsgərlərə paylanmalı idi (88, v.1). Eyni zamanda hissə komandirinə səlahiyyət verilirdi ki, anbarlarda mövcud olan xammaldan paltar hazırlamaq üçün mütəxəssislərə sifariş versin və iş haqqını hissənin maliyyə vəsaitlərindən ödəsin (107, v.73). Sifarişlər icra olunduqdan sonra maliyyə məsrəfi aktlaşdırılmalı və Nazirliyə təqdim edilməli idi. Müvəqqəti hal kimi çağırışçıların özlərinin geyimlərindən də istifadə edilməsinə icazə verilirdi. Şəxsi geyimlərin xidmətdə istifadə edilməsi ilə bağlı nazirin əmri ilə xüsusi komissiya yaradıldı və bu komissiya çağırışçıların xidmətə yararlı olan geyim əşyalarının əvəzində onlara pul ödənci verilməsi barədə qərar qəbul etdi. Şəxsi əşyalar iki növə bölünürdü: təzə əşyalara, istifadə edilmiş əşyalara. Bu növlərin hər birinin öz qiymət var idi. Mahud şinelin təzəsi üçün qiymət-100 rubl, işlədilmişi üçün-60 rubl, gödəkçənin təzəsi üçün–55 rubl, işlədilmişi üçün–24 rubl, ləzgi mahudundan olan şalvarın təzəsi üçün–35 rubl, işlədilmişi üçün–20 rubl, mahud şalvarın təzəsi üçün–35 rubl, işlədilmişi üçün–20 rubl, mahud gimnastyorkanın təzəsi üçün–40 rubl, işlədilmişi üçün–24 rubl (107, v.47) və nəhayət çəkmənin təzəsi üçün–150 rubl, işlədilmişi üçün–100 rubl müəyyən edilmişdi (116, v.1).

Ordunun pal-paltarla tə'min edilməsi üçün sahibkarlar da bu işə cəlb edildi. Bakıda və Azərbaycanda fəaliyyət göstərən uyğun müəssisələrdə hərbi sifarişlərin icrasının imkanları öyrənildi. Bir çox sahibkarlar ordu üçün lazım olan paltarın tikilməsinə hazır olduqlarını bildirsələr də onların xammalı yox idi. Bunun üçün də onlar Hərbi Nazirlikdən "ağ" parça verilməsini tələb edirdilər. Nazirliyin ixtiyarında isə belə parça yox idi. Eyni zamanda belə parçaların respublika daxilində əldə edilməsi də mümkün deyildi (58, v.1).

Hərbi nazir S.Mehmandarov Azərbaycanın Gürcüstandakı diplomatik nümayəndəsi Cəfərovla əlaqə saxlayıb Gürcüstanın sənaye müəssisələrində bu məsələnin həllinin mümkünlüyünü öyrənilməsini xahiş etdi. Nazir respublikanın daxilində də bu problemin həlli ilə bağlı imkanların aranmasını şəxsi nəzarət altında saxlayırdı. O, Nuxada olarkən şəhər başçısı Adilxanovla, şəhər məclisinin nümayəndələri ilə görüşmüş, Nuxadakı müəssisələrin istehsalı ilə yaxından maraqlanmış və nəticədə ayaqqabıya olan ehtiyacın qismən aradan qaldırılması üçün mövcud olan yerli imkanlardan istifadə edilməsi qərara alınmışdı. Nazirin bildirdiyinə görə, o burada çarıq əldə edə bilmişdi ki, ayaqqabı və çəkmə yerinə hələlik onlardan istifadə etmək olardı (58, v.7).

Şuşada olarkən nazir burada hərbi geyimin tikilməsi üçün tamamilə yararlı olan parça görmüş və onun alınması üçün müqavilə bağlamışdı.

Nazir xüsusi razılıqla qeyd edirdi ki, mundir geyimləri üçün də Şuşada yaxşı möhkəm material əldə edilmiş və onun alınması üçün də müqavilə bağlanmışdı (58, v.1).

Mövcud böhranın aradan qaldırılması üçün əl atılan vasitələr çox vaxt özünü doğrultmur, tədarük olunan əşyalar heç də həmişə öz keyfiyyəti ilə fərqlənmirdi. Nazik geyimlər nazirin qeyd etdiyi kimi, ağ parçadan tikilir və sonra süni yolla rənglənirdi. Belə parçalar çox davamsız olurdu və bir neçə aydan sonra sıradan çıxırdı. Möhkəm olmayan parçadan tikilmiş şalvarlar da az vaxtdan sonra yararsız hala düşürdü. Məcburiyyət üzündən istifadə edilən çarıqlar istifadədə xeyli çətinliklər yaradırdı. Əvvəla, çarığın yağmurlu havada geyilməsi onun tezliklə xarab olmasına və əsgərlərin soyuqlamasına səbəb olurdu. Digər tərəfdən, elə quru şəraitdə də çarıqların istifadə müddəti elə də uzun deyildi. Yaxşı halda 3-4 həftədən sonra çarıqlar yararlılığını itirirdi. Eyni zamanda çarıqların patavalarının bağlanması xeyli vaxt aparır və bununla da əsgərlər üçün müəyyən narahatçılıq yaradırdı (297, v.42).

Hərbi nazir vəziyyətdən çıxmaq üçün hissələrin ətrafında olan yaşayış məntəqələrindən xidmət üçün münasib olan paltarların alınmasına da icazə verirdi. Bunun üçün o əmr edirdi ki, müvafiq komissiya yaradılsın və əhalidən paltar alınması həmin komissiyaya tapşırılsın (148, v.403).

Ordunun geyim ehtiyatının təkmilləşdirilməsi üçün müsadirə olunmuş əmlakdan da istifadə edilirdi. Dövlət orqanlarının qəbul etdiyi qərara görə liman anbarlarında mövcud olan əmlakın bir hissəsi müsadirə edilmişdi. Həmin anbarlara 1918-ci il sentyabrın 15-də gətirilmiş olan əmlak tamamilə müsadirə edilib, Hərbi Nazirliyin sərəncamına verilmişdi. Bu əmlak əsasən bolşevik hakimiyyəti dövründə gətirilmiş və hərbi məqsədlər üçün ehtiyat yığılmışdı. Orada mövcud olan digər əşyaların istifadəsi isə qəbul edilmiş qərar əsasında tənzimlənirdi (97, v.28).

Hərbi Nazirliyin rəhbərliyi mövcud olan pal-paltar ehtiyatının qənaətlə işlədilməsinə də xüsusi diqqət yetirirdi. Xüsusən geyim əşyalarının oğurlanmasının qarşısının alınması üçün hərbi nazir ən qəti tədbirlərin görülməsini tələb edirdi. Bununla bağlı hələ 1918-ci il dekabrın 8-də imzaladığı 5 saylı əmrində o, paltarların oğurlanması kimi şərəfsiz əməllərdə Azərbaycan zabitlərinin adlarının hallanmasını çox böyük təəssüf hissi ilə qeyd edirdi. Nazir belə halların baş verməsində hissələrin komandirlərini də günahkar bilir və hər hansı hissədə paltar oğurluğunun davam edəcəyi təqdirdə həmin hissələrin komandirlərinin də məs'uliyyətə cəlb ediləcəyini vurğulayırdı (86, v.3).

Bundan başqa Ləvazimat İdarəsinin rəisi 1919-cu ilin fevral ayında bütün hissə komandirlərindən tələb edirdi ki, paltar qıtlığını nəzərə alaraq əsgərlər üçün nəzərdə tutulmuş geyim əşyalarını zabitlərə, mülki şəxslərə



paylamasınlar. Çünki bunun nəticəsində məhdud geyim ehtiyatı da məsrəf olunur və xidmətə yeni cəlb edilən əsgərlər paltarsız qalırdı (107, v.31).

Geyimə olan ehtiyacın ödənilməsi, xüsusilə qoşunların ayaq geyimləri ilə təchiz edilməsi üçün Hərbi Nazirliyin tərkibində Dəri zavodunun açılması məsələsi qaldırıldı və 1919-cu ilin sonlarında Hərbi Şura bu təklifi müdafiə edib Dəri zavodunun açılması, onun lazımi istehsal vasitələri ilə təchiz olunması üçün qərar qəbul etdi (98, v.99).

Qoşun hissələri formalaşdıqca onların tərkibində paltar e'malatxanaları açılırdı. Bu e'malatxanalar bazardan alınmış xammal hesabına hissənin geyimə olan ehtiyaclarının ödənməsində, habelə mövcud olan geyimlərin bərpa edilməsində əhəmiyyətli rol oynayırdı.

Bununla belə, əsas geyim ehtiyatları kənardan alınırdı ki, bu da əsasən Ləvazimat İdarəsinin rəhbərliyi altında həyata keçirilirdi. Sahibkarlardan geyim əşyalarının alınması da çox vaxt müsabiqə yolu ilə keçirilir və bu müsabiqənin şərtləri əvvəlcə adətən Hərbi Şurada müzakirə edilirdi. Məsələn, Hərbi Şuranın 24 noyabr 1919-cu il tarixli iclasında Kadişşevin çəkmə e'malatxanasının təklif etdiyi başmaqlar çarıqdan daha davamlı və eyni zamanda ucuz başa gəldiyi üçün onların alınması məqsədəuyğun bilinmişdi (98, v.82). Hərbi Şuranın 1919-cu ilin dekabr ayındakı iclası çarıq alınması üçün keçirilmiş sövdələşməni ləğv etmiş, çust üçün keçirilmiş sövdələşməni isə daha məqsədəuyğun bilərək təsdiq etmişdi. Dekabr ayının son günlərində keçirilmiş daha bir iclas isti paltar tikilməsi barədə ləzgi şallarının alınması üçün bağlanan sövdələşməni təsdiq etmişdi (98, v.109,145). Yenə Hərbi Şura özünün başqa bir iclasında qoşunlarda böyük ehtiyac duyulan səfər çantalarının hər biri 815 rubl olmaqla 18 min ədəd alınmasını qeyri məqsədəuyğun saymışdı (97, v.5).

Görülən işlərin nəticəsində 1919-cu ilin ikinci yarısında ordunun geyim təchizatı xeyli yaxşılaşmışdı. Məsələn, Zaqataladakı əlahiddə taborda (sonra alaya çevrildi) şəxsi hey'ətin geyim vəziyyəti heç bir narahatçılıq doğurmurdu. Nazirliyin qayğısı və tabor komandiri Dibirovun təşəbbüskarlığı, işgüzarlığı bu sahədə olan gərginliyi aradan qaldırmağa imkan vermişdi (161, v.61).

1919-cu ilin iyun ayında 2-ci Qarabağ süvari alayını, 1-ci Cavanşir piyada alayını, bu alayın Şuşada yerləşən 1-ci taborunu, 2-ci dağ topçu divizionunu yoxlayan nazirliyin komissiyası öz hesabatında bu hissələrin pal-paltarla tə'minatında ciddi narahatçılıq doğuracaq bir irad göstərməmişdi (153, v.8-14).

Azərbaycan hökumətinin göstərdiyi qayğı nəticəsində Hərbi Nazirlik qoşunların paltar tə'minatında böyük dəyişikliklər yaratmaq üçün real imkanlar əldə etmişdi. 1919-cu il dekabrın 27-də öz növbəti iclasını keçirən Hərbi Şura əldə edilmiş imkanlardan istifadə edərək ordunun növbəti ildə paltar tə'minatını xeyli yaxşılaşdırmaq məsələsini müzakirə etdi. Burada

qərara alındı ki, 1920-ci il üçün 25 min əsgərə 5 min ədəd də ehtiyat olmaq şərti ilə cəmi 30 min dəst alt paltarı və yataсaq əşyaları hazırlanması üçün əməlli tədbirlər görülsün. Sifarış verilməsi və ya yerlərdə hazırlanması nəzərdə tutulan əşyalar aşağıdakılar idi: adambaşına köynək – 2 ədəd, alt şalvarı – 2 ədəd, əl dəsmalı -3 ədəd, əl-üz dəsmalı – 2 ədəd, alt balış üzü – 1 ədəd, döşək ağı – 2 ədəd, ayaq sarğısı – 3 ədəd, döşək üzü – 1 ədəd, balış üzü – 2 ədəd, odeyal – 1 ədəd, bəyaz gimnastyorka – 2 ədəd, bəyaz şalvar – 2 ədəd. Bütün bu əşyaların tikilməsi üçün 2 milyon 40 min arşın parça lazım idi. Paltarın bir hissəsini hissələrin e'malatxanasında hazırlamaq, bir hissəsini də sövdələşmə yolu ilə əldə etmək planlaşdırılırdı (98, v.115).

Qoşun hissələrinə zəruri olan pal-paltarın əldə edilməsi üçün Hərbi Nazirlik İtaliya hökuməti ilə, İtaliyanın sənaye kompaniyaları ilə danışıqlar aparmaq qərarına gəldi. Bunun üçün xüsusi komissiya təşkil edildi. Komissiyaya 2-ci piyada diviziyasının komandiri general Usubov rəhbərlik edirdi. Komissiyanın tərkibində Ləvazimat İdarəsinin, habelə Yollar Nazirliyinin nümayəndələri də var idi. S.Mehmandarov general Usubova bildirirdi ki, o, İtaliyanın Soloniki şəhərinə yollanıb Azərbaycan Ordusuna zəruri olan topçu, istehkam, tibb, geyim və s. ləvazimatların əldə edilməsi üçün danışıqlar aparmalıdır. Ancaq nazir ilk növbədə pal-paltarın alınmasının və digər işlərin görülüb qurtarmasını gözləmədən dərhal Batuma yola salınmasının zəruriliyini vurğulayırdı. Hərbi pal-paltarın 25 min komplekt alınması planlaşdırılırdı. Onların da çoxu isti paltarlar və yarımçəkmələr olmalı idi (141, v.7).

General Usubovun rəhbərlik etdiyi komissiya 1919-cu il oktyabr ayında Batumdan gəmi ilə İtaliyanın Soloniki şəhərinə gəldi. O, ingilis qoşunlarının vaxtı ilə burada yerləşmiş böyük paltar anbarları ilə əlaqə saxladı və onlardan paltar almağın mümkünlüyü ilə maraqlandı. Mə'lum oldu ki, Antanta komandanlığı buradakı paltar ehtiyatlarını rumın, çex və polyak qüvvələrinə paylayıb. Həmin qüvvələrin əlində olan paltar ehtiyatları isə az miqdarda olduğundan general Usubov və rəhbərlik etdiyi komissiya oktyabrın 20-də Romaya gəldi. İtaliyanın Müdafiə Nazirliyi ilə əlaqə saxlandı və zəruri olan əşyaların siyahısı nazirliyə təqdim olundu. Azərbaycandan olan komissiya ona tapşırılan vəzifəni həll etmək üçün Genuya və Turindəki müvafiq kompaniyalarla əlaqə saxladı. İtaliyanın Müdafiə Nazirliyi Azərbaycandan olan komissiyanın xahişinə müsbət cavab vermədi və Azərbaycana hərbi geyim satmaqdan imtina etdi. Belə olanda komissiya yenidən şəxsi kompaniyalarla danışıqlar aparmağa başladı. Noyabrın 10-dan sonra Genuya, Milan, Turin, Verona və Triento şəhərlərinin kompaniyaları ilə əlaqə saxlandı. Ancaq bu şəhərlərdə də lazım olan əşyaları əldə etmək mümkün olmadı. Yalnız Kiono, Qella və Ko yoldaşlığı ilə aparılan danışıqlar ümidedici nəticələr verdi. Bu kompaniyanın anbarlarında 25 min dəst münasib paltar var idi. Komissiya həmin paltardan 20 min dəst seçib götürdü. Ancaq kompaniyanın rəhbərliyi söz verirdi ki, bir neçə gün ərzində qalan paltarı da tikib hazır edə bilərlər. Kompaniya eyni zamanda generallar və zabitlər üçün də 500 dəst paltar hazırlamağa söz verirdi. Noyabrın 23-də Azərbaycandan olan komissiya ilə İtaliya kompaniyası arasında müqavilə imzalandı. Müqavilədə 25 min dəst paltarın satılması nəzərdə tutulurdu. Müqaviləni Azərbaycan tərəfindən general-mayor Usubov, mə'mur Xanbudaqov imzaladılar. Müqaviləyə görə 1919-cu il dekabrın 20-də kompaniya nəzərdə tutulan əşyaları gəmilərlə Turindən Bakıya yola salmalı idi. Ancaq bu mümkün olmadı. Adı çəkilən kompaniyada sosialistlər güclü tə'sirə malik idilər. Onlar keçmiş Çar Rusiyasının bütün ərazisini Sovet Rusiyasının ərazisi bilir və müstəqilliyini e'lan etmiş respublikaları Sovet Rusiyasının düşməni hesab edirdilər. Sosialistlərin tə'siri altında olan fəhlələr kompaniyanın rəhbərliyindən tələb edirdilər ki, Sovet Rusiyasının daxili işinə qarışmasın və Sovet Rusiyasının düşmənlərinə kömək etməsin. Azərbaycana göndərilməsi nəzərdə tutulan yük fəhlələr tərəfindən həbs edilmişdi (111, v.59-65).

Buna görə də Azərbaycandan olan komissiya danışıqları dayandırıb geri qayıtdı və 1920-ci ilin fevralında Bakıya çatdı (111, v.65).

Sonradan müqavilə ilə nəzərdə tutulan əşyalar nəhayət ki, Bakıya gətirildi. Ancaq bu əşyalar Azərbaycanın bolşevik qüvvələri tərəfindən işğalı ərəfəsində çatdırıldığından onlar Qırmızı Ordunun sərəncamına keçdi (297, s.42).

1920-ci il martın 15-də orduya növbəti çağırış kampaniyasının başlanması nəzərdə tutulmuşdu. Yeni çağırılan gənclərin hissələrdə qarşılanmasına hazırlıq işləri ilə bağlı hərbi nazirin 25 fevral 1920-ci ildə imzaladığı 125 saylı əmrdə başqa məsələlər kimi paltara tə'minat işinə də ciddi diqqət yetirilirdi. Bu əmrə əsasən hissəyə gələn çağırışçılar dərhal paltarla da tə'min edilməli idilər (147, v.150). Yə'ni artıq ordunun imkanları bu sahədəki gərginliyi aradan götürmüşdü.

Əsgərlərdən başqa ordunun zabit hey'ətinin və həkimlərinin xidməti paltarları da dövlət xəzinəsi hesabına ödənirdi. Bu məsələnin özü də Hərbi Nazirliyin rəhbərliyinin daimi nəzarəti altında idi və hər hansı bir narahatçılıq yarandığı zaman məsələ dərhal dövlət orqanları qarşısında qaldırılırdı. Məsələn, 1920-ci il yanvarın 30-da Hərbi nazir Dövlət Müdafiə Şurasında çıxış edərək Zəngəzur və Quba dəstələrinin zabitlərinin isti paltarla təchiz edilməsi və bunun üçün maliyyə vəsaiti ayrılmasını xahiş etdi. Dövlət Müdafiə Komitəsi hərbi nazirin təklifini dəstəkləyərək lazımi maliyyə vəsaitinin ayrılması barədə qərar qəbul etdi (93, v.7).

1920-ci il fevralın 2-də isə hərbi nazirin mə'ruzəsindən sonra Dövlət Müdafiə Komitəsi Azərbaycan Ordusunun generallarının, qərargah zabitlərinin və baş zabitlərin, habelə həkimlərin xidməti geyimlə təchiz edilməsi

üçün 23 milyon 950 min rubl pul ayırmaq barədə qərar qəbul etdi. Həmin qərara müvafiq olaraq adları çəkilən kateqoriyalardan olan hər bir şəxsə 25 min rubl xərclənməli idi. Bu pula 1 dəst qış kostyumu, 1 dəst yay kostyumu, 1 ədəd palto, 1 ədəd papaq, 1 cüt ayaqqabı, 3 ədəd alt köynəyi və 2 dəst yatacaq əşyası alınmalı və ya hazırlanmalı idi. Nəzərdə tutulan maliyyə vəsaitinin 20 milyon rublu Hərbi Nazirliyin 1920-ci il smetasına əlavə olaraq ayrılmışdı (106, v.137).

Azərbaycan Ordusunun formalaşmasının və möhkəmlənməsinin vacib istiqamətlərindən biri də qoşun hissələrinin atlarla, süvari təchizatı ilə, silah, sursat və texnika ilə təchizi məsələsi idi. Qoşunların döyüş hazırlığının ümumi səviyyəsi, hissələrin döyüşkənliyi həm süvari vasitələrindən, həm də texniki vəsaitlərdən birbaşa asılı idi. Bunlardan birincisini əsasən respublikanın daxili imkanları hesabına ödəmək mümkün idisə, texniki vasitələr əsasən xaricdən idxal edilib ordunun sərəncamına verilə bilərdi. Lakin onların hər ikisinə olan ehtiyacın aradan qaldırılması Hərbi Nazirliyin rəhbərliyindən eyni dərəcədə gərginlik, təşəbbüskarlıq, ardıcıllıq və qətiyyətlilik göstərilməsini tələb edirdi. Çünki türk qoşunlarının Azərbaycanı tərk etməsindən sonra bu sahələrdə də vəziyyət heç də ürəkaçan deyildi. Yuxarıda qoşun hissələrindəki atların nə vəziyyətdə olması barədə S.Mehmandarovun parlamentdəki çıxışı xatırlanmışdı. Hərbi nazirin bu çıxışı hissələrlə əyani tanışlıq zamanı şahidi olduqlarından doğan qənaətə əsaslanırdı. 1918-ci il noyabr ayının 27-də 1-ci Tatar süvari alayında gördüyü atları hərbi nazir dəri və sümük adlandırır, onların yemlənməsinə qayğı göstərilmədiyini bildirirdi. 2-ci Qarabağ süvari alayında saxlanılan atların vəziyyəti 1-ci süvari alayındakından elə də fərqlənmirdi (86, v.6). Halbuki süvari diviziyası hələlik bu iki alaydan ibarət idi və Azərbaycan Ordusunun ən yaxşı at ehtiyatı bu alaylarda cəmlənməli idi. Çevik bir qüvvə kimi nəzərdə tutulan süvari hissələrinin atlarının yararsız halda olması bu qoşun növünün qarşısında dayanan taktiki vəzifələrin həllini də qeyri-mümkün edirdi.

4-cü və 5-ci dağ topçu batareyalarının döyüş hazırlığının əsas elementini təşkil edən atların vəziyyəti hərbi nazirdə narahatçılıq və təşviş doğurdu. S.Mehmandarov hərbi hissələrlə bu tanışlığından sonra imzaladığı müvafiq əmrdə 4-cü dağ topçu batareyasında, 2-ci Qarabağ süvari alayında mövcud olan silah və texnikanın da çox pis vəziyyətdə olduğunu qeyd edirdi (86, v.6,7).

Bölmə komandirləri sərəncamlarında olan atlara düzgün qulluq göstərmirdilər. Onların nə vaxt nallandığından və ya köhnə nalların nə vaxt dəyişilməli olduğundan xəbərdar deyildilər. Süvarilər isə atlara qulluq etmək barədə ən adi mə'lumata malik deyildilər (173, v.30). Bütün bunlar yenidən bərpa edilmiş Hərbi Nazirliyin fəaliyyətinin ilk ayının təəssüratları idi. Lakin mövcud olan çətinliyin qısa vaxt ərzində qaldırılması da mümkün deyildi. Buna görə ilk aylar Hərbi Nazirliyin rəhbərliyinin fəaliyyəti üçün də daha çox bu və ya digər hissənin özünün imkanlarını səfərbər etmək, əldə olunanların səmərəli istifadəsinə nail olmaq, heç olmasa vəziyyətin daha da mürəkkəbləşməsinə yol verməmək istiqamətində qurulmuşdu.



Azərbaycan Ordusunun hissələrində mövcud olan silahlar əsasən çar Rusiyası qoşunlarından miras qalmış, Bakı tutulan zaman əldə edilmiş və türk qoşunlarından verilmiş silahlar idi. Onlar da heç kifayət qədər deyildi. Mövcud olan silahlar hissələrin ehtiyacını ödəməyə çatmırdı. 1919-cu ilin fevralında Qarabağ general-qubernatoru bölgədə sakitlik yaratmaq üçün Hərbi Nazirlikdən azacıq silah və sursat istəyəndə buna mənfi cavab almışdı. Hərbi nazir şəxsən hökumətin sədrinə bildirirdi ki, Hərbi Nazirliyin özü hərbi-texniki təchizata böyük ehtiyac duyduğundan Qarabağ general-qubernatoruna silah verə bilməz. Əksinə nazir hökumətin sədri qarşısında məsələ qaldırırdı ki, ordu üçün həm atıcı silah, həm də top alınmalıdır. Birincinin yoxluğu üzündən 2-ci piyada diviziyasının təşkili gecikə bilər, ikincinin qıtlığı üzündən isə 2-ci dağ topçu diviziyonunda topçu batareyasının formalaşdırılması yarımçıq qalmışdır. Nazir eyni zamanda hökumətin sədrindən xahiş edirdi ki, onun Tiflisə getməsi və silah əldə etməsi üçün Gürcüstanın Hərbi Nazirliyi ilə danışıqlar aparmasına icazə versin (56, v.1).

Belə bir qıtlıq şəraitində hissələrdə olan atların və silahların saxlanılmasına zəruri diqqətin yetirilməməsi də hərbi nazirdə böyük narahatçılıq doğururdu. 1919-cu il yanvar ayının sonlarında bir neçə hissə və bölmə ilə tanışlıqdan aldığı təəssüratı ümumiləşdirərək S.Mehmandarov 17 fevral 1919-cu il tarixdə 85 saylı əmri imzaladı. Bu əmrdə o, şahidi olduğu nöqsanları sadalayaraq bütün komandirlərdən oxşar səhvlərə yol verilməməsini tələb etdi (bax:148, v.403, 404).

3-cü Gəncə piyada alayının Qazaxda yerləşən birinci taborunda atlar nisbətən yaxşı vəziyyətdə olsa da, silahların saxlanılması hərbi naziri razı salmadı. Silah dayaqları yox idi, tüfənglər bir-birinin üstünə qalaqlanırdı, heç biri təmizlənmirdi, yağlanmırdı, sürtgü materialları mövcud deyildi, silah qayışları alınmamışdı, silahların süngüləri yox idi. Ağdamdakı topçu bölməsinin atlarının əksəriyyəti qotur idi, Xankəndində yerləşmiş 2-ci Qarabağ süvari alayı bölüyünün atları döyüş vəzifələrini yerinə yetirmək qabiliyyətində deyildi (148, v.403-404).

3-cü Gəncə alayının digər taborlarında da silahın saxlanması vəziyyəti ürəkaçan deyildi. Silahların bir çoxunun detalları xarab olmuşdu, döyüş patronunun çoxunu pas atmışdı (88, v.11).

Silahların, texnikanın və atların saxlanması üzrə mövcud olan nöqsanlar Hərbi Nazirliyin rəhbərliyinin diqqətindən qaçmırdı. Üzə çıxarılan faktlar dərhal ümumiləşdirilərək hərbi nazirin əmri ilə rəsmiləşdirilir və nöqsanların aradan qaldırılması üçün ən sərt tədbirlərin qəbul edilməsi xid-

məti təşkil edə bilməyən komandirlərin tutduğu vəzifədən uzaqlaşdırılması belə istisna edilmirdi.

Hərbi nazirin qəbul etdiyi qərarlar təkcə bu və ya digər zabitin, komandirin fəaliyyətinin qiymətləndirilməsi ilə kifayətlənmirdi. 1919-cu ilin aprel ayından başlayaraq ordunun at və süvari ləvazimatı ilə təchizı sisteminin təkmilləşdirilməsinə cəhd göstərildi. Həmin vaxta qədər süvari qoşunlarına çağırılan gənc özü ilə at da gətirməli idi. Bu isə çox zaman ümid edilən nəticəni vermirdi. Çünki çağırış-səfərbərlik işində nöqsanların mövcud olduğu şəraitdə orduya çağırılan yoxsul təbəqənin yaxşı atı yox idi. Xidmətə yararsız atların hissəyə gətirilməsi ilə döyüş hazırlığının qaldırılmasında əhəmiyyətli bir rol oynamırdı (162, v.48).

1919-cu ilin aprel ayından başlayaraq atların da çağırışçılar üzrə deyil, çağırış məntəqələri üzrə toplanmasına başlandı. Hər çağırış məntəqəci üzrə çağırılacaq atların, habelə yəhərlərin norması müəyyənləşdirilirdi. Ancaq atlar və yəhərlərin təchizat mənbəyi təkcə çağırış deyildi. Eyni zamanda bazardan da atlar alınırdı. Hərbi nazirin əmri ilə atların alınması üçün xüsusi komissiya yaradılmışdı və at alqı-satqısı bu komissiyanın rəhbərliyi altında həyata keçirilirdi. Nazir bu komissiyanın işində əliəyriliyə, israfçılığa yol verilməməsini başlıca vəzifə kimi irəli sürürdü (94, v.65).

Qoşun hissələrində nazirin əmri ilə yaradılan başqa bir komissiya atların xidmətə yararlı olub-olmadığını müəyyənləşdirirdi. Bu komissiya əsasən baytar həkimlərdən təşkil edilirdi (107, v.7).

Qoşunların atla təchizat sisteminin təkmilləşdirilməsi hissələrdə atların sayının artmasına da müsbət tə'sir göstərdi. 1919-cu ilin artıq yayında vəziyyət 1919-cu ilin əvvəli ilə müqayisədə xeyli yaxşılaşmışdı.

1919-cu ilin may ayında süvari diviziyasının sərəncamına 397 baş at verilmişdi. Bu atlardan 200 başı Göyçay qəzasından, 100 başı Şamaxı qəzasından, 97 baş at isə Bakı qəzasından alınmışdı. Bu atların təxminən yarısı Şəki süvari alayına verilmişdi (162, v.93). Həmin ilin iyun ayında süvari diviziyası iki böyük partiyada at aldı. Birinci partiya 100 atdan ibarət olub Müsüslüdən, ikinci partiya isə 44 atdan ibarət olub Salyandan toplanmışdı. Bu atların hamısı 3-cü Şəki süvari alayına verilmişdi (162, v.19).

1919-cu il avqustun 1-də 1-ci Tatar süvari alayında 442 at var idisə (162, v.19), həmin ilin sentyabr ayında burada atların sayı artıq 467 başa çatmışdı (297, s.55). Belə artım bütün süvari alaylarında mövcud idi. Bunu aşağıdakı cədvəldən də görmək mümkündür (bax: 162, v.19,102).

| Hissələrin adı | 1 avqust 1919-cu ildə | | 15 avqust 1919-cu ildə | |
|---|---|---|---|---|
| | atların sayı | yəhərlərin sayı | atların sayı | yəhərlərin sayı |
| 1-ci Tatar süvari alayı | 442 | 150 | 435 | 180 |
| 2-ci Qarabağ süvari alayı | 330 | 234 | 412 | 232 |
| 3-cü Şəki süvari alayı | 380 | 298 | 442 | 393 |



Doğrudur, mövcud olan atlar süvari alaylarının ştatının təxminən yarasını təşkil edirdi. Ancaq görmək çətin deyil ki, həyata keçirilən tədbirlər atların ümumi miqdarının getdikcə artmasına səbəb olurdu.

Süvari diviziyasının sərəncamına daxil olan atlardan topçu hissələrinə də verilirdi. 2-ci yüngül topçu batareyası əlavə olaraq 31 at, 6-cı dağ topçu batareyası 54 at və qaubitsa batareyası 69 at almışdı. Nəticədə bu batareyalarda atların sayı 75 başa çatdırılmışdı. Halbuki, bu batareyaların sülh dövrü üçün ştatında 59 baş at olmalı idi. 3-cü yüngül topçu batareyasına 22 baş at verilərək bölmədəki atların sayı 59 başa çatdırılmışdı. Bunlardan başqa, 2-ci yüngül topçu divizionuna 37 baş, dağ-süvari batareyasına isə 35 baş at verilmişdi (162, v.93).

1919-cu il sentyabr ayının sonlarında 1-ci Tatar süvari alayının atlarla təchiz mənzərəsi belə idi (297, s.55).

| | ştat üzrə | mövcud | çatışmır | |
|---|---|---|---|---|
| | | | miqdarı | faizlə |
| atların ümumi sayı | 979 | 467 | 512 | 52,3 |
| onlardan nizami atlar | 762 | 411 | 351 | 46 |

Piyada alaylarında isə 1919-cu ilin yayında atlarla təchizat səviyyəsi xeyli aşağı idi. Məsələn, həmin il sentyabr ayının ilk günlərində 1-ci Cavanşir piyada alayında ştatla 239 baş ata qarşı yalnız 44 baş, 2-ci Zaqatala piyada alayında ştatla 206 baş ata qarşı cəmi 10 baş və 3-cü Gəncə piyada alayında ştatla 160 baş ata qarşı 29 baş at var idi (162, v.172).

Yuxarıdakı cədvəldən göründüyü kimi hətta süvari alaylarında mövcud olan atların çoxu yəhərsiz idi. Bu da bütünlükdə hissələrin döyüş hazırlığına tə'sir edirdi. Süvari diviziyasının komandiri 1919-cu il sentyabrın 11-də Hərbi Nazirliyə göndərdiyi arayışında bildirirdi ki, 1-ci Tatar süvari alayı nizami planda lazımi döyüş hazırlığına malikdir. Lakin şəxsi hey'ətin çoxu atsızdır. Yəhər isə daha çox çatmır. Diviziya komandiri 1-ci Tatar süvari alayı komandirinin hissəsini yəhərlə tə'min etmək üçün irəli sürdüyü təklifinin hərbi nazir tərəfindən müdafiə edildiyini bildirirdi. Diviziya komandirinin fikrincə, bu təklifin həyata keçirilməsi mövcud olan şəxsi hey'əti 4-5 gün ərzində bütünlüklə at belinə qaldırmağa imkan verirdi (162, v.192).

Həmin vaxt Quba ətrafında yerləşən və Quba dəstəsinin tərkibinə daxil olan 1-ci Tatar süvari alayının komandiri təklif edirdi ki, Quba qəzasında olan 220 kəndin hər birindən pulla 2 ədəd yəhər alınsın. Ümumən

alınmış 440 ədəd yəhər alayın mövcud ehtiyaclarını ödəməyə bəs edərdi. Alay komandiri təklif edirdi ki, bunun üçün xüsusi komissiya təşkil edilsin, komissiya kəndlərin nümayəndələri ilə danışıq aparsın və alqı-satqıya rəhbərlik etsin. Hər kənd üçün 2 ədəd yəhər elə də çox deyildi və bu kəndlərdə elə bir narazılıq da yaratmazdı (161, v.185).

Atların yəhərlərlə tə'min edilməsi üçün hissələrin daxili imkanlarından istifadə olunurdu. Süvari alaylarında həm nalbəndxanalar və həm də yəhərtikmə e'malatxanaları var idi. Bu e'malatxanaların səmərəli işlədilməsi üçün süvari diviziyasının komandiri müvafiq strukturlar qarşısında yəhərtikən ustaların xidmətə çağırılması və süvari alaylarına göndərilməsi barədə vəsatət qaldırmışdı. 1919-cu ilin sentyabr ayında diviziya komandirinin arzuladığı qədər usta çağırılmasa da (162, v.192), hər halda bu e'malatxanalar fəaliyyət göstərir, yəhərlə bərabər digər süvari təchizatının hazırlanması və bərpası ilə məşğul olurdu. (161, v.86).

Süvari alaylarında atlar süvarilər arasında bölüşdürülmüşdü və hər at konkret olaraq bir süvariyə tapşırılmışdı. Süvari yalnız öz atını istifadə edə bilərdi və başqasının atını tə'limə çıxarmaq ixtiyarı yox idi. Bu tələb əvvəlki vaxtlardakı təcrübədən fərqli olaraq atlara qayğının və eləcə də buna cavabdeh olan hərbi qulluqçuların məs'uliyyətinin artırılmasına imkan verirdi. (174, v.77).

Atların yemləndirilməsində bir yüngüllük yaratmaq üçün alaylara nazirlik tərəfindən torpaq sahələri ayrılmışdı. Bu torpaq sahələri alayların özləri tərəfindən qorunmalı və orada atlar üçün ot əkilib biçilməli idi. (174, v. 74).

Orduya cəlb edilmiş olan atların mühafizəsi və qorunması üçün də Hərbi Nazirliyin rəhbərliyi tərəfindən müvafiq tədbirlər həyata keçirilirdi. Bə'zi hissələrdə atların dəyişdirilməsi və ya onların yoxa çıxması xəbərini aldıqdan sonra nazir əmr etdi ki, bütün atların ciddi qeydiyyatı aparılsın. Bunun üçün atlar surğuclanıb möhürlənmiş kitablarda qeyd edilsinlər. İki nüsxədə işlənmiş bu kitablardan biri hissədə saxlansın, biri isə Ümumi qərargaha göndərilsin (90, v.27).

Atların qorunmasında, işlədilməsində və onların təchizatında biganəlik və laqeydliyə yol verən şəxslərə qarşı hərbi nazir çox barışmaz mövqe tuturdu. 1919-cu ilin sentyabr ayında Gəncədə 4 baş ingilis atının ölməsi xəbərini eşidən kimi nazir xüsusi komissiya tə'yin etmişdi ki, bu faktı yoxlasın və cavabdeh şəxsləri müəyyənləşdirsin. Nazir komissiyaya tapşırıq vermişdi ki, təhqiqatın nəticələrini şəxsən ona mə'ruzə etsin. Bu məsələ ilə bağlı imzaladığı əmrdə nazir hissə komandirlərinin atların qorunmasına olan münasibətini bütünlükdə dövlət malına münasibəti kimi qiymətləndirir və bunun dözülməz bir hal olduğunu vurğulayırdı (153, v. 112).

1919-cu ilin sentyabr ayında Gəncədən Bakıya daşınarkən dördçarxlı arabanın və üç ədəd yəhərin qatardan aşıb xarab olmasına görə təqsirkar



bilinən poruçik Kordzaxiya Azərbaycan Ordusunun sıralarından xaric edilmişdi. Xidməti əmlakın qorunmasında ehtiyatsızlıq və laqeydlik göstərdiyi üçün hərbi nazir Kordzaxiyanı Azərbaycanda hər hansı bir dövlət qulluğunda işləmək hüququndan məhrum etmişdi. (153, v.114).

Hərbi nazir S. Mehmandarov qiymətli cins olan ingilis atlarının yerli-yersiz minilməsini, onlardan istifadə edilməsini də qadağan edirdi. O, bir sıra zabitlərin səhərlər bu atlarla işə gəlməsinə təəccübünü bildirir və belə hallara son qoyulmasını tələb edirdi. Bu məsələ ilə bağlı S. Mehmandarov 1919-cu il oktyabrın 1-də imzaladığı 449 saylı əmrində bildirirdi: "Mənə minik üçün ayrılmış ingilis atı və iki şəxsi ata malik olmağıma baxmayaraq xidmət yerinə piyada gedirəm. Bunu gənclər də edə bilərlər" (153, v.125).

Hissələrdə atların miqdarının, onların vəzifələrinə görə bölüşdürülməsinin nizamlanması ilə bağlı nazir 1919-cu il oktyabrın 23-də 494 saylı əmr imzaladı. Həmin əmrdə göstərilirdi ki, mövcud ştatların dəyişilməsinə kimi piyada süvari və topçu hissələrində atlar əmrdə göstərildiyi miqdarda saxlansın və qeyd olunan qayda üzrə bölüşdürülsün. Yeni normalara görə piyada alayında 26 minik atının, 2 qoşqu atının və 76 baş malın saxlanmasına icazə verilirdi. Minik atları alay komandiri, onun yavəri, onun müavini, 3 nəfər tabor komandiri, 3 nəfər pulemyot komandası komandiri, 6 nəfər pulemyot komandasının zabiti, 10 nəfər çapar və rabitə rəisi üçün nəzərdə tutulmuşdu. Süvari alaylarının hər birində 600 baş nizami at, alay qərargahı üçün 6 baş minik atı, 19 baş yük atı, pulemyot komandaları üçün 75 baş at və 10 baş mal olmalı idi. Əmrdə topçu hissələrində olan atların sayı da göstərilmişdi. Bu atlar topçu hissələrini hərəkətə gətirmək üçün bəs etməli idi. Həmin hissələrin komandir hey'ətini gəzdirmək üçün də atlar nəzərdə tutulmuşdu (153, v. 170).

1919-cu ilin ikinci yarısında qoşunların atlarla və yəhərlərlə təchizat səviyyəsi xeyli yaxşılaşdırılmışdısa, qoşqu arabalarına olan tələbat əvvəlki kimi qalmışdı. Hərbi Nazirliyin rəhbərliyi əldə olunan imkandan istifadə edərək 1920-ci ildə bu sahədə də dönüş yaratmağı planlaşdırırdı. Təsdiq edilmiş plana görə Azərbaycan Ordusuna 1920-ci ildə aşağıdakı miqdarda müxtəlif növ qoşqu arabaları alınmalı idi. (297, s.67)

| Arabaların növləri | ştat üzrə | mövcud | çatışmır | çatışmır (% hesabı ilə) |
|---|---|---|---|---|
| İkiatlı dördçarxlı araba | 393 | 34 | 359 | 91,4 |
| Biratlı dördçarxlı araba | 156 | 25 | 131 | 34,0 |
| Telefon əmlakının nəqli üçün araba | 80 | 9 | 71 | 88,8 |

| | | | | |
|---|---|---|---|---|
| Biratlı dördçarxlı təsərrüfat arabası | 885 | 400 | 485 | 54,9 |
| İkiatlı dördçarxlı təsərrüfat arabası | 129 | 71 | 58 | 45,0 |
| Müxtəlif tiplərdə qoşaatlı yük arabaları | 556 | 243 | 313 | 56,2 |
| Xəstə daşıyan dördatlı araba | 39 | 1 | 36 | 97,4 |
| Qoşaatlı xəstə daşıyan arabalar | 12 | 3 | 9 | 75,0 |
| Piyada qoşunlar üçün mətbəx arabalar | 217 | 81 | 136 | 62,7 |

Bu cədvəldən həm də 1919-cu ildə Azərbaycan Ordusunda nə qədər araba mövcud olduğunu da görmək mümkündür. Çatışmayan çoxlu sayda arabanın növbəti ildə alınmasının planlaşdırılması isə ordunun maddi imkanlarının, texniki potensialının yüksələn inkişaf prosesində olduğunu sübut edirdi.

Eyni mənzərəni ordunun silah və sursatla təchizatında da görmək mümkündür. 1919-cu ilin əvvəlində bu sahədə mövcud olan qıtlıq ilin ikinci yarısında artıq aradan qaldırılmış, nəzərəçarpacaq irəliləyişlərə nail olunmuşdu. Müvafiq hesabat sənədlərinin öyrənilməsi göstərir ki, 1918-20-ci illər ərzində Azərbaycan Ordusunun təchizatında aşağıdakı atıcı və soyuq silahlar olmuşdur (bax: 94, v.131):

- üçxətlı rus piyada tüfəngi (7,62 mm);
- üçxətlı rus draqun tüfəngi,
- üçxətlı rus kazak tüfəngi;
- üçxətlı rus karabini;
- üçxətli naqan sistemli revolver;
- Berdanka sistemli 4,2 xətli rus piyada tüfəngi (10,568 mm);
- Berdanka sistemli 4,2 xətli rus piyada tüfəngi;
- Berdanka sistemli 4,2 xətli rus kazak tüfəngi;
- "Mauzer" sistemli türk tüfəngi;
- "Lebal" sistemli fransız tüfəngi;
- "Manlıxer" sistemli Avstriya tüfəngi;
- "Mauzer" sistemli alman tüfəngi;
- Yapon tüfəngi;
- "Vetterli" sistemli İsveçrə tüfəngi;
- "Smit və Vesson" sistemli rus revolveri;
- topçu qılıncı;



- Draqun qılıncı;
- kazak qılıncı;
- Asiya qılıncı;
- düz xəncər, əyri xəncər, nizə.

Hissələrin təchizatında yaranan ilk nəzərəçarpacaq müsbət dəyişiklik isə Gürcüstanla bağlanan hərbi müdafiə paktından sonra meydana gəldi. Şimaldan gözlənilən təhlükənin qarşısının alınması tədbirlərini və qarşılıqlı əlaqələrin nizamlanmasını nəzərdə tutan bu müdafiə paktı 1919-cu il iyunun 16-da Tiflisdə imzalandı. Bu müqaviləyə uyğun olaraq elə həmin gün iki respublika arasında hərbi-texniki saziş də imzalandı. Hər iki tərəfin Hərbi Nazirliyin nümayəndələrinin iştirakı ilə birgə Hərbi Şura da yaradıldı. Gürcüstan tərəfdən bu Hərbi Şuraya generallar Odişelidze və Kutateladze, Azərbaycan tərəfdən isə generallar Ə.Şıxlinski və Sulkeviç daxil idilər (310, s.219-220).

Bu sənədlər imzalanandan sonra tərəflər arasında texniki əlaqələr də gücləndi və Azərbaycanın Hərbi Nazirliyi öz ordusunun texniki təchizatını müəyyən qədər təkmilləşdirmək imkanı əldə etdi.

Qarşılıqlı razılaşma əsasında Gürcüstandan alınması nəzərdə tutulan ərzağın, silah və sursatın qəbul edilməsi üçün hərbi nazirin əmri ilə xüsusi komissiya yaradıldı və Topçu İdarəsinin rəisi general-mayor M.Tlexas bu komissiyanın rəhbəri tə'yin edildi (90, v.3).

General Tlexasın rəhbərlik etdiyi komissiya 1919-cu ilin iyul ayında Tiflisdə səmərəli fəaliyyət göstərdi və Azərbaycan Ordusunun təchizatı üçün böyük əhəmiyyət kəsb edən xeyli sayda texniki vasitə və ərzaq toplayıb Azərbaycana göndərdi.

Komissiya tərəfindən Aəzrbaycana göndərilən ərzaq əsasən qənddən ibarət idi. Əldə edilən 4 min pud qənd iki dəfəyə eşelonlarla Azərbaycana yola salındı (161, v.202).

İyulun 11-də Tiflisdən ilk silah və sursat eşelonu yola salındı. Bu eşelonda 12 ədəd dağ topu, dağ topları üçün 10 yeşik partlayıcı maddə, 1500 ədəd tüfəng, toplar və tüfənglər üçün böyük sayda ehtiyat detallar gətirildi. İyulun 19-da yola salınan ikinci eşelonda 8 ədəd yüngül top, toplar üçün 16 yeşik partladıcı maddə, 1500 ədəd tüfəng, toplar və tüfənglər üçün ehtiyat detallar, 12885 rubla alınmış dərman və tibb ləvazimatı və topoqrafiya əşyaları var idi. İyulun 17-də növbəti bir eşelon Tiflisdən yola düşməli idi. Bu eşelonda əsasən istehkam ləvazimatı toplanmışdı. Lakin yüklənən malların əvəzinin hansı yolla ödənəcəyinin aydınlaşdırılmaması üzündən bu eşelonun göndərilməsi bir qədər ləngidi və nəhayət iyulun 21-də bu eşelonda yola salındı (161, v. 202).

General Tlexasın iyulun 23-də hərbi nazirin adına göndərdiyi teleqramda bildirilirdi ki, iyulun 24-də növbəti eşelonun yola salınması planlaş-

dırılır. Həmin eşelonda qaubitsalar üçün 10 yeşik partlayıcı maddə, qaubitsalar üçün ehtiyat detallar, xəncər, süngü, süvari təchizatı olmalı idi. Bu eşalona top, pulemyot və tüfənglər üçün də ehtiyat hissələrin toplanması nəzərdə tutulmuşdu. İyulun 18-dən e'tibarən komissiya çoxlu sayda mətbəx arabalarının, dördçarxlı arabaların qəbuluna başlamışdı. Şəxsi adamlardan 20 min rubl həcmində çoxlu sayda ehtiyat top detalları alınmışdı. Şəxsi adamlardan alınan əmlakın keyfiyyətinə komissiya tərəfindən xüsusi fikir verilirdi. Alınan bütün əmlak üçün gürcü tərəfinə 80 min rubl avans verilmişdi. Gələcəkdə alınan əmlakın məbləğinin bir hissəsinin Gürcüstan tərəfinə neftlə ödənməsi razılığı əldə edilmişdi (161, v. 202-203).

Bu əmlakın gətirilməsi Azərbaycan Ordusunun hissələrinin ehtiyacını müəyyən qədər ödədi. Mövcud olan ehtiyac tamamilə aradan qaldırılmasa da vəziyyət kifayət qədər yaxşılaşmışdı. 1919-cu il avqustun 1-də süvari alaylarının odlu və soyuq silahla təchizat mənzərəsi aşağıdakı şəkildə idi (bax: 162, v. 100):

| Alayların adı | mövcud əsgərlərin sayı | tüfəng | | revolver | | qılınc | | xəncər | | süngü | |
|---|---|---|---|---|---|---|---|---|---|---|---|
| | | mövcud | çatmır | mövcud | çatmır | mövcud | çatmır | mövcud | çatmır | mövcud | çatmır |
| 1-ci Tatar süvari alayı | 685 | 319 | 433 | – | 155 | 437 | 256 | 676 | 175 | 361 | – |
| 2-ci Qarabağ süvari alayı | 705 | 593 | 159 | – | 155 | 258 | 535 | – | 851 | 100 | 156 |
| 3-cü Şəki süvari alayı | 661 | 430 | 329 | – | 155 | 244 | 549 | 344 | 307 | 82 | 174 |

Bu cədvəldə çatışmayan silahların sayı ştat göstəricilərinə görə verilmişdi. Mövcud olan əsgərlərin sayına görə isə tüfənglə təchizat ümumən 60-65 faiz arasında idi.

Piyada alaylarında isə təchizat səviyyəsi daha yaxşı idi. 1919-cu il sentyabrın 25-də 1-ci Cavanşir piyada alayında mövcud olan 1703 əsgərin 1015 üçxətli rus tüfəngi və 24 ədəd "Maksim" pulemyotu, 2-ci Zaqatala piyada alayında mövcud olan 1342 əsgərin 1190 ədəd üçxətli rus tüfəngi və 4 ədəd "Maksim" pulemyotu, 3-cü Gəncə piyada alayının mövcud olan



1218 əsgərinin 1573 tüfəngi və 17 ədəd "Maksim" pulemyotu var idi (162, v.172).

1919-cu ilin avqustunda ingilis qoşunları Bakını tərk edərkən müəyyən miqdarda hərbi sursat, radiostansiya və bir neçə gəmi Azərbaycana verildi (310, v.256). Verilən mə'lumata görə "Qars", "Ərdəhan" hərbi gəmilərinin, "Astrabad", "Araz" və "Nargin" köməkçi gəmilərinin Hərbi Nazirliyə verildiyi güman edilir (202, s.123). İngilislərin getməsindən sonra Hərbi Nazirliyin tərkibində Hərbi liman da tə'sis edildi. Ancaq 1919-cu ildə yuxarıda göstərilən gəmilərin hamısının işlək olmasını iddia etmək olmazdı.

1919-cu il sentyabrın 1-də Hərbi limanın, oktyabrın 1-də isə "Astrabad" gəmisinin ştatının açıldığı barədə nazirin əmri olsa da (100, v.8), 1919-cu ilə aid olan arxiv sənədlərində yuxarıda adları çəkilən gəmilər barədə mə'lumatlarla rastlaşmaq çətindir. Digər tərəfdən, mə'lumdur ki, ingilis qoşunlarının getməsindən sonra Bakının Denikin təhlükəsindən qorunması üçün yaranan əsas narahatçılıqlardan biri hərbi gəmilərin olmaması və dəniz istiqamətindən Bakının müdafiəsiz qalması idi (Bu barədə aşağıda danışılacaqdır). Digər tərəfdən isə texniki qüvvələr olmadığı üçün Dövlət Müdafiə Komitəsinin 13 dekabr 1919-cu il tarixli qərarı ilə Hərbi liman Yollar Nazirliyinin sərəncamına verilmişdi (97, v.76).

Hərbi təchizata olan ehtiyacın qismən ödənilməsi üçün həm respublikanın potensialından, həm də hissələrin daxili imkanlarından da istifadə edilirdi. Bununla bağlı Gəncədəki hərbi zavod yenidən quruldu. Hərbi Nazirliyin rəhbərliyi Nazirlər Şurası qarşısında bu zavodda mərmi sexi açılması və bunun üçün zəruri olan maliyyə vəsaitlərinin ayrılması barədə məsələ qaldırdı (101, v.3). Gəncə zavodunun yenidən qurulması məsələsi parlamentin iclaslarının birində də müzakirə edildi və nəzərdə tutulan yenidənqurmanın həyata keçirilməsi üçün 688 min rubl vəsaitin ayrılması barədə qərar qəbul edildi (1112, v.12).

Hissələrdə olan silah e'malatxanaları isə xarab olmuş silahları tə'mir və bərpa edirdilər. Bu işi lazımi səviyyədə təşkil etmək üçün hissələrə mülki ustaların qəbul edilməsi məsələsi də qaldırılmışdı (98, v.59). Qoşun hissələrində silahın hansı vəziyyətdə olması Hərbi Nazirliyin rəhbərliyinin daimi nəzarəti altında idi. Vaxtaşırı nazirliyə hissələrdən təqdim olunan arayış-mə'lumatda işlək və qeyri-işlək silahların sayı, silah e'malatxanasının vəziyyəti və nə qədər silah tə'mir edilməsi barədə də mə'lumatlar verilirdi (162, v.20; 163, v.74).

2-ci piyada diviziyasının komandiri 27 oktyabr 1919-cu il tarixli daxili əmrində Lənkəran köməkçi (ehtiyat) taborunda silah e'malatxanasının yaxşı təchiz edildiyini, səmərəli işlədiyini qeyd edərək komandir kapitan Rəfibəyova təşəkkür e'lan edirdi. Tabora verilmiş olan 300 ədəd tüfəngdən 205

ədədi qısa müddət ərzində texniki tələblərə uyğun şəkildə tə'mir edilmişdi (171, v.61).

1920-ci ilin əvvəllərində hərbi uğursuzluqlara düçar olan Denikin ordusunun komandanlığı Azərbaycan Ordusuna 20 ədəd top, 100-dən çox pulemyot, 15 min tüfəng, 10 milyon patron, 9 ədəd təyyarə və başqa texnika, silah və sursat verdi (305, s.248). Bunlar qoşun hissələrinin maddi-texniki imkanlarını bir qədər də yaxşılaşdırırdı. Lakin Hərbi Nazirliyin rəhbərliyi 1920-ci ildə Azərbaycan Ordusunun maddi-texniki təchizatını daha da təkmilləşdirmək üçün qarşıya böyük planlar qoymuşdu. Bu planların həyata keçirilməsi Azərbaycanın döyüş imkanlarını və müdafiə qüdrətini xeyli artırmalı idi.

1920-ci ildə Xəzər Hərbi Donanmasının əməli surətdə yaradılması və möhkəmləndirilməsi üçün xaricdən saatda ən azı 23 uzel* gedən 6 ədəd sür'ətli katerlərin alınması planlaşdırılırdı ki, belə katerlər 34-76 mm-lik topla və bir ədəd zenit topu ilə təchiz edilirdi. Onlar dənizdə çevik manevrlər etməklə yanaşı kifayət qədər tə'sirli atəş qüvvəsinə də malik idilər. Sonra 47 mm-lik və ya 57 mm-lik topla, 2 ədəd mina qurğusu ilə silahlanmış və həmin sür'ətlə üzə bilən 12 ədəd kater, habelə sualtı qayıqlarla mühafizə üçün nəzərdə tutulmuş, bir ədəd 57 mm-lik topla, bir ədəd zenit topu ilə təchiz edilmiş və saatda 26 uzeldən 36 uzelədək sür'ətlə hərəkət edə bilən katerin alınması planlaşdırılırdı. Sadalanan silahlardan başqa bu katerlərin hər birinə ən azı 2 ədəd pulemyot, fəaliyyət radiusu 200-250 mil olan simsiz teleqraf qurğuları qoyulmalı idi. Katerlərin həcm ölçüləri e'tibarilə elə də böyük olmayacağı, uzunluğunun 18-20 metri aşmayacağı məqsədəuyğun sayılırdı ki, onu sökmədən, qurulu halda dəmiryolu vasitəsilə Bakıya gətirmək mümkün olsun. Dənizdən düşmən gəmilərinin hücumlarının qarşısının alınması, Bakı hövzəsinin müdafiəsinin gücləndirilməsi üçün mina düzən gəminin alınması da 1920-ci ilin planlarına daxil idi (297, s.62-63).

Xəzər Hərbi Donanmasının formalaşdırılması barədə Azəbaycan hökumətinin hazırladığı plana habelə çox da böyük olmayan 6 ədəd sualtı gəminin, mövcud olan gəmilərin təchiz edilməsi üçün 16 ədəd 120 mm-lik, 16 ədəd 76 mm-lik uzaqvuran top, 20 ədəd 57 mm-lik, 20 ədəd 47 mm-lik, 20 ədəd 37 mm-lik top (cəmi 92 ədəd) alınması, sahildə yerləşdirilmiş toplar üçün kifayət qədər mərmi əldə edilməsi də daxil idi. İngilis qoşunlarından alınmış gəmilərin sökülmüş silahlarını bərpa etmək üçün də Hərbi Nazirlik əməli tədbirlər həyata keçirmək fikrində idi. (297, s.63).

Hərbi Nazirliyin 1920-ci ilə planlaşdırdığı fəaliyyətinin başqa bir sahəsini də mövcud olan hava qüvvələrinin möhkəmləndirilməsi və bunun

* 1 узел = 1,852 км / саат



üçün 12 ədəd hidroplanın və 6 ədəd aeroplanın əldə edilib Azərbaycana gətirilməsi təşkil edirdi (297, s.63).

Piyada qüvvələrinin maddi-texniki bazasının möhkəmləndirilməsi də Hərbi Nazirliyin rəhbərliyinin diqqət mərkəzində idi. Nazirliyin rəhbərliyi təkcə qoşunların sayının deyil, onun üçün zəruri olan silah və texnikanın sayının da artırılmasına və onun ştat göstəricilərinə uyğunlaşdırılmasına da çalışırdı.

Aşağıdakı cədvəldən 1919-cu ildə Azərbaycan Ordusunda nə qədər silah və sursatın olduğu və nə qədər çatışmadığı aydın görünür. 1920-ci ildə Hərbi Nazirlik bu çatışmayan silah, sursat və texnikanı əldə etməyi planlaşdırırdı (bax: 297, s.63).

| Əşyaların adı | ştat üzrə | mövcud | çatışmır | çatışmır (% hesabı ilə) |
|---|---|---|---|---|
| 1902-ci il nümunəli üçdüyməli* yüngül top | 54 | 32 | 22 | 40,7 |
| 1909-cu il nümunəli üçdüymədi dağ topu | 54 | 24 | 30 | 55,5 |
| 1910-cu il nümunəli 48 xətlik qaubitsa | 14 | 4 | 10 | 71,5 |
| "Maksim" pulemyotu | 416 | 116 | 344 | 72,2 |
| İngilis tüfəngləri | 40000 | 14000 | 26000 | 65 |
| "Brauninq" nümunəli revolver | 5000 | 100 | 4900 | 98 |
| Top və pulemyotlu zirehli avtomobil | 10 | 1 | 9 | 90 |
| Yalnız pulemyotlu zirehli avtomobil | 10 | 1 | 9 | 90 |
| Tank | 5 | - | 5 | 100 |
| Stereotruba | 100 | 1 | 99 | 99 |
| Durbin | 500 | - | 500 | 100 |
| Üçdüyməli səhra qumbarası | 54000 | 4500 | 49500 | 91,7 |
| Üçdüyməli şrapnel | 108.000 | 43000 | 65000 | 60,2 |
| Üçdüyməli dağ qumbarası | 54000 | 9000 | 45000 | 83,4 |
| Üçdüyməli dağ şrapneli | 108000 | 8000 | 100000 | 92,6 |
| 48 xətlik qaubitsa bombası | 315000 | 10000 | 21500 | 68,3 |

* 1 дүјмә = 25,4 мм.

| | | | | |
|---|---|---|---|---|
| 48 xətlik qaubitsa şrapneli | 10500 | 4000 | 6500 | 62 |
| Tüfəng üçün üçxətlik patron | 40 milyon | 8 mil | 32 mil | 80 |
| Pulemyot üçün patron | 46 mil | - | 46 mil | 100 |
| Revolver patronu | 500000 | - | 500000 | 100 |

Qoşun hissələrinin maddi-texniki təchizi ilə bağlı Hərbi Nazirliyin 1920-ci il üçün fəaliyyət proqramı eyni zamanda onu göstərirdi ki, ordunun təkcə say tərkibinə deyil, onun keyfiyyət tərkibinə, hərbi hissələrinin döyüş potensialının genişləndirilməsinə xüsusi diqqət yetirilirdi. 1919-cu il boyu mürəkkəb tarixi şəraitə baxmayaraq ordunun yüksək xətt üzrə inkişafda olması, Azərbaycan hökumətinin ordunun formalaşmasına daimi qayğısı 1920-ci il üçün qarşıya qoyulan planların da reallığından xəbər verirdi.

Beləliklə, türk qoşunlarının Azərbaycanı tərk etməsi ərəfəsində Hərbi Nazirliyin bərpa edilməsi, hərbi hissələrin təşkilinə rəhbərliyin ona tapşırılması müstəqil ordu quruculuğunun keyfiyyətcə yeni bir mərhələsini təşkil edirdi. Azərbaycan hökuməti, onun strukturuna daxil olan Hərbi Nazirlik çox mürəkkəb ictimai, siyasi, iqtisadi və hərbi şəraitdə dövlətin müstəqilliyini qorumağa qadir olacaq bir ordunu yaratmalı idi. İstər tarixi şəraitin mürəkkəbliyi, istərsə də hərbi təcrübə, ən'ənə və bazanın xüsusiliyi ordunun formalaşdırılmasını çətinləşdirsə də, Hərbi Nazirliyin rəhbərliyinin ardıcıllığı, təşəbbüskarlığı, işgüzarlığı qısa müddət ərzində öz bəhrəsini verməyə başladı. Azərbaycan Ordusunun tezliklə real bir qüvvəyə çevrilməsi ilk növbədə Hərbi Nazirliyin rəhbərliyinin düzgün, real və səmərəli təşkilatçılıq fəaliyytinin məntiqi nəticəsi idi. Bu rəhbəredici və istiqamətləndirici orqan öz çevikliyi, ardıcıllığı ilə ordunun bütün strukturlarının səmərəli işinə obyektiv bir zəmin yaradırdı. Hərbi Nazirliyin aparatı Azərbaycan Ordusunun bütün mövcudluğu ərzində daim təkmilləşdirilmə prosesində olmuş, bürokratik manelər aradan qaldırılmışdı. Bu orqanın rəhbərliyi altında qoşun növlərinin və hissələrinin formalaşdırılmasında bir məqsədyönlülüyə nail olunmuşdu. Yə'ni sadəcə olaraq ordunun say tərkibinin artırılmasına deyil, onun struktur tərkibinin əsaslandırılmasına, qarşılıqlı fəaliyyət əlaqələrinin tənzimlənməsinə, idarə edilməsində çevikliyin əldə edilməsinə xüsusi diqqət yetirilirdi.

Real strukturlar üzərində formalaşdırılan qoşun hissələrinin taktiki imkanları, döyüşkənlıyi maddi-texniki təchizat səviyyəsindən birbaşa asılı olduğu üçün bu sahə də Hərbi Nazirliyin rəhbərliyinin daimi qayğısı və nəzarəti altında idi. Qoşunların yerləşdirilməsinin, pal-paltar və ərzaqla tə'minatının, silah, sursat və texnika ilə təchizatının yaxşılaşdırılması üçün daim yollar aranırdı. İlk növbədə mövcud olan ehtiyatların qorunması və



səmərəli işlədilməsi, sonra isə maddi-texniki təchizatın yaxşılaşdırılması Azərbaycan Ordusunun ehtiyaclarını xeyli dərəcədə ödəmiş və 1919-cu ilin ikinci yarısından e'tibarən qoşun hissələri kifayət qədər döyüşkənlik əldə etmişdi.

# ÜÇÜNCÜ FƏSİL

## ORDUNUN ZABİT VƏ SIRAVİ HEY'ƏTİ İLƏ KOMPLEKTLƏŞDİRİLMƏSİ

Maddi-texniki baza və şəxsi hey'ət ordunun təşkilinin ən başlıca elementlərindəndir. Maddi-texniki bazası olmayan şəxsi hey'ət insan toplusundan başqa bir şey deyil. Şəxsi hey'ətsiz maddi-texniki baza isə reallaşmamış potensialdır. Yaradılan ordu üçün seçilən ən yaxşı struktur formasının, idarəetmə orqanının, ən müasir texnikanın imkanlarını reallaşdıran ordunun şəxsi hey'əti, onun zabit və əsgərləridir. Onların seçilməsi, yerləşdirilməsi, hazırlıq səviyyəsinin təkmilləşdirilməsi, şəxsi işgüzarlıq keyfiyyətləri ilə qarşıya qoyulan hərbi tapşırıqların üzvi şəkildə əlaqələndirilməsi ordunun döyüş hazırlığının əsas əlamətlərindən biridir. Ona görə də qoşun hissələrinin zəruri kadrlarla tə'min edilməsi, sıravi hey'ətlə komplektləşdirilməsi Azərbaycanın müstəqil ordu quruculuğunun əsas istiqamətlərindən birini təşkil edirdi. Bu istiqamətdə qarşıda dayanan vəzifələrin həyata keçirilməsi bir sıra çətinliklərlə şərtlənirdi. Həmin çətinliklər də ondan ibarət idi ki, mövcud olan milli zabit kadrları planlaşdırılan ordunun yaradılması üçün ehtiyac duyulan kadrların çox-çox cüz'i bir hissəsini təşkil edirdi. Azərbaycanlıların Çar Rusiyası dövründə hərbi məktəblərdə təhsil almasına məhdudluq qoyulmasının acı nəticələri yeni orduda böyük kadr problemi yaratmışdı. Bu problemin aradan qaldırılması lazımi yollarin axtarılıb tapılmasını, vaxt ötürmədən yeni milli kadrların hazırlanmasını tələb edirdi. Ən başlıcası isə orduya cəlb edilmiş olan zabitlərin Azərbaycanın mənafelərinə sədaqətlə xidmət etməsinə nail olmaq idi.

Zabitlərin təkcə say artımının əldə edilməsi deyil, onların düzgün seçilməsi, bacarıq və qabiliyyətlərinə uyğun olaraq düzgün yerləşdirilməsi bütünlükdə kadr siyasətinin formalaşdırılmasını, onun dövrün xüsusiyyətlərinə *uyğun qurulmasını tələb edirdi.*

Ordunun formalaşdırılması, döyüş hazırlığının qaldırılması sahəsində zabitlərin və onlardan ibarət olan komandir hey'ətinin təşkilatçılıq fəaliyyətinin nəticələri sıravi hey'ətin şəxsində reallaşır. Sıravi hey'ətin hansı səviyyədə istiqamətləndirilməsi, öyrədilməsi ordunun döyüş potensialının açılmasında da həlledici əhəmiyyətə malikdir. Bu göstəricilərin əldə edilməsi



isə hər şeydən əvvəl ordunun sıravi hey'ətlə komplektləşdirilməsindən başlayır.

Ordunun sabit komplektləşdirilməsinə nail olmaq üçün bu sahədə də məqsədyönlü və səmərəli bir xətt həyata keçirilməli idi. Azərbaycanın kifayət qədər çağırışçı ehtiyatı vardı. Lakin bu çağırışçı ehtiyatından uzun illər istifadə edilməməsi, əhalinin psixologiyasında əsgəri xidmətə qarşı bir inamsızlıq və e'timadsızlıq yaranması müəyyən problemlər yaradırdı. Ordunun qurulmasının mühüm istiqamətlərindən biri də az qala ümumxalq miqyasında özünü göstərən bu e'timadsızlıq, inamsızlıq, qorxu və təşvişin aradan qaldırılması, çağırışçılarda xidmətə qarşı şüurlu münasibətin yaradılması ilə bağlı idi.

### *I. ORDUNUN ZABİT HEY'ƏTİ*

Azərbaycan Ordusunun zabit kadrlarla tə'min edilməsinin iki mənbəyi var idi. Birinci, daxili mənbə – yə'ni milli zabit kadrları, ikincisi isə xarici mənbə – yə'ni rus, gürcü və digər millətlərdən olan kadrlar. Öz çəkisi e'tibarilə ikinci mənbəyə aid olan zabitlər ordunun kadr hey'ətində heç də az deyildi və bu da əslində obyektiv şəraitlə şərtlənirdi. Yuxarıda qeyd edildiyi kimi, Azərbaycanın milli zabit kadrları həddən artıq az idi və yeni yaradılan qoşun hissələrinin kadr hey'əti ilə tə'min edilməsi üçün qeyri-milli kadrların istifadə edilməsinə xüsusi diqqət yetirilirdi. Onların arasında da çar ordusunda xidmət etmiş rus zabitləri çoxluq təşkil edirdi və Azərbaycan Ordusunun formalaşmasında bu zabitlərin də özünəməxsus xidməti və rolu var idi. 1919-cu ilin əvvəlində ordunun Ümumi qərargahında ərzaq payı olan zabitlərin siyahısındakı 48 zabitdən yalnız 14-ü azərbaycanlı idi (118, v. 47). Yə'ni qərargahın fəaliyyətini tənzimləyən zabitlərin az qala dörddə üçü qeyri-azərbaycanlı zabitlər idi və ordunun formalaşmasının çox məs'uliyyətli sahələri onlara tapşırılmışdı. Bu kadrların arasında general-leytenant Tarxanov, general-mayor Makeyev, polkovnik Serebrennikov, polkovnik Bekov, polkovnik Mixaylov, polkovnik Xarkeviç, polkovnik Mixaylovski və s. kimi fəaliyyəti həmişə rəğbət doğuran zabitlər vardı. Müxtəlif vəzifələrdə xidmət edən bu zabitlər öz təcrübəsi və tapşırılan işə yüksək sədaqəti və məs'uliyyəti ilə fərqləndiyi üçün ordunun möhkəmləndirilməsi istiqamətində ən vacib sahələrə göndərilirdi, qoşun hissələrində xidmətin təşkilinə yaxından kömək edirdilər. Bu zabitlərdən bir çoxunun e'zamiyyətdə olduğu bir sıra hissələrdə təchizat işinin təşkilindəki nöqsanlar barədə verdiyi mə'lumatdan sonra hərbi nazir S.Mehmandarov ordunun təchizat sistemində ciddi dəyişikliklər etmək qənaətinə gəlmişdi (bax: 95, v. 24, 27, 30, 37, 40, 49, 60; 158, v.86).

Milliyyətindən asılı olmayaraq xidməti vəzifəsini sədaqətlə yerinə yetirən heç bir zabitin fəaliyyəti Hərbi Nazirliyin rəhbərliyinin diqqətin-

dən qaçmırdı. 1919-cu ilin yayında Şuşada hərbi vəziyyət mürəkkəbləşəndə, orada yerləşən qoşun bölmələri erməni silahlı dəstələrinə layiqli cavab verdilər. Hərbi nazir öz əmrinin birində qeyd edirdi ki, şəhərin mühafizəsində dayanan və qarovul xidmətini icra edən şəhər qarnizonu öz mövqelərini şücaətlə qorudular və tapşırılan vəzifənin öhdəsindən dəqiqliklə gəldilər. Nazir bu uğurun qazanmasında 1-ci Cavanşir piyada alayının buradakı birinci taborunun komandiri ştabs-kapitan Ştollun və bölük komandiri poruçik Yan Kosinskinin fəaliyyətini vəzifə borcunun vicdanlı icrası kimi qiymətləndirir və qorxmazlığı ilə əsgərləri də ruhlandıran bu zabitlərin hər ikisinə səmimi təşəkkürünü çatdırırdı (90, v. 36).

Azərbaycan Ordusu sıralarında xeyli sayda gürcü zabiti də var idi (145, v. 87) və onların sədaqətli xidməti, Azərbaycan Ordusunun formalaşmasındakı rolları minnətdarlıqla qiymətləndirilirdi. İste'faya çıxan general-mayor Amaşukelinin Azərbaycan Ordusu sıralarındakı xidmətinə hərbi nazirin verdiyi qiymətə yuxarıda toxunulmuşdu. Onu da qeyd etmək lazımdır ki, bolşevik işğalı ərəfəsində Azərbaycan hökumətinin ordu ilə bağlı son qərarlarından biri də məhz iki gürcü zabitinə – polkovnik Karqatleteli və polkovnik Çxeidzeyə general-mayor rütbəsi verilməsi ilə bağlı idi (bax: 269, s. 208).

Bütün zabitlər kimi qeyri-azərbaycanlı zabitlərin Azərbaycan Ordusunda xidmətə qəbulu hərbi nazirin əmri ilə rəsmiləşdirilirdi. Onlar xidmətə qəbul olunan kimi Azərbaycan Respublikasına sədaqət andı qəbul etməli idilər. Qəbul edilən hər bir zabitin əvvəlki xidmət stajı, rütbəsi və müvafiq hüquqları saxlanılırdı. Hətta Azərbaycan Ordusunda xidmət edərkən gürcü zabiti rotmistr Pxakadze Gürcüstan hökumətinin qərarı ilə podpolkovnik rütbəsinə layiq görülmüşdü və Azərbaycanın hərbi nazirinin müvafiq əmri ilə Pxakadzenin yeni rütbəsi buradakı xidməti zamanı nəzərə alınırdı (90, v. 69).

Bir sözlə, orduya qəbul edilən qeyri-azərbaycanlı zabitlərin xidmətinin icrası üçün azərbaycanlı zabitlərlə bir səviyyədə lazımi şərait yaradılır və qayğı göstərilirdi. Bununla belə onlara qarşı çox böyük tələbkarlıq da nümayiş etdirilirdi. Zabit kadrlarının həddsiz qıtlığına baxmayaraq hər birinin fəaliyyəti daimi nəzarət altında idi və hərbi xidmətin tələblərinə cavab verməyən və ya vəzifəsinin icrasına laqeydlik və biganəlik göstərənlərə qarşı ən sərt tədbirlər həyata keçirilirdi. Məsələn, gürcü generalı Purseladze zabit mə'nəviyyatının və davranış qaydalarının tələblərinə cavab verə bilmədiyi, tabeçiliyində olanların gözü qarşısında sərxoşluq edib kart oynamağa meyl göstərdiyi üçün hərbi nazirin 20 fevral 1920-ci il tarixli əmri ilə Azərbaycan Ordusu sıralarından xaric edilmişdi (147, v.123).

Azərbaycan Ordusunda xidmətin tələblərinə cavab verməyən digər qeyri-azərbaycanlı zabitlərə qarşı da belə ciddi bir tələbkarlıq mövcud idi. Hər şeydən əvvəl Azərbaycan Ordusuna qəbul edilən bütün zabitlər



qarşısında belə bir tələb qoyulurdu ki, onlar bir ay ərzində komanda və əmrlərin Azərbaycan dilində qarşılığını öyrənməli və şəxsi hey'ətə komandanı Azərbaycan dilində verməlidirlər. Göstərilən müddət ərzində Azərbaycan dilində zəruri lüğət bazasını öyrənə bilməyən zabitlər onların birbaşa komandirləri tərəfindən Azərbaycan Ordusundan xaric olunması üçün təqdim edilməli idilər (107, v.22). Hərbi nazir 1919-cu il iyunun 25-də imzaladığı başqa bir əmrində də xüsusi olaraq qeyd edirdi ki, bu tələb gürcü zabitlərinə də aiddir və onlar Azərbaycan Ordusuna qəbul edildəndən sonrakı bir ay müddətində şəxsi hey'ətə Azərbaycan dilində komanda vermək üçün zəruri olan lüğət bazasını öyrənməlidirlər. Əks tədbirdə bir ayın sonunda onlar da xidmətdən azad edilməlidirlər (90, v.10). Qeyri-azərbaycanlı zabitlərin Azərbaycan dilini öyrənməsi ilə bağlı 8 oktyabr 1919-cu il tarixli 460 saylı başqa bir əmrində hərbi nazir göstərirdi ki, komanda sözlərini Azərbaycan dilində bilməyən zabit bölük komandiri vəzifəsinə tə'yin edilə bilməz (91, v.62).

Hərbi Nazirliyin rəhbərliyi qeyri-azərbaycanlı zabitlərdən Azərbaycan dilində zəruri söz ehtiyatlarına malik olmasını tələb etməkdən əlavə həm də onlardan xidməti keyfiyyətlərin təkmilləşdirilməsini, daim öz üzərlərində işləmələrini, ardıcıllıq, təşəbbüskarlıq və mə'nəvi bütövlük göstərmələrini tələb edirdi. Hərbi nazir özünün 21 may 1919-cu il tarixli 258 saylı əmrində göstərirdi ki, qoşun hissələrinin tələsik yaradılması ilə əlaqədar olaraq qoşuların tə'lim və tərbiyəsində lazımi hazırlığı olmayan bir sıra zabitlər də xidmətə qəbul edilmişdir. Nazir təəssüflə qeyd edirdi ki, ötən beş ay müddətində belə zabitlər öz üzərlərində işləmək üçün kifayət qədər vaxta malik olsalar da, Azərbaycan dilini bilməmələri, təcrübələrinin aşağı olması və çalışqanlıq göstərməmələri üzündən əvvəlki səviyyədə qalmaqdadırlar. Ona görə bu zabitlər onlara bağlanan ümidləri doğrultmadığı üçün Azərbaycan Ordusu sıralarından xaric edilirdilər. Xaric olunanların siyahısında 10 nəfər zabitin adı var idi. (152, v. 272).

Ordu sıralarından xaric edilən qeyri-azərbaycanlı zabitlərin bir çoxu hətta Azərbaycanda yaşamaq hüququndan məhrum edilirdilər. Bu məsələ hərbi nazirin müvafiq əmrində hökmən qeyd edilirdi. (153, v.218). Hərbi nazir Nazirlər Şurasının sədrinin adına göndərdiyi məktubunda, ümumiyyətlə, ordu sıralarından xaric edilmiş rus zabitlərinin e'tibarsız elementlər kimi Azərbaycandan çıxarılması barədə lazımi tədbirlərin həyata keçirilməsinin zəruriliyini vurğulayırdı (102, v. 15).

Konkret tarixi şəraitin xüsusiyyətləri, denikinçilərin, biçeraxovçuların Bakıda açıq fəaliyyəti, Bakıdakı Rus Milli Şurasının rus əhalisi arasında iş aparması və onları Denikin ordusu sıralarına cəlb etməsinə çalışması Azərbaycan Ordusunda xidmət edən rus zabitlərinin müəyyən hissəsinə də tə'sir göstərməyə bilməzdi. Ona görə Hərbi Nazirliyin rəhbərliyi əqidəcə qeyri-sabit olan belə zabitlərin əvəz edilməsi üçün yollar axtarırdı.

1919-cu ilin ilk aylarında Tiflisdəki diplomatik nümayəndəliyin mə'lumatı əsasında Xarici İşlər Nazirliyi, Hərbi Nazirliyə sorğu göndərmişdi ki, Azərbaycan Ordusunda xidmət etmək arzusunda olan xarici zabitlər arasında hansı ixtisasda olanların seçilməsinə üstünlük verilməsi məqsədəuyğundur? (136, v.12). Azərbaycanda xidmət etmək istəyən belə zabitlər arasında türk zabitləri də var idi. Hərbi Nazirlik bu sorğu ilə bağlı verdiyi cavabında bildirirdi ki, müsəlman məzhəbinə mənsub olan türk zabitlərinin Azərbaycan Ordusuna qəbul edilməsi çox yaxşı olardı. Çünki Praporşiklər məktəbinin növbəti buraxılışından sonra ordudakı e'tibarsız rus zabitlərinin təmizlənməsinə başlanacaq və piyada qoşunlarında onların miqdarı 5-7 faizdən artıq olmayacaq. Süvari qoşunlarda və topçu hissələrində vakant vəzifələrə Krımdan gəlməsi gözlənilən tatar-müsəlman zabitlərin tə'yin edilləcəyi planlaşdırılırdı. Türk zabitlərinin qəbul edilməsi və e'tibarsız elementlərin yerinə vəzifələrə tə'yin edilməsi qoşunların xeyrinə olardı. Hərbi nazir buna rəğbətlə yanaşsa da ingilis qoşunları komandanlığının türklərə olan barışmaz münasibəti onu ehtiyatlı hərəkət etməyə vadar edirdi. İngilis qoşunları komandanlığı Azərbaycan Ordusunda türk zabitlərinin olmasına heç bir vəchlə yol vermirdi və onların çoxsaylı xəffiyyələri Azərbaycan qoşunlarına türk zabitlərinin qəbul edilib-edilməməsinin daim nəzarət altında saxlayırdılar (102, v. 16).

Buradan Hərbi Nazirliyin rəhbərliyinin kadr siyasətinin Azərbaycan Ordusu zabitlərinin milliləşdirilməsinə, müsəlman zabitlərin sayının artırılmasına, sədaqətliliyi şübhə doğuranların isə ordudan uzaqlaşdırılmasına istiqamətləndiyi aydın görünür.

Rus zabitlərinin bir çoxunun sabit mövqedə dayanıb öz zabit vəzifəsini qoruya bilməməsi Azərbaycan Ordusunda xidmət edən rus zabitlərinin heç də hamısı tərəfindən müdafiə edilmirdi. 1919-cu ilin fevral ayında hərbi nazirin razılığı ilə rus zabitləri Gəncə şəhərində ümumi iclas keçirib bir sıra rus zabitlərinin Azərbaycan Ordusundakı xidməti barədə müzakirələr apardılar, qarşılarında dayanan vəzifələr haqqında söhbət açdılar. Bir neçə gündən sonra rus zabitləri Gəncə şəhərində növbəti ümumi iclas çağırdılar. Hərbi nazirin razılığı olmadan çağırılan bu iclasda da başlıca olaraq Azərbaycan Ordusunun rus zabitlərinin xidməti vəzifənin icrasına münasibəti, onların peşə və mə'nəvi-etik keyfiyyətləri müzakirə edildi. İclasın Azərbaycan Ordusunda xidmət edən rus zabitlərinin Şurası seçildi. Bu Şura könüllü olaraq öz üzərinə Azərbaycan Ordusunda xidmət etmək istəyən rus zabitlərinin seçilməsi, onların mə'nəvi və hərbi keyfiyyətlərinə görə Azərbaycan Ordusunda xidmətə yararlığının müəyyənləşdirilməsi vəzifəsini götürdü. Hərbi nazir S.Mehmandarov bir sıra rus zabitlərinin kadrların seçilməsi üçün narahatçılıq keçirmələrindən razılıq duyduğunu bildirməklə yanaşı qeyd edirdi ki, zabit kadrlarının seçilməsi, xidmətə qəbul edilməsi hərbi Nazirliyin müstəsna səlahiyyətidir və hər hansı bir qurumun bu səlahiyyətlərə müdaxilə etməsi qəbul olunmazdır. Nazir onu da əlavə edirdi ki, səbatlı kadrların qəbul edilməsi hazırda Hərbi Nazirliyin rəhbərliyinin ciddi diqqəti altındadır, dini və milli mənsubiyyətindən asılı olmayaraq orduya yalnız layiqli kadrlar seçiləcəkdir (107, v.29).



Nazirə görə, bu və ya digər zabitin əməlinə qiymət verilməsi isə zabitlərin Şərəf məhkəmələrinin səlahiyyətinə aiddir. Belə məhkəmələr hər bir alayda yaradılmalıdır. Bütün millətlərdən olan zabitlər bir yerə yığışaraq özləri arasından ən layiqlilərini, mə'nəvi, etik, əxlaqi keyfiyyətləri ilə hörmət qazanmış zabitləri bu Şərəf məhkəmələrinə seçməli və sonra da bu və ya digər zabitin əməllərinin qiymətləndirilməsini bu məhkəmələrə e'tibar etməlidirlər. Nazir bütün zabitləri belə məhkəmələr əsasında öz fəaliyyətlərini nizamlamağa çağırırdı. Ona görə də S.Mehmandarov bu və ya digər millətlərdən olan zabitlərin toplaşaraq qurum yaratmalarını və bu qurumların işinin konkret millətdən olan zabitlərin əməllərinin qiymətləndirilməsi üzərində qurulmasını yolverilməz hesab edirdi. Onun fikrincə, bu təcrübə tezliklə digər millətlərdən olan zabitlərin də öz qurumlarının yaratmasına yol aça bilərdi. Nazir zabitlərin əməllərinin qiymətləndirilməsi üçün yalnız Şərəf məhkəmələrini tanıdığını və ordudan xaric ediləsi zabitlərin hərəkətlərinin də məhz bu məhkəmələrdə təhqiq edilməsinin və onların xidmətin tələblərinə uyğun gəlməyən hərəkətlərinin burada araşdırılmasının vacibliyini vurğulayırdı (107, v.29)

Bu məsələ ilə bağlı 17 fevral 1919-cu il tarixli əmrini birinci bəndini nazir belə tamamlayırdı: "Bütün millətlərdən olan zabitlərə xatırladıram ki, onlar həqiqi dövlət xidmətindədirlər və mövcud qanunlar qarşısında eyni məs'uliyyəti daşıyırlar" (107, v.29)

Bu tələblər bütünlüklə azərbaycanlı zabitlərə də şamil edilirdi. Hərbi Nazirliyin kadr siyasətində milli tərkibin sayının artırılmasına xüsusi diqqət yetirilsə də, onlar qarşı tələbkarlıq da azaldılmırdı. Hər bir azərbaycanlı zabitin xidməti instansiyalar üzrə daimi qayğı və nəzarət altında saxlanılırdı.

Hərbi Nazirliyin azərbaycanlı zabit kadrlarının ilkin bazasını hələ Müsəlman Korpusunda toplaşmış, sonra isə xüsusi Azərbaycan Korpusunda xidmətini davam etdirmiş zabitlər təşkil edirdilər. Onların arasında general-leytenant Ə.Şıxlinski, polkovnik H.Səlimov, polkovnik S.Əfəndiyev, polkovnik Qaytabaşı, polkovnik Əmənulla Mirzə Qacar, polkovnik Yadigarov kimi təcrübəli və savadlı zabitlər var idi. Azərbaycan Ordusunun tərkibində xidmətlərini davam etdirərkən bu zabitlər həm məs'uliyyətli vəzifələrə tə'yin edilməklə ordunun möhkəmləndirilməsinin mühüm sahələrini öz üzərinə götürmüş, həm də müstəqil Azərbaycan dövlətinin yüksək hərbi rütbələrinə layiq görülmüşdülər. Azərbaycan Ordusunda xidmət edən azərbaycanlı zabitlər tək bunlar deyildilər və vaxtilə çar ordusunda xidmət etmiş

azərbaycanlı zabitlər milli ordunun yaradılmasında bütün bacarıqlarını sərf etməyi özlərinin şərəf və vətəndaşlıq borcu sayırdılar.

Nazirlər Şurasının 19 fevral 1919-cu il tarixli qərarı ilə bütün nazirliklərə tapşırılmışdı ki, Hərbi Nazirliyin razılığı olmadan heç bir müsəlman zabit mülki işə qəbul edilməmişdir (105, v.8). Nəticədə iş üçün dövlət müəssisələrinə müraciət edən azərbaycanlı və digər müsəlman zabitlər Hərbi Nazirlik tərəfindən aşkar edilir və onların xidmət etmək imkanları öyrənilirdi.

Çar Rusiyası ordusunda xidmət etmiş azərbaycanlı zabitlərin qıtlığı yeni milli kadrların hazırlanmasını tələb edirdi. Bu sahədə mövcud olan yeganə təhsil müəssisəsi hələlik Gəncə Praporşiklər məktəbi idi. Türk qoşunları Azərbaycanı tərk etdikdən sonra bu məktəbin fəliyyətinin təşkili tamamilə Hərbi Nazirliyin üzərinə düşmüşdü. Əhəmiyyəti nəzərə alındığı üçün idi ki, Praporşiklər məktəbində təhsilin və tədrisin, tə'lim-tərbiyənin təşkilinə xüsusi diqqət yetirilirdi. Türk qoşunları Azərbaycanı tərk etdikdən sonra podpolkovnik Kosəmənski, sonra isə polkovnik R. Şıxlinski məktəbin rəisi tə'yin edildilər. Məktəbin növbəti iki buraxılışı da məhz polkovnik Şıxlınskinin rəhbərliyi altında baş verdi.

Məktəbdə yunkerlər üçün xüsusi rejim hazırlanmışdı. Həmin rejim aşağıdakı şəkildə idi (bax: 188, v.40):

6.00 – yunkerlərin yerindən qalxması
6.30 – səhər çayı
7.00-7.45 – səhər gimnastikası
8.00-11.00 – sıra hazırlığı
11.00-12.00 – yuxarı siniflər üçün leksiya, aşağı siniflər üçün nizamnamələr
13.00-14.00 – nahar yeməyi
14.00-17.10 – istirahət saatları
17.30-19.30 – yuxarı siniflər üçün leksiya, aşağı siniflər üçün nizamnamələr
19.45 – şam yeməyi və axşam çayı
21.00 – axşam yoxlaması

Cümə axşamı günü dərslər yalnız günün birinci yarısı keçirilirdi. Həmin gün saat 11.00- 12.30 arasında yuxarı siniflərdə nizamnamələrin öyrənilməsi ilə məşğul olurdular. Cümə günləri isə istirahət günləri idi. (158, v. 40).

Azərbaycan Ordusunun gələcək zabitlərinin necə hazırlaşdırılması Hərbi Nazirliyin rəhbərliyinin də daimi nəzarəti altında idi. 1918-ci il dekabr ayının əvvəllərində hərbi nazir S. Mehmandarov özü şəxsən məktəbə baş çəkdi, tə'lim-tərbiyənin gedişi, yunkerlərin qayğısı ilə yaxından tanış



oldu. Bu tanışlıqdan sonra imzaladığı müvafiq əmrdə S.Mehmandarov gələcək zabitlərin ərzaq və digər tə'minatlarına xüsusi diqqət yetirilməsini tələb edirdi (86, v.5).

1919-cu ilin fevral ayında isə hərbi nazirin müavini Ə. Şıxlinski və Ümumi Qərargahın rəisi H.Səlimov ayrı-ayrılıqda məktəbdə olaraq tə'lim-tərbiyənin gedişi ilə yaxından tanış oldular. Ə.Şıxlinskinin qənaətləri əsasında Hərbi Nazirlik üzrə, H. Səlimovun müşahidələri əsasında isə Ümumi Qərargah üzrə əmr imzalandı. Onu da qeyd etmək lazımdır ki, Ə. Şıxlinski fevral ayında məktəbdə iki dəfə olmuşdu.

Nazir müavini müşahidə etmişdi ki, bölük silahla tə'lim keçdiyi halda zabitlərin və tə'limatçıların silahı yox idi. O bunu düzgün saymırdı. Topçu bölüyünün sinifdə zabitsiz məşğul olmasını da düzgün qiymətləndirmirdi. Bunlara baxmayaraq Ə. Şıxlinski məktəblə ilk tanışlığından məmnun qaldığını bildirirdi. Generalı xüsusilə o razı salmışdı ki, yunkerlərin geyimi şaxdır, ayaqqabıları eyni tipli olmasa da yaxşı vəziyyətdədir, çörək və yemək ə'ladır, otaqlar təmizdir (135, v. 78).

Məktəbdə Ə.Şıxlinskinin ən böyük iradına səbəb buradakı dükanın işi olmuşdu. Dükan mülki şəxslər tərəfindən işlədilirdi və bir sıra əşyalar, o cümlədən də çörək şəhərdəki qiymətlərdən baha satılırdı. Nazir müavininin bununla bağlı verdiyi mə'lumatından sonra nazir 1919-cu il fevralın 16-da imzaladığı 75 saylı əmrdə bu dükanın dərhal bağlanmasını tələb etdi. Elə həmin əmrlə məktəb rəisinə tapşırılırdı ki, dükanın işi məktəbin qüvvələri ilə yenidən qurulsun və burada gələcək zabitlərə qarşı yol verilən ədalətsizliklərə son qoyulsun (135, v. 78).

Məktəbə ikinci səfərindən sonra Ə.Şıxlinski yazırdı ki, yunkerlər uzun müddətdən bəri açıq sırada eyni vaxtda silahdan atəş açılmasını təmrin edirlər. Bu zaman əsas diqqət silahların havada bir xətt boyunca saxlanmasına və çaxmağın bir vaxtda şaqqıldamasına verilir. O, isə tələb edirdi ki, atəş hazırlığı zamanı əsas diqqət nişangahın düzgün qoyulmasına, silahın düzgün dayaqlandırılmasına və hədəfin dəqiq alınmasına yönəldilməlidir (152, v. 94).

Ə. Şıxlinski yunkerlərin təklikdə silah priyomlarını öyrənmə metodikasını da düzgün saymırdı. Onun müşhidələrinə görə yunkerlər bir cərgədə dayanır, hər biri qışqıraraq özünə komanda verir və sonra da özü verdiyi komandanı yerinə yetirirdi. Heç kəs onun hərəkətlərinin doğruluğunu yoxlamırdı. Ə. Şıxlinski bildirirdi ki, belə metod nəinki yunkerləri bir tə'limatçı kimi hazırlamırdı, hətta onların öz səhvlərini görməyə imkan vermirdi (152, v. 94).

Ümumi Qərargah rəisi H.Səlimov da məktəbdə olarkən yunkerlərin sıra tə'limlərinin necə keçirilməsini izləmişdi. İkinci bölükdə keçirilən dərslərə poruçik Vəzirov rəhbərlik edirdi. Bölük iki yerə bölünüb qarşı-qarşıya düzülmüşdü. Hamı eyni vaxtda verilən komandanı icra edirdi.

Dərsin rəhbəri isə bu zaman yunkerləri ayrı-ayrılıqda yoxlaya bilmirdi. H.Səlimov əmr edirdi ki, sıra tə'limləri əvvəlcə hər bir yunker üçün ayrı-ayrılıqda keçilsin, sonra isə dərslər 3-4 nəfərlik qruplarda davam etdirilsin. Yalnız bu vaxt aparılan tə'limin səmərəliliyinə nail olmaq olar. Silahsız sıra tə'limlərinin ümumi səviyyəsi ilə polkovnik H.Səlimov razı idi. Ancaq bu sahədəki vərdişlərin daha da təkmilləşdirilməsini lazım bilirdi. O eyni zamanda tələb edirdi ki, gündə ən azı bir saat süngü ilə müqəvva üzərindəki tə'limlərə, bir saat da atəş hazırlığına sərf edilsin (135, v. 113).

1919-cu il mayın 4-də Gəncə Praporşiklər məktəbinin növbəti buraxılışı oldu. Bu münasibətlə Bakıdan xüsusi qonaqlar gəlmişdi. Parlamentin sədri Ağayev, parlament üzvü A. Rzayev, Gəncə şəhərinin başçısı X. Səfikürdski və başqaları bu qonaqlar arasında idi. Gündüz saat 12-də bütün qonaqlar və məktəbin yunkerləri Topçu meydanında düzülmüşdülər. Məktəbin rəisi Şıxlinskinin raportunu qəbul edəndən sonra S. Mehmandarov yunkerləri təhsili başa vurmaları və praporşik rütbəsi almaları münasibəti ilə təbrik etdi. Sonra bayram təntənəsi məktəbin özündə davam etdirildi. Hazırlanmış bayram süfrəsi arxasında hərbi nazir yenidən gənc zabitlərə müraciət etdi: "Sizə çox məs'uliyyətli bir vəzifə həvalə olunur, bu gündən siz bizim gənc ordumuzun rəhbərlərinə çevrilirsiniz. Unutmayın ki, siz əsgərlərə yalnız mehriban və səmimi münasibətinizlə Azərbaycanın istiqlaliyyətinə sadiq olan möhtəşəm ruhlu ordunun yaradılması kimi ali məqsədə nail ola bilərsiniz. Şəxsi ləyaqət hissini yüksək tutaraq fiziki güc tətbiq etməkdən çəkinin, çünki bu tə'sir vasitəsi insanda özünə və başqalarına qarşı ehtiram hissini məhv edir. Ciddi olun, ancaq intizamın pozulması üzrə hər bir hadisəni fərdiləşdirin və buna müvafiq olaraq qərar qəbul edin. İntizamın pozulması halı heç də qərəzli iradənin ifadəsi olmur. Yalnız bu yolla siz qardaşlarınız olan əsgərlərin hörmətini qazana bilərsiniz, yalnız qarşılıqlı məhəbbət və e'timad əsasında ordu vəkdil və güclü ailəyə çevrilə bilər, yalnız belə ordu həqiqi ordudur, xalqın dayağı, bizim istiqlaliyyətimizin dayağıdır" (11, 12.04.1919).

Hərbi nazir S. Mehmandarovun nitqindən sonra respublika Parlamentinin sədri H. Ağayev də gənc zabitlərə müraciət etdi: "Siz bizim ordumuza qatılacaq, dirilik suyu kimi onu canlandıracaqsınız. İnanıram ki, siz müəllimləriniz və komandirləriniz tərəfindən aşılanan Azərbaycanın müstəqilliyi ideyasından ruhlanaraq bu ideyanı bizim ordumuza da təlqin edəcəksiniz. Bu ideyadan kənarda bizim milli qurtuluşumuz yoxdur. Siyasətdən kənar olmaqla, inanıram ki, siz hamınız yalnız gənc ordunun möhkəmləndirilməsinə və bununla da bizim gənc müstəqil dövlətçiliyimizin möhkəmləndirilməsinə xidmət edəcəksiniz" (11, 12.04.1919).

1919-cu ilin may ayında Gəncə Praporşiklər məktəbini 119 nəfər bitirdi və onların hamısına praporşik rütbəsi verildi. (88, v. 14-36).



Praporşiklər məktəbini qurtaranlar xidmətdən imtina edə bilməzdilər. Onlar məcburi olaraq iki il hərbi xidmət keçməli və yalnız bundan sonra istədikləri halda xidmətdən azad oluna bilərdilər (90, v.88).

Məktəbi qurtaranlar bir dəst zabit paltarı və təchizatı ilə tə'min edilirdilər. Heç bir xidməti paltar və geyim əşyaları almayan gənclərə 4 min rubl məbləğində pul verirdilər ki, özünə zabit paltarı hazırlatdırsın, lazımi təchizatı alsın. Xidməti paltar və ayaqqabı alanlara isə digər geyim və təchizat əşyalarını əldə etmək üçün 2 min rubl məbləğində pul buraxılırdı (89, v. 122).

Məktəbi bitirib topçu hissələrinə göndərilən gənc zabitlər ilk aylar bu hissələrdə e'zamiyyətdə sayılırdılar. Müəyyən müddət ərzində onlar topçu peşəsinin sirrlərini, xüsusiyyətlərini öyrənməli və topçuluq üzrə imtahan verməli idilər. Həmin ixtisas imtahanını uğurla verdikləri təqdirdə gənc zabitlər əmrlə topçu hissəsinə təsdiq edilirdilər (90, v. 88).

1919-cu il iyul ayının 7-də Praporşiklər məktəbi Hacıkəndə köçdü və təxminən ay yarım ərzində öz tə'lim-tərbiyəsini burada davam etdirdi. Çox güman ki, məktəbin Hacıkəndə köçməsi tə'lim-tərbiyənin səmərəli aparılması üçün orada daha münasib şəraitin olması ilə bağlı idi. Avqustun 28-də məktəb bütün şəxsi hey'əti, əmlakı ilə birlikdə yenidən Gəncəyə qayıtdı və təxminən bir həftə sonra, yə'ni 1919-cu il sentyabrın 5-də Praporşiklər məktəbi İstehkam məktəbi ilə Bakıya köçürüldü (154, v. 27, 50, 51). Burada məktəb Torqovı küçəsi ilə Budaqovski küçələrinin kəsişməsində olan keçmiş 10-cu əsgər xəstəxanasının binasında yerləşdirildi (159, v. 58; 182, v.61). 1919-cu ilin elə sentyabr ayında da məktəbin növbəti buraxılışı oldu və 114 nəfər gənc ilk zabit rütbəsinə layiq görüldü (88, v. 65-66).

1919-cu il oktyabr ayının sonunda Praporşiklər məktəbinin bazasında Hərbi məktəb yaradıldı. Bütün hazırlıq işləri başa çatdırıldıqdan sıra 1919-cu il noyabrın 9-da Hərbi nazirin 522 saylı əmri ilə Praporşiklər məktəbi Hərbi məktəb adlandırıldı (91, v.112).

Hərbi məktəbin Əsasnaməsində qeyd olunurdu ki, bu məktəbin yaradılmasında məqsəd ümumi savada malik olan gənclərə hərbi tərbiyə, sonra tə'limi və elmi-pedaqoji hazırlıq verməkdən ibarətdir. Burada təhsil alan gənclər də həqiqi hərbi xidmətdə sayılır və yunker adlandırılırdılar. Məktəb üç bölmədən ibarət idi – piyada, topçu və istehkam bölmələri. Nizami planda piyada bölməsi – iki bölüklü tabordan, topçu bölməci – iki toplu taqımdan, istehkam bölməsi isə – bir istehkam bölməsindən ibarət idi. (91, v. 81).

Məktəbdə təhsil müddəti iki il idi. Burada həm hərbi qulluqçular, həm də 17-28 yaş arasında olan mülki şəxslər təhsil ala bilərdilər. Piyada bölməsinə gimnaziyanın 4-cü sinfini və ya ona müvafiq olan təhsil ocağını bitirmiş, ya da ali ibtidai məktəbin tam kursunu bitirmiş gənclər, topçu və

istehkam bölmələrinə isə gimnaziyanı və ona uyğun olan digər təhsil müəssisəsinin tam kursunu bitirmiş gənclər daxil ola bilərdilər. Məktəbin hərbi tə'lim-tərbiyəsində aşağıdakı məqsədlər əsas tutulmalı idi: 1. Vətəndaş və hərbi borca dərin məs'uliyyət hissinin aşılanması; 2. İşgüzar və mübariz xarakterin tərbiyə edilməsi; 3. Vətənin müdafiəsində dayanmalı olan hərbçinin müqəddəs vəzifələrinə şüurlu münasibətin formalaşdırılması; 4. Hərbi intizama və özündən böyüklərə ehtiram bəslənilməsinin yunkerlərə öyrədilməsi; 5. Yoldaşlarına qarşı səmimi münasibətin əldə edilməsi (91, v. 82).

Məktəbdə aşağıdakı fənlər tədris edilirdi:

**Ümumi təhsil fənləri:**

- İlahiyyət qanunları;
- Türk dili və ədəbiyyatı;
- Riyaziyyat;
- Fizika və kimya;
- Coğrafiya;
- Ümumi tarix və türk xalqları tarixi.

**Hərbi fənlər:**

- Taktika və hərbi-tarixi nümunələr;
- Topoqrafiya;
- İstehkam işləri;
- Topçuluq;
- İnzibatçılıq;
- Qanunşünaslıq (91, v.90).

1919-cu il dekabrın 1-də Hərbi məktəbin rəisi polkovnik Şıxlinski 2-ci topçu briqadasının komandiri tə'yin edildi. Onun yerinə isə 4-cü Quba piyada alayının polkovniki Çxeidze tə'yin olundu (153, v.221).

Mə'lumdur ki, məktəbin nəzdində qısamüddətli kürd bölməsi də yaradılmışdı. Həmin bölmədə 250 nəfər yunker təhsil alırdı (88, v.130-131). Lakin Azərbaycanın bolşevik işğalı ilə bağlı olaraq Hərbi məktəb gənc zabitlərin buraxılmasına nail ola bilmədi.

Hərbi məktəbdən başqa İstehkam məktəbi və Hərbi Dəmir Yolu məktəbi də Azərbaycan Ordusu üçün zabitlər hazırlayırdı. İstehkam məktəbinin 1919-cu ilin əvvəllərində açılması güman edilir (317, s. 91). Bu məktəb də 1919-cu ilin sentyabrına kimi Gəncədə fəaliyyət göstərmiş və sonra Praporşiklər məktəbi ilə birlikdə Bakıya köçürülmüşdü. Onun yaradılmasında əsas məqsəd Azərbaycan Ordusu üçün zəruri olan istehkamçı kadrların hazırlanması idi.

Hərbi Dəmir Yolu məktəbi isə 1919-cu il avqustun 10-da açılmışdı (153, v. 141). Onun açılması hərbi daşınmalarda, hərbi infrastrukturanın işinin təşkilində dəmir yolu nəqliyyatının artan əhəmiyyəti və bu nəqliyyat növü üçün hərbi mütəxəssislərin hazırlanması zərurəti ilə bağlı idi. Məktəbdə həm əsgərlərin, həm də zabitlərin hazırlanması planlaşdırılırdı. Daha doğrusu, burada gənc zabitlərin yenidən ixtisaslaşdırılması aparılırdı. 120 nəfər əsgərdən başqa Birinci və İkinci piyada diviziyalarından bərabər sayda göndərilən 20 nəfər zabit də bu ixtisasa yiyələnməli idi. Zabit kursu praporşiklərdən komplektləşdirilməli olan bu məktəb Gəncə dəmir yolu stansiyasında açılmışdı (153, v.81).



Hava qüvvələri qoşun növünün yaradılmasına başlanması ilə əlaqədar 1920-ci ildə bu sahədəki fəaliyyətin daha da genişləndirilməsini planlaşdıran Hərbi Nazirliyin rəhbərliyi Azərbaycanda Hərbi Təyyarəçilər məktəbi açmaq istiqamətində də müəyyən işlər görürdü. Bununla bağlı nazir S.Mehmandarov 1919-cu il noyabrın 27-də Xarici İşlər Nazirliyinə yazdığı məktubundan Hərbi Təyyarəçilər məktəbinin açılması üçün İngiltərə və İtaliyadan təcrübəli mütəxəssislərə ehtiyac olduğunu bildirir və bu mütəxəssislərin Azərbaycana gətirilməsi mümkünlüyünün öyrənilməsini xahiş edirdi (74a, v.38). Mə'lumdur ki, bu məktəb açılmamışdı. Ola bilsin ki, bolşevik işğalı belə tezliklə baş verməsəydi Hərbi Nazirlik bu məktəbin açılmasına da nail olacaqdı. Ancaq artıq yaradılmış olan aviasiya dəstəsinin mütəxəssislərə olan ehtiyacının ödənilməsi üçün bir qrup zabit Tiflisə e'zam olundu ki, orada radioteleqraf və aviasiya ixtisasları üzrə ixtisaslaşdırılsınlar (138, v. 49).

Hərbi Nazirliyin rəhbərliyi gənc zabitlər arasında qərargah işlərindən yaxşı baş çıxaran zabitlərin ixtisaslaşmasına da xüsusi diqqət yetirirdi. Bununla bağlı Birinci və İkinci diviziyaların hər birindən 3 nəfər praporşik Ərkanihərbə e'zam olunmalı və onlar burada qərargah işlərinin xüsusiyyətlərini öyrənməli idilər (153, v.117).

İlkin zabit rütbəsi adətən hərbi təhsil müəssisələrini bitirənlərə verilirdi. 1919-cu ilin mart ayında Şərur və Naxçıvan qəzalarının erməni təcavüzkarlarından müdafiəsi zamanı göstərdiyi şücaətlərə görə bir qrup şəxs cənubi-qərb Azərbaycan general-qubernatorunun köməkçisi Bəhram xan Naxçıvanski tərəfindən ilkin zabit rütbəsi verilməsinə təqdim edilmişdi. Hərbi nazir, Bəhram xan Naxçıvanskinin vəsatətinə əsasən təqdim edilən şəxslərə praporşik rütbəsi verilməsi barədə əmr imzalamaqla bərabər, bildirirdi ki, gələcəkdə belə hallara yol verilməməlidir. Çünki hərbi şücaətlərinə görə zabitliyə irəli sürülən şəxslər əvvəlcə Gəncə Praporşiklər məktəbində imtahan verməli və müvəffəq qiymət aldığı halda zabit rütbəsinə təqdim olunmalıdır (89, v.13).

Hərbi nazirin yalnız ilkin zabit rütbəsi olan praporşik rütbəsini vermək səlahiyyəti var idi. Bunu o, 1918-ci il 15 dekabr tarixli 18 saylı əmri ilə bütün qoşunlara da e'lan edirdi. Praporşikdən sonrakı bütün hərbi rütbələr hərbi nazirin təqdimatı ilə Nazirlər Şurası sədrinin əmri ilə verilirdi (86, v.24). Nazirlər Şurasının hərbi qulluqçulara hərbi rütbələr verilməsi ilə bağlı hərbi nazirin müvafiq əmri isə bütün qoşunlara e'lan edilirdi və hər

bir belə əmrdə mütləq göstərilirdi ki, adları çəkilən zabitlərə növbəti rütbələr Nazirlər Şurasının hansı saylı və hansı tarixdən olan əmri əsasında verilmişdir (bax: 153, v. 19, 234).

Nazirin əmri ilə zabitlərin növbəti hərbi rütbəyə təqdim olunmasının dövriliyi də müəyyənləşdirilmişdi. Vaxtı çatması ilə əlaqədar növbəti hərbi rütbəyə müvafiq sənədlər Novruz, Ramazan və Qurban bayramları ərəfəsində təqdim edilməli idi. Döyüş igidliyinə və digər şücaətinə görə fərqlənənlər isə istənilən vaxt hərbi rütbə alınmasına təqdim edilə bilərdilər (89, v. 13).

Bir çox hərbi hissələrin komandirləri öz zabitlərini kütləvi surətdə növbəti hərbi rütbələrə təqdim edirdilər. Hərbi nazir bununla razılaşmırdı və belə bir praktikaya son qoyulmasını tələb edirdi. Onun fikrincə, kütləvi təqdimatların göndərilməsi zamanı hissə komandirləri zabitlərin şəxsi işlərini lazımınca nəzərdən keçirmirdilər, bir çox məsələlərin fərqinə varmadan müvafiq sənədləri imzalayırdılar. Təqdim edilənlər arasında eləsləri də olurdu ki, sonuncu rütbəni almasından cəmi 3-4 ay keçmişdi. Nazir diqqəti belə bir məqama yönəldirdi ki, vaxtı çatdı-çatmadı zabitlərin növbəti rütbəyə təqdim edilməsi bu tədbirin əməli və mə'nəvi keyfiyyətlərini itirir və o, zabit həyatında hiss olunacaq bir məqama çevrilmir. Onun fikrincə, kütləvi təqdimatların göndərilməsi Hərbi Nazirliyin rəhbərliyini də ən layiqliləri seçib haqqında vəsatət qaldırmaq imkanlarından məhrum edirdi. S.Mehmandarov xüsusi olaraq vurğulayırdı ki, hər bir zabit növbəti rütbəyə xidməti və mə'nəvi keyfiyyətlərinə görə təqdim edilməlidir. Qayda üzrə zabit o vaxt növbəti rütbəyə təqdim oluna bilər ki, o, sonuncu rütbəsində ən azı bir il baş zabit və ən azı 2 il qərargah zabiti kimi xidmət etmiş olsun. Azərbaycan Ordusu sıralarında 6 aydan az xidmət etmiş zabit rütbəyə təqdim edilə bilməzdi (107, v. 159).

Azərbaycan Ordusunda aşağıdakı hərbi rütbələr tətbiq edilirdi (bax: 153, v. 19):

| piyada qoşunları | süvari qoşunları |
|---|---|
| praporşik | praporşik |
| podporuçik | kornet |
| poruçik | poruçik |
| ştabs-kapitan | ştabs-rotmistr |
| kapitan | rotmistr |
| podpolkovnik | podpolkovik |
| polkovnik | polkovnik |
| general-mayor | general-mayor |
| general-leytenant | general-leytenant |
| tam general | tam general |



Ali rütbələrdən Nazirlər Şurasının qərarı ilə Azərbaycan Ordusu zabitlərinə general-mayor və tam general rütbələri verilmişdi. Yuxarıda qeyd edildiyi kimi, Azərbaycan hökumətinin qərarı ilə general-mayor rütbəcini ilk dəfə Suleyman bəy Əfəndiyev, sonuncu dəfə isə Karqaleteli və Çxeidze almışlar. Tam general rütbəsi isə yalnız bir nəfərə - Ə.Şıxlinskiyə verilmişdi. Nazirlər Şurasının 28 iyun 1919-cu il tarixli 29 saylı qərarı ilə hərbi nazirin müavini Əliağa Şıxlinski yüngül artilleriya üzrə tam artilleriya generalı rütbəsinə layiq görülmüşdü (153, v. 41).

Hərbi Nazirliyin arxiv sənədlərinin öyrənilməsi göstərir ki, 1918-1920-ci illər ərzində Azərbaycan Ordusunun sıralarında müxtəlif vaxtlarda və vəzifələrdə 27 general xidmət etmişdir. Onlar aşağıdakılardır: tam artilleriya generalı S.Mehmandarov, tam artilleriya generalı Ə. Şıxlinski (hərbi nazirin müavini), general-leytenant Tarxanov (İstehkam İdarəsinin rəisi), general-mayor H.Səlimov (Ümumi qərargahın rəisi), general-mayor S.Əfəndiyev (1-ci piyada diviziyasının komandiri), general-mayor M.Tlexas (Topçu İdarəsinin rəisi, Bakının general-qubernatoru), general-mayor H.Qaytabaşı (növbətçi general), general-mayor T.Novruzov (süvari diviziyasının komandiri), general-mayor Usubov (2-ci piyada diviziyasının komandiri), general-mayor C.Şıxlinski (1-ci piyada diviziyasının komandiri), general-mayor Vəkilov (topoqrafiya şö'bəsinin rəisi), general-mayor D. Yadigarov (1-ci piyada diviziyası komandirinin müavini), general-mayor F.Vəzirov (Bakı şəhərinin hərbi komendantı), general-mayor Həşimbəyov (Ləvazimat İdarəsinin rəisi), general-mayor Məmmədmirzə Qacar (Hərbi Nazirliyin təchizat rəisi), general-mayor Amaşukeli (süvari diviziyası komandirinin müavini), general-mayor Dubrovski (Hərbi ədliyyə hissəsinin rəisi), general-mayor Sisianov (Ləvazimat İdarəsini rəisi), general-mayor Makeyev (2-ci piyada diviziyası komandirinin müavini), general-mayor Purseladze (tapşırıq generalı), general-mayor Feyzulla Mirzə Qacar (Gəncə qarnizonu rəisi), general-mayor Xlebnikov (Hərbi məktəbin müəllimi), general-mayor Əmənulla Mirzə Qacar (Süvari diviziyası komandirinin müavini), general-mayor Çxeidze (Hərbi məktəbin rəisi), general-mayor Əmir Mirzə Kazım Qacar (Gəncə şəhərinin hərbi komendantı).

Ordu sıralarında bir sıra nəsillərin bir neçə nümayəndəsi eyni zamanda xidmət edir və fədakar zəhmətləri ilə Azərbaycan Ordusunun şərəfini yüksəklərdə saxlamağa çalışırdılar. Məsələn, Şıxlinskilər nəslindən ordu sıralarında iki general xidmət edirdi. Biri tam artilleriya generalı Ə. Şıxlinski, o biri isə uzun müddət 1-ci piyada diviziyasının komandiri vəzifəsində xidmət etmiş general-mayor Cavad bəy Şıxlinski idi. Bu nəslin başqa bir nümayəndəsi polkonik Rüstəm bəy Şıxlinski isə uzun müddət Praporşiklər məktəbinin, Hərbi məktəbin rəisi olmuşdu. Yadigarovlar nəslinin də Azər-

baycan Ordusu sıralarında bir neçə nümayəndəsi xidmət edirdi. Onların arasında general-mayor Davud bəy Yadigarov, kornet Rəhim bəy Yadigarov, kornet Vəli bəy Yadigarov, praporşik Adil bəy Yadigarov da var idi.

Azərbaycan Ordusuna daha çox zabit və generalı isə Qacarlar nəsli vermişdi. Onlar aşağıdakılardır: general-mayor Məmmədmirzə Qacar, general-mayor Feyzulla Mirzə Qacar, general-mayor Əmənulla Mirzə Qacar, general-mayor Əmir Mirzə Kazım Qacar, polkovnik Seyfulla Mirzə Qacar, podpolkovnik Xosrov Mirzə Qacar, rotmistr Rza Mirzə Qacar, kornet İdris ağa Qacar, kornet Firudin Mirzə Qacar, praporşik Abbas Mirzə Qacar Qacarlar nəslinin nümayəndələrindən Azərbaycan Ordusunda çox məs'uliyyətli vəzifə tutanlar da var idi. Bolşevik işğalı ərəfəsində polkovnik Sədrəddin Mirzə Qacar Ləvazımat İdarəsinin rəisi, general-mayor Məmmədmirzə Qacar Ordunun təchizat rəisi idi. Bütün sahələr üzrə ordunun təchizat məsələlərinə birbaşa o cavabdehlik daşıyırdı. Hərbi nazir S. Mehmandarov onun fəaliyyətinə çox yüksək qiymət verirdi. Bu generalın sonsuz işgüzarlığına, 1-ci piyada diviziyası komandiri vəzifəsinin müvəqqəti icraçısı olduğu vaxt erməni təcavüzkarları ilə mübarizə aparmaq üçün xüsusi tə'yinatlı taborun formalaşdırılmasında, təchiz edilməsində göstərdiyi xidmətlərinə görə hərbi nazir öz əmrlərindən birində ona dərin təşəkkürünü çatdırmışdı (153, v. 220).

Zabit kadrlarının hazırlanmasına, kənardan cəlb edilməsinə xüsusi fikir verilsə də, Azərbaycan Ordusunun mövcudluğu dövründə bu problemi də bütünlüklə aradan qaldırmaq mümkün olmamışdı. Ancaq mövcud olan hərbi təhsil ocaqlarının bir neçə buraxılışı vəziyyəti xeyli yaxşılaşdırmış və planlaşdırılan tədbirlər yaxın gələcəkdə problemin demək olar ki, aradan qaldırılmasına imkan verə bilərdi. Buna görə bir sıra hissələrdə zabit kadrlarına olan ehtiyac daha çox idi, bir sıra hissələrdə isə bu qıtlıq xüsusi bir şəkildə hiss olunmurdu. Süvari diviziyasında zabitlərin qıtlığı üzündən bə'zi bölüklərin formalaşdırılması ləngiyirdi. (161, v. 96). 1-ci topçu briqadasının zabitlərinin çatışmazlığı üzündən şəxsi hey'ətin tə'lim-tərbiyəsini lazımi səviyyədə aparmaq mümkün deyildi. Zabit olmadığından bu iş kiçik çinlərə tapşırılırdı ki, bu da gözlənilən nəticəni vermirdi. (161, v.65).

1919-cu il sentyabrın 9-da Topçu idarəsinin rəisi general M.Tlexas Nazirliyin rəhbərliyinə mə'lumat verirdi ki, formalaşdırılmasına başlanmış 1-ci yüngül topçu divizionunda indiyə kimi nə bir zabit var, nə də bir savadlı əsgər və xahiş edirdi ki, heç olmasa divizion üçün Azərbaycan dilini bilən iki zabit ayrılsın (162, v.188).

1919-cu il sentaybr ayının əvvəllərində 1-ci piyada diviziyasının alaylarında zabitlər ştat və siyahı üzrə, habelə mövcudluğuna görə aşağıdakı şəkildə idi (162, v. 172):



| Hissələrin adı | ştat üzrə | | | siyahı üzrə | | | mövcud | | |
|---|---|---|---|---|---|---|---|---|---|
| | general | qərargah zabiti | baş zabit | general | qərargah zabiti | baş zabit | general | qərargah zabiti | baş zabit |
| 1-ci Cavanşir piyada alayı | - | 6 | 55 | - | 3 | 59 | - | 1 | 34 |
| 2-ci Zaqatala piyada alayı | - | - | - | - | 3 | 60 | - | 2 | 41 |
| 2-ci Gəncə piyada alayı | - | - | - | - | 4 | 63 | - | 4 | 30 |

Cədvəldən göründüyü kimi, adları çəkilən hissələrin ştat üzrə zabitlərinin yarıdan bir qədər çoxu mövcud idi. Bə'zi hissələrdə zabit hey'ətinə olan ehtiyacın aradan qaldırılması üçün münasib yollar aranırdı. Məsələn, Zaqatala alayı hələ əlahiddə tabor kimi mövcud olan vaxt hissə komandirinin təşəbbüsü ilə bir sıra zabit vəzifələrinə orduya çağırılmış qeyri-peşəkar şəxslər tə'yin edilmişdi və hissə komandirliyinin rəhbərliyi altında bu şəxslərin uğurlu fəaliyyəti hərbi nazirin özü tərəfindən də qeyd edilmişdi (89, v. 78).

1-ci Tatar və 2-ci Qarabağ süvari alaylarında da peşəkar zabitlər demək olar ki, yox idi. Onların yerinə dinc dövrün süvari məktəblərini qurtaran şəxslər tə'yin edilmişdi (162, v. 96).

Bütünlükdə süvari alaylarında da ümumi vəziyyət piyada alaylarından çox da fərqlənmirdi. Lakin problem yerində də qalmırdı. Aşağıdakı siyahıdan da görmək mümkündür ki, zabitlərin mövcud miqdarında az da olsa müəyyən dəyişikliklər var idi. (162, v. 19, 101):

| Hissələrin adı | Siyahı üzrə 1919-cu il avqustun 1-də | | | Siyahı üzrə 1919-cu il avqustun 15-də | | |
|---|---|---|---|---|---|---|
| | general | qərargah zabiti | baş zabit | general | qərargah zabiti | baş zabit |
| Süvari diviziyasının qərargahı | 1 | 2 | - | 1 | 2 | 1 |
| 1-ci Tatar süvar alayı | - | 3 | 23 | - | 4 | 23 |
| 2-ci Qarabağ süvari alayı | - | 4 | 29 | - | 3 | 30 |
| 3-cü Şəki süvari alayı | - | 4 | 19 | - | 3 | 21 |

Bir sıra hissələrin komandirləri kadr ehtiyacını aradan qaldırmaq üçün öz tanış zabitlərini yanlarına çəkməyə cəhd göstərirdilər ki, bu da

Nazirliyin rəhbərliyinin ciddi narazılığı ilə qarşılanırdı. Hərbi nazirin bu məsələ ilə bağlı müvafiq əmrində göstərilirdi ki, zabitlərin hara tə'yin edilməsini ordunun rəhbərliyi müəyyənləşdirir və bu vaxt o əsas tutulur ki, bütün hissələrdə zabitlərin miqdarı eyni səviyyədə olsun (135, v. 258).

Zabit kadrlarına belə bir ehtiyac duyulduğu vaxtda Hərbi Nazirliyin rəhbərliyi onların düzgün seçilib yerləşdirilməsinə, ixtisas hazırlığının daim təkmilləşdirilməsinə, mə'nəvi tərbiyəsinə xüsusi diqqət yetirirdi. Yə'ni keyfiyyət göstəriciləri kəmiyyət göstəricilərindən heç də az əhəmiyyət kəsb etmirdi və nazirliyin rəhbərliyini zabitlərin sayının azlığından daha çox onların hərbi keyfiyyətlərinin aşağı olması daha çox narahat edirdi. Özünün 1 mart 1919-cu il tarixli 119 saylı əmrində hərbi nazir S. Mehmandarov bildirirdi: "... İndi isə xəbərdar edirəm ki, yalnız maaş almaq üçün xidmət edib heç bir səmərəli fəaliyyət göstərməyən şəxslər mənim tərəfimdən heç bir mövqeyi nəzərə alınmadan dərhal xidmətdən xaric ediləcəklər. Azərbaycan Ordusuna qəbul olunmuş zabitlərə tapşırıram ki, öz işlərinə ciddi münasibət göstərsinlər. Əks təqdirdə onlar tezliklə xidmətdən uzaqlaşdırılacaqlar. Öz biganə xidmətləri ilə hissələrdə düşkünlük yaradan belə zabitlərin varlığındansa, olmaması daha yaxşıdır (139, v. 158).

Əmrlərinin birində 1919-cu ilin mart ayında 3-cü Gəncə piyada alayında xidmətin təşkilinin qənaətbəxş səviyyədə olmadığını göstərməklə nazir mövcud nöqsanların çoxunun zabitlərin fəaliyyəti ilə bağlı olduğunu qeyd edirdi. O, alay komandiri polkovnik Seyfulla Mirzə Qacara xəbərdarlıq etməklə bərabər, onu tabeçiliyində olan komandir və zabitlərə qarşı tələbkarlığı artırmağa çağırırdı. Nazir tələb edirdi ki, həvalə olunan məs'uliyyətli vəzifələri icra etmək qabiliyyətində olmayan, tutduğu vəzifəyə uyğun gəlməyən tabor komandirləri dərhal xaric edilmək üçün təqdim olunmalıdır. Nazirin fikrincə, alayda baş verənlərə və bu zaman zabitlərin səmərəsiz fəaliyyət göstərməsinə qarşı alay komandiri biganə qalmamalı idi (135, v.152).

Bu məsələ ilə bağlı 20 mart 1919-cu il tarixli 137 saylı əmrində hərbi nazir təəccüblə qeyd edirdi ki, bir sıra bölük komandirləri xidmətdən sonra uzaqda yaşamalarını bəhanə edərək şəxsi hey'ətə baş çəkmirdilər. Nazir belə bir faktı da dözülməz hal kimi, bölük komandirlərinin öz vəzifələrinin icrasına laqeyd münasibətin ifadəsi kimi qiymətləndirirdi (135, v.152).

Zabitlərin seçilməsində və yerləşdirilməsində bə'zi hissə komandirlərinin səbri və qətiyyətli mövqedə dayanmaması da naziri ciddi narahat edirdi. 17 fevral 1919-cu il tarixli 83 saylı əmrində nazir göstərirdi ki, hissə komandirlərindən biri tabeçiliyində olan zabitlərdən birinin həvalə olunan vəzifəni icra edə bilmədiyi üçün xidmətdən qovulması üçün vəsatət qaldırılmış və bu vəsatət müdafiə olunmuşdu. Bir müddətdən sonra isə hissə komandiri həmin zabitin yenidən xidmətə bərpa olunması barədə vəsatət qaldırmışdı. Bununla bağlı nazir bütün komandir hey'ətinin nəzərinə çatdırırdı ki, belə mövqedə dayanmaq yolverilməzdir və oxşar hərəkətlərə yol verən



komandirlərə qarşı qanunun bütün ciddiliyi ilə ən sərt tədbirlər həyata keçiriləcəkdir (107, v. 29).

Xidməti vəzifənin icrasına məs'uliyyətsizcəsinə yanaşan hər bir zabitə qarşı sərt tədbirlər həyata keçirilirdi. Bu baxımdan 3-cü Şəki süvari alayının yavəri, poruçik Qalacovla bağlı nazirin imzaladığı əmr xarakterik bir əmr idi. Adı çəkilən poruçik 1919-cu il dekabrın 2-də qatarla gedəndə bir sıra məxfi sənədləri yaddan çıxarıb qatarda qoymuşdu. Qatar bələdçisi təsadüfən onları tapıb Parlamentin dəftərxanasına təhvil vermişdi. Məxfi sənədlərin qorunmasına məs'uliyyətsizcəsinə yanaşdığına görə Poruçik Qalacov bir ay həbs edilməklə bərabər tutduğu vəzifədən azad edilib kiçik zabit vəzifəsinə tə'yin olunmuşdu. Nazir bildirirdi ki, o bu vəzifədə ən azı üç il işləməli və sonra onu yüksək vəzifəyə irəli çəkilməsi şəxsən hərbi nazirin razılığı ilə olmalıdır (153, v.251).

Süvari diviziyasının komandiri də özünün daxili əmrlərindən birində zabitlər qarşısında belə tələblər qoyurdu, onların seçilməsinə, tə'yin edildikləri vəzifənin icrasına məs'uliyyət hissi aşılanmasına xüsusi diqqət yetirirdi: "Alay komandirlərindən tələb edirəm ki, zabit hey'ətinə ən ciddi diqqət yetirsinlər. Xüsusən də bölük komandirlərinə ki, onlar həqiqətən tə'yin edildikləri vəzifəyə uyğunluq təşkil etsinlər. Onlar tərəfindən yol verilən bütün fəaliyyətsizlik və nöqsanlar barədə haqqında müvafiq tədbirlər görülməsi üçün mənə xəbər verilsin" (161, v. 86).

1-ci və 2-ci piyada diviziyalarının komandanlığı da tabeçiliyində olan zabitlərə qarşı belə ciddi və işgüzar tələblər irəli sürürdülər (bax: 150, v.14-15; 156, v. 26).

Zabit hey'ətinin mə'nəvi-əxlaqi cəhətdən formalaşmasına, şəxsiyyətlərinin bütövləşməsinə də Hərbi Nazirliyin rəhbərliyi tərəfindən xüsusi diqqət yetirilirdi. Mə'nəvi keyfiyyətlərin bütövlüyü, saflığı, milli ən'ənələrə dayaqlanması, milli mənafelər üstündə köklənməsi Azərbaycan zabitinə xas olacaq xüsusiyyətlər kimi qiymətləndirilirdi. Vətən uğrunda ən çətin mübarizələrə hazır olan əsgərləri də mə'nəvi keyfiyyətləri hörmət və ehtiram doğuran zabitlər yetişdirə bilərdi. Əgər Həbib bəy Səlimov hələ Hərbi Nazirlik yaranmamışdan əvvəl qoşunların yenidən qurulması zərurətini Nazirlər Şurasına yazdığı məktubunda əsaslandırarkən ordu quruculuğu üçün hər şeydən əvvəl maliyyə vəsaitinin lazım olduğunu bildirir və bununla bağlı Napoleonun fikrini xatırladırdısa (94, v. 1), sədaqətli xidməti, bacarığı, yorulmazlığı ilə Azərbaycanın hərb tarixində özünə layiqli yer tutmuş Əbdülhəmid bəy Qaytabaşı özünün mütaliə qeydlərində şəxsi hey'ətin və o cümlədən də zabitlərin mə'nəvi keyfiyyətlərini hərbi uğurun əldə edilməsində başlıca şərt sayırdı. O da fikrini əsaslandırmaq üçün Napoleonun belə bir ifadəsinə müraciət edirdi ki, hərbi uğurun üç hissəsi mə'nəvi keyfiyyətlərdən, bir hissəsi isə maddi amildən asılıdır (124, v.34).

Ə.Qaytabaşı öz qeydlərində zabit xarakterinin formalaşması üçün aşağıdakı cəhətlərin zəruri olduğunu vurğulayırdı: 1) igidlik, 2) qətiyyət, 3) iradənin gücü, 4) zirəklik, 5) tabeliyində olanlara inam aşılamaq qabiliyyəti, 6) arxasınca aparmaq bacarığı, 7) hərbi bilik (124, v.35).

Hərbi nazirin müavini Ə.Şıxlinski nazir vəzifəsinin icraçısı kimi imzaladığı əmrlərin birində Azərbaycan Ordusunda xidmət edənlərə qarşı belə bir tələb irəli sürürdü: "Azərbaycanlılar birdəfəlik yadda saxlamalıdırlar ki, doğma ordumuz isti ocaq deyil və ona görə yaradılmayıb ki, istənilən azərbaycanlı özü üçün daha əlverişli yer tutsun. O, Vətənin dayağıdır və ora ölkənin ən yaxşı qüvvələri daxil olmalıdır." (152, v.77).

Ə.Şıxlinskinin fikrincə, öz kiçik şəxsi maraqlarını doğma yurdun və xalqın maraqlarından üstün tutan şəxslərə orduda yer olmamalıdır. Hər bir işdə şəxsi xeyir güdən kəsif xislətli insanlardan ordu hər vasitə ilə təmizlənməlidir. Generala görə, belə insanlar nəinki orduda, heç bir dövlət vəzifəsində xalqına fayda gətirə bilməzlər. (152, v.77).

Hərbi Nazirliyin mövcud olduğu il yarım ərzində Azərbaycan Ordusunun real qüvvəyə çevrilməsində onun rəhbərliyini təmsil edən sərkərdərin hərbi və mə'nəvi keyfiyyətlərinin də öz rolu var idi. Əvəzsiz hərbi nazir olan S.Mehmandarov bu məs'ul vəzifədəki bütün fəaliyyəti ilə bütöv şəxsiyyət olduğunu sübut etdi. Onun ardıcıllığı, qətiyyəti və eyni zamanda insanlığı, qayğıkeşliyi ətrafındakılar üçün də nümunə və örnək idi. S.Mehmandarov sədaqətli xidməti, həvalə olunan çox mürəkkəb vəzifənin icrasını təşkil etmək bacarığı və qabiliyyəti ilə göstərirdi ki, o, peşəkar Azərbaycan hərbinin ən böyük şəxsiyyətlərindən biridir. Öz əmrlərində də dəfələrlə qeyd etdiyi kimi, S.Mehmandarov Azərbaycan xalqının milli mənafelərini şəxsi mənafelərindən üstün tutmuş və hərbi nazir kimi fəaliyyətində də bunu sübut etmişdi. O, nazir seçildiyi gündən bolşevik işğalına qədər bir neçə kabinet dəyişikliyini yaşasa da, hökuməti təşkil edən bütün siyasi xadimlər hərbi nazir portfelini S.Mehmandarova e'tibar etmişdilər.

S.Mehmandarovun adı ölkənin siyasi xadimləri arasında ardıcıllıq, prinsipiallıq və vətənpərvərlik, xalq arasında isə mübarizlik simvoluna çevrilmişdi. Doğrudur, S.Mehmandarovun prinsipiallığından razı qalmayanlar da var idi. Lakin belələrinin mövqeyi nə dövlət rəhbərləri, nə də xalq arasında müdafiə olunurdu.

S.Mehmandarovun 1919-cu il fevralın 25-də Parlamentdəki böyük çıxışı onun proqram xarakterli bir çıxışı idi (bax:58, v.2-15). Bu çıxışında nazir ötən 4 ayda görülmüş işlər barədə mə'lumat verir, həm də qarşıda dayanan vəzifələrin mürəkkəbliyini açıqlayırdı. Parlament üzvlərini maraqlandıran məsələləri hərbi nazir elə bir dildə aşkarlayıb mə'lumat verdi ki, onun ordu quruculuğunda tutduğu mövqeyinin düzgünlüyünə qarşı kimsədə şübhə yeri qalmadı. Həmin çıxışın sonunda hərbi nazir bir sıra qoşun hissələrində vəziyyətin mürəkkəbliyi ilə bağlı tənqid və mülahizələrin ifrat xarakter alması, onun şəxsiyyətinə qarşı yönədilmiş fikirlərin əsassız olmasına toxunurdu: "Cənablar, mən nəyi isə tənqid etmək fikrindən uzağam. Bizdə nə pis idisə indi tədricən yaxşılaşır... Ancaq onu demək istəmirəm ki, azad müzakirələr əleyhinəyəm. Çünki heç bir sahədə sağlam tənqid və azad müzakirələr olmadan inkişafa nail olmaq mümkün deyil. Qəzet bu sahədə böyük əhəmiyyətə malikdir. Mən sizə yalnız mə'lum olan bir şeyi deyim. Mədəni ölkə olan İngiltərədə İrlandiya üsyanları zamanı konservativ quruluş üzvlərinin çoxu qəzetlərin bağlanmasını tələb edirdilər. Üzvlərdən biri isə sübut etdi ki, parlamentin özünü ləğv etmək, aradan götürmək daha yaxşı olar, nəinki qəzetlərin qarşısını almaq. Lakin adamların tənqid adı altında haqsızlıqlara yol verməsi insanda qəmgin əhval-ruhiyyə yaradır. Sizin vaxtınızı çox alsam da demək istəyirəm ki, haqqımda qaldırılan səs-küy Azərbaycan xəzinəsinə sağmal inək. Hərbi Nazirliyə isə isti ocaq kimi baxdıqları üçün mənim tərəfimdən xaric edilən zabitlər və şəxslər tərəfindən aparılır. Bu səs-küy məndə nifrət hissləri yaradır, lakin bu məni elə də narahat etmir. Hazırladığım plana heç bir dəyişiklik edilə bilməz. Bu çətin yolla gedirəm və nə qədər ki, bu vəzifədəyəm heç bir qüvvə mənim qarşımı almağa qadir deyil. Son olaraq deyim ki, bu müddət ərzində mənim tərəfdən çoxlu suallar ortaya atılmışdır. Onlar nəinki həll edilmiş, hətta praktiki olaraq həyata keçirilmişdir. Məni hərbi nazir vəzifəsində kim əvəz edərsə fəaliyyətimin miqyası və səmərəliliyi barədə çox geniş materiallar əldə edə biləcəkdir" (58, v.15).

S.Mehmandarovun çıxışından sonra bir sıra parlament üzvləri çıxış edərək həm hərbi nazirin söylədiklərinə, həm də ordu quruculuğunun gedişinə öz münasibətlərini bildirdilər. Parlamentin üzvü A. Səfikürdski öz çıxışında dedi: "...Bizim də nöqsanlarımız olub. Lakin bu gün qarşımızda çıxış edən hərbi nazirin iş başına gəlməsi ilə hərbi işin vəziyyəti yaxşılaşır. Bu yaxşılaşma gündən-günə artmaqdadır... Əlbəttə ki, biz ordumuza pul verməkdən imtina etməyəcəyik. Ancaq bu zaman xalq pulunun hər qəpiyinə qənaətcilliklə yanaşmaq lazımdır. Belə münasibəti biz bu gün hərbi nazirin sözlərində gördük" (11, 4.03.1919).

S.Mehmandarovun Parlamentdəki çıxışı ictimaiyyət arasında da bu rəğbət və orduya qarşı bir inam yaratmışdı. Üzeyir bəy Hacıbəyov öz məqalələrinin birində bununla əlaqədar belə yazırdı:" Bir neçə zaman bundan əvvəl Parlament iclaslarının birində hərbiyyə nazirimiz S.Mehmandarovun ordumuzun təşkili haqqında bəyanatını dinlədik. Ordu görməmiş, rəsmi əsgərliyə adət etməmiş olan millətimiz içində birinci qədəm olaraq ordu təşkil etmək işinin nə qədər çətin bir əmr və bu işin bu qədər qarışıq zamanda nə növ müşkülat və manelər qarşısında əngəllərə düçar olduğunu eşidib bütün çətinlikləri təsəvvürə gətirməklə bu çətinlikləri rəf və izalə edəcək olan zatın nə qədər sahibi qüdrət və maliki-qüvvət bir orqanizator olması lüzumunu da dərk etdik. Bu təsəvvüratdan hasil

olan təəssüratın o rəngi və ya bu rəngdə olması hərbiyyə nazirimiz olan general həzrətlərinin iste"dadına bağladığımız ümidin qəvi və ya zəifliyinə vabəstə idi... Ordu təşkili işimiz bu intizam ilə davam edərsə bir qədər zamandan sonra mükəmməl bir ordusu ilə sayılan bir dövlət olduğumuzu hər kəs iqrar etməyə məcbur olacaqdır" (308, s.68).

Çox mürəkkəb bir tarixi şəraitdə fəaliyyət göstərməsinə baxmayraq, S.Mehmandarov ona həvalə edilmiş olan məs'uliyyətli vəzifənin icrasında yersiz güzəştlərə getmək, barışdırıcı mövqedə dayanmaq kimi hallara qarşı qətiyyətli mövqe tuturdu. Bu baxımdan onun ordudakı bolşevik təbliğatına (bu barədə aşağıda danışılacaqdır) və ingilis komandanlığının Hərbi Nazirliyin fəaliyyətinə müdaxilələr etməsinə qarşı tutduğu mövqe xüsusilə xarakterikdir. Ordunun bütün məs'uliyyətini öz üzərinə götürmüş bir şəxs kimi S.Mehmandarov ingilis zabitlərinin Azərbaycanda tutduqları mövqedən istifadə edərək peşə etikasını pozub qoşun hissələrinə, Azərbaycan hərbçilərinin xidmətinə bu və ya digər şəkildə müdaxilə etmək cəhdlərini çox böyük həyəcan və narahatçılıqla qarşılayır, mə'lum olan hər hansı bir faktı cavabsız qoymurdu. 1919-cu il aprelin 1-də ingilis silahlıları Ağstafa və Gəncə stansiyalarına daxil olmuş, bir müddətdən sonra isə Şuşada Azərbaycanın mənafeyi ilə səsləşməyən hərəkətlər etmişdilər. S.Mehmandarov Nazırlər Şurası sədrinin adına yazdığı məktubda ingilisləri tutduqları mövqedən sui-istifadə edərək xəbərsiz və icazəsiz Azərbaycan qoşun bölmələrinin mövqelərini tutmasını açıq müdaxilə kimi qiymətləndirir və bu faktlarla bağlı ingilis komandanlığının qarşısında məsələ qaldırılmasını xahiş edirdi (102, v.14).

İngilis kapitanı Dellinin, Denikinin nümayəndəsi ilə heç kimdən icazə olmadan şimal sərhəddinə getməsini, onun kəşfiyyat xarakterli mə'lumatlar toplamasını da S.Mehmandarov çox böyük hiddətlə qarşılamışdı. O dərhal Nazırlər Şurasının sədrinə mə'lumat verərək ondan ingilis komandanlığına e'tiraz göndərilməsini xahiş etdi.Bununla əlaqədar yazmış olduğu məktubunu S.Mehmandarov belə tamamlayırdı: "Tiflisdən qayıdan kimi mən təltif edildiyim I və II dərəcəli müqəddəs Mixail və müqəddəs Georgi ingilis ordenini sizə göndərəcəyəm (onların I dərəcəsini talan vaxtı bolşeviklər məndən almışdılar). II dərəcəlisini isə xahiş edirəm ki, ingilislərə qaytarasınız və bildirəsiniz ki, bunu gəzdirmək istəmirəm, çünki mən onları Azərbaycanın düşməni sayıram" (243,s.30).

Yüksək peşəkarlığı ilə bərabər şəxsiyyət bütövlüyü, mə'nəvi keyfiyyətləri S.Mehmandarova xalq arasında sonsuz nüfuz və ehtiram qazandırmışdı. Qəzetlər onun haqqında böyük qürur hissi ilə yazırdılar, onun ictimaiyyət arasına çıxması hədsiz sevinc və iftixarla qarşılanırdı.1919-cu il sentyabrın 15-də hökumət və parlament üzvlərinin iştirakı ilə Azərbaycan Ordusunun generalları və yüksək rütbəli zabitlərinin şərəfinə ziyafət verildi. Qəzetlərin yazdığına görə burada diqqət mərkəzində S.Mehmandarov idi və onun şərəfinə bir neçə dəfə yüksək alqışlar səsləndi(11, 17.09.1919).

1919-cu il oktyabrın 15-də Lənkəran şəhər duması şəhər əhalisi adından hərbi nazir S.Mehmandarovu Azərbaycan parlamentinə üzv seçdi (15,14.X.1919).

Azərbaycan Ordusunun rəhbərliyində, qoşun birləşmələrinin komandanlığında bütöv mə'nəvi keyfiyyətləri və yüksək peşəkarlığı ilə fərqlənən generallar az deyildirlər və onların hər birinin fəaliyyəti S.Mehmandarovun fəaliyyətini tamamlayırdı. S.Mehmandarovun təqdimatı ilə general rütbəsi alan azərbaycanlı zabitlərin hamısının sədaqətli xidməti, sonsuz vətənpərvərliyi yüksək mə'nəvi keyfiyyətlərin ifadəsi idi. S.Mehmandarovun silahdaş və məsləkdaşları, generallar Ə.Şıxlinski, M.Sulkeviç, H.Səlimov, H.Qaytabaşı, S.Əfəndiyev, T.Novruzov, İ.Vəkilov və digərləri Azərbaycan zabitinin şərəfini yüksək saxlamağa çalışdıqları kimi, tabeçiliyində olan zabitləri də belə görməyə çalışır, onların davranış normalarını pozmalarına qarşı barışmaz mövqe tuturdular. Məsələn, 1-ci topçu briqadasında poruçik Ertuqanov öz komandirinə şər atdığı üçün Şərəf məhkəməsinə verilmiş və bu məhkəmənin qərarına uyğun olaraq Azərbaycan Ordusundan xaric edilmişdi (90, v.54).

Qaubitsa divizionunun komandiri podpolkovnik Qiyasbəyovun tabeçiliyində olan əsgərlərə nizamnamədə nəzərdə tutulmayan cəza verməsi insan şərəfini alçaldan bir hərəkət kimi qiymətləndirilmiş və ona Hərbi Nazirliyin rəhbərliyi tərəfindən töhmət e'lan olunmuşdu (90, v.47). Bir sıra zabitlərin ictimaiyyət arasında özlərini ləyaqətli aparmamaları, dəmir yolu kassalarında növbələri gözləmədən bilet almağa çalışmaları və beləliklə də ictimaiyyət arasında Azərbaycan zabitinin mə'nəvi əxlaq keyfiyyətləri haqqında pis fikir formalaşmasına səbəb olmaları ilə bağlı hərbi nazir xüsusi əmr imzalamış, bütün zabitlərdən öz hərəkətlərinə məs'uliyyətlə yanaşmalarını tələb etmişdi (91, v.72).

1919-cu il iyunun 5-də 1-ci Cavanşir piyada alayının kapitanı Vahid bəy Nəbibəyov hərbi nazirin adına raport yazıb xidmətdən azad olunmasını xahiş etmişdi. O, raportunda belə bir ifadə işlətmişdi: "Səhhətim və şərait mənə respublika hökumətinə xidmət etməyə imkan vermir". Hərbi nazir vəzifəsinin müvəqqəti icraçısı olan Ə.Şıxlinski belə sözlərin işlədilməsini Azərbaycan zabitinin ləyaqətini əks etdirməyən ifadə kimi qiymətləndirmiş və onun xidmətdən azad olunması ilə bərabər həm də bir ay müddətində həbs edilməsi barədə əmr vermişdi (152, v.317).

Ancaq sonradan bu məsələ həll olunmuşdu. Güman ki, kapitan V.Nəbibəyov hərbi nazir S.Mehmandarov qarşısında məsələnin mahiyyəti ilə bağlı izahat vermək imkanı əldə etmiş və özünü doğrulda bilmişdi. Bir neçə gündən sonra S.Mehmandarov imzaladığı əmrində V.Nəbibəyovun işlətdiyi ifadə ilə qərəzli məqsəd güdmədiyi üçün onu bağışladığını bildi-

rırdı. Özü də S.Mehmandarov əvvəlki əmri imzalamış olan müavini Ə.Şıxlinskinin nüfuzunun qorunmasına da ehtiramla yanaşırdı. İkinci əmrdə S.Mehmandarovun "mən ona (Nəbibəyova-**M.S)** verdiyim cəzanı bağışlayıram" cümləsini işlətməsi, birinci əmrin məs'uliyyətini də öz üzərinə götürməsi, heç şübhəsiz ki, Ə.Şıxlinskinin nufuzunun qorunması istəyindən irəli gəlirdi (153, v.5).

Hissələrdə zabitlərin hansı mə'nəvi keyfiyyətlərə malik olmaları, zabit şərəfini necə qorumaları daimi müşahidə altında saxlanılırdı. Bununla bağlı Hərbi Nazirliyin rəhbərliyi birləşmə və hissə komandirlərindən tələb edirdi ki, onlar vaxtaşırı göndərdikləri arayış-mə'lumatlarda hissələrin zabitlərinin arasında mövcud olan əvqata da toxunsunlar, hər bir zabitin adının qarşısında onun xidməti və peşə keyfiyyətlərini qeyd etsinlər (94, v.11).

Hərbi Nazirliyin rəhbərliyi bütün zabitlərdən tələb edirdi ki, onlar heç vaxt hissə ilə əlaqələrini kəsməsinlər, hətta saat 8-dən sonra bir yerə getsələr belə harada olmaları barədə evdə mə'lumat saxlasınlar ki, lazım olanda onları tapmaq mümkün olsun (94, v.88).

Hərbi Nazirliyin rəhbərliyi eyni zamanda zabitlərin yerli-yersiz e'zamiyyətlərə göndərilməsinə də son qoyulmasını tələb edirdi. Belə e'zamiyyətlər hissələrdə xidmətin təşkilində bir boşluq yaratmaqla bərabər, əlavə dövlət xərclərinə səbəb olurdu. Buna görə də Hərbi Nazirliyin rəhbərliyi həm də nazirliyin icazəsi olmadan zabitlərin e'zamiyyətə getməsinə son qoyulmasını (89, v.18), həm də Bakıya e'zamiyyətə gələn zabitlərdən mütləq Ümumi Qərargaha gəlmələrini tələb edirdi (94, v.97).

Kadrların düzgün seçilməsi, hərbi keyfiyyətlərinə müvafiq olaraq yerləşdirilməsi, mə'nəvi cəhətdən formalaşması ilə bərabər onların peşə hazırlığının təkmilləşdirilməsi, zabitlərin müasir hərbi-elmi tələblər səviyyəsində olması da Hərbi Nazirliyin kadr siyasətinin əsas istiqamətlərindən birini təşkil edirdi. Zabitin həm mə'nəvi, həm də ixtisas keyfiyyətlərinə malik olması onun şəxsiyyətini tamamlayan, əsgəri xidmətin lazımi səviyyədə təşkili üçün zəruri olan əsas cəhətlər kimi götürülürdü.

Zabitlərin ixtisas hazırlığının təkmilləşdirilməsi Hərbi Nazirliyin rəhbərliyi tərəfindən ikitərəfli bir proses kimi qəbul edilirdi. Bir tərəfdən hər bir zabit özü ardıcıl olaraq öz üzərində işləyib bilik və təcrübi səviyyəsini təkmilləşdirməli idisə, digər tərəfdən də Nazirliyin, birləşmə və hissələrin rəhbərliyi zabit hey'ətinin tə'limini, bilik səviyyəsinin artırılmasını təşkil etməli idi. Bu məsələlərə Hərbi nazir S.Mehmandarov öz münasibətini belə bildirirdi: "Çoxlu rəhbər şəxslər və komandirlər bildirirlər ki, tabeçiliklərində olan zabitlər və dərəcəli çinlər öz vəzifələrinə uyğun deyillər. Buna da günahkar komandirlərin özləridir. Onlar öz zabitləri ilə dərslər aparmalı, onları tərbiyə etməli və ümumiyyətlə, bütün sahələr üzrə onları hazırlamalıdırlar ki, tutduqları vəzifəyə layiq olsunlar" (135, v.78).



Zabitlərin öz üzərində çalışmalarının zəruriliyi ilə bağlı bolşevik işğalından bir neçə il sonra, 1926-cı ildə Azərbaycan Hərbi məktəbini qurtaran zabitlər qarşısında S.Mehmandarovun söylədikləri xarakterik fikirlərdir... "Siz daha müstəqil yola çıxmısınız. Ancaq bu müstəqil yolda sizi çətin və məs'uliyyətli iş gözləyir. Onun bacarıqlı və vicdanlı icrasından sizə tabe olan adamların döyüş hazırlığının səviyyəsi asılı olacaqdır. Bax, bu iş barədə sizin üçün təntənəli olan gündə öz xidməti və döyüş təcrübəmə əsaslanaraq bir neçə söz demək istərdim.

Siz, yoldaşlar, Azərbaycan Hərbi məktəbini bitirib yadınızda yaxşı saxlamalısınız ki, heç bir təhsil ocağı, hətta ali məktəb elmi bilik vermir, yalnız gələcəkdə özünü təkmilləşdirməyə hazır olan gəncləri buraxır. Bu məsələni siz hərbçilər daha yaxşı yadınızda saxlamalısınız, çünki indi hərbi texnika çox böyük uğurlar əldə edib. O da, ümumiyyətlə, hərbi işdə, xüsusən də mübarizənin qüdrətli vasitəsi olan artilleriyada özünü daha yaxşı göstərir. Mexanika və taktika öz aralarında bir-biri ilə sıx bağlıdır və texnikanın inkişafı taktika sahəsində köklü dəyişikliklər doğurur. Yeni hərbi-elmi kəşflərə görə top atəşinin qüdrəti ildən-ilə daha da artır və texnikanı da bu tələblərə uyğunlaşmağa məcbur etməklə döyüşün aparılması yolları və taktiki üsullarında, hücum və müdafiənin formalarında böyük dəyişikliklər yaradır. Ona görə də müasir tələblərin zirvəsində dayanmaq üçün Siz gələcəkdə də ardıcıl şəkildə və səylə öz üzərinizdə işləməli, hər şeydən xəbərdar olmaq üçün cari hərbi ədəbiyyatı diqqətlə izləməli və yenə də oxumalı və oxumalısınız. Yalnız bu tələblərə cavab verdikdə siz yüksəklərdə dayana və tabeçiliyinizdə olanların hörmətini qazana bilərsiniz.

Texnikanın inkişafının və artilleriya atəşinin qüdrətinin getdikcə artmasını lazımınca qiymətləndirməklə bərabər, mən eyni zamanda deməliyəm ki, sonsuz sür'ətlə irəli hərəkət etməyə həvəsləndirilən ideyadan ilham alan qoşunlarda insan amili birinci dərəcəli əhəmiyyətə malikdir, texnika isə ikinci dərəcəli əhəmiyyətə. Çünki texnikanı da hərəkətə gətirən insandır. Hərbi-Elmi Cəmiyyətdəki mə'ruzələrimdən birində mən artıq sizə demişdim ki, hərbi iş–canlı işdir, burada təcrübə və praktika çox böyük əhəmiyyətə malikdir və bu təcrübə ilə praktika çoxsaylı nəzəri təsəvvürlərdən üstün dayanmalıdır. Bunu deməklə mən heç də nəzəriyyənin əhəmiyyətini kiçiltmək istəmirəm, çünki hərb sənəti nəzəriyyəsinin özü bu praktikadan əldə edilən qənaətlərdir. Əgər bu belədirsə, əgər bu doğrudursa, onda bu vasitələr səriştə, təcrübə və praktika əldə etməyə kömək edə bilər.

Hərbi şəraitdə səriştə və təcrübə şəxsi praktika ilə qazanılır. Sülh dövründə isə bunlar aşağıdakı yollarla qazanıla bilər: yeni nizamnamələrlə, sülh və müharibə şəraitində rəhbər tutduğumuz göstərişlərlə, əsaslı tanışlıq vasitəsilə, taktiki vəzifələrin icrası üçün sahəyə çıxmaqla, ikitə-

rəfli manevrlərlə, komandir hey'ətinin səhra tərminləri ilə, hərbi oyunlarla, hərb tarixinin öyrənilməsi ilə və s." (181, s.73-75).

Bu məsələlərin vacibliyi nəzərə alındığı üçün idi ki, zabit hey'ətinin hazırlıq səviyyəsinin təkmilləşdirilməsi döyüş hazırlığı planında nəzərdə tutulmuşdu və nizamlı şəkildə aparılırdı. Zabitlər üçün də xüsusi tə'lim planı hazırlanmış və bu plana uyğun olaraq dərs saatları ayrılmışdı. Hissələrdə *zabitlərin hazırlıq səviyyəsinin təkmilləşdirilməsi üçün nəzərdə tutulan* plan Hərbi Nazirliyin müəyyənləşdirdiyi proqrama uyğun olaraq hazırlanırdı. Məsələn, 1-ci piyada diviziyasının hazırladığı plan əsasında diviziyanın hissələrində həftədə iki dəfə zabitlərlə dərs keçirilirdi (161, v.68).

1-ci qaubitsa divizionunda zabitlərlə ilkin məşğələlər topdan atəş, atəş qaydalarının öyrənilməsi, bucaqölçmə nəzəriyyəsi, topların paralel istiqamətləndirilməsi, artilleriyanın taktikası, artilleriyanın təşkili, topların əsas ballistik xüsusiyyətləri və xarakteristikası, batareyanın quruluşu, səfər hərəkəti və topçu kəşfiyyatı mövzuları ətrafında aparılmışdı. Hissədə atların olmadığı vaxtlar bu dərslər otaqlarda, nəzəri şəkildə aparılırdı (161, v.146).

1-ci topçu briqadasının 2-ci dağ divizionunda gənc zabitlərlə, praporşiklərlə dərs gündə 2 saat aparılırdı. Bundan artıq vaxt ayırmaq mümkün deyildi, çünki onlar 7 saatlıq səhra tə'limlərində iştirak edirdilər. Zabitlərin müxtəlif naryadlara göndərilməsi isə dərslərdə ardıcıl olaraq iştirak etmələrinə mane olurdu (161, v.181).

Yuxarıda qeyd edildiyi kimi, Praporşiklər məktəbini bitirib topçu hissələrinə gələn gənc praporşiklər topçuluqdan imtahan verməli idilər. 1-ci topçu briqadasında belə zabitlər üçün 2 aylıq kurslar planlaşdırılmışdı. Praporşiklər həmin kursu xüsusi zabitlərin rəhbərliyi altında keçdikdən sonra imtahan verməli idilər (161, v.182).

Süvari diviziyasının komandiri tələb edirdi ki, hissəyə gələn gənc zabitlərlə dərhal süvari xidmətinin əsasları barədə dərslər keçirilsin, onlara qılınc işlətmə üsulları, atəş hazırlığı, piyada tə'limi, və s. keçilsin və sonra onlar tə'limatçı kimi əsgərlərin öyrədilməsinə buraxılsın. Diviziya komandiri general-mayor Novruzov tələb edirdi ki, bütün zabitlər Sıra Nizamnaməsini əzbər bilməlidirlər (162, v.194).

Ümumi döyüş hazırlığı planı çərçivəsində Süvari diviziyasının zabit hey'əti üçün 1919-cu ilin aprel-oktyabr ayları ərzində aşağıdakı dərs proqramı tutulmuşdu (bax:140, v. 19-20):

**Daxili xidmət:**

1. Hərbi qulluqçuların qarşılıqlı münasibətləri. Rəis və tabeçilikdə olan;
2. Rəislərin ümumi vəzifələri;
3. Kiçik çinlərin ümumi vəzifələri;
4. Hərbi salam verilməsi qaydası;
5. Qışlaların təmiz və qaydasında saxlanması;



6. Kiçik çinlərə mə'zuniyyət və hissədən kənara icazə verilməsi;
7. Daxili xidmət naryadları. Növbətçinin, gün növbətçisinin və mühafizəçinin (dozorun) vəzifələri;
8. Atlara, süvari təchizatına qulluq, at tövləsində qaydanın yaradılması;
9. Bölükdə xidmətin sənədləşdirilməsi, əsgərlərin adlı siyahısı, əmlak cədvəli, naryad vərəqi, atların müxtəsər təsviri, gün cədvəli, bölük kitabı və əşyaların siyahısı.

**Qarovul xidməti:**

1. Qarovulun vəzifəsi, onun dəyişdirilməsi, qarovul rəisinin, dəyişdirici və saatdarın hüquq və vəzifələri;
2. Parol və buraxılış;
3. Hərbi əmlakın qorunması, məhbusların qarovul altında saxlanması qaydası;
4. Post cədvəlləri.

**İntizam Nizamnaməsi:**

1. Hərbi intizam haqqında mə'lumat;
2. İntizam cəzaları;
3. Rəislərin cəza vermək səlahiyyətləri;
4. İntizam cəzasının verilməsi və onun tətbiqi qaydası;
5. Şikayətlər haqqında;
6. Zabit cəmiyyətləri məhkəməsi haqqında.

**Sıra xidməti:**

1. Atların yəhərlənməsi qaydası;
2. Atların sürülməsi: Atda oturuş qaydası və onun idarə edilməsi;
3. Manеələrdən tullanma;
4. Atla birlikdə üzmə;
5. At üzərində qılınc və süngü işlətmə qaydası;
6. Piyada sıra: sırada dayanmaq, hərəkət, qılınc və tüfənglə priyomlar, hərbi salamın verilməsi;
7. Taqım və bölük tə'limləri, bölüyün tərkibi, bölüyün sırası və rəislərin sırada yeri, komandalar, siqnal və şərti işarələr; düzlənmək və istiqamət, kolon, genişləndirilmiş sırada və kolonda hərəkət;
8. Hücum;
9. Açılmış sıra, bölüyün süvarilərinin piyadaya keçməsi.

**Tüfəng və revolverdən atmaq barədə tə'limat:**

1. Atəş açmaq dərsləri üçün nəzəri hazırlıq;
2. Nişangahın düzgün təsbit edilməsi;
3. 800 addıma qədər məsafəyə tək-tək tə'lim atışı;
4. Döyüşdə tüfəng atəşi, hissənin atəşinin idarə edilməsi sahəsində taqım və bölük komandirlərinin vəzifələri;
5. Tüfəngin sökülməsi və yığılması, silaha qulluq qaydası.

**Səhra xidməti.**

**Kəşfiyyat:**

1. Kəşfiyyatın təşkili barədə ümumi göstərişlər;
2. Kəşfiyyat xidməti, mə'lumat və onun çatdırılması;
3. Rabitənin yaradılması;
4. Səfər hərəkəti zamanı kiçik dəstələrin dəf edilməsi. Zastava və dozor xidməti;
5. Dağlarda səfər hərəkətinin xüsusiyyətləri;
6. Kiçik bölmələrin döyüşdə fəaliyyəti.

**Səhra və sıra nizamnamələrinə əsasən tapşırığın yerinə yetirilməsi:**

1. Tapşırığın yerinə yetirilməsi, zastava, taqım və bölük komandirinin müxtəlif taktiki vəziyyətdə rolu. Bu zaman nizamnamələri bilmə səviyyəsi, onun əraziyə tətbiqi, əmrin verilməsinin, mə'lumatın hazırlanmasının düzgünlüyü yoxlanılır.
2. Xəritənin və planların oxunması, miqyas haqqında mə'lumat, səmtləmə, məsafənin müəyyənləşdirilməsi, kəşfiyyatın və dozorların hərəkət marşrutunun müəyyənləşdirilməsi;
3. Quşlar vasitəsilə poçtun təşkili.

**Atlar haqqında mə'lumat:**

Zabit dərslərinin birinci ayında baytar həkimi atlar haqqında ümumi mə'lumat verməlidir (140, v.19-20).

Zabitlərlə planlaşdırılan dərslərin gedişi barədə vaxtaşırı nazirliyə mə'lumat verilirdi.

1920-ci ilin əvvəllərində Azərbaycan Ordusunda 958 nəfər zabit və dərəcəli çin var idi (101, v.17). Mə'lumatların qıtlığı üzündən bu göstərilən sayın nə qədərinin zabit və nə qədərinin dərəcəli çin olduğunu söyləmək çətindir. Dərəcəli çinlər, mülki şəxslər elə də çox deyildilər. Məsələn, piyada alaylarının hər birinin ştatında 61 zabit və cəmi 6 dərəcəli çin var idi (162, v. 172). Ordunun Ümumi qərargahının yeni strukturunda 69 zabit və 18 dərəcəli çin var idi (162, v.112). Faiz nisbətilə götürülsə güman etmək olar ki, 1920-ci ilin əvvəllərində Azərbaycan Ordusunun tərkibində mövcud olan zabitlərin sayı 800-dən artıq idi. Azərbaycan Ordusunun təşkilinin ağırlığı da bu sayda olan zabitlərin üzərinə düşmüşdü. Çətin şəraitdə formalaşmasına baxmayaraq, Azərbaycan Ordusunun qısa vaxt ərzində real qüvvəyə çevrilməsində bu zabitlərin də öz rolu var idi.

## *2. ÇAĞIRIŞ VƏ SƏFƏRBƏRLİK İŞİ*

Bərpa edilmiş Hərbi Nazirliyin fəaliyyətə başlanmasının elə ilk günlərindən ortaya çıxan əsaslı problemlərindən biri də çağırış və səfərbərlik işinin vəziyyəti idi. Nazirliyin həmin dövrə aid olan sənədləşmələrində bu məsələyə xüsusi yer verilir, onun yaxşılaşdırılmasının yolları aranırdı.



Uzun illər boyu Azərbaycan əhalisinin əsgəri xidmətə çağırılmaması, türk qoşunlarının Azərbaycanda olduğu vaxt ciddi ədalətsizliklərə yol verməsi adamlarda xidmətə qarşı böyük bir e'timadsızlıq, təşviş və qorxu hissləri yaratmışdı. Digər tərəfdən, xidmətə cəlb olunanlara qarşı fiziki cəzaların tətbiq edilməsi, onların şəxsiyyətlərinin təhqir olunması, ən adi yaşayış normalarına malik olmamaları fərariliyin kütləvi şəkil almasına zəmin yaradırdı. Çağırış və səfərbərlik işinin təşkili yeni nazirliyin rəhbərliyi üçün nə qədər aktual idisə, fərariliyin qarşısının alınması və bunun üçün səmərəli tədbirlər sisteminin tətbiq edilməsi də o qədər vacib idi.

Bu məsələlərin həllinə nail olmaq üçün Hərbi Nazirliyin rəhbərliyi öz fəaliyyətini əsasən üç başlıca istiqamətdə qurmağa çalışırdı. Birincisi, çağırış və səfərbərlik işinin, fərariliyin qarşısının alınmasının hüquqi bazası yaradılırdı. Bu sahədəki praktiki fəaliyyətin tənzimlənməsi üçün mövcud qanunvericilik aktları təkmilləşdirilir, yeni-yeni qərarlar, əmr və sərəncamlar qəbul edilirdi. İkincisi, əhali və çağırışçılar, habelə xidmətdən yayınanlar arasında təbliğat işi genişləndirilir, xidmətin təşkilində mövcud olan yeniliklər, tarixi dövrün xüsusiyyətləri onların diqqətinə çatdırılır və psixoloji ovqatlarında bir dəyişiklik yaradılmasına cəhd göstərilirdi. Üçüncü istiqamət isə xidmət şəraitinin yaxşılaşdırılması, əsgərlərə sosial qayğının artırılması, onlara münasibətdə qanunsuzluqların qarşısının alınması idi.

Hərbi Nazirliyin rəhbərliyi genişlənməkdə olan fərariliyin qarşısının alınmasında inzibati orqanların və yerli hakimiyyət qurumlarının fəaliyyətinə böyük ümid bəsləyirdi. Çünki fərariliyin qalması hissələrin döyüş hazırlığını zəiflətməklə bərabər, xidmətə yenicə cəlb olunmuş çağırışçılara da dağıdıcı tə'sir göstərir, onların da xidmətdən yayınmalarına psixoloji bir zəmin yaradırdı. Ona görə Hərbi Nazirliyin rəhbərliyi Daxili İşlər Nazirliyinin müvafiq strukturlarını, bu nazirliyin yerlərdəki orqanlarını ciddi əməkdaşlığa də'vət edirdi. Fərarilərin tutulub geri qaytarılmasının başlıca məs'uliyyəti də əslində bu orqanların üzərində idi.

1918-ci il dekabr ayının əvvəllərində 1-ci piyada diviziyasından xəbər verilirdi ki, hissələrdə fərarilik davam edir. Görülən işlərin heç bir nəticəsi yoxdur. İndiyədək bir nəfər olsa fərari yaxalanıb geri qaytarılmayıbdır (155, v.11).

Belə cəzasızlıq və hüquqi boşluq birdən-birə çətin xidmət şəraitinə düşmüş olan digər gəncləri də əsgərliyi tərk etməyə, öz ailəsinə qayıtmağa sövq edirdi.

Daxili İşlər Nazirliyinin strukturlarının, yerli idarəçilik orqanlarının fərariliyin qarşısının alınması işində çiyinlərinə düşən vəzifələrin icrasına məs'uliyyətsizcəsinə yanaşması Hərbi Nazirliyin rəhbərliyini də ciddi narahat edirdi. Hərbi nazirin 10 dekabr 1918-ci il tarixli 10 saylı əmri də bu narahatçılığın ifadəsi idi. Əmrdə göstərilirdi ki, fərarilik davam etməkdədir və

görülən işlərin hələlik heç bir səmərəsi yoxdur. S.Mehmandarov qoşun komandirlərindən tələb edirdi ki, onlar özləri də fərarilərin tutulub məhkəmələrə verilməsi ilə bərabər qubernatora da müvafiq mə'lumatlar göndərsinlər və onun rəhbərliyi altında yerli idarəçilik orqanları da fərarilərin tutulub geri qaytarılması ilə məşğul olsunlar. Hərbi Nazirliyin rəhbərliyi şübhə etmirdi ki, yerli idarəetmə orqanlarının yaxından köməyi olmasa fərariliyin qarşısını *almaq mümkün olmayacaqdır (86, v.9).*

1918-ci ilin dekabr ayında S.Mehmandarov məktubla daxili işlər nazirinin özünə də müraciət etdi. Bu məktubda da başlıca olaraq fərarilik məsələlərinə, onu doğuran səbəblərə və aradan qaldırılması yolunda Daxili İşlər Nazirliyi orqanlarının qarşısında dayanan vəzifələrə toxunulurdu. Məktubda göstərilirdi ki, bu bəlanın başlanğıcı hələ türk qoşunları Azərbaycanda olarkən qoyulmuşdu və indiyədək onun qarşısını almaq mümkün olmamışdır. Hərbi xidmətə yeni cəlb olunanların hələ türk komandanlığı dövründən başlanan fərariliyinə bu günə kimi son qoyulmamışdı. Əvvəllər bunun üçün müxtəlif səbəblər mövcud idi: pis yemək, paltar və ayaqqabının verilməməsi, başlıcası isə türk komandirlərinin cavan əsgərləri çox möhkəm döyməsi. Silahlı qüvvələrə rəhbərlik mənə həvalə edildiyi indiki zamanda isə hərbi hissələrə xidmət şəraiti xeyli dəyişmişdir. Yemək yaxşılaşmış, paltar və ayaqqabı verilir, türk komandanlığı zamanı tətbiq edilən döyülmə hallarının gələcəkdə olmaması üçün ciddi göstərişlər verilmişdir (136, v.15).

S.Mehmandarov narahatlıqla qeyd edirdi ki, xidmət şəraitində belə müsbət dəyişikliklərin yaranmasına baxmayaraq fərarilik hələ də davam edir. Onun fikrincə, bunun əsas səbəblərindən biri Əxzi-əsgər idarələrinin fəaliyyətinin düzgün təşkil edilməməsi ilə bağlı idi. Əxzi-əsgər idarələrinin rəisləri çağırış işinin təşkili üçün əllərində əsas tutmalı olduqları sənədlərə açıq-açığına məhəl qoymurdular və bu işi əsasən öz şəxsi mənafeləri üzərində qurmağa çalışırdılar. Xidmətə o adamlar çağırılırdılar ki, onların rüşvət verib canlarını qurtarmaq imkanı yox idı. İmkanlı şəxslər isə qeyri-qanuni olaqələr yaradır və müəyyən məbləğ əsasında övladlarını əsgəri xidmətdən azad edirdilər. Məktubda göstərilirdi ki, belə seçmə üsulunun tətbiqi nəticəsində qoşun hissələrində bir nəfər də olsa imkanlı adamın övladı yoxdur. Yalnız Praporşiklər məktəbində imkanlı ailələrin nümayəndələrinə rast gəlmək olardı ki, *onlar da öz arzusu ilə bura gəlmişdilər.*

S.Mehmandarov fərariliyin mövcudluğunun digər səbəbləri barədə öz məktubunda belə yazırdı: "İkincisi, hərbi mükəlləfiyyətin bütün ağırlığı kənd cavanlarının, xüsusilə də kasıbların üzərinə düşmüşdür. Belə ki, kənd komissiyaları və kəndlərin məs'ul şəxsləri çağırış siyahılarını tərtib edərkən, öz mənfəətləri naminə ora əsasən çağırış yaşına çatmamış yeniyetmələri və ya çağırış yaşını ötmüş gəncləri daxil edirdilər. Bunu dəfələrlə çağırış zamanı Əxzi-əsgər idarələrində də bildirmişlər. Üçüncüsü, qəza və şəhər polis nümayəndələri çağırış siyahılarının düzgün tərtib edilməsini gözləməli olduqları halda bu xidməti vəzifələrinə laqeydcəsinə yanaşmış və bu istiqamətdə cinayətkar səhlənkarlığa yol vermişlər. Qubernatorluq tərəfindən dəfələrlə xəbərdar olunmalarına baxmayaraq polis nəfərləri fərariləri tutmurlar. Buna görə də fərarilər açıq-açığına küçələrdə gəzir və sakitcə evlərində yaşayırlar" (136, v.35)

Məktubda bildirilirdi ki, hərbi hissələrdən qanunsuz yerə buraxılmış olan gənclər də bütün günü şəhərdə veyillənirlər. Onların özləri könüllü şəkildə xidmətə qayıtmaq istəmədikləri kimi, polis orqanları da bununla bağlı heç bir qətiyyətli tədbirə əl atmırdı və əslində elə polis orqanlarının gözü qarşısında fərarilik əl-qol açırdı.

S.Mehmandarov məktubunda polis orqanlarının daha bir səhlənkarlıq hərəkətini daxili işlər nazirinin diqqətinə çatdırırdı. Onun qeyd etdiyinə görə, polis mühafizə dəstələrinin tərkibində çoxlu sayda çağırış yaşı çatmış gənclər var idi. Həmin gənclər əsgəri xidmətə yollanmamaq üçün bu dəstələrin tərkibinə daxil olurdular. Bu dəstələrin tərkibinə hətta fərarilər də mövcud idi. Polis orqanları isə belə şəxsləri xidmətə yollamaqdansa, onları himayə edirdi. "Bütün bu təəssüf doğurucu hallar çağırışçı gənclərə zərərli tə'sir göstərir. Onlar Əxzi-əsgər idarələri rəislərinin, kəndin məs'ul şəxslərinin və polis nümayəndələrinin qeyri-doğru hərəkətlərindən qəzəblənərək və fərarilərə qarşı heç bir tədbir görülmədiyini bilərək xidmətdən qaçırlar. Əsgərlərin məişətinin qoşunlarda yaxşılaşdırılması üçün görülən işlər də fərarilik axınının qarşısını almağa qadir deyildir" (136, v.35).

Hərbi xidmətə çağırışın təşkilində mövcud olan nöqsanların aradan qaldırılması üçün S.Mehmandarov daxili işlər nazirindən daha qətiyyətli tədbirlərin həyata keçirilməsini xahiş edirdi. Məktubda göstərilirdi ki, fərarilərin tutulub saxlanması barədə polis orqanlarına ciddi tapşırıqların verilməsi, fərarilərin tutulmasına barmaqarası yanaşan polislərə qarşı isə sərt cəzaların tətbiq edilməsi, onların məhkəmələrə verilməsi yaxşı olardı. S.Mehmandarov onu da tə'kid edirdi ki, əvvəlki çağırış siyahıları yenidən tərtib olunsun, burada yol verilmiş olan çatışmazlıqlar aradan qaldırılsın, çağırışçıların toplanmasında mövcud olan ədalətsizlik ləğv edilsin və bütün sosial təbəqələrin nümayəndələri qanunauyğun olaraq xidmətə cəlb edilsinlər (136, v.35).

*Daxili işlər nazirinə* ünvanladığı məktubunu S.Mehmandarov belə tamamlayırdı: "Yaranmış vəziyyətdə nöqsanların aradan qaldırılması üçün tə'cili tədbirlər görülməsə, hərbi hissələrin komplektləşdirilməsi qeyri-müəyyən vaxta qədər tə'xirə salınacaqdır. Bu isə bir sıra məntəqələrdə təbliğatçı çıxışlarla və talançı dəstələrin meydana gəlməsi ilə pozulmaqda olan daxili sabitliyin bərqərar edilməsi üçün öz ordusunun tezliklə formalaşdırılmasını tələb edən ölkəyə sonsuz fəlakətlər gətirə bilər (136, v.36).

Həmin məzmunda başqa bir məktubu isə S.Mehmandarov Yelizavetpol qubernatoruna göndərdi və daxili işlər nazirindən müvafiq göstəriş alana qədər ondan fərariliyə qarşı ciddi tədbirlər həyata keçirilməsini xahiş etdi. Məktubda bildirilirdi ki, fərarilərin siyahısı yerli polis orqanlarına təqdim edilmiş və gələcəkdə də təqdim ediləcəkdir. Ona görə də əllərində siyahıların olmasına baxmayaraq polis orqanlarının heç bir iş görməməsi yalnız təəccüb doğurur. S.Mehmandarov qeyd edirdi ki, polis nümayəndələrinin fərarilərin tutulmasında səhlənkarlığa yol verməsi dözülməzdir və belə polislər barədə gələcəkdə teleqrafla daxili işlər nazirinə şəxsən mə'lumat vermək və onların cinayət məs'uliyyətinə cəlb olunması barədə vəsatət qaldırmaq məcburiyyətində qalacaqdır (136, v.36).

1918-ci il dekabrın 25-də S.Mehmandarov xidmətə çağırış işinin yaxşılaşdırılması ilə bağlı xalqa da müraciət etdi. Bu müraciət həm rus dilində, həm də Azərbaycan dilində çap edilərək vərəqələr şəklində əhali arasında yayıldı. Bu müraciətində də o ilk növbədə qoşun hissələrində fərariliyi doğuran səbəblərə, səhvlərə, nöqsanlara toxunurdu. Hissələrdə mövcud olmuş ağır məişət şəraitini də qeyd etməklə bərabər əlavə edirdi: "İndi isə qoşun düzəltməyi öz öhdəmə götürmüşəm və cəmi vətəndaşları - istər fağır, istər dövlətli, əsgərliyə çağırıram. Hər kəs ki, bir dövlətli uşağını qələmdən salıb azad etsə, böyük cəzaya düçar olacaqdır və burası da mə'lum olsun ki, əsgərlər yaxşı geyəcəklər və yeməklərin də yaxşı olmağına mən çox çalışıram. Otaqları isti olacaq və hər bir əsgər üçün ayrı yorğan-döşək hazırlatmışam" (20, № 2, 1993, s.118).

S.Mehmandarov müraciətində əhalinin nəzərinə əsgərlərə məvacib veriləcəyini, fiziki güc tətbiq edilməsinə qarşı lazımi tədbirlər görüləcəyini də çatdırırdı. Müraciətin sonunda fərarilik edənlərin günahlarının bağışlandığı və müəyyən edilmiş müddət ərzində geri qayıdacaqları təqdirdə onları heç bir cəza gözləmədiyi bildirilirdi: "Ey vətəndaşlar, bu qanunlar tamam olandan sonra sizə mə'lum edirəm ki, o şəxslər ki, əsgərlikdən qaçıbdılar, onların böyük xətalarını əfv etdim, ancaq gərəkdir ki, onlar bu sənə yanvar ayının əvvəlinə kimi gəlib öz bölüklərinə qayıtsınlar. Hər kəs qayıtmasa hərbi qanuna görə onlara cəza veriləcəkdir. Əziz olan Vətənim tərəfindən Vətən əhlinə müraciət edib deyirəm ki, Vətən hissi, millət hissi olan cavanlarımız hansı ki, əsgərliyə düşür, borcludur ki, məhəlli Əxzi-əsgər idarələrinə gəlib yazılsınlar və bununla milli qoşunumuzun təşkil olunması barəsində bizə yardım etsinlər. Hər kəs öz vəzifəsini unudub gəlmək istəmirsə, camaatın töhməti altında qaldığından divani-hərbiyyəyə veriləcəkdirlər. Mənim bu də'vətnaməm hər bir yerdə yapışdırılsın. Savadlı adamlar borcludur ki, savadsızlara oxuyub qandırsın" (20, № 2, 1993, s.118).

S.Mehmandarov son aylar ərzində aparılan çağırış işində yol verilmiş nöqsanlardan birini də əhalinin ailə vəziyyətinin nəzərə alınmamasında



görürdü. Rüşvət vermək imkanı olmayan ailələrin övladları heç nəyə diqqət yetirilmədən qoşun hissələrinə göndərilirdi. Ata-ananın yeganə övladı və yeganə çörək gətirəni də əsassız olaraq xidmətə cəlb edilirdi ki, bu da camaat arasında haqlı narazılıqların genişlənməsinə səbəb olurdu. Hərbi nazir çağırış işində belə ədalətsizliyə yol verilməməsi və onun hüquqi cəhətdən möhkəmləndirilməsi üçün Nazirlər Şurasının qarşısında vəsatət qaldırırdı. Azərbaycan hökumətinin 18 yanvar 1919-cu il tarixli qərarı ilə ailənin yeganə övladı və müəllimlər hərbi mükəlləfiyyətdən azad edildilər (135, v.52).

Hərbi Nazirliyin rəhbərliyi çağırış işinin vəziyyətində dönüşə nail olması üçün onun sisteminin təkmilləşdirilməsinə çalışırdı. Nazirliyin aparatında çağırış və səfərbərlik işinə rəhbərlik edən xüsusi struktur Azərbaycan Ordu Livası rəyasəti (Upravlenie mestnoy briqadı) adlanırdı. Polkovnik Klimentyev bu rəyasətin rəisi tə'yin edilmişdi. 1918-ci ilin dekabr ayının 10-da imzaladığı 10 saylı əmrində S.Mehmandarov polkovnik Klimentyevdən tələb edirdi ki, həm çağırışın mövcud vəziyyəti, həm də onun bütünlükdə yaxşılaşdırılması barədə öz fikir və mülahizələrini ümumiləşdirib təqdim etsin. S.Mehmandarov başlıca diqqəti hərbi rəislərin idarələrinin sayının artırılmasına, əhalinin sıx olduğu ərazidə də yeni çağırış orqanlarının yaradılmasının məqsədəuyğunluğuna yönəldirdi. Onun fikrincə, Ordu Livası rəyasəti hərbi rəislərin idarələrinin fəaliyyəti üzərində nəzarəti daha da gücləndirməli, çağırışın təşkilində bu orqanların yol verdiyi və camaatın haqlı narazılığına səbəb olan nöqsanlar haqqında qətiyyətli tədbirlər həyata keçirilməli, günahkar şəxslər cinayət məs'uliyyətinə cəlb edilməlidirlər (86, v.4).

Əmrdə hərbi rəislərin idarələrinin Əsasnaməsinin layihəsinin hazırlanması da polkovnik Klimentyevə tapşırılırdı. Hərbi rəislərin idarələri bölmələr üzrə çağırışın təşkilinə ümumi rəhbərlik edirdi. Çağırış işinin icrası isə Daxili İşlər Nazirliyinə tabe olan Əxzi-əsgər idarələrinin üzərində idi.

Təcili çağırış işinin hüquqi bazasının təkmilləşdirilməsi məqsədilə 1918-ci ilin ortalarında əhalinin hərbi mükəlləfiyyəti barədə qəbul edilmiş qanun dövrün tələblərinə cavab verməyən qeyri-kamil bir sənəd kimi ləğv edildi. Hərbi nazirin 1919-cu il 5 fevral tarixli 10 saylı əmri ilə Azərbaycanın çağırış işinin təşkili ilə bağlı yeni qanunu hazırlananadək Çar Rusiyası dövrünün müvafiq qanunu əsas götürülməli idi (107, v.3).

Nazirin bu əmrinə əsasən hərbi rəislərin idarələrinin sayı artırıldı. Sayı 6-ya çatdırılmış həmin idarələr aşağıdakı şəhər və məntəqələrdə yerləşməli idilər: 1. Gəncə şəhərində yerləşən hərbi rəis idarəsi. Bu idarənin rəisi podpolkovnik Vəzirov tə'yin edilmişdi. Həmin idarə Gəncə və Qazax qəzalarını əhatə edirdi; 2. Nuxa şəhərində yerləşən hərbi rəis idarəsinə rotmistr Qabulov başçılıq edirdi. Bu idarəyə Zaqatala dairəsi, Nuxa və Ərəş qəzaları daxil idi; 3. Bərdə şəhərindəki idarənin rəisi podpolkovnik

Zilov idi. Bu idarəyə Cavanşir, Qaryagin, Şuşa və Zəngəzur qəzalara aid idi. Bərdədə yerləşən idarə çox böyük ərazini əhatə edirdi və buna görə də bütün ərazilərdə düzgün nəzarətin həyata keçirilməsi xeyli çətin idi. Hərbi Nazirliyin rəhbərliyi nəzərdə tutmuşdu ki, imkan yaranan kimi Şuşada yeni bir hərbi rəis idarəsi yaradılsın və Şuşa ilə Zəngəzur qəzaları bu idarənin əhatə dairəsinə daxil edilsin; 4. Qubada yerləşən idarənin rəisi podpolkovnik Məmmədbəyov idi. Bu idarə Bakı və Quba qəzalarında və Bakı şəhərində çağırışın təşkili ilə məşğul olmalı idi; 5. Salyanda yaradılmış idarənin rəisi polkovnik Brilkin tə'yin edilmişdi. Bu idarənin fəaliyyət sahəsinə Cavad və Lənkəran qəzaları daxil idi. 6. Göyçayda yerləşən idarə isə Göyçay və Şamaxı qəzalarını əhatə edirdi. Bu idarənin rəisi podpolkovnik Voyçek idi (107, v.3).

Hərbi nazir 1919-cu il fevralın 5-də imzaladığı əmrində də çağırış işindəki nöqsanların hələ də davam etdiyini təşviş və narahatçılıqla qeyd edirdi. Onun başlıca iradı yenə də yerli idarəetmə orqanları tərəfindən siyahıların düzgün tərtib edilməməsi, bu siyahılarda çağırışçıların hamısının nəzərə alınmaması ilə bağlı idi. Nazir tələb edirdi ki, bu siyahılar tərtib edilərkən Azərbaycan hökumətinin müvafiq dekreti rəhbər tutulsun və sosial mənşəyindən asılı olmayaraq 19 yaşından 24 yaşına kimi bütün gənclər çağırışçı siyahısına daxil edilsinlər. S.Mehmandarov tə'kid edirdi ki, çağırış işinə başlanması ərəfəsində siyahılar bir də yoxlansın və dəqiqləşmələr aparılsın. Hərbi rəislər və yerli idarəetmə orqanları müxtəlif yaşayış məntəqələrində çağırışın müxtəlif vaxtda aparılması gününü müəyyən etməli idilər. Bu, Hərbi Nazirliyin rəhbərliyi tərəfindən çağırışın təşkilinə gətirilmiş bir yenilik idi. Əvvəllər çağırış bütün yaşayış məntəqələrində eyni vaxtda aparılırdı. Ona görə bütün məntəqələrdə çağırışın gedişini lazımi nəzarət altında saxlamaq mümkün olmurdu. S.Mehmandarov mövcud tarixi şəraitdə yaşayış məntəqələrində çağırışın eyni vaxtda deyil, müxtəlif vaxtlarda aparılmasını və bu zamanda nəzarətin lazımi səviyyədə təşkil edilməsini məqsədəuyğun bilirdi (107, v.3).

Hərbi nazir əmrində göstərirdi ki, qəzalarda xidmətdən yayınmış tacir, bəy və imkanlı adamların uşaqlarının siyahısı tərtib ediləcək və qəza rəisinin adı əlavə olunmaqla həmin siyahılar müvafiq dövlət orqanlarına təqdim ediləcək ki, həm birincilər, həm də ikincilər barəsində lazımi ölçü götürülsün (107, v.3).

S.Mehmandarovun çağırış və səfərbərlik işinin dövrün tələbləri səviyyəsində qurulması üçün irəli sürdüyü məsələlər və təkliflər heç də cavabsız qalmırdı. Müvafiq hərbi orqanlarla bərabər yerli idarəetmə orqanları da bu məsələyə diqqəti artırırdılar. Məsələn, 1919-cu il fevralın 15-də Qarabağ general-qubernatoru X.Sultanovun sədrliyi altında Şuşada keçirilən qəza rəislərinin iclasında bir sıra digər məsələlər kimi çağırış və səfərbərlik işinin vəziyyəti də müzakirə olundu və bununla bağlı müvafiq



qərarlar qəbul edildi. Qəza rəisləri qərara aldılar ki, hər bir kənddə əhali arasında nüfuz və hörmətə malik olan adamlardan ibarət xüsusi komissiyalar təşkil edilsin, çağırışçıların siyahılarının tərtib edilməsi və toplanılması bu komissiyalara tapşırılsın. Siyahıları sahə pristavları əhaliyə e'lan etməli və ona riayət olunmasına nəzarət etməli idilər. İclas görüləcək işlər barədə Hərbi Nazirliyə mə'lumat verilməsini lazım bildi və qəza rəislərinə tapşırdı ki, uşaqlarını xidmətə göndərmək istəməyən imkanlı adamların qanun qarşısında məs'uliyyət daşıdığı və bu qanuna əsasən cinayət məs'uliyyətinə cəlb ediləcəkləri barədə xəbərdar olsunlar (56, v.16).

Həyata keçirilən tədbirlər əhali arasında da müəyyən bir fəallaşmaya, onların çağırış işinə *münasibətində nəzərəçarpacaq dönüşün yaranmasına* səbəb olmuşdu. 1919-cu il fevralın 25-də Azərbaycan Parlamentində çıxış edərkən A.Səfikürdski bildirirdi ki, son vaxtlar indiyədək görünməmiş halları müşahidə etmək mümkündür. İndi əhali özü fərarilərə qarşı çıxış edir, hərbi mükəlləfiyyətdən boyun qaçıranları əhali özü tutub müvafiq orqanlara təhvil verir. Səfikürdski xalqın xidmətə münasibətində belə dönüş yaranmasını ilk növbədə əldə edilmiş istiqlaliyyətin qorunması, xalqın hüquqlarının tə'min edilməsi keşiyində dayanılmasının yalnız öz qüvvələrimizlə mümkün olduğunun başa düşülməsi ilə bağlayırdı. O, bildirirdi ki, respublikanın müstəqilliyinə ölkə xaricindən Denikin qüvvələri kimi təhlükə mövcud olduğu kimi, ölkə daxilində də istiqlaliyyətə qənim kəsilən qüvvələr vardır. Belə qüvvələrin qarşısı isə yalnız güclü ordu ilə alına bilərdi. Buna görə Səfikürdski gənclərin xidmətdən fərariliyinə səbəb olan nöqsanların aradan qaldırılması üçün Hərbi Nazirliyin rəhbərliyi tərəfindən görülən işləri dəstəklədiyini bildirirdi (11, 4.03.1919).

Mə'lumdur ki, Parlamentin 1919-cu il fevralın 25-də olan iclasında hərbi nazir S.Mehmandarov da böyük bir nitqlə çıxış etmiş və həmin çıxışında çağırış və səfərbərlik işinin vəziyyətinə, bu istiqamətdə görülən işlərə də xüsusi yer ayrılmışdı. Nazir mə'lum olan nöqsan və çatışmazlıqlara toxunur, hərbi rəis idarələrinin sayının artırıldığını bildirirdi. O, Bakıda yeni bir hərbi rəisliyin də təşkil edildiyini parlament üzvlərinin nəzərinə çatdırırdı. Həmin idarə Bakı şəhərində çağırış və səfərbərlik işinə rəhbərlik etməli idi. Nazir çağırış sistemində də dəyişiklik edilməsi, bütün məntəqələrdə eyni vaxtda çağırışa son qoyulması, hərbi rəislərin idarələrinin yeni Əsasnaməsinin hazırlanması barədə Parlamentdə mə'lumat verdi. O, bir sıra kateqoriyaların xidmətdən azad edilməsi və ya onlara güzəşt verilməsi barədə öz mülahizələrini də parlament üzvlərinə çatdırırdı. Onun fikrincə, müəllimlərə güzəşt verilməsi əhalinin savadlandırılmasında mövcud olan çətinliklərin nəzərə alınması ilə bağlı idi. Çünki milli məktəblərin müəllimlərinin xidmətə çağırılması həmin məktəblərin bağlanması ilə nəticələnə bilərdi. S.Mehmandarov qeyd edirdi ki, bizim savadlılarımız elə də çox deyil ki, mövcud olan məktəbləri də bağlayaq (58, v.10).

Hərbi nazir sonra Dəmir Yolu məktəbində oxuyan azərbaycanlılara da xidmətdən güzəşt verildiyini bildirirdi. Onun sözlərinə görə, ölkənin təsərrüfat həyatı və hərbi infrastrukturu üçün strateji nəqliyyat növü olan dəmir yolunda azərbaycanlı sürücülər xeyli azdır.

Mövcud olan mütəxəssislər isə əsasən rus, gürcü və ermənilərdən ibarət idi. Onların milli kadrlarla əvəz edilməsi üçün həm Bakıda, həm də Gəncədə Dəmir Yolu məktəblərində oxuyanlara hərbi mükəlləfiyyətdən güzəşt verilirdi. S.Mehmandarov əlavə edirdi ki, yaxın gələcəkdə ocaqçılara, maşinistlərə, hökumət nəşriyyatlarının mürəttiblərinə (yığıcılarına), habelə gəmilərin matroslarına da xidmətdən möhlət veriləcəkdir. Ancaq matroslarla bağlı o gəmilərin matroslarına möhlət veriləcək ki, onlar daşınmalar barədə əvvəldən sazişlər imzalamışdılar. Yeni sazişlər bağlayan gəmilərin matroslarına isə bu güzəşt şamil edilmirdi (58, v.10).

S.Mehmandarov bildirirdi ki, Azərbaycanın çox böyük çağırışçı ehtiyatı vardır və ildə 60 min gənci xidmətə cəlb etmək olar. Bütün bu ehtiyatların hamısının orduya çağırılmasına heç ehtiyac da yox idi. Bunun üçün gələcəkdə daha çox kateqoriyalardan olan gənclərə güzəşt verilməsi barədə məsələ qaldırılacağı bildirilirdi. Nazir onu da əlavə edirdi ki, hazırda əgər 19 yaşından 24 yaşınadək 6 yaş qrupu üzrə çağırış aparılırsa, yaxın vaxtlarda 2 yaş qrupu üzrə çağırışa keçilməsi planlaşdırılır. Bu da xeyli sayda adamın xidmətdən azad edilməsi demək idi (58, v.10).

Hərbi Nazirlikdə fəaliyyətə başladığı ilk gündən fərariliyə qarşı qətiyyətli mübarizə aparmağı tə'kid edən S.Mehmandarov parlamentdəki çıxışında bu məsələnin artıq əvvəlki kimi ciddi dayanmadığını bildirirdi. Onun fikrincə, əvvələr bu barədə xeyli danışılıb fəryad qopardılırdısa bu narahatçılıq artıq yavaş-yavaş səngiməkdədir. S.Mehmandarov qeyd edirdi ki, hərbi mükəlləfiyyət həyata keçirilən bütün ölkələrdə fərarilik mövcuddur. Lakin bu istiqamətdə görülən iş məsələnin böhranlı hal almasını qabaqlayır və prosesi istiqamətləndirir. Belə bir vəziyyət Ermənistanda və Gürcüstanda da ortaya çıxmışdı. Nazir əlavə edirdi ki, fərariliklə bağlı olan problem müvəqqəti haldır və gənclərdə, onların valideynlərində Vətən, torpaq təəssübkeşliyi artdıqca xidmətə münasibət də dəyişəcəkdir S.Mehmandarov da çıxışında əhalinin fərariliyə münasibətinin getdikcə dəyişdiyini sübut edən nümunələr gətirirdi. Yə'ni əhali də bu hala qarşı mənfi münasibət bəsləyirdi. Hətta bə'zi fərarilərin döyülməsi və zorla geri qaytarılması faktları da olmuşdu (58, v.11).

Yerlərdən Hərbi Nazirliyə daxil olan mə'lumatlar da fərariliyə qarşı aparılan işlərin səmərəsinin xeyli artmasından xəbər verirdi. 1919-cu il mart ayının ortalarında Ərəş qəzasının rəisi Ordu Livası rə'yasətinin rəisinə göndərdiyi məktubunda fərarilərin tutulub saxlanılmasına diqqətin gücləndirildiyini bildirirdi. O yazırdı ki, pristavlar, kənd böyükləri bir-bir, iki-iki fərari tutub qəza orqanlarına təhvil verirlər. Qəza orqanları isə onları qaçdıqları hissələrə göndərirdi. Fərarilərin xidmət yerinə çatdırılması üçün müşayiətçi şəxslər tə'yin olunurdu. Ancaq hər gün gətirilən fərarilərin yanına müşayiətçi qoşub hissələrə göndərilməsinin müəyyən çətinlik yaratdığını nəzərə alaraq qəza rəisi xahiş edirdi ki, Ərəş ərazisindən tutulan fərarilərin Ləkidəki topçu cəbbxanasına təhvil verilməsinə icazə verilsin. Hərbi nazir S.Mehmandarov bu təklifi müdafiə etdi. Çünki bu, fərarilərlə iş aparmaq üçün həm yerli orqanların vəziyyətini yüngülləşdirir, həm də daşınmalara olan xərci müəyyən qədər azaldırdı (169, v.8-9).

Fərarilərə qarşı mübarizə Zaqatala bölgəsində də xeyli güclənmişdi. Zaqatalada olan əlahiddə tabordan fərarilik edənlərin sayının çoxalması barədə mə'lumat alınan kimi qubernator əhaliyə müraciət etdi. O, bildirirdi ki, fərariliyin artması ilə barışa bilməz və bununla bağlı ən sərt qərarların qəbul edilməsindən çəkinməyəcəkdir. Qubernator bə'yan edirdi ki, fərariləri gizlədən şəxs Vətən qarşısında məs'uliyyət daşıyır. Günahkar şəxslər 5 min rubla kimi cərimə ediləcək, ya da 3 ay müddətində həbs olunacaqlar. Qubernator onu da bildirirdi ki, hər hansı bir kənddə fərarilərin gizlədilməsi barədə mə'lumat alarsa, həmin kəndin ətrafında hərbi postlar qoyulması barəsində məsələ qaldıracaqdır. Zaqatala qubernatoru öz müraciətini belə bitirirdi: "Fərariliyə şərait yaradan hər bir şəxs özünə iyrənc bir şərəfsizlik qazanır. Belə ki, o ən yaxşı arzularımızın həyata keçəcəyini şərtləndirən möhkəmlənməmiş gənc ordumuzu zəiflədir və nəticədə respublikamızın bütün müsəlmanlarının ən vacib istəklərinin həyata keçməsinə mane olur" (108, v.26).

1919-cu il aprelin 14-də respublika parlamenti Hərbi Nazirliyin təqdim etdiyi çağırışdan güzəştlər layihəsini təsdiq etdi. Hərbi nazirin parlamentdəki çıxışında toxunduğu kateqoriyalardan başqa poçt-teleqraf idarəsində işləyənlər də çağırışdan güzəşt siyahısına daxil idi. Dəmir yolunda işləyən mütəxəssislər dəmir yolu bölüklərinin ehtiyat siyahılarına daxil edilirdilər (60, v.255).

Nazirin fərariliklə bağlı Parlamentdəki çıxışı heç də bu bəlaya qarşı mübarizənin zəiflədilməsi demək deyildi. Müəyyən müsbət dəyişikliklər meydana gəlsə də, fərariliyə qarşı qətiyyətli mövqe heç vaxt zəifləməmişdi. Bütünlükdə Azərbaycan Ordusunun bütün mövcudluğu dövründə fərariliyə nə son qoyulmuşdu, nə də bu məsələ diqqətdən kənarda qalmışdı.

Hərbi nazir S.Mehmandarov tələb edirdi ki, bütün hissələr vaxtaşırı fərarilər haqqında raport versin və bu raporta aşağıdakı mə'lumatlar daxil edilsin: 1) fərarinin adı və familiyası; 2) qaçma vaxtı; 3) fərarinin vətəni (quberniya, qəza, kənd); 4) fərari hansı xidməti mülkiyyəti özü ilə aparıb; 5) fərariliyə səbəb (94, v.35).

Nazir eyni zamanda tələb edirdi ki, xidmətə qayıdan fərarilər barədə də raportlar verilsin və həmin raportlara aşağıdakı mə'lumatlar daxil edilsin: 1) fərarinin adı; 2) qaçma tarixi; 3) qayıtma tarixi; 4) fərarilik barədə nə vaxt və hansı nömrəli raportla Ordu Livası rəyasətinə mə'lumat verilib; 5) hissədən aparılmış xidməti əşyalardan hansı geri qaytarılmayıb (94, v.35).

Fərariliyə qarşı mübarizənin səmərəliliyinin artırılması üçün bir sıra digər qətiyyətli addımlar da atıldı. Hərbi nazirin 14 iyun 1919-cu ildə imzaladığı 292 saylı əmri də belə addımlardan biri idi. Bu əmrdə fərarilərə və onları gizlədənlərə qarşı bir sıra cəza normaları təsbit edilmişdi. Daxili İşlər Nazirliyi ilə razılaşdırılandan sonra qəbul edilən bu normalara görə fərarini gizlədən hər bir şəxs 10 min rubl məbləğində cərimə olunur, ya da 6 ay müddətində həbs edilirdi. Fərarinin gizləndiyi kəndin vəzifəli şəxsləri onun tutulması üçün səhlənkarlıq göstərməkdə günahlandırılardılarsa, dərhal vəzifədən azad edilməli idilər. Sonra, əgər fərari hissənin əşyalarını özü ilə aparmış olardısa onun dəyərini ikiqat məbləğində ödəməli idi. Əsgərin özünün pulu olmasa həmin pul onun ailəsindən tutulurdu. Nəhayət, çağırışçının gizlədilməsi və ya çağırışdan yayındırılmasında günahlandırılan ailə 10 min rubl cərimə verməli və ya ailənin böyük kişisi 6 ay müddətində həbs olunmalı idi (89, v.174).

1919-cu ilin iyun ayında Azərbaycan Parlamenti bir daha çağırış və səfərbərliyin təşkili, fərariliyə qarşı mübarizənin gücləndirilməsi ilə bağlı məsələ müzakirə etdi və burada müvafiq qərara əsasən çağırış və səfərbərlik işində əsas tutulan hərbi mükəlləfiyyət haqqında 1915-ci ildə qəbul edilmiş Əsasnamənin 20-ci maddəsində dəyişiklik olundu. Bu dəyişiklikdə bildirilirdi ki, 1918-19-cu illərdə xidmətə çağırılan 19-24 yaş arasındakı gənclərin xidmət müddəti 2 il saxlanılır və sonra onlar ehtiyata buraxılırlar. Fərarilər və xidmətdən yayınanlar üçün isə xidmət müddəti 3 il e'lan olunurdu. Bundan əlavə, əsgərlərin fərarilikdə və həbsdə olduğu müddət xidmət müddəti sayılmırdı (117, v.89).

Parlamentin bu qərarının e'lan edilməsi ilə bağlı imzaladığı əmrində S.Mehmandarov tələb edirdi ki, fərarilikdə olan əsgərlər haqqında dərhal onların xidmət kartında qeyd edilsin ki, gələcəkdə həmin qeydlərə əsasən fərarilikdə olmuş əsgərin xidmət müddəti üç ilə çatdırılsın (117, v.89).

Xidmət kartlarının tətbiqi də xidmətin təşkilinə gətirilən yeniliklərdən biri idi. Həmin yeniliyin tətbiqinə Parlamentin çağırışla bağlı iyul ayında qəbul etdiyi qərardan sonra başlanmışdı. Bu kartlar əsgərlərin ştat sayı miqdarında tutulmalı və bura əsgərin xidmətindəki bütün yerdəyişmələr, xidməti dəyişikliklər yazılmalı idi. Nazir tələb edirdi ki, kartların işlənməsi üçün xüsusi bir katib ayrılsın. O eyni zamanda çağırışçılar üçün hissələrdə ayrıca əlifba kitabının tutulmasını da vacib bilirdi (96, v.72).



Qəbul edilən qərarlar və onların həyata keçirilməsi ilə bağlı aparılan işlər bir sıra hissələrdə fərariliyin xeyli səngiməsinə səbəb oldu. Məsələn, 3-cü Gəncə piyada alayından verilən raportda göstərilirdi ki, hərbi nazirin 14 iyun 1919-cu il tarixli 292 saylı əmri Azərbaycan dilinə tərcümə olunub əsgərlərə şərh edildi. Həmin əmr vərəqələrdə çap edilərək kazarmalarda asılmışdı ki, daim əsgərlərin gözləri qarşısında olsun. Bununla bərabər, alay hərbi məhkəmələrinin fəaliyyəti də əsgərlərə xeyli tə'sir göstərmiş və vəziyyət xeyli yaxşılaşmışdı (94, v.68).

Fərariliyin xüsusilə kütləvi hal aldığı Süvari diviziyasında da 1919-cu ilin avqust ayında vəziyyət xeyli sabitləşmişdi (162, v.98).

Bu diviziyada fərariliyin mövcudluğu daha çox kənardan göstərilən tə'sirlərlə bağlı idi. Məsələn, Qarabağda olan süvari hissələrinə bu bölgədə aparılan təbliğat işləri və köçərilik mövsümünün başlanması tə'sir göstərirdisə (162, v.85), böyük bir hissəsi ləzgilərdən ibarət olan və Dağıstan sərhəddində yerləşən 1-ci Tatar süvari alayına isə Dağıstandan aparılan təbliğat öz tə'sirini göstərirdi (163, v.39).

Ancaq bütünlükdə vaxt ötdükcə fərariliyin azalması meyli özünü göstərməkdə idi. Məsələn, 3-cü Gəncə piyada alayında 1919-cu ilin iyun ayında fərarilərin sayı 129 nəfər, həmin il noyabr ayının birinci yarısında artıq 44 nəfər idi. 6-cı Göyçay piyada alayında noyabr ayında fərarilərin sayı 77 nəfər, dekabrın əvvəllərində 31 nəfər olmuşdu. 2-ci Zaqatala piyada alayında avqustun 2-ci yarısında fərarilərin sayı 85 nəfər idisə, sentyabrın əvvəllində onların sayı 46 nəfərə enmişdi (297, s.54).

Aparılan işlər çağırış və səfərbərliyin təşkilində də bir canlanma yaratmışdı. Hətta birbaşa hissələrə gələrək xidmətə könüllü yazılanlar da var idi. Ancaq Hərbi nazir tələb edirdi ki, Praporşiklər məktəbindən başqa heç bir hissənin könüllüləri qəbul etmək səlahiyyəti yoxdur. Xidmətə gələnlər mütləq Əxzi-əsgər idarələrinin qeydiyyatından keçməli və onlar tərəfindən hissələrə göndərilməli idi (94, v.44).

Xidmətə cəlb olunanların Əxzi-əsgər idarələrində xüsusi forma üzrə qeydiyyatı aparılır və sonra işlənmiş olan həmin formaların bir nüsxəsi hərbi hissələrə təqdim edilirdi. Bu formalar aşağıdakı kimi idi (bax: 190, v.34):

| sıra №-si | Çağırışçının adı, atasının adı və familiyası (burada onun yaşı da göstərilirdi) | 1. Savadı<br>2.Məşğuliyyəti<br>3. Ailə vəziyyəti | Yaşayış yeri | Çağırış məntəqəsinə gəldiyi vaxt | Qeyd |
|---|---|---|---|---|---|

Gətirilən çağırışçılar hissədə həmin formalı siyahı üzrə qəbul edildikdən sonra mə'lumatlar xüsusi kitablara yazılırdı. Həmin kitabların forması aşağıdakı kimi idi (bax:165, v.169):

| Çağırış məntəqəsinin nömrəsi | 1. Xidmətə çağırılanın adı, atasının adı və familiyası 2. Hansı sosial təbəqəyə mənsub olması haqqında mə'lumat | xidmətə nə vaxt çağırılıb | təvəllüdü | boyu | hansı xidmətə qadirdir (Burada çağırışçının bütün nöqsanları və bədən çatışmazlıqları göstərilməlidir) | 1) Məzhəbi 2) ailə vəziyyəti, uşaqlarının sayı, atasının məzhəbi | Təhsili haqqında tam mə'lumat | Xidmətə hara göndərilməsi barədə Əxzi-əsgər idarəsi rəisinin qeydi |
|---|---|---|---|---|---|---|---|---|
| | | il, ay, gün | il, ay, gün | | | | | |

Hərbi Nazirliyin rəhbərliyinin göstərdiyi bütün sə'ylərə baxmayaraq, çağırış işindəki nöqsanlar qalmaqda davam edirdi. Bir sıra məntəqələrdə adı çağırış siyahısında olan gənclər çağırış məntəqəsinə gətirilirdilər. Ancaq qeydiyyatdan keçdikdən sonra onlar öz qohumlarının biri ilə əvəz edilirdilər. Adətən belə çağırışçılar ya böyük qardaşla, ya da səhhəti normal olmayan bir nəfərlə əvəz edilirdi ki, hissədə o, xidmətə yararsız sayılıb geri qaytarılsın. Çağırışçının əvəz edilməsi isə çox vaxt hissələrə aparılarkən yolda baş verirdi. Belə hallara yol verilməməsi üçün hərbi nazir tələb edirdi ki, Əxzi-əsgər idarələrində həkim komissiyasından keçərkən bütün çağırışçıların adlarının qarşısında onların fiziki ölçüləri yazılsın və hissədə qəbul edilərkən çağırışçılar həmin fiziki ölçülərə görə yoxlansınlar (94, v.36).

Çağırış işinin icrası ilə bağlı yerli hakimiyyət orqanlarının, xüsusilə cavabdeh polislərin fəaliyyətindəki səhlənkarlıq da aradan qaldırılmamışdı. Hərbi Nazirliyin rəhbərliyi bu məsələ ilə bağlı bir neçə dəfə Daxili İşlər Nazirliyi qarşısında məsələ qaldırmışdı. Yerlərdə mövcud olan bürokratizm, qanunsuzluq halları, Əxzi-əsgər idarələrində də özünü göstərirdi. Bu orqanın fəaliyyətinin yaxşılaşdırılması üçün 1919-cu ilin iyun ayının elə ilk günlərində Bakının hərbi rəisi, podpolkovnik Sədrəddin Mirzə Qacar Bakı və Balaxanı-Sabunçu polis rəislərinə müraciət etmək məcburiyyətində qalmışdı. Sədrəddin Mirzə Qacar polis rəislərindən xahiş edirdi ki, çağırış işində mövcud olan nöqsanların aradan qaldırılması üçün aşağıdakı məsələlərə diqqət gücləndirilsin; 1) çağırışla məşğul olan bütün polis işçiləri daimi diqqət altında saxlanılsın; 2) pristavlara tapşırılsın ki, çağırış günləri hörmətli və nüfuzlu adamlar tərəfindən tərtib edilmiş siyahılar üzrə çağırışçıların toplanması istiqamətində polis nəfərlərinin fəaliyyətinə şəxsən rəhbərlik etsin; 3) çağırış siyahılarını tərtib edən komissiyalara övladları hərbi xidmətdə olan nüfuzlu şəxslər daxil edilsin; 4) çağırışçını çağırışdan qizlədən bütün şəxslər sosial mövqeyindən asılı olmayaraq dərhal həbs edilsinlər və qizlətdikləri çağırışçı xidmətə çağırılan günədək həbsdə saxlansınlar. Pristavlar tələb etsinlər ki, həbs olunanların siyahısı iki nüsxədə tərtib olunsun, onlardan biri Əxzi-əsgər idarəsinin rəisinə təhvil verilsin; 5) əhaliyə e'lan edilsin ki, çağırış günü çağırış yaşı çatmış olan gənclər adları çağırışçıların siyahısına daxil edilib-edilməməsindən asılı olmayaraq çağırış məntəqələrinə gətirilməlidirlər. Çağırışçını gizlədənlər isə həbs ediləcəklər; 6) siyahıları tərtib edən şəxslərə çatdırılsın ki, adları siyahıya düşməyənlər üçün əlavə siyahılar tərtib edilsin və Əxzi-əsgər idarələrinə təqdim edilsin. Bu adamlar xəbərdar olunsun ki, kiminsə adı siyahıya düşməsə onlar məs'uliyyət daşıyırlar və çağırışçıları gizlətdiklərinə görə onlar istintaqa cəlb olunacaqlar; 7) pristavlara tapşırılsın ki, onlar əlavə siyahıların tərtibini nəzarət altına götürsünlər, xəfiyyələr vasitəsilə toplanılan mə'lumatlar əsasında həmin siyahıların doğruluğu yoxlanılsın; 8) pristavlar xəbərdar edilsin ki, gənclərin yaşının çağırış yaşına uyğun gəlib-gəlməməsi şübhə doğursa onların adları siyahıya salınsın ki, bu məsələ Əxzi-əsgər idarələrində həkim komissiyası tərəfindən müəyyənləşdirilsin; 9) pristavlara göstəriş verilsin ki, hərbi nazirin əmrinə əsasən iyun ayının 1-nə kimi bu və ya digər səbəblərə görə çağırışdan möhlət almış şəxslər də yoxlanılmaq üçün Əxzi-əsgər idarələrinə çağırılsınlar; 10) çağırış siyahılarını tərtib edən komissiya üzvlərinə bildirilsin ki, pristavlarla bərabər onlar da çağırış günü Əxzi-əsgər idarələrinə gəlsinlər (11, 7.07.1919).

Bu tələblərin və təkliflərin həyata keçirilməsi çağırış işinin səmərəliliyinin artmasına zəmin yaratmalı idi. Mə'lumatların qıtlığı bütün il boyu bu prosesin mənzərəsini təsəvvür etməyə imkan vermir. 1919-cu il avqust ayının 15-də əsas döyüş hissələrinin komplektləşdirmə mənzərəsi aşağıdakı kimi idi (297, s.55):

| Hissələrin adı | ştat üzrə | siyahı üzrə | mövcud | faizlə miqdarı |
|---|---|---|---|---|
| 1-ci Cavanşir piyada alayı | 2481 | 2435 | 1591 | 64,2 |
| 2-ci Zaqatala piyada alayı | 2481 | 1851 | 1114 | 44,9 |
| 3-cü Gəncə piyada alayı | 2481 | 1806 | 1105 | 44,5 |

1919-cu il avqustun 15-də 1-ci Tatar süvari alayında 645, 2-ci Qarabağ süvari alayında 529, 3-cü Şəki süvari alayında 568 əsgər və çavuş var idi (163, v.167). Nəzərə alınsa ki, 1-ci Tatar süvari alayının ştatında 803 nizami əsgər və çavuş var idi (163, v.33), onda görmək çətin deyil ki, süvari alaylarında ştatın yarıdan çoxu mövcud idi. Bu rəqəmlər daim dəyişirdi. Məsələn, 1-ci Cavanşir piyada alayında 1919-cu il sentyabrın 5-də əsgər

və çavuşların mövcud olanlarının sayı 1703 nəfər, 2-ci Zaqatala piyada alayında isə 1342 nəfər idi (162, v.172).

1919-cu ilin avqustun 15-də 1-ci topçu briqadasının 1-ci divizionunda ştatla 482 nəfər əsgər və çavuşa qarşı 342 nəfər, 2-ci divizionda isə 402 nəfərə qarşı 285 nəfər mövcud idi (163, v.167). Yə'ni, 1-ci topçu briqadası əsgər və çavuşlarla təxminən 70 faiz komplektləşdirilmişdi.

Bununla belə, çağırışın ümumi səviyyəsi hərbi naziri qane etmirdi. 1919-cu ilin oktyabr ayında o, daxili işlər nazirinin adına yazdığı məktubunda bildirirdi: "Çox böyük təəssüflə qeyd edirəm ki, maliyyə məsələlərindən başqa bütün məsələlərdə mənə yalnız sözdə kömək edirlər. Artıq beş aydır ki, mən ordunun komplektləşdirilməsi, təchizatı və səfərbərlik üzrə bir sıra məsələlər qaldırmışam, lakin onların heç biri öz həllini tapmamışdır" (297, s.52). Nazir qeyd edirdi ki, Mərkəzi Əxzi-əsgər idarəsinin Əsasnaməsinin hazırlanması, partizanların siyahısının tutulması, atların, gəmilərin mükəlləfiyyəti, əhalinin müdafiə işlərinə cəlb edilməsi qaydaları ilə bağlı olan həmin məsələlər Dövlət Müdafiə Komitəsinin iclaslarında da qaldırılmış, lakin heç biri haqqında lazımı qərar qəbul edilməmişdir. Nazirə görə çağırış işinin uğuru qəza rəislərinin vicdanına bağlı idi. Hansı qəza rəisi ki, bu işə vicdanla yanaşırdı, orada vəziyyət də yaxşı idi. Məktubda Şamaxı qəzasının rəisi Zülqədərovun bu sahədə səmərəli fəaliyyəti xüsusilə qeyd olunurdu. Şamaxıdan 1800 nəfər, Kürdəmir sahəsindən isə 930 nəfər çağırışçı xidmətə cəlb olunmuşdu. Nazir göstərirdi ki, 80000 əhalisi olan Bakı şəhəri 5000 çağırışçı vermək əvəzinə cəmi 800 nəfər çağırışçı toplanmışdı. Qarabağ general-qubernatorluğu 7200 nəfər əvəzinə cəmi 1902 nəfər çağırışçı vermişdi (297, s.51-52).

Yuxarıda qeyd edildiyi kimi, 1919-cu ilin sonuna ordunun şəxsi heyətinin sayının 20 minə, 1920-ci ilin sonunda isə onun sayının 2 dəfə artırılaraq 40 minə çatdırılması planlaşdırılırdı (97, v.129).

Şəxsi hey'ətin sayının bir il ərzində iki dəfə artırılmasının planlaşdırılması heç şübhəsiz ki, çağırışçı ehtiyatının mövcudluğunu və bu istiqamətdə görülə biləcək işlərin nəticələrinin reallığı ilə şərtlənirdi.

Bə'zi tarixi ədəbiyyatlarda 1920-ci ilin aprel ayında Azərbaycan Ordusunda şəxsi hey'ətin sayının 30 minə çatdığı göstərilir (211, s.332). Lakin bu mə'lumatın dəqiqliyi şübhə doğurur. Çağırış işinin yaxşı qurulacağı təqdirdə 1920-ci ilin ortalarında bu rəqəmin əldə edilməsi bəlkə də mümkün idi. Bolşevik işğalı ərəfəsində isə bu sayda ordunun varlığını iddia etmək olmaz. 1920-ci ilin əvvəlində mövcud olan mürəkkəb tarixi şərait çağırışın belə görünməmiş sür'ətlə aparılması üçün münasib deyildi... O biri tərəfdən yuxarıda qeyd edildiyi kimi 1920-ci ildə kütləvi çağırış kampaniyasına mart ayının 15-dən başlanmalı idi. Bu isə təxminən Qarabağda irimiqyaslı döyüşlərin başlanması ilə bir vaxta düşürdü. Ona görə də xidmətə cəlb edilən çağırışçıların böyük bir hissəsi döyüş zonasındakı canlı itki-



lərin bərpasına yönəldilməli idi. Mövcud vəziyyətin öyrənilməsi, 1919-cu ildə çağırış-səfərbərlik işinin təcrübəsinin müqayisəsi və 1920-ci ilin birinci rübündə ölkədə və ordu daxilindəki şəraitin nəzərə alınması göstərir ki, bolşevik işğalı ərəfəsində Azərbaycan Ordusunun sayı yaxşı halda 25 min nəfərdən artıq ola bilməzdi.

Beləliklə, ordu quruculuğunun digər sahələrində olduğu kimi qoşun hissələrinin zabit və əsgər hey'əti ilə komplektləşdirilməsində də bir sıra real və obyektiv çətinliklər var idi. Həmin çətinlik başlıca olaraq azərbaycanlıların sün'i surətdə hərb işindən uzaqlaşdırılması və milli hərbi kadrların xeyli az olması ilə şərtlənirdi. Mövcud olan problemin həlli üçün bir sıra vasitələrdən istifadə edilirdi. Ordunun zabit ştatlarına rus və gürcü zabitləri də'vət olunurdu. Həmin zabitlər Azərbaycan Respublikasına sədaqət andı qəbul etdikdən sonra lazımi ştatlara tə'yin edilirdilər. Milli kadrların tərkibinin artırılması üçün hərbi təhsil ocaqlarının işinə diqqət gücləndirilirdi. Mövcud olduğu dövrdə Praporşiklər məktəbi üç dəfə buraxılış etmişdi. Zabitlərin peşə hazırlığının yüksəltmək üçün Praporşiklər məktəbinin bazasında hərbi məktəb yaradıldı. Çağırış və səfərbərlik işinin yaxşılaşdırılması üçün onun hüquqi bazası xeyli təkmilləşdirildi, fərariliyə qarşı mübarizə ilə bağlı bir sıra sərt qərarlar qəbul edildi və onların tətbiqinə başlandı. Uzun illər boyu hərbi xidmətə cəlb edilməyən əhalinin əsgəri xidmətə münasibətində birdən-birə keyfiyyət dəyişikliyininin yaranması, çağırış işində əliəyriliyin, səhlənkarlığın qarşısının alınması elə asan olmasa da, aparılan ardıcıl iş günü-gündən müsbət meylləri daha da gücləndirirdi. Yə'ni Hərbi Nazirliyin rəhbərliyi tərəfindən bu istiqamətdə aparılan işlərin düzgün əsaslandırılması və onların reallaşdırılmasında ardıcıllıq göstərilməsi nəzərəçarpacaq irəliləyişlərin əldə edilməsinə səbəb olmuşdu.

# DÖRDÜNCÜ FƏSİL

## QOŞUNLARIN TƏ'LİM VƏ TƏRBİYƏSİ

Qoşunların maddi-texniki təchizatı və tə'minatı, hərbi hissələrin zabit və əsgər hey'əti ilə komplektləşdirilməsi ordu quruculuğunun vacib sahələrindən biridir. Ancaq ordunun gücü təkcə bu vacib elementlərin mövcudluğunda deyil, həm də onların necə hərəkətə gətirilməsində, qarşılıqlı əlaqələrinin necə yaradılmasında, malik olduqları imkanların nə dərəcədə reallaşdırılmasındadır. Mə'lumdur ki, orduda kəmiyyət ölçülərinin əhəmiyyəti böyükdür. Ancaq hərb elmi inkişaf etdikcə, elm və texnika insan həyatına daha fəal müdaxilə etdikcə hərb işində də keyfiyyət amili çox mühüm əhəmiyyət kəsb edir. Yə'ni bu amilləri ayrıca götürmək, onlar arasında dialektik bağlılığı nəzərə almamaq ordu qarşısında qoyulmuş olan böyük vəzifələrin həllində uğursuzluğa apara bilər.

Ehtimal olunan düşmənə üstün gəlmək, ölkənin üstünü almış təhlükəni dəf etmək mürəkkəbləşən hərbi şəraitdə hər bir ordunun qarşısında dayanan aktual məsələdir. Ordunun iştirak etdiyi döyüşün nəticələrinə çox amillər tə'sir göstərə bilər. Ancaq hərbi uğurun başlıca səbəblərindən biri döyüş hazırlığı səviyyəsi, qarşı tərəflə müqayisədə daha yüksək döyüş qabiliyyətinə, fəaliyyət səmərəliliyinə malik olmasıdır. Bu keyfiyyətlər isə birdənbirə əldə edilmir və burada subyektiv amilin, insan faktorunun xüsusi yeri vardır. Uzun illər boyu hərbi kadrlar qarşısında həmişə iki mühüm problem dayanmışdı – gələcək müharibənin xarakterini əvvəldən müəyyənləşdirmək və buna uyğun olaraq tə'limin mahiyyətini dəqiqləşdirmək. Yə'ni qoşunları nəyə və necə hazırlaşdırmaq. Başqa sözlə, tə'limin elə bir forma və metodunu axtarıb tapmaq ki, o müharibənin aparılması sahəsində doğruluğu güman edilən nəzərlərin və qoşunların döyüş hazırlığı işində bundan irəli gələn tələblərin həyata keçməsini tə'min etsin (210, s.3).

Qarşısında ölkənin ali mənafelərini qorumaq kimi yüksək vəzifələr dayanan ordu ona çəkilən xərcləri o vaxt doğrultmuş olar ki, o daim hərbə hazır olsun. Bu isə o deməkdir ki, ordu hələ müharibə olmadığı vaxt müharibənin tələb etdiyi gərginliklərə sinə gərməyi, şəraitin tələbinə görə daha çevik, daha səmərəli və daha düzgün hərəkət etməyi, bütün fiziki, maddi və mə'nəvi gücünü daha tam səfərbər etməyi bacarmalıdır. Həmin keyfiyyətlər isə qoşunlarda düzgün qurulmuş tə'lim və tərbiyə ilə əldə edilir.



Tə'lim və tərbiyə döyüş əməliyyatının aparılması və hərbi xidmətin yerinə yetirilməsi üçün bölmələrin, hissələrin və onların idarəetmə orqanlarının döyüş fəaliyyətinin nizamlanması və hərbi qulluqçuların ayrı-ayrı kateqoriyalarının hərbi, nəzəri, praktiki vərdişlərinin artırılması, mə'nəvi keyfiyyətlərinin formalaşdırılması sahəsində həyata keçirilən tədbirlər sistemidir (248, s.50).

Qoşunların tə'lim və tərbiyəsi dərslər, tə'limlər, döyüş atıcılığı, manevrlər, çöl təmrinləri və s. formada həyata keçirilir. Bu formaların hansının nə vaxt seçilməsi də böyük nəzəri və praktiki əsaslandırmanı tələb edir.

Müvafiq struktur və orqanların fəaliyyətinin səmərəliliyi də məhz onunla xarakterzə olunur ki, həmin strukturlar tə'limin zaman və məkan daxilində ən düzgün formasını seçir, onun reallaşdırılması, digər formalarla uzlaşdırılması və real həyata yaxınlaşdırılması üçün müvafiq tədbirləri həyata keçirirlər.

### *1. DÖYÜŞ HAZIRLIĞI*

Döyüş hazırlığının təkmilləşdirilməsi, onun əsaslandırılmış bir sistem kimi formalaşdırılması ordu quruculuğunun yeni mərhələsinin qarşısında dayanan mühüm məsələlərdən biri idi. Türk qoşunlarının Azərbaycanda olduğu vaxt azərbaycanlı əsgərlərin döyüş hazırlığı ilə məşğul olmaq üçün kifayət qədər vaxt yox idi. Xidmətə cəlb olunan gənclər çox vaxt birbaşa cəbhəyə göndərilir və ən adi döyüş vərdişlərini də elə səngərlərdə əldə etməli olurdular. 1918-ci ilin noyabrından Azərbaycan Ordusunun qurulmasının bütün məs'uliyyətini öz üzərinə götürən Hərbi Nazirlik bu sahəyə də xüsusi diqqət ayırdı. Hərbi Nazirliyin rəhbərliyinin qoşun hissələri ilə ilk tanışlığı isə göstərirdi ki, bu istiqamətdə görüləsi işlər xeyli çoxdur. Məsələn, 1918-ci il dekabrın 2-də 2-ci Qarabağ süvari alayında olan general S.Mehmandarov şəxsi hey'ətin döyüş hazırlığına malik olmadığını qeyd edirdi (86, v.6). Bu alayda döyüş hazırlığının qaldırılması istiqamətində çox işlər görülməsinin zəruriliyini alay komandiri S.Əfəndiyev də öz daxili əmrlərində e'tiraf edirdi. Dekabrın 15-də (1918-ci il) Boyəhmədli kəndində yerləşən 1-ci bölükdə olarkən o, süvarilərin xarici görkəmlərinin lazımi tələblərə cavab vermədiyini, onların atəş hazırlığının aşağı olduğunu, nişangah qaydalarını bilmədiklərini, tüfənglərin nömrəsini yadda saxlamadığını, verilən suallara qorxa-qorxa cavab verdiklərini qeyd edirdi. Komandirin yazdığına görə, süvarilərin bir çoxu kimə və nəyə xidmət etdiklərini də aydın təsəvvür etmirdilər. Polkovnik S.Əfəndiyev eyni zamanda qeyd edirdi ki, nə yeni, nə də köhnə süvarilər atlara qulluq edilməsi qaydasını bilmirlər. Halbuki, atların vaxtında təmizlənməsi, onların gümrah saxlanması süvari hissələrində döyüş hazırlığının çoxsaylı elementlərindən biridir (173, v.30).

2-ci Qarabağ süvari alayının 3-cü bölüyündə şəxsi hey'ət nisbətən daha yaxşı tə'lim görmüşdü. Onların sırada hərəkəti, rəislərin salamına gümrahlıqla cavab vermələri, atların qənaətbəxş vəziyyətdə olması S.Mehmandarovu da razı salmışdı. Görülmüş bu işlərə görə o, bölüyün komandiri poruçik Sadıxova öz minnətdarlığını da bildirmişdi (86, v.7).

4-cü dağ topçu batareyasında şəxsi hey'ətin ümumi döyüş hazırlığı S.Mehmandarovu qane etsə də, 5-ci dağ topçu batareyasında 1-ci piyada diviziyasının hissə və bölmələrində döyüş hazırlığının səviyyəsi onda təşviş və narahatçılığa səbəb olmuşdu (86, v.7).

1919-cu il yanvarın 1-də 2-ci Bakı piyada alayında olan hərbi nazır burada da döyüş hazırlığına kifayət qədər diqqət yetirilmədiyini bildirirdi. Alayın şəxsi hey'əti tə'lim atışlarına başlasa da, bunun üçün zəruri olan heç bir hazırlıq təmrinlərini yerinə yetirməmişdı. Nəticədə birdən-birə atəş mövqeyinə çıxarılan əsgərlər səmərəsiz yerə patronları zay edirdilər (152, v.27).

Hərbi nazirin müavini general-leytenant Ə.Şıxlinski də bir çox hərbi hissə və bölmələrdə oxşar vəziyyətlərin şahidi olmuşdu. 1-ci topçu briqadasının 1-ci divizionunda tə'limin gedişini müşahidə etdikdən sonra Ə.Şıxlinski qeyd edirdi ki, şəxsi hey'ət cüt sırada böyük meydan boyu addımlayırdı. Onların yanında olan üç nəfər tə'limatçı isə öz vəzifələrini əsgərlərin addımlarını saymaqla bitmiş hesab edirlər. Sıra tə'liminin tələbləri isə həyata keçirilmirdi. Əsgərlər öz gövdələrini arxaya tərəf meyllləndirərək xırda addımlarla addımlayırdılar (152, v.94).

Ə.Şıxlinskinin 3-cü Gəncə piyada alayında gördüyü tə'limin keyfiyyəti topçu divizionunda gördüyündən çox da fərqlənmirdi. Burada əsgərlər ümumi sırada bir təhər addımlasalar da, cərgə ilə addımlamağa hazır deyildilər. Cüt sırada isə addımlarını düzgün ata bilməyən əsgərlər bir-birinə mane olur, biri digərinin dabanlarını döyürdü. Tabor komandiri podpolkovnik Qasımbəyov tə'limin bu vəziyyətdə olmasını müvafiq nizamnamələrin göndərilməməsi və tə'lim zamanı köhnə türk nizamnamələrinin əsas tutulması ilə bağlasa da, Ə.Şıxlinski qeyd edirdi ki, bu izah tamamilə əsassızdır. Əvvəla, ona görə ki, Azərbaycan Ordusunda tə'lim rus ordusu nizamnamələri əsasında qurulmuşdu və bu tə'limnamələr əsasında yetişmiş olan tabor komandiri də tə'limi öz təcrübəsi üzərində qurmalı idi. O biri tərəfdən, Ə.Şıxlinski bildirirdi ki, türk ordusunun özündə də sıra tə'limləri zamanı iri addımlar tətbiq edilir. Buna görə də o tələb edirdi ki, zabitlər öz vəzifələrinin icrasına məs'uliyyətlə yanaşsınlar və yol verdikləri səhlənkarlıq üçün bəhanə axtarmasınlar (152, v.94).

Ə.Şıxlinski 1-ci Tatar süvari alayının 3-cü bölüyünün tə'limində də ciddi nöqsanların olduğunu görmüş və bu nöqsanları imzaladığı əmrdə digər hissələrin də nəzərinə çatdırmışdı. Bu bölüklə Gəncənin küçələrində rastlaşan Ə.Şıxlinski süvarilərə yerində dönmək əmri verəndə mə'lum olmuşdu ki, onlar ən adi hərəkəti yerinə yetirə bilmirlər. Ə.Şıxlinski eyni zamanda süvarilərin tə'lim məqsədilə küçəyə çıxmalarını düzgün saymırdı. Bildirirdi ki, bunun üçün hissənin tə'lim meydanından istifadə edilməsi daha məqsədəuyğundur (152, v.94).

Qoşunlarda tə'lim-tərbiyənin qurulmasında rus ordusunun nizamnamələri əsas götürülsə də, Hərbi Nazirliyin rəhbərliyi bu nizamnamələrin bütün müddəalarının rəhbər tutulmasını düzgün saymırdı. Bu nizamnamələrdə bir sıra məqamlar I dünya müharibəsinin təcrübəsindən əldə edilən qənaətlərlə səsləşmirdi və yeni dövrün tələblərinə cavab vermirdi. Ərkani hərbin rəisi, general-leytenant M.Sulkeviç 1919-cu il aprel ayının əvvəllərində hərbi nazirın adına yazdığı raportunda adları çəkilən nizamnamələrin təkmilləşdirilməsi, onların Azərbaycan Ordusu üçün uyğunlaşdırılması barədə məsələ qaldırmışdı. M.Sulkeviç yazırdı ki, bizim əsgərlərin öyrədilməsindəki çətinliklərin həlli əyani nümayiş, praktikanın nəzəriyyəyə nisbətən üstünlük təşkil etməsini tələb edir (102, v.12).

Nizamnamələrin təkmilləşdirilməsi ilə bağlı Sulkeviç təklif edirdi ki, üç komissiya yaradılsın. Birincisi – piyada komissiyası. Bu komissiya piyadalar üçün Sıra Nizamnaməsini və atış tə'limatını nəzərdən keçirməli idi. İkincisi – süvari komissiyası. Bu komissiya Süvari Nizamnaməsini təkmilləşdirməli idi. Ümumi komissiya adlandırılan üçüncü komissiya isə bütün qoşun növlərinin nümayəndələrindən təşkil edilməli və Səhra Nizamnaməsini araşdırmalı idi. Birinci komissiyaya general Usubovun, 2-ci və 3-cü komissiyalara isə süvari diviziyasının qərargah rəisi, general Amaşukelinin sədr tə'yin edilməsi təklif olunurdu (102, v.12).

Qoşun hissələrində tə'lim və tərbiyənin təşkilində çavuş hey'ətinin xüsusi yeri vardı. Bu kontingentin Azərbaycan Ordusunda çatışmaması döyüş hazırlığının ümumi səviyyəsinə də öz tə'sirini göstərirdi. Həmin boşluğun aradan qaldırılması üçün ordu daxilində bir sıra tədbirlər həyata keçirilirdi. 1918-ci il dekabrın 10-da Gəncədə tə'lim taborunun yaradılması barədə əmr imzalandı. Taborda 1000 nəfər əsgər hazırlıq keçməli idi. Bu əsgərlər 3 piyada bölüyündə və bir pulemyot bölüyündə birləşməli idilər (155, v.11). Ancaq mə'lumdur ki, bu tabor uzun müddət mövcud olmadı və 1919-cu ilin yanvarında ləğv edilərək 3-cü Gəncə piyada alayının 2-ci taboruna çevrildi (152, v.8).

Bundan sonra çavuş hey'ətinin hazırlanmasının ağırlığı hissələrin öz üzərinə düşdü. Bütün hissələrin tərkibində tə'lim komandaları var idi. Bu komandalara hissənin bölmələrindən əsgərlər toplanılır və onlara ən təcrübəli zabitlər dərs keçirdilər. Onlar üçün xüsusi dərs proqramı hazırlanırdı. Tə'lim komandalarının dərs proqramına bölük taktiki tə'limi, qarovul xidməti, saatdarların dəyişdirilməsi qaydası, nişangahın tə'yin edilməsi, düzgün nişanalma qaydası, atəş hazırlığı, Daxili Xidmət Nizamnaməsi, İntizam Nizamnaməsi, sıra tə'limi, silahla hərəkətlər, silahların sökülməsi və yığılması, silaha qulluq qaydaları, qarovul rəisinin və bölüşdürücünün

vəzifələri, süngü döyüşünün qaydaları, saatdarların hüquq və səlahiyyətləri, hərbi qulluqçuların məs'uliyyəti, qarovulun bölüşdürülməsi, qarovul binalarının sahmana salınması və s.daxil idi. Komandalarda fiziki və mə'nəvi hazırlığa da yer verilmişdi. Səhərlər gimnastika üçün vaxt ayrılmışdı. Dərs cədvəlinə mollaların söhbəti də salınmışdı. Bundan başqa, komandada hərbi andın əhəmiyyəti, fərarilik və ona qarşı cəza tədbirləri, xidmət borcu, şəxsi gigiyena və s. mövzularda da söhbətlər aparılmalı idi (bax:156, v. 44-45).

Tə'lim kurslarının təşkili istiqamətində 1-ci piyada diviziyasında görülən işlər Hərbi Nazirliyin rəhbərliyi tərəfindən təqdir olunmuş və diviziya komandirinin nazirin adına göndərdiyi raportun məzmununun bütün qoşun hissələrinə çatdırılması barədə göstəriş verilmişdi. Raportda bildirilirdi ki, çavuş hey'ətinin tamamilə olmaması onların görməli olduğu bütün işin ağırlığını podporuçiklərin və zabitlərin üzərinə qoymuşdur. Ancaq dövrün tələbi ilə tələsik hazırlanmış olan zabit kadrlarının ümumi hazırlıq səviyyəsi, təcrübəsi tə'limin müasir səviyyədə təşkilinə imkan vermirdi. Buna görə də 1-ci piyada diviziyasında iki tə'lim kursu yaradılmışdı. Onlardan biri çavuş hazırlamaq üçün, ikincisi isə cavan podporuçiklərin və zabitlərin hazırlıq səviyyəsinin təkmilləşdirilməsi üçün nəzərdə tutulmuşdu. Hərbi nazir bu fikrin məqsədəuyğunluğunu təsdiq edərək onun bütün hissələrdə tətbiq edilməsi barədə göstəriş vermişdi (144, v.6).

1919-cu ilin ortalarında 5-ci Bakı piyada alayının nəzdində bütün 2-ci piyada diviziyası üçün tə'lim-pulemyot məktəbi yaradılmışdı. Diviziyanın komandiri göstəriş vermişdi ki, hər alaydan bir zabit, 2 çavuş və 23 savadlı əsgər bu tə'lim məktəbinə göndərilsin. Onlar bu kursu bitirdikdən sonra yenidən öz hissələrinə qayıtmalı idilər. Yə'ni hissələrin əsgərlərinin qruplarla belə xüsusi kurslara cəlb edilməsi onların döyüş hazırlığına müsbət tə'sir göstərə bilərdi (156, v.38).

Tə'lim-pulemyot məktəbi 1919-cu ilin əvvəlində 1-ci piyada diviziyasının tərkibində də açılmışdı. Bə'zi müəlliflərin bunu kiçik zabit məktəbi (194, s.256) adlandırmalarını isə doğru saymaq olmaz. Azərbaycanda zabit hazırlayan məktəblər barədə yuxarıda artıq danışılmışdır. Bu məktəblər birbaşa Hərbi Nazirliyə tabe olan təhsil müəssisələri idi. Yenicə formalaşma mərhələsi keçirən 1-ci diviziyanın tərkibində isə zabit hazırlayan məktəbin açılması mümkün deyildi və diviziyanın heç belə səlahiyyətləri də yox idi.

Diviziya miqyasında yaradılan kursların biri də 1919-cu ilin sonlarında Süvari diviziyasının nəzdində açılmışdı. Diviziya komandiri general-mayor Novruzovun müvafiq əmrində göstərilirdi ki, uryadniklərin çatışmadığı, alayların daim xidməti e'zamiyyətlərdə olması və onların nəzdində olan tə'lim məktəblərinin zabitlərinin böyük səriştəyə malik olmaması üçün diviziyanın nəzdində tə'lim komandası yaradılır. Bu tə'lim komandasında süvarilər 6 ay dərs keçməli idilər. Komandanlığın fikrincə, həmin komandanın təşkili



diviziyanın döyüş hazırlığında olan boşluğun aradan qaldırılmasına kömək edəcəkdi (163, v.157).

Tə'lim komandalarının şəxsi hey'əti kursun sonunda tədris olunan fənlər üzrə imtahan verirdilər. Kursların buraxılışı hissə üçün əlamətdar bir hadisə sayılırdı. 1919-cu il aprelin 7-də 2-ci süvari alayının tə'lim komandasının ilk buraxılışı oldu. Kursun nəticələri ilə bağlı alay komandiri polkovnik D.Yadigarovun imzaladığı əmrdə tə'lim komandasının şəxsi hey'ətinin ümumi hazırlıq səviyyəsindən razılıq ifadə olunurdu. Onun fikrincə, cəmi iki ay ərzində süvarilər nizamnamələr üzrə proqramı yüksək səviyyədə mənimsəmiş, qarnizon və səhra xidməti üzrə yaxşı biliklər əldə etmişdilər. Alay komandiri qeyd edirdi ki, süvarilər aldığı bilikləri praktikada yaxşı nümayiş etdirirlər, verilən suallara və komandalara aydın və gümrah cavab verirlər və bütün fəaliyyətləri ilə sübut edirlər ki, öz gələcəklərini, tabeçiliklərində olanlara qarşı xidməti və mə'nəvi borclarını düzgün başa düşürlər (174, v.70).

Tə'lim komandasını bitirən süvarilər komanda vermək vərdişlərinə kifayət qədər yiyələnmişdilər. Onların verdiyi komandalar aydınlığı, səlisliyi ilə fərqlənirdi. Sırada yerdəyişmələr tez və düzgün həyata keçirilirdi. İmtahan üçün verilən çöl tapşırıqları da süvarilər tərəfindən lazımi səviyyədə icra edilirdi. Alay komandiri atsürmə vərdişlərinin də qənaətbəxş səviyyədə öyrənildiyini qeyd edir, göstərdikləri çalışqanlıq və zəhmətkeşliyə görə bütün süvarilərə təşəkkürünü çatdırır və əlavə edirdi ki, tə'lim komandasında əldə etdiyi nailiyyətlərlə Azərbaycan əsgəri həm də nəyə qadir olduğunu nümayiş etdirir. Polkovnik D.Yadigarov şübhə etmirdi ki, tə'lim komandasında alınan biliklər hissələrdə döyüş hazırlığının ümumi səviyyəsinin qalxmasına da öz müsbət tə'sirini göstərəcəkdir (174, v.70).

Bu müsbət hallara baxmayaraq Azərbaycan Ordusunda çavuş hey'ətinə böyük ehtiyac son günə qədər qalmışdı və ona görə bu kontingentin tə'lim-tərbiyənin təşkilində görməli olduğu işin əsas ağırlığını zabitlər öz üzərinə götürmüşdü. 1919-cu il avqustun 15-də bir sıra hissələrdə çavuş hey'əti ilə tə'minat səviyyəsi aşağıdakı kimi idi (297, s.56):

| Hissələrin adı | Ştat üzrə | Siyahı üzrə mövcuddur | |
|---|---|---|---|
| | | miqdarı | faizlə nisbəti |
| 1-ci Cavanşir piyada alayı | 355 | 55 | 15,5 |
| 2-ci Zaqatala piyada alayı | 355 | 45 | 12,6 |
| 3-cü Gəncə piyada alayı | 355 | 14 | 3,9 |
| 4-cü Quba piyada alayı | 355 | 35 | 9,8 |
| 5-ci Bakı piyada alayı | 355 | 18 | 5 |
| 1-ci yüngül topçu divizionu | 77 | 16 | 20,8 |
| 2-ci dağ topçu divizionu | 57 | 16 | 28 |

Çavuş hey'ətinin hazırlanması tə'lim kursları ilə bitmirdi. Döyüş hazırlığı planı çərçivəsində il boyu çavuş hey'əti ilə də xüsusi dərslər keçilir, onların hazırlıq səviyyəsi təkmilləşdirilirdi. Zaqatala piyada alayında ümumi döyüş hazırlığı planı əsasında çavuşlar həftədə iki dəfə saat 14.30-dan 16.30-dək dərs keçməli idilər. Bu dərslərdə adətən 2 fənn tədris olunurdu. Saat 14.30-dan 15-dək Çöl Nizamnaməsi, Sıra, Qarnizon və Daxili Xidmət nizamnamələri öyrənilir, qalan vaxt ərzində isə taktika keçirilirdi. Aşağıdakı mövzular taktika üzrə tədris proqramına daxil edilmişdi: 1) taqım komandirinin vəzifələri; 2) ərazidə və plan üzrə səmtləmə; 3) atəşin idarə edilməsi (atəş hazırlığı); 4) döyüş zamanı patron ehtiyatının yaradılması və onun məsrəfi; 5) ərazi üzərindəki obyektlər uğrunda mübarizə, çöl qurğuları; 6) səngərlərin yerinin müəyyənləşdirilməsi və tikilməsi, onların müdafiəsi. Sün'i manеələrin hazırlanması; 7) pulemyotun əhəmiyyəti və ondan taktiki planda istifadə edilməsi; 8) döyüş tərtibinin hissələri arasında əlaqə, döyüşdə qarşılıqlı yardım; 9) döyüş vaxtı cinahlara göndərilmiş dozorun və zastava rəisinin vəzifələri; 10) dağlarda səfər hərəkətinin və döyüşlərin xüsusiyyətləri; 11) gecə və qış vaxtı səfər hərəkətinin və döyüşlərin xüsusiyyəti; 12) səfər hərəkəti zamanı komandirlərin, dozorların, səfər zastavalarının, ön, cinah və arxa dəstələrin vəzifələri və s. (161, v.7).

Çavuşlarla dərslər qrup şəklində, birtərəfli, ikitərəfli keçirilə bilərdi. Hər dərsdən sonra çavuşlar və dərs rəhbəri tərəfindən dərsin gedişi müzakirə edilməli və hər bir çavuşun hərəkətinə və biliyinə qiymət verilməli idi (161, v.7).

Bir sıra ixtisaslar üzrə mütəxəssislərin mövcudluğu da qoşunların döyüş hazırlığının əhəmiyyətli elementlərindən biri idi. Yuxarıda qeyd edilmişdi ki, bir sıra problemlərin yerlərdə həll edilməsi üçün hissələrdə müxtəlif e'malatxanalar döyüş hazırlığının lazımi səviyyədə saxlanması üçün silahların tə'mirini, atların nallanmasını, soyuq silahların bərpasını və s. vəzifələri öz üzərinə götürdülər. Həmin e'malatxanaların səmərəli işləməsi zəruri mütəxəssislərin olmasını tələb edirdi. Belə mütəxəssislər həm çağırış-səfərbərlik yolu ilə hissələrə cəlb edilirdilər, həm də onların qoşunların özündə, xüsusi kurslarda hazırlanırdılar. 1919-cu ilin martında hərbi nazır özünün 120 saylı əmri ilə tələb edirdi ki, baytar həkimləri olan hissələrin nəzdində tə'limi-dəmirçixanalar açılsın. Həmin əmrə əsasən tə'limi-dəmirçixanaların biri 1-ci Tatar süvari alayının nəzdində açılmalı idi. 12 nəfər üçün nəzərdə tutulmuş bu dəmirçixanaya hər bölükdən 2 nəfər olmaqla 8 nəfər Tatar süvari alayından, 2 nəfər 2-ci Bakı piyada alayından və 2 nəfər də 3-cü Gəncə piyada alayından cəlb edilməli idi. İkinci dəmirçixana 2-ci Qarabağ süvari alayının nəzdində açılmalı idi. Bu dəmirçixana 8 nəfər (Qarabağ süvari alayının 4 bölüyünün hər birindən 2 nəfər) üçün nəzərdə tutulmuşdu. Üçüncü dəmirçixana birinci topçu briqadasının 1-ci yüngül topçu divizionunun nəzdində açılmalı idi və bura divizionun üç batareyasının hər birindən 2 nəfər cəlb olunmalı idi. Dördüncü dəmirçixana isə 2-ci dağ topçu divizionunun nəzdində 6 nəfər üçün açılmalı idi. 4 nəfər topçu batareyalarından, 2 nəfər isə 1-ci Cavanşir piyada alayından gəlməli idi. Dəmirçixanalarda tə'limin müddəti 4 ay nəzərdə tutulmuşdu (152, v.110).

Silahların və topların tə'miri üzrə əsgərlər arasından mütəxəssislərin hazırlanması üçün isə 1919-cu ilin aprel ayında Gəncədə topçu e'malatxanasında tə'lim kursları açılmışdı. Nazirin əmrinə görə bu kurslara piyada və süvari alaylarının hər birindən 6 nəfər əsgər, Topçu briqadasının hər batareyasından isə 4 nəfər əsgər göndərilməli idi (152, v.195).

Əsgərlər arasında müxtəlif ixtisaslar üzrə mütəxəssislərin hazırlanması üçün başqa vasitələrdən də istifadə olunurdu. Məsələn, Gürcüstanla hərbi əməkdaşlıq barədə saziş bağlanandan sonra bir neçə zabitlə bərabər 10 nəfər əsgər də Tiflisə hərbi kurslara göndərilmişdi. Həmin əsgərlər radio-teleqraf ixtisası üzrə kurslarda təhsil almalı idi (129, v.1).

Bundan əlavə, Ərkani-hərb rəisi Sulkeviçlə qarşılıqlı danışıqlardan sonra Bakıdakı ingilis qoşunlarının qərargah rəisi azərbaycanlı zabit və əsgərlərin ingilis topları üzərində topçu işinin vərdişlərinə öyrədilməsinə kömək göstərilməsinə razı olduğunu bildirmişdi. Sulkeviç ingilis nümunəli topların öyrənilməsi üçün 2-3 zabitin rəhbərliyi ilə 50-80 nəfərlik qrupun yaradılmasını məqsədəuyğun bilirdi (127, v.23). Bu kursun təşkili hərbi nazirlə razılaşdırıldıqdan sonra Sulkeviç müəyyənləşdirilmiş sayda əsgər və zabitin göndərilməsi üçün hissə komandirlərinə teleqram vurmuşdu (144, v.81).

Tə'lim-tərbiyə prosesinin əsas tərkib hissəsini sıravi hey'ətlə aparılan döyüş hazırlığı təşkil edirdi. Sıravi hey'ət qoşunlarda mütləq çoxluğa malik idi və bütün təşkilatçılıq işləri də məhz bu hey'ətin ümumi hazırlıq səviyyəsinin qaldırılmasına istiqamətləndirilmişdi.

Döyüş hazırlığı proqramı həm qoşun növlərinə görə, həm də ilin fəsillərinə görə fərqli xüsusiyyətə malik idi. Ümumi tələb və me'yarlar saxlanılmaqla hər qoşun növü öz xüsusiyyətlərindən irəli gələn vərdişlərin əldə edilməsinə daha geniş yer verirdi.

Hər bir qoşun növünün özünün xarkterik xüsusiyyətləri var idi. Bu xarakterik xüsusiyyətlərin üzə çıxarılmasında və qarşıya qoyulan vəzifələrin həyata keçirilməsində sıravi hey'ətin döyüş hazırlığının çox mühüm yeri var. Məsələn, general Qaytabaşının razı olduğu qənaətlərə görə piyada qoşunları aşağıdakı xarakterik xüsusiyyətlərə malik idilər:

– Piyada qoşunları həm odlu, həm də soyuq silahlarla vuruşur. O, döyüşü hazırlayıb qələbə ilə sona çatdıra bilər;

– Piyada qoşunları gərgin və uzunmüddətli döyüşlər aparmağa qadirdir;

– Piyada qoşunları uzun müddət öz nizamını saxlaya və qısa müddət ərzində sıralarını bərpa edə bilər;

- Piyada qoşunları ilin bütün fəsillərində, istənilən ərazidə fəaliyyət göstərə bilər;
- Piyadalar bütün döyüş vəzifələrini icra edə bilərlər;
- Piyada qoşunlarının formalaşdırılması, komplektləşdirilməsi, təchizatı, ərzaq tə'minatı, başqa qoşun növlərinə nisbətən daha sadədir;
- Piyada qoşunlarının saxlanılması daha ucuz başa gəlir. Bütün bu xüsusiyyətlərinə görə *piyada qoşunları əsas qoşun növü sayılır (124, v.39).*

Piyada qoşunlarda mövcud reallığa əsaslanaraq hazırlanan döyüş hazırlığı proqramının qarşıya qoyduğu əsas vəzifə də bütün bu xüsusiyyətləri özündə canlı şəkildə əks etdirən hissələrin formalaşdırılması idi.

Döyüş hazırlığı proqramları hissələrin özlərində hazırlanırdı. Hissənin yerləşdiyi ərazi, malik olduğu tə'lim bazası və s. amillərə görə hazırlıq proqramları bir-birindən azacıq fərqlənə bilsə də, ümumi tələblər konkret qoşun növünün bütün hissələr üçün eyni idi.

Döyüş hazırlığının planında yay və qış mərhələlərinin xüsusiyyətləri nəzərə alınırdı, lakin bu mərhələlər arasında qəti bir sərhəd yox idi. Hər tə'lim mərhələsinə aid olan tə'lim-tərbiyə proqramları bir neçə dövrü əhatə edirdi. Hər biri bir neçə həftədən və ya aydan ibarət olan bu dövrlərin müəyyənləşdirilməsində də xüsusi me'yar yox idi. Bu dövrlər əsasən tə'lim prosesinin qarşısına qoyulan konkret vəzifələrlə müəyyənləşdirilirdi.

Zaqatala piyada alayında qəbul edilmiş proqram 6 həftə üçün nəzərədə tutulmuşdu. Bu proqramın qarşısında dayanan vəzifələr aşağıdakı kimi müəyyənləşdirilmişdi: sıravi əsgərdən ona e'tibar edilmiş silahdan yaxşı istifadə etməyi bacaran, qarşıya çıxan çətinlikləri dəf etməyə qadir olan şüurlu döyüşçü hazırlamaq. Bunun üçün sıravi aşağıdakıları mənimsəməli idi: 1) döyüş fəaliyyətinin bütün növlərində (döyüş, səfər, istirahət, mühafizə xidməti, kəşfiyyat, qarovul və daxili xidmət) əsgərin vəzifələrini öyrənmək; 2) döyüş silahını (tüfəng, əl qumbarası və pulemyot), ondan istifadəni və atmağı, ona qulluq etməyi, habelə soyuq silahdan istifadə etməyi bacarmaq; 3) çöl gimnastikası ilə məşğul olmaq. Bunun üçün əl altında olan əşyalardan ən sadə alətlər – paralel qollu turnik, üfüqi tir, müxtəlif manеələr hazırlanmalı idi. Dərslərin ikitərəfli və şərti düşmənə qarşı mübarizə əsasında hazırlanmış taktiki tə'limlə başa çatdırılması nəzərdə tutulurdu. Proqramda gecə dərslərinin keçilməsi də nəzərdə tutulmuşdu. Əsgərlər gündə 6 saat fəal məşğul olmalı idilər (161, v.3).

6 həftəlik döyüş hazırlığı proqramı aşağıdakı şəkildə tərtib edilmişdi (bax:161, v.6-7):

**A. Birinci həftə**

saat 7.00 - 8.30. Passiv gimnastika.
saat 8.30 – 9.00. İdman qurğuları üzərində gimnastika.



saat 9.15 – 9.55. Tüfəngin qundağının düzgün dayaqlandırılması, bütün vəziyyətlərdə düzgün nişanlanma, nişangahın düzgün qurulması.
saat 10.00 – 11.00. Sıra dərsləri. Dönmə hərəkətləri, cərgə tə'limi və bir sıradan iki sıraya keçid.
saat 11.00 – 11.30. Səpələnmiş sıra ilə tanışlıq.
saat 13.00 – 14.30. Nişançının zəncirvari hərəkət zamanı vəzifələri, tüfənginin sökülməsi və yığılması.

**B. İkinci həftə**

saat 8.00 – 8.30. Passiv gimnastika.
saat 8.30 – 9.00. İdman qurğuları üzərində gimnastika.
saat 9.15 – 9.55. Tüfəngin qundağının düzgün dayaqlandırılması, nişangahın düzgün qurulması, bütün vəziyyətlərdə tüfəngin doldurulması, tətiyin çəkilməsi.
saat 10.00 – 11.00. Sıra dərsləri. Taqım tə'limləri.
saat 11.00 – 11.30. Səpələnmiş sıra - səpələnmiş taqım və onun ərazidə istifadə edilməsi.
saat 13.30 – 14.30. Nişançının zəncirvari hərəkət zamanı vəzifələri, tüfənginin sökülməsi və yığılması, onun təmizlənməsi.

**C. Üçüncü həftə**

saat 8.00 – 8.30. Passiv gimnastika.
saat 8.30 – 9.00. İdman qurğuları üzərində gimnastika.
saat 9.15 - 9.55. Qundağın düzgün dayaqlandırılması, nişanalma, nişangahın düzgün qurulması, tüfəngin doldurulması, tətiyin çəkilməsi, tək-tək atəş və yaylım atəş
saat 10.00 - 11.00. Sıra dərsləri. Taqım tə'limi.
saat 11.00 - 11.30. Taqımın səpələnmiş sırası və ərazidə taktiki məsələnin həlli
saat 13.30 14.30 Çöl Nizamnaməsi. Keşikçi xidməti, onun məqsədi. Keşikçi tərtibləri haqqında ümumi mə'lumat. Zastava, çöl qarovulu, saatdarın, dozorun, pusqunun vəzifələri, mühafizə keşiyində, ehtiyatda, zastavada, çöl qarovulunda riayət olunan qaydalar.

**Ç. Dördüncü həftə**

saat 8.00 8.30. Passiv gimnastika.
saat 8.30 - 9.00. İdman qurğuları üzərində gimnastika.
saat 9.15 - 9.55 Qundağın düzgün dayaqlandırılması, nişanalma, nişangahın düzgün qurulması, tüfəngin doldurulması, tətiyin çəkilməsi.
saat 10.00 - 11.00. Bölük praktiki tə'limi.
saat 13.30 - 14.30 Keşikçi xidməti, onun məqsədi, mühafizə keşiyi, keşikçi dəstəsi və çöl qarovulu haqqında mə'lumat.

**D. Beşinci həftə**

saat 8.00 – 8.30. Passiv gimnastika.

saat 8.30 – 9.00. Qurğular üzərində gimnastika.

saat 9.30 – 9.55. Qundağın düzgün dayaqlandırılması, bütün vəziyyətlərdə nişanalma, nişangahın qurulması, tüfəngin doldurulması və tətiyin çəkilməsi.

saat 10.00 – 11.00. Ərazidə praktiki məsələlərin həlli ilə bölük taktiki tə'limi.

saat 13.30 – 14.30. Keşikçi xidməti, səfər və hücum mə'lumatları. Hər bir sıravi üçün Qarnizon Nizamnaməsindən zəruri olan mə'lumatlar.

**E. Altıncı həftə**

saat 8.00 – 10.00. Zəif atıcılarla atışın müxtəsər kursunun keçilməsi.

saat 10.00 – 10.30. Bölük komandirləri tərəfindən tərtib edilmiş proqramın sıra və praktiki tə'limin zəif mənimsənilmiş bölmələrinin təkrarı.

saat 13.30 - 14.30. Sıravi üçün Daxili Xidmət, İntizam və Qarnizon nizamnamələrindən zəruri olan mə'lumatlar.

2-ci süvari alayında 1919-cu ilin may ayında Azərbaycanın istiqlaliyyətinin 1 illiyi münasibətilə keçiriləcək parada hazırlaşmaq üçün müvəqqəti məşğələlər proqramı tərtib edilmişdi. Bu proqrama görə hər gün səhər saat 8-də süvari dərsləri başlamalı idi. Saat 14-dən 15-dək piyada məşğələləri keçilməli, saat 15.30-dan 16.30-dək isə atlara bir sıra elementlərin öyrədilməsi üzrə tə'limlər aparılmalı idi (174, v.119).

Hərbi paradın keçirilməsindən sonra 2-ci süvari alayında əvvəlcə 2 həftəlik proqram tutuldu. Proqrama həm süvarilər üçün, həm də zabitlər üçün dərslər daxil edilmişdi. Proqramın hazırlanması zamanı alay komandirinin bir sıra tələbləri də nəzərə alınmışdı. Məsələn, hələ 1919-cu ilin fevral ayında alay komandiri polkovnik Yadigarov göstəriş vermişdi ki, hər gün saat 11-dən 12-yədək zabitlərin atla məşğələlər keçirilsin. Tə'yin olunmuş vaxtda bütün zabitlər komandirlərin və ya baş zabitlərin rəhbərliyi altında tə'lim meydanında toplaşmalı və burada müəyyənləşdirilmiş elementləri yerinə yetirməli idilər (174, v.9).

Polkovnik Yadigarov eyni zamanda bölük komandirlərindən və rəislərindən tələb edirdi ki, dərs proqramının düzgün yerinə yetirilməsinə ciddi riayət etsinlər. Dərslər proqramda göstərilən vaxtda başlasın və vaxtında da başa çatdırılsın (174, v.66).

Hər gün saat 5-də isə otlaqlar üzrə növbətçi zabitin rəhbərliyi altında atlar tövlədən çıxarılmalı və ayrılmış otlaq sahələrinə sürülməli idi.

Mayın 31-dən iyunun 15-dək olan dövrü əhatə edən proqramda saat 11-dən 12-dək zabitlərin atlarla məşğələləri, saat 15-dən 17-dək isə zabitlərin sinif məşğələləri nəzərdə tutulmuşdu. Sinif məşğələlərində adətən nizamnamələr öyrədilirdi. Zabitlərin dərslərinə alayın yüksək rütbəli zabitləri rəhbərlik edirdilər (174, v.128).



Proqramda süvarilər üçün hər gün gimnastika, sıra tə'limləri, atəş hazırlığı, keşikçi xidməti üzrə hazırlıq nəzərdə tutulmuşdu (174, v.128).

1919-cu il iyunun 15-dən sonrakı dövr üçün yeni proqram hazırlandı. Çox güman ki, bu proqram da uzun müddət üçün nəzərdə tutulmamışdı. Çünki proqrama hər gün üçün təxminən eyni dərslər salınmışdı (174, v.160).

saat 7.30-8.30. Gimnastika, soyuq silahın işlədilməsi.

saat 9.00-11.00. Piyada, süvari tə'limi, atəş hazırlığı, nişanalma və qundağın düzgün dayaqlandırılması.

11.30-12.30. Zabitlərlə dərs.

15.00-17.00. Keşikçi xidməti, quşlarla təşkil edilən poçt. Həftəlik tərtib edilmiş proqramda yalnız sonuncu dərs "Səfər hərəkəti" ilə günaşırı növbələnirdi (174, v.160).

Tərtib olunmuş proqramların həyata keçirilməsinə bir sıra səbəblər bu və ya digər dərəcədə tə'sir göstərirdi. 3-cü Gəncə piyada alayının komandiri bildirirdi ki, əsgərlərin tə'lim komandasını bitirəndən sonra döyüş hazırlığının aparılmasına cəlb edilməsi ümumi hazırlıq səviyyəsini qaldırmış və əsgərlərin çoxunun şüurunda xidməti borcların icrasına və hərbi xidmətin mahiyyətinə münasibətdə bir dönüş yaratmışdır. (161,v.68).

Ancaq mövcud olan arxiv sənədlərində hissə komandirləri tə'lim-tərbiyənin gedişinə əks-tə'sir göstərən amillərə daha çox toxunur və Hərbi Nazirliyin rəhbərliyinin diqqətini də bu amillərin aradan qaldırılması üzərində cəmləşdirməyə çalışırdılar. Hissələrdə narahatçılıq doğuran məsələlərdən biri zabit kadrlarının kifayət qədər olmaması idi. Savadlı, təcrübəli zabit kadrları çatışmayan hissələrdə əsgərlərlə dərslərin aparılması gənc zabitlərə tapşırılırdı ki, bu da tə'limin keyfiyyətinə mənfi tə'sir göstərirdi (161,v.65).

Bir sıra qoşun hissələrində, xüsusilə topçu hissələrindəki zabitlər Azərbaycan dilini bilmirdilər və ya zəif bilirdilər. Bu zabitlərlə əsgərlər arasında ünsiyyət yaratmağın çətinləşməsi döyüş hazırlığının keyfiyyətinə tə'sir edir. topların material-texniki hissəsi haqqında biliklərin əldə edilməsini mürəkkəbləşdirirdi (161, v.65).

2-ci Dağ topçu divizionunda atların çatışmaması topların və onların təchizatının tə'lim meydanlarına çıxarılmasına və praktiki dərslərin aparılmasına mane olurdu (161, v.65).

Hissələrin şəxsi hey'ətinin keşikçi və mühafizə xidmətlərinə cəlb edilməsi, gücləndirilmiş naryadların tə'yin edilməsi tə'limin ümumi ahəngini pozurdu. Çağırış-səfərbərlik işinin qeyri-ahəngdar aparılması da tə'lim prosesinin təşkilinə maneçilik törədirdi. Çağırışçılar hissələrə böyük qruplarda deyil, kiçik qruplarla daxil olurdu. Zabit hey'ətinin azlığı üzündən bir neçə nəfər üçün ayrıca proqram hazırlanması mümkün deyildi. Ümumi-

tə'lim prosesinə qoşulmaları isə onları bir sıra ilkin vərdişlərin və anlayışların əldə edilməsindən məhrum edirdi(161,v.48).

Mülki hakimiyyət orqanlarının xahişi ilə asayişin bərpa edilməsi üçün çoxsaylı naryadların ayrılması hissələrdə gərginlik yaratmaqla bərabər, tə'lim-tərbiyə prosesinin gedişini də ümumi axarından çıxarırdı (161, v.85).

Bir sıra hissələrin şəxsi hey'ətinin döyüş tapşırıqlarının icrasına cəlb edilməsi də tə'lim-tərbiyə prosesinin ahəngdarlığına güclü əks-tə'sir göstərirdi. 1-ci Cavanşir piyada alayının komandirinin Hərbi Nazirliyə göndərdiyi arayışda bildirilirdi ki, ermənilərin 1919-cu ilin yayında Şuşada təcavüzü gücləndirmələri dərslərin düzgün axarını kəskin şəkildə dəyişdirmişdir. Atış kursunun keçilməsi tamamilə dayandırılmışdı.Əsgərlərin yalnız yarısı 1 saylı döyüş tapşırığını,tək-tək atış üçün hazırlıq məşğələlərini keçə bilmişdi. Şuşa, Əsgəran və Xocalı ətrafında keşikçi postlarına gücləndirilmiş naryadların göndərilməsi bölüklərdəki bütün hazırlıqlı əsgərlərin məsrəfinə gətirib çıxarmışdı. Hər səhər hissənin düzülüşündə bölüklərin sırasında cəmi 10-15 əsgər dayanırdı. Bölmələrdə əsgərlərin həddən artıq az olması tə'lim proqramının da yenidən qurulmasına səbəb olurdu. Şəxsi hey'ətin böyük bir hissəsi isə tə'lim-tərbiyə prosesindən kənarda qalırdı (161, v.12).

Tə'lim-tərbiyə prosesinin qarşısında dayanan vəzifələrin həllinin və ortaya çıxan problemlərin aradan qaldırılmasının müxtəlif şəkildə həlli bu və ya digər hissələrdə döyüş hazırlığının eyni səviyyədə olmaması ilə nəticələnirdi. Hərbi Nazirliyin rəhbərliyinin həyata keçirdiyi yoxlama-tanışlıq hissələrin bir çoxunda döyüş hazırlığı səviyyəsinin qənaətbəxş olduğunu təsdiqləyirdisə, bir sıra hissələrdə ümumi hazırlıq səviyyəsi lazımı tələblərə cavab vermirdi. Bu yoxlama-tanışlıqların nəticəsi kimi ortaya çıxan arayış-hesabatlar ümumiləşdirilir və sonra rəsmiləşdirilərək bütün qoşun hissələrinin komandanlıqlarının nəzərinə çatdırılırdı. Həmin hesabat-arayışlarda hissələrin döyüş hazırlığının ümumi mənzərəsi ətraflı təhlil edilir və bütün hissə komandirlərinin diqqəti döyüş hazırlığına verilən tələblər üzərində cəmləşdirilirdi.

General-mayor Usubov 1919-cu ilin mart ayında 3-cü Gəncə piyada alayında tə'lim-tərbiyənin gedişi ilə tanış olandan sonra öz hesabatında yazırdı ki, alayda dərslər sistemsiz keçirilir,proqram yoxdur, türk Nizamnamələri döyüş hazırlığı üçün əsas tutulur. Sıra tə'limlərində ancaq addımlama, dönmə və hərbi salamvermə hərəkətləri yerinə yetirilir. Zabitlər özləri sıra tə'limini və nizamnamələri zəif bilirlər. Sırada intizam çox zəifdir, "farağat" komandası veriləndən sonra sırada tərpəniş və nizamsızlıq hiss olunur. Komandirlərin salamına sıradakılar çox süst cavab verirlər (86, v.11).

1919-cu ilin əvvəlində Zaqatala əlahiddə taboru ilə tanışlıqdan sonra Ə.Şıxlinski tə'lim-tərbiyənin gedişi barədə yazırdı ki, təşkil edilmiş tə'lim



komandası hazırlıq səviyyəsinə görə başqa bölmələrdən müsbət tərəfə fərqlənir. Zabitlər öz əsgərlərini yaxşı tanıdığı kimi əsgərlər də bütün zabitləri, onların rəhbərlərini, yaxşı tanıyırlar. Sırada tam intizam vardır. Əsgərlərin əllərinin vəziyyəti düz olmasa da, onların sıradakı duruşu normaldır. Dönmə hərəkətləri çevik və eyni vaxtda yerinə yetirilir. Silahla hərəkətlər aydın şəkildə həyata keçirilir. Sıraların yenidən düzülüşü yaxşıdır. Taktiki tə'limlərin keçirilməsinə ciddi əhəmiyyət verilir. Bu zaman şərti düşmən müəyyənləşdirilir, vəzifələr dəqiqləşdirilir və sonra onların icrasına başlanır. Zabitlər və əsgərlər atəş altında hərəkət, ərazinin xüsusiyyətlərindən istifadə etmək, səpələnmiş sıranı idarə etmək barədə lazımi təsəvvürlərə malikdirlər (89, v.60-61).

1919-cu ilin iyun ayında general-mayor Həbib bəy Səlimov Qarabağda yerləşən qoşun hissələrinin vəziyyəti, onlarda tə'lim-tərbiyənin gedişi ilə yaxından tanış olmuş və qənaətlərini əks etdirən müfəssəl bir hesabat hazırlamışdı. General Səlimov əvvəlcə 2-ci Qarabağ süvari polkunda olmuşdu. İyun ayının 4-də o, 1-ci, 2-ci və 4-cü bölüklərə, bir pulemyot komandasına baxış keçirdi. Birinci bölüyün komandiri kornet Kərimov, 2-ci bölüyünkü ştabs-rotmistr Yadigarov, 4-cü, bölüyünkü poruçik Sadıqov, pulemyot komandasının komandiri isə ştabs-rotmistr Çervinov idi. Baxış üçün çıxarılan bölmələrdə 150 nəfər var idi ki, onlardan da 40 nəfəri hissəyə aprelin 15-də gəlmiş yeni əsgərlər idi. 3-cü bölük və digər bölüklərin bir sıra süvariləri naryadda olduğundan onlar baxışa cəlb edilməmişdilər.

Baxış üçün düzülən sıralar salamlaşmaya, gur, aydın və gümrah cavab verirdilər. Süvarilərin görkəmi yaxşı tə'sir bağışlayırdı, baxmayaraq ki, generalın fikrincə bir sıra süvarilər at üzərində yaxşı oturuşa malik deyildilər. General Səlimovun şəxsi hey'ətin geyiminə də xüsusi bir iradı yox idi. Ancaq bir çox atların və yəhərlərin ümumi vəziyyəti onu razı salmadı. Yəhərlərin tə'miri və bərpası üçün hissədə e'malatxana olmadığı üçün general kənardan mülki mütəxəssislərin cəlb edilməsinə icazə verdi. Pulemyot komandasında topçu hissələrində işlədilən arabalardan istifadə olunurdu. Bu arabaların yaxşı qoşulması,atların yaxşı bərkidilməsi heç bir irad doğurmurdu (153, v.8).

Generalın əmri ilə əvvəlcə baxışa çıxarılan bütün bölmələrə təntənəli marşla meydandan keçmək işarəsi verildi. Ahəstə hərəkət zamanı süvarilər özlərinin kifayət qədər inamlı tutur, aralarındakı məsafəyə, sıraların düzlüyünə düzgün riayət edirdilər, lakin sür'ətli hərəkət zamanı sıranın düzlüyü pozulur və süvarilər bir-birinin hərəkətinə mane olurdular. Pulemyot komandasının şəxsi hey'ətinin hərəkətləri isə generalda çox yaxşı tə'əssürat yaratdı. Təntənəli marşdan sonra 2-ci bölükdə pulemyot komandası nümunəvi tə'lim keçirməli idi. Həmin tə'lim şeypurçuların işarəsi ilə başladı və bütünlükdə generalı qane etdi. Sonra bölüyün bir taqımına sırada səpələnmək əmri verdi. Taqımın süvarilərinin sırada səpələnməsinə

bölük komandiri Yadigarov özü rəhbərlik edirdi. Generalın fikrincə, sıranın səpələnməsini bir qədər də sür'ətlə icra etmək olardı.Taqım əvvəlcə bir cərgədə düzüldü və sonra da zəncir üzrə səpələnməni icra etdi. Səlimovun qeydlərinə görə taqımın atlardan düşüb cərgəyə düzülməsində də müəyyən ləngllik var idi. Onun bir iradı da bunda idi ki,süvarilər arazidən yaxşı istifadə edə bilmirlər, müəyyən edilmiş xətdə atəş mövqeləri seçsələr də hansı tərəfə atmalı olduqlarını bilmirdilər, çünki onlara hədəf göstərilməmişdi. Eyni zamanda komandir taqıma səpələnmək əmri versə də cinahlardan onun mühafizəsini təşkil etməmişdi. Pulemyot komandası isə böyük sür'ətlə müəyyən edilmiş mövqeləri tutdu, qısa müddət ərzində pulemyotları arabadan götürüb atəş mövqeyində yerləşdirdi. Lakin hədəf göstərilmədiyindən onlar da pulemyotu müxtəlif səmtə istiqamətləndirmişdilər. Pulemyotun komandasına atəşin hansı növünün açılması barədə də göstəriş verilməmişdi. General Səlimov onu da nəzərə alırdı ki, bölüklərin ən təcrübəli və hazırlıqlı əsgərləri Şuşa ətrafına döyüş mövqelərinə göndərilmişdi. Bütünlükdə o, alayın döyüş hazırlığından razı qaldı və bu barədə Hərbi Nazirliyin rəhbərliyinin adına yazdığı hesabatda mə'lumat verdi (153, v.8-9).

İyunun 5-6 da general Səlimov 1-ci Cavanşir piyada alayının Xankəndində olan bölmələrinə baxış keçirdi. Baxışa 5-ci, 6-ci və 7-ci bölüklər, tə'lim komandası, 2-ci və 3-cü pulemyot bölükləri və orkestr çıxarıldı. Sırada 25 zabit, 224 əsgər dayanmışdı.Baxışda iştirak edən 5-ci bölüyün komandiri ştabs-kapitan Klimentyev,6-cı bölüyün komandiri ştabs-kapitan Belozıqin, 7-ci bölüyünkü ştabs-kapitan Krivsov, tə'lim komandasının komandiri ştabs-kapitan Ratuşev idi. Pulemyot bölüklərinə polkovnik Tauren rəhbərlik edirdi (153, v.10).

Alayın komandiri polkovnik Sofiyevin verdiyi mə'lumata görə, döyüş hazırlığı xüsusi proqram üzrə keçirilirdi. Bu proqrama müvafiq olaraq tə'lim komandasına tədris üçün 12 həftə, bölüklərə isə 6 həftə ayrılmışdı. Baxış keçirilən gün tə'limin 4-cü həftəsi başa çatdırılmışdı. Baxışa çıxarılan bölmələrin ümumi görünüşü, sırada dayanışı, salamlaşmaya cavabı bütünlükdə general Səlimovda yaxşı təəssürat yaratdı.

5-ci və 6-cı bölüklərdə sıra və atəş hazırlığına baxış keçirildi.Əsgərlərin sırada dayanması, tək-tək və cərgə ilə hərəkətlər, addımlama, atəşə hazırlıq təmrinləri, sıranın səpələnməsi, habelə əsgərlər tərəfindən İntizam, Daxili, Qarnizon və Çöl Xidməti nizamnamələrindən zəruri olan biliklərə necə yiyələnmələri yoxlanıldı. 7-ci bölükdə isə gimnastika hərəkətləri nəzərdən keçirildi. General Səlimovun fikrincə, əsgərlər düzgün dayanmağı və dönmə hərəkətinin icrasını öyrənmişdilər, silahla edilən hərəkətlərin icrası qənaətbəxş idi. Bütün vəziyyətlərdə atəş mövqeyi tutmaq və tüfəngi döyüşə hazırlamaq ümumən yerinə yetirilirdi. Lakin əsgərlərin heç də hamısı nişangahı düzgün qurmur, tüfəngin doldurulmasını



və boşaldılmasını vaxtında icra etmirdilər. Bir sıra zabitlər və çavuşlar sıra hərəkətlərinin icrası zamanı türk nizamnamələrində olduğu kimi komanda verirdi. Komandalar çox zəif və süst verildiyi üçün onların icrası da əsgərlər tərəfindən süst həyata keçirilirdi. Burada zabitlərin və çavuşların təqsirkar olduğunu subut etmək üçün Səlimov özü sıralara komanda verib dediklərini əyani nümayiş etdirdi. (153,v.10).

Cərgənin seyrəlməsi, sıxlaşması, bir cərgədən iki cərgəyə keçid, seyrəlmiş və sıxlaşmış sırada düzülüşlər, hərəkətlər yaxşı icra edilsə də əsgərlərin addımları xırda idi, hərəkət taktını yalnız sol ayaqları ilə tuturdular. Ümumən bölüklərin sıra hazırlığı general Səlimovu razı saldı. Ancaq onların taktiki hazırlıq səviyyəsindən general heç də razı qalmadı. Onun hesabatından mə'lum olurdu ki, əsgərlər süngü döyüşünə, ümumiyyətlə, bələd deyillər. Döyüş mövqelərinə hərəkət zamanı əsgərlərin zəncir boyu səpələnməsi də düzgün icra edilmir və ümumiyyətlə, əsgərlər hərəkət zamanı zəncir boyu səpələnmiş sırada ərazinin xüsusiyyətlərindən lazımınca istifadə etməyi bacarmırdılar. Cəlimovun qeydlərinə görə, taktiki hazırlıq dərslərində əyanilikdən istifadə edilmirdi, əsgərlər əraziyə çıxarılmırdı və ona görə də ərazidə düzgün mövqe tutmaqda çətinlik çəkirdilər. Onun fikrincə, Nizami Piyada Xidməti Nizamnaməsinin 78-ci maddəsində əsgərlərin səpələnmiş sırada 12 bənddə izah edilmiş vəzifələri bir-bir əsgərə öyrədilməli və əyani göstərilməli idi. 7-ci bölükdə gimnastika hərəkətləri yaxşı yerinə yetirilirdi, nizamnamələrdən verilən suallara əsgərlərin cavabı qənaətbəxş idi. Səhra Nizamnaməsi üzrə biliklər isə tələb olunan səviyyədə deyildi. Bütünlüklə general Səlimov 1-ci Cavanşir piyada alayında da tə'lim-tərbiyənin təşkilinə ciddi və ardıcıl diqqət yetirildiyini və bu sahədə müəyyən irəliləyişlərin mövcud olduğunu qeyd edirdi (153, v.11-12)...

Döyüş hazırlığına ciddi diqqət yetirilməsinin nəticəsi idi ki, sentyabr ayında 1-ci Cavanşir alayında ümumi vəziyyət daha da yaxşılaşmışdı. Bölüklərdə taktiki tə'limlər keçirilirdi. Bu tə'limlərin uğurla keçirilməsi yaxın vaxtlarda bölüklərin qarşı-qarşıya taktiki tə'limlərinə, sonra isə taborların tə'limlərinin başlanmasına yaxşı zəmin yaratmışdı (162, v. 184).

Qoşunlarda tə'lim-tərbiyənin ümumi gedişi ilə tanış olandan sonra Ə.Şıxlınski əsgərlərin fərdi hazırlığına daha çox yer ayrılmasını xüsusilə məqsədəuyğun sayırdı. Onun fikrincə, əsgərin fərdi hazırlığı onun bütün tə'lim-tərbiyəsinin əsas tərkib hissəsini təşkil edirdi. Bu məsələ bütün nizamnamə tələblərinin əsgər tərəfindən vaxtında yerinə yetirilməsinə, onun hərəkətlərində çevikliyin aşılanmasına tə'sir göstərməklə bərabər, həm də döyüşçü kimi formalaşmasında tərbiyəvi əhəmiyyətə malik idi. Fərdi hazırlığın düzgün təşkili və onun ardıcıl aparılması hərbi xidmətin elə ilk günlərindən əsgərləri onlara verilən əmrlərin və göstərişlərin müstəqil şəkildə icra-edilməsinə alışdırırdı. Əksinə, fərdi hazırlıq tam keçiril-

mədən əsgərin ümumi sıraya salınması və ümumi komandaların icrasına məcbur edilməsi onda kütlə (sürü) xüsusiyyətlərinin möhkəmlənməsinə zəmin yaradırdı. Bu, onları döyüş tapşırığının icrası zamanı köməksiz bir vəziyyətə salırdı. Şıxlinski alay və diviziya komandirlərindən tələb edirdi ki, şəxsi hey'ətin tə'lim-tərbiyə prosesinin gedişini öz əllərində möhkəm saxlasınlar, bir sıra vacib elementləri nəzərdən qaçırmasınlar. O, təəssüflə qeyd edirdi ki, bə'zən hissə komandirlərinə hərb işinin əlifbasını öyrətmək ehtiyacı yaranır, halbuki, belə olmalı deyil (139, v. 135).

Hərbi Nazirliyin rəhbərliyi qış tə'lim mərhələsində tə'lim-tərbiyənin təşkilinə və həyata keçirilməsinə də belə yüksək tələblər irəli sürürdü. Yay tə'lim mərhələsində əldə edilmiş nəzərəçarpacaq irəliləyişlərin daha da möhkəmləndirilməsi, qoşun hissələrinin döyüşkənliyinin gücləndirilməsi başlanmış işin ardıcıl surətdə davam etdirilməsi, tə'lim-tərbiyə prosesini fəslin tələblərinə uyğun şəkildə qurulması və bu prosesə bir məqsədyönlülük gətirilməsi ilə bağlı idi. Yeni mərhələ üçün hissə və birləşmələrdə hazırlanan tə'lim-tərbiyə proqramının qarşısında məhz belə vəzifələr dayanırdı və bütün diqqət də bu vəzifələrin həyata keçirilməsinə istiqamətləndirilirdi.

2-ci piyada diviziyasının komandirinin qış tə'lim mərhələsində tə'lim-tərbiyənin təşkili ilə bağlı 27 noyabr 1919-cu il tarixli əmrində deyilirdi ki, diviziyanın alayları dərhal qış dərslərinin cədvəllərini hazırlasın, hava şəraiti imkan verdikcə dərslər açıq havada keçirilsin. Diviziya komandiri diqqəti ilk növbədə əsgərlərin fiziki hazırlığı üzərinə yönəldirdi, onların qol əzələlərinin və bütünlükdə bədənlərinin möhkəmləndirilməsi üçün vaxtaşırı gimnastika edilməsinin zəruri idman avadanlığının hazırlanmasının məqsədəuyğunluğunu vurğulayırdı. Onun qənaətinə görə, hər bir təmrinin icrasına başlamamışdan əvvəl bu hərəkətin mahiyyəti izah edilməli, dərs rəhbəri tərəfindən əyani nümayiş etdirilməli, sonra da əsgərlər tərəfindən icrası nail olunmalı idi. Boş vaxtlarda isə bölüklər arasında oyunların, müsabiqələrin keçirilməsi lazım bilinirdi. Bu vaxt buraxılan hər bir səhvin təmkinlə, sakitcə əsgərlərə başa salınması, onlarda icra etdikləri hərəkətlərə qarşı mə'suliyyət və meyl yaradılması diviziya komandirinin əmrində dərs rəhbərlərinə qarşı irəli sürülən tələb kimi təsbit edilmişdi. Dərs rəhbərlərindən tələb edilirdi ki, əsgərlərə əvvəlcə döyüş şəraiti, sonra isə sülh dövrü üçün zəruri olan vərdişlər və biliklər aşılansın. Gün ərzində dərslər 6 saat müddətində planlaşdırılsın və müəyyən müddətdən sonra gündəlik dərslərin müddəti 7 saata çatdırılsın. Dərs zamanı çox mə'lumatın verilməsi lazım bilinmirdi. Başlıcası o gözlənilməli idi ki, əgər verilən kiçik bilik əsgər tərəfindən mənimsənilibsə, şifahi cavab almadan həmin biliyin praktikada yoxlanmasına daha çox üstünlük verilsin. Əmrdə qeyd edilirdi ki, gənc əsgərlərin iki aylıq tə'limi başa çatdıqdan sonra tabor komandirləri bilikləri yoxlamalı və müvəffəqiyyətlə hazırlanmış əsgərlər



ümumi sıraya qatılmalı, müvəffəq olmayanlardan isə bölüklər və ya taborlar üzrə komandalar yaradılmalı və bu komandalarda davam etdiriləcək tə'limlərə rəhbərlik üçün taborların ən yaxşı zabitləri tə'yin olunmalıdırlar. Gənc əsgərlərin tə'limi başa çatdıqdan sonra onların bilik səviyyəsi alay komandirinin sədrliyi altında olan komissiya tərəfindən yoxlanılmalı idi (156, v.48).

Əmrdə tələb olunurdu ki, Səhra Nizamnaməsinin və səngər işinin öyrənilməsi praktiki olaraq ərazidə aparılsın. Bu iş əvvəlcə plan üzərində, bölüklərdə hazırlanmış qum yeşiklərinin üzərindəki hazırlıq dərsləri ilə başlanmalı və praktiki məşğələlərlə əldə edilən vərdişlərlə möhkəmləndirilməli idi (156, v.48).

Mə'lumdur ki, 1920-ci il martın 15-də növbəti kütləvi çağırış kompaniyasına başlanmalı idi. Bu çağırış zamanı xidmətə cəlb olunan gənclərin hissələrdə qarşılanması, yerləşdirilməsi, onların tə'lim-tərbiyəsinin təşkili ilə bağlı hərbi nazirin 1920-ci ilin fevral ayında imzaladığı 125 saylı müvafiq əmrində də döyüş hazırlığı məsələlərinə geniş yer ayrılmışdı. Döyüş hazırlığının təşkili ilə bağlı hərbi nazirin irəli sürdüyü tələblər tezliklə gənc əsgərlərə ən zəruri döyüş vərdişlərini aşılamalı və onları xidmətin bütün gərginliyini öz üzərinə götürməyə hazırlamalı idi. Nazirin xatırlanan əmrində döyüş hazırlığının təşkili ilə bağlı aşağıdakı bəndlər var idi:

Gənc əsgərlər hissələrdə mehribanlıqla qarşılanmalı idi ki, onlar tədricən xidməti çətinliklərə alışsın;

– Onlarla dərhal tə'limlərin keçirilməsinə başlansın, ancaq ilk vaxtlar onların dərslərdən yorulmasına yol verilməsin, dərslərin yükü tədricən artırılsın;

– Bölüklərdə gənc əsgərlər ərazi prinsipi üzrə bölüşdürülsünlər. Bu onlara boş vaxtlarında öz yerliləri ilə daha çox ünsiyyətdə olmağa imkan verər;

– Bütün bölüklərdə gənc əsgərlərlə işləmək üçün müəllimlər ayrılsın. Elə etmək lazımdır ki, hər 6-8 əsgərə bir müəllim tə'yin edilsin;

– Gənc əsgərlər bölüklərdə ayrıca qruplaşdırılsın və onlara rəhbərlik zabitlərə tapşırılsın;

– Bölük komandirləri kifayət qədər təcrübəyə malik olmadıqları üçün gənc əsgərlərə dərslərin keçirilməsi tabor komandirlərinin nəzarəti altında aparılsın;

– Gənc əsgərlərə rəhbərlik edəcək komandirlərin və zabitlərin hazırlıq səviyyəsinə diqqət yetirilsin. Bu zabitlər gənc əsgərlərin tə'liminə başlamazdan əvvəl özləri a) sülh dövründə əsas xidmət olan qarovul xidmətinin təşkilini, b) fərdi və cərgə tə'limini, v) döyüşçünün hazırlaşdırılmasını, q) atışa hazırlıq təmrinlərini və d) süngü döyüşünün əsaslarını yaxşı bilməlidirlər.

Nazir irəli sürülən tələblərin keyfiyyətli həllinin heç də asan olmadığını yaxşı bilirdi. Lakin qısa müddət ərzində həmin tələblərin həllinə

nail olmağın imkandan kənarda qalmadığına da əmin idi. Ona görə də o öz əmrini bu sözlərlə bitirirdi: "Yuxarıda göstərilənlər o vaxt asanlıqla əldə edilir ki, zabit özü düzlük və səmimiyyət nümunəsinə çevrilir. Əks təqdirdə biz heç vaxt lazımı nəticəni əldə edə bilməyəcəyik". (106, v.105).

Azərbaycan Ordusunun qoşun növlərinin təchizatında həm odlu, həm də soyuq silahlar var idi. Doğrudur, hərb işinin inkişafı ilə odlu silahlar qoşunlarda getdikcə özünə daha çox yer qazanırdı, ancaq soyuq silahlar da hələ aradan çıxmamışdı və əsas silah növlərindən biri sayılırdı. Bu silahların hər birinin özünün xarakterik xüsusiyyətləri və vəzifələri var idi. Əgər soyuq silahlar (qılınc, süngü) düşmənə müstəqimən zərbə vurmaq üçün nəzərdə tutulmuşdusa, odlu silahlar (müxtəlif qumbaralar, top, tüfəng, tapança), qeyri-müstəqim, müəyyən məsafədən zərbə vurmaq üçün nəzərdə tutulmuşdu. Onlar aşağıdakı digər xüsusiyyətlərə də malik idi;

- Odlu silah uzaq məsafədən tə'sir göstərirsə, soyuq silah yalnız müstəqim təmas zamanı tə'sirə malik olurdu;
- Odlu silahla fəaliyyət uzun müddət üçün; soyuq silahla isə qısa müddət üçün nəzərdə tutulurdu;
- Odlu silahın nəticəsi qeyri-qəti idisə, soyuq silahınkı qəti idi;
- Odlu silahın işlədilməsi üçün bacarıq lazım idisə, soyuq silah üçün fiziki hazırlıq və qorxmazlıq;
- Odlu silahın işlədilməsi üçün bir nöqtədə dayanmaq lazım idi, soyuq silahın işlədilməsi üçün isə hərəkət;
- Odlu silahın işlədilməsi üçün təmkin lazım idi, soyuq silah üçün isə canfəşanlıq;
- Odlu silahı atəş üçün hazırlamaq lazımdır, soyuq silah isə zərbə üçün həmişə hazır idi;
- Odlu silah üçün güllə, patron lazım idi, soyuq silah üçün yox;
- Odlu silah daim təkmilləşdirilir, soyuq silah isə buna az meyllidir;
- Odlu silah hücumu başlamaq üçün, soyuq silah isə onu sona çatdırmaq üçün istifadə edilirdi;

Soyuq silah başlıca olaraq süvari qoşun növünün işlətdiyi əsas silah növündən biri idi. Ona görə də topçu hissələri əgər piyadaların atəş zərbəsini gücləndirirdisə, süvarilər də onların soyuq zərbələrini gücləndirirdi. Yə'ni döyüş zamanı müxtəlif qoşun növlərinin zərbə tə'sirlərinin nizamlanmasına və qarşılıqlı əlaqələrinin yaradılmasına xüsusi diqqət yetirilirdi (89,33).

Piyada hissələrinin əsas silahı olan tüfənglər də həm atəş, həm də soyuq silahı özündə birləşdirirdi. Piyadaların bu çox işlətdiyi silaha qarşı irəli sürülən tələblərə görə onlar yüngül, dəqiq, sür'ətlə atan, uzağı vuran, dağıdıcı tə'sirə malik, sadə, möhkəm, düşmən silahından üstün olmalı idi. (89, v.40).

Həm odlu silahdan, həm də soyuq silahdan bacarıqlı istifadə vərdişlərinin aşılanması tə'lim-tərbiyənin başlıca tərkib hissəsi idi. Atəş və soyuq silah hazırlığı ümumi proqram çərçivəsində aparılsa da, bu sahənin öz xüsusiyyətləri var idi və onun aparılmasına ən yaxşı zabitlər rəhbərlik edirdilər. Bütünlükdə silah hazırlığı qoşunlarda silaha qulluq, silahın saxlanılması ilə paralel olaraq aparılırdı. Yuxarıda toxunulduğu kimi, Hərbi Nazirliyin rəhbərliyinin hissələrlə hər bir tanışlığında mövcud olan silahların saxlanılmasına, onlara necə qulluq edilməsinə də diqqət yetirilir və mövcud olan nöqsanların aradan qaldırılması üçün lazımi göstərişlər verilirdi.

Xüsusi olaraq silahların saxlanması vəziyyətini yoxlamaq üçün də hissələrdə yoxlamalar aparılırdı. Belə yoxlamalardan biri 1919-cu ilin aprel ayında keçirildi. Yoxlama 1-ci Tatar süvari alayının, 2-ci Bakı piyada alayını, 3-cü Gəncə piyada alayını, İstehkam məktəbini, Gəncə stansiyası komendantının komandasını, zirehli qatarı, Praporşiklər məktəbini, 1-ci yüngül topçu divizionunun əhatə edirdi. Yoxlamanı aparan komissiya hissələrdə bir sıra çatışmazlıqlar aşkara çıxarmış və bunu Hərbi Nazirliyin rəhbərliyinə çatdırmışdı. Hissələrdə ən müxtəlif silahlar, müxtəlif sistemli pulemyotlar mövcud idi. Komissiyanın qənaətinə görə bu yolverilməz idi. Piyada hissələrində üçxətli tüfəng və "Maksim" pulemyotu, süvari hissələrində isə üçxətli tüfəng və "Kolt" pulemyotu olmalı idi. (89, v.94-96).

Yuxarıda qeyd edildiyi kimi, atəş hazırlığı nəzəri hazırlıqdan başlayırdı. Əsgərlər silahla tanış edilir,onların istifadəsi qaydası, silahların sökülüb-yığılması göstərilirdi. Atəş üçün hazırlıq təmrinləri var idi. Bu təmrinlər də icra edildikdən sonra əskərlərə tə'lim atışı keçirilirdi. Eyni hərəkətlər pulemyotlar üzərində icra edilirdi. Pulemyotun material-texniki hissələrini öyrənmək, atəş xüsusiyyətlərini mənimsəmək üçün xüsusi tə'lim qurğulardan da istifadə edilirdi. Döyüşdə güclü zərbə qüdrətinə malik olan pulemyotun tədrisi zamanı əskərlər aşağıdakıları bilməli idilər: 1) pulemyotun material hissəsini, 2) pulemyotun və onun qıfılının sökülüb yığılmasını, 3) pulemyotun atəşə hazırlanması, 4) pulemyotun detallarının qarşılıqlı əlaqəsini, 5) atışda dayanma baş verməsini və onun aradan qaldırılmasını, 6) ikiatlı pulemyot arabalarının qoşulması və hərəkətə hazırlanmasını, 7) pulemyotun yüklənməsi qaydalarını, 8) patronların yüklənməsini, nişanalma, məsafənin gözlə tə'yini, atışla məsafənin tə'yini (88, v. 18).

Atış hazırlığının həyata keçirilməsi üçün atış meydanları təchiz edilmişdi. Ərkani-hərb rəisi Sulkeviç 1919-cu ilin may ayında Gəncə, Xankəndi, Nuxa, Qazax, Zaqatala, Qusar və Bakı qarnizonlarının rəislərindən tələb edirdi ki, atış meydanları üçün münasib yer seçib onu təchiz etsinlər. Bunun üçün lazım olan maliyyə vəsaiti də ayrılmışdı (142, v.19,63). Bakı qarnizonu üçün atış meydanı Qurd qapısında yaradılmışdı.

1919-cu ilin may ayında Hərbi Nazirlik tə'lim atıcılığının kursunu hazırladı və hərbi nazirin 27 may 1919-cu il tarixli 271 saylı əmri ilə bu kurs bütün qoşunlara e'lan edildi. Kurs həm piyadalar, həm də süvarilər üçün nəzərdə tutulmuşdu. Nazirliyin əmrində tələb olunurdu ki, hissələr dərhal tə'lim atıcılığına başlasınlar. Həmin əmrlə nazir eyni zamanda qarnizonların rəislərindən tələb edirdi ki, atış meydanlarının təchizi qurtar-

mayıbsa bu iş dərhal başa çatdırılsın və atışların başlanması barədə teleqrafla mə'lumat verilsin (89,v.150).

Atış kurslarının hazırlanması və onun həyata keçirilməsinə rəhbərlik üçün Hərbi Nazirlik tərəfindən xüsusi komissiya yaradılmışdı. Komissiyaya Ərkanı-hərbin rəisi Sulkeviç sədrlik edirdi (134, v.228).

1919-cu ildə Azərbaycan Ordusunun piyada və süvari hissələrində tə'lim atışı kursunun həyata keçirilməsi üçün metodiki göstəriş də hazırlanmışdı. Bu göstərişdə bildirilirdi ki, indiyə kimi bir sıra hissələr atışa hazırlıq təmrinləri üçün heç bir vəsaitəyə malik deyildilər. Nəticədə də bölük və bölmələrdə əsgərlər nəinki düzgün nişanlama qaydalarını, atəşdən doğan və ya tüfəngin özü ilə bağlı olan qeyri dəqiqliyin meydana gəlməsi səbəblərini öyrənməmişlər, hətta bütün vəziyyətlərdə qundağın düzgün dayaqlandırılması, silahın doldurulması, nişangahın qurulması, tətiyin düzgün çəkilməsi qaydalarını da lazımınca mənimsəməmişlər. Ona görə də atışın dərhal döyüş patronları ilə başlanması doğru deyil (134, v.228)

Bütün bu deyilənlər, habelə hissələrdə atəş hazırlığı üzrə təcrübəli zabitlərin azlığı və atış meydanlarının tələb olunan səviyyədə təchiz edilməməsi üzündən 1919-cu il üçün tə'lim atışı kursu böyük ixtisarla tərtib edilmişdi. Kurs iki hissədən ibarət idi: 1) ilkin fərdi atış təmrinləri və 2) fərdi hazırlıq atışı təmrinləri.

| Sıra №-si | məsafə (addım) | nişangah | Atış hədəfi | atıcının vəziyyəti | Təmrinin icra edilməsi şəraiti | patronların sayı |
|---|---|---|---|---|---|---|
| 1. | 200 | 11 | Qurşaq hədəfi. 30x36 verşok ölçüsündə olan şitin ortasından | uzanmış vəziyyətdə | Qeyri-müəyyən vaxt ərzində. Hər atışdan sonra nəticə nümayiş etdirilir | 4 |
| 2. | 200 | 11 | Döş hədəfi. 20x20 verşok ölçüdə olan şitin ortasından | "-----" | "------" | 4 |
| 3. | 200 | 11 | Baş hədəfi. 20x20 verşok ölçüdə olan şitin ortasından | "-----" | "------" | 4 |

**1919-cu ildə Azərbaycan Ordusunun piyada və süvari hissələrində ilkin fərdi atış təmrinləri kursu (134, v.8).**



İlkin fərdi atış təmrinlərinin aparılmasında məqsəd əsgərin döyüş patronları ilə atəşə öyrənilməsi və hədəfin vurulmasına nail olması idi.

| Sıra №-si | məsafə (addım) | nişangah | atıcının vəziyyəti | Hədəf | Təmrinin icra şəraiti | patronların s. | silahın doldurulması üsulu |
|---|---|---|---|---|---|---|---|
| 1 | 200 | 11 | uzanmış | Döş hədəfi | Qeyri-müəyyən vaxt ərzində | 5 | patrondaş darağından |
| 2 | 300 | 11 | ayaq üstə | Qurşaq hədəfi | "------" | 5 | "-----" |
| 3 | 300 | 11 | uzanmış | Baş hədəfi | "-----" | 5 | "----" |
| 4 | 500 | 11 | "-----" | üç döş hədəfi | "-----" | 5 | "-----" |
| 5 | 800 | | "---" | üç yanaşı qurşaq hədəfi | "----" | 5 | "----" |
| 6 | 400 | 11 | "----" | peyda olan qurşaq hədəfi | Hər atışa 10 saniyə | 5 | "----" |
| 7 | 400 | 11 | "-----" | peyda olan döş hədəfi | "-----" | 5 | "-----" |
| 8 | 500 | 11 | "-----" | Döş hədəfinin peyda olması ilə yox olan qurşaq hədəfi | Əvvəlcə 1 dəqiqə müddətində qurşaq hədəfinə 3 patron, sonra 1 dəqiqə ərzində döş hədəfinə 3 patron | 6 | "-----" |
| 9 | 600 | | səngərdə diz üstündən | üç yanaşı döş hədəfi | 500 metr məsafəyə qaçandan sonra qeyri-müəyyən vaxt ərzində | 5 | "----" |
| 10 | 80 | | səngərdə ayaq üstü | üç yanaşı döş hədəfi | 50 metr məsafəyə qaçandan sonra qeyri-müəyyən vaxt ərzində | 5 | "----" |

**Fərdi hazırlıq atəşləri təmrinləri kursu (134, v.228)**

İlk vaxtlar əsgərlərin hədəfi vura bilməsi və bununla da özünə və tüfəngin döyüş keyfiyyətlərinə inam yaranması üçün ilkin fərdi atəşin yaxın məsafəyə, 200 addımlıqda olan hədəflər üzərində keçirilməsi, sonra isə hədəflərin tədricən kiçildilməsi məsləhət bilinirdi (134, v.228).

Fərdi hazırlıq atəşlərinin keçirilməsində əsas məqsəd isə döyüşçüyə müstəqil surətdə dəqiq və sür'ətli ata bilmək vərdişlərinin aşılanması idi. Hərbi Nazirlik tərəfindən hazırlanmış metodiki göstərişdə bildirilirdi ki, dünya müharibəsinin təcrübəsi səngərdən atış vərdişlərinin öyrənilməsinin zəruri-

lıyini təsdiqləyir. Ona görə də fərdi hazırlıq atışları kursuna səngərdən 600 və 800 metrlik məsafələrdən atış təmrinləri də salınmışdı (161, v.229).

1919-cu ilin iyun ayında 1-ci Cavanşir piyada alayında bir sıra atış təmrinləri keçirləndən sonra mə'lum olmuşdu ki, tüfənglərin çoxunda atəş zamanı güllələr hədəfə düz dəymir, hədəfdən yayınır. Güllələrin hədəfdən belə yayınma halları silahların lülələrinin çox işlədilməsindən və lülədaxili aşınmadan irəli gəldiyi üçün tə'cili tə'mir və bərpa işlərinin aparılması lazım idi. Bundan başqa tüfənglərin təxminən yarısının arpacıqlarının dəyişdirilməsi ehtiyacı yaranmışdı. Onların lazımi normalara cavab verməməsi atəşin dəqiqliyinə tə'sir göstərirdi. Ona görə də hissə komandanlığı atəş hazırlığının lazımi səviyyədə aparılması üçün Topçu İdarəsinin cəbbəxanalarından təchizat detallarının ayrılmasını vacib sayırdı (161, v.12).

1919-cu ilin iyun ayında general-mayor H.Səlimov 1-ci Cavanşir piyada alayında təftiş yoxlaması apararkən hissənin atəş hazırlığına da diqqət yetirmişdi. Mə'lum olmuşdu ki, əsgərlər silahların sökülüb yığılmasını bacarsalar da, onun hissələrinin vəzifələrini və onlardan istifadəni hələ bılmirilər. Bölüklərdə nişangah qurğuları üzərində çox az məşğələ keçirilmişdi. Ona görə də əsgərlər nişangahın vəzifəsinə, silahın dəqiq atəş açmamasının mahiyyətinə bələd deyildilər. Zabitlər bunu nişangah qurğularının azlığı ilə izah etsələr də general Səlimov bildirirdi ki, tə'lim məşğələlərini heç olmasa qum kisələrinin üzərində aparmaq olardı. Əsgərlər süngü döyüşünə də bələd deyildilər (153, v.11).

Pulemyot bölüklərində də general Səlimov oxşar mənzərənin şahidi olmuşdu. Piyada bölükləri ilə müqayisədə daha zəif hazırlığa malik olan pulemyot bölüyünün şəxsi hey'əti də pulemyotu söküb yığa bilmir, nişangahı qurmağı, güllələrin yayılmasının qarşısını alan mexanizminin işlədilməsini, doqiq və təqribı nişanalmanın icra edilməsini bacarmırdılar (153, v. 11).

General Səlimov təftiş yoxlamasının nəticələri ilə bağlı hesabatında bütünlükdə bu hissədə də vəziyyətin yaxşılaşdırılması istiqamətində nəzərəçarpacaq işlər görüldüyünü və bunun davam etdirildiyini qeyd edirdi. Heç şübhəsiz ki, alayın komandanlığı atəş hazırlığı sahəsində mövcud olan nöqsanların aradan qaldırılması üçün zəruri olan tədbirləri həyata keçirirdi. Nəticədə artıq həmin ilin sentyabr ayında alayın Şuşada olan 1-ci taboru fərdi döyüş atışının 5-ci təmrininin icrasını başa çatdırmışdı (162, v.184).

Süvari diviziyasının komandiri general Novruzov 1919-cu ilin sentyabrında 1-ci Tatar süvari alayına baxış keçirərkən atəş hazırlığının vəziyyəti ilə tanış oldu. O bu tanışlığın nəticələri ilə bağlı imzaladığı əmrində bildirirdi ki, atəş tə'limi çox zəifdir, döyüş mövqelərinə hərəkət zamanı əsgərlərin zəncir boyu səpələnməsi çox süst şəkildə icra edilirdi. Manqalar arasında sərhəd bilinmirdi, çavuşlar arxada mövqe tutmaqdansa əsgərlərlə bir sırada dayanırdılar. Ərazinin xüsusiyyətlərindən atəş mövqeyinin seçilməsi üçün istifadə edilmirdi (162, v.192).



Atəş hazırlığında mövcud olan nöqsanların aradan qaldırılması üçün 2-ci piyada diviziyasının komandiri qış tə'lim mərhələsinə hazırlıqla bağlı 1919-cu il noyabr ayının 27-də imzaladığı əmrində hissə komandirləri qarşısında aşağıdakı vəzifələri qoyurdu: silahların qorunması, qulluq edilməsi, sökülüb yığılması üçün bölükdə xüsusi hazırlığa malik bir çavuş və ya əsgər olmalıdır. Bu şəxslər atəş hazırlığı üzrə dərs apararkən bölüyün siyahısı üzrə əsgərləri iki-iki çağırmalı, tüfəngin detallarını onlara göstərməli və nədən ötrü olduğunu başa salmalıdır. Hədəfi nişanalma, nişangahın qurulması, tüfəngin tuşlanması, tətiyin çəkilməsi qaydası əsgərlərə hər gün proqramda hansı dərslərin nəzərdə tutulmasından asılı olmayaraq öyrədilməlidir. Hər bir hissədə nişangah qurğuları olmalıdır. Diviziya komandirləri tələb edirdi ki, dərhal belə qurğular əldə edilsin, tuşlanma təmrinləri üçün lazım olan qum dolu kisələr gətirilsin. Bu işləri alaylar öz qüvvələri daxilində də görə bilərdilər. Eyni zamanda alayların silah e'malatxanasında tə'lim patronlarının hazırlanmasının təşkili məqsədəuyğun sayılırdı. Əmrə görə hər bir əsgər üçün ən azı bir daraq tə'lim patronunun hazırlanması lazım idi (156, v.48).

Hissələrin formalaşmasının və tə'lim-tərbiyəsinin bir sıra məsələləri kimi atəş hazırlığının vəziyyəti, atəş təmrinlərinin icrası barədə vaxtaşırı Hərbi Nazirliyə mə'lumat verilirdi. Müəyyən məxfilik doğuran bir sıra belə mə'lumatlar bə'zən adi teleqramlarla nazirliyə ötürülürdü və surəti nazirliyə göndərilən daxili əmrlərdə bə'zən məxfi mə'lumatlar açıqlanırdı. Hərbi nazir birləşmə və hissə komandirlərindən döyüş hazırlığı səviyyəsinin qorunmasının vacib elementi kimi bu məsələyə ciddi diqqət yetirilməsini tələb edirdi (94, v.7).

Məxfi yazışmaların aparılması üçün nazirlik tərəfindən xüsusi bir tə'limat da hazırlanmışdı. Həmin tə'limata görə aşağıdakı sənədlər məxfi yazışmaya aid idi və onların işlənməsində və göndərilməsində zəruri tələblərə riayət olunmalı idi:

– əməliyyat-səfərbərlik mə'lumatlarının (istər əməliyyat planı, istərsə də səfərbərlik cədvəli olsun ) şifrləri, yeni hissələrin yaranması, onların cəmlənmə məntəqələri, döyüş hazırlığı səviyyəsi, şəxsi hey'ətin və atların sayı, hərbi xarakterli obyektlərin yerləşməsi, hissələrin komplektləşdirilməsi, istehkam rayonlarının planı və sxemləri, onların silah və təchizatı və kəşfiyyat işlərinin nəticələri barəsində mə'lumatları, smeta-hesabatları özündə əks etdirən sənədlər;

– şifrlənmiş teleqramların mətnləri;

– mükafatlandırma və ya yüksək vəzifələrə tə'yinat məqsədi ilə hazırlanmış təqdimatlar;

– zabit cəmiyyəti məhkəmələrinin kargüzarlığı üzrə yazışmalar;

– hərbi qulluqçuların dövlət və siyasi cinayətləri haqqında yazışmalar;

-imza edən şəxsin mülahizəsinə görə məxfi saxlanılması vacib olan mə'lumatları özündə əks etdirən sənədlər (153, v. 147)

Hərbi Nazirlik üzrə sənədlər öz məxfilik dərəcəsinə görə üç kateqoriyaya bölünmüşdü. Birinci kateqoriya "şəxsən özünə" qrifi ilə fərqləndirilirdi. Bu kateqoriyadan olan yazışmalar şəxsən ünvanlandığı şəxsə təqdim edilməli və həmin sənədin məzmunu da yalnız həmin şəxsə bəlli olmalı idi.

İkinci kateqoriyaya aid olan sənədlər "məxfi" adlanırdı. Bura o yazışmalar daxil idi ki, onlar aidiyyatı olmayan şəxslər üçün məxfi qalmalı idi. Üçüncü kateqoriyaya aid olan sənədlər isə "e'lan edilməməli" qrifi ilə işarələnərdi. Bu kateqoriyaya daxil olan yazışmalar məxfi sayılmırdı, lakin onların geniş kontingent üçün bəlli olması məqsədəuyğun bilinmirdi (153, v. 147).

Qoşunların döyüş hazırlığının yüksək səviyyədə saxlanılması üçün Hərbi Nazirliyin rəhbərliyi kəşfiyyat işinin təşkilini, qoşunların xidməti ilə bağlı olacaq mə'lumatların toplanmasını və onların vaxtında öyrənilməsini də diqqətdən kənarda qoymurdu. Ərkani-hərbin rəisi qarnizon rəislərindən tələb edirdi ki, əldə etdikləri bütün informasiyaları dərhal nazirliyə göndərsinlər. O, bildirirdi ki, mə'lumatların vaxtında lazımi orqanlara çatdırılması böyük əhəmiyyətə malikdir. Onlardan yalnız vaxtında çatdırıldıqda maksimum istifadə etmək olar. Vəziyyətin hər an dəyişə biləcəyi bir vaxtda mühüm əhəmiyyət kəsb edən mə'lumatların ləngidilməsi və onların lazımi orqanlara ötürülməsinin gecikdirilməsi malik olduğu qiyməti tamamilə itirir (133, v. 5).

Hərbi hissələrin özündə də kəşfiyyat işi təşkil edilir və ehtimal olunan təhlükə barədə ətraflı mə'lumatların toplanması üçün iş aparılırdı. Ərkani-hərbin rəisi general-leytenant Sulkeviç öz əmrlərinin birində 1-ci Cavanşir piyada alayının praporşiki Qaraşarova verilən tapşırıq üzrə ətraflı mə'lumat toplayıb çatdırdığına görə öz təşəkkürünü bildirirdi (130, v. 7).

Kəşfiyyat işləri təkcə respublikanın daxilində deyil, həm də respublikadan kənarda təşkil olunmuş və agentura yaradılmışdı. Bu agenturanın saxlanılması üçün Hərbi Nazirliyin smetasında xüsusi maddə də nəzərdə tutulmuşdu (bax: 149,v.21).

Hərbi Nazirliyin rəhbərliyi Petrovsk, Dərbənd, Temir xan Şura, Qroznı, Vladiqafqaz, Taqanroq, Batum, İrəvan, Qars, Dilican, Rəşt, Krasnovodsk, Tiflis, Astarxan şəhərlərində 14 rezidentin saxlanmasını planlaşdırırdı. Bu rezidentlər başlıca olaraq Denikin qoşunlarının erməni ordusunun fəaliyyəti və planları barədə daha dürüst mə'lumatların toplanması üçün tə'yin edilməli idilər (149, v. 21).

Hərbi Nazirliyin rəhbərliyi hökumət orqanlarına göndərdiyi təqdimatında bildirirdi ki, adları çəkilən rezidentlərdən başqa xüsusi tapşırıqların icrasını öz üzərinə götürə biləcək kəşfiyyatçıların fəaliyyətinin maliyyələşdirilməsi də zəruridir. Böyük risq tələb edən tapşırıqları yerinə yetirəcək agentlərə yüksək məbləğdə ödəncin verilməsi planlaşdırılırdı. Xüsusi tapşırıqları icra edəcək kəşfiyyatçıların biri Ermənistanda, biri Gürcüstanda, biri İranla Türküstanda, ikisi Denikin ordusunun tərkibində fəaliyyət göstərməli və iki nəfər də ehtiyatda saxlanılmalı idi (149, v. 21).



Hərbi xərclərin əsaslandırılması üçün hazırlanmış smeta hesablamalarında göstərilirdi ki, hər bir rezidentlə əlaqə saxlayacaq bir rabitəçi də maliyyələşdirilməlidir. Bu rabitəçilər rezidentlərə lazımi tapşırıqları çatdırmalı və eyni zamanda onların toplamış olduğu mə'lumatları əldə edib mərkəzə çatdırmalı idilər (149, v. 46).

İstər erməni qoşunlarının, istərsə də Denikin qoşunlarının fəaliyyəti və planları barədə mə'lumat toplamaq üçün təşkil edilən kəşfiyyat kifayət qədər səmərəli işləyirdi. Bunun nəticəsi idi ki, Azərbaycanın istiqlaliyyəti üçün təhlükə törədən qüvvələrin hərəkətləri və niyyətləri barədə Hərbi Nazirliyin əlində lazımi mə'lumatlar toplanırdı. Bu da vaxtında lazımi tədbirlərin planlaşdırılmasına və həyata keçirilməsinə zəmin yaradırdı.

Respublikanın, o cümlədən Azərbaycan Ordusunun daxilində işləyən casusların ifşa edilməsi istiqamətində də kəşfiyyat orqanları öz sə'ylərini göstərməyə çalışırdılar. Bunun nəticəsi idi ki, 1919-cu ilin mart ayında Gəncədə Denikin ordusunun və Ermənistanın xeyrinə fəaliyyət göstərən agent Smıslova ifşa edilmişdi. Aparılan təhqiqat işlərindən sonra mə'lum olmuşdu ki, Smıslova Azərbaycanda tək işləmir. Tanışı Nella Fyodorovna Çernışova və onun ordu qərargahında işləyən əri Stanislav Rudolfoviç Zuber də Denikin ordusunun və Ermənistanın xeyrinə mə'lumatlar toplayırmışlar (123, v. 8).

Bütün bu görülən işlər qoşunların döyüş hazırlığının ümumi səviyyəsində də öz əksini tapır və hərbi hissələrin döyüşkən qüvvəyə çevrilməsinə zəmin yaradırdı.

## *2.ŞƏXSİ HEY'ƏTİN MƏ'NƏVİ TƏRBİYƏSİ MƏSƏLƏLƏRİ*

Qoşunların tə'lim və tərbiyəsinin əsas istiqamətlərindən biri də şəxsi hey'ətin mə'nəvi tərbiyəsi, zabit və əsgərlərin dünyagörüşlərinin genişləndirilməsi, xidməti borca şüurlu münasibət bəsləyən sədaqətli döyüşçü, bütöv şəxsiyyət və yetkin Azərbaycan vətəndaşı formalaşdırılmacı idi. Bu məsələ bütün tə'lim-tərbiyə prosesinin fövqündə dayanırdı və ordu quruculuğunda onun yeri kifayət qədər reallıqla qiymətləndirilirdi. Uzun illər boyu hərbi xidmətdən yadırğamış olan xalqın övladlarını ordu quruculuğu prosesinin gərginliklərinə, ağırlıqlarına alışdırmaq, onlara yeni dəyərlər aşılamaq, yaradıcı xidmətə ruhlandırmaq, mübarizlik, vətənpərvərlik göstərilməsinə həvəsləndirmək bütün səviyyələrdən olan komandirlərin diqqətdən bir an da olsa qaçırmadığı fəaliyyət sahəsi idi. Azərbaycan Ordusu sıralarında şərəfli xidmət yolu keçmiş olan general-mayor Qaytabaşının yaddaş dəftərində olan qeydlərə görə düzgün və dəqiq qurulmuş olan bu fəaliyyət sahəsi son nəhayətdə döyüşçüdə aşağıdakı keyfiyyətləri formalaşdırmalı

idi: 1) fədakarlıq səviyyəsinə çatdırılmış olan borc hissələri və ya yoldaşının xilası üçün özünü qurban verməyə hazır ola bilməsi; 2) qorxmazlıq və təşəbbüskarlıq; 3)bütün rəislərə sonsuz tabeçilik; 4) hərbi şəraitdə bütün ağırlıq və çətinliklərə sinə gərmək (124, v.35).

Hərbi Nazirliyin rəhbərliyi şübhə etmirdi ki, ordunun vahid bir orqanizm şəklində birləşdirilməsinin başlıca zəmini müstəqil Azərbaycan Ordusunda xidmət edən hər bir hərbi qulluqçuda xidməti borca şüurlu münasibət yaradılmasıdır. Vətən və xalq qarşısında şəxsi mə'suliyyətin vətəndaş mövqelərindən dərk edilməsidir. Ordu quruculuğu prosesinin izlənilməsi göstərir ki, digər sahələrdə olduğu kimi bu istiqamətdə də xeyli çətinlik və problemlər mövcud idi. Lakin ardıcıl olaraq aparılan məqsədyönlü iş vaxt ötdükcə Azərbaycan döyüşçüsünün xarakterini bütövləşdirir, orduda sağlam əhval-ruhiyyə formalaşdırırdı.

Qoşunların şəxsi hey'ətinin mə'nəvi tərbiyəsində tələbkarlıqla qayğı və eyni zamanda əsaslandırılmış və məqsədyönlü iş üzvü vəhdət təşkil etmişdi. Eyni zamanda bu məsələ ayrıca təcrid olunmuş şəkildə deyil, bütün tə'lim-tərbiyə prosesinin ümumi axarında həll edilirdi. Hərbi qulluqçunun şəxsiyyətinə hörmət ona e'timad, inam və ümid bütün görülən işlərin mərkəzində dayanırdı.

Hərbi Nazirliyin rəhbərliyi qoşun hissələrinin şəxsi hey'ətinin mə'nəvi tərbiyəsini hər şeydən əvvəl xalqın milli-mə'nəvi dəyərləri üzərində aparılmasını zəruri sayırdı. Nazirliyin rəhbərliyində, hissə və birləşmələrin komandanlığında olan yüksək rütbəli zabitlərin hamısının bir hərbçi kimi Çar Rusiyası ordusunda tamam fərqli olan milli-mə'nəvi me'yarlar çərçivəsində yetişmələrinə baxmayaraq, Azərbaycanın milli dəyərlərinə olan münasibəti qürur mənbəyi, vətənpərvərliyin bariz nümünəsi idi.Bununla bağlı əvvəlki fəsillərdə artıq bir sıra məqamlara toxunulmuşdur. Əsgərlərin məişətinin təşkilinin milli zəminlər üzərində qurulması, xidmət nizamnamələrinə milli elementlərin daxil edilməsi, hərbi cimvolların milli planda tərtib edilməsi və s. bir sıra məsələlər milli-mə'nəvi dəyərlərə münasibətin ifadəsi idi.Azərbaycan döyüşçüsünün mə'nəvi dünyasının yaradılmasında mənsub olduğu xalqın tarixi keçmişinin öyrənilməsinə, onun qəhrəmanlıq nümunələri üzərində tərbiyələndirilməsinə böyük diqqət yetirilirdi. Bu baxımdan hərbi nazir S.Mehmandarovun bu günümüz üçün də öz aktuallığını itirməyən çox qiymətli fikirləri qorunub saxlanmaqdadır. Həmin fikirlərin mahiyyəti bundan ibarətdir ki, Azərbaycanın qəhrəmanlıq tarixi həm araşdırılmalı həm də xalq kütlələrinə, o cümlədən qoşunların şəxsi hey'ətinə çatdırılmalıdır. S.Mehmandarov şübhə etmirdi ki, yalnız azərbaycanlılardan təşkil edilmiş olan hərbi qüvvələr öz xalqının qəhrəmanlıq tarixini yaxşı bilməli, ondan ibrət götürməlidir. Hərbi nazir bu istiqamətdə aparılan işlərdə ifratçılığa varmağa, milli tərbiyəni millətçiliyin qızışdırılması ilə bir səviyyədə tutulmasına heç cürə razı



deyildi. O milli tarixi keçmişin öyrənilməsində yalnız sağlam hisslərin aşılanmasını və mütərəqqi xəttin izlənilməsini əsas sayırdı: " Bolşevizmə qarşı mübarizənin istiqamətlərindən biri xalq içərisində sağlam milli hisslərin yaradılmasıdır. Azərbaycanın yaranmaqda olan gənc ordusu üçün bu xüsusilə lazımdır. Yalnız azərbaycanlılardan təşkil olunmuş hərbi qüvvələrimiz öz xalqının ümumdünya tarixinin səhifələrinə yazmış olduğu və bizdən daha çox Avropa xalqlarının xatırlayıb danışdıqları çoxlu igidlikləri, şərəfli döyüş keçmişini bilməlidirlər. Bir əsrdən də artıq rus ağalığından xilas olmuş türk xalqı bilməlidir ki, biz heç də həmişə əsarətdə olmamışıq, həm də öz iradəmizi Avropa və Asiyaya nümayiş etdirmişik. Güman edirəm türk tarixinin bilicilərindən kimsə xalqımızın müxtəsər tarixini və bu günümüzə qədər olan ən mühüm hadisələri əks etdirən kütləvi kitabçaların tərtib və nəşr edilməsinin tapşırılması faydalı olardı. Sadə xəritələrin əlavə edilməsi də yaxşı olardı. Burada bizim tarixi qəhrəmanlığımız və yad hakimiyyətlər altında olduğumuz vaxt çəkdiyimiz iztirablar güzgüdə olduğu kimi öz əksini tapmalıdır. Onların ifadə tərzi obyektiv və təmkinli olmalıdır ki, millətçilik barədə təsəvvür yox, bəlkə əsrlik yuxudan oyanan millətdə sağlam milli hisslər yaratsın.

Bizim bir sıra müsəlman mütəfəkkirlərin meyl etdiyi ifrat sosial-tə'limlər müsəlman xalq kütlələrindən yüksək mədəni inkişaf tələb edir. Onların qaranlıq, nadan kütlələrlə calaşdırılması bütün Avropa Rusiyasının mə'ruz qaldığı anarxiya və terrora yol aça bilər. Biz müsəlmanlar şüurlu həyata və milli yaradıcılığa yenicə qədəm qoymuşuq. İnternasional ideyaları hələlik bizdən çox uzaqdır. Bax buna görə də bizim ziyalılarımızın ən mühüm vəzifələrindən biri xalqı və ordunu onun tarixi keçmişi ilə tanış etməkdir. Bu bizim internasional sə'ylərimizin əsassızlığını, xalqda milli hisslərin və türk irqinə mənsubluqdan qürur keçirməyin inkişaf etdirilməsi üçün yaxşı sübut olardı. Belə kütləvi tarixi nəşrlər xalq arasında və qoşunlarda geniş yayılmalı və bunun üçün hər bir kənd müəllimi, hər bir müsəlman zabit ondan geniş istifadə etməlidir.

Gələcəkdə ümumxalq qərarı və hökumətin köməyi ilə türk xalqının böyük xadimləri və rəhbərləri müvafiq abidələr qoyulmaqla əbədiləşdirilməlidirlər" (70, v. 2-3).

Çıxışlarının birinə S.Mehmandarov hərb tarixinin öyrənilməsinin zəruriliyi barədə öz fikirlərini belə davam etdirirdi:" ... hərb tarixinin öyrənilməsi əqli dünya görüşünü genişləndirir, tənqidi mühakiməni, diribaşlıq və zirəkliyi inkişaf etdirir. Hərb tarixini öyrənməklə siz ovucunuzun içində olduğu kimi bu və digər tərəfin bütün səhvlərini, nəyi etməyin lazım gəlmədiyini və necə hərəkət lazım olduğunu görürsünüz, hərb tarixini öyrənməklə siz ən çətin vəziyyətdən baş çıxarmaq və müvafiq qərarı çıxarmaq vərdişləri əldə edirsiniz; Hərb tarixini öyrənməklə döyüş zamanı qoşunlara çox baha başa gələn səhvlərin buraxılmasından özünüzü müəyyən qə-

dər qorumuş olursunuz. Güman edirəm ki, deyilənlər hərb tarixinin öyrənilməsinin əhəmiyyətini başa düşməyə kifayətdir. Bunun üçün də mən belə hesab edirəm ki, hərb tarixi hər bir hərbi adam üçün stolüstü kitaba çevrilməlidər. Onu öyrənməklə siz heç şübhəsiz ki, özünüzü həsr etdiyiniz yolda uğurlar qazanacaqsınız" (181, s.76).

Yuxarıda qeyd edilmişdi ki, istiqlaliyyət əldə edildikdən sonra Azərbaycan hökuməti Azərbaycan dilini respublikanın dövlət dili e'lan etmişdi. Azərbaycan dili ordunun da dövlət dili e'lan edilmişdi və bu faktın özü də Azərbaycan əsgərlərində milli hisslərin inkişafına kömək edəcək bir amil kimi qiymətləndirilirdi. Komandaların milli dildə verilməsi, dərslərin milli dildə aparılması əsgərlərdə xidmətə qarşı bir bağlılıq yaradırdı. Artıq mə'lumdur ki, Hərbi Nazirliyin rəhbərliyi hətta rus və gürcü zabitlərinin qarşısında da belə tələb qoymuşdu ki, bir ay müddətində bütün komanda sözlərinin azərbaycanca qarşılığını öyrənsinlər və şəxsi hey'ətə Azərbaycan dilində komanda versinlər. Əks təqdirdə onlar xidmətdən uzaqlaşdırılmalı idilər.

Hərbi nazir bütün hissə komandirlərindən, idarə və şö'bə rəislərindən tələb edirdi ki, möhürlər Azərbaycan və rus dilində hazırlansın. Hərbi Nazirliyin bərpasından sonra ilk aylarda aparılan yazışmalarda möhürlər və künc ştamplarında hissələrin və strukturların adı yalnız rus dilində yazılırdı. S. Mehmandarov bunu yolverilməz sayırdı. O bildirirdi ki, künc ştampları və möhürlər hazırlanarkən respublikanın dövlət dilinin Azərbaycan dili olması yaddan çıxarılmamalıdır. Onlarda hissə, birləşmə, idarə və şö'bələrin adları birinci Azərbaycan dilində yazılmalı, sonra isə aşağıda rus dilində yazılmalıdır (94, v.32).

Zabitlərə Azərbaycan dilinin yaxşı öyrədilməsi üçün həm ordu daxilində, həm də ordudan kənar bir sıra kurslar təşkil edilmişdir. Ordudan kənar Azərbaycan dili kursları Maarif Nazirliyinin 20 avqust 1919-cu il tarixli qərarı ilə Bakı realnı məktəbində açılmışdı. Pulsuz olan həmin axşam kurslarında həftədə üç dəfə dərs keçirilməli idi. Hərbi nazirin əmri ilə bu barədə qoşunlara mə'lumat verilməklə zabitlərə həmin kuslara getmək tövsiyə olunurdu (117, v.97).

Az sonra belə kurslar ordunun daxilində də yaradıldı. Ümumi Qərargah rəisinin 21 sentyabr 1919-cu il tarixli sərəncamında göstərilirdi ki, Azərbaycan dilinin dövlət dili olması haqqında Azərbaycan hökumətinin 27 iyun 1918-ci il tarixli qərarının reallaşdırılması məqsədilə Ümumi Qərargahın nəzdində də hərbi qulluqçular üçün Azərbaycan dili kursları açılmışdır. Bu kurs iki şö'bədə tə'sis edilmişdi. Birinci şö'bə Azərbaycan dilini heç bilməyənlər üçün nəzərdə tutulmuşdu. Kursda dərslər iki smestrdə keçirilməli idi. Birinci smester sentyabrın 26-dan dekabrın 20-dək, ikinci semestr 1920-ci il yanvarın 2-dən aprelin 1-dək davam etməli idi. Dərslər



həftədə 3 dəfə 2 saat həcmində planlaşdırılmışdı. Belə kursların hərbi hissələrdə də açılması nəzərdə tutulmuşdu (94, v. 93).

Dil kursları təkcə zabitlər üçün deyil, həm də əsgərlər üçün açılırdı. Mə'lumdur ki, orduya gələn əsgərlərin mütləq çoxluğu savadsız idi. Bu isə onların milli dəyərlərlə yaxından tanışlığına maneçilik törətməklə bərabər tə'lim-tərbiyə prosesinin ümumi gedişinə də mənfi tə'sir göstərirdi. Savadlı əsgərlərin azlığı üzündən çavuş hey'ətinin hazırlanması da xeyli ləng gedirdi.

1920-ci ildə Hərbi Nazirlik əsgər hey'ətinin savadlandırılması işində nəzərə çarpacaq irəliləyişin əldə edilməsini planlaşdırırdı. Bu məsələ ilə bağlı hərbi nazir 1920-ci il martın 3-də 129 saylı əhatəli bir əmr imzaladı. Həmin əmrdə deyilirdi ki, əsgərlər arasında Azərbaycan dilində savadın yayılması və tə'lim komandalarının savadlı əsgərlərlə komplektləşdirilməsi üçün piyada və süvari alaylarında tabor məktəbi yaradılmalıdır. Taborlardakı savad məktəbləri aşağıdakı tələblər əsasında təşkil edilməli idi:

1. Tabor məktəblərinə savadsızlar, az savadlılar, lakin fəhmli əsgərlər göndərilməli idi;
2. Hər bir bölük məktəbə 15 əsgər göndərməli idi;
3. Tabor məktəblərində tədris müddəti 4 ay idi;
4. Tabor məktəblərinə rəhbərlik Azərbaycan dilini yaxşı bilən, xüsusən də vaxtilə müəllim işləmiş zabitlərə tapşırılmalı idi;
5. Tabor məktəblərini bitirən əsgərlərin arasından 20-25 nəfər ən yaxşısı seçilərək alay məktəbinə göndərilməli idi;
6. Alay məktəbləri isə tabor məktəblərini bitirən əsgərlərin savad səviyyəsini daha da təkmilləşdirməli və tə'lim komandalarında hazırlıq keçməsi üçün onlara zəruri olan biliklər verməli idi;
7. Alay məktəblərində də təhsilin müddəti 4 ay olmalı idi;
8. Alay məktəbində ilkin savaddan başqa əsgərlər hesabın dörd qaydasını və Azərbaycan xalqının müxtəsər tarixini keçməli idilər;
9. Alay məktəblərində dərslərin keçirilməsinə alay mollaları da cəlb edilməli idi;
10. Süvari alaylarının hər birində alay məktəbi yaradılmalı və ora hər bir süvari alayından 5-10 savadlı əsgər cəlb edilməli idi;
11. Topçu hissələrində belə məktəblər hər bir batareya və diviziyonda təşkil edilməli idi;
12. Bu məktəblərdə işləyən müəllimlər üçün əlavə mükafatlandırma vəsaitləri nəzərdə tutulmalı idi;
13. Dərslər xidmətdən kənar vaxtlarda, gündə 2 saat müddətində keçirilməli idi;
14. Dəftərxana ləvazimatının əldə edilməsi üçün alayların maliyyə vəsaitindən ayda bir min rubl ayrılmasına icazə verilirdi.

Bundan başqa nazir əmrində Ordunun qərargah rəisinə, ləvazimat rəisinə tapşırıq vermişdi ki, məktəblərin işinin təşkili üçün Maarif Nazirliyi ilə əlaqə yaratsınlar və lazımi işləri görsünlər (106, v. 113).

Qoşunların ümumi tə'lim-tərbiyəsi çərçivəsində əsgərlərlə söhbətlər aparılması, onlara Azərbaycanın tarixi, əsgəri borcun mahiyyəti, hərbi andа sədaqət və s. mövzuların çatdırılması da nəzərdə tutulurdu. Belə dərslərin aparılmasına ən yaxşı zabitlər və hissələrin mollaları cəlb edilirdilər (156, v.44-45).

Qoşunların şəxsi hey'ətinin milli tarixı köklərə bağlanılması və onların mə'nəvi saflaşması baxımından Novruz bayramlarının ümumordu miqyasında qarşılanmasının və keçirilməsinin təşkili də diqqəti cəlb edirdi. Öz mövcudluğu dövründə Azərbaycan Ordusu iki dəfə Novruz bayramını qarşılamış və hər ikisını də tən'tənəli şəkildə keçirmişdi. Novruz bayramının qeyd edilməsi əsl bayram ovqatında həyata keçirilirdi. Hər iki bayram da qoşunların hərbı-paradı ilə şəxsi hey'ətin yadında qalmışdı.

1919-cu ilin Novruz bayramı ərəfəsində nazirin imzaladığı əmrə əsasən şəxsi hey'ət üç gün dərslərdən azad edilirdi. Bu əmrə əsasən ümumi bayram süfrəsi açılmalı, əsgərlərin iaşəsi gücləndirilməli idi (86, v. 10).

1920-ci ilin Novruz bayramının yadda qalan keçirilməsi üçün üç gün ərzində əsgərlərin iaşəsinə hər gün üçün əlavə 40 rublun xərclənməsinə icazə verilmişdi.

Novruz bayramı ərəfəsində hərbi nazir mərhəmət və qayğı göstərərək cəzalandırılmış əsgərlərin günahından keçır, ya da cəzalarını azaltmaqla onlara bayram sevinci bəxş edirdi. 1919-cu ilin Novruz bayramı ərəfəsində hərbi nazir S. Mehmandarov ölüm hökmünə məhkum edilmiş 6 əsgəri əfv edərək onların cəzalarını 6 illik həbslə əvəz etmişdi. 3-cü Gəncə piyada alayından olan həmin əsgərlər 1919-cu il martın 8-də axşam silahlı şəkildə yolda rastlaşdıqları bir neçə nəfəri hədələyərək soymuşdular. Əsgər adına və şərəfinə yaraşmayan bu əməllərə görə onlar dərhal hərbi səhra məhkəməsinə verilmiş və burada onlara ölüm cəzası kəsilmişdi. Hərbi Nazır 14 mart 1919-cu il tarixli 127 saylı əmrində bildirirdi ki, bu hökm tamamilə ədalətli hökmdür. Lakin əsgərlərin öz günahlarını e'tiraf etməsini, ordu quruculuğu prosesində bir sıra çətinliklərin olmasını və habelə Novruz bayramının yaxınlaşmasını nəzərə alaraq nazır ölüm cəzasını həbs cəzası ilə əvəz etməyi məqsədəuyğun bilirdi (86, v. 7).

1920-ci ilin Novruz bayramı ərəfəsində də hərbı nazir S. Mehmandarov əmr imzalayaraq intizam qaydasında həbs edilmiş bütün hərbi qulluqçuları azad etmişdi. Ancaq həmin əmrdə göstərilirdi ki, bu tələb istintaq altında olan hərbi qulluqçulara şamil edilmir (106, v.134).

Hərbı Nazirliyin rəhbərliyi eyni zamanda hərbi qulluqçuların millimə'nəvi normalarla səsləşməyən hərəkətlərə yol verməsinə qaşı kəskin mövqe tutur və bunu ordunun mə'nəvi saflığının qorunmasına təhlükə kimi qiymətləndirirdi. Hərbi nazirin 14 mart 1919-cu il tarixli 126 saylı əmrində deyilirdi ki,alınan mə'lumatlara görə ordunun bir sıra zabitləri və mə'murları klub və cəmiyyətlərdə böyük pula qumar oyunları oynayırlar. Əmrdə şəhər komendantından, idarə rəislərindən tələb olunurdu ki, bu məsələ ciddi nəzarət altında saxlansın və kimsə belə bir işdə günahkar bilinərsə dərhal xidmətdən azad olunması üçün təqdim olunsun (86, v. 6).

Yuxarıda qeyd edilmişdi ki, zabit nufuzu və şərəfi ilə bir araya sığmayan belə hərəkətlər üçün hərbi nazir hətta generala da güzəştə getməmiş və general-mayor Pursiladzeni Azərbaycan Ordusunun sıralarından xaric etmişdi. 1920-ci ilin mart ayında Novruz bayramı ərəfəsində S.Mehmandarovun əmri ilə əsgər şərəfi, əxlaqı və alicənablığı anlayışları ilə bir araya sığmayan əməllərə yol verdiyi, zabit şərəfini qoruyub saxlaya bilmədiyi və davranış normalarına riayət etmədiyi üçün iki azərbaycanlı praporşik də xidmətdən azad edilmişdilər (106, v. 130).

S.Mehmandarov bütün fəaliyyəti boyu zabit və komandirləri əsgər zəhmətini düzgün qiymətləndirməyə, yersiz hərəkətləri, əsaslandırılmamış əmrləri ilə əsgərlərdə xidmətin müqəddəsliyinə, komandirlərinə qarşı e'tibarsızlığın yaranmasına yol verməməyə çağırırdı. 1919-cu il fevral ayının əvvəlində hərbi nazirin Şuşaya gəlməsi münasibətilə buradakı taborun şəxsi hey'əti açıq havada düzülmüş və qarşılanma mərasimi keçirilmişdi. S. Mehmandarov onun xəbəri olmadan şəxsi hey'ətin soyuq havada sıraya düzülməsinin və bu vəziyyətdə xeyli gözləməsinin komandir hey'ətinə qarşı əsgərlərdə hər hansı hörmətin formalaşdırılmasına zəmin yaratmadığını qeyd edir və belə hərəkətlərə qarşı kəskin e'tirazını bildirirdi (148, v. 404). O, sün'i şəkildə ordu rəhbərliyinə qarşı hörmət yaradılmasının tamamilə əleyhinə idi və əsgər qəlbinə daha qayğıkeş və prinsipial münasibətlərlə yol tapmağa çalışırdı. Xidmətə qarşı sədaqət və vicdanlı münasibət göstərən heç bir əsgərin və zabitin ibrətamiz əməlləri hərbi nazirin diqqətindən kənarda qalmırdı. Belə əməllər əmrlə ordunun bütün şəxsi hey'ətinə e'lan edilirdi və onlara nümunə kimi təqdim olunurdu. Hərbi nazir özünün 3 mart 1919-cu il tarixli 130 saylı əmrində göstərirdi ki, 1-ci Tatar süvari alayının əsgəri, Bakı qəzasının Saray kəndinin sakini Xanmirzə Məlik Əhməd oğlu xəstə anasına baş çəkmək üçün icazə alıb evlərinə gedibmiş. Necə olursa əsgər özü evlərində vəfat edir. Ancaq vəfatından qabaq xəstə anasından xahiş edir ki, əsgər libası hökumət malı olduğu üçün onu hissəyə göndərsin. Anası da oğlunun vəsiyyətinə əməl edərək xidməti paltarı geriyə qaytarır. S.Mehmandarov vəfat etmiş süvarinin xidməti ilə maraqlandıqda mə'lum olmuşdu ki, o, həmişə nümunəvi davranışı, sonsuz təmizliyi, işgüzarlığı və intizamlılığı ilə fərqlənirmiş. Belə bir əsgərin - Vətən müdafiəçisinin ölümünü hərbi nazir ağır bir itki sayırdı və onun Azərbaycan Ordusu sıralarında xidmətə vicdanlı münasibətini hamıya nümunə göstərirdi. Adı çəkilən əmrini S.Mehmandarov aşağıdakı cümlələrlə

bitirirdi: "Belə bir süvarinin ölümü xidmət etdiyi hissə üçün böyük itkidir. Hamının diqqətini belə bir məsələyə cəlb edirəm ki, ölüm anına qədər Xanmirzə Məlik Əhməd oğlu bütün xidməti əmlakı öz hissəsinə qaytarmağa borclu olduğunu unutmamışdı. Onun qoca anası isə çox kasıb olmasına baxmayaraq oğlunun iradəsini yerinə yetirməyə imkan tapmışdı. Allah bizim Vətənimizə belə təmiz insanlardan daha çox qismət eləsin" (106, v.114).

Hərbi nazirin başqa əmrlərində hissələrdə Xanmirzə kimi əsgərlərin hərəkətləri ilə daban-dabana zidd olan əməllərə yol verildiyinin və onların həm zabitlər, həm də əsgərlər tərəfindən törədildiyinin şahidi olmaq mümkündür. Məsələn, 28 fevral 1920-ci il tarixli 125 saylı əmrində S.Mehmandarov bildirirdi ki, bir sıra hərbi hissələrdə, o cümlədən də Hərbi məktəbin özündə bə'zi zabitlər və hətta çavuşlar tərəfindən xidməti əmlaka, maliyyə vəsaitlərinə qərəzli münasibət barədə mə'lumat alınmaqdadır. Hərbi nazir bu sayaq əməlləri şərəfsizlik kimi qiymətləndirirdi, belə mə'nəvi düşkünlüyə yuvarlanmış hər bir zabitə və çavuşa qarşı ən qətiyyətli tədbirlərin tətbiqinin zəruriliyini vurğulayırdı. Hərbi nazir bütün səviyyələrdə olan komandirlərdən tələb edirdi ki, gənclərin tərbiyəsinə diqqət yetirsinlər və mə'nəviyyatsızlığa yol verib xidməti əmlaka nankorcasına yanaşan çavuşlar rütbələrinin aşağı salınması üçün təqdim edilsinlər (106, v. 105).

Hərbi nazirin 25 iyun 1919-cu il tarixli 311 saylı əmrinin məzmunundan mə'lum olur ki, çoxdan xidmətdə olan bir sıra əsgərlərin xidmətə yeni gələn əsgərlərdən rüşvət alma halları da mövcuddur. Nazir təəssüflə qeyd edirdi ki, bu barədə mə'lumatlar bütün hissələrdən alınmaqdadır. S.Mehmandarov köhnə və yeni əsgərlər arasında rüşvətalma faktının olmasını gənc əsgərlərin tərbiyəsinə və intizamına zıyan gətirən özbaşınalıq kimi qiymətləndiririrdi. O diviziya komandirlərindən qətiyyətlə tələb edirdi ki, belə özbaşınalıqlara tə'cili surətdə son qoyulsun və günahkar şəxslər mə'suliyyətə cəlb olunsunlar. (86, v. 10).

Xidməti tələblərə mə'suliyyət nümayiş etdirməyərək hərbi intizamın pozulmasına yol açan bütün hərəkətlər ciddi şəkildə cəzalandırılırdı. Gəncə hərbi rəisinin idarəsində xidmət edən əsgər otağa daxil olan zabitə əsgəri qaydada hərbi-tə'zim etmədiyi üçün hərbi səhra məhkəməsinə göndərilmişdi (110, v. 99).

Bə'zi əsgərlərin nalayiq hərəkətləri barədə "Azərbaycan" qəzetində qeydlər çap olunandan sonra hərbi nazirin əmrinə müvafiq olaraq Ərkanihərbin rəisi Sulkeviç həmin əsgərlərin tapılıb məs'uliyyətə cəlb olunması barədə göstəriş vermişdi (142, v.41).

Hərbi Nazirliyin rəhbəri şəxsi hey'ətin mə'nəviyyatının korlanmasına, intizamsızlığın genişlənməsinə, ordunun dayaqlarını təşkil edən dəyərlərin zəifləntdilməsinə istiqamətlənmiş yad təbliğatların qarşısının alınması ilə də kəskin mübarizə aparırdı. Xalqın və ordunun qarşılaşdığı obyektiv çətinliklərdən istifadə edərək öz fəaliyyətini genişləndirməyə çalışan bir sıra qüvvələr tutduqları ifrat mövqe ilə Azərbaycan dövlətçiliyinin əsaslarına qarşı mübarizə aparır və ordunun şəxsi hey'ətini də bu mübarizəyə qatmağa çalışırdılar.

Azərbaycan Ordusu daxilində ilk ciddi sınaq olan bu özbaşınalıqlar həyata keçirilən ciddi və qətiyyətli tədbirdən sonra tezliklə yatırıldı və tə'lim-tərbiyə prosesinin ahəngi bərpa olundu. İfrat mövqedə dayanan qüvvələr ordu daxilində özlərinə sosial baza tapa bilmədilər və onların ideyaları şəxsi hey'ət arasında lazımi əks-səda yaratmadı. Ancaq ordunun şəxsi hey'əti arasında aparılan zərərli işlər heç də bununla bitmədi. Ordunun mövcudluğunun bütün tarixi boyu həmin təbliğat davam etmişdi. Belə qüvvələrin arasında bolşeviklər və kommunistlər xüsusilə fərqlənirdilər. Doğrudur, denikinçilər də Azərbaycan Ordusu daxilində olan rus zabitləri vasitəsilə hərbi hissələrdə müəyyən əhval yaratmağa çalışırdılar. Lakin bolşevik təbliğatı denikinçilərlə müqayisədə daha əhatəli, geniş və ardıcıl idi. Xüsusilə, Qırmızı Ordu hissələrinin cənuba doğru hərəkəti dərinləşdikcə Azərbaycandakı bolşevik qüvvələrinin fəaliyyəti və onların ordunun möhkəmlənməsinə qarşı istiqamətlənmiş əks-təbliğatı daha dağıdıcı xarakter alırdı. Cəmiyyət və ordu daxilində mövcud olan çətinliklər və problemlər isə bə'zən bolşevik təbliğatının yayılmasına obyektiv zəmin yaradırdı.

Azərbaycan Ordusunun möhkəmlənməsinə qarşı istiqamətlənmiş təbliğat sırf şəxsi hey'ət arasında aparılmırdı. Mövcud reallıqlardan məharətlə istifadə edən bolşevik təbliğatçıları ilk növbədə savadsız kütlələrin şüuruna tə'sir göstərməyə, onları öz övladlarını Azərbaycan Ordusu sıralarında xidmətə göndərməkdən çəkindirməyə çalışırdılar. Çağırış-səfərbərlik işində mövcud olan çətinliklərin bir səbəbi də məhz bu cəhətlə bağlı idi. 1919-cu il martın 8-də Nazirlər Şurası sədrinin adına göndərdiyi məktubunda hərbi nazir S.Mehmandarov bildirirdi ki, Qazax qəzasının kəndləri demək olar ki, bütünlüklə çağırışçı verməkdən imtina edirlər. Bu da həmin zonada aparılan bolşevik təbliğatının nəticəsi idi. Bolşevik ünsürləri bölgədəki həm hərbi qüvvələrin, həm də əhalinin arasında ciddi təbliğat aparırdılar ki, bu da ordu quruculuğu prosesini xeyli çətinliklərlə qarşılaşdırırdı. Nazir vəziyyətin ciddiliyini belə təsvir edirdi: "Hazırda vəziyyət çox ciddidir. Əgər hökumət, xüsusilə də Daxili İşlər Nazirliyi və yerli inzibati orqanlar bu təbliğatın qarşısının alınması üçün fəal tədbirlər həyata keçirməsələr mənə həvalə olunan vəzifənin uğuruna zəmanət verə bilmərəm... Təbliğat mənbələrinin ləğvi üçün əsaslı işlər görülməlidir və nə qədər ki gec deyil hökumətin qərarlarının həyata keçirilməməsinə zəmin yaradan bütün səbəblər kökündən qoparılmalıdır" (56, v.25).

Ərkanı-hərbin rəisi general-leytenant Sulkeviçin 1919-cu il aprelin 6-da qarnizon rəislərinə göndərdiyi sərəncamında bildirilirdi ki, Zaqafqazıya dəmiryolçularının nümayəndələrinin son günlərdə Ksanka stansıyasında keçirilən qurultayında da Azərbaycanda, onun ordusunun şəxsi hey'əti

arasında bolşevik təbliğatının gücləndirilməsi qərara alınmışdı. Bunun üçün Bakı təşkilatına tapşırılmışdı ki, təbliğat işinin aparılması üçün zəruri olan vəsaitin və ədəbiyyatın təchiz edilməsini öz üzərinə götürsün. Qoşun hissələri arasında bolşevik təbliğatının genişləndirilməsi üçün xüsusi bir qrup yaradılmışdı. Bu qrupa iki rus zabiti və bir neçə dəmiryolçu daxil idi. Həmin şəxslərin vasitəsi ilə qoşunlarla əlaqə yaradılması, şəxsi hey'ət arasında bolşevik ədəbiyyatının yayılması nəzərdə tutulmuşdu (3, s.100).

1919-cu il aprelin 7-dən 15-dək Bakıda keçirilmiş olan Zaqafqaziya Dağıstan və Zakaspi Həmkarlar İttifaqının qurultayında (3, s.523) bir sıra məsələlərlə yanaşı Azərbaycanda bolşevik təbliğatının genişləndirilməsinə də toxunulmuşdu. Qurultay qarşıda dayanan başlıca vəzifənin Zaqafqaziya hüdudlarında Sovet hakimiyyətinin qurulması uğrunda mübarizə aparılmasından ibarət olduğunu vurğulayırdı. Hərbi nazir S.Mehmandarov şübhə etmirdi ki, belə vəzifəni qarşıya qoyan bolşeviklərin məqsədi Azərbaycanın müstəqilliyini məhv etmək və yenidən Sovet Rusiyası ilə birləşməkdir. 1919-cu il aprelin 21-də daxili işlər nazirinin adına ünvanladığı raportunda S.Mehmandarov Azərbaycanın istiqlaliyyətinin qorunması, respublika hökumətinin fəaliyyətinin əsasını təşkil etdiyi üçün bolşeviklərin dağıdıcı əməllərinə qarşı hökumət səviyyəsində lazımi addımlar atılacağına ümid edirdi (67, v.50).

Hərbi nazirin fikrincə, Zaqafqaziya bolşevizminin mərkəzi olan Bakıda bu qüvvələr fəaliyyətini genişləndirdikcə orduya göstərilən tə'sir də güclənəcəkdi. Ona görə də S.Mehmandarov daxili işlər nazirindən xahiş edirdi ki, polis orqanları Bakı qarnizonuna daxil olan hissələrə qarşı təbliğat işinin aparılmasını nəzarət altına götürsünlər və bununla hissələrin komandanlığına yardım etsinlər. Daxili İşlər Nazirliyi tərəfindən bolşevik təbliğatının qarşısının alınmasına qarşı yönəldilmiş tədbirləri S.Mehmandarov ordunun vahidliyinin və bütövlükdə Azərbaycanın istiqlaliyyətinin qorunması uğrunda aparılan mübarizə kimi qiymətləndirirdi və bu iki orqan arasında qarşılıqlı-faydalı əməkdaşlığın yaxşı əsaslar üzərində qurulacağına ümid etdiyini bildirirdi (67, v.50).

Bununla belə, bolşevik təbliğatı gündən-günə genişlənir və onun orduya nüfuz etmək ehtimalı real xarakter alırdı. Xüsusilə azərbaycanlılardan olan bolşeviklər nəyin bahasına olursa-olsun Bakı qoşun bölmələrinin qışlalarına yol taparaq azərbaycanlı əsgərlər arasında öz təbliğatlarını aparmağa və bununla da daxili nizam və intizamı pozmağa cəhd göstərirdilər. Hərbi nazir S.Mehmandarov qeyd edirdi ki, Bakıda olan hərbi qüvvələr, xüsusən piyada hissələri kifayət qədər formalaşmamışdı və buna görə də bolşeviklərin apardığı təbliğatın bu qüvvələrə daha tez tə'sir göstərəcəyi ehtimalı var idi. S.Mehmandarov 1919-cu il mayın 11-də daxili işlər nazirinə göndərdiyi məktubunda hələ tam formalaşmamış qoşun bölmələrinin bolşeviklərin dağıdıcı təbliğatından qorunması üçün hərbi şəhərciklərə



polis nəzarətinin gücləndirilməsini və kənar adamların şəhərciklərə girməsinə yol verilməməsini xahiş edirdi (67, v.56).

Azərbaycan Ordusunun qoşun hissələri arasında bolşevik təbliğatı aparmaq üçün "Hümmət" təşkilatının nəzdində xüsusi Hərbi komissiya yaradılmışdı. Bu komissiyanın üzvləri – D.Bünyadzadə, M.D.Hüseynov, H.Cəbiyev və Ə.Əhmədov Azərbaycan Ordusunun hissələri ilə əlaqəyə girməli, tək-tək mövcud olan kommunistləri birləşdirərək ordu daxilində partiya qrupları yaratmalı idilər. "Hümmət" təşkilatının nəzdindəki Hərbi komissiya ilə bərabər Rusiya Kommunist (bolşevik) Partiyası Bakı Komitəsinin nəzdində Hərbi təşkilat yaradılmış və hərbi komissiyanın üzvlərindən biri də həmin qurumun nümayəndəsi kimi Hərbi təşkilata daxil edilmişdi. Bakı Komitəsinin nəzdində yaradılan hərbi təşkilatın fəaliyyətinin başlıca məqsədi qoşun hissələri arasında güclü dayaq toplamaq və ona arxalanaraq hakimiyyətin ələ keçirilməsi üçün silahlı üsyan qaldırmaq idi (297, s.71-73).

"Hümmət" təşkilatı nəzdindəki Hərbi komissiyanın üzvlərindən biri olan M.D.Hüseynovun verdiyi mə'lumata görə, qısa müddət ərzində Lənkəran, Qarabağ və Quba qarnizonlarında bolşevik qruplarını yaradılmasına nail olunmuşdu. Bakı qarnizonuna daxil olan hissələrdə aparılan iş də səngimək bilmirdi (245, s.51). Bolşeviklərin göstərdikləri ciddi cəhddən sonra 5-ci Bakı piyada alayında 15 nəfərdən ibarət partiya qrupu yaradılmışdı. Bu qrup qoşun hissələri arasında ən güclü mərkəzlərdən biri sayılırdı (297, s.71). M.D.Hüseynov bu qrupun fəaliyyətinə arxalanaraq hətta alayın bölüklərini bolşevik nəzarəti altında saxlamağın mümkünlüyünü də irəli sürürdü (245, s.51).

7-ci Şirvan piyada alayında da bolşeviklərin dayaq qrupu yaradılmışdı. Burada boşeviklər bir neçə çavuşu öz sıralarına sövq edə bilmişdi (297, s.71).

Bakıda bolşevik strukturlarının fəaliyyəti genişləndikcə onların yerlərdəki ardıcılları da hərəkətə gəlirdilər. Quba piyada alayından göndərilən məktub və raportlarda bildirilirdi ki, yerli bolşeviklər də artıq açıq fəaliyyət üçün baş qaldırmışlar və onlar qarnizon əsgərlərini öz təbliğat dairələrinə salmaqdan da çəkinmirlər (69, v.37). Həmin alaydan göndərilən başqa bir mə'lumatda isə bildirilirdi ki, əsgərlər arasında Azərbaycan dövlətçiliyi əleyhinə təbliğatlar aparmaq üçün Qubaya xüsusi tə'limatlandırılmış üç nəfər bolşevik gəlmişdir. Onların təşkil edəcəyi təbliğat kampaniyasının tə'sir dairəsinə düşməmək üçün hissə komandanlığı əsgərlərin mülki əhali ilə ünsiyyətini tam nəzarət altında saxlamağa çalışırdı (69, v.44).

Mövcud olan mə'lumatlara görə 3-cü Gəncə piyada alayında da bolşeviklərin partiya qrupu yaradılmışdı, Xankəndi qarnizonunda isə tək-tək partiyaçılar var idi (297, s.71).

"Hümmət" təşkilatı nəzdində yaradılmış olan Hərbi komissiyanın fəaliyyəti 1920-ci ilin fevralınadək davam etdirildi. Azərbaycan Kommunist (bolşeviklər) Partiyası yaradılandan sonra isə AK(b)P Mərkəzi komitəsinin nəzdində Əməliyyat qərargahı təşkil edildi. Azərbaycan Ordusunun hissə və bölmələrində bolşevik təbliğatının aparılması bu qərargahın tərkibində olan siyasi şö'bəyə tapşırıldı. Həmin şö'bəyə Dadaş Bünyadzadə rəhbərlik edirdi. Siyasi şö'bənin qoşun hissələri ilə əlaqə saxlayan xüsusi adamları var idi və bu adamlar vasitəsilə şəxsi hey'ət arasında bolşevik ədəbiyyatının yayılmasına cəhd göstərilirdi (297, s.71).

1920-ci il fevralın 5-də 6-cı Göyçay piyada alayının əsgərləri şəhərdəki postlarda növbəni başa vurub geri qayıdanda bolşevik fəalları onlara bolşevik təmayüllü 15 qəzet vermişdilər. Əsgərlər isə qəzetləri onbaşıya, o da bölük komandirinə təhvil vermişdi. Hissənin komandanlığı şəhər inzibati orqanlarına yazdığı məktubunda əsgərlərə tə'sir göstərməyə çalışmış bolşevik fəallarının ünvanını açıqlayaraq onlara qarşı lazımi tədbirlər görülməsini xahiş edirdi (3, s.402).

Quba qarnizonunun rəisi, podpolkovnik Məmmədbəyov Hərbi Nazirliyə göndərdiyi raportunda şəhər çayxanalarının çayçılarından birinin əsgərlər arasında bolşevik ədəbiyyatı yayılmasına görə həbs edildiyi barədə mə'lumat verirdi (3, s.440).

1919-cu ilin sonu və 1920-ci ilin ilk ayları ərzində formalaşdırılan hərbi gəmilərin şəxsi hey'əti arasında da bolşeviklərin təbliğat işləri ara vermirdi. Hərbi Nazirliyin rəhbərliyi "Qars", "Ərdəhan" və digər hərbi gəmilərin komplektləşdirilməsinə, onların döyüş hazırlığı səviyyəsinə gətirilməsinə xüsusi diqqət yetirirdi. Ancaq bu sahədə də azərbaycanlılar arasında ixtisaslı kadrlar olduqca az idi. Gəmilərin döyüş hazırlığını tə'min etmək üçün Hərbi Nazirlik keçmiş dənizçiləri, xüsusən də qeyri-azərbaycanlı dənizçiləri gəmilərdə xidmətə qəbul etmək məcburiyyətində qalırdı. Bu kontingent arasında isə bolşevizmə meyllilik xeyli güclü idi. Hərbi gəmilərə yol tapmış olan bolşeviklər boş yerlər üçün öz tanışlarını də'vət edir və onların xidmətə götürülməsinə nail olurdular. Nəticədə bolşeviklər hərbi gəmilərdə daha çox tərəfdarlarının toplanmasına müvəffəq olmuşdular (245, s. 56). Hərbi gəmilərin bolşevik fəalları ilə komplektləşdirilməsində Bakı limanının rəisi və Hərbi Donanmanın rəis müavini tə'yin edilmiş Çingiz İldırım öz vəzifə imkanlarından və ona göstərilən e'timaddan xüsusilə sui-istifadə edirdi (245, s.55).

Qoşun hissələrində genişlənən bolşevik təbliğatına qarşı ümumdövlət səviyyəsində mübarizə aparılması ilə bağlı hələ 1919-cu il sentyabrın 13-də Dövlət Müdafiə Komitəsində məsələ müzakirə olunmuşdu. Burada Yollar nazirinin təklifi ilə qoşunlarda bolşevik təbliğatı ilə mübarizə aparmaq üçün hərbi əks-kəşfiyyat təşkilatının yaradılması barədə qərar qəbul edilmişdi (68, v.14). Ancaq hərbi nazirin müavini Ə.Şıxlinski adı çəkilən təşkilatın bolşevik təbliğatına qarşı səmərəli fəaliyyət göstərəcəyini qəbul etmir və onun yaradılmasını məqsədəuyğun saymırdı. Dövlət Müdafiə Komitəsinə göndərdiyi raportunda o, öz fikrini belə əsaslandırırdı: Birincisi, Hərbi əks-kəşfiyyatın başlıca vəzifəsi bolşevizmə qarşı mübarizə aparmaq yox, ölkə daxilindəki hərbi casuslarla mübarizə aparmaqdır. Bolşevizmə qarşı mübarizə tək Hərbi Nazirliyin gücü çata bilməyəcəyi ümumdövlət işidir. İkincisi, Rus ordusunun dairə qərargahlarında və Baş qərargahında tə'sis edilmiş olan əks-kəşfiyyat strukturlarının fəaliyyətinin təcrübəsi də göstərirdi ki, Hərbi Nazirliyə böyük miqdarda maliyyə vəsaiti ayrılsa da təcrübəli icraçılar aparatı olmadan bolşevizmlə mübarizəni təşkil etmək çox mürəkkəb bir vəzifədir. Ona görə Ə.Şıxlinski təklif edirdi ki, əks-kəşfiyyat sturkturu Daxili İşlər Nazirliyinin tərkibində təşkil edilsin. Çünki Daxili İşlər Nazirliyinin bu iş üçün hazır polis aparatı var və bu aparat bir qədər də gücləndiriləcəyi təqdirdə həm dövlət casusluğuna qarşı, həm də xalq və ordu arasında aparılan bolşevik təbliğatına qarşı uğurla mübarizə apara bilərdi. Üçüncüsü, Ə.Şıxlinskinin fikrincə, Hərbi Nazirlik öz üzərinə yalnız xarici kəşfiyyatı, yə'ni ehtimal olunan düşmən haqqında mə'lumatlar toplanmasını götürməlidir. Bu iş hərbi xarakter daşıyır və ona görə də ən'ənəvi olaraq hərbi qurumlar tərəfindən həyata keçirilir. Xarici kəşfiyyat ölkədən kənardakı rezidentlər tərəfindən yerinə yetirilir və bu sahəyə general-kvartirmeysterin tabeçiliyində olan kəşfiyyat şö'bəsi vasitəsilə rəhbərlik edilir (68, v.15-16).

Verilən təkliflərin nəzərə alınması Ə.Şıxlinskinin fikrincə, qoşunlarda bolşevizm təbliğatının qarşısının daha səmərəli şəkildə alınmasına kömək etməli idi.

Sovet tarixşünaslığında bolşevik təbliğatından sonra Azərbaycan Ordusunun şəxsi hey'əti arasında intizamsızlığın artması, xidməti borclara məs'uliyyət hissinin xeyli aşağı düşməsi barədə yazılsa da (297, s.69-74; 245, s.51-56), əslində vəziyyət təsvir edildiyi qədər də böhranlı deyildi. Doğrudur, 1920-ci ilin aprel çevrilişi ərəfəsində hərbi gəmilərdə şəxsi hey'ətin əsasının qeyri-azərbaycanlılar olması üzündən bolşeviklərin nüfuzu güclü idi. Ancaq qoşun hissələrində vəziyyət komandanlıqların nəzarəti altında idi. Burada bolşevik elementləri mövcud olsa da onların ümumi çəkisi ordunu böhran qarşısında qoymaq dərəcəsində deyildi. Bütün ordu daxilində cəmi 35-40 kommunist var idi (297, s.71). 1919-cu ilin payızında Moskvada verdiyi mə'lumatında N.Nərimanov orduda mövcud olan real nöqsan və çatışmazlıqlara toxunmaqla bərabər, qoşunların şəxsi hey'əti arasında intizamın möhkəm olduğunu qeyd edirdi. O eyni zamanda əlavə edirdi ki, Azərbaycan əsgərləri kifayət qədər çalışqan və itaətkardırlar (3, s.292). Yə'ni bolşevik təbliğatı nə qədər gücləndirilsə də, hissə daxilində

aparılan işlər nəticəsində Azərbaycan əsgərləri ümumən öz mə'nəvi-döyüş keyfiyyətlərini qoruyub saxlaya bilmişdilər. Bunu tək bolşevik fəalları deyil, Azərbaycana gəlmiş olan xarici jurnalistlər də qeyd edirdilər. İngilis jurnalisti Skotland Liddel 1919-cu ilin sentyabrında yazdığı məqalələrindən birində Azərbaycan Ordusunda əldə edilmiş möhkəm intizamla bağlı şahidi olduqlarını ayrıca başlıq altında öz oxucularına çatdırırdı. S.Liddel gördüklərini belə təsvir edirdi: "Gündüz Bakıya çatdım və yaxşı bir faytonda otelə yollandım. Faytonçu yaxşı geyinmişdi... Mənimlə cavan bir azərbaycanlı zabit də gedirdi. Yol boyu yeni Azərbaycan Ordusunun yüzlərlə gənc əsgəri ilə qarşılaşdıq. Hamısı hərbi salam verirdi. Mən təəccüb içində idim. Bu mənim son iki ildə gördüyüm əsgərlər deyildi. Bunlar yeni adamlar idilər, bunlar yeni, intizamlı, gənc, qüvvətli və cəsur əsgərlər idilər.

Azərbaycan Ordusu tez yaradıldı və sür'ətlə lazımi görkəm alır. Azərbaycan başa düşdü ki, intizamsız ordu mövcud ola bilməz. Adamların çoxu cavandır, əvvəllər xidmət etməyiblər, köhnə rejimin rus ordusunu parçalamış bolşeviklər tərəfindən hələ yoldan çıxarılmayıblar. Azərbaycanda dəmir intizam var. Elə bir intizam ki, Rusiyada da görünməmişdi" (79, v.18).

Bir fransız jurnalisti isə Azərbaycanın qoşun hissələri arasında mövcud olan ovqat barədə belə yazırdı: "Rus çarları zamanı azərbaycanlılar hərbi xidmətə çağırılmırdılar. Bax buna görə də onlar atıcılıq təmrinlərini yerinə yetirməyi çox sevirlər. Azərbaycan zabitləri xalqa silahdan istifadə etməyi öyrədirdilər. Zərurət yarananda bütün xalq öz ölkəsini qorumağa hazır olacaqdır. Axşam, gündüz əməyindən sonra hər yerdə milli mahnıların necə oxunduğunu eşitmək olar: "marş, irəli, irəli, Azərbaycan əsgəri" (85, v.41).

Oxunan bu marşlar Azərbaycan əsgərinin mə'nəvi yaşantılarını əks etdirən bədii nümunələr idi. Onlar dövrün həm söz ustaları, həm də əsgərlər və xalq tərəfindən yaradılırdı. Əsgər həyatının elə bir sahəsini və ya qayğısını tapmaq mümkün deyil ki, ona şərqilər həsr edilməsin, marşlarda tərənnüm olunmasın (bax:104, v.1-43). Bu hərbi şərqilərdə Vətənini sevən, onun yolunda canından keçməyə hazır olan, xalq yolunda xidməti müqəddəs vəzifə sayan Azərbaycan əsgərinin daxili aləmi açılır, mə"nəvi keyfiyyətləri üzə çıxır. Vətənə bağlılıq və məhəbbət ruhunda qoşulmuş şərqilər həm də bir mə'nəvi tərbiyə vasitəsi idi, onların mütəmadi ifası əsgərlərdə kollektivçilik, birlik, qələbə əhval-ruhiyyəsi aşılayırdı:

**Cihad var, cihad var partladalım bombalar,**
**Məhv olsun, məhv olsun xain, alçaq yağılar,**
**Qoşa addım, irəli, dönməyərim biz geri,**
**İrəli, irəli,vətən fədailəri,**
**İrəli, irəli, Azərbaycan əsgəri!**
**Bu sancaq bizlərə qanlı kəfən olacaq,**



**Yaxında şənlənəcək hər yer, hər ocaq,**
**Qoşa addım irəli, vətən fədailəri,**
**İrəli, irəli, Azərbaycan əsgəri!** (18, 16.09.1993)

Əsgər şərqiləri arasında Azərbaycan övladlarını xidmətə səsləyən, Vətən və torpaq qarşısındakı borclarını başa düşməyə çağıran, hərb işinin gərginliklərinə sinə gərməyə ruhlandıran, yaxasını çağırışdan kənara çəkmək istəyən gənclərə qarşı qəzəb və nifrət aşılayan yaradıcılıq nümunələri də az deyil.

**Mən bir türkəm, dinim köküm uludur,**
**Sinəm, özüm atəş ilə doludur,**
**İnsan olan Vətəninin quludur,**
**Türk övladı evdə durmaz, gedəlim!** (18, 25.02.1992).

Və ya Məhəmməd Ümid Gəncəlinin 30 yanvar 1920-ci il tarixli "Azərbaycan" qəzetində çap olunmuş bir şərqisində gənclərin hərbi xidmətə könüllü yazılmalarına bir çağırış ifadə olunmuşdu. Şərqidəki mübariz ruh vətənpərvər gənclərin döyüşkən keyfiyyətlərinin formalaşması üçün güclü tə'sir qüvvətinə malik idi:

**Azərbaycan torpağıdır türk yurdunun ürəyi,**
**Hifz etməli o ölkəni nasıl gözün bəbəyi.**
**Tarixə bax,unutma sən ulu baba dediyi,**
**Qan tökmüşlər bu vətənçün, həm çəkmişlər əməyi.**
**Vətən üçün, millət üçün gənclər getdi əsgərə,**
**Könüllü get, sən də yazıl o mübarək səfərə.** (226, s.39).

Qoşunların şəxsi hey'ətinin mə'nəvi cəhətdən formalaşmasında və bütövləşməsində dini dəyərlərin də xüsusi yeri var idi. Xidmətə çağırılmış gənclər dini mərasimlərin icrasından ayrılmırdılar, əksinə hissə və birləşmələrdə müqəddəs dini ayinlərin, islamın vacibatlarını yerinə yetirilməsi üçün hər cürə şərait yaradılırdı. Bu sahədə bir nizamlılıq yaratmaq üçün hissələrin ştatında mollalar var idi. Həmin mollaların fəaliyyətinə nazirliyin baş mollası rəhbərlik edirdi. Alaylarda ibadət yerləri də yaradılmışdı. Yuxarıda qeyd edilmişdi ki, tə'lim-tərbiyyə proqramına mollaların əsgərlərlə söhbəti də daxil edilirdi. Mollalar xidmətin müqəddəsliyi, dini kitablarda xidməti borcun yerinə yetirilməsinin vacibliyi və fəzilətləri barədə söhbətlər edirdilər. Hissələrin mollaları sadəcə olaraq ayinlərin icrasına rəhbərlik etmirdilər. Hərbi nazir S.Mehmandarov orduya qəbul edilmiş din xadimlərinin qarşısında dayanan başlıca vəzifənin əsgərlərin dini-mə'nəvi tərbiyəsi olduğunu vurğulayır və bununla bağlı tələb edirdi ki, həmin vəzifələrə nail olunması üçün ilk növbədə din xadimləri özü qanunun və şəriətin bütün tələblərinin icrasının nümunəsi olmalıdırlar (106, v.12).

Buna görə də dini ayinlərin icrası, dini-mə'nəvi tərbiyə Hərbi Nazirliyin rəhbərliyinin nəzarəti altında idi. Vaxtaşırı bu məsələlərlə bağlı na-

zının əmri imzalanır və qoşunlara e'lan olunurdu. Baş mollanın fitvası əsasında hərbi nazirin 30 may 1919-cu il tarixdə imzaladığı 277 saylı əmrində bildirilirdi ki, qeyri-nizamı hissələrinin əsgərlərinin hamısı ramazan ayında oruc tutmalıdırlar. Nizami hissələrin əsgərləri isə ramazan ayının 1, 15, 19, 21, 23, 30-cu günləri və bir də cüməyə düşən günlər oruc tutmalıdırlar. Əsgərlərin oruc olduğu günlərdə keçirilən dərslər 3 saatdan artıq olmamalı idi. (89, v. 153).

Dini bayramlar qoşunlarda böyük təntənə ilə qeyd edilirdilər. 1919-cu ilin orucluq bayramında hətta qoşunların paradı da təşkil edilmişdi. Hərbi nazirin əmrinə əsasən orucluq bayramı münasibətilə əsgərlərə üç gün istirahət verilmiş və həmin günlər ərzində şəxsi hey'ətə bayram yeməkləri hazırlanması üçün əlavə pul ayrılmışdı (90, v. 6a).

Qurban bayramı münasibətilə şəxsi hey'ətə bir gün istirahət verilirdi. Bayram günləri qoşun hissələri Hərbi Nazirliyin rəhbərliyini təbrik etdiyi kimi, nazirliyin rəhbərliyi də qoşun hissələrinin şəxsi hey'ətini təbrik edirdi. Məsələn, hərbi nazirin Qurban bayramı münasibətilə Zaqatala piyada alayına göndərdiyi teleqramda deyilirdi: "Təbrik üçün alayın bütün çinlərinə öz minnətdarlığımı bildirirəm. Eyni zamanda Sizin hamınızı təbrik edirəm". Ə.Şıxlinskinin göndərdiyi teleqramda isə yazılırdı: "Sizə və mənim üçün əziz olan zaqatalılara təşəkkür edirəm və hamınızı Qurban bayramı münasibətilə təbrik edirəm. Alayınızda şahidi olduqlarım onun uğurları üçün möhkəm zəmindir. Qadir Allah alayın hazırlanması üçün yorulmaz və vicdanlı xidmətinizdə sizə yar olsun" (109, v. 96).

Hərbi nazirin əmri ilə qoşunlarda xristian bayramları da qeyd edilirdi. Həmin günlərdə xristian dininə mənsub olan zabit və mə'murlara istirahət verilirdi (94, v. 49).

Şəhid olmuş və ya xidmət müddətində vəfat etmiş hərbi qulluqçuların son mənzilə yola salınması zamanı dini normalara riayət edilməsinə də Hərbi Nazirliyin rəhbərliyi son dərəcə ciddi diqqət yetirirdi. Mərhumun dəfninə göstərilən ən adi səhlənkarlıq bütünlükdə hərbi qulluqçuların qayğısına, onların dini, ən'ənəvi tərbiyəsinə göstərilən səhlənkarlıq kimi qiymətləndirilirdi. Hərbi qulluqçunun dini və insani tələblərə uyğun olaraq son mənzilə yola salınmasını Hərbi Nazirliyin rəhbərliyi bütün hissənin, başlıcası isə bu işlərə məs'ul olan mollaların ən böyük vəzifə, mə'nəvi və insani borcu kimi qəbul edirdi. Dəfn tədbirlərinin icra edilməsi üçün Nazirliyin smetasında xüsusi xərclər də nəzərdə tutulmuşdu.

| | 1919-cu il iyunun 1-nədək | | | | 1919-cu ili iyunun 1-dən sonra | | | |
|---|---|---|---|---|---|---|---|---|
| | müsəlman | | xristian | | müsəlman | | xristian | |
| | rubl | qəpik | rubl | qəpik | rubl | qəpik | rubl | qəpik |
| Qəbrin qazılması | 30 | | 30 | | 40 | | 50 | |
| kəfən | 145 | | | | 160 | | | |
| Ətirli əşyalar və dəfn | 25 | | | | 50 | | | |
| Rütubətli torpaqda işlədilən taxta | 50 | | | | 80 | | | |
| cənazə | | | 150 | | | | 280 | |
| əklil və dua | | | 50 | | | | 80 | |
| qəbrüstü xaç | | | 50 | | | | 60 | |

**Hərbi qulluqçuların dəfni üçün nəzərdə tutulan xərclər**



Hərbi qulluqçular son mənzilə böyük hörmət və ehtiramla yola salınırdılar. 3-cü Şəki süvari alayının podpolkovniki, xəstəlikdən vəfat etmiş Şahverdi xan Ziyadxanovun dəfninin təşkili üçün nazirin imzaladığı əmrdə göstərilirdi ki, mərhumun evinə hərbi naryad göndərilsin. Bu hərbi naryada 3-cü Şəki süvari alayının mövcud olan bütün şəxsi hey'əti, topçu briqadasının bir topçu batareyası, bir bölük yunker və orkestr daxil idi. Dəfn mərasimində nazirliyin bütün zabitlərinin iştirak etməsi zəruri idi (94, v. 50).

Digər zabitlərin dəfni də belə böyük hörmət və ehtiramla icra edilirdi (bax: 92, v.23). Hərbi nazirin əmri ilə hətta hərbi qəbristanlığa qulluq edilməsi və onun qorunması üçün xüsusi ştat da ayrılmışdı (106, v.101).

Əsgər şərəfinə böyük bir hörmətlə yanaşan hərbi nazir vəfat edənlərin dəfninə azacıq səhlənkarlığın şahidi olan kimi dərhal ona qarşı öz münasibətini bildirir və müvafiq əmr imzalayırdı. Onun 1919-cu il dekabrın 28-də imzaladığı 600 saylı əmr əsgər xəstəxanalarında vəfat edən hərbi qulluqçuların dəfninin ləngidilməsi ilə bağlı idi. Nazir tələb edirdi ki, əsgər xəstəxanalarında hər hansı əsgər vəfat edərdisə, bu barədə dərhal əsgərin mənsub olduğu hərbi hissəyə xəbər verilsin və Daxili Xidmət Nizamnaməsində təsbit edilmiş qaydalar əsasında onun dəfni təşkil edilsin. Əmrdə göstərilirdi ki, dəfn mərasimi alay mollaları tərəfindən icra edilməlidir. Göstərilən tələblərin yerinə yetirilməsinə hər hansı biganəliyin yol verilməsi, nazirin fikrincə, müvafiq mollaların öz vəzifə borclarını lazımınca başa düşməməsi ilə bağlı idi və belələri dərhal tutduğu vəzifədən uzaqlaşdırılmalı idilər (91, v.203).

9 yanvar 1920-ci il tarixli 13 saylı əmrində də hərbi nazir bir sıra hərbi hissələrdə mollaların vəfat edənlərin lazımi qaydada dəfnini icra etmədiklərinə görə həm baş mollanın, həm də hissə komandirlərinin qarşısında çox ciddi tələblər qoyurdu (106, v.12).

1920-ci ilin yanvarında Hərbi Şura müzakirələrdən sonra vəfat edən hərbi qulluqçuların dəfni üçün zəruri olan vəsaiti təxminən iki dəfə artırdı (92, v.55).

Hərbi Nazirliyin rəhbərliyi qoşunların şəxsi hey'ətinin mə'nəvi əhval-ruhiyyəsinə, xidmətə qarşı formalaşan münasibətinə tə'sir göstərə biləcək bütün mövcud amilləri nəzərə almağa və onların reallaşdırılmasını qarşılıqlı şəkildə əlaqələndirməyə çalışırdı. Qoşunların mə'nəvi əvqatında nəzərəçarpacaq dəyişikliklərin yaranması da bu ardıcıllığın və sistemliliyin nəticəsi idi.

### 3. QARNİZON VƏ QAROVUL XİDMƏTİ

Azərbaycan Ordusunun sənədlərinin öyrənilməsi göstərir ki, xidmətin təşkili işində daim diqqət mərkəzində saxlanılan məsələlərdən biri də qarovul və qarnizon xidmətinin düzgün qurulması idi. Bu məsələ vaxtaşırı istər hissə komandirlərinin, istərsə də Hərbi Nazirliyin rəhbərliyinin imzaladığı əmrlərin obyektinə çevrilirdi. Həmin əmrlərdə mövcud olan nöqsanlar açıqlanır və onların aradan qaldırılması yolları göstərilirdi.

Qarovul xidməti sülh şəraitində qoşunların icra etdiyi ən başlıca döyüş tapşırığı kimi qəbul edilirdi və ona görə də həm qoşun komandirləri, həm də Hərbi Nazirliyin rəhbərliyi qarovula göndərilən şəxsi hey'ətdə yüksək məs'uliyyət, sərvaxtlıq, intizam, döyüş tapşırığının icrasına dəqiqlik aşılamağa çalışırdı. Xüsusən onlara verilmiş olan silahdan düzgün davranmaları, qarovul nəfərlərinin Nizamnamədən irəli gələn vəzifələrə riayət edilməsi bu xidmətin təşkili üçün irəli sürülən əsas tələblər idi. Lakin təəssüf ki, xidmətin təşkilinə məs'ul şəxslər tərəfindən lazımi diqqət yetirilmədiyi, qarovul nəfərlərinin öz vəzifələrini bilməməsi və bununla bağlı xidmətin tələblərinə riayət edilməməsi üzündən bə'zən çox kobud çatışmazlıqlar özünü göstərirdi. 1918-ci il dekabrın 2-də 2-ci Qarabağ süvari alayında döyüş patronları verilmiş süvarinin biri ehtiyatsızlıq üzündən açdığı atəşlə başqa bir süvarini öldürmüşdü. Alay komandiri polkovnik S.Əfəndiyev bu hadisə ilə bağlı imzaladığı əmrində göstərirdi ki, süvarilərin odlu silahla ehtiyatla davranmaması zabitlər tərəfindən şəxsi hey'ət arasında heç bir işin aparılmamasının, zabit sözünün heç bir hörmət və nüfuza malik olmamasının nəticəsidir. Alay komandiri qeyd edirdi ki, bütün xalqın böyük ümid bəslədiyi ordunun şəxsi hey'ətinə belə ehtiyatsızlıq üzündən xətər yetirilməsi yolverilməz bir haldır. Xidmətin tələblərinə əməl etməyib belə hallara səbəb olan əsgər isə vətənin və xalqın şərəfinin müdafiəçisi kimi bir adı daşımağa layiq deyil və beləlləri ordudan uzaqlaşdırılmalıdır (173, v.20).

S.Əfəndiyevdən sonra 2-ci Qarabağ süvari alayına komandir tə'yin edilmiş polkovnik Yadigarovun 1919-cu ilin fevralında imzaladığı daxili əmrlərdən görünürdü ki, hissədə qarovul xidmətinin təşkilində hələ də bir sıra nöqsanlar qalmaqdadır. Fevralın 18-də imzaladığı əmrdən mə'lum olur ki, alayın qarovul otağında bir nizamsızlıq hökm sürməkdədir. Qarovul rəisi özü xidmətin təşkilinə məsuliyyətlə yanaşmır, qarovul otağına gələn komandir və rəisləri qarşılamır, qarovul rəisinin vəzifələrindən isə heç xəbəri yoxdur. Onun məs'uliyyətsizliyi üzündən otaqlar təmizlənməmiş, inzibati qaydada həbs olunmuş əsgərlər yuxudan qaldırılmamışdı (174, v.4).

At tövlələrinə baş çəkərkən də polkovnik Yadigarov oxşar mənzərənin şahidi olmuşdu. Alay komandiri təəccüb edirdi ki, tövlələrin qorunmasına xidmət təcrübəsi olan əsgərlər deyil, hissəyə yenicə gətirilmiş və hələ hərbi geyim almamış şəxslər tə'yin edilmiş və hətta onlara odlu silah da verilmişdi (174, v.6).

Polkovnik Yadigarovun gəldiyi qənaət belə idi ki, bölmə komandirləri əsgərləri qarovula və sutkalıq naryadlara göndərməzdən qabaq onların öz vəzifəsini necə bilməsini yoxlamırlar, bu sahədə onlarla məşğul olmurlar. Ona görə də alay komandiri bütün komandirlərdən tələb edirdi ki, əsgərləri naryada və qarovula göndərməzdən əvvəl onlarla söhbət aparılsın, qarovulun və növbətçinin vəzifələrinə nə dərəcədə bələd olmaları yoxlanılsın (174, v.61).

Polkovnik Yadigarov öz əmrində qeyd edirdi ki, alay üzrə növbətçi tə'yin edilən alay zabitləri və bölük komandirləri qarovulun yoxlanılması qaydaları ilə bağlı Qarnizon Xidməti Nizamnaməsinin 126-cı maddəsini yerinə yetirmirlər. Həmin maddəyə görə naryadı başa vurmuş alay növbətçisinin köməkçisi dərhal poçt cədvəlini alay dəftərxanasının nizami hissəsinə təqdim etməlidir. Naryadı qəbul edən zabit isə naryadın şəxsi hey'ətinin düzülüşündən və yoxlanılmasından əvvəl yeni qarovul üçün həmin cədvəli oradan götürməlidir (174, v.62).

Qarovul xidmətinin təşkilində nöqsanlara yol verilməməsi üçün polkovnik Yadigarov başqa bir əmrində tələb edirdi ki, naryadı qəbul edəcək zabit gündüz saat 11.30-da yeni qarovulun şəxsi hey'ətini alay qərargahının qarşısındakı meydanda düzməli, onların sayını dəqiqləşdirməli, qarovul xidməti barədə biliklərini yoxlamalıdır. Burada naryadın bütün şəxsi hey'əti ilə tə'limat aparılmalı və hər şeyin qaydasında olduğuna əmin olduqdan sonra onlar azad edilməlidir. Bundan başqa, polkovnik Yadigarov bölmə komandirlərindən də tələb edirdi ki, tez-tez qışlaları və tövlələri yoxlasınlar, xüsusilə də gecə vaxtı qarovul xidmətinin necə yerinə yetirilməsini nəzarət altında saxlasınlar (174, v.99, 105).

Qarovul xidmətinin təşkilinə tez-tez toxunan digər hissə komandirlərinin imzaladığı əmrlərdən aydın olur ki, mövcud olan nöqsanların çoxu, zabitlərin, bölmə komandirlərinin qarovulun şəxsi hey'ətinin naryada hazırlaşdırılmasına kifayət qədər məs'uliyyətlə yanaşmamasının nəticəsidir. Hərbi məktəbin rəisi polkovnik R.Şıxlinski də daxili əmrlərdə məktəb növbətçiləri olan zabitlərin öz vəzifələrini bilməməsini, naryadların düzgün tə'yin etməyi bacarmamasını, bə'zən qarovul yerinə gün növbətçisinin göndərildiyini qeyd edirdi. Bir çox zabitlər isə hansı bölmələrin naryada cəlb edilib edilməyəcəyi barədə heç təsəvvürə də malik deyildilər (158, v.45).

2-ci piyada diviziyasının komandiri də qarovul xidmətinin təşkili ilə bağlı əmrlərində göstərirdi ki, dəfələrlə yoxlanılmasına, iradlar söylənilməsinə baxmayaraq qarovulun çinləri öz vəzifələrini çox zəif bilirlər, hətta qarovul rəisi tə'yin edilən zabitlər Qarnizon Xidməti Nizamnaməsi ilə yaxşı tanış deyildirlər. Qarovul yoxlanılmır, yoxlanılırsa da bu barədə kitabda müvafiq qeydlər edilmir. Diviziya komandiri hissə növbətçilərindən və qarovul rəislərindən tələb edirdi ki, naryadı qəbul etməzdən əvvəl saatdarların və saatdarların dəyişdiricilərinin öz vəzifələrini necə bilmələrini yoxlasınlar və onlara tə'limat versinlər (156, v.33).

Qarovul çinlərinin öz vəzifələrini kifayət qədər bilməmələrini hərbi nazir də öz əmrlərinin birində qeyd edirdi. O göstərirdi ki, postda dayanan saatdarlar hətta mənim yanımda gəlib-gedənlərlə danışır, onlardan hədiyyə alır, bə'zən lazım olan şəxsləri içəri buraxmırlar. Qarovul otağında kənar adamları görmək mümkündür. Bunu müvafiq şəxslərin nəzərinə çatdırmaqla nazir tələb edirdi ki, belə hallara son qoyulmalı, qarovul xidməti müvafiq normalar çərçivəsində təşkil edilməlidir (91, v.71).

Təkcə hissələrin daxilində deyil qarnizon obyektlərində də qarovul xidmətinin təşkilində bə'zən oxşar nöqsanlarla rastlaşmaq mümkün idi. Bakı qarnizonunun rəisi qarnizon qauptvaxtında qarovul xidmətinin yarıtmaz təşkil edilməsi ilə dəfələrlə rastlaşmışdı və söylədiyi iradlar da yerinə yetirilməmiş qalmaqda idi. 6-cı Göyçay piyada alayının nəzdində olan bu obyektdə də nə qarovul rəisləri, nə də qarovulun digər çinləri vəzifələrinin nədən ibarət olması barədə ən adi təsəvvürlərə malik deyildilər. Qarovulun şəxsi hey'əti müəyyənləşdirilmiş yerdə düzülmürdü, əsgərlərin çoxu "qarovul" komandası verilən zaman tüfəngin necə tutulmasını bilmirdilər, qarovulun patron sumkası yox idi, patronlar stol üzərinə qalaqlanırdı, posta göndərilən qarovullar patronsuz yola salınırdı, qarovul otağında Qarnizon Xidməti Nizamnaməsi yox idi, hərbi nazirin və hökumətin sədrinin mühafizəsi üçün tə'yin olunmuş postlara göndərilən saatdarların xarici görkəminə diqqət yetirilmirdi (156, v.46).

Hərbi Nazirliyin bərpasının ilk aylarından Gəncə şəhərində komendatura yaradılmışdı. Hərbi Nazirliyin aparatı və bir sıra hissələrin qərargahı da Gəncədə yerləşirdi. Nazirliyin əsas idarəetmə orqanları və strukturları



Gəncədə yerləşdiyindən burada qarnizon və qarovul xidmətinin təşkilinə xüsusi fikir verilirdi. Qarnizon üzrə naryadlar və qarovul postları müəyyənləşdirilmişdi və bu xidmətlər qarnizonda yerləşən hissələrin şəxsi hey'əti tərəfindən yerinə yetirilirdi. Gəncə qarnizonu rəisinin əmri ilə 1919-cu ilin fevralından e'tibarən 1-ci Tatar süvari alayı və 3-cü Gəncə piyada alayı gündəlik 5 nəfər aşağı çinli hərbi qulluqçunu silahlandırıb şəhər komendantının sərəncamına göndərməli idi. Həmin silahlılar ya şəhərə patrul kimi, ya mühüm obyektlərin qarovuluna göndərilir, ya da gözlənilməz hadisələrin aradan qaldırılması üçün komendaturada növbədə saxlanılırdı. Eyni zamanda qarnizon rəisi qarnizonun hissə komandirlərinə göstəriş vermişdi ki, gecə vaxtı şəhərciklərin ətrafına xüsusi patrullar, icazəsiz hissədən çıxmışlar saxlanılsın və müvafiq qaydada cəzalandırılsınlar (154, v.1).

Qarnizon rəisinin əmri ilə 1-ci Tatar süvari alayı və 3-cü Gəncə piyada alayı eyni zamanda 1919-cu ilin mart ayından başlayaraq növbətçi taqım tə'yin etməli idi. Bu taqım bütün şəxsi hey'ət ilə, hissə daxilində bütün texizatı ilə birlikdə döyüş tapşırığını icra etməyə hazır dayanmalı və həyəcan siqnalı veriləcəyi təqdirdə müəyyənləşdirilmiş nöqtədə yoxlanmalı idi. Həyəcan siqnalı e'lan edildiyi vaxt Tatar süvari alayı bir süvarini çapar sifəti ilə komendantın sərəncamına göndərməli idi. (154, v.2).

1919-cu il iyunun sonlarından 1-ci piyada diviziyasının komandiri polkovnik C.Şıxlinski Gəncə qarnizonunun rəisi tə'yin edildi. Onun qarnizon rəisi tə'yin edilməsi ilə qarnizon xidmətinin təşkilinə irəli sürülən tələblər daha da kəskinləşdirildi. Yalnız qarovul və naryadların tə'yin edilməsinə, onların öz vəzifələrini yerinə yetirməsinə deyil, bütünlükdə qarnizonda nizam-intizama əməl olunmasına, xidmət normalarına riayət edilməsinə nəzarət daha da gücləndirildi. Qarnizon rəisinin əmri ilə qarnizon üzrə aşağıdakı qarovul naryadları müəyyənləşdirilmişdi (bax:154, v.28).

**Əsas qarovul üzrə:**

1) Qarnizon qauptvaxtı və ləvazimat anbarları – 3 nəfər
2) Hərbi aptek anbarı – 2 nəfər
3) Gəncə quberniya xəzinədarlığı - 3 nəfər keşikçi qarovul
4) Hərbi Nazirliyin binası – 1 nəfər
5) Əsgər xəstəxanası – 1 nəfər
6) 1-ci piyada diviziyası qərargahının qarajı – 1 nəfər

Hərbi Nazirliyin aparatı Bakı şəhərinə köçürüləndən sonra buradakı komendaturanın səlahiyyətləri xeyli genişləndirildi. Bununla bağlı Hərbi Nazirliyin dövlət orqanları qarşısında qaldırdığı vəsatətdə deyilirdi ki, Bakıda yerli qarnizondan başqa xarici qoşunlar da var. Onların şəhərdəki davranışının təmizlənməsi, hərbçi olmayan şəxslərin hərbi geyimdə olmasına yol verilməməsi və qarnizon xidmətinin daha yaxşı təşkili üçün digər dövlətlərin paytaxtında olduğu kimi Bakıda da xüsusi komendatura yara-

dılması məqsədəuyğun olardı. Şəhər komendantının səlahiyyətlərinin diviziya komandirinin səlahiyyətlərinə bərabər tutulması təklif olunurdu (101a, v.3). 1919-cu il avqustun 1-də səlahiyyətləri genişləndirilmiş olan Bakı komendantı vəzifəsinə general-mayor Firudin bəy Vəzirov tə'yin edildi. (153, v.50). F.Vəzirov bu vəzifəyə tə'yin olunanda 69 yaşı var idi. Zabitlik təcrübəsi, ordu quruculuğuna verə biləcəyi xidmətləri nəzərə alınaraq o, Hərbi Nazirliyin rəhbərliyi tərəfindən ordu sıralarına də'vət edilmişdi. F.Vəzirov da bu də'vəti böyük məmnuniyyətlə qəbul etmiş, biliyini, bacarığını Azərbaycan Ordusunun möhkəmləndirilməsinə sərf etməyə razı olmuşdu (269, v.168).

Şəhər komendantlarının, qarnizon rəislərinin qarşısına qoyulan başlıca vəzifə qarnizon xidmətinin düzgün təşkilinə, qarnizon daxilində nizam-intizama, hərbi davranış normalarına riayət edilməsinə nail olunması idi.

Hələ 1918-ci ilin dekabrında polkovnik İvanovu Gəncə şəhərinin müvəqqəti komendantı tə'yin etməsi ilə bağlı əmrində S.Mehmandarov bildirirdi ki, vəzifəsinin icrasına başlamaqla o, Qarnizon Xidməti Nizamnaməsi əsasında öz işini qurmalı, qarnizona gələn bütün zabitlərin uçotunu aparmalı, mə'zuniyyətə və e'zamiyyətə gəlmiş zabitlərdən müvafiq sənədləri tələb etməli, davranış normalarını nəzarət altında saxlamalı, bütün hərbi qulluqçuların, o cümlədən mülki mə'murların geyim formalarını pozmasına yol verməməli idi. Elə həmin əmrdə qeyd edilirdi ki, Azərbaycan Ordusu sıralarında xidmət etməyən zabitlərin (üzürlü səbəblər istisna olmaqla) Azərbaycan ərazisində hərbi geyimdə gəzmələri qadağandır. Bu tələb də qarnizon xidmətinin təşkilinə məs'ul olan şəxslər tərəfindən həyata keçirilməli idi (86, v.42).

Qarnizon xidmətinin təşkilində daha çox irad doğuran məqamlar hərbi qulluqçuların geyim formalarını pozması, hissədən kənarda, ictimaiyyət arasında hərbi davranış normalarına riayət etməməsi ilə bağlı idi. Geyim formasının pozulması daha çox zabitlər arasında qeydə alınırdı. Heç şübhəsiz ki, əsgərlər arasında da belə hallar istisna deyildi. 2-ci Qarabağ süvari alayının komandiri daxili əmrlərinin birində bütün bölmə komandirlərindən tələb edirdi ki, təsdiq edilməmiş geyim növlərindən istifadə edilməsinə yol verilməsin, paqonsuz hərəkət edilməsinə isə birdəfəlik son qoyulsun (174, v.225).

Hərbi nazir S.Mehmandarov 1919-cu ilin iyun ayında imzaladığı əmrlərdən birində göstərirdi ki, bir çox topçu əsgərlər, hətta bir sıra zabitlər qırmızı lampaslı şalvarlar geyirlər. Halbuki Azərbaycan Ordusu üçün təsdiq edilmiş geyim formasında belə bir element yox idi. Ona görə nazir həm hissə komandirlərindən, həm də qarnizon rəislərindən tələb edirdi ki, geyim formalarına riayət edilməsinə nail olunsun (90, v.10).

Azərbaycan Ordusu sıralarında xidmət etməyən bir çox zabitlər üzərində "Azərbaycan" sözü yazılmış paqonlar gəzdirirdilər. Azərbaycan Ordusu sıralarında xidmətə qəbul edilmiş bir sıra gürcü zabitləri isə üzərində gürcü simvolları olan paqonlar və furajkalar istifadə edirdilər. Hərbi nazir hər iki halın qarşısının alınmasını tələb edirdi. Xidmətə yenicə qəbul edilmiş gürcü zabitlərinə Azərbaycan Ordusunun geyim forması ilə təsdiq olunmuş papaq və paqonların əldə edilməsinə bir ay vaxt ayrılırdı. Bu vaxt ərzində geyim formasını sahmana salmayan zabitlərə qarşı müvafiq tədbirlər görülməli idi (90, v.31).



Hərbi nazir eyni zamanda qarnizonların rəislərindən, şəhərlərin və dəmiryolu stansiyalarının komendantlarından tələb edirdi ki, e'zamiyyətə gəlmiş zabitlər istisna olmaqla Gürcüstan və Ermənistan zabitlərinin Azərbaycan ərazisində hərbi formada gəzməsinə imkan verməsinlər (106, v.75).

Hərbi nazirin müşahidələrinə görə, Azərbaycan və Gürcüstan ordularından tərxis edilmiş zabitlər, habelə bir sıra keçmiş rus ordusu zabitləri paqonlarını çıxarsalar da, dəmir düymələri, rəngli yaxalıqları olan hərbi palto, kokardalı furajka, dəmir düyməli səfər mundiri, baftalı və kantlı şalvarlar geyinir, kütlə arasında seçilir, əhalidə və əsgərlərdə onların ordu zabiti olması təsəvvürü yaradırdı. Ona görə də tələb olunurdu ki, furajkadan kokarda, səfər mundirindən və paltolardan dəmir düymələr, rəngli yaxalıqlar, şalvardan baftalar qoparılsın. Bütün bunlara əməl olunmasına nəzarət qarnizon rəislərinə və şəhər komendantlarına tapşırılırdı (106, v.75).

Qarnizonlarda geyim formasına tutulan iradlardan biri də polislərin hərbi geyim elementlərindən istifadə etməsi ilə əlaqədər idi. Onlar hərbi formaya oxşar forma və üstündə "Azərbaycan" sözləri yazılmış olan paqonlar geyirdilər. Hərbçilərə isə küçədə rastlaşanda hərbi salam vermirdilər. Bu əsgərlər arasında çaşqınlıq, əhali arasında isə ordu daxilində intizamsızlığın mövcud olması təəssüratı yaradırdı. Gəncə şəhər komendatı məsələ ilə əlaqədar ölçü götürülməsi üçün Hərbi Nazirliyin rəhbərliyinə, hərbi nazirin müavini Ə.Şıxlinski isə Daxili İşlər nazirinə müraciət etdi (160, v.62,65).

Müxtəlif təşkilatların əməkdaşlarının hərbi geyimdən istifadə edilməsinə son qoyulması üçün hərbi nazir S.Mehmandarov məktubla Nazirlər Şurasının sədrinə müraciət etdi. Məktubda bildirilirdi ki, təkcə polislər deyil, bir sıra digər strukturların əməkdaşları da heç bir maneəçilik olmadan malik olduqları hərbi geyimlərdən istədikləri vaxt istifadə edirlər, kütlə arasına çıxırlar. Bu isə həm əhalidə, həm də mətbuatda söz-söhbətə səbəb olur və həmin adamların günahları ordunun ayağına yazılırdı. Ona görə də hərbi nazir xahiş edirdi ki, hərbi geyimlərdən belə sui-istifadə edilməsinə, onların mülki paltar yerinə geyilməsinə icazə verilməsin (160, v.189).

Orduda xidmət edən zabitlərin özlərinin də bə'zi geyim formasından sui-istifadə etməsi hallarına təsadüf olunurdu. Bir çox zabitlər növbəti rütbəyə təqdimat yazılan kimi müvafiq əmrin olmamasına baxmayaraq dərhal

paqonlarını dəyişdirir, həqiqi rütbələrindən yuxarı rütbə paqonu daşıyırdılar. Süvari hissələrinə dəyişdirilmiş bə'zi piyada zabitləri isə özlərini süvari zabiti hesab edir və süvari zabit kimi təqdim edirdilər. Halbuki piyada zabitinin süvari qoşunlarına daxil edilməsi və bununla da onların özlərini süvari zabiti adlandırması üçün hərbi nazirin xüsusi əmri olmalı idi (152, v.52).

Geyim formasına riayət edilməsi ilə bərabər Hərbi Nazirliyin rəhbərliyi zabitlər və əsgərlər tərəfindən hərbi davranış normalarına riayət edilməsini də ciddi nəzarət altında saxlayırdılar. S.Mehmandarov hələ 1919-cu ilin mart ayında Gəncə komendantına əmr etmişdi ki, polislərlə birlikdə Gəncədə yaşayan və xidmətdə olmayan bütün zabitlər qeydiyyata alınsınlar. Çünki bu zabitlərin çoxu hərbi formada şəhər arasında zabit şərəfinə ləkə gətirən hərəkətlər edərək camaat arasında haqlı narazılığa səbəb olurdular. Əhalidə onları Azərbaycan Ordusunun zabitləri hesab etdiklərindən öz narazılıqlarını ordu ilə bağlayırdılar (152, v.109).

1919-cu ilin sentyabr ayında oxşar əmri Bakı şəhər qarnizonunun rəisi də imzalamışdı. O, Bakıda rəsmi xidmətdə olan xarici dövlətlərin zabitlərindən başqa bütün digər zabitlərin qeydiyyatdan keçməsini tələb edirdi. Bu tədbir üçün bir həftə vaxt ayrılmışdı. Həmin vaxt ərzində qeydiyyatdan keçməyənlər şəhərdən xaric edilməli idi (11, 12.09.1919).

Hərbi salamın verilməsi həm zabitlər, həm də əsgərlər arasında hərbi intizamın vacib elementlərindən biri sayıldığı üçün ona riayət edilməsi həm hissə, həm də qarnizon daxilində daimi diqqət altında idi. Hərbi nazirliyin rəhbərliyi bu elementin icrasına komandirlərin nüfuzunu saxlayan, şəxsi hey'ətə intizam vərdişlərini aşılayan lazımlı bir hərəkət kimi baxırdı və ona riayət edilməməsini hərbi intizamın kobud şəkildə pozulması kimi qiymətləndirirdi. İngilis jurnalisti Skondand Liddel Azərbaycan Ordusundakı intizamın möhkəmliyindən yazarkən küçələrdə qarşılaşan əsgər və zabitlərin bir-birinə hərbi salam vermələrini xüsusilə qeyd edir və əlavə edirdi ki, Kerenski hökumətinin ordusunun çox böyük sür'ətlə dağılmasının, öz intizamını itirməsinin əsas səbəblərindən biri də əsgər və zabitlər arasında hərbi salam verilməsinin ləğv edilməsi idi (79, v.39).

Zabitlər arasında hərbi salam verilməməsi hallarının heç biri məs'ul şəxslərin, o cümlədən Hərbi Nazirliyin rəhbərliyinin diqqətindən kənarda qalmırdı. Hərbi salamın verilməməsinə görə zabitlərin hətta həbs edilməsi, sonra da ordu sıralarından xaric edilməsi faktları da mövcuddur (131, v.31).

Qarnizon xidmətinin təşkilində xüsusi təşvişlə qarşılanan məsələlərdən biri əsgərlərin hissədən kənarda intizamsızlıqlar törətməsi, bə'zən də cinayət hərəkətlərinə əl atması idi. Belə halların qarşısının alınması üçün Hərbi Nazirliyin rəhbərliyi çox barışmaz mövqedə dururdu. Hərbi nazir öz əmrlərində bir neçə dəfə qeyd etmişdi ki, qatarlarda çoxlu əsgər və zabit olmasının qarşısı alınsın. Onlar çox vaxt xidməti mövqelərindən istifadə edərək qatarlara pulsuz minir və sərnişinlər arasında narahatçılığa



səbəb olurdular (86, v.4). Onların bə'ziləri hətta sərnişinlər arasında qanunsuz axtarışlar da aparırdılar. S.Mehmandarovun 27 dekabr 1918-ci il tarixdə imzaladığı 35 saylı əmrdə göstərilirdi ki, Hacıqabulda yerləşən 2-ci piyada alayının hərbi qulluqçuları burada sərnişinlər arasında özbaşına axtarışlar aparmış və onların bə'zi əşyalarını özləri ilə götürmüşdülər. Alay komandirindən tələb olunurdu ki, bu şəxsləri aşkar etsin, əsgərlər Hərbi məhkəməyə verilsin, zabitlər isə xidmətdən xaric olunmaq üçün təqdim edilsinlər (86, v.43).

1919-cu ilin martın 8-də Gəncədə 3-cü piyada alayının 6 əsgərinin yoldan keçənləri soyması faktı mə'lum olan kimi onlar dərhal Hərbi Səhra məhkəməsinə verilmiş və bir həftədən sonra bu məhkəmədə ölüm cəzasına məhkum edilmişdilər. Oğurluq hallarının Azərbaycan əsgərinin şərəfini necə ləkələdiyini və belə halların cəzasız qalmayacağını nümayiş etdirmək üçün Hərbi Səhra məhkəməsinin qərarı hərbi nazirin əmri ilə bütün qarnizon qarşısında e'lan edildi. Bunun üçün 1919-cu il martın 14-də saat 12-də 3-cü Gəncə alayının 5-ci bölüyü tam hey'ətdə, digər bölüklərdən isə bir taqım Gəncənin Topçu meydanına çıxarıldı. Bura 1-ci Tatar süvari alayının, Praporşiklər məktəbinin, 1-ci topçu divizionunun, İstehkam məktəbinin hər birindən bir taqım da çıxarılmışdı. Hərbi bölmələrin hamısı silahla meydanda düzülmüş və Hərbi Səhra məhkəməsinin qərarı onlara e'lan olunmuşdu (152, v.116). Mə'lumdur ki, sonradan Novruz bayramının gəlişi münasibətilə hərbi nazir onları əfv etmiş, ölüm cəzasını 6 illik həbslə əvəz etmişdi. Bununla belə, nazir bu hadisənin çox ciddi şəkildə araşdırılmasını tələb edirdi. Nazir təəccüb edirdi ki, 3-cü Gəncə piyada alayının 5-ci bölüyündən olan həmin əsgərlər necə olmuşdu ki, icazəsiz şəhərə çıxmış, cinayət törətmişlər və heç kəsin də bundan xəbəri olmamışdı. Yalnız axşam saat 9.30-da komendant hadisədən xəbər tutmuş və Dondukov küçəsində onları tərksilah edərək həbsə almışdı. Həmin gün 3-cü piyada alayının pulemyot komandasının bir neçə kiçik çini də icazə vərəqi olmadan şəhərdə gəzdikləri vaxt yaxalanmışdır.

3-cü piyada alayında belə özbaşınalıqların mövcud olmasına görə hərbi nazir ilk növbədə hissə komandirini günahlandırır və hissədə daxili xidmətin düzgün təşkili üçün tə'cili tədbirlər görülməsini tələb edirdi. Nazirin bu məsələ ilə bağlı imzaladığı müvafiq əmrdə vurğulanırdı ki, hissədən kənara buraxılmasına, şəxsi hey'ətin axşam yoxlanışına, xidmətdən sonra zabitlərin qışlalara baş çəkməsinə, əsgərlərin daimi nəzarət altında saxlanmasına xüsusi diqqət yetirilsin (152, v.109).

Həyata keçirilən qətiyyətli tədbirlər əsgərlərin hissədən kənarda davranış normalarına riayət etmələrinə müsbət tə'sir göstərsə də, bə'zi nöqsanlar qalmaqda idi. Qarnizon xidmətinin və eləcə də əsgərlərin mə'nəvi tərbiyəsinin təşkilində azacıq səhlənkarlığa yol verilməsi müvafiq nəticələri ilə Hərbi Nazirliyin rəhbərliyinin də narahatçılığına səbəb olurdu. Hərbi

nazirin 18 iyun 1919-cu il tarixdə imzaladığı 302 saylı əmrindən aydın olur ki, Gəncə qarnizonunun bə'zi hissələrinin əsgərləri şəhərin ermənilər yaşayan hissəsində avara-avara veyillənir və küçədən keçən qadınlara söz atırlar. Ayrı-ayrı əsgərlərin belə özbaşınalığı Hərbi Nazirliyin rəhbərliyinin ciddi təşvişinə səbəb olmuş və çox böyük nigarançılıqla qarşılanmışdı. Adı çəkilən əmrdə bu hadisəyə belə qiymət verilirdi: "Əsgərlər arasındakı bu özbaşınalıq yolverilməzdir. Əsgərlər hər yerdə və həmişə dinc əhalinin müdafiəçiləri olmalıdırlar, yoxsa qarnizonda təsadüf edildiyi kimi asayişi pozmamalıdırlar. Əsgərlər arasında qadınlara sataşma hallarını isə mən xüsusi təəssüflə qeyd edirəm. Hansı ki, müsəlmanlar arasında qadına ehtiram həmişə ən yaxşı keyfiyyətlərdən biri olmuşdur. Əsgərlərin küçədə nalayiq hərəkətləri hissələrdə əsgərlərin şəhərə buraxılması üzərində nəzarətin olmamasından, habelə əsgərlərin əxlaqı tərbiyəsinə diqqət yetirilməməsindən xəbər verir" (90, v.1).

Hərbi nazir bildirirdi ki, gələcəkdə əsgərlər belə hərəkətlərə yol verərlərsə, onların mənsub olduqları hissələrin zabitləri və komandirləri ciddi məsuliyyətə cəlb ediləcəklər (90, v.1).

Hissələrdən kənara buraxılanların hərəkətlərinin nəzarət altında saxlanması və nizamlanması üçün Ərkani-hərbin rəisi general-leytenant Sulkeviç bütün hissə komandirlərindən tələb edirdi ki, belə əsgərlərə ya xüsusi nişan, ya da təsdiqlənmiş icazə sənədi verilsin (142, v.14).

2-ci Qarabağ süvari alayının komandiri verdiyi əmrlə bölmə komandirlərindən tələb edirdi ki, hətta xidməti işlər üçün də əsgərlərin tək-tək şəhərə və bazara buraxılmasına son qoyulsun. Onun fikrincə, belə işlərin icrası üçün xüsusi qrup yaradılmalı və bir nəfər zabit də həmin qrupun rəhbəri tə'yin edilməli idi (174, v.227).

2-ci piyada diviziyasının komandiri də əsgərlərin hissədən kənara buraxılmasını və qarnizon daxilində onların hərəkətlərini nəzarət altında saxlamağa imkan verən əmrlər imzalamışdı. İlk növbədə tələb olunurdu ki, hissədən kənara buraxılan əsgərlər intizamlı davranmağı, qarşısına çıxan zabitlərə hərbi salam verməyi bacarmalıdır. İcazənin müddəti üçün məhdudiyyət də qoyulurdu.

Diviziya komandirinin əmrlərindən birində isə əsgərlərin tək-tək kino və teatra buraxılmasına qadağa qoyulurdu. Verilən göstərişə görə kino və teatrlara ən azı 5 nəfərdən ibarət olan qrup buraxılmalı və qrup üzvlərindən biri böyük tə'yin edilməli idi. İstirahət ocaqlarına bütöv bir bölmə getdikdə isə zabitlərdən biri onun rəhbəri tə'yin edilməli idi (156, v.10).

Zabitləri narahat edən məsələlərin müzakirəsi, onların sosial qayğısının gücləndirilməsi, asudə vaxtlarının təşkili üçün Qarnizon əsgəri iclasları yaradılmışdı. Bu strukturların formalaşdırılması üçün Nazirliyin fondundan maliyyə vəsaiti ayrılırdı (153, v.6). Qarnizon əsgəri iclaslarının icraçı komitələri seçilirdi (176, v.113). Qarnizon əsgəri iclası üzvlərinin 2/3 hissəsi



iştirak etdikdə səlahiyyətli sayılırdı (154, v.30). Bu qurumun üzvləri üzvlük haqqı da verməli idi. Gəncə qarnizonunun zabitləri üçün bu üzvlük haqqı məvacibin bir faizi həcmində müəyyənləşdirilmişdi (154, v.56).

Xankəndi qarnizonunun əsgəri iclasında isə üzvlük haqqı belə müəyyənləşdirilmişdi-qərargah zabitləri üçün 30 rubl, böyük zabitlər üçün - 20 rubl və podpraporşiklər üçün - 10 rubl. 1919-cu il mayın 13-də burada keçirilmiş iclasda o da qərara alınmışdı ki, Şəfqət bacıları da Qarnizonun hərbi iclaslarına üzv qəbul olunsunlar və onlar üçün 5 rubl həcmində üzvlük haqqı müəyyənləşdirilsin (174, v.113).

Xankəndi qarnizonunun əsgəri iclasında bir qrup zabit yumoristik jurnal hazırlayırdı. Bir neçə nömrədən sonra qarnizon rəisi bu jurnalın buraxılmasını məqsədəuyğun bilmədi. Öz qərarını o bununla əsaslandırırdı ki, adi zarafat üçün hazırlanmış yazı və ya rəsm zabiti gülüş obyektinə çevirir, onun şəxsiyyətinə hörmətsizlik yaradırdı. Belə zarafatlar bə'zən zabitin heysiyyətinə toxunur və münaqişələrə səbəb olurdu. Qarnizon rəisi bildirirdi ki, bir zabitin digərinə zarafat etməsi ictimai şəkildə deyil, məhdud dairədə, yaxın yoldaşlar arasında baş verə bilər. Ancaq onun jurnal səhifəsinə çıxarılması və ictimaiyyətə çatdırılması əslində bu jurnalın hazırlanması zaman qarşıya qoyulmuş məqsədə uyğun deyildi. Ona görə də jurnalın hazırlanmasının nəinki dayandırılması, həm də buraxılış nömrələrin də məhv olunması əmr edilirdi (174, v.118).

Qarnizon miqyasında planlaşdırılan və həyata keçirilən mühüm tədbirlərdən birini tarixi günlər və bayramlar münasibətilə keçirilən paradlar təşkil edirdi. Bu böyük tədbirlərə bayram xarakteri verilir və onun keçirilməsinə xüsusi hazırlıq işləri görülürdü. Hərbi paradlar həm də formalaşmaqda olan Azərbaycan Ordusunun gücünün və qüdrətinin nümayişinə çevrilirdi.

Azərbaycan Ordusunun ilk paradı 1919-cu ilin Novruz bayramında keçirildi. Parad əvvəlcə martın 22-nə planlaşdırılsa da sonradan martın 24-nə dəyişdirildi. Nazirin əmrinə əsasən paradda Gəncə qarnizonunun hissələri, habelə 1-ci Cavanşir piyada alayının bir bölüyü, 2-ci Bakı piyada alayının isə bir taboru iştirak etməli idi. Parada hazırlıqla bağlı nazirin əmrində göstərilirdi ki, paradın keçirilməsinə xüsusi hazırlıq görülməli və ona azad Azərbaycan xalqının milli bayramı xarakteri verilməlidir. Nazir tələb edirdi ki, parada çıxarılan şəxsi hey'ət yeni və bir tipli formada olmalı, görkəmlərinin şaxlığına fikir verilməlidir (94, v.8,23).

Azərbaycan Ordusunun növbəti paradı 1919-cu il mayın 28-də Azərbaycanın istiqlaliyyətinin bir illiyi münasibətilə keçirildi. Hərbi nazirin əmri ilə həmin gün Gəncə qarnizonunun paradı Topçu meydanında olmalı idi. Parada Praporşiklər məktəbinin bir bölüyünün, 1-ci topçu briqadasının iki batareyasının, 3-cu Şəki süvari alayının 2 süvari bölüyünün çıxarılma-

sına göstəriş verilmişdi. Bölüklər sıraya 32 cərgədə dayanmalı idilər. Ayın 27-də təbilçilərin iştirakı ilə baş məşq keçirilməli və mayın 28-də saat 10-da paradın bütün şəxsi hey'əti meydanda öz yerlərini tutmalı idilər. Paraddan əvvəl Nazirliyin baş mollası tərəfindən təntənəli dua mərasimi keçirilməsi nəzərdə tutulmuşdu. Qarnizonun bütün zabitləri təntənəli dua mərasimində və paradda iştirak etməli və meydanın sol cinahında toplaşmalı idilər. Parada komandanlıq etmək 3-cü Şəki süvari alayının komandiri polkovnik Xosrov Mirzə Qacara həvalə olunmuşdu (94, v.42).

1919-cu il mayın 28-də Bakı qarnizonunda da qoşun hissələrin paradı keçirildi. Gündüz saat 1-də "Azadlıq" meydanında təşkil edilmiş parada piyada bölmələri və hökumət orqanlarının mühafizə bölüyü çıxarılmışdı. Paradı hərbi nazir S.Mehmandarov qəbul edirdi (11, 31.05.1919).

Gəncə qarnizonunda yerləşən qoşun hissələrinin 1919-cu il iyunun 30-da Ramazan ayının başlaması münasibətilə, həmin il sentyabrın 6-da Qurban bayramı münasibətilə paradı keçirildi (153, v.4; 154, v.50).

1919-cu il sentyabrın 15-də isə həm Gəncədə, həm də Bakıda daha təntənəli bir parad keçirildi. Bu parad Bakı şəhərinin bolşevik-daşnak qüvvələrindən azad edilməsinin 1 illiyinə həsr edilmişdi. Bakıdakı parad bulvarla üzbəüz olan Naberejnıda olmalı və ona Praporşiklər məktəbinin komandiri polkovnik R.Şıxlınski komandanlıq etməli idi (159, v.68). "Azərbaycan" qəzeti qoşun hissələrinin parada gəlməsini belə təsvir edirdi. "Qoşunların qarşısında bir neçə generalın və ordunun yüksək çinlərinin müşayəti ilə at belində igid hərbçi, ordumuzun təşkilatçısı, tam artilleriya generalı Səməd bəy Mehmandarov gedirdi. Onlar şəhərin Şamaxı küçəsinə daxil olanda çoxsaylı publikanın gurultulu alqışları qopdu... Qoşunlar keçən küçələr adamlarla dolu idi. Hətta evlərin damları da "Yaşasın Azərbaycan" "Yaşasın bizim əsgərlər" şüarları qışqıran qadın və uşaqlarla tutulmuşdu" (11, 17.09.1919).

Qoşun hissələrinin növbəti paradı 1920-ci il yanvarın 14-də keçirildi. Bu parad müttəfiq dövlətlər tərəfindən Azərbaycanın istiqlaliyyətinin tanınmasına həsr edilmişdi. Hərbi nazirin əmri ilə Azərbaycanın istiqlaliyyətinin tanınması bütün qarnizonlarda təntənəli şəkildə qeyd edildi və paradlar keçirildi (157, v.17).

Nəhayət, 1920-ci il martın 20-də Azərbaycan Ordusunun qoşun hissələrinin sonuncu paradı keçirildi. Şahidlərdən biri bu paradı sonralar belə xatırlayırdı: "1920 sənəsi 22 mart Novruz bayramı münasibətilə icra edilən son rəsmi keçidi dəxi təxəttür etməmək qeyri-mümkündür. Əcaba hansı azərbaycanlı o məs'ud günü xatırlamır? Ordunun qabiliyyət və intizamı, mə'nəviyyatı təsəvvürün fövqündə idi. Əcnəbi səfirləri az bir zamanda, vasitəsizlik içində, bu qədər münəzzəm təşkilata malik bir əsgəri-qüvvət vücudu gətirildiyinə heyran qalırdı. Əhalidən bir çoxu duyduğu fərd məhzuziyyətdən ağlayırdı O gün Azərbaycanın ən şanlı, ən bəxtiyar günü idi. Fəqət... Fəqət. Azərbaycan Ordusunun son rəsmi-keçidi idi"(262).

Azərbaycan Ordusunun formalaşdırılması, ilkin təşkilati problemlərin həlli real, obyektiv çətinliklərlə qarşılaşsa da, qoşun hissələrinin tə'lim-tərbiyəsinə, ən qısa zaman ərzində onların döyüşkən və mübariz hissələrə çevrilməsinə diqqət bir an da olsa nəzərdən qaçırılmırdı. Döyüşçü hissəyə daxil olduğu gündən onun tə'lim-tərbiyəsinə başlanırdı. Qış və yay tə'lim mərhələləri üzrə tə'lim-tərbiyə proqramları hazırlanır və bunun əsasında dərslər keçirilirdi. Hissələrin komplektləşdirilməsinin xüsusiyyətləri ilə əlaqədər olaraq tə'lim-tərbiyə proqramı bütün mərhələ üçün deyil, mərhələ daxilində bir neçə dövr üçün hazırlanırdı. Döyüş hazırlığının nəzəri məsələləri ilə praktiki tərəfi üzvi şəkildə əlaqələndirilirdi. Hissələrin tə'lim meydanlarında bütün təmrinlər sistemli şəkildə yerinə yetirilirdi. Zabitlərin çatışmaması, hissələrə yeni əsgərlərin az-az gətirilməsi, döyüş tapşırıqlarının icrası, mülki hakimiyyət orqanlarına vaxtaşırı göstərilən köməklər döyüş hazırlığının ümumi ahənginə mənfi tə'sir göstərsə də mövcud olan bütün imkanlar səfərbərliyə alınırdı. Başlıcası isə şəxsi hey'ətdə vəzifə borclarına şüurlu münasibət formalaşdırılmasına, əsgər və zabitlərin mə'nəvi tərbiyəsinə böyük əhəmiyyət verilirdi. Bu istiqamətdə hərbi qulluqçuya qayğı ilə tələbkarlıq düzgün əlaqələndirilirdi. Qoşunların şəxsi hey'ətinin mə'nəvi tərbiyəsi hərb işinin müsbət təcrübəsi, xalqın milli və dini ən'ənələri, dəyərləri üzərində aparılırdı. Azərbaycan əsgərinin şərəfini doğrultmayan, istər hissə, istərsə də qarnizon daxilində hərbi davranış normasını pozanlara qarşı qətiyyətli tədbirlər həyata keçirilirdi. Bütün bunların nəticəsi idi ki, özünün fiziki, maddi və hərbi imkanlarına görə Azərbaycan Ordusunun hissələri kifayət qədər döyüşkən hissələrə çevrilmişdilər.

# BEŞİNCİ FƏSİL

## AZƏRBAYCAN ORDUSUNUN DÖYÜŞ FƏALİYYƏTİ

1918-20-ci illərdə Azərbaycanda ordu quruculuğunun başlıca obyektiv çətinliklərindən biri də o idi ki, qoşun hissələrinin formalaşması və əməli fəaliyyəti eyni vaxtda aparılırdı. İstiqlaliyyətin e'lan edildiyi elə ilk günlərdən xarici müdaxilə və təcavüz təhlükəsi saatbasaat güclənməkdə idi. Mövcud tarixi şərait və vəziyyət isə Azərbaycan Ordusunun qoşun hissələrinin daim döyüşə hazır olmasını tələb edirdi.

Azərbaycanın dövlət müstəqilliyinin və ərazi bütövlüyünün qorunması kimi ali vəzifəsi olan qoşun hissələrinin döyüş əməliyyatlarında iştirakı onların qarşılaşdığı çox ciddi sınaq olmalı idi. Bu döyüşlər Azərbaycan Ordusunun nəyə qadir olduğunu, tə'lim-tərbiyə prosesinin nəyə gətirib çıxardığını, xalqın və ordunun bağladığı ümidlərin əbəs olub-olmadığını üzə çıxarmalı idi.

### *I. LƏNKƏRAN ƏMƏLİYYATI*

1918-ci ilin payızında Türk-Azərbaycan qoşunları Bakının və Qarabağı yad qüvvələrdən təmizlədikdən sonra Lənkəran bölgəsi istisna olmaqla Azərbaycanın bütün ərazisində respublika hökumətinin səlahiyyətləri bərpa edildi. İngilis qoşunlarının Bakıya gəlməsi, türk qoşunlarının isə Azərbaycandan çıxarılması respublikanın cənubunu da təmizləyib orada qanuni dövlət orqanlarının yaradılmasını tə'xirə saldı.

Tutduğu geostrateji mövqe e'tibarilə Lənkəran bölgəsi müxtəlif siyasi qüvvələrin diqqətini cəlb edir və onlar qarşıya qoyulan məqsədlərin əldə edilməsi naminə burada möhkəmlənməyə çalışırdılar. Çox qısa müddət ərzində burada bir neçə siyasi qüvvə öz hakimiyyətini e'lan etdi. 1918-ci ilin əvvəllərində müsavatçı qüvvələr buradakı silahlı ünsürləri tərksilah edib hakimiyyət orqanlarını nəzarət altına alsalar da, 1918-ci ilin aprelində "Aleksandr Jander" gəmisində bölgəyə gələn bolşevik qüvvələri hakimiyyəti ələ keçirdilər (216, s.18). Ancaq bolşeviklərin hakimiyyəti də bölgədə uzun sürmədi. Bakı Xalq Komissarları Sovetinin yıxılması və "Sentrokaspı Diktaturası"nın yaradılması ilə cənub bölgəsində də bolşevik qüvvələrinin nüfuzu xeyli zəiflədi. Onların əvəzinə bölgədə yerləşdirilmiş olan və bölgənin



rus əhalisi tərəfindən müdafiə olunan rus qoşun hissələrinin millətçi zabitləri fəallaşmağa başladılar. Rusiyadakı Denikin qoşunları ilə sıx əlaqəsi olan bu qüvvələrə polkovnik İlyaşeviç rəhbərlik edirdi. O, İranla sərhəd xəttinin qorunması üçün Muğanın cənubunda yerləşdirilmiş olan 29-cu rus sərhəd briqadasının komandiri idi (227a, s.28). Rus millətçi zabitlərinin tipik nümayəndəsi olan polkovnik İlyaşeviç Azərbaycanın müstəqil olmasını heç vəchlə qəbul etmək istəmir və onu bölünməz Rusiyanın tərkib hissəsi sayırdı. Buna görə də o yaranmış vəziyyətdə güc tətbiq edərək bölgəni öz nəzarəti altına gətirmək və burada möhkəmlənərək məntəqəni denikinçilərin Azərbaycan üzərinə gələcək hücum bazasına çevirmək üçün fəal tədbirlərin icrasına əl atdı. 1918-ci ilin avqust ayında o öz qərargahı ilə Cavad qəzasının Biləsuvar kəndindən Lənkəran qəzasının Prişib kəndinə köçdü. İlyaşeviçin komandiri olduğu briqadada bu vaxt 6 minə qədər silahlının olduğu güman edilirdi. Həmin silahlıların təzyiqi ilə avqustun 4-5-də Prişib kəndində fövqəl'adə qurultay çağırıldı və orada Lənkəran və Cavad qəzalarında hakimiyyət məsələsi müzakirə edildi. Qəbul edilən qərara görə həmin qəzaları idarə etmək üçün 5 nəfərdən ibarət "Müvəqqəti diktatura" yaradıldı. Bu diktatura "beşlər diktaturası"da adlandırılırdı (224, s.52).

Beləliklə, millətçi rus zabitləri cənub bölgəsində hakimiyyəti öz əllərinə aldılar. İxtiyarlarında olan silahlı qüvvələrə, bölgənin rus qolçomaqlarına, Bakıdakı rus milli komitəsinə və Denikinin yardımlarına arxalanaraq Müvəqqəti diktatura əhalini çapıb-talamağa öz mənafeyinə uyğun olan yeni bir rejim yaratmağa başladı. Bakı şəhəri bolşevik-daşnak qüvvələrindən azad edildikdən sonra cənub bölgəsində zülm və özbaşınalıqlardan cana doymuş olan əhali öz nümayəndələrini Nuru Paşanın yanına göndərib ondan kömək istədi. Nuru Paşa yaxın vaxtlarda Lənkəran bölgəsinin də təmizlənəcəyini və'd etdi. Ancaq türk qoşunlarının Azərbaycanı tərk etməsi ilə bu və'd yerinə yetirilməmiş qaldı (224, s,53).

İngilis qoşunları tərəfindən də himayə olunan denikinçilər isə cənub bölgəsində möhkəmlənməkdə davam edirdilər. Mövcud olan mə'lumatlara görə, 1918-ci ilin son aylarında cənub bölgəsindəki denikinçi qüvvələrin sayı 10 min nəfərə çatdırılmışdı (224, s.53).

Türk qoşunları Azərbaycanı tərk etdikdən sonra respublika hökumətinin belə bir qüvvə ilə mübarizə aparmaq imkanı yox idi. Qoşun hissələri hələ kifayət qədər möhkəmlənməmişdi. Ona görə də kömək göstərilməsi üçün müraciət edən Lənkəran nümayəndələrinə Azərbaycanın xarici işlər naziri bildirmişdi ki, indiki halda bu məsələ general Tomsonun qarşısında qaldırılmalıdır (11, 21.11. 1918).

1918-ci il dekabrın sonlarında Lənkəran əhalisinin nümayəndə hey'əti Bakıya Tomsonun görüşünə gəldi (283, s.72). Nümayəndə hey'ətinə Teymur bəy Bayrambəyov başçılıq edirdi. İngilis generalı ilə görüşündə nümayəndə hey'əti bölgənin ağqvardiyaçılardan təmizlənməsi və orada

Azərbaycan hökumətinin səlahiyyətlərinin bərpası barədə məsələ qaldırıldı. General Tomson bu işdə lazımi tədbirlərin həyata keçiriləcəyi barədə nümayəndə hey'ətinə və'd verdi (224, s.58-59).

Cənubda özlərini hakim e'lan etmiş millətçi rus zabitləri isə mövcud olan münasib tarixi şəraitdən istifadə edərək öz mövqelərini möhkəmləndirməyə və ona qanuni don geyindirməyə çalışırdılar. 1919-cu ilin fevralında rus zabitlərinin nəzarəti altında olan ərazilər "Lənkəran respublikası" e'lan edildi və Suxorukovun rəhbərliyi ilə demokratik hökumət təşkil olunduğu bildirildi (224, s.59).

İdarəçilik üsuluna yeni bir don geyindirilsə də cənubda e'lan olunan qurum hərbçilərin diktaturasından başqa bir şey deyildi və günü-gündən genişlənməkdə olan xalq narazılıqlarından bu qurumu qoruyan da hərbçilərin süngüsü idi. Azərbaycan hökumətinin qətiyyətli tədbirlər həyata keçirmək imkanı olmadığı bir vaxtda bu süngülər hələlik xalq qəzəbinin qarşısını almağa kifayət edirdi.

Cənub bölgəsinin yeni oyuncaq qurumu mövcudluğunun tanınması naminə Azərbaycanın hökumət orqanları ilə danışıqlar aparmaq kimi vasitələrə də əl atırdı. 1919-cu il martın əvvəllərində Gerasimovun sədrliyi altında bir nümayəndə hey'əti təşkil edildi və Azərbaycan hökumətinin yanına göndərildi. 1919-cu il martın 21-də Azərbaycanı parçalamaq iddiasında olan qüvvələrin Prişibdə qurultayı çağırıldı. Bu qurultayda həm Gerasimov dinlənildi, həm də oyuncaq qurumun möhkəmləndirilməsi yolları müzakirə edildi. Belə bir qərar qəbul edildi ki, Paris sülh konfransı öz işini qurtaranadək Lənkəran qəzası Azərbaycanın hakimiyyəti altına verilməsin və "Muğan vilayəti" adı altında yaradılan müstəqil bir quruma tabe etdirilsin (224, s.59-60).

Azərbaycanın cənubunda yaranmış olan qanunsuzluq və özbaşınalıqlardan bolşevik qüvvələri də öz planları üçün istifadə etməyə çalışırdılar. Onlar da Lənkəran bölgəsinə Bakı üzərinə qətiyyətli hücumun başlanması üçün əlverişli baza kimi baxırdılar. Lənkəranın ələ keçirilməsi hələ də qaçıb dağılmış olan bolşevik elementlərinin toplaşmasına, onların qüvvələrinin birləşdirilməsinə imkan verə bilərdi. Bunun üçün onlar tədricən bölgəyə axışır, əhali arasında təbliğat aparmaqla bərabər öz silahlı dəstələrini də formalaşdırırdılar. Heç şübhəsiz ki, ağqvardiyaçı rus zabitlərinin iradəsini həyata keçirən yeni qurumun qanunsuzluq və özbaşınalıqlarından cana doyan yerli əhalinin genişlənən narazılıqları da bolşevik üsyanının uğuru üçün zəmin yaradırdı.

1919-cu ilin yazında bolşeviklərin Qafqaz Diyar Komitəsi Lənkəran bölgəsində silahlı yolla hakimiyyəti ələ almaq üçün ciddi hazırlıq işlərinə başladılar. Tərtib edilmiş üsyan planına görə qırmızı partizanlar və digər bolşevik qüvvələri oyuncaq qurumun yerləşdiyi binanı, qoşunların qərargahını, radiostansiyanı, dəniz agentliyini tutmalı idilər. Ağqvardiyaçı zabitlərin əsas fiqurlarının siyahısı tutulmuşdu. Silahlı üsyan başlanan kimi həmin zabitlər dərhal həbs edilməli idilər. Şəhərin mərkəzi küçələrinə silahlı drujinaçı dəstələr qoyulmuşdu. Bolşeviklər tərəfinə keçmiş olan zirehli avtomobil Xan sarayı yaxınlığında dayanmışdı. Şəhərin mərkəzi meydanlarına pulemyotlar çıxarılmışdı və aprelin 25-də onlar hamısı üsyana hazır vəziyyətdə idi. Həmin günü Lənkəranda ağqvardiyaçı zabitlərin müşavirəsi keçirilirdi. Gündüz müşavirədən sonra zabitlər nahar yeməyi üçün evlərinə dağıldıqda bolşevik qüvvələri qəti hücuma keçdilər. Bir süvari taqımı qoşunların qərargahını tutdu. Qırmızı partizanlar isə oyuncaq hökumət orqanının yerləşdiyi binanı, poçtu, radiostansiyanı, dəniz agentliyini və mayakı tutdu. Bir neçə saat ərzində şəhərin ən vacib nöqtələri ələ keçirildi (283, s.83).

Dərhal da kütləvi həbslərə başlandı. Polkovnik İlyaşeviç başda olmaqla rus zabitlərinin e'lan etdiyi oyuncaq hökumətin bütün fəalları həbs edildi. Əvəzində yeni inqilabi idarəetmə orqanı yaradıldı. Hələlik müvəqqəti xarakter daşıyan bu orqana Jirikov başda olmaqla üç nəfər rəhbərlik edirdi (224, s.64).

Hakimiyyət məsələsinin həll edilməsi üçün 1919-cu il mayın 15-də Lənkəranda kəndli deputatları Muğan sovetinin fövqəl'adə qurultayı çağırıldı. Qurultayda iştirak edən deputatların təxminən yarısı azərbaycanlı deyildi (216, s.38). Dörd gün davam edən qurultayda Azərbaycanın cənubunda Sovet hakimiyyəti qurulduğu e'lan edildi və 35 nəfərdən ibarət qanunverici orqan seçildi. "Muğan ölkə soveti" adlandırılan bu orqanın sədri vəzifəsinə David Çirkin, onun müavini vəzifəsinə isə Şirəli Axundov irəli sürüldü (224, s.66).

Zaqafqaziya sovet hakimiyyətinin yeganə dayaq nöqtəsi olan Lənkəran bölgəsində üsyan xəbəri alınan kimi bura bolşevik yardımı daha da artırıldı. 1919-cu il aprel ayının sonuncu günləri Bakı bolşevikləri gizlicə "Vstreça" gəmisi ilə Lənkərana xeyli miqdarda silah və sursat, 9 milyon rubl pul və çoxlu siyasi ədəbiyyat gətirdilər (305, s.226).

Şimali Qafqazda Denikin ordusuna qarşı mübarizə aparan XI ordunun bir qrup döyüşçüsü müqavimətə dözməyərək geri çəkilməyə və Bakıya gəlməyə məcbur olmuşdu. S.Orconikedzinin göstərişi ilə həmin döyüşçülərdən də 200 nəfərə qədəri 1919-cu ilin may ayında Lənkərana aparıldı (224, s.67).

Həştərxandan da Lənkərandakı bolşevik qüvvələrinə böyük kömək göstərilirdi. Leninin tapşırığı ilə kommunist T.İ.Ulyantsev (Otradnev) də Lənkərana gəlib burada İnqilabı Şura təşkil etdi (235, s.191).

1919-cu il may ayının sonunda cənubda e'lan olunmuş sovet hakimiyyətinin sərəncamında bir piyada taboru, süvari eskadronu, 6 səhra və 3 dağ topu, 3 hidroplan var idi. Silahlı qüvvələrin ümumi sayı 5-6 min nəfərə çatırdı (235, c.192).

Ancaq yenicə e'lan edilmiş bolşevik hakimiyyəti də əhalinin həyat şəraitinin yaxşılaşdırılması üçün lazımi xətt tuta bilmədi. Tezliklə bunu anlayan xalq kütlələri bolşevizmə əks olan mövqelərə meyllənməyə başladılar. Hətta bolşeviklərin sosial bazası güman edilən yerli rus əhalisi də, ağ qvardiyaçı zabitlərin ətrafında cəmləşir, onların təşkil etdikləri silahlı dəstələrdə birləşirdilər. Novo-Qulyayevka və Petropavlovka kəndləri ətrafında 5 min nəfərlik silahlı dəstə təşkil etməyə müvəffəq olan (235, s.192) ağqvardiyaçı zabitlər iyunun 15-də Prişibdə qurultay keçirdilər və sovet hakimiyyətinin devrilməsi məqsədilə Lənkəran üzərinə hücum etmək üçün qərar qəbul etdilər (224, s.73).

Sovet hakimiyyətinə onun yeritdiyi siyasətə qarşı Azərbaycan kəndləri də yorulmaz mübarizə aparırdılar. Bu istiqamətdə Astarada Hüseyn Ramazanovun rəhbərliyi altında təşkil edilmiş partizan dəstəsi xüsusilə səmərəli fəaliyyət göstərirdi. Əvvəllər elə də böyük olmayan bu partizan dəstəsi may ayının əvvəllərində Şahağac və Alekseyevka kəndlərinə hücuma keçdi. Lakin daha böyük gücə malik olan bolşevik qüvvələri H.Ramazanovun partizan dəstəsinin hücumunun qarşısını ala bildi (301,s.84).

İyunun 10-da H.Ramazanovun partizan dəstəsi yenidən Astaradakı bolşevik qüvvələri üzərinə hücuma keçdi. Onlar arasında gedən gərgin döyüşlər bir neçə gün davam etdi. Lənkərandan gələn əlavə qüvvələr bolşevik dəstələrini müəyyən qədər gücləndirsələr də onlar ciddi bir uğur qazana bilmədilər. İyunün 17-də isə bütünlükdə Lənkərana doğru geri çəkilmək məcburiyyətində qaldılar. (224, s. 71; 235, s. 192).

Bu hərbi uğursuzluqdan sonra öz hərbi mövqelərini möhkəmləndirmək üçün bolşeviklər bir sıra tədbirlər həyata keçirdilər. Hakimiyyət Ulyansevın rəhbərliyi altında olan Hərbi İnqilab Şurasına verildi, müxtəlif məhəlli müdafiə komitələri yaradıldı, əhalinin qırmızı qüvvələrin sırasına səfərbərliyi e'lan edildi, imkanlı şəxslər üzərində 8 milyon manatlıq təzminat qoyuldu (224, s.72).

Lakin bu tədbirlərin heç biri süngü gücünə öz hakimiyyətlərini e'lan etmiş və əsasən də rus və erməni bolşevikləri tərəfindən idarə olunan sovetlərin mövqeyinin möhkəmlənməsində ciddi bir dönüş yaratmadı. Geniş xalq kütlələri tərəfindən müdafiə olunmayan bu oyuncaq qurum e'lan edildiyi gündən mə'ruz qaldığı böhrandan çıxa bilmədi. İyunun 23-də ağqvardiyaçı zabit Xoşevin rəhbərliyi altında 500 nəfərlik silahlı dəstə bölgədə hakimiyyətin yenidən denikinçi rus zabitlərinin əlinə keçməsi üçün növbəti cəhd göstərdi. Bolşeviklərin çaş-baş düşməsindən istifadə edən ağqvardiyaçılar iyunun 25-də Lənkəranın şimal-şərq hissəsini, habelə mayakı tutdular. Xoşev hətta bolşevik qüvvələrindən 9 saat ərzində hakimiyyəti təhvil verməyi, polkovnik İlyaşeviç başda olmaqla həbs edilmiş 82 rus zabitinin (216, s.69) dərhal azadlığa buraxılmasını tələb etdilər. Ancaq bir neçə gün ərzində bolşeviklər bütün güclərini səfərbərliyə alıb denikinçi zabitlərin rəhbərlik etdiyi dəstəni Lənkərandan uzaqlaşdıra bildilər. Bu döyüşlərin gedişində bolşeviklər xeyli itki verdilər. Onlar Hərbi İnqilab Şurasının sədri Ulyansevi də itirdilər (235, s.192).



Bölgədə Azərbaycan hökumətinin bərpa edilməsini arzulayan azərbaycanlı qüvvələrin də sayı artmaqla bərabər, fəaliyyətləri də genişlənirdi. İyunun axırlarında Bakıdan Məlik-Yeqanovun rəhbərliyi altında Astaraya canlı qüvvə gəldi və H. Ramazanovun dəstəsi ilə birləşdi (224,s.75).

Hüseyn Əlixanın və Rəşid xanın kiçik dəstələri də Ramazanovun və Şahverənin başçılığı altında olan başqa bir partizan dəstəsinə qoşuldular (301,s.87). Şahverənin rəhbərliyi altında yaradılan və denikinçi, bolşevik qüvvələrinə qarşı fəal mübarizə aparan partizan dəstəsi Zuvand dağlarında özünə məskən tapmışdı (11, 19.07.1919).

Mövcud olan mə'lumatlara görə iyul ayının sonlarında H. Ramazanovun və Şahverənin dəstələri də Astara, Şahağac və Alekseyevka kəndlərinə hücum etdilər. Astarada 20 çekist, 10 milisioner və 10 qırmızı əsgər öldürüldü. Şahağacada 15 nəfərlik sovet postu məhv edildi. Partizanların başqa bir qrupu isə Alekseyevka kəndində bolşeviklərin 200 piyadası, 60 süvarisi və bir dağ top batareyası ilə qarşılaşdı. Bolşevik süvariləri partizanların İrana çəkilmək yolunu kəsdilər. Topların işə salınması onların vəziyyətini xeyli mürəkkəbləşdirdi. Erməni bolşeviklərinin komandirliyi altında olan Lənkəran taborunun birinci bölüyünün və Muğan süvari eskadronunun fəal hərəkətləri partizanlar tərəfindən hərbi təşəbbüsün itirilməsinə səbəb oldu və onlar sərhəddəki dağlara sarı geri çəkildilər (301 ,c.87).

1919-cu il iyulun 5-də Prişibdə denikinçi rus zabitlərinin, malakan və rus kəndlərinin növbəti qurultayı çağırıldı. Qurultayda bir sıra Azərbaycan kəndlərinin nümayəndələri də iştirak edirdi. Burada qərara alındı ki, bölgə kommunist təxribatçılardan təmizlənsin və muğanlıların hakimiyyəti bərpa olunsun (11, 20.07.1919)

İyul ayının ikinci yarısında rus zabitlərinin rəhbərliyi altında olan Muğan qüvvələri Lənkəran üzərinə qəti hücuma keçdilər. İyulun 15-də onlar artıq şəhərin şimal həndəvərinə soxula bilmişdilər (224, s.76).

Lənkərandakı bolşevik qüvvələri təkcə muğanlıların deyil, həm də azərbaycanlılardan ibarət olan könüllü dəstələrin hücumuna mə'ruz qaldılar. İyulun 17-də, gecə saat 12-də başlanan hücum ərəfəsində Şahverənin rəhbərliyi altında olan 500 nəfər yaxşı silahlanmış dəstə H. Ramazanovun dəstəsi ilə birləşdi və onlar xalqın mənafeləri naminə birgə fəaliyyət göstərməyi qərara aldılar. Birləşmiş dəstənin komandanlığının keçirdiyi hərbi şurada Lənkəran üzərinə üç istiqamətdən hücum etmək məqsədəuyğun bilindi. Şahverənin rəhbərliyi altında olan bir dəstə qərbdən, Ramazanovun rəhbərliyi altında olan ikinci dəstə cənubdan, Lənkəran çayının yatağı boyu, Hacı Osmanın rəhbərliyi altında olan üçüncü dəstə isə şərqdən Lənkəran üzərinə hücuma keçməli idi (11. 19.07.1919).

Əlaqələndirilmiş şəkildə həyata keçirilən hücum könüllü milli dəstələrin uğurları ilə başladı. Hər tərəfdən sıxışdırılan bolşevik silahlıları geri çəkilmək məcburiyyətində qaldılar. Onların bir hissəsi şəhər qülləsində, bir hissəsi isə dənizdə dayanmış "Milyutin" gəmisində və digər üzən obyektlərdə özlərinə sığınacaq tapdılar. Ayın 18-də bolşevik qüvvələrin sığındıqları yerlərdən könüllü dəstələrin mövqelərini güclü top atəşlərinə tutdular. Şəhərin mərkəzində isə zirehli avtomobil azərbaycanlı silahlıların irəliləməsinə mane olurdu. Vuruşan bolşeviklərin əksəriyyəti erməni idi. Onlar öz ailələrini Sara adasına təxliyə etmişdilər. Gün ərzində davam edən atışmalardan sonra Böyük bazar, habelə çoxlu sayda evlər tamamilə dağıdılmışdı (11, 19.07.1919).

Lənkəranın daxilində döyüşlər bir neçə gün davam etdi. Bolşevik qüvvələri tamamilə mayaka doğru sıxışdırılmışdı. Onların sərəncamında olan toplar və pulemyotlar bu mövqeni möhkəm saxlamağa və azərbaycanlıların hücumlarının qarşısını almağa imkan verirdi. Şəhərin qalan hissəsi isə demək olar ki, azərbaycanlı könüllülərin əlinə keçmişdi. Şəhərin şimal nöqtəsindən başlayaraq Hacı Qurban küçəsinə kimi bütün dəniz boyu sahə Şahverənin dəstəsinin, şəhərin qərb ətəyindən başlayaraq sol sahilinə kimi H.Ramazanovun dəstəsinin, Sutamərdob tərəf isə dənizdən başlayaraq Lənkəran çayının sağ sahilinə kimi Hacı Osmanın dəstəsinin nəzarəti altında idi (11, 23-24.07.1919).

Kifayət qədər qüvvəsi olan Azərbaycan könüllüləri öz hücumlarını davam etdirmək niyyətində idilər. Bolşevik qüvvələrin vəziyyətlərinin çıxılmaz olduğunu yaxşı anlayırdılar. Buna görə də onlar şəhəri tərk edib Sara adasına çəkilməyi qərara aldılar. Ancaq hakimiyyəti Azərbaycanın milli qüvvələrinə deyil, Muğan qüvvələrinə təhvil verdilər. İyunun 24-25-də Muğan qüvvələri şəhərin mühüm obyektlərinə buraxıldı və onların həbs edilmiş zabitlərinin hamısı azad olundular (11, 30.07.1919).

Lənkəranın mühüm obyektlərini ələ keçirən muğanlılar əvvəlcə iyulun 26-da Prişibdə özlərinin növbəti qurultayını çağırdılar. Orada qərara alındı ki, kəndli deputatları Muğan sovetinin mayın 15-dəki fövqəl'adə qurultayında seçilən hakimiyyət orqanı e'tibarsız sayılır və o öz səlahiyyətlərini hazırkı qurultayda seçilən hakimiyyət orqanına təhvil verməlidir (11, 30.07.1919).

Polkovnik İlyaşeviç həbsdən azad edilən kimi bölgədə idarəçiliyi yenidən öz əlinə aldı. Bolşeviklərin uzaqlaşmasından sonra, Azərbaycan könüllülərinin fəaliyyətini ələ keçirdiyi hakimiyyətə təhlükə hesab etdiyindən onlara qarşı müxtəlif vasitələrə əl atdı. Bu könüllü dəstələrdən birinin rəhbəri olan Yusif bəyə göndərdiyi ultimatumunda polkovnik İlyaşeviç bildirirdi ki, onların mübarizəsi bolşeviklərin əleyhinə istiqamətlənmişdi. Bu qüvvələr isə artıq devrilmiş və Lənkəran-Muğan qüvvələrinin əlinə keçmişdir. Guya əlavə qan tökülməsinə razı olmayan rus polkovni-



ki, Yusif bəydən tələb edirdi ki, 12 saat ərzində öz dəstəsini rus Astarasının hüdudlarından kənara çıxarsın. Əks-təqdirdə o, Yusif bəyin dəstəsinə qarşı güclü hücuma keçəcəyi ilə hədələyirdi. Yusif bəy isə polkovnik İlyaşeviçə cavab göndərdi ki, o, Azərbaycandan başqa heç bir hökuməti tanımır və heç kəsin ultimatumunu qəbul etməyəcəkdir (11, 30.07.1919). Bölgədə gedən proseslər Azərbaycan hökuməti tərəfindən də diqqətlə izlənilirdi. Bolşevik qüvvələri Lənkəranı tərk etdikdən sonra Lənkəran qəzasının idarə edilməsi üzrə fövqəl'adə müvəkkil tə'yin edilmiş olan Məlik-Yeqanov bölgəyə göndərildi. O, Lənkərana deyil Astaraya gəldi. Sərəncamında olan qüvvələrlə Azərbaycan könüllülərini bölgədən vurub çıxaracağına əmin olan İlyaşeviç Azərbaycan hökumətinin qanuni dövlət orqanının Astaraya gəlməsi xəbərini eşidəndən sonra planlarını bir də götür-qoy etməyə məcbur oldu. O, Yusif bəyə yeni bir məktub göndərdi. Azərbaycanın qanuni hakimiyyət nümayəndələrinin bölgəyə gəlməsinə təəccübünü gizlətməyən İlyaşeviç məktubunda bildirirdi ki, Muğanın Azərbaycana birləşdirilib-birləşdirilməməsinə beynəlxalq sülh konfransında baxılmalıdır. İngilislərin razılığı olmadan bu məsələ həll edilə bilməz. O təklif edirdi ki, yeni tə'yin olunmuş qubernator Lənkərana gəlib səlahiyyətlərini təsdiq edən sənəd təqdim edərsə, onun mühafizəsi tə'min olunar və bölgənin taleyi ilə bağlı məsələlərin müzakirəsinə başlanar (11, 30.07.1919).

Məlik-Yeqanovla bərabər Astaraya Azərbaycan qoşun bölmələri də göndərilmişdi (224, s.75). İlyaşeviçin ətrafındakılarla Azərbaycanın hakimiyyət nümayəndələri arasında danışıqlar bir neçə gün çəkdi. Muğanlılar vaxtı uzatmaqla güman edirdilər ki, ingilislər məsələyə müdaxilə edəcək və Muğanın Azərbaycana birləşdirilməsinə imkan verməyəcəkdir. Lakin tezliklə onların bu ümidləri də boşa çıxdı və ingilislər Muğanın Azərbaycan hökumətinin hakimiyyəti altına gətirilməsinə tərəfdar oldular. İngilis komandanlığı bu məsələ ilə bağlı İlyaşeviçin tərəfdarlarına öz tələbini çatdırdı. Həmin tələbdə deyilirdi:" Müttəfiq dövlətlərin və admiral Kolçakın nümayəndələrinin Parisdə qəbul etdikləri razılaşmaya əsasən Britaniya hökuməti qərara gəlir ki, Muğan vilayəti və Lənkəran qəzası Azərbaycanın hüdudları daxilində olan ərazi kimi bu respublikanın hakimiyyət orqanları tərəfindən idarə edilməlidir və həmin ərazilərdə bu hakimiyyət bərqərar olmalıdır. Lənkəranda və Muğanda qanuni hakimiyyəti bərqərar etməyə çalışan Azərbaycan Respublikasının qanuni hərəkətlərini müdafiə edən Britaniya hakimiyyəti bölgədəki rus əhalisinin maraqlarını nəzərə alacaq lazımi hakimiyyət orqanlarının yaradılmasına kömək üçün ora öz fövqəl'adə komissiyasını göndərir" (11, 13.08.1919).

İngilis komandanlığının və bütünlükdə müttəfiq dövlətlərinin Azərbaycanın ərazi bütövlüyünü dəstəkləmək xəbəri Muğan qüvvələrini çaş-baş salsa da onlar hakimiyyəti asanlıqla təhvil vermək niyyətində də deyildi-

lər. Onlar bildirdilər ki, ingilis komandanlığının tələbləri avqustun 10-da Ümummuğan qurultayında müzakirə ediləcək. Nümayəndələrinin hamısının yerli rus əhalisindən olacaq qurultayın hansı qərar çıxaracağını təsəvvür etmək elə də çətin deyildir. Bununla belə, Muğan qüvvələrinin liderləri çətin vəziyyətə düşdüklərini hiss etdiklərindən hər gün bölgədəki az saylı qoşun bölmələrini, könüllü silahlı dəstələrin mövqelərini gülləyə tutur və bu yolla özləri üçün daha sərfəli güzəştlərə nail olmaq istəyirdilər. Qarşılıqlı atışmalar nəticəsində hər iki tərəfdən ölən və yaralananlar var idi (11, 13.08.1919).

1919-cu il avqustun 10-na keçən gecə Muğan qüvvələri qəti hücuma keçdilər. Bütün cəbhə boyu həyata keçirilən bu hücumla muğanlılar Azərbaycan qüvvələrinin müdafiədə dayanan mövqelərinə xeyli yaxınlaşdılar. Hücumun uğurlu olacağı təqdirdə hansısa bir güzəştə ümid edən Muğan qüvvələrinin silahlıları Azərbaycanın müdafiə səngərlərinə təmas xəttinə çatdılar. Lakin göstərdikləri cəhdlər heç bir nəticə vermədi və böyük itkilərə mə'ruz qalaraq şəhərə yaxın geri çəkilməli oldular. Bu uğursuz hücum muğanlıların bölgədə möhkəmlənmək ümidini boşa çıxardı və onlar ingilis nümayəndəliyinə xəbər göndərərək Azərbaycan hökumətini tanımağa razı olduqlarını bildirdilər (11, 16.08.1919).

Avqustun 11-də muğanlıların qurultayı çağırıldı və burada da onların Azərbaycan hökumətinə tabe olduğu bəyan edildi. Ancaq qəbul olunan qərarda muğanlıların özlərini Rusiyanın tərkib hissəsi kimi görməyə ümidlərini hələ də kəsmədikləri aydın görünürdü: "Özümüzü Böyük Rusiyanın tərkib hissəsi sayaraq və rus meylliliyini itirməyərək Muğan və Lənkəran qəzası üzərində Azərbaycanın qanuni hakimiyyəti tanınsın və bu məsələ Ümumrusiya müəssisələr Məclisində həll edilənə kimi Rusiyanın və rus xalqının şərəfini alçaltmayan şərtlər əsasında müvəqqəti olaraq Azərbaycan Respublikasının tərkibinə daxil olunması qəbul edilsin" (15, 16.08.1919).

Muğanlıların, ingilislərin və Azərbaycanın hakimiyyət orqanlarının nümayəndələri görüşərək Muğanın hansı şərtlər əsasında Azərbaycan hökumətinin nəzarəti altında keçməsini müzakirə etdilər. Əldə olunan razılaşmaya əsasən avqustun 11-də axşam saat 6-da hər iki tərəf öz mövqelərindən geri çəkilməli və ingilis komandanlığının nümayəndəsi tərəflərin döyüş mövqeyini gözərək razılaşmaya necə əməl edildiyini yoxlamalı idi. Ayın 13-dən e'tibarən isə şəhər Azərbaycan hökumətinin nəzarəti altına keçməli idi (15, 22.08.1919)

Qərara alınmışdı ki, şəhərə əvvəlcə azsaylı qoşun bölməsinin müşayiəti ilə hakimiyyət nümayəndələri daxil olunsunlar, inzibati binaları və əmlakı təhvil alsınlar. Ayın 12-də gündüz saat 1-də bir qrup əsgər zabitlərin komandanlığı altında şəhərə doğru hərəkətə başladı. Güclü yağış yağmasına baxmayaraq onların eləcə də onları qarşılayan şəhər əhalisinin çox yüksək əhval-ruhiyyəsi var idi. Şəhərin həndəvərinə toplaşmış olan əhali "Yaşasın Azərbaycan", "Yaşasın əsgərlərimiz və zabitlərimiz" deyə qışqırırdılar. Rəsmi qarşılama mərasimi məscidin yanında keçirildi. Çıxış edənlər Azərbaycanın hökumət nümayəndələrinin və bölgədəki qoşun bölmələrinin təmkinli hərəkətlərini xüsusi qeyd etdilər və onlara öz minnətdarlıqlarını bildirdilər. Əhali qarşısında çıxış edən fövqəl'adə müvəkkil bölgədə qanunçuluğun bərpasının zəruriliyindən danışdı və toplaşanlara Azərbaycan əsgərlərinin "Ya Lənkəranı azad etməliyik, ya da ölməliyik" əzmi ilə vuruşduğunu vurğuladı (11, 16.08.1919).

Elə həmin gün də Məlik-Yeqanov Lənkəran qəzası əhalisinə belə bir müraciət imzaladı:" Tam qanun-qayda və sakitlik bərpa edilənədək mən Lənkəran qəzasında hərbi vəziyyət e'lan edirəm. Bununla bağlı aşağıdakılar qadağan edilir:

1. Azərbaycan Respublikasının hakimiyyəti əleyhinə təbliğat işləri ilə məşğul olmaq;
2. İcazəsiz silah gəzdirmək və silahla şəhərdə gəzmək;
3. İlkin tələbat üçün zəruri olan malların qiymətini qaldırmaq;
4. Vətəndaşların dinc həyatını pozan yersiz atəşlər açmaq;
5. Sərxoş vəziyyətdə şəhərdə gəzmək;
6. Axşam saat 10-dan sonra şəhərdə gəzmək;
7. Oğurluq əşyaları alıb satmaq. Əhalidə olan bütün hərbi əşyalar dərhal hakimiyyət orqanlarına qaytarılmalıdır" (11, 22.08.1919).

Muğanlılar Lənkəranı təhvil vermək məcburiyyətində qalsalar da çox güclü hərbi qüvvəyə malik idilər. Silahlı dəstələrin tərkibində olan zabitlərin böyük bir hissəsi keçmiş rus ordusunda xidmət yolu keçmiş təcrübəli zabitlər idi. Bu qüvvələr və eləcə də bölgənin rus əhalisi ixtiyarlarında olan çoxsaylı ağır hərbi texnika, silah və sursatla Azərbaycanın ərazi bütövlüyü üçün potensial təhlükə idi və nə qədər ki, bu qüvvələr zərərsizləşdirilməmişdi Azərbaycan istənilən vaxt üç tərəfdən – şimaldan, dənizdən və cənubdan şovinist rus dairələrinin silahlı təzyiqinə mə'ruz qala bilərdi. Şübhə yox idi ki, Denikin qoşunları ilə əlaqə saxlayan muğanlılar istənilən vaxt Denikin tərəfində döyüşlərə girməyə və arxadan Azərbaycan hökumətinə güclü zərbə endirməyə hazır idilər. Eyni zamanda Azərbaycan hökumətinin nümayəndəsi Lənkərana gəlsə də bölgədə olan bütün rus kəndləri tamamilə yeni hakimiyyətin iradəsini yerinə yetirməyə hazır deyildilər. Əksinə əllərində olan silahlarla onlar da öz iradələrini qəbul etdirməyə çalışırdılar.

Bütün bunlar Azərbaycan hökumətindən qətiyyətli tədbirlər görməyi, respublikanın cənubunda birdəfəlik sabit vəziyyətin yaradılmasını tələb edirdi. Belə qətiyyətli tədbirlər Azərbaycan Ordusunun qoşun hissələrinin bölgəyə göndərilməsi ilə yerinə yetirildi.

Hərbi Nazirliyin rəhbərliyi bölgəyə qoşun dəstəsi göndərməsi barədə göstərişi hələ bolşevik qüvvələri burada öz hakimiyyətlərini e'lan etdikləri vaxt almışdı. Azərbaycan hökuməti bölgədə vəziyyətin sabitləşdirilməsi və qanuni hakimiyyətin bərqərar edilməsi üçün ingilis komandanlığı ilə məsləhətləşmələr aparmağı, Azərbaycan hökumətinin nümayəndəsi olan fövqəl'adə müvəkkilin bölgəyə göndərilməsi üçün yollar aramaqla bərabər problemin hərbi yolla həlli məsələsini də mümkün sayırdı və buna hazırlıq görülməsi üçün hələ iyul ayının əvvəlində Hərbi Nazirliyə tapşırıq vermişdi.

1919-cu il iyulun 7-də hərbi nazir S. Mehmandarov Nazirlər Şurasının sədrinə məktub yazaraq ona aldığı tapşırığın icrası ilə bağlı bir sıra mülahizələrini çatdırdı. Nazir yazırdı ki, yaranmış şəraitdə Lənkərana xüsusi qoşun dəstəsi göndərmək imkanı yoxdur. Çünki Qarabağda ermənilərin təcavüzünün fəallaşması nəticəsində vəziyyət xeyli mürəkkəbləşmişdir. Oradan heç bir qüvvəni çıxarıb Lənkərana göndərmək düzgün olmazdı. Respublikanın şimalında olan Xaçmaz dəstəsinin hissələrinin gətirilməsi və onun zəifləndilməsi də xoşagəlməz nəticələr verə bilərdi. Nazirin qənaətinə görə, Gəncədə olan qüvvələri Lənkərana göndərməklə Gəncənin özünü müdafiəsiz qoymaq da məqsədəuyğun olmazdı. Çünki quberniyanın bir sıra məntəqələrində hökumət əleyhinə həyəcanlar baş verirdi və hökumət əleyhinə olan qüvvələr Gəncənin müdafiəsizliyindən istifadə etməyə çalışırdılar. (125, v.6).

S. Mehmandarov məktubunda hökumət miqyasında görülməsi vacib olan məsələlərdə də toxunurdu. Bu, birinci növbədə hissələrin komplektləşdirilməsi sahəsində yerli inzibati orqanların qarşısında dayanan vəzifələrlə bağlı idi. S. Mehmandarova görə, döyüş bölgələrində olan hissələrin heç də hamısının tam şəkildə komplektləşdirilməməsi mövcud gərginliyi ortaya çıxarmışdı. O əlavə edirdi ki, Lənkəran məsələsi ilə bağlı artıq Hərbi Nazirlikdə müşavirə keçirilmiş və alınan tapşırığın yerinə yetirilməsi üçün lazımi tədbirlərin həyata keçirilməsinə başlanmışdır. Nazirin fikrincə, Lənkəran istiqamətinə qoşun dəstəsini yaxşı halda bir aydan sonra göndərmək mümkün olardı. Çünki bir tərəfdən ora göndəriləcək hissələrin kəm-kəsirləri düzəldilməsi, komplektləşdirilməsi üçün bə'zi işlər görməli və dəstə özü hazırlanmalı idi. Dəstənin tərkibinə daxil olan hissələr kollektiv şəkildə fəaliyyət göstərmələri üçün müəyyən təmrinlər icra edilməli, qarşılıqlı əlaqələr sahmana salınmalı idi. Lənkərana göndəriləcək dəstənin tərkibi isə aşağıdakı kimi planlaşdırılırdı: bir piyada alayı, bir süvari alayı, bir yüngül batareya, bir qaubitsa batareyası, bir süvari-dağ və ya dağ batareyası, iki zirehli avtomobil və iki aeroplan (125, v.6).

Mövcud olan arxiv sənədlərindən mə'lum olur ki, hərbi nazir S.Mehmandarov parlamentin üzvü M.Ə.Rəsulzadəni də Lənkəran məsələsi ilə bağlı keçirilən müşavirəyə də'vət etmişdi. Həmin müşavirə 1919-cu il



iyulun 5-də Parlamentin yaxınlığında yerləşən Realnı məktəbin binasında keçirilmişdi (125, v.5).

Lənkərana qoşun dəstəsi göndərilməsinə hazırlıq tədbirləri çərçivəsində Lənkəranın və ətrafının kəşfiyyatı aparıldı. Bolşeviklərin ağalığı dövründə aparılmış bu kəşfiyyatla onların qüvvələrinin və hərbi texnikasının sayı, yerləşdikləri məntəqələr, hərbi imkanları, ərazinin xüsusiyyətləri, hərəkət marşrutu üzərində olan kəndlərin demoqrafik tərkibi, hakim yüksəkliklər və s. məsələlər barədə ətraflı mə'lumat toplanmışdı (125, v7).

Xüsusi dəstənin Lənkərana göndərilməsi 1919-cu ilin avqust ayına planlaşdırılırdı. Ancaq hələ iyulun 23-də hərbi nazir C.Mehmandarov Lənkəran qəzasının sakinlərinə müraciətnamə imzalamışdı. Bu müraciətnamə aşağıdakı məzmunda idi:

"Vətəndaşlar!

Azərbaycan Respublikası hökumətinin iradəsi ilə mən Lənkəran qəzasına dəstə göndərirəm. Vətəndaş müharibəsinə birdəfəlik son qoymaq, qayda-qanun yaratmaq, sizi dinc əhaliyə əzab verən zorakı dəstələrdən və qatillərdən azad etmək işi bu dəstəyə tapşırılıb.

Azərbaycanın ayrılmaz bir hissəsi olan qəzada məskunlaşmış bütün millətlərə ədalətli münasibət bəsləyən Azərbaycan qoşunları sizin yanınıza qanunçuluğun daşıyıcısı kimi gəlirlər.

Silahlı qüvvələrin himayəsi ilə ölkənin bütün sahələrinin idarə olunmasında tə'cili mülki idarəetmə orqanları bərpa ediləcək. Mən əminəm ki, siz özünüz də Azərbaycan Respublikasının gələcək tamhüquqlu vətəndaşları kimi sülh şəraitində birgə yaşamağın möhkəm əsasının qoyulması marağındasınız və görəcəyiniz bütün tədbirlər ölkədə qanun-qaydanın bərpa olunmasında hökumətin bütün qanuni əmrlərinin könüllü surətdə yerinə yetirilməsində öz xeyirxah münasibətinizlə Azərbaycan Respublikası hökumətinin nümayəndələrinə hər cürə köməklik göstərəcəksiniz.

Bununla bərabər mə'lum edirəm ki, sovetlər, komitələr və ya "Muğan respublikası" adı altında hər hansı özbaşına təşkilatın yaradılmasına yol verilməyəcəkdir.

Lənkəran qəzasında yalnız bircə Azərbaycan Respublikasının hakimiyyəti tanınmalıdır və onun göstərişlərinə itaət etməyənlər müharibə dövrünün qanunlarına əsasən qiyamçı kimi mə'suliyyətə cəlb olunacaqlar.

Dəstə rəhbərinin əmri ilə əhali silahları təhvil verməlidir. Kim buna əməl etməsə Hərbi Cəbhə məhkəməsinə veriləcəkdir.

Xəbərdar edirəm ki, rus əhalisinə qarşı hər hansı bir zoorakılığa və soyğunçuluğa yol verməyəcəyəm, çünki qəzada yaşayan başqa millətlərin nümayəndəsi kimi onları da Azərbaycan Respublikasının vətəndaşı sayıram.

Amma Rus əhalisinin şəxsiyyətinə və toxunulmazlığına tə'minat verərkən mən onlardan da yerli hakimiyyətin verdiyi qanunların yerinə yetirilməsinə əməl etmələrini tələb edirəm.

Hər bir silahlı müqavimət ölüm cəzası ilə cəzalandırılacaq və belə hallarda qoşunlara amansız olmaları barədə əmr olunub.

Bununla bağlı bu və digər bəhanələrlə ordu və hakimiyyət əleyhinə zorakılıq göstərmək niyyətinə düşənləri də xəbərdar edirəm.

Mən də öz növbəmdə dəstə komandirinə əmr etmişəm ki, qoşunun əhaliyə heç bir xətər toxundurmaması haqda ölçü götürsün və dinc əhaliyə qarşı hər hansı zorakılıq göstərənlər ciddi cəzalandırılsınlar (125, v.2: 271, s. 100-102).

Bu müraciətin ilkin mətni rus dilində hazırlanmışdı. Ərkani-hərbin rəisi Sulkeviçin əmri ilə mətn Azərbaycan dilində tərcümə edilərək çoxaldılmış və Xüsusi Lənkəran dəstəsinin komandiri H. Səlimova verilmişdi ki, bölgəyə gələndə əhali arasında yayılsın və təbliğ edilsin.

1919-cu il avqust ayının əvvəllərində Lənkəran dəstəsi artıq formalaşdırılmış və hərəkət üçün müəyyən hazırlıq da görülmüşdü. Bununla bağlı avqustun 4-də hərbi nazir müvafiq əmr imzaladı. Həmin əmrlə dəstənin komandanlığı həvalə olunmuş Ümumi qərargahın rəisi general-mayor Həbib bəy Səlimova göstəriş verilirdi ki, dəstənin tərkibinə daxil olan hissələrlə Hacıqabul, Salyan, Pokrovsk, Prişib və Lənkəran marşrutu ilə Lənkəran qəzasına hərəkət etməli və orada qayda-qanun ilə sakitliyi bərqərar etməlidir (87, v.11).

Dəstənin ümumi sayının 3,5 min nəfər olacağı güman edilirdi. Əmrdə bu sayda olan şəxsi hey'ətə və atlara ərzaq və yem normaları da müəyyən edilmişdi. Mövcud olan normativlər əsasında aparılan hesablamalar göstərirdi ki, bir sutka ərzində 3500 nəfər üçün 67 pud ət, 197 pud çörək, 55 pud tərəvəz, 10 pud duz, 6,5 pud qənd, 18,25 funt çay və 1000 baş at üçün 250 pud arpa və 250 pud saman lazımdır. Bütünlükdə sutka ərzində 335 pud ərzaq və 500 pud heyvan yemi məsrəf olunmalı idi. Bu qədər yükün daşınması üçün 42 ədəd araba tələb olunurdu.Hissələr onların anbarlarında olan ehtiyatlar hesabına deyil, Hərbi Nazirliyin Ləvazimat idarəsinin hesabına tə'min edilməli idi. Ətin isti havada uzun müddət saxlanması mümkün olmadığı üçün dəstəyə ətlik heyvanların verilməsi nəzərdə tutulurdu. Çörəyin isə Hacıqabulda, Salyanda və Pokrovskdə bişirilməsi planlaşdırılırdı (87, v. 11).

Dəstənin tərkibinə daxil olan hissələrin və əmlakın Hacıqabula gətirilməsinə Süvari diviziyası da kömək göstərməli idi. Bununla bağlı Hərbi Nazirliyin rəhbərliyi süvari diviziyasının komandirinə müvafiq göstəriş vermişdi (128, v. 1).



Ərkani-hərbin rəisi Sulkeviçin imzaladığı sərəncama görə Lənkəran dəstəsi avqustun 12-də Hacıqabula toplaşmalı və səhərisi gün, yə'ni avqustun 13-də Salyana doğru hərəkətə başlamalı idi (128, v. 3).

Lənkəran dəstəsinin formalaşdırılması və cənub bölgəsinə hərəkəti ilə bağlı mövcud olan cüz'i sənəd və mə'lumatlar göstərir ki, bu dəstənin bütün fəaliyyəti hərbi nazir S. Mehmandarovla Ərkani-hərbin rəisi Sulkeviçin ciddi nəzarəti altında olmuşdu. Düzgün qurulmuş rabitə ilə S. Mehmandarov və Sulkeviç dəstə barədə tam mə'lumata malik olmuş və onun bütün fəaliyyətini tənzimləyə bilmişdilər. Lənkəran dəstəsinin yaradılmasında və onun tapşırılan döyüş vəzifələrini uğurla yerinə yetirilməsində Sulkeviçin də böyük rolu və xidmətləri olmuşdur. Hərbi nazirin əmrləri dəstəyə çox vaxt Sulkeviçin sərəncamları və teleqramları vasitəsilə çatdırılırdı.

Lənkəran dəstəsinin qərargahı da təşkil edilmişdi. Dəstənin fəaliyyəti bu qərargah tərəfindən idarə edilirdi. Qərargah rəisi vəzifəsinə podpolkovnik Ehsan xan Naxçıvanski tə'yin edilmişdi. (172, v.7). Dəstənin fəaliyyətinin sənədləşdirilməsi aparılır və gündəlik döyüş əmri imzalanırdı. Döyüş əmrlərinin hamısı mövcud olmasada da arxivlərdə qalan sənədlərdən dəstənin fəaliyyətinin, hərəkətinin ümumi mənzərəsini təsəvvür etmək mümkündür (bax: 172).

Lənkəran dəstəsinə daxil olan hissə və bölmələr 1919-cu il avqustun 12-də Hacıqabulda toplaşdılar. Həmin gün hissə və bölmələrin hamısında hərbi səfər üçün hazırlıq işləri aparıldı, həvalə olunan tapşırıqlar dəqiqləşdirildi və qarşılıqlı fəaliyyətin tənzimlənməsi üçün zoruri məsləhətləşmələr aparıldı. Ancaq əvvəldən müəyyənləşdirildiyi kimi dəstə avqustun 13-də yola düşmədi.

Mövcud olan sənədlərdən aydın olur ki, dəstənin tərkibinə daxil olan hissə və bölmələrin Hacıqabula toplaşması avqustun 13-ü səhərə kimi davam etmişdi. Ola bilsin ki, bə'zi hissə və bölmələr ləngidiyi üçün dəstənin hey'ətinin tam formalaşması da bir gün tə'xirə salınmışdı. Həmin gün (avqustun 13-də) Lənkəran dəstəsinə daxil olan hissə və bölmələrin Hacıqabulda-toplanış məntəqəsində paradı keçirildi. Çoxlu sayda yerli əhalinin tamaşa etdiyi paradı general H.Səlimov qəbul edirdi. Qəzetlərin yazdığına görə, dəstənin tərkibinə daxil olan hissə və bölmələr qısa müddət ərzində vahid kollektiv kimi formalaşmış, yüksək çeviklik və məharət nümayiş etdirə bilmişdilər. Bu da dəstənin komandiri, general H. Səlimovun böyük sevincinə səbəb olmuşdu (11, 17.08.1919).

Dəstənin ilk döyüş əmri 1919-cu il avqustun 13-də imzalanmışdı. Əmrdə dəstənin qarşısında dayanan vəzifə, onun tərkibi, hərəkət vaxtı, hərəkət qaydaları və s. məsələlər öz əksini tapmışdı. Dəstənin tərkibinə 5-ci Bakı piyada alayı, 3-cü Şəki süvari alayı, 2-ci yüngül topçu, 6-cı dağ

topçu və əlahiddə qaubitsa batareyaları, istehkam taqımı və zirehli maşınlar taqımı daxil idi (172, v. 1).

İlk döyüş əmrində göstərilirdi ki, dəstə malyariya xəstəliyinin geniş yayıldığı ərazilərdən keçəcəyi üçün çiy su içilməsi qadağan edilsin, malyariyanın yayılması üçün zəmin yaradan qarpız, yemiş və meyvələrdən istifadə məhdudlaşdırılsın, dəstə qaynanmış su ilə təchiz edilsin, hərəkətdən qabaq hamıya çay verilsin. General Səlimov tələb edirdi ki, hissə və bölmələr hərəkət qaydalarına riayət etməli, aralarındakı məsafəni gözləməli, heç kəs sıradakı yerini dəyişməməlidir. Gündəlik mənzil başına çatanda hissə və bölmələr Səhra Nizamnaməsinə uyğun olaraq yerləşməli və dəstənin mühafizəsi tə'min edilməli idi (172, v. 2).

Dəstənin şəxsi hey'ətinin davranış normalarına ciddi əməl etməsi zəruriliyi döyüş əmrində xüsusilə vurğulanırdı. General H. Səlimov hissə və bölmə komandirlərinin nəzərinə çatdırırdı ki, hər bir nəfərin əməlinə onlar göz yetirməli, dəstənin qarşısında dayanan vəzifələrin doğru və düzgünlüyü şəxsi hey'ətə çatdırılmalıdır. Dəstə komandirinə görə bütün şəxsi hey'ət məzhəbindən asılı olmayaraq bütün yerli əhaliyə hörmət və ehtiramla yanaşmalı, ölçülüb-biçilmiş hərəkətləri ilə özlərinə hörmət qazanmalı və özlərini qanunçuluğun dayağı kimi nümayiş etdirməlidirlər. Əmrdə bildirilirdi ki, qanun-qaydanı pozanlar, talan və zorakılıqda günahlandırılanlar dəstənin nəzdində yaradılacaq hərbi-səhra məhkəməsinə veriləcəkdir. Nəhayət, əmrdə müəyyənləşdirilirdi ki, hər gün axşam saat 6-da hissə və bölmələr şəxsi hey'ətin və atların sayı barədə dəstənin qərargahına mə'lumat təqdim etməlidirlər (172, v. 2).

Avqustun 15-də dəstə Salyana çatdı. Şəxsi hey'ət iki gün ərzində çox yorulduğu üçün general Səlimov ayın 16-nı istirahət günü e'lan etdi. O əmr verdi ki, Salyanda aralıq sursat anbarı yaradılsın və buraya bütün toplar, pulemyotlar və tüfənglər üçün tam döyüş komplekti cəmləşdirilsin (172, v. 5).

Salyana çatana kimi Səlimov muğanlıların yanına öz nümayəndələrini göndərdi və onların sülh yolu ilə deyilənlərə əməl etməyə çağırdı (11, 23.08.1919). Eyni zamanda Səlimov S.Mehmandarovun Lənkəran qəzasının əhalisinə imzaladığı müraciətnaməmənin yayılmasına başlanması barədə göstəriş verdi (11, 24.08.1919).

Avqustun 14-də Lənkəran dəstəsi hərəkətə başlayan günü hərbi nazir S.Mehmandarov general Səlimova teleqram göndərdi. Teleqramlardan birində tələb olunurdu ki, dəstənin tərkibinə daxil olan yüngül topçu batareyası dərhal geri Hacıqabula, oradan da Bakıya göndərilsin (172, v. 11).

O biri teleqramda isə deyilirdi ki, yaranmış olan vəziyyət qoşunların tezliklə Bakıya qaytarılmasını tələb edir. Ona görə də nazir bildirirdi ki, dəstə Lənkərana çatan kimi ona bir günlük istirahət verilsin və geri Hacıqabula qayıtsın. Lənkəranda isə qanunçuluğun qorunması üçün 600 nəfərlik bir



tabor saxlanmalı idi. Gələcəkdə Lənkəran köməkçi (ehtiyat) taboru təşkil edildikdən sonra oradakı tabor geri qayıtmalı idi (128, v.10).

Heç şübhəsiz ki, hərbi nazir S.Mehmandarov Səlimovdan sadəcə olaraq Lənkərana çatıb geri qayıtmağı tələb etmirdi. O, dəstədən qarşıya qoyulan bütün vəzifələrin operativ və sür'ətlə yerinə yetirilməsini tələb edirdi. Çünki yaranan vəziyyət vaxt itirmədən qoşunların geri qaytarılmasını, respublikanın dövlət müstəqilliyi üçün meydana gələn təhlükənin sovuşdurulmasına cəlb edilməsini zəruri edirdi. Denikin qoşunlarının Azərbaycana müdaxiləsi təhlükəsi respublikada çox böyük gərginlik yaratmışdı. Bu təhlükə hər an reallaşa bilərdi və həmin təhlükənin qarşısının alınması üçün heç də kifayət qədər qüvvə yox idi. Lənkəran dəstəsinin tərkibində olan hissə və bölmələr şimaldakı müdafiə mövqelərini müəyyən dərəcədə möhkəmlədə bilərdilər. Digər tərəfdən, Qarabağda hərbi şərait xeyli mürəkkəbləşmişdi və Qarabağ ermənilәri ilə müvəqqəti razılaşma hələ əldə edilməmişdi. Nəhayət, Şamaxı qəzasının malakan əhalisi Azərbaycan hökumətinə qarşı itaətsizlik göstərir, yerli idarəetmə orqanlarının iradəsinin əksinə gedirdilər. Buradakı hökumət əleyhinə çıxışlar elə bir miqyas almışdı ki, Şamaxı qəza rəisi malakanların tərksilah edilməsi üçün hərbi qüvvə göndərilməsini xahiş etmiş (160, v.258), hərbi nazir isə ora Şəki süvari alayını göndərməyi qərara almışdı (128v.10).

Beləliklə, 1919-cu ilin yayında respublikada bir neçə böyük gərginlik ocağı yaranmışdı. Heç şübhəsiz ki, belə həyəcanların başlanması eyni zamanda təsadüfi deyildi. Nəzərə alınsa ki, erməni-daşnak qüvvələri ilə Denikin arasında sıx əlaqələr mövcud idi, onda mə'lum olar ki, bu həyəcanların hamısı bu və ya digər dərəcədə Denikin qoşunlarının fəallaşması ilə bağlı idi.

General Səlimova göndərdiyi teleqramında S.Mehmandarov daha sonra tələb edirdi ki, əhalidən alınmış olan toplar və odlu silahlar Hacıqabula, oradan da Gəncəyə nəql edilsin. Əhalidə olan topçu təchizatının toplanması, Muğan qüvvələrinin hakimiyyətdə olduqları vaxt Lənkəranın müdafiəsində işlətdikləri zirehli avtomobilin axtarılıb tapılması, yığılan silahların miqdarı barədə vaxtaşırı mə'lumat göndərilməsi barədə də teleqramda Səlimova lazımi göstəriş verilirdi (128, v.10).

Yuxarıda qeyd edilmişdi ki, avqustun 8-10-u arası Muğan qüvvələrinin liderləri Azərbaycan hökumətinə tabe olmağa razılıq versələr də danışıqları hər vasitə ilə uzadırdılar və öz niyyətlərinə nail olmaq üçün hətta geniş miqyaslı hücuma da keçmişdilər. Azərbaycan hökumətinə qarşı birmə'nalı mövqedə dayana bilməyən bu qüvvələrin respublikanın istiqlaliyyəti üçün real təhlükə təşkil etdiyinə şübhəsi olmayan S.Mehmandarov avqustun 14-də Səlimova göndərdiyi başqa bir teleqramında əhalidə olan həm odlu, həm də soyuq silahların, topların, pulemyotların, revolverlərin, patronların, qılınc, süngü, bıçaq və xəncərlərin yığılmasını tələb edirdi. Nazir Səlimo-

va çatdırırdı ki, əhali arasında izahat işləri aparılsın və onlar silahlarını gizlədəcəyi təqdirdə hərbi səhra məhkəməsinə verəcəkləri barədə xəbərdar olunsunlar. Belə sərt tələblər hərbi qulluqçulara qarşı da irəli sürülürdü. Əhalidən alınmış silahı gizlətməyə cəhd göstərən hər bir hərbi qulluqçu ciddi məs'uliyyətə cəlb olunmalı idi (128,v.12).

Hərbi Nazirliyin rəhbərliyi ingilis qoşunları komandanlığından xahiş etdi ki, nümayəndələrinin birini Lənkəran dəstəsinə göndərsin və əhalidən silahların toplanmasını müşahidə etsin. İngilis qoşunlarının nümayəndəsi muğanlıların çoxlu silaha malik olduqlarını görüb Azərbaycanın dövlət müstəqilliyinə qarşı çevrilə biləcək bu silahların toplanmasına tə'sir göstərə bilərdi. Ancaq General Sulkeviç teleqramlarından birində Səlimova bildirirdi ki, ingilis qoşunları komandanlığı bu təklifə tərəfdar çıxmamışdır (128, v.13).

Avqustun 17-də Lənkəran dəstəsi Salyandan hərəkətə başladı. Səhər saat 4-də 3-cü Şəki süvari alayı, 6-cı dağ topçu batareyası və bir zirehli avtomobil yola düşdü. Həmin qrupdan 30 dəqiqə sonra 5-ci Bakı piyada alayı, qaubitsa batareyası və digər bölmələr hərəkətə başladılar. General Səlimov imzaladığı müvafiq döyüş əmrində dəstənin hər iki qrupundan tələb edirdi ki, hərəkət zamanı marşrut boyu müşahidə aparsınlar və şəxsi hey'ətin mühafizəsini tə'min etsinlər. Avqustun 17-si axşamını dəstə Şorsulu-Ramazanlı məntəqəsində keçirməli idi (172,v.6).

S.Mehmandarovun avqustun 14-də general Səlimova göndərdiyi sonuncu teleqramda rus əhalisində olan hər cürə silahın yığılması məsələsini qoyurdu. Bu tələb nazirin Lənkəran qəzası əhalisinə müraciətnaməsində irəli sürdüyü tələblə müqayisədə daha qətiyyətli idi. Yerli əhali isə bəhanə edirdi ki, ingilis komandanlığının iştirakı ilə polkovnik İlyaşeviçin və Azərbaycan hökuməti nümayəndəsinin əldə etdiyi razılaşmada, ümumiyyətlə, tərksilah məsələsindən söhbət getmirdi. Rusdilli əhali silahların hamısını təhvil verəcəyi təqdirdə bölgədə mövcud olan silahlı dəstələrin basqınları qarşısında müdafiəsiz qalacaqlarını irəli sürürdülər. Onlar bütünlüklə silahlarının təhvil verilməsini xoş iradə ilə qarşılamırdılar. Bütün bunlara görə general Səlimov Hərbi Nazirliyə göndərdiyi teleqramda tə'kidlə soruşurdu ki, silahların toplanması ilə bağlı hansı tələbi yerinə yetirməlidir (128, v.15). Göründüyü kimi silahların toplanması ilə bağlı Səlimov bölgədəki rus əhalisinin güclü müqavimət ilə rastlaşmışdı. Ona görə də o, həmin məzmunda Hərbi Nazirliyə ikinci bir teleqram göndərib hansı tələbin fəaliyyət üçün rəhbər tutulmasını dəqiqləşdirməyi xahiş etmişdi. Səlimovun bildirdiyinə görə yerli əhali ingilislərin iştirakı ilə Lənkəranda imzalanmış və silahların əhalidən yığılmasını nəzərdə tutmayan razılaşmanın həyata keçirilməsini tələb edirdilər (128, v.16).

Avqust ayının 17-də Sulkeviç Səlimova cavab teleqramı göndərdi. O, bildirirdi ki, muğanlılar Azərbaycan hökumətinə qarşı ikibaşlı mövqe



tutduqları və avqustun 11-də keçirdikləri qurultayda qərəzli və hədələyici bir qərar qəbul etdikləri üçün onların bütün silahları toplanmalıdır. Müraciətnamədə irəli sürülən tələblərə dəyişiklik edilməsi bununla bağlı idi. Rus əhalisinin baş verə biləcək hər hansı bir təhlükədən qorunmasına gəlincə, general Sulkeviç əlavə edirdi ki, bu yerli hakimiyyət orqanlarının işidir və bu istiqamətdə onlar lazım olan tədbirləri həyata keçirəcəklər (128, v.14).

Avqustun 17-də general Səlimov təkcə rus əhalisi ilə olan münasibətlərin aydınlaşdırılmasına deyil, həm də dəstədə nizam və intizamın möhkəmləndirilməsinə xeyli vaxt ayırdı. Həmin gün dəstə Salyandan Şorsuluya doğru irəliləyərkən 3-cü Şəki süvari alayının süvarisi Yəhya Sarı oğlu yolda içində Biləsuvar kəndinin və Astrarxanka kəndinin iki rus mənşəli sakini olan furqonu saxlamış, öldürəcəyi ilə hədələyərək onlardan 3725 rubl pul almışdı. Rus sakinləri bu barədə dəstənin rəhbərliyinə şikayət etdilər. Səlimov bu barədə mə'lumat alan kimi dərhal soyğunçu əsgəri hərbi səhra məhkəməsinə vermək haqqında göstəriş verdi. Avqustun 19-da 5-ci Bakı piyada alayının komandiri podpolkovnik İsrafilovun sədrliyi altında təşkil edilən hərbi-səhra məhkəməsi dəstə komandanlığının tələblərinə riayət etmədiyi və döyüş şəraitində əsgər şərəfinə ləkə gətirən hərəkətlə məşğul olduğu üçün onu ölüm cəzasına məhkum etdi (128, v.9, 10).

Avqust ayının 18-də Lənkəran dəstəsi öz hərəkətini davam etdirdi. General Səlimovun və dəstənin qərargah rəisi podpolkovnik Ehsan xan Naxçıvanskinin imzaladığı 6 saylı döyüş əmrində göstərilirdi ki, həmin gün hissə və bölmələr 18 verst qət etməlidir. Hərəkətə başlamazdan əvvəl 3-cü Şəki süvari alayından irəliyə göndərilən zabit kəşfiyyat qrupu marşrutun təhlükəsizliyini öyrənib dəstə komandanlığına xəbər verməli idi. Rus kəndlərinə əmrsiz daxil olmaq qəti qadağan edilirdi. Yol ayrıclarına xüsusi qarovullar tə'yin edilməli idi. Yük arabaları və dəstəni tamamlayan qrup əvvəlcə müəyyənləşdirilmiş ardıcıllıqla hərəkət etməli idi. İstirahət yerinə çatan kimi 5-ci piyada alayı düşərgənin ətrafına mühafizə postları qoymalı, hava qaralandan sonra düşərgəyə kənar adam buraxılmamalı idi (172, v.7,8).

Avqust ayının 19-da dəstə artıq Pokrovskda idi. Avqustun 20-si dəstəyə istirahət günü e'lan edilmişdi (172, v.9).

Lənkəran dəstəsi sadəcə olaraq müəyyən edilmiş marşrut üzrə hərəkət etmirdi. Həm də marşrut boyu yerləşən rus kəndlərindən silah da toplayırdı. Avqustun 17-18-də dəstə tərəfindən rus kəndlərindən 3 top və 5 pulemyot alınıb Bakıya yola salınmışdı. Ayın 19-da həmin silahlar artıq Bakıya çatmışdı. S.Mehmandarov avqustun 19-da Səlimova göndərdiyi teleqramında tələb edirdi ki, Azərbaycan hökumətinin və ordusunun nüfuzunun aşağı düşməsinə yol verməmək üçün daha qətiyyətlə hərəkət edin və dəstənin mümkün qədər tez Bakıya qaytarılmasını tə'min edin. S.Mehman-

darov elə həmin gün general Səlimova daha bir teleqram göndərdi. Nazir bir daha xatırladırdı ki, Azərbaycan hökumətinin muğanlılarla heç bir razılaşması yoxdur və silahların yığılmasına qarşı onların hər hansı bir müqavimət göstərməsi əsassızdır. Hərbi nazir bildirirdi ki, muğanlılara rəhbərlik edən polkovnik İlyaşeviç və onun oğlu Azərbaycan hökumətinin tələblərinə qarşı çıxmaqda davam edərsə həbs olunmalı və Bakıya göndərilməlidir (128, v.17,18).

Avqustun 20-də Pokrovska çatandan sonra bu kənd də dəstə tərəfindən mühasirə olundu və əhalidə olan silahların toplanmasına başlandı. Kənd əhalisindən 2 ədəd top və 4 pulemyot alındı (128, v.22).

S.Mehmandarov ayın 20-də Səlimova göndərdiyi teleqramında qeyd edirdi ki, əgər əhali Azərbaycan hökumətini tanıyıb onun qərarlarını bütünlüklə yerinə yetirməyə söz verirsə onların tüfəngini saxlamaq olar. Ancaq zirehli avtomobil, toplar və pulemyotlar isə heç nədən asılı olmayaraq toplanmalıdır (128, v.24).

Avqustun 21-də dəstə Prişibə doğru hərəkət etməli idi. Dəstə komandanlığının imzalamış olduğu 10 saylı müvafiq əmrində hissə və bölmələrin hərəkət zamanı yeri, onların vəzifələri barədə mükəmməl mə'lumat mövcuddur. Dəstənin avanqardına polkovnik Şahzadə Xosrov Mirzə Qacar komandanlıq etməli idi. Onun tərkibinə 5-ci Bakı piyada alayının bir taboru, 6-cı qaubitsa batareyasının 4 topu, 3-cü Şəki süvari alayının bir bölüyü, zirehli avtomobillər taqımının bir avtomobili daxil idi. Avanqardın saat 4-də Prışıb-Nikolayevsk yolu ilə hərəkətə başlaması və Prişibə 3 verst qalmış irəli süvari və piyada dozorlar göndərməsi nəzərdə tutulurdu. Piyada bölmələrin döyüşqabağı mövqelər tutması, süvarilərin onların cinahlarında, topların isə Prişibdən 4 verst aralı olan təpəliklərin arxasında yerləşdirilməsi planlaşdırılmışdı. Dəstə komandirinin əlavə əmrinə əsasən avanqard irəli hərəkəti davam etdirən zaman Prişibi adlamalı, Əhmədli kəndi yaxınlığında çayı keçib Nikolayevkaya gedən şosse yolun cənubunda dayanmalı və Əhmədli kəndinin şimalına və şimal-qərbinə keşikçi-mühafizə dəstələri göndərməli idi (172, v.11).

Dəstənin əsas qüvvələrinə 5-ci Bakı piyada alayının komandiri polkovnik İsrafilov komandirlik edirdi. Onun tərkibinə 5-ci piyada alayının 9 bölüyü, qaubitsa batareyasının 4 ədəd topu və Şəki süvari alayının 4 bölüyü daxil idi. Əsas qüvvələr avanqarddan yarım saat sonra, yə'ni səhər saat 4.30-da hərəkətə başlamalı və günün sonuna Əhmədli kəndi yaxınlığındakı düşərgəyə çatmalı idi. 5-ci piyada alayının bir bölüyü isə dəstənin aryerqardını təşkil edirdi. Aryerqard səhər saat 5-də hərəkətə başlamalı və bütün arabalardan sonra irəliləməli idi (172, v.11).

Prişibdə və onun ətrafında əhalidən nə qədər silah toplandığını söyləmək çətindir. Mövcud olan sənədlərdə bu barədə mə'lumat yoxdur. Ancaq mə'lumdur ki, Prişibdə əhalidən 105 baş at və 101 ədəd yəhər yığılmışdı (407, v.32).

Avqustun 22-də dəstə Əhmədli kəndi yaxınlığındakı düşərgədən hərəkəti davam etdirirdi. Həmin gün 27 verst yol qət olunmalı və Qumbaşı stansiyası yaxınlığında, Lənkərana aparan yolun üzərində düşərgə salınmalı idi. Kolonnanın tərkibi və sırası əvvəlki şəkildə saxlanılmışdı. Avqustun 22-nə imzalanmış döyüş əmrində ştabs-rotmistr Ağalarov Prişibin komendantı tə'yin edilirdi. O, əhalidən toplanmış olan silahı, sursatı, hərbi təchizatı aktlaşdırmalı və sonra da mühafizə altında Salyana göndərməli idi (172, v.11).

Avqustun 23-də dəstə Lənkərana çatdı. Lənkərana girərkən dəstənin sırasında dəyişiklik edildi. Şəhərə girən dəstənin ardıcıllığı belə idi: 5-ci Bakı piyada alayının bir taboru, qaubitsa batareyası, piyada alayının digər taboru və 3-cü Şəki süvari alayı. Hissə və bölmələrin tərkibində su çənləri daşıyan arabalar və sanitar arabaları da hərəkət edirdi. Qalan bütün əmlak, sursat isə lap arxada hərəkət edirdi (172, v.13).

Dəstənin Lənkərana gəlişi yerli əhali arasında böyük sevinc və təntənə ilə qarşılandı. Avqustun 24-25-də hissə və bölmələrə istirahət verildi. Dəstə komandanlığının döyüş əmrində göstərilirdi ki, bu günlər ərzində şəxsi hey'ət istirahət etməklə bərabər, növbəti tapşırıqlar üçün hazırlıq aparmalı, hərbi qulluqçuların səbəbsiz yerə şəhərdə gəzişməsinə yol verilməməlidir (172, v.14).

Sonrakı günlər ərzində dəstənin əmlakı Lənkəranda saxlanıldı və bura əsas bazaya çevrildi. Avqustun 26-da dəstə Yeddi Oymaq kəndinə doğru hərəkətə başladı, avqustun 28-də Astraxanka, avqustun 26-da isə Biləsuvar yaşayış məntəqələrində oldu (128, v.32). Biləsuvarda dəstə əhalidən 6 ədəd top və ona lazım olan çoxlu alət və təchizat əldə etdi (160, v.299).

Avqustun sonuna Lənkəran dəstəsi ona həvalə olunmuş vəzifələri tamamilə yerinə yetirdi, xüsusi bir silahlı müqavimətə rast gəlmədən bölgənin rus əhalisini, polkovnik İlyaşeviçin rəhbərliyi altında olmuş silahlı dəstələri tamamilə tərksilah etdi və respublikanın cənubunda Azərbaycanın istiqlaliyyəti üçün mövcud olan təhlükə birdəfəlik sovuşduruldu.

Tərksilah zamanı əhalidən və Muğan qüvvələrindən 22 ədəd top alındı. Həmin topların 20 ədədi tam işlək vəziyyətdə, 2-si sökülmüş vəziyyətdə idi. Bundan başqa 25 ədəd tam işlək pulemyot və 7 ədəd işləməyən pulemyot toplanmışdı (160, v.299).

1919-cu il sentyabrın 3-də Lənkəran dəstəsi həvalə olunan döyüş tapşırığını yerinə yetirdikdən sonra Hacıqabula qayıtdı və həmin gün dəstənin komandiri general-mayor Səlimovun və dəstənin qərargah rəisi podpolkovnik Ehsan xan Naxçıvanskinin imzası ilə 23 saylı sonuncu döyüş əmri imzalandı. Burada göstərilirdi ki, Lənkəran dəstəsinin qarşısına çox mürəkkəb bir vəzifə qoyulmuşdu. 2500 nəfərlik şəxsi hey'ət 8 topun müşayəti ilə 8 min nəfərlik silahlı dəstə və 6 top batareyası çıxarmaq imka-

nına malik olan Muğanın rusdilli əhalisindən bütün silah və sursatı toplamalı idi. Dəstə yerli əhaliyə heç bir xətər yetirmədən bu çətin vəzifənin öhdəsindən gəldi, yalnız ultimativ tələblərlə xeyli sayda silah və sursat topladı. Toplardan və pulemyotlardan başqa əhalidən 4 minə qədər mərmi, 3 yük avtomobili, 209 xidməti at və çoxlu sayda hərbi təchizat yığılmışdı. Yığılan əmlakın içərisində motosiklet, telefon aparatları, toplar və pulemyotlar üçün ehtiyat detallar da var idi. Döyüş tapşırığının icrası ərzində dəstə 425 verst yol qət etmişdi. Bu müddət ərzində dəstənin şəxsi hey'əti davranış normalarına lazımınca riayət etmiş və kəndlərdən silah toplanarkən əhalidən heç bir şikayət alınmamışdı. Hətta vaxtı ilə rus ordusunda xidmət etmiş keçmiş əsgərlər Azərbaycan Ordusundakı nizam və intizamın Napoleon dövrlərində olduğundan da möhkəm olduğunu qeyd edirdilər.

Əmrdə qeyd olunduğuna görə bir sıra ucqar kəndlərdə Azərbaycan Ordusunun çox qısa zamanda formalaşması əhalinin heyrətinə səbəb olmuşdu. Orkestrin sədaları altında şax addımlarla hərəkət edən qoşun bölmələrini gördükdə çoxları ordunun baş komandanı, hərbi nazir S.Mehmandarova öz xeyir-dualarını göndərirdilər. General Səlimov qürur hissi ilə vurğulayırdı ki, yaratdığı gənc ordunun əhalinin hörmət və məhəbbətini qazanmasını S.Mehmandarova çatdırmaqdan şərəf duyacaqdır.

Tapşırılan vəzifələrin tamamilə icra edildiyi üçün general Səlimov hissə və bölmələrin komandirlərinə, dəstənin tərkibinə daxil olan bütün zabitlərə və əsgərlərə öz minnətdarlığını bildirirdi. Xidmətdə xüsusilə fərqlənən bir neçə zabitə isə şəxsən minnətdarlığını çatdırmağı Həbib bəy Səlimov özünün şəxsi və vəzifə borcu bilirdi. Həmin hərbi qulluqçular bunlar idi: 5-ci Bakı piyada alayının komandiri podpolkovnik İsrafilov, 3-cü Şəki Süvari alayının komandiri polkovnik Xosrov Mirzə Qacar, 6-cı dağ topçu batareyasının komandiri podpolkovnik Tarxanov, dəstənin qərargah rəisi podpolkovnik Ehsan xan Naxçıvanski, dəstənin həkimi, mə'mur Bulatov, dəstənin ləvazimat rəisi Xan Talışinski.

Lənkəran dəstəsinin cənub bölgəsində fəaliyyəti ərzində yuxarıda göstərilən silahlardan başqa Muğandakı qüvvələrdən və rus əhalisindən 517 ədəd berdanka tüfəng, 93 ədəd türk tüfəngi, 382 ədəd ov tüfəngi, 289 ədəd müxtəlif silahlar, 36 ədəd süngü, 670 ədəd ingilis patronu, 12454 ədəd berdanka patronu, 26 ədəd səhra bombası, 3 ədəd aeroplan bombası, 15 ədəd qılınc və 40 ədəd xəncər alınmışdı. Bütün bu silahlar sonradan Lənkəranda təşkilinə başlanan köməkçi tabora təhvil verilmişdi (172, v.67).

Respublikanın cənubunda aparılan təmizləmə əməliyyatından sonra burada vəziyyətin birdəfəlik sabitləşdirilməsi üçün Hərbi Nazirliyin rəhbərliyi Nazirlər Şurası qarşısında qondarma Muğan hökumətinin bütün çinovniklərinin və onun silahlı dəstəsinin bütün zabitlərinin Azərbaycanın hüdudlarından çıxarılması barədə məsələ qaldırdı (160, v.371).



Lənkəran hadisələrindən təxminən iki ay sonra, 1919-cu il oktyabr ayının sonlarında hərbi nazir S.Mehmandarovla Cənubi Rusiya Silahlı Qüvvələri Baş komandanının Azərbaycandakı nümayəndəsi arasında aparılmış yazışmalardan aydın olur ki, Lənkəran bölgəsində silahlı Muğan qüvvələrində olan rus zabitlərindən heç biri qalmamışdır və rusdilli zabitlərinin hər hansı birinin, hər hansı bir məqsədlə bu bölgəyə səfəri Azərbaycanın hökumət orqanlarının icazəsi ilə ola bilərdi və həmin səfər dövlət orqanlarının ciddi nəzarəti altında saxlanılırdı (160, v.379).

1919-cu il sentyabr ayının birinci yarısında hərbi nazir S.Mehmandarov da bir neçə gün ərzində Lənkəranda oldu (11, 17.09.1919). Lənkəran dəstəsinin burada görmüş olduğu işlərlə, bölgədəki mövcud vəziyyətlə yaxından tanış oldu. Bakıya qayıtdıqdan sonra o, Lənkəran dəstəsinin fəaliyyətinin nəticələri ilə bağlı 19 sentyabr 1919-cu il tarixli 420 saylı əmrini imzaladı. Əmrin ikinci bəndində deyilirdi: "Lənkəran şəhərinin tutulması, həmin rayonda qayda-qanunun bərpa edilməsi və Azərbaycan hökumətinin hakimiyyətinin təsdiq edilməsi üçün mənim tərəfimdən Lənkərana Ümumi qərargah rəisi general-mayor Səlimovun komandanlığı altında üç qoşun növündən ibarət xüsusi dəstə təchiz edilmiş və göndərilmişdi.

Hacıqabuldan Lənkərana və geriyə olan 430 verstlik məsafəni güclü istidə bizim gənc ordumuz xəstələr və arxada qalanlar olmadan 15 günə qət etmişdir. Bütün yürüş ərzində dəstədə qayda-qanun pozulmamış, yerli sakinlərdən heç birinə kiçik bir ziyan da vurulmamışdır. Yolboyu şəhər və kəndlərin əhalisi dəstənin zabit və əsgərlərinin nəzakətli davranışlarını böyük minnətdarlıqla qeyd edirdilər. Mən buna dəstənin Lənkərandan getməsindən sonra olan şəxsi səfərim zamanı əmin oldum. Hamıda öz əsl hərbi görkəmi və nümunəvi nizam-intizamı ilə güclü təəssürat yaradan dəstə zəngin hərbi qənimətlə Lənkəran qəzasını və Muğanı əzizimiz Azərbaycanın ağuşuna qaytardı, zülmdən və anarxiyadan əziyyət çəkən əhalini sakitləşdirdi və əmin-amanlığı tə'min etdi. Bütün bunlar bir damla qan tökülmədən həyata keçirildi.

Yürüşün bu cür yaxşı nəticələrinə, başlıcası isə hərəkətin nizamının qurulmasını təşkil edən, qoşunun ehtiyaclarına qayğı və ağıllı tələbkarlıq göstərən dəstə rəisinə, general-mayor Həbib bəy Səlimova xidmətlərinə görə səmimi təşəkkürümü bildirirəm. Dəstənin tərkibinə daxil olan hissələrin rəislərinə, bütün zabitlərə və sanitar hey'ətinə qayğıya, yol və dayanacaqlarda tam qayda-qanunun qorunmasına görə təşəkkür edirəm.

Azərbaycan Ordusunun birinci hərbi yürüşündə özlərini qoçaq və şərəfli döyüşçü kimi göstərən gənc əsgərlərə ürəkdən "sağ ol" deyirəm" (271, s.107; 90, v.143).

Lənkəran dəstəsinin nə döyüş əmrlərində (onların heç də hamısı mövcud deyil-M.S.), nə də dəstə komandanlığının Hərbi Nazirliklə teleqram mübadiləsində aparılan əməliyyat zamanı hərbi qulluqçulardan kimsənin

şəhid olması barədə mə'lumat yoxdur. S.Mehmandarovun yuxarıdakı əmrində də dostə qarşısında dayanan vəzifələrin bir damla qan tökülmədən yerinə yetirildiyi vurğulanır. Bununla belə, ingilis jurnalisti Skotland Liddel Bakıdan hazırladığı yazılarından birində Lənkəran ətrafındakı döyüşlərdə həlak olmuş 9 nəfər əsgərin dəfn mərasimini təsvir edirdi. Müəllif bu əsgərlərin Lənkəranda bolşeviklərə qarşı aparılan mübarizədə şəhid olmalarını vurğulamasından güman etmək olar ki, həmin itki xüsusi Lənkəran dəstəsinin bölgəyə gəlməsindən əvvəl burada mövcud olan azsaylı qoşun bölmələrinin və könüllü silahlıların Lənkəranın azad edilməsi uğrunda apardığı döyüşlər zamanı verilmişdi. İngilis jurnalisti bu dəfn mərasiminin ümumxalq kədərinə və yekdilliyinə çevrildiyinə xüsusi diqqət yetirirdi və bununla da oxucularına sadə xalq kütlələrinin gənc Azərbaycan Ordusuna olan münasibətini çatdırırdı: "Ötən bazar ertəsi mən Bakıda tamamilə fərqli dəfn mərasiminin şahidi oldum. Lənkəran ətrafında 9 Azərbaycan əsgəri öldürülmüşdü. Bolşeviklər əleyhinə hərbi əməliyyat gənc Azərbaycan Ordusunun ilk döyüş fəaliyyəti idi. 9 əsgərin cənazəsi dəniz yolu ilə Bakıya gətirilmiş və burada onlara möhtəşəm bir dəfn mərasimi təşkil edilmişdi. Nadir hallarda belə kütləvi mənzərənin şahidi olmuşdum. Tabutların arxasınca gedənlərin uzun sırasında Azərbaycanın bütün nazirliklərinin və ictimai təşkilatlarının nümayəndələri var idi. Görkəmli adamlar və tüfənglərinin lüləsi aşağı çevrilmiş bir neçə min əsgər azərbaycanlıların çiyinlərində apardığı 9 tabutun ardınca düzülmüşdülər. Küçələr adamlarla və əsgərlərlə əhatə olunmuşdu" (79, v.1).

İngilis jurnalistinin fikrincə, bu qədər adamın küçələrə çıxması bir tərəfdən Azərbaycan Ordusuna səmimi münasibəti ilə bağlı idisə, o biri tərəfdən bolşevizmə olan nifrətdən irəli gəlirdi (79, v.1).

Apardığı müşahidələr əsasında Skotland Liddel yazısında Azərbaycan Ordusu barədə də öz təəssüratını bölüşürdü. Onun fikrincə, əgər tabutlar və matəm marşı olmasaydı küçə ilə irəliləyən əsgər və zabitlərin qumral və şax yerişi gənc Azərbaycan Ordusunun paradını andırırdı (79, v.1).

### *2. ERMƏNİ TƏCAVÜZÜNƏ QARŞI MÜBARİZƏ*

1918-ci ilin sentyabrında Bakı şəhəri azad edildikdən sonra türk qoşun hissələrinin Qarabağa gəlməsi ilə burada azərbaycanlılara qarşı həyata keçirilən qırğınların və təcavüzlərin qarşısı alınsa da, Zəngəzur qəzasının azərbaycanlı əhalisi erməni zülmü altında inləməkdə davam edirdi. Qeyri-insani əməlləri heç bir çərçivəyə sığışmayan Andronikin dəstələri qəzanın azərbaycanlılardan təmizlənməsi üçün heç bir qansızlıqdan çəkinmirdilər. Yerli əhalinin müdafiə imkanlarına malik olmaması, havalar soyuduqca əlaqələrin çətinləşməsi erməni-daşnak silahlı dəstələrinin qarşılarına qoyduqları niyyətlərin həyata keçirilməsini daha da asanlaşdırırdı.



1918-ci ilin payızında Zəngəzurda 52 kənd məhv edilmişdi. 32 kənddə 495 ev yandırılmış, 492 ev dağıdılmış, 2254 azərbaycanlı öldürülmüş, 304 nəfər azərbaycanlı isə yandırılmışdı (165, s.51).

Mövcud olan mə'lumata görə yalnız azərbaycanlıların qırılması üçün toplanmış olan Andronikin dəstəsinin böyük hərbi potensialı var idi (265, s.62). Həmin hərbi potensial Azərbaycan kəndləri üzərinə hücum çəkmək və əhalini ata-baba torpaqlarından qovaraq bu əraziləri şəriksiz hakim olmaq üçün toplanmışdı.

1918-ci ilin noyabr-dekabr aylarında türk qoşunlarının Azərbaycan ərazilərini tərk etməsi Zəngəzurda və Qarabağda erməni təcavüzünün yeni bir faciəli dövrünün başlanğıcını qoydu. Azərbaycanlılara qarşı həyata keçirilən qırğın və talanlar daha geniş vüs'ət aldı. Həmin ilin dekabr ayının 2-də Gülyataq ermənilərı böyük bir silahlı dəstə ilə Sırxavənd kəndi üzərinə hücum etdi. Bütün gücü ilə müdafiə olunan azərbaycanlılar 1 erməni öldürüb 6 ermənini yaralasalar da, aparılan yüzlərlə mal-qaranı geri qaytara bilmədilər (11, 1.1.1919).

Dekabrın 12-də Qarakənd erməniləri azərbaycanlılar üzərinə hücum etdilər, çoxlu dağıntı və talanlar törətdilər (76, v.6). 1918-ci ilin sentyabrından dekabrınadək Zəngəzur qəzasında erməni silahlı dəstələrinin Azərbaycan kəndləri üzərinə 34 irimiqyaslı hücumu baş vermişdi. Həmin hücumlar nəticəsində çoxlu adam öldürülmüş, evlər yandırılmış, mal-qara aparılmışdı (76, v.10-11).

1918-ci ilin sonlarında Andronikin silahlı dəstəsi Zəngəzur qəzası ilə bərabər Şuşa və Cəbrayıl qəzasının kəndlərində də qırğın və talanları xeyli genişləndirdi (265, s.106). Hətta bu qırğınların miqyasından ingilis qoşunlarının komandanı general Tomson da dəhşətə gəlmiş və Andronikə bu məzmunda teleqram göndərmişdi: "Andronikə və ya Şuşa rayonundakı erməni komandanına. Aldığım mə'lumata görə ermənilər azğınlıq və talanlar törədirlər. Müttəfiqlərin nümayəndəsi kimi mən sizə əmr edirəm ki, bu qanunsuzluqlara birdəfəlik son qoymaq üçün tədbirlər görün və bütün ermənilərə xəbər verin ki, onlar sakitcə öz evlərində qalsınlar. Əgər siz bu əmrləri yerinə yetirməsəniz baş verə biləcək qan tökülməsinə görə şəxsən məs'uliyyətə cəlb ediləcəksiniz. Xahiş edirəm bu teleqramı almağınızı təsdiq edəsiniz. General Tomson" (77, v.25).

1918-ci ilin sonu, 1919-cu ilin əvvəllərində ingilis nümayəndələrinin göstərişinə əsasən Zəngəzurda davam edən qırğınların qarşısının dinc yolla alınmasına da cəhd göstərildi. Abdallarda ermənilər və azrəbaycanlılar arasında danışıqlar aparıldı. Lakin Andronikin dəstəsi heç bir razılaşmaya, danışıqlara qulaq asmaq niyyətində deyildi. Onun rəhbərliyi altında yenidən 30-dan artıq Azərbaycan kəndi talan edildi (265, s.108).

Vaxt ötdükcə erməni millətçi silahlı dəstələrinin azğınlıq və qırğınları daha faciəvi xarakter alırdı. Bu özbaşınalıqlara qarşı qətiyyətli mübarizə-

nin aparılması və dinc əhalinin talanlardan qurtarılması üçün Nazirlər Şurası 15 yanvar 1919-cu il tarixli iclasında Zəngəzur, Şuşa, Cavanşir və Cəbrayıl qəzaları üzrə müvəqqəti general-qubernatorluğun yaradılmasını qərara aldı. Müvəqqəti general-qubernatorluğa fövqəl'adə səlahiyyətlər verilməsi nəzərdə tutulmuşdu (77, v.25).

Nazirlər Şurasının 15 yanvar 1919-cu il tarixli iclasında Xosrov bəy Sultanov Qarabağın general-qubernatoru vəzifəsinə təsdiq edildi və həmin il aprelin 3-də onun səlahiyyətləri rəsmi olaraq müttəfiq komandanlığı tərəfindən də tanındı (54, v.27).

Fevralın 10-da Xosrov bəy Sultanov Şuşaya gəldi. Səhərisi gün o, şəhər qlavası Q.Şahnazarovu, yepiskop Vaqanı yanına çağırtdırıb vəziyyətin sabitləşdirilməsi üçün onlarla danışıqlar apardı (47, v.13).

Qarabağ general-qubernatorluğunun yaradılması və Xosrov bəy Sultanovun da general-qubernator tə'yin edilməsi Ermənistan hökumətinin çox böyük e'tirazına və ciddi narahatçılığına səbəb oldu. Ermənilər Qarabağın və Zəngəzurun erməni torpaqları olduğunu iddia edərək yeni yaradılan general-qubernatorluğun ləğvini tələb edirdilər və bununla bağlı Azərbaycan hökumətinə rəsmi nota da göndərmişdilər. Azərbaycan Xarici İşlər Nazirliyinin 1919-cu il yanvarın 31-də verdiyi cavab notasında bildirilirdi ki, Zəngəzur və Qarabağ Azərbaycanın əzəli və ayrılmaz hissəsidir. Bu ərazilərdə öz vətəndaşlarının həyatının və əmlakının qorunması, qanun-qaydanın bərpa edilməsi Azərbaycan hökumətinin təkcə hüquqi yox, həm də mə'nəvi borcudur. Notada qeyd olunurdu ki, yeni general-qubernatorluğun yaradılması Azərbaycanın Ermənistanın daxili işlərinə qarışması deyil, əksinə onun ləğvinin tələb edilməsi Ermənistanın Azərbaycanın daxili işlərinə qarışmasıdır (76, v.3).

Qarabağ general-qubernatorluğunun yaradılması haqqında Azərbaycan hökumətinin qərarı Qarabağda və Zəngəzurda Azərbaycan əhalisinə qarşı qırğınların genişlənməsinə yeni bir təkan verdi. Azərbaycan hökumətinin bu qətiyyətli qərarından qəzəblənən erməni millətçiləri 1919-cu il yanvarın axırı, fevralın əvvəllərində neçə-neçə Azərbaycan kəndinin üzərinə hücuma keçib çoxlu qırğınlar törətdilər (bax:76, v.6-13).

Zəngəzur istiqamətindən Andronikin dəstəsi Qarabağa doğru irəliləyir və yolu üzərində olan bütün kəndləri talan edirdi. O, Şuşanın 35 kilometrliyinə çatmışdı. 1919-cu il fevralın ikinci yarısında 200 nəfərlik ingilis qoşun bölməsinin Şuşaya gəlməsi (47, v.13) Andronikin silahlı dəstəsinin Qarabağa sarı irəliləməsinə son qoydu (48, v.17).

Fevralın 19-da Britaniyanın Zaqafqaziyadakı qüvvələrinin komandanı general-mayor Loker Ermənistan hökumətinin sədrinə teleqram göndərib məsələnin sülh konfransında həll edilməsinə qədər silah gücünə ərazilərin işğalına son qoyulmasına çağırdı. Fevralın 24-də isə general Tomson Ermənistan hökumətinə göndərdiyi teleqramında bildirirdi ki, doktor Sultanov Zən-



gəzur, Cəbrayıl, Şuşa və Qarabağın general-qubernatoru kimi Şuşaya göndərilir. Generala görə X.Sultanov Şuşaya heç bir iddiasız, yalnız qanun-qaydanın bərqərar edilməsi üçün gəlmişdi və ona silahlı qüvvələrin tətbiqinə icazə verilməmişdir. General əlavə edirdi ki, X.Sultanov bacarıqlı adamdır və istəsə yaxşı tanıdığı bu ərazilərdə çox şeyə nail ola bilər (47, v.2).

X.Sultanov yeni vəzifəyə tə'yin olunan kimi Qarabağ və Zəngəzur əhalisinin müdafiəsini tə'min etmək üçün Hərbi Nazirlikdən müəyyən miqdarda silah və sursat istədi. Yuxarıda qeyd edildiyi kimi, Hərbi Nazirliyin rəhbərliyi ordunun özündə silah və sursata böyük ehtiyac olduğu üçün X.Sultanovun sərəncamına silah və sursat göndərilməsinin qeyri-mümkünlüyünü bildirdi (56, v.2).

1919-cu il fevralın 15-də Şuşada qəza rəislərinin və ictimai xadimlərinin ilk müşavirəsi keçirildi. Həmin müşavirədə başlıca olaraq erməni və Azərbaycan münasibətləri müzakirə edildi. Burada qeyd edildi ki, Andronikin dəstəsində 400 nəfər süvari və 600 nəfər piyada vardır və bu dəstənin təcavüzkar fəaliyyəti nəticəsində təkcə Zəngəzurda artıq 166 kənd talan edilmişdir. Müzakirələrin gedişində vurğulandı ki, vəziyyətin sabitləşdirilməsi üçün Andronikin dəstəsinin tör-töküntüləri və digər təcavüzkar ermənilər bu ərazilərdən qovulmalı, Azərbaycan hökumətini tanıyan ermənilərə kömək göstərilməlidir (56, v.11).

Fevralın 17-də general-qubernatorluqda növbəti müşavirə keçirildi. Müşavirədə iştirak edən ingilis qoşunlarının Şuşadakı nümayəndəsi kapitan Seyral bildirdi ki, Andronikin dəstəsinin ləğvi ilə onlar da məşğuldurlar (56, v.21).

Şuşadakı Britaniya missiyası adından mayor Monk-Mezon Qarabağ erməni Milli Şurasına müraciət edərək bütün erməniləri yeni hökumət orqanına tabe olmağa çağırdı. O bildirirdi ki, Zəngəzur, Şuşa, Cavanşir və Cəbrayıl qəzalarının müvəqqəti general-qubernatoru Britaniya komandanlığının razılığı ilə tə'yin edilmişdir. Onun mülki hissə üzrə müavini ermənidir. Bundan başqa, general-qubernatorluğun nəzdində 3 erməni və 3 azərbaycanlıdan ibarət şura yaradılmışdır. Şuranın tərkibində ingilis missiyasının bir nümayəndəsi də var idi və qubernatorluqda qoşun hissələrinin bütün fəaliyyəti ingilislərin nəzarəti altında həyata keçirilməli idi. Bütün bunlardan sonra Britaniya missiyası əhaliyə bəyan edirdi ki, Qarabağ general-qubernatorluğunun bütün göstəriş və sərəncamları hamı üçün məcburidir və hər hansı itaətsizlik göstərilməsinə qarşı ən qətiyyətli tədbirlər həyata keçiriləcəkdir (47, v.15).

Qarabağın erməni Milli Şurası və erməni qüvvələrinin komandirləri Şuşadakı Britaniya missiyasının bu bəyanatını müzakirə edib Azərbaycan hökumətinə hər hansı bir şərt altında tabe olmağın mümkünsüzlüyünü bildirdilər. Bundan sonra Qarabağ ermənilərinin 4-cü qurultayı çağırıldı və burada da Azərbaycan hökumətinə tabe olmağa, habelə Qarabağ general-qubernatorluğunun yaradılmasına qəti e'tiraz bildirildi. Qurultayda seçilən

erməni Milli şurası Bakıya, general Tomsonun yanına nümayəndə hey'əti göndərdi. Nümayəndə hey'ətinə Yepiskop Vaqan və şuranın üzvü Bahadurov daxil idilər. Onlar Bakıya gələrək general Tomsonun qarşısında aşağıdakı tələbləri qoydular: 1. Dərhal Qarabağın Ermənistana birləşdirilməsi və ya sülh konfransı çağırılanadək müvəqqəti olaraq Qarabağın Ermənistanın hakimiyyəti altına verilməsi; 2. Türk qoşunlarının gəlişindən qabaq Qarabağın vəziyyətinin bərpa edilməsi; yə'ni Qarabağ hökumətinin yenidən təşkili; 3. Yerli erməni idarəçiliyi saxlanmaqla və azərbaycanlıların maraqlarının qorunmasına zəmanət verməklə erməni zonasında ingilis general-qubernatorunun tə'yin edilməsi və ya, 4. bütün Qarabağda yerli idarəçilik orqanları təşkil edilməklə ingilis general-qubernatorluğunun yaradılması (47, v.22).

Tomson ermənilərin bu tələblərinə tərəfdar çıxmadı. Ermənilər isə Azərbaycan hökumətini tanımaqdan imtina etdilər (47, v.22). Bu məsələdə ermənilərin həyasızlığı elə bir səviyyəyə çatdı ki, əzəli Azərbaycan torpaqlarına şəriksiz sahib durmaq üçün nəinki Zəngəzur və Qarabağda, az qala Azərbaycanın bütün ərazisində hərbi hazırlığın gücləndirilməsinə başlandı. Hətta Bakı şəhərində erməni milli xadimləri,o cümlədən Amazasp Azərbaycana qarşı silahlı mübarizə aparılması üçün silah gəzdirmək qabiliyyətinə malik olan bütün erməniləri siyahıya alırdı, dəstələr düzəldir, silahlandırır və onlarla tə'lim aparırdı (11, 22.11.1919). Erməni hökumətinin Bakıdakı hərbi nümayəndəsi Ermənistan hökumətinin sədrinə və hərbi nazirinə göndərdiyi məktublarında bildirirdi ki, keçmiş Bakı ordusunun burada 8-10 min nəfər əsgər və zabiti vardır. Belə böyük bir qüvvənin toplanıb Ermənistan hökumətinin sərəncamına göndərilməsi üçün general Tomsonun da qarşısında məsələ qaldırılmışdı. General Tomson bütün erməni əsgər və zabitlərinin Ermənistana göndərilməsinə razılıq vermişdi. Hətta həmin əsgər və zabitlərin silahla Ermənistana göndərilməsi məsələsinin mümkünlüyü də nəzərdən keçirilirdi. Erəmənistanla Gürcüstan arasında müharibənin başlanması bu məsələnin operativ icrasını bir qədər ləngitsə də, onların siyahıya alınması və qruplaşdırılması davam edirdi (47, v.30).

Bakıda erməni hərbi dəstələrinin formalaşdırılmasını general Tomson özü də təsdiq edirdi. O, Nazirlər Şurasının sədri Xoyskiyə göndərdiyi məktubunda bildirirdi ki, Bakıda həqiqətən Ermənistana yola salınması üçün keçmiş erməni əsgərlərinin və zabitlərinin siyahıya alınması aparılmaqdadır. Ancaq bu dəstənin silahlandırılmasına icazə verilməmişdir (11, 22.11. 1919).

Bundan başqa, erməni tərəfi öz hərbi qüvvələrinin gücləndirilməsi üçün artıq general olmuş Biçeraxovla da əməkdaşlıq imkanlarını nəzərdən keçirirdilər. Bakıdakı Ermənistan hərbi nümayəndəsi bu məqsədlə Biçeraxovla görüşmüş və onunla danışıqlar aparmışdı. Ermənistan rəhbərliyinə göndərdiyi mə'lumatında o bildirirdi ki, qoşunsuz qalan Biçeraxov ingilislərin



də hər cürə köməyindən məhrum olmuşdur. İngilislərdən yenidən kömək almaq üçün o, müəyyən nizama malik olan orduya malik olmalıdır. Bu niyyətini həyata keçirmək üçün rus təmayülü ilə daha çox fərqlənən erməni ordusuna ümid bəsləyir. Erməni hərbi nümayəndəsi qeyd edirdi ki, Biçeraxovun hərbi-texniki imkanları olsa da, erməni qoşunlarının tamamilə ona tabe edilməsi erməni niyyətlərinin həyata keçirilməsinə mane ola bilər. Ona görə də bu məsələdə milli mənafelərin daha dərindən ölçülüb biçilməsini məqsədəuyğun sayırdı (11, v.30).

Kəskinləşməkdə olan ermən təcavüzünün qarşısını almaq üçün Qarabağın mühüm strateji əhəmiyyətli nöqtələrində – Xankəndində, Şuşada, Ağdamda Azərbaycanın qoşun hissələri yerləşdirilmiş, Əskəranda mühafizə postları qoyulmuşdu. Hərbi Nazirliyin rəhbərləri bu hissələrin və onlara həvalə edilmiş postların möhkəmləndirilməsinə xüsusi diqqət yetirirdi və həmin hissələr dəfələrlə yoxlanılmışdı.

Qarabağda yerləşən hərbi qüvvələrdən daha operativ və çevik istifadə edilməsi üçün general-qubernator X.Sultanov 1919-cu il aprel ayının ilk günlərində onların operativ planda general-qubernatorluğa tabe edilməsi barədə məsələ qaldırmışdı. Hərbi Nazirliyin rəhbərliyinin tə'kidi ilə qərara alınmışdı ki, Qarabağda yerləşən qoşun hissələrini mülki adama tabe etmək olmaz. O yalnız zərurət yaranarsa hərbi qüvvələrdən istifadə edilməsi barədə hökumət qarşısında məsələ qaldıra bilər (265, s.125-125).

Qarabağın və Zəngəzurun azərbaycanlılardan büsbütün təmizlənməsi üçün hər cürə hərəkətlərə əl atmağa hazır olan erməni qüvvələri Qarabağda yerləşən Azərbaycan Ordusunun qoşun hissələrinin potensialından çəkindikləri üçün açıq hərbi əməliyyatlara başlamaqdan bir qədər ehtiyat edirdilər. 1919-cu ilin birinci rübünün sonunda Qarabağ erməniləri 10 mindən 12 minədək silahlı adam toplamaq imkanına malik olsalar da, bu adamlar hərbi cəhətdən birləşməmiş və formalaşmamışdılar. Ona görə də Qarabağ ermənilərinin Milli Şurası Ermənistan hökumətindən xahiş edirdi ki, Qarabağ general-qubernatorluğunun ləğv edilməsi və Azərbaycanın qoşun hissələrinin Qarabağdan çıxarılması üçün ilk növbədə diplomatik kanallardan istifadə edilsin. Diplomatik təzyiqlərin, təbliğat hay-küylərinin gözlənilən nəticəni verməyəcəyi halda onlar hərbi hazırlıq işlərinin genişləndirilməsini də vacib sayırdılar. Məsələnin hərbi yolla da həllinə hazır olmaq üçün Qarabağ ermənilərinin Milli Şurası Ermənistan hökumətindən aşağıdakıları tələb edirdi: a) qısa müddət ərzində yerli hakimiyyət orqanlarının (erməni idarəçilik orqanları nəzərdə tutulur-M.S.) nizamlanması, milis alaylarının təşkil edilməsi və yerlərdə patronların, hərbi təchizatın alınması üçün tə'cili maddi kömək göstərilməsi; b) Qarabağ erməniləri üçün üçxətli tüfənglər üçün patronlar və digər sursat ayrılması; c) Qarabağ ermənilərinin hərbi işinin təşkili üçün işgüzar və nüfuzlu hərbi rəhbər göndərilməsi; ç) Andronikın hələlik Zəngəzurdan uzaqlaşmaması üçün

zəruri olan tədbirlər görülməsi; d) mümkün qədər tezliklə möhkəmləndirilmiş nizami erməni hissələrinin Zəngəzura yeridilməsi və Zəngəzurun birdəfəlik Ermənistan Respublikasının tərkibinə qatılması (47, v.34-35).

1919-cu ilin aprel ayında Qarabağ ermənilərinin 5-ci qurultayı çağırıldı. Burada da başlıca olaraq erməni – Azərbaycan münasibətləri müzakirə olundu. Millətçi elementlərin tə'siri və təzyiqi altında qurultay belə bir *qərar qəbul etdi ki, Azərbaycan hökuməti ilə əlaqəsi olan hər hansı bir* dövlət idarəçilik forması qəbul edilə bilməz (49, v.35). Yə'ni qurultay bir daha erməni qüvvələrinin təcavüzkar xəttini təsdiqlədi və ermənilərin Azərbaycan torpaqlarına olan təcavüzkar iddialarından əl çəkmədiyini nümayiş etdirdi.

Erməni qüvvələrinin fəallaşan təcavüzkarlığı ingilis komandanlığının gözü qarşısında baş verdi. Azərbaycanın ərazi bütövlüyünün gözlənilməsi və tə'min edilməsi üçün heç də birmə'nalı və prinspial mövqedə dayanmayan ingilis komandanlığının Şuşadakı nümayəndələri əhalini qızışdıran, sakitliyin bərqərar olmasına imkan verməyən erməni millətçi liderlərin Qarabağdan çıxarılması barədə X.Sultanovun təklifini müdafiə etsələr də, praktiki qərarların qəbul edilməsini ləngidirdilər (77, v.13). Bu isə vəziyyəti daha da mürəkkəbləşdirirdi. İş o yerə gəlib çıxmışdı ki, Qarabağın digər əraziləri bir yana qalsın, Şuşa şəhəri özü də tam şəkildə general-qubernatorun nəzarəti altında deyildi. Ermənilər Şuşa-Yevlax yolu boyu bir sıra yüksəkliklərdə mövqe tutub yoldan keçənləri güllləyə basırdılar. May ayının əvvəlində bu yolla hərəkət edən 9 azərbaycanlı tutulub namə'lum istiqamətdə aparılmışdı. May ayının ortalarında bu yolla hərəkət edən daha 7 azərbaycanlı yoxa çıxmışdı. Şuşa-Qaryagin və Qaryagin-Şuşa yolu günü-gündən güclənməkdə olan erməni silahlı qüvvələrinin tam nəzarəti altına keçmişdi (11, 16.07.1919).

May ayının sonlarında sürülərin dağ otlaqlarına aparılması kampaniyasına başlanmalı idi. Ermənilərin təcavüzlərinin genişləndiyi bir vaxtda sürülərin və onların sahiblərinin üzərinə ermənilər tərəfindən basqınlar ediləcəyi təhlükəsi real xarakter alırdı. Bu təhlükəni sovuşdurmaq üçün Şuşadakı Britaniya missiyasının nümayəndələri şəhərdə e'lanlar yayıb əhalini köçlərə ziyan yetirməməyə çağırırdı (77, v.10).

Qarşılıqlı münasibətlərin kəskinləşdirilməsi üçün hər cürə hərəkətə əl atmaqdan çəkinməyən erməni millətçilərinin Britaniya missiyası nümayəndələrinin çağırışlarına qulaq asmayacağı Qarabağ general-qubernatorluğunda şübhə doğururdu. X.Sultanovun bildirdiyi kimi, təcavüzkar planların reallaşdırılması üçün Ermənistan hökumətindən böyük miqdarda vəsait alan Qarabağ millətçiləri havadarlarının onlarla bağladıqları ümidlərin əbəs olmadığını sübut etmək üçün münasib vaxt gözləyirdilər. Yaxın günlər üçün planlaşdırılan belə əməllərin qarşısının alınması və bütünlükdə hökumət orqanı kimi general-qubernatorluğun möhkəmləndirilməsi



üçün X.Sultanov bir sıra tədbirləri həyata keçirməyi qərara aldı. 1919-cu il may ayının sonlarında Şuşanın erməni hissəsində olan əsgər qışlalarına qoşun bölmələrinin yerləşdirilməsi məqsədəuyğun bilindi. Bu qışlalar istifadəsiz qalmışdı və Azərbaycanın qoşun bölmələrinin orada yerləşdirilməsi həmin bölmələrin məişət şəraitini yaxşılaşdırmaqla bərabər erməni millətçilərini azğınlığının məhdudlaşdırılmasına da kömək edə bilərdi. Ancaq bunun qarşıdurmanı xeyli kəskinləşdirəcəyindən ehtiyatlanan general-qubernator müəyyən qədər gözləməyi lazım bildi. Şəhərin erməni hissəsində yerləşən xəzinədarlığın və poçtun Azərbaycan hissəsinə köçürülməsi isə dərhal həyata keçirildi (77, v.13).

Xəzinədarlığın və poçtun köçürülməsi də erməni millətçiləri tərəfindən vəziyyətin qızışdırılmasında məharətlə istifadə edildi. 1919-cu il iyulun 3-də millətçi qüvvələr Şuşanın erməni hissəsindən keçən iki azərbaycanlı əsgər üzərinə hücum edib, onların atını, tüfəngini və patronlarını əllərindən aldılar. Əsgərlər özləri isə güclə qaçıb canlarını qurtardılar. Erməni millətçiləri *tərəfindən Azərbaycan hökuməti əleyhinə təbliğatların* genişləndirilməsi, iyunun əvvəllərində Qarabağa Ermənistandan silahlı dəstələrin gələcəyi xəbərinin yayılması və nəhayət, iyunun 3-də Azərbaycan əsgərlərinə qarşı həyata keçirilən zorakılıq göstərirdi ki, daha irimiqyaslı təcavüzlərin baş verəcəyi heç də uzaqda deyil. Gözlənilən təhlükəni sovuşdurmaq və köç kampaniyasını sakitcə başa çatmasını tə'min etmək üçün iyunun 4-də Xosrov bəy Sultanov tərəfindən daha qətiyyətli və səmərəli tədbirlər həyata keçirildi. Bu tədbirlər Şuşa-Yevlax yolunun təhlükəsizliyinin tə'min edilməsi ilə bağlı idi.

Şuşanın azərbaycanlılar hissəsində hələ 1905-ci ildə erməni-Azərbaycan münaqişəsi zamanı qazılmış olan səngərlər var idi. Bu səngərlərn bir ucu gedib Üçmıx dağına çıxırdı. Azərbaycanlıların səngəri ilə üzbəüz, 500-600 metr aralı erməni səngərlərin yerləşirdi. Bu səngərlərin hər ikisində son vaxtlar hər iki tərəfdən qarovullar dayanırdı. Həmin istiqamətdə vəziyyəti daha da möhkəmləndirmək üçün iyunun 3-dən 4-nə keçən gecə İrəvan qapısı tərəfə, şəhərdən bir verst aralı yüksəkliklərin üzərində əlavə hərbi post qoyuldu. Postda 18 piyada və 9 pulemyotçu var idi. Əsgərlər tüfəng və bir ədəd pulemyotla silahlanmışdılar. İyunun 4-də səhər Azərbaycan əsgərlərinin bir qrupu erməni səngərlərinə keçib orada möhkəmlənmək istədilər. Köç keçən yolların mühafizəsinin möhkəmləndirilməsi üçün gətirilmiş olan əsgərlərin postlarda yerləşdirilməsini erməni millətçiləri şəhərin erməni hissəsinin mühasirə edilməsi kimi qiymətləndirib ehtirasların qızışdırılmasına əl atdılar (77, v.14; 11, 16.VII.1919). Elə ayın 4-də erməni silahlıları azərbaycanlı əsgərlərin ətrafına toplaşmağa başladılar. Bu silahlıların sayı 50 nəfərə çatmışdı. Onların başında Arzumanov familiyalı bir zabit dayanırdı. Erməni silahlıları Azərbaycan əsgərlərindən tələb etdilər ki, tutduqları mövqeləri tərk etsinlər. Azərbaycan

postunun rəisi Maksimoviç cavab verdi ki, hərbi intizama tabe olan bir şəxs kimi özbaşına mövqeləri tərk edə bilməz və bunun üçün yuxarı komandanlıqdan icazə alınmalıdır. Yuxarı komandanlıqla məsələni aydınlaşdırmaq üçün Maksimoviç uzaqlaşdıqdan sonra Azərbaycan postuna onun köməkçisi Kərimov rəhbərlik edirdi. Erməni silahlıları onun da qarşısında mövqeni tərk etmək tələbi qoydular. Mənfi cavab aldıqda erməni silahlıları Azərbaycan əsgərlərini atəşə tutdular. Nəticədə 4 Azərbaycan əsgəri həlak oldu. Erməni tərəfindən də itki var idi. Təxribata rəhbərlik edən zabit Arzumanov da Azərbaycan əsgərlərinin gülləsinin qurbanı oldu (11, 16.VII.1919).

Azərbaycan əsgərlərinə qarşı belə bir təxribatın həyata keçirilməsi kütləvi təcavüzün başlanmasına bir işarə oldu. Ermənilər köçlərin üstünə hücum çəkdilər. Köç adamları arasında da ölənlər və yaralananlar oldu. Bu hadisələr əks-səda verərək bir sıra yaşayış məntəqələrində silahlı qarşıdurmaya gətirib çıxardı. Bə'zi yerlərdə bu silahlı qarşıdurmanın kütləvi qırğınlara çevrilməməsi üçün general-qubernatorun xahişi ilə qoşun bölmələri göndərildi. Lakin bütün münaqişə məntəqələrinə hərbi qüvvələrin göndərilməsi mümkün deyildi. Çünki qoşunların səpələnməsi Xankəndi qarnizonunun zəifləməsinə və ermənilər tərəfindən güclü hücumlara mə'ruz qalmasına səbəb ola bilərdi (77, v.15).

Erməni təxribatları üzündən iyunun 4-də Şuşa şəhəri və onun ətrafında yerləşən kəndlər silahlı qarşıdurma mərkəzinə çevrilmişdi. Vəziyyətin daha da kəskinləşməsinə yol verilməməsi üçün iyunun 4-də axşam Xosrov bəy Sultanov Şuşadakı ingilis qoşunlarının komandanlığına müraciət edib bütün bu təxribatların ilhamçısı olan bir neçə erməni millətçisinin şəhərdən uzaqlaşdırılması məsələsini qaldırdı (77, v.15).

Hadisələrin inkişafının əyani şahidi olan ingilis zabitləri X.Sultanovun mövqeyinin doğruluğuna tamamilə şərik çıxdı. İyunun 4-də qarşıdurmanın sakitləşdirilməsi üçün yepiskop Vaqan ingilis nümayəndəliyinə müraciət edəndə oradan alınan cavab da erməni millətçi liderlərinin Şuşadan çıxarılmasının zəruriliyini təsdiq edirdi (11, 16.08.1919).

X.Sultanov qaldırdığı məsələnin həllini ingilis komandanlığından ultimativ şəkildə tələb edirdi. O bildirirdi ki, əgər erməni millətçiləri şəhərdən uzaqlaşdırılmasa, onda şəhərin ermənilər yaşayan birinci hissəsinə qoşun bölmələri yeridiləcək və həmin millətçilər həbs edilərək şəhərdən çıxarılacaqlar. İyunun 5-də səhər ingilis komandanlığı tərəfindən erməni Milli şurasının fəalları İşxanyan, Avetisyan və Tumanyans həbs edilib azərbaycanlı mə'murların müşayiəti ilə Azərbaycan sərhədindən Ermənistana ötürüldülər (77, v.9).

İyunun 6-da isə bir piyada bölüyü və bir süvari bölüyünün yarısı qədər hərbçilər şəhərin erməni hissəsindəki qışlalara daxil olub orada yerləşdilər. X.Sultanovun fikrincə, Şuşanın erməni hissəsi Qarabağda erməni mil-



lətçiliyinin və separatizminin mərkəzi idi və ora Azərbaycanın qoşun bölmələrinin yeridilməsi erməni millətçilərinin ehtiraslarının soyumasına tə'sir edəcəkdi (77, v.9).

Doğrudan da iyunun 6-da qoşun bölmələrinin şəhərin erməni hissəsinə daxil olması və millətçi liderlərin uzaqlaşdırılması ilə vəziyyət tamamilə sabitləşdirildi və hər şey öz axarına düşdü. Hətta bir çox ermənilər Qarabağ general-qubernatorluğuna məktub yazaraq Azərbaycan əsgərlərinə qarşı təxribatın baş verməsində erməni millətçi liderlərini günahlandırırdılar (77, v.11).

Azərbaycan əsgərlərinə qarşı təxribat hadisəsi haqqında xəbər alan kimi 3 minə qədər kürd silahlısı atlanıb şuşalıların köməyinə yollandılar. Onların Şuşaya daxil olacağı təqdirdə qarşıdurmanın daha da kəskinləşəcəyindən ehtiyatlanan X.Sultanov süvarilərin dayandırılmasına və geri qaytarılmasına cəhd göstərdi. Kürd süvariləri Şuşadan 18 verst aralıda dayandırıldı və geri qayıtmalarının məqsədəuyğunluğu onlara çatdırıldı. Təxminən 50-60 süvari iyunun 6-da Şuşaya daxil olsa da onlar qarşıdurma hadisələrində iştirak etmədilər (11, 16.07.1919).

Şuşada Azərbaycan əsgərlərinə qarşı təxribat törədildəndən sonra şəhərdəki hərbi qüvvələrin möhkəmləndirilməsi qərara alındı. Bunun üçün ora 2-ci Qarabağ süvari alayının bir bölüyü və 2 ədəd pulemyot göndərildi (55, v.30).

Vilayətdə vəziyyətin normalaşdırılması üçün general-qubernator təklif etdi ki, Qarabağın bütün yaşayış məntəqələrinin nümayəndələrini toplayıb ümumi iclas keçirilsin və qəti bir qərar qəbul edilsin. Lakin də'vət olunan nümayəndələr iclasa gəlmədilər. Belə olduqda iyunun10-da Şuşada bütün partiyaların nümayəndələrinin və yepiskopun iştirakı ilə iclas keçirildi. Bu iclasda qərara alındı ki, Qarabağ ermənilərinin növbəti qurultayı çağırılsın və Azərbaycan hökumətinin səlahiyyətlərinin tanınmasına münasibət bildirilsin (77, v.18).

Erməni təcavüzünün qarşısının alınması üçün Azərbaycan hökumət orqanlarının qətiyyətli hərəkətləri erməni millətçilərinin güclü hay-küyünə səbəb oldu. Hadisələrdən dərhal sonra Tiflisdə ermənilərin mitinqi keçirildi, mitinq iştirakçıları Qarabağda vəziyyətin mürəkkəbləşməsində Azərbaycanın qoşun bölmələrini və X.Sultanovu günahlandırır və onların Qarabağ ərazisindən çıxarılmasını tələb edirdilər. Tiflisdəki ermənipərəst qəzetlər də Qarabağda baş verən hadisələrin mahiyyətini tamamilə saxtalaşdıraraq ermənilərin sıxışdırılması, azərbaycanlıların təcavüzünə mə'ruz qalması barədə yalan mə'lumatları ardıcıl olaraq yaymaqda davam edirdilər. İngilis jurnalisti Skotland Liddel hələ o vaxtlar öz müşahidələrində qeyd edirdi ki, təbliğat aparmaq işində ermənilər böyük məharətə malikdirlər. "Ermənilər dünyada ən yaxşı təbliğatçıdırlar, onların təbliğatı son ayların işi deyil, əksinə uzun illər boyu sistemli şəkildə aparılmışdı. Nə Rusiyada,

nə də Qafqazda elə bir adam tapılmaz ki, ermənilər haqqında yaxşı söz işlətsin. Rusların, azərbaycanlıların və gürcülərin onlardan zəhləsi gedir və onlara nifrət edirlər. Doğru olub olmadığını mən deyə bilmərəm. Ancaq fakt göz qabağındadır. Ermənilər qəddar irqdir. Lakin onların təbliğatı xaricdə elə qurulmuşdur ki, Avropa və bütün dünya onların tərəfindədir" (79, v.2).

Məhz belə bir təbliğatın işə salınması nəticəsində ermənilər Zəngəzur torpaqlarının büsbütün erməni sakinlərindən ibarət olduğuna ingilis komandanlığını da inandıra bilmiş və bu ərazilərin idarə edilməsinə müəyyən üstünlük əldə etmişdilər (bax:266, s.150, 151). Bu isə onlara Zəngəzurda azərbaycanlılara qarşı daha geniş qırğınların törədilməsinə zəmin yaratmışdı. Lakin Qarabağ general-qubernatorunun qətiyyətli addımları ermənilərin Qarabağda da azərbaycanlılara qarşı geniş qırğınlar törətməsinə imkan vermirdi. Vaxtında həyata keçirilmiş səmərəli tədbirlər nəticəsində erməni millətçilərinin ehtirasları xeyli səngimiş və bölgədə dinc yaşayış üçün yolların aranmasına başlanmışdı. İyunun əvvəllərində Şuşada baş verən hadisələrin öyrənilməsi üçün Azərbaycan parlamenti tərəfindən xüsusi komissiya təşkil edilmişdi. Həmin komissiya Qarabağda məsələnin mahiyyəti ilə yaxından tanış olduqdan sonra 1919-cu il iyulun 7-də parlamentdə müzakirələr aparıldı. Parlamentin azərbaycanlı üzvlərinin çıxışlarında bildirilirdi ki, bölgədə sabitliyin ən yaxşı zamini erməni əhalisinin nəhayət ki, Azərbaycan hökumətini tanıması və millətçi ehtiraslara son qoyulmasıdır (11, 16.VII.1919).

Bu məsələlər Qarabağ ermənilləri və onların havadarları tərəfindən uzun müddət müzakirə edildi. Həmin müddət ərzində Şuşada və Qarabağda tam sakitlik bərqərar oldu. Şuşanın erməni və azərbaycanlı əhalisi arasındakı əlaqələr xeyli sağlamlaşdı. Adamlar qorxmadan şəhərin bu və ya digər hissəsinə hərəkət etməyə başladılar (79, v.9).

Azərbaycan hökumətinə münasibət məsələsi 1919-cu il avqustun 16-da çağırılan Qarabağ ermənilərinin 7-ci qurultayında da müzakirə edildi. Qurultay nümayəndələrindən 20 nəfər həmin gün Şuşaya gəlib qarşı tərəflər arasında imzalanacaq müqavilənin mahiyyəti barədə danışıqlar apardılar. Avqustun 18-də müqavilənin layihəsi Şuşikəndə, ermənilərə göndərildi. Həmin layihə burada ermənilər tərəfindən ciddi şəkildə öyrənildi və avqustun 19-da onlar müqavilənin imzalanmasına hazır olduqlarını bildirdilər (11, 28.VIII.1919).

Qarabağ ermənilərinin qurultayı da müqavilənin imzalanmasına razılıq verdikdən sonra avqustun 20-də erməni nümayəndələri Şuşaya gəldilər. Bu hadisə münasibətilə bütün şəhər sevinc əhval-ruhiyyəsi içində idi. Küçə və bazarlarda aşıqlar və xanəndələr çalıb-oxuyurdular. Erməni nümayəndələri gündüz general-qubernatorun otağında "Dağlıq Qarabağ ermənilərinin Azərbaycan hökuməti ilə müvəqqəti müqaviləsi"nə imza atdılar



(11, 28.08:155, v.106). Müqavilə 26 maddədən ibarət idi və onun əsas mahiyyətini sülh konfransı çağırılanadək silahlı toqquşmalara son qoyulması və ermənilər tərəfindən Azərbaycan hökumətinin tanınması təşkil edirdi. Elə həmin gün də Şuşa, Zəngəzur, Cavanşir, Cəbrayıl qəzalarının müvəqqəti general-qubernatoru X.Sultanov müvəqqəti müqavilənin imzalanması ilə bağlı bəyanət verdi və müqavilənin bütün şərtlərinə əməl olunması üçün lazımi işlər görüləcəyini bildirdi (126, v.6).

İmzalanan müqavilənin şərtlərinə görə Qarabağın erməni əhalisinin ehtiyaclarının öyrənilməsi üçün general-qubernatorun köməkçisi erməni olmalı idi və erməni və azərbaycanlılardan ibarət Şura yaradılmalı idi. Bölgədə idarəçilik forması kimi general-qubernatorluq saxlanılırdı. Hökumət Qarabağ ermənilərinin mədəni muxtariyyat hüquqlarına hörmətlə yanaşacağını bəyan edirdi. Qarabağ ermənilərinin Milli Şurası da bu mədəni muxtariyyat hüquqlarını reallaşdıracaq bir orqan olmalı və siyasi işlərə qarışmamalı idi. Milliyətindən asılı olmayaraq asayişi pozanların müharibə dövrünün qanunları ilə cəzalandırılacağı bildirilirdi. Qarabağ ermənilərinin narahatçılığına səbəb olmamaq üçün bölgədəki hərbi hissələrin yerdəyişmələri də nəzarət altına alınmalı, qoşun bölmələrinin hər hansı bu məntəqəyə hərəkəti əvvəlcə general-qubernatorun nəzdindəki Şurada müzakirə edilməli və Şura üzvlərinin üçdə ikisinin razılığı ilə qoşunların hərəkətinə icazə verilməli idi. Sülh konfransı çağırılanadək Qarabağ əhalisinin tərksilah edilməsi, siyasi əqidələrinə görə adamların tə'qib edilməsi dayandırılırdı. Siyasi səbəblərə və milli toqquşmalarda iştirakına görə Qarabağı tərk etmiş şəxslərə geri qayıtmaq hüququ, əhaliyə müxtəlif qurumlarda birləşmək, söz, mətbuat və yığıncaq azadlığı verilirdi (126, v.6).

Azərbaycan hökuməti ilə Qarabağ erməniləri arasında müvəqqəti müqavilənin imzalanması Azərbaycanın ictimaiyyəti arasında rəğbətlə qarşılandı. Həmin müqaviləyə müəyyən ümidlər bağlanırdı. Doğrudan da ayın ayında Qarabağ general-qubernatorluğunun qətiyyətli mövqeyi və sonra da müvəqqəti müqavilənin bağlanması bir müddət bölgədə asayişin saxlanmasına imkan verdi. Lakin hadisələrin sonrakı inkişafı göstərdi ki, ermənilər bu müqaviləyə daha çox vaxt qazanmaq, qüvvə toplamaq, yeni təxribatlara və təcavüzlərə hazırlaşmaq üçün münasib imkan kimi yanaşırdılar. Azərbaycan torpaqlarının Ermənistana birləşdirilməsinə əks gedə biləcək, ağla və şüura əsaslanmış heç bir sənədi ermənilər qəbul etmək niyyətində deyildilər. Qanuni vasitələrin onlar tərəfində olmadığını görən erməni millətçiləri zorakı vasitələrə əl atır, azərbaycanlılara qarşı qırğınlar törətməklə onları öz yurdlarından bezikdirməyə çalışırdılar.

1919-cu ilin yayında Qarabağda vəziyyət bir qədər sabitləşsə də Zəngəzurda erməni silahlıları azərbaycanlılara qarşı öz vəhşiliklərini davam etdirirdilər. Mövcud olan mə'lumatlara görə 1919-cu ilin iyulunda Zəngəzurda erməni nizami qoşun hissələri mövcud idi və onlar Qızılboğaz keçi-

di vasitəsilə Ermənistan hökuməti ilə əlaqələr saxlayırdılar (54, v.37). Avqustun 7-də erməni silahlıları Saldaş Azərbaycan kəndinə hücum edib əhalini gülləyə tutdular. Aqaran, Aqavurt və Ucanis erməni kəndlərinin birləşmiş qüvvələri Birinci və İkinci Yeməzli kəndləri üzərinə hücum etdilər. Erməni silahlı qüvvələri tam bir gün ərzində bu kəndləri mühasirədə saxladılar. Avqustun 21-də Zeyvə erməni kəndinin silahlı dəstələri ətrafdakı Azərbaycan kəndlərinin üzərinə basqın etdilər (11, 30.09.1919).

Quduzlaşan erməni silahlı dəstələrinə layiqli cavab vermək üçün Zəngəzurda da yerli müdafiə dəstələri təşkil edilirdi. Bu dəstələrin arasında Xosrov bəy Sultanovun qardaşı Sultan bəyin dəstəsi daha böyük müdafiə imkanlarına malik idi. Avqustun 22-24-ü arası Xaznavar kəndi ətrafında onun dəstəsi ilə erməni silahlı dəstələri arasında döyüşlər baş verdi. Avqustun 27-də Nors kəndi, avqustun 29-da isə Nijadzor və Gümrü kəndləri ətrafında qanlı döyüşlər oldu. Erməni silahlıları bu döyüşlərin gedişində xeyli itki verərək qaçmağa məcbur olmuşdular. Erməni mənbələrinin verdiyi mə'lumata görə həmin döyüşlərdə Azərbaycanın qoşun bölmələri də iştirak etmişdi (84, v.1).

Ancaq Zəngəzurda qüvvələr nisbəti heç də eyni deyildi və erməni tərəfi hökumət səviyyəsində bu qəzanın azərbaycanlılardan büsbütün təmizlənməsi üçün öz təcavüzkar siyasətini davam etdirməkdə idi:

1919-cu ilin sentyabrında erməni nizami qoşun hissələrinin və silahlı dəstələrinin Zəngəzurun Azərbaycan əhalisi üzərinə basqınları xüsusilə faciəli xarakter aldı. Sentyabrın 1-də və 3-də Qafan erməniləri böyük qüvvələrlə ətrafdakı Azərbaycan kəndlərinə hücum edib çoxlu qırğınlar törətdilər. Sentyabrın 2-də və 4-də erməni silahlı dəstələri Tarovlu və Lorcan kəndlərinə basqın etdilər. Sakinlərə canlı itki yetirməklə bərabər, onların mal-qarasını sürüb özləri ilə apardılar (54, v.55). Sentyabrın 4-də çoxsaylı erməni silahlı dəstələri Quba-Kələqi kəndinə hücum edib 10-dan artıq adam öldürdülər. Sentyabrın birinci həftəsi ərzində Zəngəzur qəzasının 3-cü və 4-cü sahəsinin kəndləri hər gün erməni hücumlarına mə'ruz qalırdı. Alınan mə'lumatlara görə bu saysız hücumlarla erməni tərəfi Zəngəzurun müdafiə imkanlarını yoxlayırdılar. Onların əsas qüvvələri Qafan rayonundakı dərələrdən birinə toplanırdı və yaxın vaxtlarda onlar kütləvi hücuma keçərək Zəngəzurun strateji əhəmiyyət daşıyan məntəqələrini işğal etməli idilər (11, 30.09.1919).

Genişlənən erməni təcavüzünün qarşısını almağa gücü çatmayan Azərbaycan kəndlərinin sakinləri yurdlarını tərk edib qaçmağa məcbur olurdular. Mövcud olan bə'zi mə'lumatlara görə 1919-cu il oktyabr ayının əvvəllərində Zəngəzurun 110 böyük kəndi məhv edilmişdi (54, v.57). Bu kəndlərin əhalisi ya qırılmış, ya da ev-eşiklərini tərk edərək qaçmağa məcbur olmuşdular. Yurdlarını tərk etmək məcburiyyətində qalan əhalinin çoxu Qarabağa pənah gətirirdi (84, v.7).



Zəngəzur qəzasından qaçqın düşənlərin sayı 60 minə çatmışdı (54, v.79). Qalan əhalinin böyük əksəriyyəti isə Azərbaycanla əlaqələrin kəsilməsi üzündən aclıq və səfalət içində idilər. Yayılan xəstəliklərdən həm mal-qara qırılır, həm də insanlar böyük əziyyət çəkirdilər (54, v.57).

Ermənilər eyni zamanda öz təbliğat kampaniyalarını işə salmışdılar. Ardı-arası kəsilməyən müraciətləri, məktubları ilə onlar Amerika ictimaiyyətində ermənilərin və onların xristian kilsələrinin mövcudluğunun təhlükə altında olduğu barədə təəssürat yaratmağa və bununla da müttəfiq dövlətlərin erməni tələblərinə münasibətin yaxşılaşdırılması nəticəsində daha çox Azərbaycan ərazilərini ələ keçirməyə çalışırdılar (bax:266, s.161-162).

Zəngəzurda baş verən qırğın və talanlar Azərbaycan ictimaiyyətini və hökumət rəhbərliyini ciddi narahat edirdi. Bu qanunsuzluqların qarşısının dinc yolla alınması üçün Azərbaycan hökuməti tərəfindən bir sıra cəhdlər göstərildi (54, v.79). Aparılan danışıqlar, göndərilən teleqram və notalar heç bir nəticə vermədi. Əksinə, Azərbaycan hökumətinin Zəngəzurda vəziyyəti sabitləşdirmək üçün göstərdiyi cəhdlər Ermənistan hökuməti tərəfindən Ermənistanın daxili işlərinə qarışmaq cəhdləri kimi qiymətləndirilirdi. Ermənistan xarici işlər naziri 1919-cu il oktyabrın əvvəllərində Azərbaycanın Xarici İşlər Nazirliyinə çatdırırdı ki, Zəngəzur Ermənistan ərazisidir və oranı Azərbaycan hökumətinin nəzarəti altına almaq niyyətləri ağır nəticələrə gətirib çıxara bilər (54, v.53).

Ərkani-hərbin rəisi general-leytenant Sulkeviç bildirirdi ki, Qarabağa nəzarətin itirilməsi ilə ermənilər heç vaxt razılaşmayacaqlar və münasib imkan yaranan kimi bu ərazini işğal etmək məqsədilə yenidən təcavüzləri genişləndirəcəklər. Təcavüzün qarşısının alınması üçün çoxlu qüvvə lazım idi. Ona görə də general Sulkeviç təklif edirdi ki, ərazi prinsipi üzrə kürd hərbi hissələri yaradılsın (126, v.30).

Kürd hərbi hissələrinin yaradılması eyni zamanda Zəngəzurda erməni təcavüzünün qarşısını almaq üçün ciddi əhəmiyyətə malik idi. Kürd əhalisi də əsasən elə Zəngəzur qəzası ərazisində yaşayırdı. Bu hissələrin kürd zabitləri ilə tə'min edilməsi üçün oktyabr ayında X.Sultanov Hərbi Nazirlik qarşısında hərbi məktəbdə kürd kursunun açılması barədə məsələ qaldırmışdı (11, 26.10.1919). Müsbət həll edilmiş bu məsələlərin hər ikisi Zəngəzurda və Qarabağda erməni təcavüzünün cilovlanması üçün atılmış daha bir addım idi.

Ermənistan hökuməti Zəngəzur məsələsini birdəfəlik həll etmək və bu qəzanın bütün ərazisini azərbaycanlılardan təmizləyib ora şəriksiz sahib çıxmaq üçün öz qanunsuz əməllərindən əl çəkmirdi. Oktyabr ayında Ermənistan hökuməti Zəngəzur ərazisinə xüsusi təxribatçılar qrupu göndərdi ki, bu qrup Zəngəzurun erməni əhalisini azərbaycanlılara və Azərbaycan hökumətinə qarşı qaldırsın. Onların ardınca isə Zəngəzura Ermənistanın nizami qoşun hissələrinin göndərilməsi planlaşdırılırdı. Zəngəzu-

nun ərazısında Ermənistan hökumətinin silahlı qüvvələrinin iştirakı ilə hazırlanmış üsyanın qarşısını almaq, ərazi bütövlüyünü tə'min etmək və əhalini özbaşınalıqlardan qorumaq üçün Azərbaycan hökuməti bu qəzaya qoşun dəstəsinin göndərilməsini qərara aldı (72, v.121).

Azərbaycanın qoşun dəstəsinin Zəngəzura yola düşməsi ərəfəsində Qarabağ general-qubernatoru erməni dilində yerli erməni əhalisinə müraciət göndərdi. Həmin müraciətdə deyilirdi ki, bir ildən artıqdır ki, Zəngəzurda anarxiya baş alıb gedir. Erməni millətçi liderləri erməni əhalisini məhvə doğru sürükləyir. Muğanda və Qarabağda dinc həyat yarandığı kimi Zəngəzurda da asayiş bərqərar edilməlidir.

General-qubernator X. Sultanov Zəngəzurun erməni əhalisinin nəzərinə çatdırırdı ki, hələ ki, gec deyil. Respublika hökuməti bu özbaşınalıqlara çox dözə bilməz. Qanunsuzluqlara dərhal son qoyulmalıdır, bu qanunsuzluqlara rəvac verən şəxslər öz silahlı tör-töküntüləri ilə bərabər qəzadan qovulmalıdırlar. Əhali belə təxribatçılara sığınacaq verməməli, kömək göstərməməlidir (11, 6.11.1919).

Zəngəzurda baş verən qırğınların qarşısını almaq, qəzada Azərbaycan hökumətinin səlahiyyətlərini tam bərpa etmək üçün 1919-cu il oktyabrın 30-da Zəngəzur dəstəsi yaradıldı. Zəngəzur dəstəsinin rəhbəri 1-ci piyada diviziyasının komandiri, general-mayor Cavad bəy Şıxlinski idi (126, v.31). Dəstə noyabrın əvvəllərində bir neçə gün gərgin döyüşlərdən iştirak etdi. Təəssüf ki, bu döyüşlər barədə mə'lumatlar xeyli az və müxtəsərdir. Həmin mə'lumatlara əsasən Azərbaycan Ordusu qoşun hissələrinin çətin hava şəraitində keçirilən irimiqyaslı döyüşlərinin müfəssəl mənzərəsini yaratmaq olmur. Ancaq əldə edilən təsəvvür döyüşlərin gərgin keçdiyindən, qoşun bölmələrinin ilk dəfə itkilərlə qarşılaşdığından xəbər verir. Dəstənin tərkibində iki qrup var idi. Birinci qrup-Birinci kolonna adlanırdı və ona general-mayor Davud bəy Yadigarov komandirlik edirdi. İkinci qrupa isə polkovnik Levestam komandirlik edirdi və bu qrup Sağ və Sol kolonnalardan ibarət idi.

Birinci kolonna tərkibinə görə daha böyük idi və heç şübhəsiz ki, qarşıya qoyulan vəzifələrin yerinə yetirilməsi üçün başlıca ümid də əsas zərbə qüvvəsi kimi bu kolonnaya bağlanmışdı. Kolonnanın tərkibinə 2-ci Zaqatala piyada alayının bir taboru və 8 pulemyotu, 2-ci Qarabağ süvari alayının 4 bölüyü və 4 ədəd pulemyotu, 3-cü Şəki süvari alayından 2,5 bölük və 2 ədəd pulemyot, 2-ci dağ-topçu divizionunun tərkibindən iki ədəd topu olan 4-cü batareyası daxil idi. Bütünlükdə kolonnada 1 tabor, 6,5 bölük süvari, 14 pulemyot və 2 ədəd top var idi. Oktyabr ayının 30-da kolonna Xankəndindən yola düşdü və elə həmin gün də 17.30-da Lıcoqorski məntəqəsinə çatdı. Şəxsi hey'ət gecəni orada keçirməli oldu. Oktyabrın 31-də kolonna öz yoluna davam etdi. Abdallara çatıb gecəni kolonna burada qaldı. Erməni silahlarının qəfil hücumlarının qarşısını almaq üçün



düşərgənin ətrafına ikiqat mühafizə xətti quruldu. Mühafizənin ön xəttində kürd partizanları, arxa xəttində isə 3-cü Şəki alayının süvariləri dayanmışdı (126, v.17).

Müxtəlif istiqamətlərdən irəliləyən həm Birinci kolona, həm də Sağ və Sol kolonnalar Dığ yaşayış məntəqəsinə doğru irəliləməli idilər. Dığın erməni silahlı qüvvələrindən təmizlənməsi həm Qarabağa aparan strateji yolu, həm də bölməni nəzarət altında saxlamaq üçün böyük əhəmiyyətə malik idi. Birinci kolonna Dığa doğru onun şimalından irəliləməli idi.

Noyabrın 1-də general Yadigarovun əmri ilə Balasoltan və Dığ istiqamətində kəşfiyyat qrupları göndərildi. Həmin kəşfiyyat qrupu Balasoltan kəndi istiqamətində erməni qüvvələri ilə rastlaşdı və bu qüvvələrin səngərlər qazaraq müdafiə mövqelərini möhkəmləndirməyə çalışdıqlarının şahidi oldu. Çox güman ki,onlar Azərbaycanın qoşun hissələrinin Zəngəzura doğru hərəkət etməsindən artıq xəbər tutmuşdular. Ona görə də qoşun hissələrinin irəliləməsinə mane olmaq üçün Zabux çayı üzərindəki körpünü partlatmaq istəyirdilər. Bu təxribatın qarşısını almaq üçün general Yadigarovun əmri ilə 2-ci Qarabağ süvari alayının komandiri polkovnik Tuqanov bir qrup döyüşçü ilə körpüyə tərəf yollandı və erməni qüvvələrini oradan uzaqlaşdırdı (126, v.17).

Həmin gün Zəngəzur dəstəsinin rəisi general-mayor C. Şıxlinski Birinci kolonnanın yerləşdiyi düşərgəyə gəldi, şəxsi hey'ətin vəziyyəti, hücuma hazırlıq işləri ilə tanış oldu. Onun əmrinə əsasən kolonna hücuma noyabrın 3-də başlamalı idi. Noyabrın 2-də kolonnanın rəhbərliyi alınan tapşırıqların öyrənilməsi və hücuma hazırlıq işləri ilə məşğul oldu. Noyabrın 3-də kolonnanın piyada bölmələri 2 ədəd topla bərabər Sultankəndə doğru irəliləməli, süvari bölmələri isə Sadınlar kəndi istiqamətində irəliləməli və orada döyüşqabağı mövqe tutmalı idi. Sonra piyada bölmələrinin qarşısında Xanazax kəndini tutmaq, süvari bölmələrin qarşısında isə Dat-Melik yüksəkliyini və Xaznavar kəndini tutmaq vəzifəsi dayanırdı. (Məntəqələrin adı döyüş hesabatlarında olduğu kimi verilir-M. S). Həmin məntəqələrdən də bütün qoşun hissələri və bölmələri Gorusa doğru hücumu eyni vaxtda başlamalı idilər.

Hücum zamanı kolonnanın sağ cinahının mühafizəsi Sultan bəy Sultanovun rəhbərliyi altında olan kürd partizanlarına tapşırılmışdı.

Noyabrın 4-nə keçən gecə kürd partizanları Keçəldağ strateji yüksəkliyini tutub orada möhkəmlənməli idilər. Bu dəstə ilə kolonnanın komandanlığı arasında daimi rabitə yaradılması üçün kürd partizanlarından bir neçə nəfər xüsusi tapşırıq almışdı. Dəstə bütünlükdə kolonnanın əməliyyat tabeçiliyində idi və kolonnanın verdiyi bütün tapşırıqları yerinə yetirməli idi (126, v.18).

Yerli əhali arasında olan kürdlərdən kolonnaya bələdçilər də verilmişdi. Kolonnanın komandanlığı alınan tapşırığın icrası üçün hərəkət marşru-

tunu nəzərdən keçirəndə bələdçilərin verdiyi mə'lumatlardan aydın oldu ki, Sultankənd istiqamətindən Xanazax kəndinə çıxmaq çox təhlükəlidir və böyük itkilər bahasına başa gələ bilər. Çünki Sultankənd dərədə yerləşirdi. Daha yüksək mövqelərdə qərar tutmuş erməni silahlıları həm Sultankəndi, həm də Sultankəndin yerləşdiyi dərənin çıxışını daim hədəfdə saxlayırdılar. Belə olanda kolonnanın komandiri Zəngəzur dəstəsinin rəisinə vəziyyət haqqında mə'lumat verərək bütün kolonnanı birləşdirib Kuqçi-Sadınlar yolu ilə aparılmasına icazə istədi. Dəstə rəisindən heç bir mə'lumat alınmadıqda general Yadigarov özü qərar qəbul etdi və təklif olunan marşrutla irəliləmək barədə əmr verdi (126, v.19).

Noyabrın 3-də səhər saat 10.30-da kolonna hərəkətə başladı. Kolonnanın qabağında süvari bölmələri gedirdi. General Yadıgarov bu süvari bölmələrinin içərisində idi. Piyada və topçu bölmələri süvarilərilərdən bir qədər geridə qalmışdı. Gündüz saat 12.30-da çətin yollardan keçən süvari bölmələri Mollalar məntəqəsinə çatdı. Burada post quruldu və sonra hərəkət yenə də davam etdirildi. Gündüz saat 14.30-da süvari bölmələri Qoçaz kəndinə gəlib çatdılar. Süvari bölmələri istirahət üçün dayandığı vaxt saat 15.30-da general Yadıgarov verdiyi mə'lumata görə 2-ci Qarabağ süvari alayının komandiri polkovnik Tuqanovla 6342 hündürlüyünə qalxıb hərəkət marşrutlarını müşahidə etdilər. Onların müşahidələri kürd bələdçilərinin verdiyi mə'lumatların doğru olduğunu, Xanazax kəndinə Sultankənd tərəfdən hərəkət etməyin qeyri-mümkün olduğunu təsdiq etdi (126, v.18,19).

Noyabrın 3-nü kolonna Qoçaz kəndində gecələdi. General Yadıgarov isə şəxsən apardığı müşahidələr əsasında ayın 4-də hərəkət planını müəyyənləşdirdi. Piyada bölmələrini təhlükəli vəziyyətə salmamaq üçün onlara Sadınlara doğru hərəkət etmək və sonra da Dat-Melik yüksəkliyini ələ keçirmək tapşırığı verildi. Piyada bölmələrinin yüksəkliyə hücumunun möhkəmləndirilməsi üçün Yuxarı Sultankənd məntəqəsində ehtiyat qüvvə kimi 2 ədəd pulemyota malik olan bir bölük saxlanmalı idi. Sadınlar kəndindən Dat-Məlik üzərində piyada bölmələrinin hücumu başlananda ehtiyatda olan bölük də hücuma qoşulmalı və onun uğurla başa çatmasına kömək etməli idi. Həmin yüksəklik tutulandan sonra kolonnanın bütün qüvvələri piyada bölmələri ilə birləşməli və birlikdə oradan Xanazax kəndinə hücum etməli idi. Xanazax kəndinin tutulması isə kolonnanın qarşısına qoyulmuş vəzifələrin təxminən yarısının yerinə yetirilməsi demək idi. Qəbul etdiyi qərar barədə general Yadıgarov dəstənin rəisi general C.Şıxlinskiyə mə'lumat göndərdi (126, v.20).

Ayın 4-də səhər erkədən əsas qüvvələrin hərəkətindən əvvəl 2-ci Zaqatala piyada alayının komandiri və 4-cü Dağ topçu batareyasının komandiri öz qüvvələri ilə hərəkət marşrutunun kəşfiyyatını aparmalı idilər. Həmin gün hava çox dumanlı idi. Belə hava şəraitindən istifadə edərək kolonna Qoçazdan Qaraqışlaq dəyirmanının yaxınlığına gəlib çıxdı. Burada



dəstə rəisindən əmr alındı ki, kolonna hücuma ayın 5-də başlasın. Ona görə də ayın 4-də kolonnaya istirahət verildi. Şəxsi hey'ətin yerləşdiyi düşərgənin mühafizəsi gücləndirildi, postların sayı artırıldı. Axşama yaxın general Yadıgarova mə'lumat çatdırıldı ki, kürd partizanları Qaragöl və Qazıgöl yaxınlığında mövqe tutublar. Ancaq onların patronları xeyli az idi. Bu da onların səmərəli döyüş imkanlarını xeyli məhdudlaşdırırdı. Kürd partizanlarının xeyli irəli hərəkət etməsindən görünür ermənilər də xəbər tutmuşdular. Ayın 4-ü gecəsi kürd partizanlarının mövqeləri erməni silahlıları tərəfindən güclü atəşə tutuldu (126, v.21).

Dəstə rəisinin verdiyi əmrə görə kolonna Dat-Məlik yüksəkliyini ayın 5-nə keçən gecə tutmalı idi. Ancaq Yadıgarov yüksəkliyi ayın 5-də səhər tutmağı qərara aldı. Öz qərarını general Yadigarov kolonnanın şəxsi hey'ətinin çox yorulması ilə əlaqələndirirdi.

Noyabrın 5-də kolonnanın bölmələri artilleriya və pulemyot hazırlığından sonra Xaznavar kəndi istiqamətində hücuma başladı. Günün birinci yarısı sakit keçdi. Axşama yaxın Dat-Məlik yüksəkliyi istiqamətində Azərbaycanın qoşun bölmələri ilə erməni silahlı dəstələri arasında döyüşlər başladı. Qoşun bölmələri ermənilərə qarşı mərdliklə mübarizə aparırdılar. General Yadigarovun mə'lumatına görə axşam saat 19.30-da Azərbaycanın qoşun bölmələri Xaznavar və Bayandur kəndlərini ermənilərdən azad etmişdilər. Gorusa aparan yol nəzarət altına götürülmüşdü. Döyüşün uğurla başa çatdığını bildirmək üçün gecə saat 24-də Dat-Məlik yüksəkliyində iki böyük tonqal yandırıldı. Gün ərzində 1 nəfər ölən və 4 nəfər yaralanan var idi. Ermənilər tərəfdən isə daha çox adamın öldürüldüyü bildirilirdi (126, v.23).

Ayın 6-da Birinci kolonnanın hissə və bölmələrinə istirahət verildi. Düşərgənin ətrafına gücləndirilmiş mühafizə qoyuldu. Növbəti döyüş üçün hazırlıq işlərinə başlandı. Erməni qüvvələri isə fəaliyyətlərini dayandırmamışdılar. Görünür onlar kolonnanın sağ cinahının daha zəif olduğunu və burada uğur əldə etməyin mümkünlüyünü yoqın etmişdilər. Onlar 2 topla Keçəldağ yüksəkliyinə hücum etdilər. Buradakı mövqelərdə də kürd partizanları dayanmışdı. Erməni qüvvələri kürd partizanlarının sağ cinahını, mərkəzini və qərargahlarını güclü atəşə tutdular. Sultan bəy, Yadıgarova xəbər göndərərək top atəşləri ilə onların himayə olunmasını xahiş etdi. Kürdlərə kömək göstərilməsi üçün general Yadıgarov Keçəldağ istiqamətinə iki bölük süvari göndərdi. Ancaq hücumu davam etdirən ermənilər saat 10-da artıq Qaragöl yüksəkliyini ələ keçirmişdilər. Kürd partizanlarının patronları isə qurtarmaqda idi.

Arxiv sənədlərində Birinci kolonnanın döyüş fəaliyyəti barədə nisbətən geniş mə'lumat yalnız general Yadıgarovun hesabat və raportlarında qalmışdır. Nəzərə alsaq ki, hərbi nazir S.Mehmandarov general Yadıgarovun bu döyüşdəki fəaliyyətindən heç də razı deyildi, onda Birinci kolon-

nada döyüşün təşkili barədə mə'lumatların təfsilatı ilə söyləndiyini demək çətin olardı.

Noyabrın 6-da ermənilərin kürd partizanları üzərinə hücumu bir növ hərbi təşəbbüsün onların əlinə keçməsinə səbəb olmuşdu. Mövcud olan mə'lumatlardan çıxış edib həmin gün ermənilərin irəliləməsinin qarşısının alınması üçün bütün imkanlardan istifadə olunduğunu müəyyənləşdirmək çətindir. General Yadigarov kürd partizanlarına kömək göstərilməsi üçün bə'zi işlər görüldüyünü bildirirdi. Patron qurtarandan sonra onlara kömək göndərildi. Sultan bəyin xahişinə müvafiq olaraq onların top atəşləri ilə himayə edilməsi isə, Yadigarovun yazdığına görə, mümkün deyildi. Çünki ermənilərin mövqeyi açıqda deyildi. Gündüz saat 13-də Sisiyan tərəfdən gətirilən topları döyüşə qoşmaqla ermənilər kürd partizanlarını tutduqları bütün mövqelərdən vurub çıxardılar (126, v.25-26).

Beləliklə, kürd partizanlarının hakim yüksəkliklərdə tutmuş olduğu mühafizə mövqelərindən geri çəkilməsi Birinci kolonnanın sağ cinahının boşalmasına səbəb oldu. Bu istiqamətdən erməni qüvvələrinin Birinci kolonnanın arxasına keçmək təhlükəsi yarandı. Sultan bəyin verdiyi mə'lumata görə həmin istiqamətdə ermənilərin 2500 nəfərlik silahlı qüvvəsi cəmlənmişdi. Ermənilər buradakı yüksəkliklərə öz toplarını yerləşdirmişdilər. Onların toplarının hakim yüksəkliklərdə yerləşdirilməsi birinci kolonna üçün daha böyük təhlükə təşkil edirdi. Birbaşa hədəfə açılan atəşlər Azərbaycanın qoşun bölmələrinə saysız-hesabsız itkilər yetirə bilərdi. Bundan başqa, ermənilər Gorusdan çəkib gətirdikləri topları da əlverişli mövqelərdə yerləşdirib kolonnanın sol cinahını atəşə tuturdular. Top atəşlərinin himayəsi altında erməni qüvvələrinin kolonnanın sol cinahını da əhatə etmək, onun arxasına keçmək təhlükəsi yaranmışdı. General Yadigarovun yazdığına görə, erməni qüvvələri kolonnanın sol cinahının arxasına keçməmiş qoşun bölmələrinin arxaya çəkilməsi barədə göstəriş verdi. Ancaq təhlükə bununla da sovuşmadı. Hərbi təşəbbüsü tamamilə ələ keçirən erməni silahlı qüvvələri Keçəldağ yüksəklikləri ilə irəliyə hərəkət edib Sadınlar kəndini də təhlükəyə mə'ruz qoydular. Buradan onların top atəşlərinin qarşısını almaq çox çətin idi. Camaatı labüd ölümdən xilas etmək üçün Sultan bəy kənd sakinlərinə tezliklə köçmək əmri verdi. Başqa bir çıxış yolu qalmayan kənd əhalisi tez-tələsik öz ev-eşiklərini tərk etmək məcburiyyətində qaldılar. (126, v.27).

Döyüşün nəticələri barədə general Yadigarovun verdiyi raportdan göründüyü kimi noyabrın 5-də əldə edilmiş uğurlar noyabrın 6-da tamamilə itirildi. Özü də sadəcə uğurlar itirilmədi, bütünlükdə hərbi təşəbbüs əldən verildi. Ərazinin hakim yüksəklikləri ermənilər tərəfindən tutuldu və ora toplar yerləşdirildi.



Noyabrın 6-da 1-ci Cavanşir piyada alayının komandiri polkovnik Levstamın komandanlığı altında olan Sağ və Sol kolonnalar da hücuma qoşuldular.

Sağ və Sol kolonnaların tərkibinə 1-ci Cavanşir alayı 2-ci Zaqatala piyada alayının 2 taboru və 3-cü Şəki süvari alayının bir bölüyü daxil idi. Kolonnalar gecə saat 2-də düşərgədən hərəkətə başladılar. Sağ kolonna və ümumi ehtiyat qüvvəsi Margiz məntəqəsinə aparan yola dönüb saat 4-də ora çatdı. Zabux çayını keçəndən sonra qarşıdakı yüksəkliklərə təhlükəsiz qalxmaq üçün qarşıya 2 bölük qüvvə göndərildi. Qəfildən bu bölmələrin gülləsi altına düşən erməni silahlıları qorxuya düşüb mövqelərini tərk etməyə üz tutdular. Ancaq bu qarışıqlıq uzun sürmədi və ilk atəşlərin qorxusundan sonra özlərinə gələn ermənilər yerlərini möhkəmlədib cavab atəşi açdılar. Saat 8.20-də ikinci bölüyün komandiri praporşik Xanbudaqov və əsgərləri ilə ermənilərin səngərlərinə girdilər və süngü döyüşündə onların mövqelərini ələ keçirdilər (126, v.108).

Birinci taborun digər bölükləri Dığ yaylasına doğru irəlilədilər və top atəşlərinin himayəsi altında ermənilərin digər səngərlərini də ələ keçirdilər. Saat 8.20-də ümumi ehtiyat qüvvəsinə əmr verildi ki, yüksəklikləri qalxıb Dığ yaylasına daxil olsunlar və kolonnanın sağ cinahının mühafizəsini tə'min etsinlər. Onlar bunun üçün zəruri olan müşahidə aparmalı idilər. Səhər saat 9.30-da ştabs-kapitan Ştollun komandirlik etdiyi birinci tabor Dığın şimalında olan bütün səngərləri ələ keçirmişdi.

General Yadigarovun komandanlıq etdiyi Birinci kolonna ilə rabitə yaradılması üçün kürd bələdçilərinin müşayəti ilə kəşfiyyatçılar qrupu göndərildi. Kolonna özü isə Mərot məntəqəsi istiqamətində hərəkətə başladı. Saat 11-də ikinci tabordan ibarət olan ehtiyat qüvvəsi döyüş sahəsinin sağ cinahı ilə irəliləmək əvəzinə istiqamətini bir qədər dəyişmişdi. Bu da onu qoşun bölmələrinin hərəkətini müşahidə edən erməni dozorunun üstünə gətirib çıxardı. Onların arasında başlanan atışmada ehtiyat qüvvələr ermənilərin müqavimətini qırdı və elə həmin istiqamətdə əlverişli mövqe tutdu. Saat 12-də aydın oldu ki, ehtiyat qüvvənin istiqaməti dəqiqləşdirilməlidir. Çünki onlar getdikcə əsas qüvvədən aralı düşürdülər. Onda ikinci taborun komandiri ştabs-kapitan Belozıkinə göstəriş verildi ki, döyüş əmrində müəyyənləşdirilmiş istiqamətə qayıtsın. Saat 13.30-da bütün mövcud toplardan erməni mövqelərinə atəş açıldı. Polkovnik Levestamın yazdığına görə həmin gün topçular məharətlə fəaliyyət göstərdilər. Dığ yaylasının asanlıqla tutulması da onların səmərəli atəşləri nəticəsində mümkün olmuşdu (126, v.108).

Zəngəzur dəstəsi rəisinin əmri əsasında Sağ kolonnadakı 12-ci bölüyün yarısı praporşik Səmədovun komandası altında Sol kolonnada podporuçik Vaçnadzenin bölməsinin möhkəmləndirilməsi üçün göndərildi. Praporşik Səmədova tapşırılmışdı ki, şosse yolun şərqindəki yüksəkliklərin

qoşunlara yaxın olan hissəsini tutsun və Zaqatala alayının bölmələri ilə təmas yaratsın.

Gündüz saat 16-da Ümumi ehtiyat qüvvəsi göstərilən mövqelərə gəldi və bundan sonra birinci tabor Dığ kəndinə hücum üçün müəyyənləşdirilmiş ilkin mövqelərə doğru hərəkətə başladı (126, v.108).

Sol kolonna Zabux çayını keçəndən sonra Melik yüksəkliyindən Dığ yaylasına doğru hərəkətə başladı. Burada bölmələr erməni qüvvələrinin müqavimətı ilə rastlaşdılar. Kolonna bütün imkanlarını səfərbər edib ermənilərlə döyüşə girdi və qısa müddətdən sonra Zaqatala alayının bölmələri Dığ yaylasının çıxışını ələ keçirib Geranzur kəndənə doğru hücumu davam etdirdilər. Sol kolonnaya verilmiş olan Şəki süvari alayının bir bölüyü əmr aldı ki, ixtiyarlarında olan 2 ədəd pulemyotla kolonnanın sol cinahının mühafizəsini tə'min etsin. Ancaq süvari bölüyü əmri yerinə yetirmədi. Bütün döyüş boyu bu bölük qüvvələrin arxasında mövqe tutub sakit guşəyə çəkilmişdi. Saat 15.00-da polkovnik Levestam şəxsən özü bölüyün olduğu yerə gəldi və verdiyi əmri bir daha təkrar etdi ki, bölmə sol cinaha yollanıb Zaqatala taborunun komandiri ilə əlaqə yaratmalı və bu taborun təhlükəsiz hərəkəti üçün verilən tapşırığı yerinə yetirməlidir. Lakin süvari bölməsi yenə də əmri yerinə yetirmədi. (126, v.109).

Polkovnik Levestamın yazdığından aydın olur ki, onun Sol kolonnası ilə rabitəsi bütünlükdə qənaətbəxş olmamışdı. Uzun müddət o, kolonnanın fəaliyyəti barədə mə'lumatsız qalmışdı. Rabitə üçün göndərilən çoxsaylı əsgərlərdən yalnız biri saat 16.10-da polkovnik Levestama xəbər gətirmişdi ki, kolonnanın patronları qurtarmaq üzrədir. Günortadan sonra Zaqatala taborunun bölükləri Geranzur kəndi yaxınlığındakı monastır ətrafında mövqe tutmuşdular. Polkovnik Levestamın bildirdiyinə görə, sonradan o özü də bu mövqelərə gəlmiş, ancaq Zaqatala taborunun komandirini tapa bilməmişdi. Heç kəs də onun yerini bilmirdi. Başsız qalmış tabora podporuçik Vaçnadze komandanlıq edirdi. O əvvəlcə bir bölüyü ruhlandırıb döyüşə aparır, sonra isə o biri bölüyün mövqelərinə keçib onun döyüşünə rəhbərlik edirdi. Saat 19.20-də polkovnik Levestam podporuçik Vaçnadzeyə tapşırıq verdi ki, köməyə gəlmiş poruçik Səmədovun döyüşçülərinin təmas xəttində mövqe tutsun və gecəni orada keçirsin. Gün ərzində Sol kolonnadan 17 nəfər əsgər yaralanmışdı (126, v.109).

Noyabrın 7-də səhər saat 8-də Vaçnadzenin komandirlik etdiyi Zaqatala taborunun hücuma keçməsi barədə xəbər alındı. Polkovnik Levestamın əmri ilə əvvəlcə 12-ci bölüyün yarısı onun köməyinə göndərildi. Həmin istiqamətdə düşmənin güclü top atəşləri başlananda praporşik Vidadovun rəhbərliyi altında olan 8-ci bölük də ora köməyə göndərildi. 11-ci və 16-cı bölüklər isə ümumi ehtiyat qüvvəsi kimi saxlanılmışdı.

Sağ kolonnanın döyüş sahəsində də düşmənin müqaviməti güclənirdi. Dığ kəndinin şərqindəki yüksəkliklərdə və Novruzlu məntəqəsinin cənubundakı hündürlüklərdə erməni silahlı dəstələri güclü mövqe tutmuşdular. Saat 10.30-da və 12-yə yaxın Novruzlunun cənubundakı hündürlükdə olan düşmən qüvvələri aşağı enib kolonnanın sağ cinahının arxasına keçməyə cəhd göstərdi. Birinci cəhd pulemyot atəşləri və ümumi ehtiyatda olan bir bölüyün düşmənin hərəkət istiqamətinin cinahına çıxarılması ilə uğursuzluğa düçar oldu. Düşmənin ikinci cəhdinin qarşısı isə qaubitsa və dağ toplarının atəşləri ilə alındı. General Yadigarovun kolonnasının hərəkəti barədə mə'lumat alınmamışdır. Ona görə Sağ kolonnanın hücumu da ləngiyirdi. Çünki general Yadigarovun kolonnasının irəli hərəkət etməməsi Sağ kolonnanın sağ cinahının da mühafizəsiz qalmasına və təhlükə altına düşməsinə səbəb ola bilərdi. Gün ərzində erməni qüvvələri iki dəfə də Sağ kolonnanın üzərinə qarşıdan və sağ cinahdan hücuma keçməyə cəhd göstərdilər. Lakin 2-ci bölük, 6-cı bölüyün bir taqımı düşmənin hər iki cəhdinin qarşısını aldılar (126, v.109).

Sol kolonna istiqamətindəki hadisələr daha dramatik şəkildə cərəyan edirdi. Hələ gecə ikən polkovnik Levestam Sol kolonnada praporşik Səmədovun tutduğu mövqeləri nəzərdən keçirmiş və podporuçik Vaçnadzeyə əmr göndərmişdi ki, Zaqatala taborunu sağa tərəfə çəkib praporşik Səmədovun bölməsi ilə yaxınlaşsın və bununla öz döyüş sahəsini də bir qədər kiçiltsin. Səhər saat 8-də hücuma başlayan Vaçnadze tezliklə çətin vəziyyətə düşdü. Saat 9-da Zaqatala taborundan praporşik Quliyevin gətirdiyi həyəcanlı mə'lumatdan sonra yuxarıda qeyd edildiyi kimi 8-ci bölük sol cinaha göndərildi. Ancaq onun komandiri praporşik Vidadov ağır vəziyyətə düşən kimi özünü itirdi, qorxaqlıq və səriştəsizlik göstərdi. Bu vaxt düşmənin güclü hücumuna sinə gərən praporşik Səmədov ağır yaralandı. Buna baxmayaraq o, döyüş mövqeyini tərk etmir, böyük igidlik və şücaət nümunəsi nümayiş etdirirdi. Praporşik Vidadov əmr aldı ki, podporuçik Muradovla birlikdə həmin sahədə müqaviməti gücləndirsinlər və düşmən hücumlarının qarşısını alsınlar. Podporuçik Muradov həmin mövqelərə yaxınlaşanda Vidadovun döyüş mövqeyini tərk etdiyini və bölüyün şəxsi hey'ətini də öz ardınca geriyə aparmaq istədiyinin şahidi oldu. Muradov irəli atılıb yenidən səngərlərdə mövqe tutdu və Vidadovun əsgərlərini də geriyə qayıtmağa, onlara tapşırılmış döyüş mövqelərini tutmağa çağırdı. Güclü top və pulemyot atəşlərinə baxmayaraq səngərdən bayıra çıxıb ayaq üstə əsgərləri bütün qüvvələri ilə döyüş aparmağa səsləyirdi. Onun qorxmazlığı əsgərlərin geri qayıtmasına tə'sir göstərsə də yaxınlıqda partlayan mərmi qəlpələrindən şəhid olandan sonra əsgərlər yenə başsız qaldı və geri çəkilməyə başladılar. Saat 9-da bu istiqamətə poruçik Berinqin komandanlığı altında dağ topları taqımı göndərildi. Bu taqım şosse yolun şərqində mövqe tutub hücum edən düşmənin qarşısını saxlamağa cəhd göstərdi (126, v.110).

Sol kolonnanın sol cinahında vəziyyət xüsusilə ağır idi. Səhər-səhər *bu cinaha yerli əhalinin silahlıları* da qoşuldu. Onlar da ermənilərə qarşı döyüşdə iştirak edirdilər. Saat 10-da bu cinahda silahlı süvari dəstələri peyda oldu. Yerli əhalidən olan silahlılar onları Azərbaycan süvariləri bilib yaxına buraxdılar. Əslində isə həmin süvarilər erməni süvariləri imiş. Onların qəflətən meydana çıxması və gözlənilmədən atəş açmaları yerli könüllüləri qorxu və təlaş içinə saldı və onlar böyük bir vahimə içində qaçıb dağılışmağa başladılar. Yerli könüllülərin vahimə içində qaçıb dağılmaları Zaqatala taborunun döyüşçüləri arasına da çaxnaşma saldı. Bu da onların fəaliyyət nizamını pozdu. Gəncə piyada alayının bu cinahda döyüşən pulemyot komandasının bir zabiti pulemyotu götürüb erməni süvarilərini atəşə tutdu və onları geri çəkilməyə məcbur etdi. Sonra bu istiqamətdə düşmənin piyada qüvvələri görünməyə başladı və həmin qüvvələr zaqatalalılar üzərinə güclü hücuma keçdilər. Erməni piyadalarının hücumunun qarşısını yalnız ehtiyat qüvvələrdən göndərilmiş olan Cavanşir alayının iki bölüyünün köməyi ilə almaq mümkün oldu. Ancaq güclü hücumlar altına düşmüş olan zaqatalalılar böyük itkilər verməli oldular (126, v.111).

Saat 15.00-da Sol kolonnanın vəziyyəti belə idi. Sol cinahda 11-ci bölük dayanmışdı. Bu bölüyün sağında Zaqatala taborundan 40 nəfər var idi. Kolonnanın sağ cinahında isə 12-ci bölük mövqe tutmuşdu. Pulemyotların çoxu işləmirdi. Təcrübəli və qorxmaz zabitlərin sıradan çıxarılması bütünlükdə şəxsi heyətin əhval-ruhiyyəsinə mənfi tə'sir göstərmişdi. Sağ kolonnanın vəziyyəti isə daha möhkəm idi. Əgər general Yadigarovun Birinci kolonnası döyüşdən çıxarılmasaydı sağ cinahı daha yaxşı mühafizə olunan Sağ kolonna irəliyə hərəkət etmək üçün yaxşı imkan əldə edərdi. Sağ kolonnanın sağ cinahı boyu həm də yarğan uzanırdı. Bu yarğan xəlvəti *şəkildə düşmənə* yaxınlaşmaq imkanı da verirdi. *Ancaq Sol kolonnanın* nizamının pozulması və xeyli zəifləməsi, digər tərəfdən də general Yadigarovun kolonnasının döyüşdən çıxarılması Sağ kolonnanın cəbhə xəttində qalmasına imkan vermirdi. Eyni zamanda günortadan sonra Sağ kolonnanın sağ cinahı boyu uzanan yarğanın başlanğıcında düşmən qüvvələrinin cəmləşdiyi müşahidə olunurdu. Onların güclü zərbəsi Sağ kolonnanı da çətin vəziyyətə sala bilərdi (126, v.110).

Cəbhədə baş verənlər Zəngəzur dəstəsinin rəisi general C.Şıxlinskinin də daimi nəzarəti altında idi. O yazırdı ki, polkovnik Levestamın sağ cinahında düşmən qüvvələrinin cəmləşməsi ona Dığı tutmağa imkan vermədi. Xüsusilə polkovnik Levestamın sol cinahının xeyli zəifləməsi şəxsi hey'ət arasında da çox böyük narahatçılıqlar yaradırdı. Ona görə də ayın 7-də hava qaralana yaxın polkovnik Levestama kolonnaları geri çəkmək əmri verildi (126, v.11).

Saat 16-dan sonra polkovnik Levestam hava qaralan kimi geri çəkilmək barədə sahənin topçu rəisinə mə'lumat verdi. Qaranlıq düşməyə baş-



layan kimi podporuçik Maksimoviçin komandası altında olan 4-cü bölüyə də geri çəkilmək və bu zaman *batareyaları da himayə etmək tapşırığı* verildi. Saat 19-da 11-ci və 12-ci bölüklər, saat 19.30 isə 2-ci və 6-cı bölüklər geri çəkilmək barədə əmr aldılar (126, v.11).

General C.Şıxlinskinin mə'lumatına görə, iki günlük döyüş ərzində Zaqatala alayından 40 nəfər ölmüş və itkin düşmüş, 50 nəfər isə yaralanmışdı. Cavanşir alayından 5 nəfər ölmüş, 20 nəfər isə yaralanmışdı. Şəki süvari alayından 2 nəfər, topçulardan isə 1 nəfər yaralanmışdı. Bunlardan başqa 3 zabit ölmüş, 4 zabit də yaralanmışdı (126, v.111). Polkovnik Levestamın verdiyi mə'lumata görə isə Cavanşir piyada alayından 29 nəfər, topçulardan isə 2 nəfər əsgər yaralanmışdı (126, v.110).

Noyabrın 7-də Birinci kolonnanın fəaliyyətinə gəldikdə isə general Yadigarovun yazdıqlarına görə, həmin gün hücum yenidən davam etdirildi. Kolonna Dat-Melik yüksəkliyi və Xaznavar kəndi istiqamətində irəliləməyə başladı. General Yadigarov saat 14-də geri çəkilmək barədə əmr alsa da hücum davam etdirildi, hətta Dat-Melik yüksəkliyi və Xaznavar kəndləri yenidən ələ keçirildi. Lakin kolonna saat 20-də yenidən Abdallara geri çəkilmək barədə göstəriş aldı. Bundan sonra kolonna geri çəkilməyə başladı və noyabrın 8-də saat 6-da Abdallara gəlib çıxdı (126, v.28-29).

Beləliklə, noyabrın 3-dən 7-dək Dığ istiqamətində aparılan döyüşlərdə Azərbaycan Ordusunun qoşun bölmələri qarşıya qoyulan vəzifələrin icrasına nail olmadan ilkin vəziyyətə qayıtmalı oldular. Heç şübhəsiz ki, bu istiqamətdə düşmənin güclü qüvvələri var idi və onlar öz qüvvələrini daha düzgün bölüşdürərək e'tibarlı müdafiə mövqeləri tuta bilmişdilər. Mövcud olan mə'lumatların öyrənilməsi onların daha çevik taktika işlədə bilmələrini də nümayiş etdirir. Erməni qoşunlarının əsas zərbə qüvvəsi Zəngəzur *dəstəsinin döyüş sahəsinin cinahlarına istiqamətləndirildiyi halda*, Azərbaycanın qoşun hissələri və bölmələri bu cinah zərbələrinin qarşısının alınması üçün çevik və səmərəli tədbirlər həyata keçirə bilmədilər və nəticədə bütün dəstə çətin vəziyyətlə qarşılaşmalı oldu.

Dığ istiqamətində aparılan döyüşlərin gedişi barədə general-mayor C.Şıxlinski öz mülahizələrini ümumiləşdirərək Hərbi Nazirliyin rəhbərliyinə mə'ruzə hazırladı. General C.Şıxlinskiyə görə Dığ və Gorus ətrafında düşmənin 6 minədək canlı qüvvəsi yerləşmişdi. Onların sərəncamında 4 qaubitsa və 2 ədəd top var idi. Düşmən toplarına təcrübəli zabitlər rəhbərlik edirdilər. Atəşlərin dəqiq və dağıdıcı olması da bundan xəbər verirdi. Süvari qoşunları nizami bölmələr idi və onun sayı 3 bölükdən az deyildi. Döyüş aparılan ərazi çox çətin ərazi idi. Tə'minat məsələlərinin həll edilməsi bir sıra problemlərlə qarşılaşırdı. Ətdən başqa hər şeyi çox uzaq məsafədən gətirmək lazım olurdu. Otun olmaması da atların saxlanmasını mürəkkəbləşdirirdi. İrəli hərəkət etmək üçün ərazidə münasib yollar yox idi. Onların çoxu Andronikin dəstəsi tərəfindən dağıdılmışdı.

Yerli könüllülərdən təşkil edilmiş partizan dəstələri hərbi baxımdan elə bu potensiala malik deyildilər. Bu dəstələrin hərbi təcrübəsi, səriştəli rəhbərləri yox idi, patronları çatışmırdı, nizam və intizamları lazımi tələblərə cavab vermirdi. Döyüşün gedişində onlar əsas qüvvələrə səmərəli yardım göstərə bilmirdilər. Əksinə güclü atəş altına düşən kimi qaçıb dağılır və öz intizamsızlıqları ilə əsas qüvvələrin şəxsi hey'ətində də vahimə yaradırdılar. Sultan bəyin rəhbərliyi altında olan kürdlər partizanlarla müqayisədə daha yaxşı döyüşürdülər. Dəstədə intizam da xeyli sağlam idi, döyüşçülərin hamısı qorxmaz və təcrübəli Sultan bəyin ətrafında birləşmiş və verilən tapşırıqların icrası üçün bütün bacarıqlarını sərf edirdilər. Lakin onlar çox zəif geyinmişdilər və malik olduqları paltarlarla havaların soyuğundan qorunmaq mümkün deyildi.

General C.Şıxlinski öz mə'ruzəsində Zəngəzur dəstəsinin şəxsi hey'ətinin də belə ağır döyüşlərin aparılmasına hazır olmadığını bildirirdi. O xüsusilə zabit hey'ətinin zəifliyindən şikayət edirdi. Əsgərlər döyüşün ağırlığını öz üzərinə götürüb heç bir çətinlikdən qorxmadığı halda onları təşkil edib irəliyə apara biləcək zabitlər xeyli az idi. Piyada qüvvələrin komandir tərkibi, təcrübəsi və nəzəri səviyyəsi çox aşağı olan gənc praporşiklərdən ibarət idi. Təcrübi və nəzəri səviyyələrinin aşağı olması isə onlara qoşunları yaxşı idarə etmək imkanı vermirdi.

Dəstə əsas bazalardan xeyli uzaqlaşdığı üçün xəstə və yaralıların təxliyyəsi xeyli çətin idi. Tibb mütəxəssisləri yox idi. Baş verən uğursuzluqdan və bir sıra təcrübəli zabitlərin itirilməsindən sonra şəxsi hey'ətin mə'nəvi əhval-ruhiyyəsi xeyli zəifləmişdi.

General C.Şıxlinski öz mə'ruzəsinin sonunda bildirirdi ki, Dığı və Gorusu tutmaq üçün bir də cəhd göstərmək olar. Lakin orada möhkəmlənmək üçün Zəngəzur dəstəsinə üç taborlu bir piyada alayı verilməlidir (bax:126, v.31).

Döyüşlərdən dərhal sonra hərbi nazir S.Mehmandarov da dəstənin fəaliyyətinə öz münasibətini bildirirdi. Noyabrın 11-də C.Şıxlinskiyə göndərdiyi teleqramında hərbi nazir aldığı mə'lumatlar əsasında general Yadigarovun fəaliyyətinə çox kəskin qiymət verdi. Bu kəskin qiymət həm də S.Mehmandarovun Dığ istiqamətində aparılan döyüşlərin nəticələrinin necə böyük həyəcan və həssaslıqla qarşıladığını nümayiş etdirirdi. O, general Yadigarovun vaxtilə komandiri olduğu 2-ci Qarabağ süvari alayının səmərəsiz fəaliyyətinə və Birinci kolonnanın uğursuzluqlarına toxunaraq yazırdı: "Bunun təfərrüatı mənə mə'lum deyil. Ancaq döyüşlərin ümumi gedişinə və itkilərin miqdarına görə səhvsiz mühakimə yürütmək olar ki, bütün uğursuzluq başlıca olaraq general Yadigarovun fərasətsizliyi üzündən baş vermişdir. Mən şəxsən heç vaxt general Yadigarovu məs'ul vəzifələri tutmağa qadir şəxs saymamışam" (126, v.33).



Sonra Hərbi nazir general C.Şıxlinskiyə tapşırırdı ki, general Yadigarovun fəaliyyəti yoxlanılsın və baş verən uğursuzluqda günahı olduğu təqdirdə dərhal dəstədən uzaqlaşdırılsın (126, v.33).

Qeyd etmək lazımdır ki, Davud bəy Yadigarov 1919-cu il avqustun 1-dən Süvari diviziyası komandirinin müavini idi (153, v.47) və 1919-cu il oktyabrın 8-də Nazirlər Şurasının qərarı ilə ona general-mayor rütbəsi verilmişdi (153, v.166). 1919-cu il dekabrın 7-də nazirin əmri ilə Süvari diviziyası komandirinin müavini vəzifəsindən azad edilib, Hərbi nazirin yanında tapşırıq üzrə qərargah zabiti tə'yin edilməsi onun fəaliyyəti ilə bağlı S.Mehmandarovun verdiyi qiymətin doğruluğunu göstərir. Çünki D.Yadigarov rütbə kateqoriyası general olan bir vəzifədən azad edilərək daha aşağı vəzifəyə, rütbə kateqoriyası zabit olan vəzifəyə tə'yin edilmişdi.

Zəngəzura Azərbaycanın qoşun bölmələrinin yeridilməsi ilə erməni təbliğatının yeni bir mərhələsi başladı. Millətçi erməni dairələri özlərinin bütün imkanlarını, qüvvələrini və havadarlarını səfərbər edərək elə bir hay-küy yaratdılar ki, öz ərazilərində öz vətəndaşlarının müdafiəsi üçün qanuni tədbirlərə əl atan Azərbaycan hökuməti güclü təzyiqlər altına düşdü. Azərbaycan hökuməti hətta məcbur olub Zəngəzur ekspedisiyası ilə bağlı qaldırılan erməni təbliğatının mahiyyəti üzrə bəyanat qəbul etdi və burada erməni hay-küylərinin qərəzliliyini, hadisələri tamamilə saxtalaşdırdığını açıqladı. Bu bəyanatda Azərbaycanın qoşun bölmələrinin Zəngəzurdakı döyüş fəaliyyəti barədə də müxtəlif mə'lumat verilirdi (54, v.79).

Əsassız erməni hay-küylərinə inanan Britaniyanın ali komissarı Lordrop və ali komissarın müavini polkovnik Rey ayrı-ayrılıqda Azərbaycanın Zəngəzura qoşun bölmələrini yeritməsini təcavüz adlandırıb ona son qoyulmasını, məsələnin sülh yolu ilə həll edilməsini tələb etdilər (54, v.82,84).

Hətta Azərbaycanla daha yaxın münasibətlərə malik olan Gürcüstanın Xarici İşlər Nazirliyi də Zəngəzura qoşun bölmələri yeridilməsindən narahat olduğunu bildirib Azərbaycanı dinc vasitələrdən istifadə etməyə çağırdı (54, v.77).

Azərbaycana qarşı münasibətdə erməni-daşnak hökuməti ilə möhkəm müttəfiqlik əlaqələrində olan Denikin də hər vasitə ilə Azərbaycana təzyiq göstərməyə və erməni qoşunlarının təcavüzkarlığına qarşı mübarizədə onu zəiflətməyə çalışırdı. Noyabrın 9-da imzaladığı teleqramla general Denikin Azərbaycanın qoşun bölmələrinin guya Ermənistan ərazisinə soxulması ilə əlaqədar olaraq Azərbaycan Ordusu sıralarında xidmət edən bütün rus zabitlərini istefa verməyə çağırırdı (80, v.9).

Bundan başqa Azərbaycanın qoşun bölmələri Zəngəzurda olduğu vaxt Denikin qoşunlarının hissə və bölmələri Dağıstan ərazisində öz fəallıqlarını xeyli artırmışdılar. Bununla da Denikin və onun ətrafındakılar istəyirdilər ki, şimal sərhədlərinin müdafiəsində dayanmış Azərbaycan Ordusu-

nın qoşun bölmələri daim gərginlik içində olsunlar və buradan Zəngəzur dəstəsinə hər hansı bir kömək göndərilməsi mümkün olmasın (127,v.19).

Zəngəzur ekspedisiyası erməni təbliğatının genişlənməsi nəticəsində çox böyük rezonans aldığı üçün bu məsələ 1919-cu il noyabrın 19-da Dövlət Müdafiə Komitəsində də müzakirə olundu. Qəbul edilmiş qərarda deyilirdi ki, Cordropun və Reyin, habelə respublika parlamentinin erməni deputatlarının müraciətlərini və yaranmış olan vəziyyəti nəzərə alaraq Zəngəzurda erməni silahlı qüvvələri ilə Azərbaycanın qoşun bölmələri arasında silahlı qarşıdurmanın aradan qaldırılması üçün lazımi tədbirlər görülsün (54, v.90).

1919-cu il noyabrın 23-də Azərbaycanın və Ermənistanın hökumət sədrləri görüşdülər. Bu görüş Amerika nümayəndələrinin vasitəçiliyi ilə təşkil edilmişdi və başlıca olaraq ərazi məsələlərinin müzakirəsinə həsr edilmişdi. Tərəflər razılığa gəldilər ki, tezliklə Bakıda, sonra da Tiflisdə birgə sülh konfransı keçirsinlər və ərazi iddiaları üzrə bütün mübahisəli məsələləri orada həll etsinlər. Azərbaycan və Ermənistan hökumətlərinin sədrləri Tiflisdə bir razılaşma imzaladılar. Həmin razılaşmanın birinci bəndində deyilirdi ki, Azərbaycan və Ermənistan davam edən qarşıdurmanı dayandırırlar və bir daha silah işlətməməyə söz verirlər. Razılaşmanın başqa bu maddəsində bildirilirdi ki, hər iki respublika bütün məsələləri, o cümlədən sərhəd məsələlərini sülh konfransında həll etməyi öhdələrinə götürür və hər hansı bir məsələ mübahisə doğurduqda üçüncü tərəf kimi Amerikanın nümayəndəsinin fikrini əsas tuturlar (81, v.9).

Tiflisdə imzalanan razılaşmaya müvafiq olaraq 1919-cu il dekabrın 14-də Azərbaycan-Ermənistan konfransının Bakıda açılışı oldu. Tərəflərin hər ikisi konfransda müzakirə edilməsi üçün öz təkliflərini hazırlamışdılar. Bu təkliflər əsasən Zəngəzurda hərbi əməliyyatların dayandırılmasına, qaçqınlar məsələsinə və kommunikasiya xətlərinin bərpasına aid idi. Hərbi məsələlərlə bağlı Ermənistanın təkliflərində aşağıdakı maddələr var idi: a) Azərbaycan öz qoşunlarını və artilleriyasını Zəngəzur sərhədlərindən əvvəlki dislokasiya məntəqələrinə qaytarmalıdır; b) Ermənistan hərbi əməliyyat zamanı Zəngəzura göndərdiyi qoşunları və artilleriyanı geri çağırmalıdır. Azərbaycanın təkliflərində isə hərbi məsələlərlə bağlı aşağıdakı maddələr var idi: a) Azərbaycan və Ermənistan hökumətləri hazırkı anda əhalisi onların hakimiyyətlərini tanımayan əraziləri özlərinə tabe etdirmək üçün heç bir hərbi qüvvə tətbiq olunmamasını öz üzərinə götürürlər, b) Azərbaycan və Ermənistan hökumətləri arasındakı bütün mübahisəli məsələləri sülh yolu ilə həll etməyə razılıq verirlər; c) Azərbaycan Respublikası hökuməti Zəngəzur rayonuna, Qarabağ general qubernatorunun sərəncamına göndərilən hərbi qüvvələri geri qaytarır, öz növbəsində Ermənistan hökuməti də hərbi hissələri, zabitləri, tə'limatçıları və komissarları Zəngəzur qəzasının hüdudlarından geri çağırır, habelə



yerli erməni əhalisindən artilleriyanın, pulemyotların və digər silahların yığılmasına hərtərəfli yardım göstərir. Eyni zamanda bu rayonun hüdudlarındakı bütün səngərlərin və möhkəmləndirilmiş mövqelərin dağıdılması üçün tədbir görülür (265, s.205).

Əsassız ərazi iddiaları dövlət siyasətinə çevrilmiş olan Ermənistanı bu tələblər sözsüz ki, qane etmirdi. Bu təkliflərin qəbul edilməsi Ermənistanın öz iddialarından əl çəkməsi demək idi. Ona görə də Ermənistan nümayəndələrinin tutduğu qeyri-əməli mövqe üzündən konfrans bir neçə gün uzandı və heç bir qərar qəbul edilmədən tə'xirə salındı (81,v.43).

Ermənistan rəhbərləri hətta iki hökumət başçısının təcavüzün dayandırılması barədə Tiflisdə imzaladıqları razılaşmaya da məhəl qoymurdular. Həmin razılaşmalardan dərhal sonra erməni silahlı dəstələri yeni-yeni talan və qırğınlara əl atdılar. 1919-cu il noyabrın 26-da Xınzirək kəndinin erməniləri Əliquluuşağı kəndinə hücum edərək 2 azərbaycanlını öldürmüş, 6 nəfəri isə yaralamışdılar. Noyabrın 28-də erməni millətçiləri Zeyvə kəndi üzərinə hücum etdilər. Kəndin müdafiə dəstələri çətinliklə onların qarşısını ala bilmişdi. Noyabrın sonlarında Zəngəzurun Oxçu rayonunda 20 Azərbaycan kəndi mühasirə vəziyyətində idi. Nizamı və qeyri-nizami erməni silahlı dəstələri burada azərbaycanlılara qarşı hər cürə vəhşilikləri törətməkdə davam edirdilər (83, v.3-5).

Həmin qırğın və talanlarla bağlı noyabr ayının 29-da Azərbaycanın Xarici İşlər Nazirliyi Ermənistan Xarici İşlər Nazirliyinə e'tiraz notası göndərdi. Bu notada Tiflisdə imzalanan razılaşmanın şərtlərinin əksinə olaraq Zəngəzurun Azərbaycan kəndlərində davam edən qırğınlara və vəhşiliklərə son qoyulması tələb olunurdu (81, v.18).

Bakıda Azərbaycan və Ermənistan nümayəndələrinin konfransı keçirilən günlərdə Zəngəzurda nisbətən sakitlik oldu. Bu, konfransın işində də qeyd edilmişdi. Ancaq konfrans Bakıda öz işini sona yetirən kimi Zəngəzurda təcavüzlər yenidən alovlandı. 1919-cu il dekabrın 27-də Hacılar kəndinə, dekabrın 28-də və 29-da Zabıx çay körpüsünə, dekabrın 30-da Muradlı dəyirmanına, 1920-ci ilin yanvarın 3-də Xinzirək və Muğancıqdan Əliquluuşağı kəndi üzərinə, yanvarın 5-də isə Müsəlmanlar kəndi üzərinə hücumlar həyata keçirildi (265, s.220).

General-qubernator X.Sultanov Nazirlər Şurasının sədrinə göndərdiyi məktubunda bildirirdi ki, nizami hissələr Abdallardan geri çəkildikdən sonra 100 verstlik ərazinin müdafiəsi 250 mühafizəçinin və 1500 nəfər partizanın ümidinə qalmışdı. Bu qüvvələr isə erməni nizami qüvvələrinin təcavüzkarlığının qarşısını almağa qadir deyildi (265, s.220).

1920-ci il yanvarın ikinci yarısından e'tibarən Ermənistanın Azərbaycana qarşı təcavüzünün yeni və daha faciəli bir səhifəsi başladı. Müşahidəçilər tamamilə haqlı olaraq qeyd edirdilər ki, erməni təcavüzünün bu səhifəsi 1920-ci il yanvarın 13-də Müttəfiq dövlətlər tərəfindən Gürcüs-

tanla bərabər Azərbaycanın da müstəqilliyinin de-fakto tanınması ilə bağlı idi. Erməni millətçi dairələri Azərbaycanın müstəqilliyinin tanınmasına, iddia olunan Azərbaycan torpaqlarının Ermənistana verilməməsindən qətiyyən razı deyildilər. Dövlətlər arasında sərhəd hələ dəqiqləşdirilməsə də ermənilər artıq bu məsələnin büsbütün onların xeyrinə həll ediləcə-yinə əmin deyildilər. Ona görə də onlar müttəfiq dövlətlərin ermənilərə qarşı ərazi məsələsində "səxavət" göstərmələrini gözləmədən yenidən silah gücünə öz niyyətlərinə nail olmağa cəhd göstərdilər (79, v.21,25).

Qafqazda cərəyan edən hadisələri obyektiv şəkildə işıqlandıran ingilis jurnalisti bu məsələyə də biganə qalmamışdı. Onun yazdıqlarına görə, müstəqillikləri tanınandan sonra Azərbaycan və Gürcüstan mübahisəli məsələlərin müttəfiqlər tərəfindən həll olunacağına ümid etdikləri halda, ermənilər yenə də günahsız insanların qanını tökməkdə davam edirdilər. İngilis jurnalisti bu haqda yazdığı məqalələrdən birini belə tamamlayırdı: "Ermənilər özlərini Zəngəzurdakı indiki hücumunun müvəqqəti uğuruna şübhə etmirlər. Onların nizami qoşun hissələrinin çoxu əvvələr rus ordusunda xidmət etmişdi, Azərbaycanın qoşunları isə yalnız yeni çağırışçılardan təşkil olunmuşdur. Lakin bu müvəffəqiyyət uzunmüddətli ola bilməz. Ermənilər nəinki doğru deyildirlər, onlar eyni zamanda azlıqdadırlar. Ancaq elə bir gün gələcək ki, bütün müsəlmanlar bir nəfər kimi onlara təzyiq göstərənlərə qarşı çıxacaqdır və həmin gün gəlib çatanda erməni xalqını heç nə xilas edə bilməyəcəkdir"(79, v.26).

1920-ci il yanvarın 16-da Dövlət Müdafiə Komitəsi öz iclasında Zəngəzurda hərbi şəraitin yenidən mürəkkəbləşməsini müzakirə etdi. Burada bildirilirdi ki, 1919-cu il noyabrın 23-də Tiflisdə imzalanan razılaşmadan sonra Azərbaycan öz qoşun hissələrini Zəngəzurdan geri çəksə də Ermənistan tərəfi nizami qoşun hissələrini nəinki geri çağırmadı, əksinə onları möhkəmləndirdi. Həmin vaxtdan keçən müddət ərzində Zəngəzurun daha 40-dək kəndi talan edilib, sakinləri öldürülüb (75, v.1).

Yanvarın 19-da erməni nizami qoşun hissələri artilleriyadan və ağır silahlardan istifadə etməklə Zəngəzurun 8 azərbaycanlı kəndini yerlə-yeksan etdilər (75, v.11). Yanvarın 19-da erməni qoşun hissələrinin Zəngəzurda başladığı hücumlar sonrakı günlər ərzində daha geniş miqyas aldı. Ayın 20-nə olan mə'lumatda göstərilirdi ki, Zəngəzurda fəaliyyət göstərən erməni silahlı dəstələri Qarabağa doğru irəliləyib buradakı erməni dəstələri ilə birləşərək, Qarabağı da qan çanağına çevirmək istəyirdilər. Əsgəran və Şuşa şəhərlərinin üzərini təhlükə alırdı. Bu istiqamətdə hərəkət zamanı erməni qüvvələri öz marşrutları üzərində olan bütün Azərbaycan kəndlərini məhv etməyi planlaşdırırdılar (75, v.4).

Erməni qüvvələri başladıqları irimiqyaslı hücumlarla təkcə Zəngəzuru deyil, Qarabağı da birdəfəlik Azərbaycadan qoparmağa və bu əraziləri azərbaycanlı əhalidən tamamilə təmizləməyə çalışırdılar.



Yanvarın 21-də verilən mə'lumatlara görə Cəbrayıl qəzasında da erməni silahlı dəstələrinin hücumları geniş miqyas almışdı. Burada döyüşlər Xanlıq kəndinin ətrafında gedirdi. Erməni silahlı qüvvələri qəzanın içərilərinə doğru hərəkətini davam etdirirdi. Kəndlərdə yaradılmış olan könüllü müdafiə qüvvələri çoxsaylı və yaxşı təchiz olunmuş erməni dəstələrinin qarşısını almağa qadir deyildi (126, v.43).

Yanvarın 21-də Zəngəzur qəza rəisliyinin yerləşdiyi Dondarlı kəndi ermənilər tərəfindən işğal edildi (75, v.50). Elə həmin gün parlamentin üzvü Cəlil Sultanov, Qaryagindən parlament sədrinə göndərdiyi teleqramda bildirirdi ki, Zəngəzur qəzasında erməni hücumları 4-cü gündür ki, davam edir. Qudablıdan Xocaqana qədər olan 50 verstlik ərazi erməni vəhşiliklərinə mə'ruz qalmışdır. C.Sultanov tə'cili olaraq məntəqəyə qoşun və patron göndərilməsini tələb edirdi. O, qəza camaatı adından xahiş edirdi ki, hökumət orqanları Ermənistan dövlətinə e'tiraz notaları göndərməklə işini bitmiş hesab etməsin. Erməni millətçilərinin qırğınlarının qarşısının alınması üçün daha tə'sirli vasitələrə əl atılsın. Hadisələrin gedişi ilə yerində tanış olan parlament üzvü şübhə etmirdi ki, Zəngəzur tamamilə işğal edildəndən sonra növbə Qarabağa çatacaqdır (75, v.14).

Genişlənən erməni təcavüzünün dayandırılması üçün Azərbaycanın Xarici İşlər Nazirliyi Ermənistan Xarici İşlər Nazirliyinə e'tiraz notası göndərdi. Həmin notada da Azərbaycan hökuməti qətiyyətli şəkildə Zəngəzurda genişlənməkdə olan talan və qırğınlara son qoyulmasını tələb edirdi. Notada o da bildirilirdi ki, erməni silahlı qüvvələrinin təcavüzkar fəaliyyətinə son qoyulmazsa onda Azərbaycan hökuməti dinc əhalinin qorunması üçün daha qəti tədbirlərə əl atacaqdır (75, v.28).

Genişlənən təcavüzlərin arxasında Ermənistanın dövlət və hökumət orqanları dayandığı üçün heç şübhəsiz ki, Azərbaycanın notası qulaqardına vuruldu və onun tələblərinin yerinə yetirilməsi üçün heç nə edilmədi. Bir qədər qabağa gedərək bildirmək lazımdır ki, Ermənistan hökuməti Azərbaycanın notasına yalnız yanvarın 30-da cavab verdi. Notada bildirilirdi ki, Zəngəzurda nə baş verdiyindən Ermənistan hökumətinin heç bir xəbəri yoxdur və Azərbaycan tərəfindən xahiş edilirdi ki, Zəngəzurda baş verən hadisələr barədə Ermənistan hökumətinə daha ətraflı mə'lumat versin (75, v.46).

Yanvarın 23-də parlamentin üzvü C.Sultanov parlamentin Nazirlər Şurasının sədrlərinə, parlamentin bir sıra fraksiyalarının sədrlərinə göndərdiyi mə'lumatda bildirirdi ki, 10 ədəd topun, çoxlu pulemyotun müşayiəti ilə erməni silahlı dəstələrinin yanvarın 19-da başladığı hücum hələ də dayandırılmamışdır. Ötən günlər ərzində təkcə Xocaqan və Qaladərəsi kəndləri arasında 15 azərbaycanlı kəndi məhv edilmişdir (75, v.17).

Həmin tarixə aid olan başqa bir mə'lumatda Zəngəzurun üçüncü sahəsinin tamamilə ermənilər tərəfindən işğal edildiyi bildirilirdi. Öz mövqe-

fəqiyyətlərindən ruhlanan erməni hissələri hücumları qəzanın 4-cü sahəsi və Cəbrayıl qəzası istiqamətində davam etdirirdilər. Dəqiqləşdirilmiş mə'lumata görə erməni hissə və bölmələrində 60 ədəd pulemyot var idi (75, v.19).

Ermənı silahlı dəstələri hücumları çox böyük bir sür'ətlə genişləndirirdilər. Gün ərzində hərbı şəraitdə çox ciddi dəyişikliklər meydana gəlirdı. Elə yanvarın 23-nə aid olan başqa bir mə'lumatda bildirilirdi ki, sayı 10 min nəfərə çatan erməni nizami qoşun dəstələri Zəngəzur vilayətini artıq bütünlüklə ələ keçirmişlər. Yanvarın 23-də qəzanın 4-cü sahəsinin salamat qalmış son kəndləri də mühasirə edilmişdi və az müddət ərzində onların da məhv ediləcəyi heç kimdə şübhə doğurmurdu. Parlamentin üzvü C. Sultanovun verdiyi mə'lumata görə yanvarın 24-də Zəngəzuru viran qoyan qoşun hissələri Cəbrayıl qəzasının içərilərinə doğru hücumlarını davam etdirməli idilər ki, burada Qarabağın erməni silahlı dəstələri ilə birləşsinlər. Bununla da onlar həm Naxçıvanı Azərbaycandan ayrı salmaq, həm də Qarabağı birdəfəlik ələ keçirmək niyyətində idilər. C. Sultanovun fikrincə, Azərbaycan hökuməti nəhayət tə'sirli tədbirlər görməsəydi, erməni millətçi qüvvələri bu planların həyata keçirilməsinə çox yaxın idilər. Son hücumlar ərzində Zəngəzurda 200 min azərbaycanlının qırıldığı güman edilirdi. C.Sultanov parlament sədrinin adına göndərdiyi teleqramı bu cümlələrlə bitirirdi: "Xahiş edirəm tə'cili tədbirlər görülsün ki, heç olmasa Qarabağ, Şuşa və Cəbrayıl qəzaları xilas edilsin. Hər dəqiqə qiymətlidir. Ləngimək cinayətə, xalq və Vətən qarşısında xəyanətə bərabərdir. Hərbı nazırin bölgəyə gəlməsi zəruridir" (75, v. 24).

Bölgədə baş verən proseslərin izlənilməsi göstərir ki, Azərbaycan tərəfi ilə müxtəlif danışıqlara girib müxtəlif razılaşmalar imzalasa da, müxtəlif dövlətlərin vasitəçiliyindən istifadə etsə də erməni millətçiləri öz xislətlərindən əl çəkmirdilər və məqsədləri Azərbaycan tərəfini sakitləşdirmək, diqqəti yayındırmaq, yeni qüvvələr toplayıb təcavüzü daha genişləndirmək idi. Yanvar ayında genişlənən təcavüzlər də erməni millətçilərinin bu ikiüzlü siyasətinin davamı idi.

Tiflisdə razılaşma imzalanandan sonra Azərbaycan qoşun bölmələrini Zəngəzurdan çıxarsa da Ermənistan öz xislətinə sadiq qalaraq buradakı qoşunlarını nəinki geri çağırmadı, əksinə onları daha da gücləndirdi və yaxşı hazırlıq gördükdən sonra irimiqyaslı hücumlara başladı. Ermənilərin təcavüzü bütün Zəngəzuru və Qarabağı bürümüşdü. Azərbaycanın qoşun bölmələrinin Zəngəzurdan çıxması, yerli könüllü dəstələrin isə lazımı imkanlara malik olmaması faciələrin vüs'ət almasına zəmin yaradırdı. Xankəndi qarnizonundan Zəngəzura kömək göndərilməsi isə xeyli təhlükəli idi. Çünki Xankəndi qarnizonunun zəifləyəcəyi təqdirdə Qarabağdakı erməni silahlı dəstələri hücum edib Şuşanı və Əsgəranı işğal edə bilərdilər (126, v. 46).



Zəngəzurda vəziyyət mürəkkəbləşən kimi Hərbi Nazirliyin məs'ul şəxsləri bölgəyə e'zam olundular. Əvvəlcə Baş Topçu İdarəsinin rəisi general-mayor Məmməd Mirzə Qacar bölgədə oldu. Vəziyyətlə tanış olandan sonra o da erməni silahlı qüvvələrinə qarşı tə'sirli və tə'xirəsalınmaz tədbirlərin həyata keçirilməsini lazım bildi. Ancaq bunun üçün general Məmməd Mirzə Qacar digər qarnizonlardan hərbi yardımın göndərilməsinin məqsədəuyğunluğunu vurğulayırdı (126, v. 4).

Yanvarın 24-də Ərkani-Hərbin rəisi M. Sulkeviç Ağdama 2 ədəd zirehli avtomobilin köndərildiyini bildirirdi. Həmin avtomobillər Şuşa - Yevlax yolunun mühafizəsini tə'min etməli idi. (126, v. 55).

Yanvarın 27-də general-leytenant M. Sulkeviç özü də süvari diviziyasının komandiri general-mayor Novruzovla Şuşaya gəldi. O, Xankəndi qarnizonunun rəisini yanına də'vət edib vəziyyətlə bağlı onunla məsləhətləşmələr apardı. Sulkeviçin Hərbi Nazirliyə göndərdiyi mə'lumatında bildirilirdi ki, süvari diviziyasının qərargahı da Yevlaxdan Xankəndinə yola düşmüşdür (126, v. 47). Bu barədə əlavə mə'lumat verilməsə də güman etmək olar ki, süvari diviziyasının qərargahının Xankəndinə göndərilməsi bölgədə yerləşən süvari hissə və bölmələrinin fəaliyyətinin gücləndirilməsi məqsədi ilə edilmişdi.

Sulkeviç vəziyyətlə tanış olduqdan sonra bölgədə hərbi texnikanın artırılmasını məqsədəuyğun bildı. Xüsusilə ora əlavə topların, pulemyotların, bir sıra məntəqələr arasında rabitənin yaradılması üçün kabelin göndərilməsi barədə məsələ qaldırmışdı (75, v. 32).

Bundan başqa, Sulkeviç erməni qoşun hissələrinin təcavüzünə qarşı mübarizə aparılması üçün təyyarələrdən istifadə edilməsini və havadan erməni hərbi bazalarına bomba atılmasını da istisna etmirdi. Onun yazdığına görə, belə bir təcrübədən Gürcüstanda hökumət əleyhinə üsyanların yatırılmasında çox səmərəli şəkildə istifadə edilmişdi. Ancaq həmin vaxt Azərbaycanda bu işi yerinə yetirə biləcək təyyarə yox idi. Sulkeviç Qarabağdan Bakıya göndərdiyi teleqramında belə bir təyyarənin Gürcüstandan müvəqqəti də olsa alınmasının mümkünlüyünü nəzərdən keçirməyi xahiş edirdı. Doğrudur, Hərbı əməkdaşlıq barədə Azərbaycanla Gürcüstan arasında olan razılaşmaya əsasən gürcü zabitlərinin Azərbaycan Ordusunda xidmət etməsinə icazə verilirdi, lakin onların Azərbaycanın daxilində gedən hərbi əməliyyatlarda iştirakı qadağan idi. General Sulkeviç bildirirdi ki, Gürcüstandan təyyarə alınarsa onu azərbaycanlı pilot Xan Əfşar da idarə edə bilər. Bu isə Gürcüstanla olan razılaşmanın pozulması demək deyildi. (126, v. 48).

Sənədlərdə erməni qoşun hissələrinə qarşı hər hansı bir təyyarədən istifadə edilməsi barədə mə'lumata rast kəlmək mümkün deyil. Çox güman ki, bununla bağlı Sulkeviçin qaldırdığı təklif öz həllını tapmamışdı.

Yanvar ayının sonlarında gərginlik nisbətən səngiməyə başladı. Çünki bir tərəfdən Zəngəzurda çoxsaylı azərbaycanlı kəndləri dağıdılmış, azərbaycanlı əhalı qəzadan qovulmuşdu. Ermənilər qarşıya qoyulan məqsədə nail olmuşdular. Digər tərəfdən isə Azərbaycan hökumətinin müvafiq tədbirlər görməsi, yenidən hərbi vasitə-lərə meyl etməsi erməniləri köhnə taktikaya əl atmağa sövq edirdi. Onlar müvəqqəti sakitlik yaratmaqla həm Azərbaycan tərəfinin, həm də müttəfiq dövlətlərin nümayəndələrinin diqqətini özlərinin törətdiyi təcavüzdən yayındırmağa çalışırdılar.

1920-ci il yanvarın 20-də Qarabağ general-qubernatorunun müavininin Cəbrayıldan Hərbi Nazirliyə göndərdiyi məktubda da bildirilirdi ki, Dondarlı ətrafında vəziyyət son günlərdə sakitdir. Cəbrayıldan olan partizanlar buradakı erməni qüvvələri üzərinə hücum etmiş və onlardan qənimət kimi bir top da ələ keçirmişdilər. Güman edilirdi ki, ermənilərin başı hazırda öz qüvvələrini bərpa etməyə qarışmışdır. General-qubernatorun müavininin yazdığından aydın olur ki, yanvar ayının sonunda general M. Sulkeviç də Cəbrayıla gəlmiş və o, Xanlıq, Müsəlmanlar və Qoçaz ətrafında olan silahlı dəstələrin vəziyyəti ilə tanış olmuşdur. Müdafiə mövqelərinin gücləndirilməsi, nəzərdə tutulan məntəqələr arasında teleqraf əlaqəsinin yaradılması planlaşdırılırdı. Abdallar-Şuşa və Abdallar-Dondarlı arasında belə əlaqələr yaradılmışdı. Digər məntəqələrlə teleqraf əlaqəsinin yaradılması üçün kabel çatışmırdı. General Sulkeviç Hərbi Nazirliyin ehtiyatlarından bura kabel göndərilməsinə kömək göstərəcəyini bildirmişdi. Qoçazda müdafiə qüvvələrinin gücləndirilməsi planlaşdırılırdı. Cəbrayıldan bura partızan dəstəsi göndərilmişdi. Əlavə olaraq fevralın 4-nə kimi 400 nəfər kürd partızanı və Şuşadan 500 partızan bura gəlməli idi. Həmin sahədə müdafiə qüvvələrinin möhkəmlənməsi Zəngəzurdan Qarabağa doğru hərəkət etmək istəyən erməni qoşun hissələrinin qarşısını ala bilərdi. Ona görə də Qarabağ general-qubernatorunun müavini Hərbi Nazirliyin rəhbərliyindən xahiş edirdi ki, Sulkeviçin və'd etdiyi topların, pulemyotun və kabelin göndərilməsini sür'ətləndirsin. Onun fikrincə, canlı qüvvəni yerli könüllülər hesabına toplamaq olardı. Hərbi Nazirlik bu könüllüləri silah və sursatla təchiz edəcəyi təqdirdə bura heç əlavə qoşun hissələrinin göndərilməsinə ehtiyac qalmırdı (75, v.32).

Hərbi nazir vəzifəsini müvəqqəti icra edən general Ə.Şıxlinski Qarabağ general-qubernatorunun müavininin müraciəti ilə bağlı erməni qoşun hissələrinə qarşı mübarizə tədbirlərinin gücləndirilməsini vacib sayırdı. Bunun üçün o, Xankəndindən bir top batareyasının lazım olan məntəqəyə göndərilməsi barədə əmr verdi. Ə.Şıxlinskinin fikrincə, başqa qarnizonlardan Qarabağa göndərilən qoşun hissəsi buraya yaxşı halda 7-8 gündən sonra gəlib çıxa bilərdi. Ancaq hələ də sovuşmayan erməni hücümlarının qarşısının alınması üçün Xankəndindəki top batareyası Zəngəzur qəzasının sərhəddinə çox tez bir zamanda yetişə bilərdi. O, Şıxlinskiyə görə, bir top batareyasının Xankəndindən çıxarılması buradakı qarnizonu çox da zəiflətməzdi. Şuşa və Zəngəzur qəzalarının sərhədində güclü müdafiə qüvvələri olduğu təqdirdə Xankəndini 2-3 bölük və bir pulemyot komandası ilə müdafiə etmək olardı. Zəngəzur qəzası sərhəddindəki müdafiə qüvvələrini arxadan himayə etmək üçün Ə. Şıxlinski Qubadan bir dağ top batareyasının, Gəncədən bir piyada bölüyünün və bir pulemyot komandasının Qarabağa göndərilməsi barədə göstəriş vermişdi. O, erməni təcavüzünün qarşısının alınması üçün bu qüvvələrin kifayət edəcəyini bildirirdi. Ə.Şıxlinskinin əmri ilə Qarabağa 60 verst kabel də göndərilmişdi (75, v. 32).

Azərbaycan hökumətinin respublikanın ərazi bütövlüyünü qorumaq üçün həyata keçirdiyi tədbirlər Ermənistan hökumətini heç də razı salmadı. Çünki bu tədbirlərin reallaşdırılması erməni millətçilərinin qarşılarına qoyduqları təcavüzkar məqsədlərə çatmasına mane ola bilərdi. Zəngəzur sərhədlərində və Qarabağda müdafiə tədbirlərinin həyata keçirilməsinə e'tiraz əlaməti olaraq Ermənistan Xarici İşlər Nazirliyi 1920-ci il fevralın 20-də Azərbaycan Xarici İşlər Nazirliyinə e'tiraz notası göndərdi. Ermənistan hökuməti Zəngəzurda törətdiyi bütün faciələrə göz yumaraq Azərbaycan hökumətini Qarabağ ermənilərinin Milli Şurası ilə əldə edilmiş və Zəngəzurda atəşin dayandırılması haqqında 1919-cu il noyabrın 20-də Tiflisdə imzalanmış razılaşmaları pozmaqda ittihamlandırır, bölgəyə əlavə qoşun bölmələrinin gətirilməsinin dayandırılmasını tələb edirdi. (75, v. 53).

Fevralın 26-da Azərbaycan Xarici İşlər Naziri F. Xoyskinin imzası ilə Ermənistana cavab notası göndərildi. Notada deyilirdi ki, Azərbaycan təcavüzkar məqsədlər izləmir. Ermənistanın notasında xatırlanan razılaşmaları da məhz Ermənistan tərəfi pozmuşdur. Əldə edilən razılaşmalara baxmayaraq erməni qoşun bölmələri Zəngəzurdan Şuşaya doğru hərəkət edir və yolu üstündə olan bütün Azərbaycan kəndlərini viranə qoyurdu. Bu qoşun bölmələrinin hərəkətinin qarşısını almaq, on minlərlə azərbaycanlının vəhşicəsinə qırılmasına son qoymaq və 1919-cu il noyabrın 23-nə qədər olan vəziyyəti bərpa etmək üçün Azərbaycan hökuməti bölməyə az miqdarda qoşun bölmələri göndərməli olmuşdu. Həmin qoşun bölmələrinin bölgəyə gəlməsi erməni qüvvələrinin təcavüzkarlığının cilovlanmasına müsbət tə'sir göstərmişdi. (75, v.59).

1920-ci il fevral ayının sonu, mart ayının əvvəllərində vəziyyət həqiqətən də bir qədər sakitləşmişdi. Lakin bu nisbi sakitlik idi və erməni millətçi qüvvələri öz xislətlərinə sadiq qalaraq növbəti təcavüz üçün öz qüvvələrini bərpa edir və nisbi sakitlik yaratmaqla diqqəti yenə də öz əməllərindən yayındırmağa çalışırdılar. Bunu mart ayının əvvəllərində əldə edilmiş kəşfiyyat mə'lumatları da sübut edirdi. Qarabağ general-qubernatoru X.Sultanovun erməni agentlərindən topladığı mə'lumatlarda bildirilirdi ki, ermənilər Dığda artıq 3 minədək silahlı erməni toplamışlar. Onlara zabit rəhbərlik edir. Dəstənin sərəncamında 2 ədəd top və pulem-

yot vardır. Bir ədəd top da Xanazakda var idi. 7-10 gündən sonra Mamzak istiqamətindən erməni silahlı dəstələrinin hücumu başlamalı idi. Hücumun başlanmasında məqsəd Qarabağdakı silahlı dəstələrlə birləşmək və burada Azərbaycan hökumət orqanlarını devirmək idi. Hücumun başlanması ilə bütün Qarabağ ermənilən də ayağa qalxmalı və Azərbaycan hökuməti əleyhinə üsyana qoşulmalı idilər. Zəngəzurda ermənilər hücuma başlayan kimi Gəncə qəzasının ermənilərdən təşkil olunmuş silahlı dəstələr Əsgəran üzərinə hərəkət edib oranı işğal etməli idilər. Mart ayının əvvəlində oradan Qarabağ ərazisinə 1000 nəfərlik dəstə göndərilmişdi. Ancaq Gəncə qəzasında 5 min nəfərlik dəstənin təşkili planlaşdırılırdı. Kütləvi üsyan üçün Qarabağ ərazisində ciddi hazırlıq işləri aparılırdı (75, v.68).

Bolşevik qoşunlarının Azərbaycanın şimal sərhədlərinə doğru irəliləməsi də erməni millətçi dairələrinin fəallaşmasına səbəb olurdu. Müxtəlif adlar, siyasi cərəyanlar altında gizlənsə də millətçi daşnak xislətindən əl çəkməyən ermənilər Azərbaycanın işğalı üçün hər cürə planların həyata keçirilməsində iştirak edirdilər. Mikoyan kimilərin işarəsi ilə Qarabağda başlanan erməni üsyanı (266, s.228) Azərbaycanın qoşun hissələrinin böyük bir hissəsinin bura cəlb edilməsi və şimal sərhədlərinin zəifləditməsi ilə nəticələndi.

1920-ci il mart ayının ortalarında Hərbi Nazirliyə daxil olan mə'lumatlarda bildirilirdi ki, Qarabağda ermənilər bütün cəbhə boyu güclü hazırlıq işlərini davam etdirirlər. 60 nəfərlik qruplarla ermənilər Mamzak-Xocaqan və Zəngilan istiqamətində kəşfiyyat işləri aparırlar. Cəbrayıl ətrafında da onların xeyli fəallaşması müşahidə olunmuşdu. İran ərazisində erməni silahlıları tə'lim keçirdilər. Cəbrayılda olan qoşun bölmələrinin rəhbərliyi ehtiyat edirdi ki, erməni silahlı qüvvələri qəfil hücuma başlasaydılar onların qarşısını almaq çox çətin olardı. (75,v.93).

Erməni silahlı dəstələrinin hazırladıqları irimiqyaslı təcavüz tezliklə öz əməli təcəssümünü tapdı. Martın 19-da erməni silahlıları hücum edərək 2 nəfər azərbaycanlı əsgəri qətlə yetirdilər (75, v.81). Martın 20-də yerli hökumət orqanlarında işləyən 2 erməni çinovnikinin vasitəsilə 25 nəfər erməni silahlısı gizlicə Şuşaya gətirildi. Martın 22-də onların sayı Şuşada 200 nəfərə çatdırılmışdı. (11, 18.01.1920).

Kütləvi üsyana erməni millətçi qüvvələri çoxdan hazır olsalar da onun başlanması üçün münasib vaxt martın 22-si qəbul olundu. Bu tarixin seçilməsi təsadüfi deyildi. Çünki həmin gün bütün Azərbaycan xalqı kimi Azərbaycan əsgərləri də Novruz bayramının gəlişini qeyd edəcəkdilər. Qoşun bölmələrinin milli bayramının qarşılanması ilə məşğul olması erməni silahlılarına qəfil hücum üçün əlverişli şərait yaradırdı. Erməni millətçi dairələri bu irimiqyaslı hücumun başlanmasına geniş hazırlıq işləri aparmışdılar. Hücumun bir neçə məntəqədə aparılması üçün öz qüvvələrini vaxtında qruplaşdırmış, onları lazımi silah və sursatla tə'min etmişdilər.



Hücum ərəfəsində Hərbi hissələr və müdafiə postları arasında olan bütün teleqraf və telefon xətləri kəsilmişdi (75, v.98).

Erməni qüvvələrinin hücumu martın 22-də gecə saat 3-də eyni vaxtda Şuşa, Xankəndi, Əsgəran, Xocalı və Tərtərdə yerləşən qoşun bölmələrinin üzərinə basqınla başladı. Əsgəranda Azərbaycan Ordusunun 50 nəfərlik kiçik bir dəstəsi var idi. Bu dəstə erməni silahlılarına bütün gücləri ilə müqavimət göstərsələr də qüvvələr nisbəti bərabər deyildi. Ona görə ermənilər Əsgəran postunu ələ keçirib buradakı əsgərlərin hamısını qırdılar (75, v.98).

Digər məntəqələrdə isə erməni silahlı dəstələri uğur qazana bilmədilər. Şuşa şəhəri hücum vaxtı Şuşikənddən güclü top atəşlərinə mə'ruz qalmışdı. Şuşanın ətraf aləmlə bütün əlaqələri kəsilmişdi. Şuşa, Xankəndi və Tərtər ətrafına çoxlu erməni silahlı dəstələri toplaşmışdı. Martın 23-də gündüz Əsgəran ətrafında top atəşlərinin səsləri eşidilməkdə idi (75, v.81).

Erməni silahlı hissələrinin Qarabağda irimiqyaslı hücumları bu bölgədə onsuz da ağır hərbi şəraiti daha da mürəkkəbləşdirdi. Bununla belə, bu təcavüzün qarşısının alınması üçün lazımi tədbirlərin həyata keçirilməsinə başlandı. Qarabağ general-qubernatoru ermənilərin hücum xəbərini eşidən kimi yerli partizanları döyüşə səfərbər etdi. Ağdamla-Əsgəran arasında olan bir sıra mövqelər Azərbaycanın partizanları tərəfindən tutuldu. Əhali ermənilərin növbəti həyasızlığını qəzəblə qarşılayırdı. General-qubernatorun verdiyi mə'lumata görə, qəzəblənmiş olan əhalini ermənilərə qarşı özbaşına əməllərdən çəkindirmək çətinləşirdi. Ermənilərin hücum xəbəri alınan kimi Tərtər ətrafında da könüllü partizanlar toplaşmağa başlamışdılar (75, v.81-84).

Martın 24-də səhər saat 6-da erməni silahlı qüvvələri Tərtər üzərinə böyük hücuma keçirdilər. 3-cü Şəki alayının komandiri podpolkovnik Tonqıyevin verdiyi mə'lumata görə, onlar Tərtəri tutmağa sə'y göstərirdilər. Ancaq mövcud olan qüvvələrin səfərbər edilməsi bu erməni hücumunun da qarşısını aldı (114, v.1).

Ermənilərin Qarabağda və Zəngəzurda böyük qüvvələri cəmləşmişdi. Ancaq qarşıya qoyulan məqsədə çatmaq üçün onlar bu bölgəyə yeni-yeni qüvvələrin gətirilməsini planlaşdırırdılar. Martın ortalarında Dilicandan Zəngəzura 7 min erməni silahlısı gətirilmişdi (75, v.65). İrəvan quberniyasının Yenibəyazıd qəzasından Qarabağa doğru çoxsaylı erməni silahlı dəstələri yola düşmüşdü (75, v.98).

Çaykənddə 2500-3000-ə qədər erməni silahlısı toplanmışdı. Bu silahlıların çoxu vaxtilə rus ordusunda xidmət etmiş keçmiş şəxslər idi. Onların xeyli əl qumbarası və çoxlu patronları var idi. İrəvandan gəlmiş olan millətçilər burada geniş təbliğat işi aparır, əhalini Azərbaycan hökuməti əleyhinə qızışdırırdılar. Burada təşkil edilən silahlı dəstələri təchiz etmək

üçün patron, bomba hazırlayan e'malatxana açılmışdı. Çaykənddə yaradılan silahlı dəstələr Əsgəran ətrafına yola salınırdılar (59, v. 1-2).

Şuşada, Xankəndində və Tərtərdə Azərbaycan qoşun bölmələrinin qışlalarını, silah və sursat anbarını tutmaq üçün erməni silahlı dəstələrinin göstərdiyi ilk cəhd uğursuzluğa düçar olsa da aydın idi ki, mövcud qüvvələrlə güclənməkdə olan erməni dəstələrinin növbəti basqınlarının qarşısını almaq heç də asan olmayacaqdır. Ona görə də həm Qarabağın general-qubernatorunun (415, v.1), Həm də Daxili İşlər Nazirliyinin bölgəyə gəlmiş olan rəhbərliyi respublika hökumətindən Qarabağa əlavə qüvvələrin göndərilməsini xahiş edirdi (57, v.21). Daxili işlər naziri Vəkilov xüsusilə artilleriyanın gətirilməsini vacib sayırdı. Onun fikrincə, bu iş operativ surətdə görülməli və ermənilərin Əsgəranda lazımınca möhkəmlənməsinə imkan tapmamış əks-hücumlar başlanmalı idi. Daxili işlər nazirinin göndərdiyi teleqramdan aydın olur ki, Ağdamda Salah bəyin rəhbərliyi altında olan partizan dəstəsi Əsgəran yolunun açılmasına çalışsa da bir nəticəyə nail ola bilməmişdilər. Çünki Əsgərandakı erməni qüvvələri ilə müqayisədə onların gücü xeyli zəif idi. (57, v. 3).

Qarabağdakı qoşun hissələrinin möhkəmləndirilməsi üçün şimal sərhədlərində olan qüvvələrin bir hissəsinin ora göndərilməsi qərara alınmışdı. Martın 19-da hərbi nazir 1-ci Tatar süvari alayının tam tərkibdə, habelə Quba piyada alayının bir taborunun Qarabağa yola salınması barədə göstəriş vermişdi (132, v. 46-47). Ancaq ermənilərin hücumları başlananda bu qüvvələr hələ gəlib Qarabağa çıxmamışdı.

Qarabağda ermənilərin təcavüzü genişlənən kimi bura digər əlavə qüvvələrin göndərilməsi də qərara alındı. Başlanan təcavüz respublikanın ərazi bütövlüyü üçün çox ciddi təhlükə yaratdığından Azərbaycan Ordusunun bütün potensialı səfərbərliyə alındı və onun əsas gücü bura istiqamətləndirildi. Martın 24-də Gəncə piyada alayının 2 ədəd topa malik olan bir taboru bölgəyə yola salındı. Bu dəstəyə podpolkovnik Qasımbəyov komandirlik edirdi. Həmin dəstənin tərkibində 18 zabit, 633 əsgər, 1 həkim və 97 baş at var idi (114, v.1).

Qarabağda vəziyyətin sabitləşdirilməsi üçün təkcə qoşun hissələri deyil, yerli əhali və mülki vətəndaşlar da əllərindən gələni edirdilər. Bölgədə olmuş daxili işlər naziri bildirirdi ki, əsgərlərin çox mübariz əhval-ruhiyyəsi vardır. Onların yeməkləri çox yaxşıdır. Yerli əhali özü əsgərləri yemək-içməklə tə'min edir. Hərbi qulluqçulara tibb xidməti də lazımi səviyyədədir. Bu sahədə həm hökumət orqanları, həm də əhali orduya yaxından kömək edirdi. Azərbaycanın bütün məntəqələrindən axışıb gələn könüllülər sanitar dəstələrində birləşirdilər.Əsgər və zabitlərə xidmət göstərilməsi üçün müəllimlər, ictimai təşkilatların əməkdaşları da sanitar dəstələrini yaratmışdılar (11, 3.04.1920).



Erməni silahlı qüvvələrinin təcavüzünə qarşı aparılan mübarizəyə rəhbərlik etmək üçün ordu qərargahının rəisi general-mayor H.Səlimovun rəhbərliyi altında xüsusi bir qərargah da yaradılmışdı. Həmin qərargah martın 26-da Ağdama gəldi. (57, v.23).

Qarabağda baş verən hadisələr Hərbi Nazirliyin rəhbərliyinin də ciddi nəzarəti altında idi. Təcavüzün başlanmasının elə ilk günlərindən hərbi nazir respublikanın qərb rayonlarına yollanıb həm bu bölgənin möhkəmləndirilməsi, həm də qüvvələrin. Qarabağa səfərbər edilməsi ilə məşğul olmağa başladı. O buradan həm Qarabağ bölgəsi, həm Qərb bölgəsi, həm də Bakı ilə sıx əlaqə saxlayır və lazımi göstərişlər verirdi. Erməni millətçi dairələri həm Gəncə qəzasında, həm Qazax-Ağstafa istiqamətində güclü hazırlıq işləri aparırdılar. Bu istiqamətdə onların başlana biləcək hücumlarının qarşısı alınmasaydı respublikanın vəziyyəti daha da mürəkkəbləşə bilərdi.

24-26 mart günlərində Tərtər ətrafında xüsusi bir gərginlik yaranmışdı. Ayın 24-də erməni qüvvələri bir neçə dəfə Tərtər üzərinə hücuma keçmişdi. Bu hücumların hamısı dəf edilmişdi. Bir əsgər şəhid olmuş, 5 nəfər isə yaralanmışdı (114, v.1). Tərtər ətrafında Azərbaycan partizanları da igidliklə vuruşurdular. Quduzlaşan erməni qüvvələrinin geri atılmasında onların da böyük rolu var idi (57, v.3).

Tərtər ətrafına Azərbaycan partizanları toplaşmaqda davam edirdi. Martın 25-də Tərtərə növbəti hücumlar gözlənilirdi. Bu dəfə Gəncə ətrafında yaradılmış olan erməni silahlı dəstələrinin də arxadan Tərtərə zərbə endirəcəyi barədə xəbər alınmışdı (57, v.3).

Martın 25-də səhər saat 6-da erməni qüvvələri Tərtər üzərinə yeni hücuma başladılar. Onların məqsədi Tərtəri ələ keçirib burada möhkəmlənmək idi. İlk hücum uğursuzluğa düçar olsa da, ikinci cəhddə ermənilər bir qədər irəliləyə bildilər. Onlar qoşun bölmələrini və müdafiədə dayanan partizanları sıxışdıraraq Tərtər ətrafındakı iki kəndi işğal etdilər. Lakin həmin kəndlərdə möhkəmlənmək ermənilərə nəsib olmadı. Azərbaycanın qoşun bölmələri və partizanları yenidən qruplaşdırıldı və onlar həyata keçirdiyi əks-hücum erməniləri əvvəlki mövqelərə çəkilməyə məcbur etdi. Topların döyüşə qoşulması ermənilərin təlaş içində dağlara çəkilməsinə səbəb oldu. Onların qüvvələrinə güclü zərbə endirmək üçün yaxşı zəmin yarandığından axşamüstü Azərbaycanın qoşun hissələri və partizanları hücumu davam etdirdilər. Əvvəlcə Marağalı kəndi ermənilərdən azad edildi, sonra isə Marquşevan kəndində Yüzbaşovun malikanəsi ələ keçirildi. Qoşun hissələri Marquşevan yaxınlığında olan Çaylı kəndini də atəşə tutmuşdu (114, v. 4).

Martın 26-da Tərtər ətrafında Azərbaycanın qoşun bölmələrinin və partizanların uğurlu hücumları davam etdirildi. Gündüz saat 12-də Çaylı və Bruc erməni kəndləri də ələ keçirilmişdi. Erməni qüvvələri Çaylının

qərbində olan dağlara səpələnmişdilər. 3-cü Şəki süvari alayının komandiri podpolkovnik Tonqiyev birinci bölükdən kornet Yadigarovun və praporşik Seyidzadənin rəhbərliyi altında olan topçuların qorxmaz və səmərəli fəaliyyətinin gün ərzində əldə edilən uğurlarda xüsusi rolu olduğunu qeyd edirdi. Topçular dəqiq atəşləri ilə düşmənin bütün mövqələrini vurub dağıtmışdılar. Kornet Yadigarovun süvarilərinin qəfil və sür'ətli hücumu isə ermənilərin canına bir vəlvələ salmış, onların qorxu və təlaş içində qaçıb dağılmasına səbəb olmuşdu (114, v. 6).

Martın 26-da 3-cü Gəncə piyada alayından podpolkovnik Qasımbəyovun komandirliyi altında göndərilmiş olan dəstə də bölgəyə gəlib çıxmışdı. Həmin dəstə Tərtərlə Goranboy arasında mövqe tutmuşdu və bu istiqamətdən müstəqil şəkildə erməni silahlı dəstələrinin mövqələri üzərinə hücum çəkməli idi. Podpolkovnik Tonqiyev bildirirdi ki, gələcək döyüşlərdə öz planlarını podpolkovnik Qasımbəyovla nizamlayacaqdır. O, Hərbi Nazirliyə göndərdiyi raportunda qeyd edirdi ki, erməni qüvvələrinin tezliklə məhv edilməsi üçün əlavə nizami bölmələrin göndərilməsi zəruridir. Çünki bir tərəfdən Şəki süvari alayının şəxsi hey'ətinin miqdarı az idi, o biri tərəfdən isə 3 günlük gərgin döyüşlərdən sonra partizanların çoxu yorulduqlarından evlərinə dağılırdılar. Bu da ümumi qüvvənin zəifləməsinə zəmin yaradırdı (114, v.6).

Qarabağdakı qüvvələrin daha da möhkəmləndirilməsi üçün Hərbi Nazirliyi də bura göndərilən qüvvələrin sayının artırılmasını məqsədəuyğun bilirdi. 8-ci Ağdaş piyada alayı da Qarabağa yollanmaq barədə göstəriş almışdı və martın 26-da bu alay artıq Yevlaxa çatmışdı. Zaqatala piyada alayının 700 nəfərlik Nuxa taboru da Qarabağa yollanmaq əmri almışdı. Ancaq bu taborun geyimi çox zəif idi. Alay komandiri polkovnik Dibirov Hərbi Nazirliyə bu barədə xəbər verərək mümkün köməyin göstərilməsini xahiş edirdi (114, v. 7).

Martın 26-da general Səlimov Ağdama çatan kimi Əsgəran yolunun kəşfiyyatını apardı. Əldə olunan mə'lumatlar göstərirdi ki, Əsgəran ətrafındakı bütün yüksəkliklər erməni silahlılarının əlində idi. Ancaq bu məntəqədə düşmənin topa malik olduğu aşkarlanmamışdı. Ona görə də general Səlimov hərbi nazirdən xahiş edirdi ki, orduda olan 3 ədəd zirehli avtomobildən biri Ağdama göndərilsin. Düşmənin top təhlükəsi olmadığı bir vaxtda zirehli avtomobil çox böyük səmərə verə bilərdi. (114, v. 6).

Hərbi nazir S. Mehmandarov bu zaman artıq Gəncədə idi və Qarabağ bölgəsində baş verənləri buradan izləyirdi. Lazım olan müvafiq göstərişləri də buradan verirdi. Hərbi nazir general Səlimovdan başqa Qaryagində olan polkovnik Xosrov Mirzə Qacardan da teleqram aldı və bu teleqram onun narhatçılığına səbəb oldu. S.Mehmandarov həmin teleqramın məzmununu Ə.Şıxlinskiyə də çatdırdı. Polkovnik Qacar yazırdı: "Düşmən hücumdadır, onun bir topu var. Bütün cəbhə boyu atışma gedir. Birinci hücumu biz dəf etmişik. Partizanlar çox patron məsrəf edirlər və heç də təpərli deyildirlər... Xahiş edirəm şimaldan hücumu başlayın ki, düşmən Qarabağ erməniləri ilə birləşə bilməsin. Cəbrayıl təhlükədədir. Polkovnik şahzadə Qacar" (114, v. 4).

S.Mehmandarov Ə.Şıxlinskidən dərhal Qaryaginlə əlaqə saxlamağı, vəziyyətin nə yerdə olduğunu aydınlaşdırmağı tələb edirdi. Hərbi nazir başa düşə bilmirdi ki, nə üçün polkovnik Xosrov Mirzə Qacar beş piyada bölüyünə, iki batareyaya və iki süvari bölüyündən ibarət bir dəstəyə malik olduğu halda Cəbrayıl təhlükə altında olmalıdır. Bunlardan başqa yerli partizan dəstələri də artıq təşkil edilmişdi. S.Mehmandarov belə mürəkkəb şəraitdə Qaryagin dəstəsinin belə kəsərsiz fəaliyyəti ilə barışa bilmirdi. Onun fikrincə, polkovnik X.Mirzə Qacar təşəbbüskarlıq göstərib qətiyyətli hərəkət etməkdənsə başqalarına göstəriş verməklə məşğul idi. Hərbi nazir patronların mə'nasız yerə məsrəf edilməsini də yolverilməz sayırdı (114, v.4).

Martın 27-də podpolkovnik Qasımbəyovun dəstəsi ilk döyüşə qoşuldu və onu uğurla başa çatdırdı.Güclü döyüşdən sonra Yenikənd və Qaraçinar kəndləri ermənilərdən azad edildi. Əsgərlərdən 15 nəfər yaralanmış, 7 nəfər isə şəhid olmuşdu. (114, v.8).

Martın 27-də 1-ci Tatar süvari alayının komandiri podpolkovnik Sofiyev şəxsi hey'ətlə Yevlaxdan Qarabağa doğru yola düşməzdən əvvəl Gəncəyə gəlib hərbi nazir S. Mehmandarovla görüşmüş və icra edəcəyi tapşırıqları bir daha dəqiqləşdirmişdi (114, v.10). Martın 28-də isə S. Mehmandarov artıq Qazaxda idi və bu bölgənin müdafiəsinin təşkili ilə məşğul idi. Ə. Şıxlinskiyə göndərdiyi məktubunda bildirirdi ki, Gəncədə yalnız şəhərin müdafiəsinin təşkilinə kifayət edəcək qədər qüvvə saxlanılmışdır. Qalanlar isə döyüş tapşırıqlarının icrasına göndərilmişdi. Nazir narahat idi ki, 1-ci piyada diviziyasının komandiri general-mayor C.Şıxlinski xəstə olduğundan bölgədə təcrübəli rəhbər kadr yox idi. Ona görə də S.Mehmandarov Ə.Şıxlinskidən Gəncə, Qazax və Şamxor qəzalarının İstehkamat hissəsinin rəisi tə'yin edilmiş general-mayor Makeyevi tə'cili tapıb Gəncəyə göndərməyi tələb edirdi. Hərbi nazir elə ayın 28-də Ağstafada da olmuş və burada da müdafiənin təşkili ilə tanış olduqdan sonra Gəncəyə qayıtmışdı (114, v.8).

Bütünlükdə hərbi nazir qərb bölgəsində sərhədlərin müdafiəsinin təşkilindən tam razı deyildi. Sonradan o, Ə. Şıxlınskiyə göndərdiyi teleqramında Tovuza digər bir zirehli qatarın göndərilməsi barədə göstəriş vermişdi. Bununla da bölgədə iki zirehli qatar olmalı idi: biri Tovuzda, o biri isə Ağstafada. S.Mehmandarov eyni zamanda bütün hissələri müharibə dövrünün ştatlarına uyğun yenidən qurulmasını, onların tərkibinin artırılmasını məqsədəuyğun bilirdi (114, v.10).

Martın 28-də podpolkovnik Qasımbəyovun dəstəsi yerləşdiyi istiqamətdə düşmənə yeni bir zərbə vurdu. Azərbaycan döyüşçülərinin güclü hücumunun qarşısını ala bilməyən erməni silahlıları günorta saat 2-də Xarxaput kəndini də tərk etmək məcburiyyətində qaldılar. Böyük qüvvələr çəkib gətirmiş olan ermənilər müqavimət göstərməyə çalışsalar da podpolkovnik Qasımbəyovun zərbələrinin qarşısını almağa qadir deyildi. Tezliklə döyüş erməni Borisı kəndi ətrafına keçirilmişdi. Gün ərzində gedən döyüşlərdə 4 əsgər şəhid olmuş, 10 nəfər isə yaralanmışdı (114, v.10).

Həmin gün Qaryagində partizan dəstələrinin gücü ilə bir neçə kənd azad edilmişdi. Cəbrayıl istiqamətində düşmənin hücumlarının qarşısı alınmışdı. Bu istiqamətdə düşmən qüvvələrinin toplaşması müşahidə olunmuşdu. Tərtər istiqamətində qoşun bölmələri tutulmuş olan mövqelərdə möhkəmlənirdilər. Şuşa və Xankənd ətrafında isə vəziyyət nisbətən sakit idi. Alınan kəşfiyyat mə'lumatlarına görə Şuşa və Xankəndinin şimalında, xüsusən də, Ballıca məntəqəsi ətrafında erməni qüvvələri yığılırdı. Gorusa podpolkovnik Qazarovun komandirliyi altında bir piyada alayı gətirilmişdi. Zəngəzurda fəaliyyət göstərən Dronun dəstəsində 7 minədək silahlı toplanmışdı. Əsgəran ətrafında isə Doli Qazarın dəstəsi döyüşürdü. Həmin dəstədə yerli ermənilərlə birlikdə 4 minədək silahlı var idi (114, v.10).

Martın 29-da Azərbaycanın qoşun hissələrinin Əsgəran istiqamətində hücumu başladı. Mə'lum idi ki, bu istiqamətdə düşmənin möhkəmləndirilmiş atəş mövqeləri var idi və onların alınması böyük sə'y və ardıcıllıq tələb edirdi. Daşbaşı kəndindən Naxçıvanik kəndinə kimi olan ərazi xüsusilə möhkəmləndirilmişdi. Ermənilər bura bir ədəd top da çəkib gətirmişdilər. Həmin gün güclü yağışın yağması qoşun hissələrinin hərəkətini xeyli çətinləşdirirdi (114, v.10).

Əsgəranın möhkəmləndirilmiş mövqelərinin tutulması üçün hücum şose yolu boyu Xanabadadək aparılmalı idi. Döyüşə partizan dəstələri də cəlb edilmişdi. Onlar 3360 nömrəli hündürlük istiqamətində hərəkət etməli idilər. Xramort kəndi istiqamətində Parlament mühafizə dəstəsi, Daşbaşı kəndi istiqamətində isə Bakı piyada alayının bölmələri irəliləməli idi. General H. Səlimov bir piyada bölüyünü ehtiyatda saxlamışdı. Bunlardan başqa Naxçıvanik kəndi ətrafında partizanlardan bir dəstəsi nümayişkaranə hücuma qoşulub düşmənin diqqətini özünə cəlb etməli idi. Bakı alayı bölmələrinin sağ cinahının mühafizəsi üçün ora süvari partizan dəstəsi və Tatar süvari alayının bölüyünün yarısı göndərilmişdi. Süvarilərə Həşimbəyov rəhbərlik edirdi. Toplanmış kəşfiyyat mə'lumatlarına uyğun olaraq ermənilərin bütün atəş mövqelərinin zərərsizləşdirilməsi üçün belə bir döyüş planı hazırlanmışdı (114, v.26).

Döyüş səhər saat 7-də başladı. Saat 11-də artıq Xramort kəndi tutulmuşdu. Bu kəndə birinci olaraq Parlament mühafizə dəstəsinin süvarisi podpraporşik Mövsüm İbrahimov üç süvari ilə daxil olaraq düşmənin atəş mövqeyi yerləşmiş evlərə od vurdu. Saat 13-də Parlamentin mühafizə dəstəsi 3360 hündürlüyünə yaxınlaşdı. Partizanlar Xanabadın ətrafını artıq ələ keçirmişdilər. Bakı piyada alayının bölmələri isə hakim təpəliklərlə Daşbaşı yüksəkliyinə xeyli yaxınlaşdılar. Lakin podpolkovnik Nəbibəyovun səhlənkarlığa yol verməsi bu istiqamətdə uğurları genişləndirməyə imkan vermədi. Qarşısından qaçan düşməni tə'qib edərək qoşun bölmələri onlar üçün tə'yin edilmiş döyüş sahəsindən kənara çıxmış və bununla da topların himayəsindən məhrum olmuşdular. Nəticədə onların hərəkəti düşmən dəstələrinin biri tərəfindən dayandırıldı və istifadə edilən əl qumbaraları ilə bölmələrin geri qaytarılmasına nail oldu. Saat 17-də topların yerləri dəyişdirildikdən sonra yenidən həmin qoşun bölmələrinin himayə altına alınması mümkün oldu. Lakin artıq gec idi Bakı alayının bölmələri Daşbaşı yüksəkliyindən xeyli geri çəkilmişdi (114,v.26).

Həşimbəyovun rəhbərliyi altında olan süvarilər də onlara verilən tapşırıqları yerinə yetirə bildilər. Onların igidliyi və sür'ətli hücumu nəticəsində Məşədəli məntəqəsi və Fərrux kəndi ələ keçirildi. Güclü hücumdan sonra qüvvələrini toplayıb irəliyə atılan düşmən dəstələri bə'zi istiqamətlərdə Azərbaycanın qoşun bölmələrinin hərəkətinin qarşısını aldı, bə'zi yerlərdə isə əvvəlki mövqelərin bərpa olunmasına cəhd göstərdilər. Sol cinahda vuruşan erməni dəstələri Əsgərandan əlavə kömək və 2 ədəd pulemyot aldıqdan sonra əks-hücuma keçdi və Xanabaddan Azərbaycan qüvvələrini geri atdı. Buradan geri çəkilən qüvvələrin qarşısını Parlament mühafizə dəstəsinin bir süvari bölüyü ilə general H. Səlimov özü almaq məcburiyyətində qaldı. Günün sonunda Azərbaycan qoşun bölmələri erməni qüvvələrini 2-verst geri çəkilməyə məcbur etdi. General Səlimovun bildirdiyinə görə bə'zi istiqamətlərdə qoşun bölmələri ermənilərin əks-hücumu ilə geri çəkilsələr də döyüşçülərin əhval-ruhiyyəsi mübariz və döyüşkən idi. Topçuların fəaliyyətindən general Səlimov xüsusilə razılıq edirdi. Onların dəqiq atəşləri gün ərzində əldə edilən uğurun əsas tə'minatçılarından biri idi. Döyüşlərin gedişində Parlamentin mühafizə dəstəsindən 7 əsgər şəhid olmuş, 15 əsgər isə yaralanmışdı. 5-ci Bakı piyada alayından praporşik Nəcəfəliyev və daha 16 əsgər şəhid olmuş, podporuçik Dauşvili, praporşiklər Əsgərov və Ərəbov isə yaralanmışdılar. Düşmən tərəfdən itki isə daha çox idi. Təkcə Xramort kəndində ermənilər 60 meyid qoyub getmişdilər.

Bu döyüşün nəticələrini təhlil edərkən H.Səlimov göstərirdi ki, Əsgəranın hər iki tərəfindəki hakim yüksəkliklərdə ermənilərin möhkəmləndirilmiş atəş mövqeləri vardır. Belə bir şəraitdə cəbhənin mərkəzindən Əsgəranı almaq heç də asan olmayacaqdır. Döyüşü uğurla başa çatdırmaq üçün çevik taktika işlədilməli, düşmən qüvvələri əhatə edilməli və ya cinah döyüşlərinə üstünlük verilməlidir. 5-ci Bakı piyada alayının bölmələri

düşmənin sol cinahının əhatə edilməsinə istiqamətləndirilsə də partizanlar belə döyüşlər üçün hazır deyildirlər. Azlıq təşkil edən Bakı alayının bölmələrinin irəliyə hərəkəti topçuların böyük sə'yi ilə mümkün oldu. Piyadalar sayca az olduğu üçün onların irəliyə atdığı hər addım top atəşləri ilə himayə olunurdu ki, bu da çoxlu mərmi israfına səbəb olurdu. Səlimov dağlıq şəraitdə dağ toplarına üstünlük verirdi və bu toplardan da bölgəyə göndərilməsini məqsədəuyğun bilirdi. Onun bildirdiyinə görə Əsgəran ətrafında Dilicandan gəlmiş və çox yaxşı hazırlıq keçmiş Dəli Qazarın dəstəsi vuruşurdu. Bu dəstənin məhv edilməsi üçün qüvvələr nisbətində ciddi dəyişiklik yaradılmasını tələb edirdi (114, v.21-22).

Hərbi nazir S.Mehmandarova göndərdiyi teleqramında da H.Səlimov Əsgəranın alınmamasını partizanların zəif döyüşü ilə əlaqələndirirdi. Onun bildirdiyinə görə partizanlar ardıcıl deyildilər və daha çox lazımsız yerə patron məsrəf edirdilər. H. Səlimov hücumların gücləndirilməsi üçün nazirdən əlavə silahlı qüvvələrin göndərilməsini xahiş edirdi. Nazir isə bununla bağlı martın 30-da Gəncədən Ə.Şıxlinskiyə göstəriş vermişdi ki, Quba alayının Bakıya gələn taborları dərhal Ağdama göndərilsin. H.Səlimovun xahişinə müvafiq olaraq S.Mehmandarov bir dağ top batareyasının da Ağdama yola salınmasını lazım bilirdi (114, v.19).

Mart ayının 30-da S.Mehmandarov Gəncədən Ə.Şıxlinskiyə ikinci bir teleqram göndərdi. Nazir həmin teleqramda bildirirdi ki, respublikada mürəkkəb vəziyyət yarandığı bir vaxtda verilən bütün göstərişlər vaxtında yerinə yetirilməlidir. O, Ə. Şıxlinskidən nazirliyin əməkdaşlarında da belə məs'uliyyət hisslərinin aşılanmasını tələb edirdi. S. Mehmandarovu narahat edən o idi ki, xeyli əvvəl göstəriş verilməsinə baxmayaraq Quba alayının taborları hələ də Qarabağa gəlib çıxmamışdı. Həmin taborlardan ehtiyat qüvvə yaradılması və Tərtər dəstəsinin gücləndirilməsi nəzərdə tutulurdu. Hərbi nazir tə'kidlə vurğulayırdı ki, bu taborların göndərilməsi sür'ətləndirilməli və zərurət yaranardısa şəxsi hey'ət isti paltarla tə'min edilməli idi (114, v.17).

Mövcud olan sənədlərdən aydın olur ki, Quba alayının taborları Qarabağa martın 31-də çatmışdı. Ancaq bu taborların tərkibi, şəxsi hey'ətinin sayı və hazırlıq səviyyəsi barədə verilən mə'lumatlar hərbi nazirin daha bir narahatçılığına səbəb oldu. 2 tabor əvəzinə Qarabağa cəmi 375 nəfər gəlib çıxmışdı. Göndərilənlərdən 300 nəfəri isə səhhətinin zəifliyi üzündən Bakıda saxlanmışdı. Verilən döyüş tapşırığının icrasına belə məs'uliyyətsiz münasibəti S.Mehmandarov dözülməz bir hal kimi qiymətləndirirdi. Ə.Şıxlinskiyə göndərdiyi teleqramında S. Mehmandarov bildirirdi ki, Quba alayının komandiri polkovnik Ququşevin xidmətə münasibəti onu heç vaxt qane etməmişdir. Alayın saxlanılması üçün milyonlarla vəsait xərclənirdi. Ancaq döyüş tapşırıqlarını yerinə yetirmək lazım gələndə aydın olmuşdu ki, alay ancaq kağız üzərində mövcuddur. Nazirin aldığı mə'lumata görə polkovnik Ququşev həmin vaxt Bakıda mə'zuniyyətdə idi. O, Ə. Şıxlinskidən tələb edirdi ki, əgər bu mə'lumat doğrudursa dərhal onu tapdırsın, alayın vəziyyəti barədə ondan izahat alınsın və yenidən Qusara vəzifəsinin icrasına göndərilsin. Polkovnik Ququşev Qusarın mühafizəsi üçün bir bölük saxlamalı və alayın digər bütün şəxsi hey'ətini toplayıb Qarabağa, döyüş bölgəsinə yola düşməli idi. Aprelin 1-də göndərilmiş olan bu teleqramın sonunda S. Mehmandarov bildirirdi ki, Yevlaxdan yenicə qayıtmışdır və səhhəti yenidən korlanmışdır (114, v.22).

Xəstələnməsinə baxmayaraq S.Mehmandarov bölgədə qalaraq Azərbaycan torpaqlarının müdafiəsinin təşkilinə rəhbərliyi davam etdirirdi. Onun göstərişi ilə Bakıdan H.Səlimovun sərəncamına bir ədəd zirehli avtomobil də göndərilmişdi. Lakin bu avtomobil Bərdə yaxınlığında xarab olub yolda qalmışdı. H.Səlimov xahiş edirdi ki, "Zorab" adlandırılan digər zirehli avtomobil Qarabağa göndərilsin (114, v.20).

Mövcud olan bütün çətinliklərə baxmayaraq Qarabağda olan nizami və qeyri-nizami qüvvələrin köməyi ilə gərginliyin artmasının qarşısı alınmışdı. Erməni silahlı qüvvələri bir çox istiqamətdə güclü mövqelərə malik olsalar da, onların yeni əraziləri və məntəqələri işğalını davam etdirmək cəhdlərinin qarşısı alınmışdı. Martın sonuncu günlərində Tərtər istiqamətində vəziyyət nəzarət altında idi.Şuşa ətrafında və Cəbrayıl istiqamətində nisbi sakitlik yaranmışdı (114, v.24). Alınan kəşfiyyat mə'lumatlarına görə yaxın vaxtlarda Dronun rəhbərliyi altında olan erməni qüvvələrinin Şuşa üzərinə hücumu gözlənilirdi. Həmin hücumun zərbə qüvvəsini zəiflətmək üçün general Səlimov Cavad qəzası süvarilərinin iştirakı ilə Cəbrayıl istiqamətindən erməni qüvvələrinə təzyiqin gücləndirilməsini məqsədəuyğun bilirdi. Onun fikrincə, Şahsevən süvarilərinin Zəngilan qəzasından həyata keçiriləcək hücumu da ermənilərin qüvvəsinin parçalanmasına səbəb ola bilərdi (415, v.21).

Bütün bunlarla bərabər general H.Səlimovun əsas diqqəti Əsgəran istiqamətində düşmənə güclü zərbə vurulmasına, Əsgəranın azad edilməsinə yönəlmişdi. Bu məntəqənin azad edilməsi Xankəndi və Şuşaya gedən yolların açılması demək idi. Həm də Əsgəranda düşmənin daha güclü atəş mövqeləri var idi. Həmin mövqelərin məhv edilməsi Qarabağda gərginliyin xeyli səngiməsinə səbəb ola bilərdi.

Səlimovun Hərbi Nazirliyə göndərdiyi raportlarından aydın olur ki, Əsgəran istiqamətində növbəti hücumun həyata keçirilməsi üçün lazımi hazırlıq işləri görülürdü (114, v.21). Aprelin 2-də Ağdama Zaqatala piyada alayının, Şirvan alayının və Tərtər süvari alayının hissə və bölmələri gəlib çıxdı. Bu da Ağdam dəstəsinin xeyli möhkəmlənməsinə imkan verdi (114, v.23). Əlavə nizami qüvvələrlə möhkəmləndirilən Ağdam dəstəsi aprel ayının 3-də yenidən Əsgəran istiqamətində hücuma başladı. Erməni silahlı qüvvələri bütün imkanlarını səfərbərliyə alıb əvvəlki hücumda

olduğu kimi Ağdam dəstəsinin qarşısını almağa çalışsalar da gərgin şəraitdə keçən döyüş Azərbaycanın qoşun bölmələrinin böyük uğuru ilə nəticələndı. Xeyli tələfat verən düşmən əvvəlcə Əsgəranı, sonra da Xocalını tərk etməli oldu. Bölgədə strateji əhəmiyyətə malik olan bu iki məntəqə Ağdam dəstəsi tərəfindən azad edildilər (57, v.39). Döyüşlərin gedişində erməni dəstələrinin rəhbəri Dəli Qazar öldürüldü (20, N 4-5, 1994, s.101).

Ağdam dəstəsi gün ərzində təkcə Əsgəran və Xocalının təmizlənməsi ilə kifayətlənmədi. Uğurlu hücumu davam etdirən dəstə bir neçə kəndi də azad edərək günortadan sonra, saat 4-də Azərbaycanın qoşun bölmələri Ağdam-Əsgəran yolunun kənarında yerləşən Kətik, Aranzəmin və Naxçıvanik kimi möhkəmləndirilmiş məntəqələrini də erməni qüvvələrindən azad etdilər və Malıbəyli kəndinə yaxınlaşdılar (114, v.47).

Döyüşdə qazandığı uğurlara görə artıq polkovnik rütbəsinə layiq görülmüş olan Qasımbəyovun dəstəsi aprelin 3-də Talış kəndi üzərinə hücuma keçdi. Bu kənd ətrafında da düşmənin çox güclü atəş mövqeləri var idi. Göstərilən bütün sə'ylər lazımi nəticə vermədi. Polkovnik Qasımbəyovun dəstəsi itkilər verərək geri çəkilməli oldu (114, v.29).

Tərtər istiqamətində isə 3-cü Şəki süvari alayının bölmələri daha bir uğur qazanıb Levonarx kəndini erməni silahlı qüvvələrindən azad etdilər (114, v.30). Aprelin 5-də növbəti döyüşdən sonra Talış kəndi də düşmənlərdən təmizləndi. Polkovnik Qasımbəyovun dəstəsi irəliyə doğru hərəkətini davam etdirərək daha əhəmiyyətli və əlverişli olan döyüş mövqelərinə çıxdılar (114, v.34).

Əsgəran ətrafında uğursuzluğa düçar olan düşmən qüvvələri geri çəkilərək Malıbəyli-Daşkənd yüksəklikləri və Şuşikənd arasında toplaşmışdılar. Ətraf kəndlərdə olan erməni silahlı dəstələri də bura axışaraq böyük bir zərbə qüvvəsi yaratmışdılar. Bu dəstənin sərəncamında 3 ədəd dağ topu və 2 ədəd pulemyot var idi. Dəstədə birləşən silahlıların sayı 2 min nəfərdən yuxarı idi. Onlar vaxtaşırı Şuşa-Xankənd şose yolunu gülləyə tutur və bu yolu nəzarət altında saxlamağa çalışırdılar. Şuşa və Xankəndi, eləcə də Şuşa-Xocalı-Əsgəran-Ağdam arasında əlaqələrin normal hala salınması bu yol üzərində mövcud olan təhlükənin aradan qaldırılmasını tələb edirdi. Bu məqsədlə də aprel ayının 5-də Ağdam dəstəsi Şuşikənd istiqamətindəki erməni mövqeləri üzərinə hücuma keçdi. Səhər saat 10-da başlayan hücum üç istiqamətdə həyata keçirilirdi. Cəbhənin mərkəzində 4-cü Quba piyada alayının bölmələri döyüşürdülər. Sağ cinahda Malıbəyli kəndini ötüb keçərək Şuşikəndin şərqindəki yüksəkliklərə doğru Tatar süvari alayının bölmələri irəliləyirdi. Sol cinahdan isə – Şuşikənd qəbrıstanlığı istiqamətindən kəsə yolla Bakı piyada alayının bir taboru hücum edirdi. General Səlimovun verdiyi mə'lumata görə qoşun bölmələri döyüşlərdə bərkiyib möhkəmlənmiş bölmələrə xas olan sonsuz bir igidliklə vuruşurdular. Cəbhənin mərkəzində qərar tutmasına baxmayaraq Quba alayının bölmələri bir göz qırpımında Daşkənd yüksəkliklərini ələ keçirdilər. Nəbibəyovun komandirliyi altında olan batareyanın topçuları isə düşmənə dinclik vermədilər, dəqiq atəşləri ilə onun bütün mövqelərini məhv etdilər. Saat 12-də cinahlarda vuruşan bölmələr düşməni mühasirəyə almağa başladılar. Ehtiyatda saxlanılan bölmələrlə hücumun gücləndirilməsi ermənilərin tamamilə nəfəsini kəsdi və onlar sür'ətlə Keşişkənd istiqamətinə qaçıb dağıldılar. Saat 20-də döyüşü uğurla başa vuran hissə və bölmələr Şuşaya gəlib çıxdılar (114, v.40).

Üç gün davam edən ağır döyüşlərdə yorulmuş olan bölmələrə istirahət verildi. Şuşikənd və Daşkənd ətrafına mühafizə postları qoyuldu. Aprelin 8-də erməni silahlı dəstələri Şuşikənd və Daşkənd üzərinə hücuma başladılar. Onlar güman edirdilər ki, azsaylı mühafizə postlarının müqavimətini qıraraq yenidən Şuşıkəndi və Daşkəndi ələ keçirə biləcəklər. Düşmənin hücumu barədə xəbər alınan kimi Bakı piyada alayının bölmələri mühafizə postlarının köməyinə göndərildi. Xeyli çəkən döyüşdən sonra erməni qüvvələri növbəti ağır zərbəni alıb Keşişkəndə doğru qaçdılar. Şuşikənd ətrafındakı və Keşişkənd yaxınlığındakı bütün hakim yüksəkliklər Azərbaycanın qoşun bölmələrinin əlinə keçdi. Əlavə olaraq Daşaltı kəndi də ermənilərdən azad edildi. Erməni hücumlarının təkrarlana biləcəyindən ehtiyat edildiyi üçün bölmələrin elə döyüş mövqelərində gecələməsi qərara alındı. Bu döyüşün gedişi ilə bağlı general Səlimovun verdiyi mə'lumatda daha sonra bildirilirdi ki, Cəbrayıl istiqamətində də düşmənin Poryaşen mövqeləri ələ keçirilmişdir. Qoçaz istiqamətində vəziyyət sakitlik idi. Polkovnik Qasımbəyovun dəstəsi isə Gəncəyə çağırılmışdı (114, v.44).

General Səlimovun mə'lumatında polkovnik Qasımbəyovun dəstəsinin Gəncəyə çağırılmasının səbəbləri barədə mə'lumat verilmirdi. Çox güman ki, bu polkovnik Qasımbəyovun dəstəsinin fəaliyyət göstərdiyi sahədə döyüş tapşırıqlarının uğurla yerinə yetirilməsi və Qazax-Ağstafa istiqamətində müdafiə qüvvələrinin möhkəmləndirilməsi zərurəti ilə bağlı idi. Qarabağda olduğu kimi ermənilər bu istiqamətdə, o cümlədən Gəncə ətrafında təcavüzkarlığı genişləndirməyə cəhd göstərirdilər. Aprelin 5-də onlar Qazax istiqamətində Tatlı kəndinə hücum etdilər. Səhər saat 5-də başlanan bu hücum 2 saat davam etdi. Erməni silahlıları kəndə xeyli yaxınlaşa bilsələr də onun müdafiəçilərinin müqavimətini qıra bilmədilər və geri çəkilmək məcburiyyətində qaldılar (114, v.31).

Elə həmin gün azərbaycanlı partizanlar Çaykənd və Azad kəndlərində cəmlənmiş olan 1000 nəfərlik erməni silahlı bölmələrinin üzərinə hücum etdilər. Azərbaycan partizanları sayca üstünlük təşkil etsələr də, ciddi bir hərbi nizama malik deyildilər. Ona görə də ermənilərin cavab zərbəsinə davam gətirə bilmədilər. Əvəzində əks-hücuma keçən ermənilər Hacıkəndin cənubundakı yoxuşu ələ keçirdilər (114, v.31).

Qaxaz-Tovuz istiqamətində ermənilərin 2 minlik silahlı qüvvəsi toplanmışdı. Bu qüvvələrin arasında nizami qoşun bölmələri də var idi. Aprelin 6-da həmin qüvvələr sərhəddə yerləşən Yaradulla kəndinə basqın etdilər. Səhər saat 5-də başlanan bu basqının gedişində kənd tamamilə talan edildi, əhalinin üçdən biri öldürüldü. Bu vəhşiliklərdən daha da ruhlanan ermənilər Tatlı kəndi üzərinə də hücum etdilər. Bir gün əvvəl buradakı uğursuzluğun əvəzini çıxmağa çalışan ermənilər Tatlını da talan etməyə cəhd göstərsələr də yerli əhali və ətraf kəndlərdən axışıb gələn könüllülər onların qarşısını aldılar və kəndə girməyə imkan vermədilər. Ermənilər geri çəkilib Yaradulla kəndində toplaşdılar (114, v.33).

Qaxaz-Tovuz istiqamətində ermənilər daha dar sahədə fəaliyyət göstərir və qüvvələrin səpələnməsinə imkan vermirdilər. Bu məqsədlə onlar buradakı bütün qüvvələrini səfərbər edib bir istiqamətdə hucuma keçir və Azərbaycan qüvvələrinə ixtyarında olan bütün vəsaitlərdən istifadə edərək ağır zərbə endirməyə çalışırdılar.

Tatlı kəndi üzərinə ikinci hücumları da boşa çıxan ermənilər Yaradulla kəndinə yeni qüvvələr çəkib gətirdilər. Aprelin 7-də ermənilər bütün qüvvələrini səfərbər edib yenidən Tatlı kəndinə doğru üz tutdular. Bu dəfə kəndin müdafiə qüvvələri çoxsaylı ermənilərin qarşısını saxlaya bilmədilər. Ermənilər həm Tatlını, həm də Möhnəqışla kəndini ələ keçirib talan etdilər. Yerli hakimiyyət orqanları erməni qüvvələrinə rəhbərlik edən general Bağdasarov və polkovnik Mnatsakanovla danışıqlar aparıb atəşin dayandırılması barədə razılaşma əldə etsə də buna riayət olunmadı. Öz xisəltinə sadiq qalan ermənilər burada da danışıqlardan yalnız qüvvələrinin bərpası, əlavə qüvvələrin gətirilməsi üçün fürsət kimi istifadə edirdilər. Qazax-Tovuz istiamətində nizami qoşun bölmələrinin olması, dağ toplarından istifadə edilməsi müvafiq müdafiə tədbirlərinin həyata keçirilməsini tələb edirdi. Gəncə general-qubernatoru Xan Xoyski də Hərbi Nazirliyə göndərdiyi teleqramlarda bu məsələni xüsusilə vurğulayırdı. (114, v.37).

Sonrakı günlərdə ermənilər Qazaxda Qaraqaya dağını tutdular. Sonra Əskipara və Kəmərli istiqamətində hücumu davam etdirməyə cəhd göstərdilər. Lakin ciddi müqavimətlə rastlaşıb geri çəkildilər (114, v.44).

Aprelin 9-da Ermənistan nümayəndələri ilə yenidən danışıqlar aparıldı. Qazax-Tovuz istiqamətində atəşin dayandırılması, pozulmuş sərhədlərin bərpa edilməsi razılaşdırıldı, mübahisəli məsələlərin qarşılıqlı danışıqlar əsasında həll edilməsi qərara alındı. Lakin ermənilərin təqsiri üzündən bu razılaşmaya da riayət olunmadı və sərhəd bölgəsində döyüşlər yenidən qızışdı. Aprelin 12-də düşmən 2 dəfə Saltımış dağına hücum etdi və hər iki dəfə uğursuzluğa düçar oldu. Axşama yaxın Kəmərli üzərinə hücum da gözlənilən nəticəni vermədi. Ancaq ermənilər sakitləşmək bilmirdilər. Sonrakı gün onların davam edən hücumları Sofulu və Barxudarlı kəndlərinin yandırılması ilə başa çatdı (114, v. 48, 50).



Aprelin 9-dan 12-dək Şuşa yaxınlığındakı Keşişkənd ətrafında da gərgin döyüşlər baş verdi. Bu döyüşlər Qarabağdakı erməni qüvvələrinin ən ciddi və ən möhkəmləndirilmiş bazasını məhv etdi. Ən'ənəvi olaraq bura ermənilər üçün xüsusi əhəmiyyət kəsb edən bir məntəqə idi. Çünki təbii şərait Keşişkənd ətrafında uzun müddət uğurlu müdafiə döyüşləri aparmağa imkan verirdi. Bütün əlverişli nöqtələr ermənilərin əlində idi. Əsgəran istiqamətindən geri çəkilən qüvvələr burada cəmləşmişdilər. Döyüşün uğurlu qurtarmasını tə'min etmək üçün Cəbrayıl və Zəngəzurdan da bura xeyli erməni qüvvəsi gətirilmişdi. Erməni silahlılarının ümumi sayı üç minə qədər idi. Onların tərkibində 2 ədəd topu və 8 ədəd pulemyotu olan 2 nizamı tabor da var idi. Belə bir qüvvə ilə döyüşə girən ermənilər uğur qazanacaqlarına, Şuşa-Xankənd yolunu yenidən nəzarət altına almaqla Azərbaycanın qoşun bölmələrini Şuşaya sıxışdıracaqlarına şübhə etmirdilər. 1918-ci ildə bu ərazidə türk qoşun bölmələrinin hücumunun qarşısının alınması da ermənilərdə Keşişkənd mövqelərinin məğlubedilməzliyi təsəvvürü yaratmışdı (bax: 114, v.51).

Aprelin 9-da Azərbaycanın qoşun bölmələri tərəfindən Şuşikənd ətrafındakı yüksəkliklərin əksəriyyəti ələ keçirildi. Burada yalnız bir yüksəklik tutulmamışdı. Həmin yüksəklikdən də Keşişkəndə gedən yol keçirdi. Bu yüksəklik tutulmadan Keşişkəndə doğru irəliləmək mümkün deyildi. Ona görə də ayın 10-da əsas diqqət məhz bu yüksəkliyin tutulmasına yönəldildi. Yüksəkliyin tutulması Quba piyada alayının taboruna tapşırıldı. Ayın 10-da həyata keçirilən hücumla Quba alayının döyüşçüləri qısa müddət ərzində Keşişkənd yolu keçən yüksəkliyi ələ keçirdilər. Lakin onlar yüksəklikdə dayanmayıb geri çəkilən düşmənin tə'qibinə başladılar. Nəticədə erməni qüvvələrinin güclü cinah atəşlərinin altına düşdülər. Bu da Quba alayının xeyli itki verməsinə gətirib çıxardı. Döyüş bölgəsinə gələn general Səlimov dərhal qubalıların geri çəkilməsi barədə əmr verdi və bölmələr ayın 10-da səhər dayandıqları ilkin mövqelərə qayıtdılar.

Aprelin 10-da Quba alayının canlı itki verərək geri çəkilməsi digər qoşun bölmələrinin şəxsi hey'ətinin mə'nəvi əhval-ruhiyyəsinə mənfi tə'sir göstərmişdi. Ermənilər isə əksinə ayın 10-dakı döyüşün nəticələrindən ruhlanaraq ayın 11-də hücuma qoşuldular. Onlar Daşaltı yüksəklikləri tərəfindən Azərbaycanın qoşun bölmələrinin sağ cinahına hücum etdilər. Səlimovun əmri ilə ümumi ehtiyat qüvvələrdən iki bölüyün irəli hərəkəti ermənilərin hücumunun qarşısını aldı və onları geri çəkilməyə məcbur etdi. Bir neçə tüfəng qənimət kimi ələ keçirildi. Elə həmin gün 1-ci Cavanşir piyada alayının tə'lim komandası səhər çağı Quba alayı döyüşçülərinin tərk etdiyi yüksəkliyə hücum etdi. Böyük sür'ətlə həyata keçirilən bu hücumla tə'lim komandasının döyüşçüləri ermənilərə ciddi itki yetirib yüksəkliyi ələ keçirdi. Eyni zamanda ermənilərdən 10 min mauzer patronu və çoxlu pulemyot təchizatı da qənimət götürüldü. Az sonra Cavanşir

alayının kəşfiyyatçıları bu alayın taborunun cinahını əhatə etmək istəyən erməni dəstəsinə güclü zərbə endirdi və onu geri çəkilməyə məcbur etdi. Canlarını qaçmaqla xilas etməyə çalışan ermənilər döyüş meydanında çoxlu ingilis patronu qoymuşdular. Döyüş meydanının üç nöqtəsində ermənilərin güclü zərbə alması Azərbaycan döyüşçülərinin əhval-ruhiyyəsini xeyli qaldırmışdı. Səlimov qeyd edirdi ki, qoşun bölmələrində döyüşkən əhval-ruhiyyənin yaranmasını, habelə Əsgərandan Şirvan piyada alayının 2 bölüyünün gətirilməsini nəzərə alaraq hücumun davam etdirilməsini qərara aldı. Onun yazdıqlarına görə, nəyin bahasına olursa olsun Keşişkəndi tutmaq qərarı bütün döyüşçülər tərəfindən qızğınlıqla müdafiə olundu.

Keşişkənd üzərinə hücum aşağıdakı şəkildə təşkil edilmişdi. 1-ci Tatar süvari alayı süvarı tə'lim bölüyü ilə Krasnı kəndindən keçərək Keşişkəndi ötüb onun yuxarısındakı 5326-cı yüksəkliyi tutmalı idi. Polkovnik Əfəndiyevə göstəriş verildi ki, bir bölük piyada və Ağdam partizanları ilə Əsgəran istiqamətindən Kətik və Dəhraza, oradan da Mirikəndə doğru hücum etsin. Bu istiqamətdən döyüşün başlanmasında məqsəd adları çəkilən kəndlərin əhalisinin diqqətini yayındırmaq və onların Keşişkəndə kömək göndərmələrinin qarşısını almaq idi. Döyüş meydanının şərq hissəsindən isə Cavanşir piyada alayının bir taboru və Bakı piyada alayının üç bölüyü hücuma qoşulmalı idi. Cəbhənin qalan sahələrində qoşun bölmələri fəal müdafiədə dayanmalı idilər.

General-mayor Səlimovun qeydlərinə görə Keşişkənd ətrafında baş verən döyüş ən gərgin və ən qanlı döyüş idi. Ermənilər bütün qüvvələrini və imkanlarını sərf etmişdilər. Onlar nəyin bahasına olursa-olsun Keşişkəndi qorumağa çalışırdılar. Azərbaycanın qoşun hissələri isə Keşişkəndin strateji əhəmiyyətini anlayaraq bir addım da olsa geri çəkilmək fikrində deyildilər. Erməni qüvvələri əlverişli mövqelərdə qərar tutsalar da onların atəşləri Azərbaycan döyüşçülərinin əzmini və iradəsini qıra bilmədi. Ağdam dəstəsinin qərargah rəisi polkovnik Zeynalovun öz xətdə döyüşçüləri ruhlandırması, onları irəliyə səsləməsi qoşun bölmələrinin mübariz ruhunu daha da artırdı və saat 10-da Keşişkənd artıq təcavüzkar qüvvələrdən tamamilə təmizlənmişdi. Quba alayının kəşfiyyatçıları və 1-ci Cavanşir piyada alayının 9-cu bölüyü hamıdan qabaq Keşişkəndə daxil oldular. Dəstə komandiri bu böyük uğurun qazanılmasında Cavanşir alayının komandiri, polkovnik Levestamın və 7-ci Şirvan piyada alayının komandiri podpolkovnik Rəfibəyovun xidmətlərini xüsusi olaraq qiymətləndirirdi. Səlimovun yazdığına görə polkovnik Levestam onun bölmələrinə tapşırılan sahədə revolveri əlinə alıb hamıdan qabaqda gedirdi və öz döyüşçülərini də bu çətin döyüşə aparırdı. General Səlimov eyni zamanda topçuların fəaliyyətindən də razılıq edirdi. Onların dəqiq və səmərəli atəşləri piyadaların dönmədən irəliləməsinə zəmin yaradırdı.



Ermənilər böyük itki verərək Keşişkənddən qaçıb dağıldılar. Aprelin 13-də general Səlimov qoşun bölmələrini Şuşaya çəkərək onlara istirahət verdi (bax: 114, v.51).

Martın 22-dən başlayaraq davam edən döyüşlər qoşun bölmələrini yormaqla bərabər onlara müəyyən maddi və canlı itkilər də vermişdi. Döyüşlərin davam etdirilməsi bu itkilərin bərpa olunmasını tələb edirdi. Keşişkənd ətrafında erməni qüvvələri güclü zərbə alsalar da tamamilə məhv edilməmişdilər. Xırda qruplarda birləşərək onlar Azərbaycan mövqeləri üzərinə öz hücumlarını davam etdirirdilər. Belə hücumların qarşısının qətiyyətlə alınması üçün qoşun bölmələrinin hərtərəfli tə'min və təchiz edilməsi günün zəruri məsələsinə çevirilirdi.

General Səlimov tə'minat məsələlərinin lazımi şəkildə həll olunmamasından şikayət edirdi. Döyüşçülər üçün şal çatışmırdı, ayaqqabıları dağlarda tezliklə sıradan çıxdığından onların əvəz edilməsinə ehtiyac yaranırdı (114, v.52-53).

Canlı qüvvələrin bərpası da mühüm məsələlərdən biri idi. Hərbi Nazirliyə göndərdiyi teleqramlarında əlavə zabitlərin və heç olmasa 2 və ya 3 həftəlik hazırlıq keçmiş əsgər qüvvəsinin göndərilməsini xahiş edirdi (114, v.58).

Keşişkənd döyüşündən sonra bölgədə olan hissələrin şəxsi hey'ətinin sayı aşağıdakı şəkildə idi: Bakı piyada alayının – 300 nəfər, Cavanşir piyada alayının – 120 nəfər, Quba piyada alayının – 400 nəfər, Ağdaş piyada alayının – 400 nəfər, Şirvan piyada alayından olan bölüyün – 160 nəfər, Tatar süvari alayının – 380 nəfər Qarabağ süvari alayının – 250 nəfər. Cəbrayıl istiqamətində olan Gəncə piyada alayının – 400 nəfər, Şəki süvari alayının isə – 200 nəfər döyüşçüsü var idi. Bu qüvvələr aşağıdakı şəkildə qruplaşdırılmışdılar: Tərtər istiqamətində Şəki süvari alayı və 2 ədəd top, Qoçaz istiqamətində Cavanşir piyada alayı, 4 ədəd dağ topu və Sultan bəyin rəhbərliyi altında 1000 nəfərlik kürd partizan, Şuşada ehtiyat qüvvə kimi Bakı piyada alayı, Şirvan piyada alayının bir bölüyü, 4 ədəd yüngül top və 4 ədəd qaubitsa, Xankəndində Quba piyada alayının bir taboru və 2 ədəd topa malik olan Qarabağ süvari alayı, Əsgəranda Ağdaş piyada alayının bir taboru və dağ-süvari taqımı, Cəbrayıl istiqamətində Gəncə piyada alayının bir taboru, Tatar süvari alayı, 2 ədəd yüngül top, 4 ədəd dağ topu və Xəlil paşanın partizanları dayanmışdı. Bu qüvvələri yenidən qruplaşdırdıqdan sonra general Səlimov Zəngəzur istiqamətində hücumu davam etdirməyi planlaşdırırdı. Yalnız nizami qüvvələrin gücü ilə aparılması nəzərdə tutulan bu hücumun aprelin 20-si ərəfəsində başlanacağı güman edilirdi (114, v.59).

Ancaq Hərbi Nazirliyin rəhbərliyi Qarabağa nəinki canlı qüvvə göndərmək imkanına malik deyildi, əksinə Qırmızı ordunun şimal sərhədlərinə yaxınlaşması ilə buranın möhkəmləndirilməsi üçün Qarabağdan qüvvə

götürülməsinin mümkünlüyü öyrənilirdi. Aprelin 16-da hərbi nazirə göndərdiyi teleqramında general Səlimov bildirirdi ki, Şuşa və Xankəndi ətrafında xırda dəstələrdə birləşmiş olan erməni silahlıları sakitləşmək bilmirlər. Belə vəziyyətdə Qarabağdakı qüvvələrin zəifləndilməsi arzuolunmaz nəticələrə gətirib çıxara bilərdi. General Səlimov teleqramında daha sonra yazırdı: "Siyasi vəziyyət şübhəsiz ki, Sizin üçün daha aydındır. Ancaq cəsarət edərək öz fikrimi bildirirəm ki, biz iki cəbhədə müharibə apara bilmərik və belə mübarizənin nəticələri bizim üçün çox pis ola bilər. Qəti hücuma keçmək üçün əlavə köməyin göndərilməsini xahiş etmək istərdim. Cəbrayıl dəstəsini möhkəmləndirmək üçün mənim indi heç nəyim yoxdur" (114, v.60).

Bolşevik qoşunları Azərbaycanın şimal sərhədlərinə yaxınlaşdıqca erməni silahlı dəstələrinin fəallığı da artırdı. Geniş cəbhədə Azərbaycanın qoşun bölmələrinin təzyiqinə davam gətirməyən erməni silahlıları ailələrini Zəngəzura köçürüb kiçik dəstələrlə Azərbaycan kəndlərinin üzərinə hücum edirdilər. Onların partizan taktikasının qarşısını almaq qoşun bölmələri üçün heç də həmişə mümkün olmadığı üçün yerli əhali arasında da bir qorxu və təlaş var idi. Aprelin 19-da Bakıya göndərdiyi teleqramında general Səlimov ermənilərin bu taktikasının qarşısının alınması üçün də canlı qüvvənin, silah və sursatın ayrılmasını xahiş edirdi (114, v.62).

Xüsusilə daha çox narahatçılıq və təşviş doğuran Cəbrayıl istiqamətində müdafiə qüvvələrinin möhkəmləndirilməsi üçün ən azı sayı min nəfərə çatan 2 piyada taborunun göndərilməsi tələb olunurdu (114, v.63). Canlı qüvvəyə olan ehtiyacın aradan qaldırılması üçün H.Səlimov aprelin 2-ci yarısında Şuşa qəzasında səfərbərliyin keçirilməsi barədə əmr verdi. (Bu əmrə əsasən 30 yaşınadək olan yerli əhali xidmətə şamil olunurdu (114, v.66).

Bundan başqa general H.Səlimovun bölgədə olan türk generalı Nuru paşa ilə şəxsi görüşündə aydın olmuşdu ki, Bakıda, Ağdamda, Gəncədə vaxtilə Denikin ordusunda xidmət etmiş 400-dək azərbaycanlı və müsəlman yaşayır. H.Səlimov Hərbi Nazirliyin rəhbərliyindən xahiş edirdi ki, erməni təcavüzünə qarşı vuruşmağa hazır olan bu şəxslərin toplanıb Ağdama göndərilməsinə köməklik göstərilsin (114, v.69).

Azərbaycanın müdafiə qüvvələrinin Qarabağda sayca azalmasından erməni silahlı dəstələri hər vasitə ilə istifadə etməyə çalışırdılar. Keşişkənd döyüşündən sonra Azərbaycanın bolşevik işğalına qədər olan müddətdə Ağdam dəstəsinin fəaliyyəti də əsasən müxtəlif məntəqələrdə fəallaşan erməni silahlı dəstələrinin susdurulması ilə bağlı idi. Aprelin 18-dən 19-a keçən gecə erməni silahlı dəstələri Qaybalı kəndinə daxil olaraq onun bir hissəsini yandırdılar. Bu hadisənin baş verməsində kəndi qoruyan Nuxa partizanlarının da günahı var idi. Onlar intizamsızlıq göstərərək aprelin 18-də heç kimlə razılaşdırmadan kənddəki müdafiə mövqelərini tərk edib getmişdilər. Bundan ermənilər dərhal istifadə etmiş və gecə ikən kəndə soxulmuşdular. Ayın 19-da general Səlimov Ağdama gələrək Hərbi səhra məhkəməsi təşkil etmiş və özbaşına döyüş mövqelərini tərk edən partizanları bu məhkəməyə vermişdi. Hadisə ilə bağlı Hərbi Nazirliyə göndərdiyi mə'lumatdan aydın olur ki, ermənilər Güləblıya soxulanda Ağdamda 2 minədək könüllü silahlı var idi. Onların heç biri güləblıların köməyinə yetmək barədə əməli addım atmamışdı. General Səlimovun yazdığına görə, bu silahlılar nəinki Güləblıya kömək göndərməmiş, əksinə özləri də 2-3 yüz erməninin hücumu xəbərindən təlaş və vahimə içində çaşıb qalmışdılar. Kəndin müdafiəsinin möhkəmləndirilməsi üçün qoşun bölmələri Gizır yüksəkliyini ələ keçirib erməni silahlılarını Abdala doğru qovmağa başladılar (114, v.65).

Aprelin 24-də səhər tezdən 60 nəfərlik erməni silahlı dəstəsi Şuşikəndin şimal-qərbindəki yüksəkliklərdə yerləşən çöl qarovul postlarına hücum etdi. Tezliklə bu hücum dəf edildi Elə həmin gün erməni silahlıları Kətik kəndi yaxınlığındakı yüksəkliklərdə olan mövqelərə də hücum etdilər. Burada da onlar Azərbaycan döyüşçülərinin iradəsini qıra bilmədilər (114, v.72).

Aprelin 27-də Hərbi Nazirliyə göndərdiyi teleqramda H.Səlimov bildirirdi ki, onun dəstəsində qalan qüvvə yalnız Şuşa-Ağdam yolunu qorumağa çatır. Həmin gün Bakıya göndərdiyi digər bir teleqramında isə general H.Səlimov çətin vəziyyətdə olduğunu xatırladıb soruşurdu ki, ixtiyarında olan qüvvə ilə Zəngəzura doğru hərəkət etsin ya yox? 1919-cu il noyabrın 23-dək Zəngəzurda mövcud olan vəziyyətin bərpası üçün orada əməliyyat keçirilməsinin və ya yalnız sərhədlərin qorunmasının məqsədəuyğunluğu barədə H.Səlimov ona dəqiq göstəriş verilməsini xahiş edirdi (114, v.75, 80).

Ancaq 1920-ci il aprelin 27-də Bakı şəhərində baş verən hadisələr Azərbaycan Xalq Cümhuriyyətinin mövcudluğuna son qoydu və aprelin 28-də Hərbi Nazirliyin rəhbərliyi də qoşun hissələrinə komandanlığı hakimiyyətə gəlmiş bolşevik orqanlarına təhvil verdi.

### *3. ŞİMALDAN GÖZƏLƏNİLƏN TƏHLÜKƏYƏ QARŞI MÜBARİZƏ*

Azərbaycan Xalq Cümhuriyyətinin mövcud olduğu vaxt ərzində onun müstəqilliyi üçün ən böyük qorxu şimaldan gözlənilən təhlükə idi. Özü də bu təhlükə həm yenicə hakimiyyətə gəlmiş olan bolşevik qüvvələrinin şəxsində, həm də devrilmiş hakimiyyətin tərəfdarları olan şovinist rus hərbçilərinin, Rusiyanın cənub bölgələrini nəzarət altında saxlamağa çalışan Könüllü ordunu təşkil etmiş general Denikinin şəxsində reallaşmaqda idi. Siyasi mahiyyəti e'tibarilə bu iki qüvvə tamamilə bir-birinə zidd mövqelərdə dayansalar da, müstəqilliyini e'lan etmiş respublikalarla Rusiya

arasındakı əlaqələrin gələcək xarakterinə münasibətdə oxşar mövqelərdə dayanırdılar. Hər iki qüvvə müstəqilliyini e'lan etmiş respublikaları, o cümlədən Azərbaycanı Rusiyanın tərkib hissəsi kimi görürdü və Azərbaycanın yenidən Rusiyanın tərkibinə qatılması üçün bir an da olsa fəaliyyətlərini dayandırmırdı. Bolşevik hökumətinin xəttini Azərbaycanda bolşevik qurumları həyata keçirirdilər. Bakı Zaqafqaziyada bolşevizmin mərkəzi sayıldığından burada onun güclü və formalaşmış dayaqları qalmaqda idi. Denikinçi qüvvələri isə M.F.Podşibyakinin sədrliyi ilə 1918-ci ilin sentyabrında Bakıda yaradılmış olan rus Milli Komitəsi öz ətrafında birləşdirməyə başlamışdı. Rus Milli Komitəsinin ətrafında toplaşan köhnə rejimin qalıqları Denikinin qərargahı ilə, ağqvardiyaçı zabitlərlə sıx əlaqə saxlayır, onlardan aldıqları habelə özləri hazırladıqları siyasi ədəbiyyatı və nəşrləri rus əhalisi arasında təbliğ edir və yayırdılar (214, s.152).

1918-ci ilin noyabrında ingilis qoşun bölmələri ilə bərabər L.Biçeraxov da bir qrup hərbçi ilə Bakıya qayıtdı. Rus şovinist hərbçilərinin tipik nümayəndəsi olan və Denikinlə sıx əlaqə saxlayan L.Biçeraxov Bakıya daxil olan kimi bəyanat verdi. Bu bəyanatdan da görünürdü ki, L.Biçeraxov Azərbaycanı Rusiyanın tərkib hissəsi, onun sakinlərini isə Rusiya vətəndaşları sayırdı. O, bütün əhalini, siyasi qüvvələri bütün narazılıqları kənara qoyaraq Rusiya naminə fəaliyyət göstərməyə çağırırdı (44, v.1).

Biçeraxov və onun ətrafındakılar Bakıda özlərini çox nalayiq aparır, heç nə ilə hesablaşmır, asayişi pozur, əhalinin narahatçılığına səbəb olurdular (77, v.30). Xüsusilə ilk vaxtlar ingilislər tərəfindən müdafiə olunmaları biçeraxovçuları daha da quduzlaşdırırdı. Onların özlərini apara bilməməsi, qanuni hökumət orqanlarına qarşı fəaliyyəti Azərbaycan hökumətini də narahat edirdi. Buna görə də Azərbaycan hökuməti ingilis qoşunlarının Bakıdakı nümayəndələri qarşısında Biçeraxova qarşı tə'cili tədbirlər görülməsi məsələsini qaldırdı. Belə olanda ingilislər məsələnin sakitliklə həll olunması xatirinə danışıqlar aparılması adı altında Biçeraxovu Londona də'vət edib onun Bakıda qalmış tör-töküntülərinin Azərbaycandan çıxarılmasını tələb etdilər (77, v.30; 310, s.216).

Biçeraxov Azərbaycandan çıxarılandan sonra general Prjevalcki adlı birisi Bakıda Denikin qoşunlarının xeyrinə öz fəaliyyətini genişləndirməyə başladı. O, həm Biçeraxovun dəstəsindən qalanları öz ətrafında birləşdirdi (287, v.101), həm də Bakıdakı rus əhalisi arasından Denikin ordusuna əsgər toplanmasına cəhd göstərdi. Azərbaycan hökuməti Könüllü ordunun heç nədən və heç kimdən çəkinməyərək Bakıda açıq şəkildə vahid və bölünməz Rusiyanı dəstəkləyəcək bir ordunun təşkili ilə bağlı işlər aparması, bu qoşun bölmələrin, xalqın gözü qarşısında nümayişlər və parad keçirməsi (11, 22.1.1919) ilə razı deyildi. Belə hallara son qoyulması üçün Nazirlər Şurasının sədri F.Xoyski 1919-cu il fevralın 15-də general Tomsona məktub göndərdi. Həmin məktubda Bakıda həm Könüllü ordu üçün, həm də Ermənistan ordusu üçün könüllülərin toplanmasına faktları açıqlanır və bununla bağlı general Tomsona Azərbaycan hökumətinin münasibəti çatdırılırdı. Məktubda deyilirdi: "Son vaxtlar Bakıda yol verilməsi mümkün olmayan hadisələr baş verir. Könüllü ordunun nümayəndələri-general Prjevalski və Erdeli Bakıda və onun rayonlarında adamlar toplayır, silah paylayır, hərbi tə'lim keçir, bir sözlə qoşun hissələrinin gücləndirilmiş hazırlığını aparırlar"(11, 22.11.1919).

Məktubda daha sonra belə qoşun hissələrinin İçərişəhərdə, tamamilə azərbaycanlılar yaşayan məhəllədə özbaşına bina tutmaları bildirilir və belə hərəkətlərə son qoyulmasının zəruriliyi ingilis generalına çatdırılırdı. General Tomson yazdığı cavab məktubunda Bakıda Denikin ordusu üçün qoşun toplanmadığını, yalnız keçmiş zabitlər arasından könüllülərin qeydiyyata alındığını və onların heç bir hazırlıq keçmədən dərhal Bakıdan çıxarıldığını bildirirdi (15,22.11.1919).

Əslində isə Bakıda təkcə könüllü zabitlər toplanmır, bütöv qoşun dəstələri formalaşdırılırdı (287, s.101). Görünür, ingilis generalı Azərbaycan hökuməti başçısının onun qarşısında qaldırdığı məsələnin tamamilə haqlı olduğuna əminlik hasil etmiş və general Prjevalskidən bütün qüvvələri ilə bərabər Azərbaycandan çıxmağı tələb etmişdi. Bununla bağlı 1919-cu il fevralın 28-də general Prjevalski belə bir əmr imzaladı: "İngilis komandanlığının verdiyi əmrə görə Cənubi Rusiya Silahlı Qüvvələrinin bütün rus qoşun hissələri sabah, martın 1-də saat 16-dək Bakını, həmin gün saat 24-dən isə Bakı hərbi qubernatorluğunun ərazisini tərk etsinlər" (287, s.102).

1919-cu il martın 1-də Könüllü ordunun qoşun hissələri Azərbaycandan çıxarıldı və elə həmin gün də Xəzər Rus hərbi donanması tərksilah edildi və ingilis komandanlığına tabe etdirildi (77, v.30).

General Denikin Könüllü ordu dəstələrinin Azərbaycandan çıxarılması ilə heç də razı deyildi. Bakıya Zaqafqaziyanı Könüllü ordunun nəzarəti altına gətirilməsi üçün bir baza kimi baxılırdı. Zaqafqaziya isə Denikin üçün bolşevik Rusiyasına qarşı mübarizə aparmaq üçün real baza rolunu oynayırdı və ona görə də Azərbaycanda və Zaqafqaziya respublikalarında nüfuzunun zəifləməsi Könüllü ordu komandanlığı üçün əlverişli deyildi. General Denikin tezliklə Qafqazdakı müttəfiq qüvvələrin komandanlığı ilə əlaqə yaradıb bu məsələni həll etməyə çalışdı. O, bildirirdi ki, müstəqil respublikalarda, o cümlədən Bakıda yaradılan qoşun dəstələri bir dəfə də olsun yerli hökumətlərin fəaliyyətinə müdaxilə etməmişdilər. Onlar yaradılan kimi dərhal Könüllü ordunun sərəncamına göndərilirdilər. Denikin müttəfiq dövlətlərin qoşunları olan respublikalarda müttəfiq qoşunlarının nəzarəti altında Könüllü ordu nümayəndələrinin fəaliyyətinə icazə verilməsini məqsədəuyğun bilirdi və belə bir xahişlə müttəfiq qoşunları komandanlığına müraciət etmişdi (36, v.3).

Könüllü qoşun dəstələri Bakıdan çıxarılsa da denikinçilərin Bakıda və Azərbaycanda fəaliyyətinə son qoyulmamışdı və bu elə bir asan məsələ deyildi. Bakıda çoxlu sayda keçmiş çar zabiti yaşayırdı. Onlar çar geyimlərini çıxarmadan şəhərdə gəzir, əyinlərindəki geyimlə bölünməz Rusiya tərəfdarları olduqlarını anlatmaqla bərabər gizlində də Denikinin xeyrinə fəaliyyətlərini dayandırmırdılar. Belə şəxslərin simasında Denikin Azərbaycanda güclü casus bazasına malik idi. Denikin tərəfdarları Bakıda gizli silah bazaları da yaradırdılar. Belə bazaların biri Balaxanı və Krasnavodsk küçələrinin tinindəki evin zirzəmisində tapılmışdı. Burada çoxlu sayda tüfəng, qumbara, patron və s. aşkara çıxarılmışdı (241, N 3-4, s.123).

Mə'lumdur ki, Azərbaycan Ordusunun sıralarında da xeyli sayda keçmiş çar ordusu zabiti xidmət edirdi. Bu zabitlərin çoxu zabit şərəfinə sədaqətlə yanaşsa da, onların arasında Denikinlə əlaqə saxlayanları, Azərbaycan Ordusu daxilində casusluq edənləri də var idi. Belə casus şəbəkəsinin biri 1919-cu ilin aprelində ifşa edilmişdi. Hərbi nazir 1919-cu ilin aprel ayında yazdığı raportların birində bildirirdi ki, Bakıda Könüllü ordunun gizli kəşfiyyat təşkilatı ifşa edilmişdir. Azərbaycan Ordusunun Ərkani-hərbində olmuş Könüllü ordunun kəşfiyyat bölməsinin rəisi kapitan Çernışovdan tapılmış sənədlərə görə hərbi nazir hökumət orqanlarında da xeyli casusun olduğunu güman edirdi. Onun fikrincə, vaxtilə Biçeraxovun, sonra da general Prjevalskinin yaratmağa çalışdığı dəstələrdən də şübhəsiz ki, Bakıda qalanı və Könüllü ordunun xeyrinə mə'lumat toplayanları var idi (217, s.249).

Azərbaycan Ordusunun daxilində Könüllü ordunun xeyrinə casusluq edən kapitan Çernışovun və arvadı, Gəncədə tutulmuş olan Smıslova adlı başqa bir casusun vasitəsilə ifşa edilmişdi. Axtarış zamanı kapitan Çernışovdan Azərbaycanın ümumi ictimai-siyasi və iqtisadi vəziyyəti, Azərbaycan Ordusunun formalaşmasının gedişi haqqında xeyli mə'lumat tapılmışdı. Əldə edilən sənədlər arasında "Vahid və bölünməz Rusiya"ya tərəfdar olmayan xalqlar arasında hansı mə'lumatların toplanmasına üstünlük verilməsi barədə Denikin kəşfiyyat orqanlarının tə'limatı da var idi. Bu tə'limata görə kapitan Çernışev və onunla birgə işləyən denikinçi casuslar Azərbaycanda aşağıdakı mə'lumatları toplamalı idilər:

1. Silahlı qüvvələr, onun tərkibi, diskolasiyası, silah və texnikası, geyimi, intizamı, komplektləşdirilməsi, təchizatı, döyüş və maddi ehtiyatları;

2. Hərbi xarakterli tədbirlər;

3. İctimai fikir, xalqın hökumətə münasibəti, "Vahid Rusiya" ideyasına rəğbət bəsləyən elementlər, onların dövlətə qarşı müxalifətdə birləşdirilməsi imkanları;

4. Hökumətin fəaliyyəti, öz nüfuzunu qorumaq üçün onun həyata keçirdiyi tədbirlər. Hökuməti gözdən salmağın mümkün vasitələri;



5. "Vahid Rusiya" vətəndaşlarının mə'nəvi və maddi maraqlarının qorunması sahəsində Hökumətin və xalq kütlələrinin digər xalqlara münasibəti;

6. "Vahid Rusiya" ideyasının təbliğinin vasitələri və üsulları (297, s.26-27).

Qəribədir ki, aparılan təhqiqat prosesində kapitan Çernışov günahlarını boynuna almamışdı. O bildirmişdi ki, mən öz vətənimdə, Rusiya imperiyası ərazisində Rusiyanın xeyirləri üçün mə'lumat toplamaqla məşğul olmuşam. Onun fikrincə, Azərbaycanın Rusiyadan ayrılmasını heç bir dövlət tanımayacaqdır. Ona görə də ölkə daxilində aparılan hərbi kəşfiyyat hərbi casusluq kimi qiymətləndirilə bilməz. Kapitan Çernışov həbs edilsə də sonradan o, ingilislərin təzyiqi ilə həbsdən azad olunmuş Azərbaycanın hüdudlarından çıxarılmışdı. Ordu daxilində casus şəbəkəsinin mövcudluğundan narahatçılıq keçirən Hərbi Nazirliyin rəhbərliyi dərhal qoşun hissələrində və digər hərbi strukturlarda mümkün təmizləmə işləri apardılar. E'tibarlılığı şübhə doğuran bir sıra keçmiş çar zabitləri və mə'murları 1-ci Cavanşir piyada alayından, 2-ci Bakı piyada alayından, 1-ci Tatar süvari alayından, 3-cü Şəki süvari alayından, İstehkam məktəbindən, Ordu Livası rəyasətindən, Praporşiklər məktəbindən, zirehli qatardan və digər strukturlardan azad edildilər. Lakin sonradan ələ keçirilmiş olan sənədlərdən aydın olurdu ki, Azərbaycan Ordusunun bütün mövcudluğu dövründə onun sıralarında Denikinin xeyrinə casusluq edən şəxslər olmuşdular. Bu casuslar vasitəsilə Azərbaycan Ordusunun vəziyyəti, onun təchizatı, qoşun hissələrinin yerləşdirilməsi və yerdəyişməsi, zabit hey'ətinin siyahısı, yaşadığı ünvan, imzalanan əmrlər barədə müfəssəl mə'lumatlar toplanıb Denikinin qərargahına ötürülürmüş (297, s.28).

Denikinin və onun ətrafındakılarının belə fəaliyyəti Azərbaycan hökumətini narahat etməyə bilməzdi. Bu fəaliyyət mahiyyət e'tibarilə Azərbaycanın müstəqil dövlət kimi mövcudluğu əleyhinə yönəldilmişdi. 1919-cu ilin aprel ayında Azərbaycan hökuməti Könüllü ordunun komandanlığından Azərbaycana olan münasibətinə bir aydınlıq gətirilməsini xahiş etdi. Denikin tərəfindən Bakıdakı ingilis qoşunları komandanlığı yanında müvəkkil edilmiş nümayəndə Azərbaycan hökumətinə çatdırdı ki, Cənubi Rusiya ordusu Azərbaycanı Rusiyanın hissəsi sayır. Ancaq Rusiyada ali hakimiyyət bərpa edilənədək Azərbaycan müstəqil qala bilər (287,s.102).

Heç şübhəsiz ki, Rusiyada ali hakimiyyətin bərpa edilməsi deyəndə Denikin və onun ətrafındakılar silahlı yolla bolşevizmin devrilməsini və müstəqilliyini e'lan etmiş respublikaların işğal olunub yenidən Rusiyaya qatılmasını nəzərdə tuturdular. Həmin məqsədlə 1919-cu ilin aprelində Denikin artıq Dağıstan ərazisində müstəqilliyini 1918-ci ilin mayında e'lan etmiş Dağlıq Respublikası (241, s.121) ilə müharibə aparırdı. Bu respublikanı işğal etməklə Denikin qoşunları birbaşa Azərbaycan sərhədlərinə çıxırdılar. Şimaldan gözlənilən təcavüzün respublika sərhədlərinə ya-

yınlaşması Azərbaycan hökumətini narahat etməyə bilməzdi. F.Xovski general Tomsona göndərdiyi e'tiraz məktubunda bildirirdi ki, Şimalı Qafqazın dağlı xalqlarının iradəsinin və suverinlik hüquqlarının pozulması Azərbaycan hökumətinin dərin e'tirazına səbəb olmuşdur və Azərbaycan hökuməti imkanı daxilində mütləq dağlılara öz köməyini əsirgəməyəcəkdir (241, s.121).

Denikin qoşunlarının Dağıstana soxulması Azərbaycan parlamentində də müzakirə olundu və dağlılara kömək göstərilməsi üçün parlament tərəfindən xüsusi komissiya təşkil olundu. 1919-cu il aprelin 30-da bu komissiya əhali arasında öz bəyanatını yaydı. Bəyanatda bildirilirdi ki, şimali Qafqazda azadlıqsevər dağlı xalqları qeyri-bərabər döyüşlərdə Denikinə qarşı mübarizə aparırlar. Onların öz müstəqilliyi uğrunda amansız mübarizəsi azərbaycanlılara anlatmalıdır ki, Denikin Azərbaycanın istiqlaliyyəti ilə də barışmayacaqdır. Günü-gündən yaxınlaşmaqda olan bu təhlükənin aradan qaldırılması üçün parlament komissiyası könüllü dəstələrin yaradılmasına başladığını bildirir və Azərbaycanın müstəqilliyinə biganə qalmayanları bu dəstələrə yazılmağa çağırırdı (241, s. 121).

May ayının axırlarında Könüllü ordunun dəstələri Dərbəndə qədər gəlib çıxdılar və bu şəhəri də işğal etdilər (310, s.216). Dərbəndin tutulması Denikinin Azərbaycana doğru irəlilədiyinə şübhə yeri qoymurdu. Bu isə istər dövlət orqanlarının, istərsə də ictimaiyyətin dərin narahatçılığına səbəb oldu. Mayın 26-da Azərbaycanın sərhədlərinə doğru irəliləyən təcavüzün qarşısının alınması məsələsi parlamentdə də müzakirə edildi. Nazirlər Şurasının sədri N.Yusifbəyli təcavüzün qarşısının alınması üçün hökumət səviyyəsində görülən işlər barədə parlament üzvlərinə mə'lumat verməklə bərabər bildirirdi ki, hələlik heç kim Azərbaycan sərhədini pozmayıb və kim bunu istəsə yalnız bizim meyidlərimiz üzərindən edə bilər (78, v.4).

N.Yusifbəyli qətiyyətsizlik və fəaliyyətsizlik göstərdiklərinə görə ingilis qoşunları komandanlığına e'tirazını çatdırdığını və Azərbaycanın sərhədlərinin müdafiəsi üçün lazım gələrsə ümumi səfərbərlik e'lan olunacağını bildirirdi. Qəbul olunmuş qərarda parlament üzvlərinin hökumətin fəaliyyətini bəyəndiyi və sərhədlərin qorunması üçün daha qətiyyətli qərarların qəbul edilməsində parlament tərəfindən müdafiə ediləcəyi ifadə olunurdu (78, v.6,8).

Ancaq təhlükənin sovuşmaması iyunun 5-də parlamentdə yenidən bu məsələyə qayıdılmasına səbəb oldu. Nazirlər Şurasının sədri N.Yusifbəylinin çıxışı göstərirdi ki, Denikin təhlükəsi günü-gündən daha real xarakter almaqdadır. Hökumətin sədri bildirirdi ki, əgər əvvəllər Denikin və onun ətrafındakılar sözdə də olsa Azərbaycanın müstəqilliyini tanıyırdılarsa, yenicə alınmış teleqramda bu çar generalları və zabitləri Azərbaycanın



müstəqilliyini tanımadıqlarını və onun Rusiyadan ayrılmış hesab etmədiklərini bəyan edirdilər. (20, №3, 1997 s. 72).

N.Yusifbəylinin fikrincə, bu istiqamətdə diplomatik fəaliyyətin genişləndirilməsi ilə bərabər sərhədlərin qorunması üçün əməli işlər də görülməlidir. Denigının nümayəndəsi ilə yazışmalarında da hökumətin sədri Azərbaycan xalqının öz istiqlaliyyətini qorumaq üçün hər şeyi qurban verməyə hazır olduğunu bildirmişdi. N.Yusifbəyli parlamentdəki çıxışında ingilis komandanlığının verdiyi və'dlərin üzərində dayanmadığını bildirərək əlavə edirdi ki, "qonşuya ümid olan şamsız qalar". Ən e'tibarlı ümid yeri – bizim öz qüvvəmizdir. Biz istənilən düşmənin həyasız iddialarına cavab verməyə hazır olmalıyıq (78, v.19-22).

Parlament müzakirə etdiyi məsələ ilə əlaqədar müvafiq qərar qəbul etdi. Həmin qərarda deyilirdi: "Denikin təhlükəsi barədə hökumət başçısının mə'ruzəsini dinlədikdən sonra Azərbaycan parlamenti e'lan edir ki, Denikinin bizim dövlətçiliyimizə qarşı yönəldilmiş niyyətləri kiçik xalqları əsarət altına almaq, azadlıqsevər demokratiyanı məhv etmək istəyən keçmiş çar generallarının imperialist cəhdlərinin nəticəsidir. Qərara alındı ki, dövlət müdafiəsi məqsədilə indiki hökumətin tərkibindən xüsusi orqan yaradılsın" (78, v.24).

Ölkənin müdafiəsinin təşkilinə məs'ul olan bu orqana xüsusi səlahiyyətlər verilməsi də qərarda öz əksini tapmışdı. Həmin orqan ölkədə hərbi və mühasirə vəziyyəti e'lan edə bilər, xüsusi könüllü dəstələr yarada bilər, digər qanunu dəyişdirə və ya onun fəaliyyətini müvəqqəti dayandıra bilərdi. Parlament bütün vətəndaşları hökumət ətrafında birləşməyə, yaxınlaşmaqda olan təcavüzə qarşı öz güclərini birləşdirməyə çağırırdı. (78, v.24).

Mə'lumdur ki, parlamentin bu qərarına əsasən 1919-cu il iyunun 9-da Nazirlər Şurasının qərarı ilə Dövlət Müdafiə Komitəsi yaradıldı (105, v.32). İyunun 11-də Dövlət Müdafiə Komitəsi tərəfindən Azərbaycan ərazisində hərbi vəziyyət e'lan olundu (310, s.217).

Denikin təhlükəsinin Azərbaycanı təhdid etməsi əhalinin də dərin narahatçılığına və təşvişinə səbəb olmuşdu. İyun ayında Bakını və bütünlükdə Azərbaycanı mitinq və e'tirazlar dalğası bürüdü. Azərbaycanın sərhədlərinə doğru yaxınlaşan təcavüzdən qəzəblənən xalq kütlələri denikinçilərdən işğalçılıq əməllərinə son qoyulmasını tələb edirdilər.

İyunun 10-da Balaxanı məktəbində təşkil olunmuş mitinqdə bildirilirdi ki, Azərbaycan fəhlələri və kəndliləri son damla qanına kimi respublikanın istiqlaliyyətini qorumağa hazırdırlar (11, 13.6.1919).

Elə həmin günlərdə Müsəlman Əməkçi Ziyalılar İttifaqının fövqəl'adə iclası da ziyalıların hökumətin həyata keçirdiyi tədbirləri müdafiə etməsinin, Azərbaycanın müstəqilliyinin qorunması üçün çiyinlərinə düşən bütün vəzifələri yerinə yetirməyə hazır olmalarının əyani nümayişinə çevril-

dı. Əməkçi ziyalılar hökumət qarşısında ümumi səfərbərliyin e'lan edilməsinin zəruriliyini qaldırırdılar (15, 13.VI.1919).

İyunun 13-də Bakıda şəhər sakinlərinin Denikin təcavüzünə qarşı izdihamlı mitinqi keçirildi. M.Ə.Rəsulzadənin apardığı bu mitinq belə bir qətnamə qəbul etdi: 1) hökumət təcavüzkar Denikinə qarşı amansız və sarsılmaz mübarizəni davam etdirməlidir; 2) Denikini müdafiə edən müttəfiq komandanlığına Denikinin fəaliyyəti ilə bağlı e'tirazları çatdırmaq və tələb etmək ki, müttəfiqlər general Denikinə tə'cili tə'sir göstərsinlər; müttəfiqlərin azsaylı xalqlara qarşı münasibəti birdəfəlik aydınlaşdırılmalıdır; 3) daxili denikinçilərə qarşı ən kəskin qərarlar qəbul edilsin. Bizə düşmən olan nəşrlər susdurulsun; 4) düşmənə bir dənə də olsa patron buraxılmasın; 5) bizi hədələyən təhlükə bütün Zaqafqaziya üçün ümumi təhlükədir. Milliyyətindən asılı olmayaraq Zaqafqaziyanın bütün demokratiyası ümumi təhlükə qarşısında birləşməli və bir nəfər kimi Denikin təhlükəsinə qarşı çıxış etməlidir; 6) bütün vətəndaşlar səfərbərliyə alınmalıdır (11, 15.6.1919).

Azərbaycan hökumətinin və xalqının qətiyyətli tələblərindən sonra ingilis komandanlığının nümayəndələri də Denikinin Azərbaycana doğru irəliləməsinə öz münasibətini bildirdi. Qafqazdakı ingilis qoşunlarının komandanı vəzifəsində general Tomsonu əvəz edən genaral Kori, Londonun Denikinlə Zaqafqaziya arasında demarkasiya xəttinin müəyyənləşdirdiyini bildirdi. Denikin qoşunlarının bu demarkasiya xəttindən cənuba keçməyə haqqı yox idi. Həmin demarkasiya xətti Bzib çayının şimalı ilə Suxuminin sərhədlərinə, oradan da Kutaisi, Tiflis, Dağıstan vilayətlərinin şərqinə doğru uzanırdı. Dağıstanda bu xətt Petrovskdan, Dağıstan dəmir yolundan 5 mil cənuba oradan da 5 mil cənub-şərqə doğru uzanan xətt boyunca keçməli idi. Dəniz sahilində demarkasiya xətti Petrovskdan 5 mil cənubda yerləşirdi. Denikin qoşunları da bu xətdən o yana keçə bilməzdilər (11, 15.VI.1919).

Əslində isə Denikin qoşunları ingilislərin müəyyənləşdirmiş olduğu demarkasiya xəttini keçib Azərbaycan sərhədlərinə yaxınlaşmışdılar və mövcud olan yazışmalardan da aydın olur ki, onlar geri çəkilmək niyyətində deyildi. Çünki bu qoşunlar Azərbaycanın hüdudlarına soxulmaq planlarının reallaşdırılmasına çalışırdılar.

Bununla bağlı olaraq iyunun 22-də Azərbaycan hökuməti general Denikinə nota ilə müraciət etdi. Həmin notada bildirilirdi ki, Britaniya hökuməti tərəfindən Denikinlə Zaqafqaziya arasında demarkasiya xətti müəyyənləşdirilsə də onun komandanlığı altında olan Könüllü ordu hissələri bu xəttin cənubunda dayanmaqda davam edirlər. Azərbaycan hökuməti Könüllü ordu komandanlığını müəyyən edilmiş demarkasiya xəttinə riayət olunmasına çağırırdı (217, s. 248).

Azərbaycan hökuməti dövlət sərhədlərini kəsdirmiş olan təcavüzün qarşısının alınması üçün istər general Denikinlə, istərsə də ingilis qoşunları komandanlığı ilə əlaqələri kəsməməklə bərabər, səmərəli və əməli tədbirlərə də əl atırdı. Mə'lumdur ki, şimal sərhədlərinin möhkəmləndirilməsi üçün hərbi nazirin əmri ilə Xaçmaz dəstəsi yaradılmışdı (153, v.25). Yaxınlaşmaqda olan ümumi təhlükənin qarşısının alınması üçün Azərbaycanla-Gürcüstan arasında hərbi əməkdaşlıq da gücləndirildi və bu əməkdaşlığı nizamlayan hüquqi baza kimi iki respublika arasında 1919-cu il iyunun 16-da hərbi saziş imzalandı. Sazişi Azərbaycan hökuməti tərəfindən xarici işlər naziri M.Cəfərov, hərbi nazir S. Mehmandarov və Ərkanihərbin rəisi M.Sulkeviç imzalamışdılar. Tiflisdə üç il müddətinə imzalanmış həmin sazişin əsas mahiyyəti bundan ibarət idi ki, respublikaların hər hansı biri xarici müdaxiləyə mə'ruz qalacağı təqdirdə digər respublika ona mümkün köməyi göstərməlidir. İkitərəfli hərbi saziş konkret olaraq aşağıdakı məsələləri özündə əks etdirirdi:

1. Razılığa gələn dövlətlər bütün silahlı qüvvələri və hərbi vasitələri ilə razılığa gələn respublikalardan birinin və ya hər ikisinin müstəqilliyini və ya ərazi bütövlüyünü təhdid edən hər hansı hücuma qarşı birgə çıxış etməyi öhdələrinə götürürlər;

Qeyd: Bu bənd Zaqafqaziya respublikaları arasında ərazi bölgüsünün hələlik başa çatmaması səbəbindən yarana biləcək sərhəd konfliktlərinə şamil edilmir.

2. Əgər hər hansı qonşu dövlət birinci bəndə əsasən hərbi əməliyyat başlanan zaman bir və ya hər iki müttəfiqə sərhəd mübahisələrinin silah gücünə həll edilməsi məqsədilə hücum edərsə, onda bu dövlət vuruşan tərəf kimi qəbul edilir;

3. Bu saziş ciddi müdafiə xarakteri daşıyır və əgər tərəflərdən biri öz təşəbbüsü ilə razılıq olmadan müharibə e'lan edər və ya hərbi əməliyyatlara başlayarsa, onda digər sazişə gələn tərəf bu hərbi əməliyyatda iştirak etməyə bilər;

4. Razılığa gələn tərəflər onlar arasında meydana çıxa biləcək sərhədlər haqqında mübahisələri saziş və ya arbitraj yolu ilə həll etməyi öhdələrinə götürürlər. Bu halda qərar son nəticə hesab olunur və hər iki tərəf üçün məcburidir;

5. Bu saziş üç il müddətinə bağlanılır. Bu müddətin qurtarmasına bir il qalmış razılığa gələn tərəflərdən biri sazişi yeni müddətə uzatmaq və ya sazişdən imtina etmələri haqqında öz arzusunu bildirir: sonuncu halda saziş öz gücünü ancaq müəyyənləşdirilmiş müddət başa çatdıqdan sonra itirir;

6. Razılığa gələn tərəflər həm'rəy olaraq hər iki dövlətin müstəqilliyini və suveren hüquqların qorunmasına yönəldilən diplomatik danışıqlar aparmağı öhdələrinə götürürlər;

7. Birinci və ikinci bəndlərdə göstərilən şərait ortaya çıxdığı zaman razılığa gələn dövlətlər separat sülh bağlamamağı öhdələrinə götürürlər;

8. Razılığa gələn tərəflər qarşılıqlı razılaşma olmadan digər dövlətlərlə hərbi konvensiya bağlamamağı öhdələrinə götürürlər;

9. Əgər 5-ci maddədə göstərilən müddət bitənə qədər onun tərkibinə daxil olan bütün dövlətlərin sərhəd toxunulmazlığına tə'minat verən Xalqlar Liqası yaranarsa, onda razılığa gələn respublikalar Xalqlar Liqasına girən andan bu sazış öz gücünü itirir;

10. Müqavilə haqqında rəsmi mə'lumat verildikdən sonra 2 həftə ərzində Ermənistana da bu sazişə qoşulmaq hüququ verilir (297, s.32-33; 20, №3, 1996, s.90-91).

Yuxarıda qeyd edildiyi kimi bu sazişdən əlavə iki dövlət arasında hərbi texniki əməkdaşlıq haqqında da sənəd imzalandı və həmin sənədə müvafiq olaraq Gürcüstan həm hərbi texnika və sursat baxımından, həm də kadrların hazırlanması baxımından Azərbaycana dəyərli kömək göstərdi. Bu respublikadan gətirilmiş olan silah, sursat və təchizat Azərbaycanın qoşun hissələrini, o cümlədən şimal sərhəddini qoruyan qoşun bölmələrinin maddi-texniki imkanlarını xeyli yaxşılaşdırdı.

Gürcüstanla bağlanan sazişin reallaşdırılması, respublikanın şimal sərhədlərinin qorunması istiqamətində Hərbi Nazirliyin rəhbərliyi də konkret və məqsədyönlü tədbirlər hazırlayıb həyata keçirirdi. Hərbi nazir S.Mehmandarovun və Ərkani-hərbin rəisi M.Sulkeviçin 1919-cu il iyunun 26-da Dövlət Müdafiə Komitəsinin sədrinin adına göndərdiyi teleqramda mövcud olan vəziyyətin sabitləşdirilməsi üçün nələrin edildiyini və hansı tədbirlərin planlaşdırıldığını aydın göstərmək olar. Hərbi Nazirliyin rəhbərliyi Azərbaycanın başı üzərini kəsdirmiş olan təhlükənin aradan qaldırılması üçün tə'xirəsalmaz tədbirlərin həyata keçirilməsinin zəruriliyini vurğulayırdı. Raportda qeyd olunurdu ki, ingilis komandanlığı tərəfindən demarkasiya xəttinin müəyyənləşdirilməsi heç də Könüllü ordunun Azərbaycana hücum təhlükəsinin aradan qaldırılması demək deyildir. Heç bir təbii maneələrlə bağlanılmayan bu şərti xətt istənilən vaxt Antantanın gizli razılığı ilə pozula bilərdi. Rus mətbuat orqanlarının verdiyi xəbərdən də mə'lum olurdu ki, Dərbəndin tutulması ingilislərin razılığı əsasında baş vermişdi və bu hərəkət Könüllü ordunun Qızılburun-Zaqataladan keçən ilkin demarkasiya xəttinə doğru irəliləməsinin birinci mərhələsi idi (161, v.1).

Hərbi Nazirliyin rəhbərliyinin fikrincə, Qarabağda və Lənkəranda iğtişaşların güclənməsi də Könüllü ordunun Dağıstan ərazisindən Azərbaycana doğru irəliləməsi ilə birbaşa bağlı idi. Yaxınlaşan təhlükənin aradan qaldırılması üçün Dağıstanın yenicə müəyyənləşdirilmiş demarkasiya xəttindən cənubdakı hissəsinin nəzarət altına alınması təklif olunurdu. Belə bir müdafiə zolağının yaradılması hətta Bakının hüdudlarının da qorunmasını asanlaşdıra bilərdi. Ancaq S. Mehmandarov və M.Sulkeviç bu işin çox ehtiyatla və tədbirlə həyata keçirilməsini lazım bilirdilər. Çünki əsaslandırılmamış addım Dağıstandakı daxili qüvvələrin narazılıqlarının güclənməsi, Könüllü ordu ilə Azərbaycan arasındakı münasibətlərin mürəkkəbləşməsi ilə nəticələnərdi. Buna yol verilməməsi üçün Hərbi Nazirliyin rəhbərliyi Könüllü ordu ilə danışıqlar aparılmasını, demarkasiya xəttindən cənubda olan əraziyə qoşun çıxarılması üçün qarşılıqlı razılığın əldə edilməsini də istisna etmirdi (161, v.1).

Raportda Dağıstana qoşun bölmələri yeridilməsindən əvvəl orada vəziyyətin hərtərəfli öyrənilməsinin, mövcud anarxiyanın aradan qaldırılması üçün lazımi tədbirlərin görülməsinin, orada mülki idarəçiliyin qaydaya salınmasının, müsəlmanlar arasında qan tökülməsi təhlükəsinin aradan qaldırılmasının zəruriliyi vurğulanırdı. Raportda daha sonra deyilirdi: "Gürcüstanda hərbi saziş bağlandıqdan sonra döyüş hazırlığımızı gücləndirmək üçün aşağıdakı tədbirlər görülmüşdür:

1. Hərbi konvensiyanın şərtlərinə əsasən buraxılan əmlakın qəbul edilməsi üçün general Tlexasın sədrliyi ilə Tiflisə yola düşəcək komissiya yaradılmışdır;

2. Bakının və onun ətrafının qurudan və dənizdən qorunması üçün mövqelərin kəşfiyyatı, onların möhkəmləndirilməsi layihələrinin hazırlanması məqsədilə Xaçmaz-Bakı-Ələt rayonuna Ərkani-hərbin zabitləri, hərbi mühəndislər və topçular çöl səfərinə göndərilmişlər. Bu məqsədlə gürcülər bizə özlərinin Baş qərargah zabitini, hərbi mühəndisini və 4 istehkam zabitini vermişlər;

3. Tiflis şəhərinə aviasiya kursuna 6 zabit və radioteleqraf kursuna 4 zabit və 10 əsgər e'zam edilir. Kurslar iyun 1-də başlanır.

4. Taborların, batareyaların təsərrüfat vəzifələrini, bölük komandiri və piyada hissələrində kiçik zabit vəzifələrini tutmaq istəyən gürcü zabitləri də'vət olunmuşlar...(161, v.1).

Daha sonra Hərbi Nazirliyin hissələrinin formalaşdırılması prosesi, yaxın gələcəkdə hansı hissələrin yaradılmasının planlaşdırıldığı, Gürcüstandan alınan hərbi silahların və texnikanın necə bölüşdürüləcəyi, hansı hissələrin möhkəmləndiriləcəyi barədə mə'lumat verilirdi. Raportda yazılanlardan aydın olur ki, şimal sərhədlərində və Bakı ətrafında istehkamçı kadrlara ehtiyac çox artdığı üçün İstehkam məktəbinin istehkam bölüyünə çevriləcəyi nəzərdə tutulur. Dəmiryolçu kadrların hazırlanması üçün Hərbi Dəmir yolu məktəbinin təşkilinə də elə bu vaxtlar başlanmışdı. Dağıstana qoşun bölmələri yeridiləcəyi təqdirdə onların aşağıdakı şəkildə yerləşdiriləcəyi planlaşdırılırdı: Teymur xan Şurada iki piyada taboru, bir topçu batareyası və bir süvari alayı (4 bölük), Dərbəndə isə bir piyada taboru və bir topçu batareyası. Bunlardan artıq Dağıstana qüvvə göndərmək imkanı yox idi. Hərbi Nazirliyin rəhbərliyinin fikrincə, Qarabağda vəziyyətin mürəkkəbləşməsi üzündən oradan və Ermənistan sərhədlərindən qoşun çəkib gətirilməsi məqsədəuyğun deyildi. Eyni zamanda Lənkəranda qanunçuluğun bərpası üçün xüsusi dəstənin formalaşdırılması da artıq günün

tələbinə çevrilməkdə idi.Ona görə də hələlik Dağıstana yalnız yuxarıda göstərilən miqdarda qoşun göndərilə bilərdi (161, v.2).

Dövlət Müdafiə Komitəsinin sədrinə verilən mə'lumatdan aydın olurdu ki, Hərbi Nazirlik yaxın vaxtlarda səfərbərlik cədvəlinin, səfərbərlik planının və dəmir yolu üzrə səfərbərlik qrafikinin hazırlanmasına da başlamalı idi (161, v.2).

Denikinin müəyyənləşdirilmiş demarkasiya xəttindən geri çəkilməməsi isə şimal sərhədlərinin və Bakı ətrafının möhkəmləndirilməsi üçün əməli işlərin gücləndirilməsinin tələb edirdi. Könüllü ordunun bölmələri demarkasiya xəttindən cənubda səngərlər qazır və müdafiə qurğuları hazırlayırdılar. Bu da onların öz təcavüzkar niyyətlərindən əl çəkmədiyini nümayiş etdirirdi.

Çox mürəkkəb bir tarixi dövrü yaşamasına baxmayaraq dövlət müstəqilliyinin, ərazi bütövlüyünün qorunması üçün Azərbaycan hökuməti də ardıcıl və qətiyyətli iradə nümayiş etdirir və bütün qüvvələrini səfərbərliyə alırdı. Azərbaycan hökumətinin nümayəndəsi, xarici işlər nazirinin müavini A.Ziyadxan güclənən təhlükə qarşısında respublikanın sarsılmaz mövqeyini belə açıqlayırdı: "...Könüllü orduya münasibətimiz belədir: Birdəfəlik və qəti olaraq qərara alınmışdır ki, könüllü ordu hissələrini Azərbaycan Respublikası ərazisinə buraxmamalı, Dağıstanda olan Könüllü ordu hissələrinin aradan çıxarılması üstündə israr etməli və Azərbaycan Ordusu demarkasiya xəttinə qədər Dağıstanı tutmalıdır" (274, s.20).

Azərbaycanın şimal sərhədlərinin və Bakının ətrafının möhkəmləndirilməsinin təşkilində Ərkani-hərbin rəisi, general-leytenant Sulkeviçin xüsusi rolu var idi. Həmin dövrün sənədləşməsinin öyrənilməsi göstərir ki, həyata keçirilən əsaslı müdafiə tədbirlərinin çoxu M.Sulkeviçin adı ilə bağlıdır. O, ya vəzifə səlahiyyətləri çərçivəsində bu və ya digər işlərin icrasını təşkil edir, ya da lazımi işlərin icrası üçün hərbi nazirin qarşısında vəsatət qaldırır, irəli sürülən təklifin mahiyyətini yazılı olaraq əhatəli şəkildə açıqlayırdı. M.Sulkeviç dövlət əhəmiyyətli müdafiə tədbirlərinin həyata keçirilməsini daim nəzarət altında saxlayır, məs'ul şəxslərdən lazımi hesabatlar tələb edirdi.

1919-cu il iyulun 8-də hərbi nazirə ünvanladığı raportunda M.Sulkeviç şimal sərhədləri ilə bərabər Bakı şəhərinin dənizdən qorunmasına da xüsusi diqqət yetirilməsini vacib sayırdı. Çünki bölgədə baş verən proseslər Bakıya çox güclü təhlükənin mövcud olduğundan xəbər verirdi ki, bu da müvafiq müdafiə tədbirlərinin həyata keçirilməsini tələb edirdi. M.Sulkeviçin fikrincə, Həştərxandan Könüllü ordunun dəniz qüvvələri, Xəzərin o tayından isə bolşeviklərin qüvvələri istənilən vaxt Bakıya desant ata bilərdilər. Özlərini Azərbaycanın müdafiəçiləri kimi göstərməyə çalışan ingilis komandanlığının Xəzər donanmasının gəmilərinin bir hissəsini Könüllü orduya verərək Bakını dənizdən müdafiəsiz qoyması isə Azərbaycanın paytaxtı üzərində real təhlükənin mövcudluğundan xəbər verirdi. Çünki dəniz tərəfdən Bakı tamamilə müdafiəsiz qalmışdı. Dənizdən gələcək düşmən qüvvələrinə müqavimət göstərmək üçün sahil boyu heç bir müdafiə tədbiri görülməmişdi. Doğrudur, Bakı körfəzində bir neçə yerdə ingilis topları qurulmuşdu. Ancaq Sulkeviçin fikrincə, həmin toplar yaxşı halda dənizdən hücuma keçən bolşevik qüvvələrinə müqavimət göstərərdilər. Qarşılıqlı əlaqələrdə olduqları könüllü ordu qüvvələrinə ingilis toplarının atəş açacağına isə M.Sulkeviç şübhə ilə yanaşırdı (129, v.3).

M.Sulkeviç öz raportunda qeyd edirdi ki, dənizdən Bakının e'tibarlı müdafiəsinə nail olmaq üçün bir sıra konkret tədbirləri həyata keçirmək lazımdır. Bunlar aşağıdakı tədbirlər olmalı idilər: 1) dənizin müşahidəsi; 2) dənizdən şəhərin həndəvərinin artilleriya müdafiəsinin təşkil edilməsi; 3) dəniz polisinin və liman növbəsinin yaradılması; 4) bütün hərbi dəniz məsələlərinin Hərbi Nazirliyin əlində cəmləşdirilməsi (129, v.3).

Dənizin müşahidəsinin təşkili üçün M.Sulkeviçə görə həm sahil kəşfiyyatı olmalı, həm də üzən vasitələr əldə edilməli idi. Bu üzən vasitələrlə dənizin özündə də kəşfiyyat aparılmaqla dozor xidməti təşkil edilməli idi. Təklif olunur ki, bunun üçün Yollar Nazirliyinin təklif etdiyi 2 ədəd paroxod alınsın, onun hey'əti azərbaycanlılardan komplektləşdirilsin və sonra da lazım olan sahələrdə istifadə edilsin. Paroxodlara toplar və pulemyotlar quraşdırmaqla onların döyüş imkanlarını artırmaq olardı. Gəmilərdən əlavə M.Sulkeviç bir neçə barkasın və mühərrikli qayığın tapılmasını da məqsədəuyğun sayırdı. Bu məsələnin həllində ingilislər tərəfindən müəyyən kömək göstəriləcəyi də güman edilirdi. Qarşılıqlı məsləhətləşmələrdən sonra yaxın vaxtlarda ingilis qoşunlarının dəniz qüvvələri qərargahı ilə xüsusi müşavirə keçirilməsi və orada bir neçə ədəd barkasla mühərrikli qayığın Azərbaycan tərəfinə verilməsinin həll ediləcəyi planlaşdırılırdı. M.Sulkeviç onu da əlavə edirdi ki, ingilislərin köməyini gözləmədən dərhal mövcud olan iki paroxodun, barkas və mühərrikli qayıqların təchizinə başlamaq lazımdır (129,v.3).

Şəhərin həndəvərinin artilleriya ilə müdafiə edilməsi üçün M.Sulkeviçin fikrincə elə də böyük xərclər lazım deyildi. Bakının dəniz kənarında yerləşməsinin xüsusiyyətləri onu e'tibarlı çarpaz top atəşləri ilə müdafiə etməyə imkan verirdi. Bayıl və Zığ burunlarında, habelə Nargin adasında yerləşdirilmiş toplar şəhərin müdafiəsini xeyli gücləndirə bilərdi. Böyük çaplı topların olmadığı üçün bu məqsədlə hələlik üçdüymə topların istifadəsi də mümkün idi (129, v.3).

Dəniz polisinin yaradılmasına gəlincə M.Sulkeviçin bildirdiyinə görə belə qüvvələr artıq mövcud idi. Ancaq yaranmış zərurətlə əlaqədar olaraq onların vəzifələrini bir qədər genişləndirmək lazım idi. Dəniz polisi yaxın məsafədə dozor xidmətini təşkil edə, sahil obyektləri ilə adalar arasında əlaqə yarada bilərdilər (129, v.4).

Bütün müdafiə məsələlərinin düzgün nizamlanması və istiqamətləndirilməsi üçün isə M.Sulkeviç bu işlərin bir mərkəzdə, Hərbi Nazirlikdə cəmlənməsini vacib sayırdı. Özü də o bunun dərhal həyata keçirilməsi üçün zəruri olan smeta xərclərini də hesablayıb raportunda nazirin diqqətinə çatdırırdı (129, v.4).

1919-cu ilin avqust ayında şimal sərhədlərində vəziyyət yenidən həyəcanlı xarakter aldı. Könüllü ordunun qoşunları cənuba doğru hərəkətlərini canlandırmaq üçün fəallaşmağa başladılar. İngilis qoşunlarının komandanlığının Könüllü ordunu Dağıstan ərazilərindən çıxarmaq və'dləri yerinə yetirilməmiş qaldı. Əslində ingilislər, buna heç bir tə'kid də göstərmədilər. Əksinə hər vasitə ilə onlar Könüllü ordunu möhkəmləndirməyə çalışırdılar. Bolşevizmlə mübarizə adı altında ingilislər Denikin ordusuna silah, sursat, hərbi texnika, maliyyə vəsaiti baxımından güclü kömək edirdilər. Denikin isə bolşevik qüvvələrinə qarşı mübarizə aparsa da Azərbaycanın işğalını da bir an da olsa yaddan çıxarmırdı və bunun üçün münasib vaxt gözləyirdi.

Avqust ayının elə ilk günlərində ingilis qoşunları komandanlığı Könüllü ordu ilə Azərbaycan arasında yeni demarkasiya xətti e'lan etdi. Bu demarkasiya xətti indi Samur çayından keçməli idi (60, v.377). Yeni demarkasiya xətti Denikin qoşunlarının Azərbaycan sərhədinin təmas xəttinə kimi irəliləmək imkanı verirdi. Bu isə təhlükənin Azərbaycan ərazisinə daha da yaxınlaşması demək idi.

Avqustun 4-də Nazirlər Şurasının sədri N.Yusifbəyli Azərbaycanın Denikin təhlükəsindən daha e'tibarlı şəkildə qorunması üçün hərbi gəmilərin bir hissəsinin respublikaya verilməsi üçün ingilis komandanlığına müraciət etdi. Xəzər hərbi donanmasının gəmilərinin yarısı Denikinin sərəncamına verilmiş, bir hissəsi də ingilis komandanlığının sərəncamında idi. Nazirlər Şurasının sədri Azərbaycana da Denikinə verilmiş sayda hərbi gəmilərin verilməsini xahiş edir və bu gəmilərin dənizdən sahil obyektlərinin qorunması üçün zəruri olduğunu açıqlayırdı (60, v.378).

Hərbi gəmilərin bir neçəsinin, heç olmasa "Qars", "Ərdahan", "Göy təpə" gəmilərinin Azərbaycana veriləcəyi təqdirdə dənizdən Bakının müdafiəsini təşkil etməyin güman olduğunu M.Sulkeviç də vurğulayırdı (129, v.18). Ancaq ingilis qoşunları Azərbaycan tərəfinin bu xahişlərinə müsbət cavab vermədi və ingilis qoşunlarının Azərbaycanı tərk etməsi təsdiqləndikdə Britaniya hökuməti Xəzər donanmasını bütünlüklə Könüllü orduya verməyi qərara aldı. Bəhanə də bu oldu ki, Xəzər hərbi donanması bolşeviklərlə mübarizə üçün yaradılmışdır (60, v.379).

1919-cu il avqustun 15-də Bakını tərk edən ingilis qoşunları Xəzər Hərbi Donanmasının bütün gəmilərini Könüllü orduya təhvil verdi. Bununla da Azərbaycanı öz təhlükəsi ilə təhdid edən Denikin ordusu hərbi cəhətdən daha da möhkəmləndirildi. İngilis qoşun bölmələri Azərbaycanı



tərk edəndən sonra isə respublika onun ətrafında kəskinləşən təhlükə ilə üzbəüz qaldı. Müdafiə baxımından Azərbaycanın vəziyyətinin mürəkkəbləşməsi M.Sulkeviçin avqust ayında hərbi nazirə yazdığı raportunda da öz əksini tapmışdı (129, v.18). 2-ci piyada diviziyasının komandirinə göndərdiyi məktubunda isə M.Sulkeviç bildirirdi ki, Bakı şəhərinin şimal tərəfdən qorunması həmin diviziyanın hissələrinə tapşırılacaqdır. Təhlükə yarandığı vaxt diviziya komandanlığının sərəncamına 5 minlik partizan dəstəsinin veriləcəyi də nəzərdə tutulmuşdu. Bütün bu qüvvələrlə Bakının həndəvərinin müdafiəsinin necə təşkil ediləcəyi barədə M.Sulkeviç diviziya komandirindən öz təkliflərini verməsini xahiş edirdi (129, v.10).

Yuxarıda qeyd edildiyi kimi, Azərbaycanın şimal sərhədlərinin və Bakı həndəvərinin müdafiəsinin təşkilində gürcü hərbi mütəxəssisləri də iştirak edirdilər. Bir müddətdən sonra gürcü zabiti ştabs-kapitan Sereteli Azərbaycanın şimal sərhədlərinin möhkəmləndirilməsi, 2-ci piyada diviziyasının komandiri general Usubov isə Bakı həndəvərinin möhkəmləndirilməsi üçün öz fikir və mülahizələrini yazılı şəkildə Hərbi Nazirliyə təqdim etdilər.

Ştabs-kapitan Serctelinin verdiyi mə'lumatdan aydın olurdu ki, Azərbaycanın şimal sərhədlərinin üç xətt boyunca möhkəmləndirilməsi planlaşdırılırdı: 1) Xəzrı mövqeləri (ön xətt), 2) Sarvan xətti (aralıq xətt), 3) Hilhil xətti (arxa xətt). Bunlardan başqa Samur körpüsü ətrafında və Mixaylovsk limanında möhkəmləndirilmə işlərinin aparılması nəzərdə tutulurdu (126, v.8).

Xəzri mövqeləri Ləcət-Seyidli arasında yaradılmalı idi. Burada müdafiə xətti iki yerə şaxələnirdi: Mururx-Şirvan və Xəzrı-Qalayi-Süvar. Seyidlidən Ləcətə doğru 4 verst məsafədə artıq möhkəmləndirilmiş səngərlər tikilmişdi. Səngərlər arasında əlaqələr yaradılmış və atəş nöqtələri düzəldilmişdi. Ləcətə 6 verst qalan ərazidə isə hələlik səngərlər tikilməmişdi. Ləcət yol ayrıcında dəmiryol xəttinin sağ və solunda 3 verstlik ərazidə də tikanlı məftillərlə möhkəmləndirilmiş olan səngərlər düzəldilmişdi. Xəzrı, Şirvan və Qalayı-Süvarı istiqamətində isə yalnız bir nəfərlik səngərlər, sığınacaqlar qazılmışdı. Bu tikililərin arasında hərəkət üçün əlaqələr yox idi. Bu sahədə eni 8 arşın olan məftil şəbəkəsinin düzəldilməsi nəzərdə tutulurdu. Ön xəttin lazımınca möhkəmləndirilməsi üçün Şirvandan Zeyxur kəndinə kimi səngərlərin qazılması məqsədəuyğun bilinirdi. Xəzrı mövqelərində səngərlərin Seyidlidən Zeyxura kimi ümumi uzunluğu 42 verst olardı. Öz mə'lumatını avqustun 27-də təqdim edən Sereteli bildirirdi ki, əgər gündə işə 1200 adam çıxarılarsa ön xətdə nəzərdə tutulan işləri iki həftə ərzində qurtarmaq mümkündür. Ancaq təəssüflə əlavə edirdi ki, hazırda işə yaxşı halda 250 nəfər çıxarılır (126, v.8).

Sarvan xəttində müdafiə mövqeləri Şirvan-Şahnəzərli və Molla-Kamil-Aşağı Kuşı məhəllələri arasından keçirdi. Onun ümumi uzunluğu 10

verstə çatırdı. Bu sahədə yalnız dəmir yolu xəttinin sağ və sol tərəflərində 3 verst uzunluğunda torpaq işləri görülmüşdü. Tikanlı məftillər bu sahədə yox idi və onun tikilməsi heç nəzərdə də tutulmurdu. İşçi qüvvəsi çatmadığından Sarvan xəttində müdafiə işlərinin aparılması dayandırılmışdı.

Hilhil müdafiə xətti Hilhil yolayrıcı yaxınlığında dənizdən dağlara qədər uzanırdı. Xəttin ümumi uzunluğu 8 verst idi. Torpaq işləri qurtarmışdı. Tikanlı məftillərin isə dirəkləri basdırılmış, özü isə hələ çəkilməmişdi.

Samur körpüsünün və Mixaylovsk limanının möhkəmləndirilməsi üçün qazılacaq səngərlərin yeri müəyyənləşdirilmiş, ancaq lazım olan olan işlər hələ görülməmişdi.

Ştabs-kapitan Sereteli müdafiə xətlərinin keçdiyi ərazidə torpağın yumşaq olduğu üçün heç olmasa pulemyot mövqelərinin betondan düzəldilməsini məqsədəuyğun bilirdi. Bundan əlavə o, Şirvanlıdan-Qubaya, Qubadan-Kozlyakovka-Şahnəzərli və Hilhil yolayrıcı arasında olan torpaq yolu bərpa etməyi də təklif edirdi. Mə'lumatının sonunda Sereteli işlərin sür'ətləndirilməsi üçün Hərbi Nazirliyin qarşısında istehkam mütəxəssislərinin və işçi qüvvəsinin artırılması barədə vəsatət qaldırırdı (bax:126, v.8-9).

General Usubovun verdiyi təklif və mülahizələrə görə Könüllü ordu Dağıstandan üç yolla Bakıya hücum edə bilərdi: Dərbənd-Quba şosse yolu ilə, Petrovsk-Bakı dəmiryolu xətti ilə və dəniz sahili ilə Dərbənddən Bakıya gələn yolla. Onun fikrincə, birinci və üçüncü yol az ehtimal olunan variant idi. Çünki birinci variantda Dərbənddən gələn şosse yolu Qubada qurtarırdı. Sonra isə yol elə də rahat deyildi. Bu isə düşmənin hərəkətini çətinləşdirəcəyindən həmin variantın seçiləcəyi inandırıcı deyildi. Eyni zamanda düşmən Qubada güclü partizan müqavimətı ilə rastlaşacağını da sözsüz ki, nəzərə alacaqdı. Üçüncü variant da az işləkliyi üzündən real deyildi. Bu yolla texnikanın hərəkəti çox çətin idi. Çoxsaylı qüvvələr üçün də bu ağır yolla hərəkət əlverişli deyildi. Düşmənin ehtimalı hərəkətinin Petrovsk-Bakı dəmiryolu ilə daha real olduğundan general Usubov əsas diqqəti də bu yolun ətrafının möhkəmləndirilməsinə yönəltməyi düzgün sayırdı. Dəmir yolu həm də Bakıya ən kəsə yol idi (126, v.114).

General Usubov ilkin müdafiə mövqelərinin Samur çayı boyunca yerləşdirilməsini lazım bilirdi.Ancaq onun yazdığına görə burada topları yerləşdirmək çətin idi.Çünki bir tərəfdən düşmən xeyli yaxında idi, digər tərəfdən də Samur çayının ətrafı bataqlıq idi. Bu da topların işlədilməsi üçün çətinlik yaradırdı. General Samur çayı üzərindən keçən körpünün partladılmasına da vaxtında hazırlıq görməyi təklif edirdi. Sonra o, ştabs-kapitan Seretelinin göstərdiyi müdafiə xətlərinin adını çəkir və onların möhkəmləndirilməsi üzərində dayanırdı. Dəniz sahilinin müdafiəsinin möhkəmləndirilməsinə gəlincə isə general Usubov çevik ehtiyat qruplarının yaradılmasını və onları dəmiryolu ilə lazım olan vaxt lazım olan yerə atılmasına hazırlanmasını irəli sürürdü (126, v.70).



Şimal sərhədinin qorunması üçün 2-ci diviziyanın komandanlığının sərəncamında 4-cü Quba piyada alayı, 5-ci Bakı piyada alayı, Gəncə piyada alayının yığma taboru, zirehli qatar, 2 top batareyası var idi. 5-6 min nəfərlik partizan dəstəsinin də şimal sərhədinin müdafiəsinə cəlb ediləcəyi planlaşdırılmışdı. Azərbaycan ərazisinə təhlükə reallaşdığı təqdirdə bu qüvvələr aşağıdakı kimi bölüşdürülməli idi: 1) Zaqatala quberniyasının partizanları Dağıstan ərazisinə yeriyərək Axtı məntəqəsini və Samur çayı hövzəsini tutmalı və Könüllü ordunun arxasında ona qarşı təhlükə yaratmalı idi; 2) Nuxa qəzasının partizanları da Dağıstan ərazisinə keçməli, düşmənə arxadan zərbə vurmaqla bərabər hərəkət istiqamətində manevçiliklər yaratmalı idi; 3) Quba partizanlarından isə əraziləri yaxşı tanıdıqları üçün həm nizami süvari bölmələr yetişənə kimi kəşfiyyatın aparılmasında, cinahların qorunmasında, Fərqat kənddən Giləziyə kimi olan ərazidən dənizin müşahidə altında saxlanılmasında, həm də Qızılburun limanının tutulmasında istifadə edilməsi nəzərdə tutulurdu (126, v.70).

Diviziyanın nizami hissələri isə aşağıdakı mövqeləri tutmalı idilər: 1) 4-cü Quba piyada alayı və 3-cü Gəncə piyada alayının yığma taboru Ləcət-Xəzri ön mövqelərini tutmalı və qorumalı idilər; 2) 5-ci Bakı piyada alayı isə Xaçmaz-Xudat stansiyalarına gətirilərək diviziyanın ehtiyat qüvvəsini təşkil etməli idi; 3) 1-ci Tatar süvari alayının bölmələri Könüllü ordu bölmələri ilə toqquşma baş verənədək kəşfiyyatla məşğul olmalı, döyüşlər başladıqdan sonra isə düşmənin arxasında və cinahlarında vuruşmalı idi; 4) 5-ci Bakı piyada alayının bir bölüyü, partizan dəstəsi, topçu və pulemyot taqımları ilə birlikdə çevik ehtiyat qüvvəsi kimi Xaçmaz və Qızılburunda saxlanmalı idi və nəhayət, 5) zirehli qatar Yalama stansiyasına doğru hərəkət edərək Samur körpüsündən keçmək istəyən Könüllü ordu dəstələrinin hərəkətini ləngitməli idi (126, v.71).

Bakı ətrafında görülmüş müdafiə işlərinin vəziyyətini yoxlamaq üçün 1919-cu ilin avqust ayında M. Sulkeviçin xahişi ilə gürcü generalları Kutalaşvili və Takayşvili Azərbaycana gəlmişdilər (129, v.2). General Takayşvili Bakı həndəvərində müdafiə-istehkam işlərinin aparılması ilə tanış olduqdan sonra Hərbi Nazirliyin rəhbərliyinə yazdığı mə'lumatında aşağıdakı məsələlərin həll edilməsini lazım bilirdi. Onun fikrincə, istehkam işlərinə cəlb edilmiş hər bir qrupun müfəssəl iş planı hazırlanmalı idi; işçilər üçün binalar hazırlanmalı idi, işçilər üçün yemək və su gətirilməli və lazımı sayda işçi toplanmalı idi. General Takayşvili tezliklə Bakı ətrafında aparılan istehkam işlərinin rəisinin tə'yin edilməsini və planlaşdırılan işlərin icrası üçün 1-2 milyon rubl vəsait ayrılmasını da lazım bilirdi (129, v.20).

Hərbi nazir S. Mehmandarov Dövlət Müdafiə Komitəsinin sədrinin adına yazdığı raportda bildirirdi ki, respublikanın sərhədlərinin düşmən təcavüzünə mə'ruz qaldığı təqdirdə Bakı şəhərinin lazımi şəkildə müdafiə

olunması üçün artıq şəhər ətrafındakı köhnə səngərlərin bərpasına, məftil manеələrin yaradılmasına, Bakı buxtasına gəmilərin girməsinə mane olacaq batareyanın yerləşdirilməsinə. 1915-16-cı illərdə aid olan telefon şəbəkəsinin yenidən qurulmasına başlanmışdır. Bu işlərin ardıcıl şəkildə davam etdirilməsi və sona çatdırılması üçün hərbi nazir Bakı İstehkamat hissəsinin təşkili barədə vəsatət qaldırırdı (129, v.26). Mə'lumdur ki, bu vəsatət Dövlət Müdafiə Komitəsi tərəfindən də müdafiə olunmuşdu.

Müdafiə tikililərinin aparılması ilə bərabər strateji məntəqələr arasında rabitənin təşkili, düşmənin hücum edəcəyi təqdirdə qoşun hissələrinin sabit şəkildə idarə edilməsinin mümkünlüyü Hərbi Nazirliyin rəhbərliyinin diqqət mərkəzində idi. Yalamadan-Bakıya və Ələtə qədər olan teleqraf xətti Bakı ilə şimal məntəqələri arasında əlaqənin yaradılmasına imkan verirdi. Ancaq düşmən bölmələrinin hücumu ilə bu əlaqə qırıldığı təqdirdə şimaldakı qoşun bölmələri ilə rabitəni tə'min etmək qeyri-mümkün olacaqdı. Buna görə də Hərbi Nazirliyin rəhbərliyi ehtiyat üçün digər teleqraf xətlərinin çəkilməsini də məqsədəuyğun bilirdi. Belə xətt Quba-Şamaxı və Şamaxı-Bakı teleqraf xətti olmalı idi. Döyüş bölgəsindən xeyli uzaqda olan bu teleqraf xətti sabit rabitə əlaqəsinin qurulmasına imkan verə bilərdi. Nazirliyin rəhbərliyi Şamaxıda aralıq bazalarının yaradılmasını və bunun üçün Kürdəmir-Şamaxı yolunun möhkəmləndirilməsini də məqsədəuyğun sayırdı. Sentyabr ayının 18-də Dövlət Müdafiə Komitəsinin iclasında bu təkliflər müzakirə edildi və müdafiə olunurdu (129, v.31,39).

Şəhərdaxili telefon şəbəkəsi də yenidən quruldu. Krasnovodsk küçəsi ilə Birja küçələrinin kəsişməsində yerləşən mərkəzi telefon stansiyası Bakı İstehkamat hissəsinin rəisinə tabe edilmişdi. Bu telefon stansiyası həm Bakının həndəvəri, həm də şəhərdən uzaq olan məntəqələrlə əlaqə yaratmağa imkan verirdi. Mərkəzi telefon stansiyasından Bakı İstehkamat hissəsinin rəisinin mənzilinə, Şıx və Zığ burunlarına, Nargın adasına və şəhərlərarası stansiyaya xətlər çəkilmişdi. Şəhərlərarası stansiyadan Nazirlər Şurasının sədri, rabitə naziri, parlament, Salyan kazarmaları, Abşeron, Tiflis, Gəncə, Xaçmaz, Yalama, Şuşa, bütün dəmiryolu stansiyaları, Bakı şəhər polis rəisi ilə əlaqə yaradılmışdı. Şəhərlərarası stansiyadan əlavə olaraq hərbi nazir, Ərkani – hərbin rəisi, Bakı şəhər başçısı, rabitə dairəsi rəisi ilə rabitə yaradılması planlaşdırılırdı. Bu şəhərarası telefon danışıqlarına gizli qulaq asılması mümkün deyildi ki, bu da onun e'tibarlılığını artırırdı (129, v.65, bax: şəkil 10).

Gürcü generalı Takayşvilinin rəhbərliyi altında Bakının və onun ətrafının konkret müdafiəsi planı da hazırlanmışdı. Həmin planda müdafiə mövqelərinin yeri və mövqelərin qorunması üçün zəruri olan qüvvə və vəsait müfəssəl şəkildə açıqlanmışdı. General Takayşvilinin fikrincə, əgər Azərbaycan hökuməti dənizdə hərbi gəmilərə malik olsaydı onda yalnız Şıx burnunun və Kürdlər burnunun möhkəmləndirilməsi dənizdən olа biləcək təhlükənin qarşısını almağa imkan verərdi. Dəniz qüvvələrinin olmaması üzündən şəhərin ətrafının daha yaxşı möhkəmləndirilməsi lazım gəlirdi.

Bakının həndəvərinin müdafiəsi iki tərkib hissədən ibarət idi: 1) Abşeron yarımadasının müdafiəsi, 2) Bakı şəhərinin müdafiəsi. Birinci müdafiə xətti Patamdardan Masazır gölünə kimi uzanırdı. Bu xətt üzrə 7 dayaq qrupu yerləşdirilməli və onların müdafiə mövqeləri hazırlanmalı idi. Həmin qruplar bunlar idi: 1) Patamdar qrupu, 2) Atəşkan qrupu, 3) Aralıq qrupu, 4) Şabandağ qrupu, 5) Xırdalan qrupu, 6) Göl qrupu, 7) Novxanı qrupu. 1-ci, 3-cü və 6-cı dayaq qruplarının hər birində 2 bölük piyada, 4 ədəd pulemyot və 2 ədəd top olmalı idi. Digər dayaq qruplarında isə 4 bölük piyada, 8 ədəd pulemyot və 2 ədəd top olmalı idi. Beləliklə, birinci müdafiə xəttində 5,5 tabor piyada, 44 ədəd pulemyot və 12 ədəd top var idi. Əlavə olaraq ehtiyatda 2,5 tabor piyada, 20 ədəd pulemyot və 4 ədəd top saxlanmalı idi. Cəmi birinci müdafiə xətti üçün 8 tabor piyada qüvvəsi, 64 ədəd pulemyot, 16 ədəd top nəzərdə tutulmuşdu. Bunlardan əlavə dəniz sahilinin qorunması üçün də 6 ədəd top ayrılmalı idi (129, v.61-62).

İkinci müdafiə xətti Biləcəri-Böyük Şor-Razin dağı və Əhmədli yüksəkliyindən keçirdi. Bu xətt üzrə 6 dayaq qrupu yerləşdirilməli idi. Onlar aşağıdakı qaydada düzülmüşdülər. 8) Biləcəri qrupu, 9) Dərnəgül qrupu, 10) Keşlə qrupu, 11) Güvüldağ qrupu, 12) Əhmədli qrupu, 13) Zığ qrupu. Bu qrupların hər biri üçün 2 piyada bölüyü, 8 ədəd pulemyot və 2 ədəd top nəzərdə tutulmuşdu. Dayaq qruplarının hər biri üçün səngərlər qazılmalı, səngərlər arasında əlaqələr yaradılmalı, atəş mögeləri düzəldilməli və onların ətrafında tikanlı məftillərdən maneələr qurulmalı idi (129, v.62, bax: şəkil 12).

Noyabr ayının əvvəllərində general Takayşvili özü şəxsən tərtib etdiyi müdafiə planının icrası gedişini yoxladı. Bütünlükdə müdafiə-istehkam işlərinin aparılması səviyyəsi onu qane etmirdi. Onun hərbi nazir S.Mehmandarovun adına yazdığı raportdan aydın olurdu ki, Şıx və Sultan burunlarında, habelə, Nargın adasında əlavə yaradılmış 14-cü dayaq qrupunda istehkam işlərinin vəziyyəti ilə tanış olmuşdu. Şıx burnunda və Nargın adasında işlər yaxşı gedirdi. Sultan (Zığ) burnunda isə görülən işlər lazımı tələblərə cavab vermirdi. Burada topların yerləşdirilməsi üçün səngərlər dənizdən 10-12 sajen aralı, çox da hündür olmayan və tamamilə açıq bir sahədə qazılırdı. İlkin planda nəzərdə tutulan dayaq məntəqəsi isə tamamilə başqa sahədə idi və həmin sahə seçilərkən ərazinin müdafiə xüsusiyyətlərinə ciddi fikir verilmişdi. Adları çəkilən dayaq qruplarında, habelə 1-ci, 4-cü və 5-ci dayaq qruplarında yalnız torpaq işləri görülmüşdü. Sığınacaqların, atəş mövqelərinin, barıt ehtiyatlarının saxlanması üçün yerlərin tikilməsinə, dayaq qrupları ətrafında sün'i maneələrin yaradılmasına hələ başlanmamışdı. General Takayşvilinin fikrincə, işlərin mövcud

sür'ətinin saxlanacağı təqdirdə ilin sonunadək onların icra ediləcəyi heç inandırıcı da deyildi (129, v. 54).

Bakının ətrafının müdafiəsi ilə bağlı M.Sulkeviçin irəli sürdüyü təkliflər içərisində şəhərin artilleriya müdafiəsinə xüsusi yer verilirdi. Yuxarıda qeyd edildiyi kimi, müdafiə batareyalarının Şıx, Sultan (Zığ) burunlarında və Nargin adasında yerləşdirilməsi planlaşdırılırdı. Bu mövqelər içərisində isə Nargin adasındakı mövqe daha böyük əhəmiyyətə malik idi. Aparılan müşahidələr göstərirdi ki, düşmən bu adanı ələ keçirib onun mərkəzindəki yüksəkliyin üzərində toplar yerləşdirsəydi şəhərin dənizdən qorunması qeyri-mümkün olardı. Çünki Bakı körfəzində hərbi gəmilər yox idi. Nargin adasındakı top mövqelərini yalnız şəhərin kənarında qurulmuş toplarla susdurmaq olardı. Nargin adasının coğrafi şəraiti isə elə idi ki, burada topları e'tibarlı şəkildə yerləşdirmək və şəhərdən atılan atəşlərdən qorunmaq olardı.

Nargin adasında topların yerləşdirilməsi ilə bağlı hazırlanan mülahizələrdə dairəvi mövqelərin düzəldılməsi təklif olunurdu. Belə mövqelər toplara bütün istiqamətlərdə üfüqi atəş aparmağa imkan verərdi. 2,5 verst uzunluğu olan Nargin adasına göndəriləcək batareyanın iki taqıma bölünməsi və müxtəlif nöqtələrdə yerləşdirilməsi planlaşdırılırdı. Bu taqımların hər biri şəhərin bir tərəfini nəzarət altında saxlaya bilərdi. Şəhər ətrafında yerləşdirilən batareyaların hər biri üçün müşahidə məntəqələri yaradılmalı idi. Müşahidə məntəqələrindən həm top atəşləri istiqamətləndirilməli, həm də ətraf ərazi nəzarət altında saxlanmalı idi. Bütün batareyalar və qərargah arasında telefon və ya digər nöqtələri yaradılması da nəzərdən qaçırılmamışdı (bax: şəkil 11).

Hərbi Nazirliyin rəhbərliyi tərəfindən ümumi səfərbərlik e'lan edildiyi təqdirdə dəmiryolu xətlərinin qorunması haqqında tə'limat da hazırlanmışdı. Tə'limata əsasən Azərbaycanın dəmiryolu xətləri beş sahəyə bölünmüşdü: Poylu-Qovlar, Qovlar-Yevlax, Yevlax-Hacıqabul, Hacıqabul-Biləcəri-Bakı, Biləcəri-Samurçay sahələri. Səfərbərlik e'lan edilən kimi bütün dəmiryolu xətti habelə Şollar su kəməri mövcud olan dəmiryolu mühafizə bölmələri tərəfindən qorunmalı idi. Bu bölmələrə kömək göndərilməsi də nəzərdə tutulurdu. Həmin kömək dəmiryolu xətti boyu yaşayış məntəqələrindən toplanacaq yaşı 40-43 arasında olan e'tibarlı vətəndaşlardan təşkil olunmalı idi. Onların nə qədər və nə vaxt çağırılması ümumi göstərişdən sonra qəza rəisləri tərəfindən dəmiryolu rəisləri ilə razılaşdırılmaqla həyata keçirilməli idi (126, v.99).

Bakı İstehkamat hissəsinin istehkam-mühəndis işlərinin rəisi tə'yin edilmiş podpolkovnik Vəkilov şimaldan müdafiənin e'tibarlılığını artırmaq üçün Quba-Qusar-Şollar su kəməri sahəsində əlavə tədbirlərin görülməsini təklif edirdi. Onun qənaəti belə idi ki, Xəzri müdafiə mövqeləri ilə Çorxı mövqelərinin arasında böyük məsafə var idi və bu ərazi müdafiəsiz



qalmışdı. O, həmin sahədə aralıq dayaq qruplarının olmasını məqsədəuyğun sayırdı. Bu dayaq qrupları Quba-Qusar, Xudat-Xaçmaz ətrafında yerləşdirilməli idi. Konkret olaraq dayaq qrupunun Vladimirovka-Nikolayevka xətti üzrə yerləşdirilməsi təklif olunurdu. Bu dayaq qrupu yaxınlaşan düşmənin sıralarını pozub onun hərəkətini xeyli ləngidə bilərdi. Podpolkovnik Vəkilovun təklif etdiyi dayaq qrupunun ərazisi də coğrafi baxımdan əlverişli idi. Ərazinin bu xüsusiyyətləri də dayaq qrupunun möhkəmləndirilməsi zəmin yaradırdı (126, v.112).

Puta və Ələt stansiyaları arasında dəmir yolu xəttının dənizə xeyli yaxın olması üzündən onun müdafiəsinin gücləndirilməsi də zəruri sayılırdı. Düşmənin hərbi gəmisi dənizdən bu yolla hərəkəti tamamilə dayandıra və yolları da xarab edə bilərdi. Ona görə təklif edilirdi ki,bu ərazidə də dənizin müşahidəsi təşkil edilsin. Bunun üçün Ələt limanı yaxınlığında yüksəkliklərdə bir batareyanın yerləşdirilməsi, limanın kənarlarında isə bir piyada bölüyünün yerləşdirilməsi üçün səngərlərin qazılması, 4 ədəd pulemyot üçün atəş mövqeləri hazırlanması həmin sahədə dənizdən müdafiəni xeyli möhkəmləndirmiş olardı. Dəmiryolu xəttinin mühafizəsi üçün zirehli qatardan istifadə edilməsi də nəzərdə tutulurdu (126, v.113).

İngilis qoşunları Azərbaycanı tərk edəndən sonra Könüllü ordunun hissə və bölmələrinin sərhəd xətti yaxınlığındakı fəallığı xeyli artmışdı. Şimal bölgəsində yerləşən hissələrin komandanlığı ilə Ərkani-hərbin rəisi M.Sulkeviçin yazışmalarından aydın olur ki, Könüllü ordunun hərbçiləri sərhəd xətti yaxınlığında təxribatlar törədir, Könüllü ordunun zirehli qatarı vaxtaşırı burada manevrlər edirdi. M.Sulkeviç də göstəriş vermişdi ki, Azərbaycan Ordusuna məxsus olan zirehli qatar vaxtaşırı sərhəd xəttinə çıxarılsın, Azərbaycanın qoşun hissələrinin Könüllü ordunun hər cürə təxribatına qarşı hazır olduqlarını nümayiş etdirsin (163, v.11).

Ancaq avqust ayında Dağıstanda yerli qüvvələrin Könüllü orduya qarşı xeyli fəallaşması, habelə Armavirdə bu orduya arxadan ciddi təhlükə yaranması denikinçilərin Azərbaycana soxulmasının tə'xirə saldı (243, s.56).

Denikinçilər şimaldan Azərbaycana təzyiq göstərdikləri kimi şərqdən – Xəzər dənizindən də təzyiq göstərməyə çalışır, dəniz hövzəsini tamamilə öz nəzarətləri altında saxlamağa cəhd edirdilər. Onlar Azərbaycanın dənizdən müdafiəsinin gücləndirilməsi üçün müvafiq tədbirlər görülməsini ciddi narahatçılıqla yaşayırdılar. Mə'lumdur ki, 1919-cu il sentyabrın 1-də Bakıda hərbi liman yaradılmış, oktyabrın 1-də isə "Astrabad" hərbi gəmisinin komplektləşdirilməsinə başlanmışdı (100, v.8).

Yuxarıda qeyd edildiyi kimi, bir sıra digər üzən vasitələrin müdafiə məqsədilə hərbi baxımdan təchizi planlaşdırılırdı. Bakıdakı saysız casusların vasitəsilə bunlardan xəbər tutan Könüllü ordu komandanlığı Azərbaycan hökumətinə nota göndərərək bildirirdi ki, 1828-ci ildə Rusiya və İran arasında imzalanmış müqavilənin 8-ci maddəsinə əsasən Xəzər dəni-

zındə hərbi gəmiləri yalnız Rusiya dövləti saxlaya bilər. Ticarət gəmilərini isə Rusiya və İran saxlaya bilər. Denikinçilərin fikrinə görə Azərbaycan Xəzər dənizində nə ticarət, nə də hərbi gəmilər saxlaya bilər və onları Azərbaycandan tələb edirdilər ki, Xəzər dənizinə gəmi çıxarmaq niyyətinə son qoysunlar (82, v.3).

1919-cu il oktyabrın 21-də Dövlət Müdafiə Komitəsi öz iclasında Könüllü ordu komandanlığının irəli sürdüyü tələbləri müzakirə etdi və Xarici İşlər Nazirliyinə tapşırdı ki, Cənubi Rusiya Silahlı Qüvvələrinin baş komandanı Denikinə aşağıdakıları çatdırsın: 1) Rusiya ilə İran arasında imzalanmış Türkmənçay müqaviləsi yalnız Rusiya və İrana aid ola bilər. Bu müqavilə Xəzər ətrafında yaradılmış yeni dövlətlərə şamil edilə bilməz; 2) Azərbaycan Xəzər dənizinin sahilində yerləşdiyi üçün onun limanı və ticarət gəmiləri var və bu gəmilər Azərbaycanın bayrağı altında üzəcəklər. Dövlət Müdafiə Komitəsi Denikinin tələblərini müstəqil Azərbaycan respublikasının suveren hüquqlarına müdaxilə kimi qiymətləndirirdi (82, v.4).

Oktyabrın 26-da Azərbaycanın Xarici İşlər Nazirliyi müttəfiq dövlətlərin Qafqazdakı ali komissarı polkovnik Haskelə, Britaniya hökumətinin Zaqafqaziyadakı Ali komissarı Uordropa məktub göndərdi və Denikinin qanunsuz hədələri onların diqqətinə çatdırıldı. Məktubda açıqlanırdı ki, Britaniya hökuməti Azərbaycanın qanuni tələblərinə qulaq asmadı, bolşevizmlə mübarizə adı altında bütün hərbi gəmiləri Denikinə təslim etdi. Denikinə verilən hərbi gəmilərin müstəqil Azərbaycana qarşı istifadə edilməyəcəyi və'd olunsa da indi Könüllü ordunun respublikaya qarşı hədələri reallaşmaqdadır. Azərbaycanın Xarici İşlər Nazirliyi məktubda Denikinə lazımi tə'sir göstərilməsini xahiş edirdi (82, v.7).

1919-cu ilin noyabr ayında şimalda bir sıra hərbi uğurlar qazandıqdan sonra Könüllü ordunun mövqeləri yenə möhkəmləndirildi və Azərbaycan üzərinə hücum təhlükəsi artdı. Könüllü ordunun fəallaşması ilə bir zamanda onunla sıx əlaqədə olan Ermənistanın silahlı qüvvələrinin də təcavüzkarlığı genişlənirdi. Zəngəzur ekspedisiyasının başlaması ilə Denikin qüvvələri Dağıstan ərazisində bir sıra yayındırıcı manevrlər etməyə də cəhd göstərdi.

Ermənistanın və Könüllü ordunun Azərbaycana qarşı cəbhə açacaqları vaxt respublika ordusu hissə və bölmələrinin necə və harada yerləşəcəyi barədə Ərkani-hərb tərəfdən xüsusi plan hazırlandı. Bu plana görə Ermənistanının və Könüllü ordunun aşağıdakı əməliyyat istiqamətlərindən hücum edəcəyi güman edilirdi: 1) Yalama-Xaçmaz-Bakı; 2) Dilican-Qazax-Akstafa; 3) Dilican-Gədəbəy-Gəncə; 4) Gorus-Şuşa-Yevlax.

Rusiyada vətəndaş müharibəsinin təcrübəsi göstərirdi ki, istər Könüllü ordu, istərsə də bolşevik qüvvələri əsasən dəmir yolu xətti boyunca əməliyyatlar aparırdılar. Bu onlara nəqliyyat və təxliyyə məsələlərini həll etməyə imkan verirdi. Ona görə Könüllü ordunun Azərbaycana doğru irəliləməyi təqdirdə hücumun dəmir yolu xətti boyunca aparılacağı şübhə doğurmurdu. Təcavüzkarlara müqavimət göstərəcək qoşun hissələrinin də əsasən dəmir yolu xətti boyunca yerləşdirilməsi nəzərdə tutulurdu. Quba rayonu ərazisində bir piyada diviziyası, bir süvari diviziyası və partizanlar yerləşdirilməli idi. Piyada diviziyasının bir alayının ehtiyat qüvvəsi kimi Xaçmazda saxlanması nəzərdə tutulurdu. Bu alay zərurət yaranardısa Samur çayı mövqelərinin gücləndirilməsinə göndərilməli idi. Dənizdən desant atılacağı təqdirdə də bu alay döyüşə qoşulmalı idi. Güman edilirdi ki, Könüllü ordu ilə mübarizə etmək üçün Gürcüstan da öz diviziyasını göndərəcəkdir. Həmin diviziya da Quba rayonu ərazisində yerləşməli idi. (127, v.19).

Ərkani-hərbin Qarabağda kütləvi erməni hücumlarının başlanmasından əvvəl hazırladığı planda Ermənistan sərhədində, Qarabağda və Gəncədə az bir qüvvə saxlanması planlaşdırılırdı. Ermənistanla sərhədin müdafiəsi qərərgahı Gəncədə yerləşəcək arxa cəbhə qoşunları komandanına tabe olmalı idi Səfərbərlik e'lan edilən kimi Azərbaycan parlamenti və hökuməti də Gəncəyə köçməli idi.

Azərbaycanla Dağıstanın sərhədindən keçən Samur çayı təbii maneə kimi hərbi baxımdan elə də böyük əhəmiyyət kəsb etmirdi. İlin çox vaxtı çayda su az olurdu və onu asanlıqla keçmək mümkün idi. Bu isə Azərbaycan ərazilərinin müdafiəsini xeyli çətinləşdirirdi. Ərazini yaxşı öyrəndikdən sonra Ərkani-hərbin rəisi M.Sulkeviçin fikrincə, müdafiə xəttinin bir qədər irəlidə, Dağıstan ərazisində yaradılması daha səmərəli olardı. O bildirdi ki, şərait imkan verərsə qoşun hissələrini irəliyə göndərib onları Dərbənd ətrafında yerləşdirmək lazımdır. Buranın coğrafi şəraiti çox az qüvvə ilə çoxsaylı qoşunun qarşısını saxlamağa imkan verirdi. Dərbənd yaxınlığında dənizlə dağlar arasındakı ərazi cəmi 2-3 verst idi. M.Sulkeviçin fikrincə, burada bir alay və möhkəmləndirilmiş ehtiyat qüvvə Könüllü ordunun Azərbaycana doğru hərəkət imkanlarını xeyli məhdudlaşdıra bilərdi (127, v.20).

Ancaq mə'lumdur ki, 1920-ci ilin mart ayında Qarabağda kütləvi erməni hücumlarının başlanması ilə Azərbaycan qoşunları əsasən burada cəmləşdi. Şimal sərhədinin müdafiəsi üçün nəzərdə tutulan Quba, Bakı piyada alaylarının, Tatar süvari alayının bölmələri Qarabağa atıldığından şimal sərhədləri tamamilə boşaldılmışdı.

Bakı şəhəri üzərinə təcavüz reallaşdıqda və həyəcan siqnalı alındıqda şəhərdəki qüvvələrin yerləşdirilməsi başa çatdırılmış və onların qarşısında dayanan vəzifələr müəyyənləşdirilmişdi. Bakı İstehkamat hissəsinin əmrinə əsasən həyəcan siqnalı verilən kimi "Rüstəm" zirehli avtomobili Hərbi məktəbin həyətində, "Zorab" zirehli avtomobili isə Bakı İstehkamat hissəsi qərargahının həyətində döyüş mövqeyi tutmalı idi. "Astrabad" və "Pı-

"rallahı" hərbi gəmiləri isə hərəkətə hazır vəziyyətə gətirilməli və lazım olardısa verilən tapşırıqların icrasına yollanmalı idilər. Şıx və Zığ burunları arasında əlaqələrin yaradılması üçün ticarət limanının rəisi tərəfindən 2 ədəd barkas ayrılmalı idi. Şəhərdə və onun ətrafında yerləşən topçu hissə və bölmələri güclü mühafizə altına alınmalı idi. 2-ci topçu briqadasının 1-ci yüngül batareyasının mühafizəsi 6-cı Göyçay piyada alayına, dağ-süvari batareyasının mühafizəsi isə 2-ci piyada diviziyası pulemyot məktəbinin bir taqımına tapşırılmışdı. Həyəcan siqnalının verilməsi ilə hər bir alay və batareya Bakı İstehkamat hissəsinin qərargahına bir çapar göndərməli idi. Bundan başqa qarovula göndərilən əsgərlərin patronlarının sayının 120-yə çatdırılması və 7 günlük ərzaq ehtiyatının tədarük edilməsi lazım bilinirdi (126, v.69).

Həyəcan siqnalı alınan kimi Bakı qarnizonunun hissələri aşağıdakı mövqeləri tutmalı idilər:

1. 6-cı Göyçay piyada alayı həyəcan siqnalını eşidən kimi tam döyüş hazırlığı vəziyyəti almalı və 2-ci diviziya komandirinin (o həm də Bakı İstehkamat hissəsinin rəisi idi - M.S.) əmrini gözləməli idi;
2. Hərbi məktəb 2 ədəd pulemyot və "Rüstəm" zirehli avtomobili ilə tam döyüş hazırlığı vəziyyətində məktəbin binasında gözləməli idi;
3. İstehkam məktəbinin yarım bölüyü hökumət binasının mühafizəsini, yarım bölüyü isə şəhər bağında dayanaraq Hərbi Nazirliyin mühafizəsini tə'min etməl idi;
4. "Perley" zirehli avtomobili hökumətin binası qarşısında dayanmalı idi. Bu rayonun mühafizə rəisi İstehkam məktəbinin rəisi polkovnik Bekov tə'yin edilmişdi;
5. Parlamentin mühafizə dəstəsi həm parlament binasının və ətrafının mühafizəsini tə'min etməli, həm də qarnizon qauptvaxtının mühafizəsini gücləndirməli idi. Bu sahənin rəisi polkovnik Əliyev tə'yin edilmişdi;
6. 2-ci topçu briqadasının birinci yüngül batareyası Bayılda müəyyənləşdirilmiş mövqelərdə yerləşməli idi. Bayıl rayonunun mühafizə rəisi polkovnik Sultanov tə'yin edilmişdi;
7. Dağ-süvari batareyası tə'yin edilmiş məntəqəyə çıxmalı idi. Həmin məntəqənin rəisi podpolkovnik Dunin-Mansenkeviç tə'yin edilmişdi;
8. Mövqe batareyası tam döyüş hazırlığı vəziyyətində olmalı və mövqenin sektorlarını nəzarət altında saxlamalı idi;
9. "Astrabad" və "Pirallahı" gəmiləri 20-ci körpüyə yan alıb döyüşə hazır olmalı idi. Hərbi gəmilərə ümumi rəhbərlik "Astrabad"ın kapitanı baş leytenant Kitançızadəyə tapşırılmışdı;
10. 1-№-li zirehli qatar Bakı və Keşlə stansiyaları arasında daimi hərəkətdə olmalı idi;
11. Anbarların mühafizəsinə əlavə qüvvələr ayrılmalı idi (126, v.69).



1920-ci ilin əvvəllərində Qırmızı ordunun uğurlu hərbi əməliyyatları Könüllü ordunun vəziyyətini yenidən xeyli ağırlaşdırırdı. Həmin ilin mart ayında denikinçilər ağır zərbə alıb məhv olmaq təhlükəsi ilə qarşılaşdılar. Meydana çıxan yeni hərbi şərait Denikinin Azərbaycana qarşı təcavüzünü xeyli zəiflətsə də başqa bir təhlükə - bolşevizm təhlükəsi Azərbaycana yaxınlaşmaqda idi. Qafqaz bolşevik diyar komitəsinin hələ 1919-cu ilin dekabrında yaydığı müraciətdə deyilirdi ki, Denikinin məhvi Zaqafqaziya milli hökumətlərinin sonu, fəhlə və kəndli hakimiyyətlərinin təntənəsinin zəmini idi (235, s.211). Bolşevik qüvvələrinin cənuba doğru sür'ətlə irəliləməsi onların Bakıdakı fəallarının da canlanmasına zəmin yaradırdı. 1920-ci il fevralın 20-də Bakıda Azərbaycandakı kommunist təşkilatlarının ilk qurultayı keçirildi və bu qurultayın nümayəndələri siyasi hakimiyyətin ələ keçirilməsi üçün silahlı üsyana hazırlıq xəttini qəbul etdilər (235, s.219).

Mart ayında Azərbaycan hökuməti məğlub olub geri çəkilən Könüllü ordu bölmələrinin Gəncədən keçərək Gürcüstana, oradan da Rusiyaya getməsinə icazə verdi. Yuxarıda qeyd edildiyi kimi, denikinçi piyada bölmələri geri çəkilərkən müəyyən sayda silahı Azərbaycan Ordusuna təhvil verdilər. Azərbaycan hökuməti ümid edirdi ki, Könüllü ordunun rəhbərliyi Xəzər hərbi donanmasının gəmilərini də Azərbaycana təhvil verəcəkdir. Bu, Azərbaycanın hərbi potensialını, onun yaxınlaşmaqda olan bolşevizmə qarşı müqavimət gücünü xeyli artıra bilərdi. Lakin denikinçilər hərbi gəmiləri Azərbaycana təhvil vermədilər və bütün gəmilər İranın Ənzəli şəhərinə aparıldı (234, s.116).

Respublikanın müdafiə qüdrətinə vurulan ən ciddi zərbə Ermənistan qoşunlarının və silahlı dəstələrinin Qarabağda başladığı irimiqyaslı hücum idi. Ordunun əsas qüvvələrinin burada toplanması və aprel çevrilişinə qarşı onların ağır döyüşlərdən ayrılmaması şimal sərhədlərinin olduqca zəifləməsinə gətirib çıxardı. Bolşevik qüvvələri isə şimal sərhədlərində elə bir qruplaşma yaratmışdılar ki, onun Azərbaycana hücumunun qarşısının alınması heç bir reallığa uyğun deyildi.

Azərbaycanın daxilində silahlı bolşevik dəstələrinin yaradılması və onların respublika hökumətinə qarşı silahlı üsyana hazırlaşması da Qırmızı ordu hissələrinin sür'ətli hücumuna kömək etdi. Hələ aprelin 7-də Rusiya Kommunist (b) Partiyası Qafqaz diyar komitəsinin üzvü V.I.Naneyşvilinin S.M.Kirova verdiyi mə'lumatdan aydın olurdu ki, Azərbaycanda hakimiyyətin silahlı yolla devrilməsi üçün onların kifayət qədər qüvvəsi vardır. V.Naneyşvili eyni zamanda S.M.Kirovdan xahiş edirdi ki, Azərbaycana hücuma başlamazdan əvvəl müsəlmanlardan ibarət hissələr yaradılsın və onlar gizlicə Yalamaya yeridilsin (4, s.275).

Bakıdakı bolşeviklərin liderlərindən biri olan A.Mikoyan isə Azərbaycanda toplanmış olan bolşevikpərəst qüvvələrin sayı barədə S.M.Kirova

belə mə'lumat verirdi: "Təkcə Bakı şəhərində bizim qüvvələrimiz silahsız 20-30 min adama çatır. Muğanda 8-10 min silahlı adam var. Bizim 2500 tüfəng, patron, bomba və s. varımızdır... Səbirsizliklə sizi gözləyirik" (250a, s.16).

1920-ci il aprelin 8-də Azərbaycan Kommunist Partiyasının Mərkəzi Komitəsi XI Ordunun qərargahına məktub göndərərək qarşılıqlı fəaliyyət əlaqələrinin qurulması üçün öz mülahizə və təkliflərini çatdırdı. Aprelin 9-da XI ordunun rəhbərliyi A.Mikoyana teleqram göndərdi və ona Azərbaycan Ordusunun arxasında təxribat işləri aparacaq silahlı dəstələrinin təşkilinin zəruriliyi bildirildi (307, s.139).

1920-ci il martın 17-də V.İ.Lenin Qafqaz Cəbhəsi Hərbi İnqilab Şurasına göndərdiyi teleqramda Azərbaycandakı inqilabi qüvvələrə hərbi kömək göstərilməsinə razılıq verdikdən sonra (250a, s.15) XI ordunun Azərbaycanı işğal etməsinə hazırlıq son mərhələsinə qədəm qoydu. İşğalın tezliklə başa çatdırılması üçün XI ordu xeyli qüvvətləndirildi və onun tərkibinə yeni-yeni birləşmələr verildi. Ordunun istər yeni hissələrlə, istərsə də təcrübəli və inanılmış kadrlarla möhkəmləndirilməsi Sovet hökuməti rəhbərlərinin, bolşevik hərbi qüvvələri ali komandanlığının ciddi nəzarəti altına alındı. XI ordunun komandanı vəzifəsinə M.K.Levandovski tə'yin edildi. Cənub cəbhəsində aparılan hərbi əməliyyatlarda xüsusilə fərqlənmiş olan P.V.Kurışkonın komandanlığı altında olan ələhiddə süvari briqadası XI ordunun tərkibinə, 20-ci 28-ci və 32-ci nişançı diviziyalar isə ordunun əməliyyat tabeliyinə verildi. Hissə və birləşmələrin Azərbaycana doğru hücumu "III İnternasional", "Timofey Ulyansev", "Qırmızı Dağıstan", "Qırmızı Astraxan", "Stepan Razin" və "Krasnoarmeyes" zirehli qatarları ilə himayə olunmalı idi. İşğalın başlanması ərəfəsində bu qatarlar artıq Dərbənddə idilər və onlar Dərbəndlə Samur çayı üzərindəki körpü arasında manevr edərək dəmiryolu xəttini qoruyurdular (250a, s.18-19).

1920-ci il aprelin 1-də XI ordunun tərkibində üç nişançı diviziya (20-ci, 28-ci, və 32-ci), Taman atıcı briqadası, 2-ci süvari korpusu, 1-ci süvari diviziyası, 11 zirehli qatar və bir aviasiya eskadrilyası var idi. Volqa-Xəzər hərbi donanması da XI ordu komandanlığının əməliyyat tabeliyində idi və bu donanmanın hərbi gəmiləri sahil boyu piyada və süvari qüvvələrinin hərəkətini himayə edirdilər. Ordunun şəxsi hey'əti 72472 nəfərdən ibarət idi (250a, s.19).

Belə böyük bir hərbi qüvvənin Azərbaycanın sərhədləri yaxınlığında toplaşması respublika hökumətini narahat etməyə bilməzdi. Lakin onun qarşısını kəsmək üçün də lazımı sayda hərbi qüvvə yox idi. Qırmızı ordunun kəşfiyyat orqanlarının verdiyi mə'lumatlara görə aprel ayında şimal sərhədində Azərbaycanın 3 min nəfərlik bir qüvvəsi var idi (250a, s.24). Əgər bu mə'lumatın doğruluğu əsas götürülsə belə nəzərə alınmalıdır ki, həmin qüvvələrin heç də hamısı nizami qüvvələr deyildilər. Ordu qüvvələrinin azlığı üzündən şimal sərhədinə jandarm bölmələri və maliyyə nazirliyinə tabe olan sərhəd bölmələri gətirilmişdi. Onların hazırlıq səviyyəsi isə xeyli aşağı idi. Yaxınlaşan təhlükənin sovuşdurulması üçün Azərbaycan hökuməti diplomatik vasitələrə əl atdı. 1920-ci il aprelin 15-də Azərbaycanın xarici işlər naziri F.Xoyski respublikanın sərhədləri yaxınlığında bolşevik qüvvələrinin cəmlənməsinə e'tiraz əlaməti olaraq RSFSR Xarici İşlər Nazirliyinə radioqram göndərdi. Həmin radioqramda deyilirdi: "Dağıstan ərazisinin Denikin qüvvələrindən təmizlənməsindən sonra Azərbaycan xal-qı ümid edirdi ki, azad və qardaş dağlı xalqları və xalqların öz müqəddəratını tə'yin etməsi kimi ali prinsipi e'lan etmiş rus xalqı ilə məskunlaşmış şimalla dinc şəraitdə yaşayacaqdır. Bununla yanaşı hazırda Dağıstan ərazisində, Azərbaycan sərhədləri yaxınlığındakı Dərbənd rayonunda Rusiya sovet hökumətinin çoxlu hərbi qüvvələrinin cəmləşməsi müşahidə olunur. Sovet hökumətinin niyyətlərindən xəbəri olmayan Azərbaycan hökuməti xahiş edir ki, göstərilən rayonlarda qoşunların cəmləşdirilməsinin səbəbləri və məqsədi barədə mə'lumat verilsin".

Azərbaycanın xarici işlər naziri eyni zamanda Rusiya tərəfini səmimi qonşuluq əlaqələrinin yaradılmasına və bunun üçün danışıqların başlanmasına çağırırdı.

Lakin Azərbaycan hökumətinin bu diplomatik çağırışı nəticəsiz qaldı. Keçmiş Çar Rusiyası hüdudlarında sovet dövləti qurmaq üçün əlverişli şəraitə və güclü qüvvəyə malik olan bolşeviklər danışıqlara vaxt ayırmaqdansa, hücumun təşkilati məsələlərinin həlli ilə məşğul idilər. 1920-ci il aprelin 20-i ərəfəsində XI ordunun hissə və birləşmələrinin Azərbaycanın işğalı ilə nəticələnəcək hücumun həyata keçirilməsi üçün yenidən qruplaşdırılmasına başlandı. 28-ci diviziyanın hissələri Teymur xan Şurada mövqe tutdular. 32-ci diviziyanın 1-ci və 2-ci briqadaları Deşləgir-Qayakənd xəttində yerləşdirildi. 7-ci süvari diviziyaya Samur çayı boyunca Orucobaya qədər, Taman süvari briqadasına isə Orucobadan dənizə qədər olan ərazilərə nəzarət etmək tapşırıldı (307, s.145).

Aprelin 21-də Qafqaz cəbhəsinin komandanı Tuxaçevski Azərbaycanın işğalına başlanması barədə XI ordu komandanlığına və Volqa-Xəzər donanmasına əmr verdi. 490 saylı həmin əmrdə göstərilirdi ki, Azərbaycanın əsas hərbi qüvvələri qərbdə toplanmışdır. Yalama-Bakı istiqamətində isə çox az sayda qüvvə vardır. Hücum üçün əlverişli şərait olduğunu anlayan Qafqaz cəbhəsi komandanlığı XI ordunun rəhbərliyindən tələb edirdi ki, aprelin 27-də qoşunlar Azərbaycan sərhədini keçsin və sür'ətli hücumla Bakı quberniyasının ərazisini tutsun. Bu əməliyyatın həyata keçirilməsi üçün 5 gün vaxt verilirdi. Əmrə müvafiq olaraq Zaqafqaziya dəmir yolunun tutulması üçün Kürdəmirə süvari dəstələri göndərilməli, XI ordu qüvvələri Abşerona yaxınlaşarkən Volqa Xəzər donanması Ələt desant çıxarmalı idi. Desant qüvvələri Bakıya doğru hərəkət edərək neft çıxarılan əraziləri nəzarət altına götürməli idi (5, s.310).

1920-ci il aprelin 20-də digər bir əmrində Tuxaçevski XI ordunun qarşısına təkcə Bakı quberniyası deyil bütün Azərbaycanı işğal etmək vəzifəsi qoyurdu (5, s.310).

1920-ci il aprelin 25-də Petrovskda (Mahaç-Qala) XI ordu komandanlığının hərbi müşavirəsi çağırıldı. Bakıdan gəlmiş olan Azərbaycan bolşeviklərinin nümayəndələrinin iştirakı ilə işğal planının həyata keçirilməsi bir daha müzakirə edildi, lazımi məsələlər dəqiqləşdirildi (264, s.16).

Aprelin 25-də XI ordu komandanı Bakıya hücumun başlanması ilə bağlı 25 saylı əmr imzaladı. Həmin əmrin giriş hissəsində Azərbaycanın hərbi qüvvələri, harada yerləşmələri, şimal sərhədində və Bakıda olan qoşun bölmələrinin şəxsi hey'ətinin miqdarı, başlanacaq əməliyyatın məqsədi barədə mə'lumat verilirdi. Konkret olaraq Azərbaycan ərazisinin işğalı ilə bağlı olaraq hissə və birləşmələr qarşısında aşağıdakı vəzifələr qoyulmuşdu (bax: 7, s.20-24):

1. Süvari korpusu aprelin 27-də səhər saat 4-də ilkin mövqelərdən hücuma keçərək Quba və Qusarı, aprelin 28-də Qızılburunu, 29-da Astraxankanı, Şamaxı və Ağsunu işğal etməli idi. Qusardan bir süvari dəstəsi Nuxa istiqamətinə, başqa bir dəstə isə Astraxanka istiqamətinə göndərilməli idi. Şamaxı-Ağsu ərazisi işğal edildikdən sonra süvari dəstələri Nuxa və Ağsu-Qaraməryəm-Göyçay-Yevlax-Ağdam istiqamətlərində hərəkət etməli, Kür çayı üzərindəki dəmiryolu körpüsünü ələ keçirməli idi. Ağsudan başqa bir süvari dəstəsi Bakı-Gəncə dəmiryolunu tutmaq üçün Kürdəmirə göndərilməli idi. Süvari korpusunun başqa bir dəstəsi 32-ci diviziyanın süvari briqadası ilə aprelin 29-da Yaşmanı, aprelin 30-da isə Biləcəri və Bakını tutmalı idi.

2. 32-ci nişançı diviziyanın hissələri aprelin 27-də süvari korpusu ilə bir vaxtda hücuma başlayıb dəmiryolu xətti boyu irəliləməli idi. Aprelin 27-də Xaçmaz, 28-də Dəvəçi, 29-da Giləzi, 30-da Sumqayıt, mayın 1-də isə Biləcəri və Bibiheybət bu diviziya tərəfindən tutulmalı idi.

3. 28-ci nişançı diviziya may ayının 1-də Biləcərini, Bakını, Ağşəhəri, Suraxanını tutmalı idi. Bunun üçün diviziya aprelin 27-də səhər saat 9-da Biləcəridən hərəkətə başlayıb həmin gün Xudatda, aprelin 28-də Zuvanlıda, Məliklər-Padarda, aprelin 29-da Xıdırzındıda, aprelin 30-da Yaşmada olmalı və sonra Bakını ələ keçirməli idi.

4. 20-ci nişançı diviziya isə aprelin 26-da Dərbənddə cəmləşməli, aprelin 27-də səhər saat 10-da hərəkətə başlamalı idi. Bu diviziya Yalama-Xaçmaz-Qızılburun-Giləzi-Sumqayıt xətti ilə irəliləməli Xırdalan ətrafında toplaşaraq XI ordunun ehtiyat qüvvəsini təşkil etməli idi.

Göründüyü kimi bolşevik qüvvələri Samur körpüsündən Bakıya qədər olan ərazini işğal etmək üçün 5 gün vaxt ayırmışdılar. Azərbaycan sərhədində azsaylı bölmələrin dayandığını bilsələr də, görünür, bolşeviklər bu qüvvələrin müqavimətinin qırılmasının heç də asan olmayacağını güman edirdilər. Lakin 70 minlik yaxşı hazırlıqlı qoşunun qarşısını 2-3 minlik dəstə ilə saxlamaq heç də asan deyildi. O da nəzərə alınmalı idi ki, hücumda bolşeviklərin 5 ədəd zirehli qatarı da iştirak etməli idi.

Aprelin 26-da bolşeviklərin zirehli qatarlar qrupunun komandiri M.Yefremov bir neçə nəfərlə Samur çayı körpüsünə gələrək şəxsən kəşfiyyat və müşahidə apardı. Onlar özlərini qaçqın kimi təqdim edərək sərhədçilərdən süd aldılar və söhbət əsnasında Yalamada nə qədər qüvvə olduğunu, telefon xətlərinin haradan keçdiyini öyrəndilər. Həmin günü axşam Azərbaycan zirehli qatarının komandiri Lordkipanidze ilə də əlaqə saxlandı, onunla danışıqlar aparıldı. Lordkipanidze bolşeviklərə bildirdi ki, Samur körpüsü minalanıb və bolşevik qoşunları Azərbaycan sərhədini keçərsə onları çox güclü müqavimət gözləyir (238, s.93).

Lordkipanidze onu da bildirdi ki, narahat olmayın, mən tezliklə körpünün o tayına keçəcəyəm ki, sovet torpağı adlanan yerdə müvəffəqiyyətlə addımlayım və sizin Qızıl Ordunun qalıqlarının axırına çıxım" (315, s.72).

Aprelin 26-da axşam "III İnternasional" və digər 4 zirehli qatar hərəkətə hazırlıq komandası aldılar. Azərbaycan sərhədini birinci olaraq "III İnternasional" zirehli qatarı keçməli idi. Gecə saat 12-də "III İnternasional" qatarı işıqlarını keçirərək, sakitcə Samur körpüsünə yaxınlaşdı. Körpüdə dayanan jandarmlar qatarın yaxınlaşmasını görüb atəş açdılar. Lakin bolşevik silahlıları onları tərksilah etdilər. Jandarmlarla bərabər çayın sahilində mövqe tutmuş olan süvarilər də zirehli qatarı atəşə tutdular. Süvarilərlə bolşevik silahlıları arasında atışma xeyli çəkdi. Ancaq qüvvələr nisbəti bərabər deyildi və azsaylı süvarilər zirehli qatarın qarşısını saxlaya bilmədilər (315, s.74).

Bolşevik qüvvələrinə qarşı növbəti müqavimət Yalama stansiyasında göstərildi. "III İnternasional" zirehli qatarının ardınca digər üç zirehli qatar da hərəkət edirdi. Bolşeviklər belə güclü bir zərbə qüvvəsi ilə irəliyə yolu açmağa çalışsalar da Yalamada ciddi müqavimətə rast gəldilər. Burada Azərbaycan Ordusunun iki piyada bölüyü, pulemyot komandası, sərhəd jandarm dəstəsi var idi. Bölmələrin yerləşdiyi bina stansiyadan elə də uzaqda deyildi. Qatar stansiyada dayanan kimi bolşevik qüvvələri atıcı silahlarla binanı mühasirəyə aldılar. Arxadan gələn zirehli qatarlar Azərbaycan qoşunlarının yerləşdiyi binanı top atəşinə tutdular. Dörd zirehli qatarın aramsız top atəşlərinə, qatardan düşənlərin pulemyot atəşlərinə baxmayaraq azərbaycanlı döyüşçülər təslim olmaq təklifinə güclü müqavimətlə cavab verdilər. Stansiyada olan dəmiryolu işçiləri orada dayanmış sərnişin qatarının lokomotivini açıb zirehli qatarların qarşısına gətirdilər və bununla qatarın hərəkətini ləngitməyə çalışdılar. Ancaq bolşevik toplarının atəşləri ilə bu lokomativ partladıldı və yol təmizləndi. Uzun çəkən döyüşdən sonra qoşun bölmələri də müqaviməti dayandırdılar və bolşeviklər irəliyə doğru hərəkəti davam etdirdilər (315, s.74).

Ləcət stansiyası yaxınlığında Azərbaycan Ordusunun 2 ədəd top və 14 ədəd pulemyotla silahlanmış zirehli qatarı bolşevik zirehli qatarına müqavimət göstərdi. Lakin bu çox çəkmədi. Bolşeviklərin 4 zirehli qatarının qarşısının alınması elə də asan olmadığı üçün Azərbayan Ordusunun zirehli qatarı geri çəkildi. Xudat ətrafında mövqe tutmuş olan piyada və topçu bölmələrinin müqaviməti də uzun sürmədi. Bolşevik qüvvələri 10 ədəd top ələ keçirdilər (250a, s. 26).

Bə'zi xırda manеələrə baxmayaraq bolşevik qüvvələri axşama yaxın Sumqayıta çatdılar. Xırdalan-Biləcəri arasında Azərbaycan qüvvələrinin möhkəmləndirilmiş müdafiə mövqelərinin olacağı güman edildiyindən bolşevik qüvvələri zirehli qatarı tərk etdilər. Ətraf təpəliklərlə irəliləyərək qatarların hərəkətini də himayə etdilər. Zirehli qatarlar isə baş verə biləcək hücumların əvvəldən qarşısının alınması üçün ətraf ərazini güclü top atəşinə tutdular. Məftil manеələr və müdafiə mövqeləri bu atəşlərlə dağıdıldı. Biləcəri yol ayrıcında zirehli qatarların ikisi Heybət-Puta yarımstansiyasına göndərildi ki, Gəncəyə doğru hərəkəti nəzarət altına alsın (315, s.79).

Beləliklə, bolşevik qüvvələri özləri də gözləmədən gün ərzində Bakıyadək irəliləyə bildilər. Mövcud olan mə'lumatlara görə aprelin 27-də hökumətin iclasında bolşevik qüvvələrin sərhədi keçmək xəbəri müzakirə edilərkən respublikanın müdafiə imkanları barədə sorğuya hərbi nazir S.Mehmandarov bildirmişdi ki, Ermənistan silahlı qüvvələrinə müqavimət göstərmək imkanımız olsa da, bolşevik qüvvələrinin hücumunun qarşısını saxlamaq mümkün deyildir (271, s.38).

S.Mehmandarov bu fikrini şimal sərhədlərində XI Qırmızı ordunun say tərkibi ilə müqayisədə Azərbaycan qoşunlarının həddən artıq az olması ilə bağlı söyləmişdi. Hərbi Nazirliyin rəhbərliyi Dağıstan ərazisində toplaşan bolşevik qüvvələrinin potensialı barədə mə'lumat əldə etmişdi və heç şübhəsiz ki, təcrübəli hərbçilər kimi S.Mehmandarov da, onun ətrafındakılar da hərbi qarşıdurmanın heç də Azərbaycanın xeyrinə olmayacağını yaxşı görürdülər.

Bolşevik qüvvələrinin Azərbaycana hücumunun qarşısının alınması üçün Qarabağdan qoşun hissələrinin şimal sərhədinə atılması ilə bağlı hökumət daxilində bə'zi fikirlər də mövcud olmuşdur. Ancaq 1920-ci il aprelin 16-da F.Xoyski bildirirdi ki, Qarabağdan qoşunları heç bir vəchlə çıxarmaq olmaz, çünki bu, erməni silahlı qüvvələrinin Azərbaycan torpaqlarına qarşı təcavüzkarlığının yenidən alovlanmasına gətirib çıxara bilərdi (266, s.277).

1920-ci il aprelin 27-də bolşevik qüvvələrinin Azərbaycan sərhədlərini pozması xəbəri alınan kimi hərbi nazir S.Mehmandarov 1-ci piyada diviziyasının komandiri, general- mayor C.Şıxlınskiyə teleqram göndərib şimal sərhədinin müdafiəsinə hərbi qüvvə ayırması barədə əmr verdi: "Bolşeviklər Yalama stansiyasına hücum etdilər. Onlar dayanmadan irəliləyirdilər. Xudatı ələ keçiriblər. Çıxılmaz vəziyyətdəyik. Günü bu gün Qızılburuna Qazaxdan bir tabor və Gəncədən bir tabor göndərməyinizi əmr edirəm. Hər bir taborda ən azı 500 süngü və pulemyot olmalıdır. Yük qatarını artıq göndərmişik. Həmin hissələrin gəlməsi vaxtını teleqrafla bildirin. Biz taborları sabaha gözləyirik" (271, s.111-112).

S.Mehmandarov bu əmri ilə də şimalın müdafiəsi üçün köməyi Qarabağdan deyil, Gəncə və Qazaxdan göndərməyi əmr edirdi. Vəziyyətin reallıqla qiymətləndirilməsi göstərir ki, Qarabağda olan qüvvələrin şimala gətirilməsi ilə belə çox böyük zərbə qüvvəsinə malik olan XI ordunun qarşısını almaq elə də asan olmazdı. Yuxarıda erməni qüvvələri ilə gərgin döyüşlərdən sonra Qarabağdakı qoşun hissələrinin say tərkibi göstərilmişdi. Erməni millətçi qüvvələrinə qarşı aparılan gərgin mübarizə Azərbaycan Ordusuna xeyli canlı və maddi itkilər yetirmişdi. Respublikanın ərazi bütövlüyünün qorunması üçün hətta şimal sərhədlərinin müdafiəsində dayanan hissələr də Qarabağa aparılmışdı. Bütünlükdə 1920-ci ilin aprelində Azərbaycanda mövcud olan hərbi şərait sür'ətlə cənuba doğru irəliləyən sovet qüvvələrinin işğalçılıq niyyətlərindən qorunmaq üçün respublikanın xeyrinə deyildi. Bolşeviklər də bundan dərhal istifadə etdilər. İşğalçı qüvvələrin əsas zərbə qüvvəsini təşkil edən zirehli qatarların Bakıya girməsi, şəhərin giriş-çıxış nöqtələrinin tutulması Azərbaycanın müstəqilliyinə son qoydu. Aprelin 28-də respublika hökuməti, Hərbi Nazirliyin rəhbərliyi istе'fa verdi. Hakimiyyət bolşeviklərin əlinə keçdi.

Bakının tutulması ilə bolşeviklər qarşılarına qoyduğu əsas məqsədə nail olsalar da respublika ərazisində döyüşlər bir neçə gün davam etdi. 7-ci süvari diviziyasının hissələri aprelin 29-da Astraxanka kəndini, aprelin 30-da isə Şamaxı şəhərini tutdular. Mayın 1-də 28-ci nişançı diviziyasının dəstələri zirehli qatarlarla birlikdə Gəncəyə daxil oldular. May ayının 3-də dənizdən Lənkərana, mayın 4-də Astaraya desant çıxarıldı. Mayın 11-də 7-ci süvari diviziyasının hissələri Zaqatala və Balakəni tutub Gürcüstan sərhədinə çıxdılar. 32-ci atıcı diviziyasının hissələri isə Yevlaxdan Qarabağa doğru irəlilədi (250a, s.28). Beləliklə, 1920-ci il may ayının ortalarında Azərbaycan ərazisi bütünlüklə XI ordu tərəfindən tutuldu.

May ayının 7-də isə Azərbaycan Respublikası İnqilab Komitəsi Azərbaycan Ordusunu operativ, inzibati və təşkilatı planda XI ordu komandanlığına tabe etdi. Bu əmrə əsasən Zaqatala, Ağdam və Nuxa qəzalarında olan Azərbaycan qoşun hissələri süvari korpusunun komandirinə, Qazax, Şamxor, Gəncə, Cavad, Şuşa və Cəbrayıl qəzalarındakı qoşun bölmələri 32-ci diviziya komandirinə, Şamaxı, Lənkəran, Bakı qəzasındakı qoşun bölmələri 28-ci diviziyanın komandirinə, Şamaxı, Quba, Göyçay qəzasındakı qoşun bölmələri 20-ci diviziyanın komandirinə tabe olmalı idi. (7, s.44). Bununlada təşkilatı planda Azərbaycan Ordusunun müstəqilliyinə son qoyuldu.

## 4. ANTİSOVET ÜSYANLARI

Ancaq Azərbaycan Ordusunun əsgər və zabitləri xidmətində dayandıqları torpaqların işğalı, respublikanın yenidən Rusiyaya birləşdirilməsi ilə razılaşa bilmədilər. 1920-ci ilin may ayından e'tibarən Azərbaycanı üsyanlar dalğası bürüdü. Bütün bu üsyanların ilhamvericiləri və aparıcı qüvvəsi Azərbaycanın əsgər və zabitləri idi. Ordusunun dağıldığını, zabitlərinin, ziyalılarının, dövlət və siyasət adamlarının həbs və e'dam edildiyini, sərvətinin yadlar tərəfindən talandığını, bayrağının endirilərək vətəninin Rusiyaya ilhaq edildiyini görən xalq üsyana qalxdı.

İlk antisovet üsyanı Tərtərdə baş verdi. Sovet qoşunlarının Azərbaycanı işğal etməsindən qəzəblənən xalq kütlələri və keçmiş hərbçilər mühafizə-gözətçi postlarından qayıdan qırmızı bölüyə silahlı müqavimət göstərdi (15, 23.VI.1920). Çox güman ki, bu atışmada üsyançılardan şəhid olan da var idi. Çünki verilən mə'lumatlara görə mayın 28-də Tərtərdə bolşeviklərə qarşı döyüşdə şəhid düşənlərin dəfn mərasimi olmuşdu (8, 26.IV.1991).

Tərtərdə antisovet üsyanı qalxan vaxt Gəncədə də bolşevik dövlətinə qarşı narazılıqlar artmaqda, qırmızı hakimiyyətin devrilməsi üçün üsyana hazırlıq aparılmaqda idi. May ayında burada Azərbaycan Ordusunun 1800-ə qədər keçmiş əsgər və zabiti toplanmışdı. Bu hərbçilər antisovet üsyanının zərbə qüvvəsini təşkil etməli idi (19, 8.V.1992).

3-cü Şəki süvari alayının komandiri olmuş polkovnik Cahangir bəy Kazımbəyov sonralar mühacirətdə yazdığı xatirələrində Gəncə üsyanına hazırlıq aparılmasını belə təsvir edirdi: "Mayın 23-də...növbəti fəaliyyət planını və birgə işləri müəyyənləşdirmək üçün şəhərdə olan 1-ci Azərbaycan diviziyasının rəisi general Cavad bəy Şıxlinskini, Azərbaycan Ordusunun baş intendantı general Məhəmməd Mirzə Qacarı və süvari diviziyasının rəisi general Teymur bəy Novruzovu müşavirəyə də'vət etdim. İlk iki general onların arxasınca göndərilmiş polk adyutantlarının müşayiəti ilə gəldilər. Küçələrə çıxan əhalinin sevincini xüsusi qeyd etmək lazımdır. Əhali polkun qərargahına gələn hər iki generalı "Yaşasın" sədaları ilə qarşıladı. Onları qərargaha əllərinin üstə apardılar. Uzun müddət küçələrdə sevinc qışqırtısı eşidilirdi. Yalnız mənim tə'kidli xahişlərimdən sonra kütləni sakitləşdirmək mümkün oldu. Xalq evlərinə dağılmışdı.

Bu müşavirədə general Məmməd Mirzə Qacar yerli hökumətin ümumi rəhbəri və təşkilatçısı seçilir. Artilleriya generalı Cavad bəy Şıxlinski həm bolşeviklərdən alınmış artilleriyanı, həm də bolşeviklərin pozub dağıtdıqları Azərbaycan artilleriyasını yenidən təşkil edir, mən öz polkuma və partizan dəstələrinin fəaliyyətinə rəhbərlik edirəm" (269, s.68).

Başqa bir mə'lumata görə isə üsyanın təşkilatçıları mayın 23-də Gəncə qəbiristanlığında toplaşmışdılar. Şəhərdə mövcud olan özbaşınalıqlara, qanunsuzluqlara, bolşevik donu ilə pərdələnmiş ermənilərin apardıqları talanlara son qoyulmasının yeganə yolunu Məhəmməd Mirzə Qacar silahlı üsyanın tezliklə başlanmasında gördü. Müzakirələr əsasında vahid qərargah və əməliyyat qrupları yaradıldı. Səhərisi gün, yə'ni mayın 24-də üsyanın təşkilatçıları Nüzgar kəndində toplaşdılar və fəaliyyət planının son detallarını müzakirə etdilər (28, v.65; 19, 8.V.1992). Üsyanın həyata keçirilməsinə Qaçaq Qənbərin və Sarı Ələkbərin rəhbərliyi altında olan partizan dəstələri də cəlb edilmişdi.

Gəncə üsyanı 1920-ci il mayın 25-dən 26-na keçən gecə başladı. Sarı Ələkbərin rəhbərliyi altında olan partizan dəstələri və keçmiş hərbçilərdən təşkil olunmuş qruplar şəhərin mühüm obyektlərini, o cümlədən Gəncənin azərbaycanlılar yaşayan məhəlləsində yerləşdirilmiş sovet qoşun bölmələrini nəzarət altına götürdülər. Bu qoşun bölmələri əsasən qeyri-nizami qoşun bölmələri idi. Nizami qoşun bölmələri isə şəhərin ermənilər yaşayan hissəsində yerləşdirilmişdi. Ona görə də üsyançılar bu məhəlləni ələ keçirə bilmədilər. Şəhər erməniləri də üsyançılara qarşı mübarizədə hər vasitə ilə qırmızı qüvvələri himayə edirdilər (15, 8.VI.1920).

Üsyançılar hərbi cəbbəxananı, şəhər türməsini, dəmir yolu stansiyasının fövqəl'adə komissarlığın binasını tutdular. Bolşevik fəallarının çoxu həbs edilib həbsxanaya salındı. Üsyançılara Şəmkir və Bağmanlardan kömək gəldi. Polkovnik C.Kazımbəyov Gəncə qarnizonunun rəisi tə'yin edildi. Üsyançıların piyada qüvvələrinə polkovnik Krauze rəhbərlik edirdi. Topçuların komandiri isə polkovnik Nikolayev idi (15, 8.6.1920; 19, 8.5.1992).

Beləliklə, qısa müddət ərzində şəhərin əsas hissəsi nəzarət altına götürüldü. Lakin üsyançılar şübhə etmirdilər ki, bolşeviklər Gəncədəki uğursuzluqları ilə razılaşmayacaq və güclü əks-hücuma keçəcəklər. Ona görə də onlar bu ağır və çətin mübarizəyə hazırlaşırdılar.

Polkovnik C.Kazımbəyovun yazdığına görə, mayın 28-də üsyanın başçıları, fəalları və Azərbaycanın müstəqilliyini sevənlər dairə məhkəməsinin binasına toplaşıb Azərbaycanın istiqlaliyyətinin e'lan olunmasının iki illiyini qeyd etdilər. Toplaşanlar qarşısında çıxış edən Şeyxülislam üsyançıları son nəfəsə qədər mübarizəyə səslədi (10, 27.5.1997).

Gəncə üsyanının yatırılması üçün bolşevik qüvvələri tə'cili tədbirlər həyata keçirməyə başladılar. Azərbaycan Xalq Daxili İşlər komissarı Həmid Sultanov eyni zamanda Gəncə quberniyası üzrə fövqəl'adə komissar, Bala Əfəndiyev isə onun müavini və Gəncə qəza milis rəisi tə'yin edildilər (19, 8.V.1992).

Gəncəyə əlavə bolşevik qüvvələrinin göndərilməsi də qərara alındı. Üsyan ərəfəsində Gəncədə sovet qüvvələrindən 178-ci və 180-ci alaylar, 20-ci diviziyanın tərkibinə daxil olan 60-cı briqadanın yüngül topçu diviziyonu dayanmışdı. Mayın 25-də Taman süvari briqadasının 2-ci briqadası

da bura gətirildi. XI ordu komandanlığının mayın 26-da imzaladığı əmrlə Gəncədəki sovet qoşunları qruplaşması 179-cu alay və 20-ci nişançı diviziyasının süvari briqadası ilə möhkəmləndirildi. Mayın 28-də hətta Zaqatala bölgəsində olan 18-ci süvari diviziyası da Gəncəyə gətirildi. Yə'ni elə də böyük olmayan hərbçilər dəstəsinin əsas zərbə qüvvəsi olduğu Gəncə üsyanının yatırılması üçün çox böyük və güclü bir qruplaşma yaradıldı (bax: 250a, s.34). Heç şübhəsiz ki, belə güclü bir qruplaşma ilə bolşeviklər Gəncə üsyanını dərhal yatırmaq və digər bölgələrə də dərs vermək istəyirdilər.

Ancaq bu böyük qruplaşma Gəncədə üsyançıların çox ciddi müqavimətı ilə rastlaşdı. Qırmızı döyüşçülərin irəliyə atdığı hər bir addım çoxlu itki bahasına başa gəlirdi.

Mayın 29-da Qırmızı Ordu qüvvələri üsyançılar üzərinə hücuma keçdilər. Elə ilk döyüşlər göstərdi ki, mübariz ruhda köklənmiş olan üsyançıların iradəsini qırmaq elə də asan olmayacaqdır. Göstərilən cəhdlər bir-birinin ardınca uğursuzluğa düçar olurdu. 178 və 179-cu alaylar şəhərin şimal-qərb istiqamətindən hücum edirdilər. Şəhərin ətrafında bu alaylar üsyançıların müqaviməti ilə rastlaşdılar. Şəhərin şərqindən, erməni məhəlləsindən hücum edən qüvvələr isə heç Gəncə çayını keçməyə müvəffəq olmadılar. Şəhərin cənubundan irəliləyən qırmızı süvarilərin qarşısını buradakı bağlarda və üzümlüklərdə mövqe tutmuş üsyançılar saxlamışdılar. Gəncə üsyanının iştirakçıları sadəcə olaraq müdafiədə dayanmamışdılar. Qırmızı qüvvələrin ilk zərbələrini dəf edən üsyançı dəstələr uğurla əks-hücuma keçib hətta 178-ci və 179-cu alayları mühasirə etmək təhlükəsi yaratmışdılar (250a, s.35).

Mayın 30-da aparılan döyüşlər də bolşeviklərin tam uğursuzluğu ilə nəticələndi. Belə olanda Gəncə ətrafındakı sovet qoşunları qruplaşmasının daha da möhkəmləndirilməsi qərara alındı. Mayın 31-də 20-ci nişançı diviziyanın Gürcüstanla sərhəddə yerləşən 59-cu briqadası da Gəncəyə gətirildi. Bu briqadanın tərkibinə 175 və 176-cı nişançı alaylar, yüngül topçu divizionu daxil idi. Bakıdan isə Gəncəyə zirehli avtomobillər divizionu gətirildi. Üsyanın əsas taleyini də elə toplarla zirehli avtomobillər həll etdi. Piyada qoşunları bütün istiqamətdən hücuma keçdikləri vaxt 57 ədəd top və zirehli avtomobil Gəncənin azərbaycanlılar yaşayan hissəsini aramsız atəşə tutdu. Yalnız güclü dağıntılardan sonra bolşeviklər üsyançıların müqavimətini qırdılar və şəhərə daxil oldular (250, s.35). XI ordunun komandiri Levandovski də e'tiraf edirdi ki, Gəncənin yarısı salamatdır, ikinci yarısı dağıdılıb viran qoyulmuşdur (15, 23.VI.1920).

Sovet mənbələrində olan mə'lumatlara görə Gəncə üsyanının yatırılması zamanı qırmızı hissələrdən 808 nəfər ölmüş və yaralanmış, üsyançılardan isə 1000 nəfər ölmüşdü (250a, s.35).



Gəncə üsyanı yatırılan kimi kütləvi həbslər aparıldı: sovet hökumətinə sədaqət göstərməyənlərə divan tutuldu. Bolşevik divanının əsas zərbəsi isə Azərbaycan zabitlərinə və hərbçilərinə doğru istiqamətləndirildi. Çox az sayda Azərbaycan zabiti bolşevik terrorundan yaxa qurtara bildi. Bunların arasında generallar və yüksək rütbəli zabitlər də var idi. Mövcud olan mə'lumata görə qısa vaxt ərzində bolşeviklər Azərbaycan Ordusu sıralarında xidmət etmiş 12 generalı, 27 polkovnik və podpolkovniki, 46 nəfər kapitan, ştabs-kapitan, poruçik və podporuçiki, 148 nəfər praporşik və podpraporşiki, 267 nəfər digər azərbaycanlı hərbi qulluqçunu güllələmişdilər (269, s.197).

Bolşevik qəzəbi Azərbaycan Ordusunun liderləri olmuş S.Mehmandarov və Ə.Şıxlinskidən də yan keçmədi. Bu böyük sərkərdələri bolşevik-erməni caynağından N.Nərimanovun V.İ.Leninə yazmış olduğu məktub xilas etdi. Həmin zabitlər vasitəsilə göndərdiyi məktubunda Nərimanov bildirirdi ki, Gəncə üsyanı zamanı köhnə Azərbaycan Ordusunun bütün zabitləri həbsə alınmışdı. Bu məktubu sizə təqdim edən məşhur generallar Mehmandarov və Şıxlinski də onların arasında idi. Diqqətli yoxlama nəticəsində mə'lum oldu ki, bu generalların üsyanla əlaqəsi olmamışdır. Lakin mövqeyimiz sabitləşənə qədər və ümumi işimizə kömək etmək məqsədilə biz hər halda bu qərara gəldik ki, onları ştabda işləmək üçün Sizin sərəncamınıza göndərək. Çünki onlar hərbi mütəxəssis olmaq e'tibarilə əvəzsizdirlər. Onlardan biri - Şıxlinski Nikolay ordusunda "artilleriyanın allahı" sayılırdı. Polşa cəbhəsi qurtarana qədər qoy onlar Moskvada işləsinlər. Sonra sizdən xahiş edəcəyəm ki, bizim əsgəri hissələrimizi təşkil etmək üçün onları buraya göndərəsiniz. Bu müddətdə onların qayğısına qalmaq lazımdır (227, s.46). Gəncə üsyanının vəhşicəsinə yatırılması heç də Azərbaycanda anti-sovet çıxışlarının qarşısını almadı. Gəncəlilər qan içində boğulduqdan az sonra Qarabağda irimiqyaslı antisovet üsyanı alovlandı.

Hələ Gəncə üsyanı yatırılmamış Qaryagində üsyanın başlaması üçün hazırlıq görüldü. Bu bölgədə üsyanın təşkilinə Azərbaycan Ordusu bölmələri, partizan dəstələri və bolşevik işğalına razı olmayan qüvvələr cəlb edilmişdilər. Gəncə üsyanının başlanması barədə xəbər alınan kimi Qaryagin ətrafında milli qüvvələrinin toplantısı keçirildi. Gəncədə üsyanın uğurları və Qarabağdakı sovet qüvvələrinin müəyyən qisminin Gəncə ətrafına aparılması barədə mə'lumat verildi. Qaryagin ətrafında da uğurlu antisovet üsyanı üçün əlverişli şərait olduğu vurğulandı. Toplantıda qərara alında ki, polkovnik Sofiyevin dəstəsi Cəbrayıldan Qaryaginə çağırılsın və partizan dəstəsi təşkil edilsin. Ağdamda vəziyyətdən xəbər tutmaq üçün Cümşüd bəyin ora göndərilməsi məqsədəuyğun sayıldı. Toplantıda antisovet üsyanını mayın 29-dan 30-na keçən gecə başlamaq razılaşdırıldı. Qaryagin qəzasında 20-yə yaxın könüllü silahlı dəstə yaradılmışdı. Mayın

29-da Tofiq bəyin 50 nəfərlik süvari dəstəsi Yolçuda dayanan bolşevik postuna hücum etdi. Mayın 30-da bolşevik orqanlarının nümayəndələri həbs edildilər və qəzada hakimiyyət milli qüvvələrin əlinə keçdi. Sovet mənbələrində olan mə'lumatlara görə Qaryagın ətrafındakı antisovet üsyanında Azərbaycan Ordusunun bir süvari alayı, bir piyada alayı, bir top batareyası, 2 pulemyot taqımı iştirak edirdi (30, v. 113-124).

Qaryagında baş verən antisovet üsyanı təcrid olunmuş ayrıca bir üsyan deyildi. Bu üsyan bütünlükdə Qarabağı bürümüş olan antisovet üsyanının tərkib hissəsi idi. Türk generalı Nuru Paşa da bu üsyanın hazırlanmasında yaxından iştirak edirdi. Qarabağ üsyanının da əsas aparıcı qüvvəsi Azərbaycan Ordusunun zabit və əsgərləri idi. İyun ayının əvvəlində Şuşa şəhəri bolşevik qüvvələrindən azad edildi (305, s. 282).

Şuşa bolşevik qüvvələrindən azad edilən gün, yə'ni iyunun 5-də Ağdam və Tərtər ətrafında da üsyanın alovları genişləndi (250a, s. 38). Erməni işğalçı qüvvələrinə qarşı mübarizə aparmaq üçün Qarabağa yerləşdirilmiş olan Azərbaycan Ordusunun hissələri hələ buradan çıxarılmamışdı. Həmin hissələr azsaylı olsalar da bütünlüklə bolşevik hakimiyyətinə qarşı üsyanda iştirak edirdilər.

Qarabağda başlanan üsyan nəticəsində Şuşa ilə bərabər Xankəndi və Ağdam da sovet hərbi qüvvələrindən təmizləndilər və bu hərbi qüvvələr geri çəkilərək Bərdədə, Tərtər çayının sol sahilində mövqe tutdular (227a, s.26).

Tərtər çayı qarşı-qarşıya dayanan qüvvələri bir-birindən ayırırdı. Burada bolşevik qüvvələrinə daha bir zərbə vurulması nəzərdə tutulurdu. Üsyançı qüvvələr bu məntəqəyə toplaşırdılar. Həttа Qaryagindən də bura 2-ci Qarabağ süvari alayının bölmələri göndərilmişdi.

Qaryagın ətrafında hakimiyyəti itirən bolşevik qüvvələri Qoç-Əhmədli kəndinə toplaşaraq burada yeni mövqelər tutmuşdular. Onlar bu kəndi üsyançılara qarşı hücum bazasına çevirmək istəyirdilər. Buna yol verməmək üçün üsyançılar iyun ayının 11-də Qoç-Əhmədli kəndi üzərinə hücuma keçdilər. Bolşevik qüvvələri kəndin dövrəsi boyu 7 yerdə güclü mövqelər düzəltmişdilər. Onları keçmək xeyli itkilərə gətirib çıxara biləcəyindən üsyançılar toplardan istifadə etməyi qərara aldılar. Murğuzlu kəndi istiqamətində yerləşmiş olan topun atəşləri bolşeviklərin müqavimətini qırdı və axşama yaxın Qoç-Əhmədli kəndi də bolşevik qüvvələrindən azad edildi (30, v.124).

İyunun 9-da Qarabağda başlanan kütləvi antisovet üsyanının yatırılması ilə bağlı XI ordu komandanı xüsusi bir əmr imzaladı. Bu əmr Qarabağı bolşeviklərdən təmizləmiş milli qüvvələrə qarşı irimiqyaslı hərbi əməliyyatın keçirilməsini nəzərdə tuturdu. Əməliyyatın uğurunu tə'min etmək üçün Qarabağa da güclü bir dəstənin göndərilməsi planlaşdırıldı. Əmrdə əvvəlcə bölgədəki vəziyyət müxtəsər təsvir olunur və bura cəlb edilən



qüvvələrin döyüş tapşırıqları dəqiqləşdirilirdi. XI ordunun hissə və birləşmələri, habelə məs'ul şəxslərin qarşısında aşağıdakı vəzifələr qoyulmuşdu (bax:7, s.61-64):

1. 32-ci diviziya zirehli avtomobillər dəstəsi, müsəlman fəhlə dəstəsi və 20-ci diviziyanın bir briqadası ilə iyunun 10-da saat 6-da bütün cəbhə boyu hücuma keçərək Tərtər-Sərkərli məntəqələri arasındakı əraziləri tutaraq yerli əhalini tərksilah etməli idi. Bərdədə güclü ehtiyat qüvvə saxlanmalı və Tərtər çayı üzərindəki körpünün qorunması da bu qüvvəyə tapşırılmalı idi. Nəqliyyat yollarının qovşağında olan Yevlağın mühafizəsi üçün xüsusi dəstələr ayrılmalı idi;

2. 2-ci süvari korpusu piyada hissələrinin cinahları boyunca irəliləyərək Tərəkəmə-Qazaxlar istiqamətindəki kəndlərin əhalisini tərksilah etməli idi Taman-süvari briqadası ehtiyat qüvvə kimi saxlanılmalı və Qarabağ üsyanı yatırıldıqdan sonra Şamaxıya qaytarılmalı idi;

3. Ordunun qərargah rəisi 1-ci süvari diviziyasının Cavad qəzasına atılması ilə məşğul olmalı idi;

4. Hərbi təyyarəçi Lunkeviçə tapşırılmışdı ki, Yevlaxda yerləşən bütün təyyarələrin fəaliyyətini nizamlasın. Burada təyyarələr kifayət qədər bomba götürərək əməliyyat rayonuna yollanmalı, 32-ci diviziyanın və 2-ci süvri korpusunun hissələrinin fəaliyyətini bombalar və pulemyot atəşləri ilə gücləndirməli idi;

5. Birləşmiş Azərbaycan diviziyası 20-ci diviziyanın əməliyyat tabeliyində olmaqla Yevlaxda mövqe tutmalı və əməliyyata cəlb edilən qüvvələrin arxa rayonunu təşkil etməli idi;

6. Əsas qüvvələrin qərargahı Bərdədə yerləşməli idi. XI ordunun komandanı Levandovski də Bərdəyə gəlməli və oradan üsyanın yatırılmasına rəhbərlik etməli idi.

Üsyanın yatırılmasına başlanması ərəfəsində Yevlaxda XI ordunun hərbi inqilab şurasının iclası oldu. İclasda Ç.İldırım, Qarabağın və Zəngəzurun fövqəl'adə komissarı D.Bünyadzadə və başqaları da iştirak edirdilər. Burada qərara alındı ki, xüsusi dəstə yaradılsın və həmin dəstə üsyançılara arxadan zərbə vurmaq üçün Ağdam, Qaryagin və Şuşaya göndərilsin (227a, s.27).

Nuru Paşanın və polkovnik Zeynalovun rəhbərliyi altında olan üsyançılar da sovet qüvvələrini dəf etməyə hazırlıq görürdülər. Polkovnik Zeynalov Qarabağda antisovet üsyanı hərbi qüvvələrinin baş komandanı tə'yin edilmişdi. Bolşeviklər qəti hücuma keçmək ərəfəsində polkovnik Sofiyevin komandirliyi altında olan 1-ci Tatar süvari alayı, Cavanşir piyada alayı, top divizionu və digər bölmələr Tərtər çayının sağ sahilində müdafiə mövqeləri tutmuşdular (225, s.76,80).

İyunun 10-da bolşevik qüvvələri bütün cəbhə boyu hücuma keçdi. Çoxsaylı toplardan, zirehli avtomobillərdən, hərbi təyyarələrdən istifadə

edən Qırmızı Ordunun qarşısını saxlamaq elə də asan deyildi. Azərbaycanın milli qüvvələri xidmət etdikləri ideyalar yolunda bütün imkanlarını sərf etsələr də həm say və həm də hərbi imkanlar baxımından böyük üstünlüyə malik olan bolşevik qüvvələrinin qarşısında geri çəkilmək məcburiyyətində qaldılar. İyunun 11-də Tərtər, Bərdə və Ağdam ərazisi XI ordu hissələrinin nəzarəti altına keçdi. İyunun 13-də Şuşa şəhəri ələ keçirildi. Nuru Paşa və polkovnik Zeynalov Şuşanı tərk etməli oldular. Şuşa şəhərində bolşevik hakimiyyəti bərpa edildikdən sonra XI ordunun hissələri Qaryagin, Cəbrayıl, Hadrut, Qubadlı, Zəngilan və başqa yerlərdə də antisovet üsyanlarını yatırdılar (225, s.80).

İyun ayının əvvəlində Zaqatala bölgəsində də güclü antisovet üsyanı baş verdi. Bu üsyan Talı kəndində başladı. Üsyançılar iyunun 5-də Zaqatalanı tutdular. İyunun 7-də isə Qax ələ keçirildi. Azərbaycan Ordusunun bölgədə olan bölmələri də üsyançılara qoşuldular (227, s.48).

İyunun 10-da XI ordu komandanı Zaqatala üsyanının yatırılması üçün də əmr imzaladı. Yeddi gün ərzində üsyançıların müqavimətini qıra bilməyən 7-ci süvari diviziyasına əlavə kömək göndərildi. 58-ci *nişançı briqada* və iki ədəd zirehli maşın Zaqatalaya göndərildi. Taman süvari briqadası Yevlaxa gətirildi *və zərurət yarandığı halda bu hissə də Zaqatalaya* atılmalı idi. Zaqatalada üsyanın yatırılmasına XI ordu komandanı M.Levandovski şəxsən özü rəhbərlik edirdi. Bolşevik qüvvələri daha bir həftə üsyançılarla döyüşməli oldu. Qüvvələr nisbətində böyük üstünlüyə *malik olan qırmızı hissələr iyun ayının 18-də Zaqatalaya* daxil olub qalanı tutdular (250a, s.36-37).

XI ordu komandanının 1920-ci il iyunun 15-də imzaladığı 65 saylı əmrdən aydın olurdu ki, Qarabağda üsyançıların əsas qüvvəsinin müqaviməti qırılsa da, onların bir hissəsi Ağdamdan geri çəkilib Qaryagin yaxınlığındakı Qarabulaq məntəqəsində toplaşmışdılar. Güman edilirdi ki, burada 1-ci Cavanşir piyada alayından 2 bölük, Gəncə piyada alayının bir taboru, Tatar süvari alayının qalıqları, 5 ədəd top, 10-dan artıq pulemyot var idi. Nuru Paşa, polkovnik Zeynalov, podpolkovnik Rəfibəyov və bir sıra digər yüksək rütbəli zabitlər də burada idi (7, s. 74).

Azərbaycan Ordusunun sıralarında xidmət etmiş zabit və əsgərlər, habelə onların ətrafına toplaşmış olan milli qüvvələr Qarabağda bolşevik işğalına qarşı öz mübarizələrini davam etdirsələr də, Bərdə yaxınlığındakı döyüşdən sonra hərbi təşəbbüs artıq birdəfəlik bolşevik qüvvələrinin əlinə keçmişdi. Qarabağ bölgəsinə çoxsaylı Qırmızı Ordu hissələrinin göndərilməsi bu bölgədə nəzarətin bolşeviklərin əlində saxlanılmasına imkan verdi.

1920-ci ilin payızında istər Qarabağda, istər Salyan bölgəsində, istərsə də Qubada bolşevik işğalına qarşı çıxışlar xeyli canlandı. Ancaq bu çıxışlar irimiqyaslı deyildi və çoxsaylı Qırmızı Ordu üçün elə də ciddi bir təhlükə təşkil etmirdi (305, s . 295).



1920-ci ilin sonlarına yaxın daha miqyaslı antisovet üsyanı Lənkəran bölgəsində qalxdı. Bu üsyanda da Azərbaycan Ordusunun hərbi qulluqçularından iştirak edənlər var idi. Üsyançılara Camal Paşa və Nəcəfqulu xan rəhbərlik edirdilər. Sovet mənbələrindən olan mə'lumatlara görə üsyançıların sayı 10 min nəfərə çatırdı. Bölgədə yerləşmiş olan 245-ci Qırmızı alay *üsyançıların müqavimətini qıra* bilmədi. Dekabr ayının ortalarında üsyançılar dəniz sahilində olan Şahağac, Gilkəran, Sefidor kəndlərini, habelə böyük bir ərazini bolşevik nəzarətindən çıxardılar (225, s.111).

Cənub bölgəsində milli qüvvələrin belə fəallaşması bolşevik hökumətini narahat etməyə bilməzdi. *Üsyanın yayılmasına imkan* verməmək və onun qarşısını almaq üçün bölgəyə əlavə olaraq 248 və 249-cu nişançı piyadalar yeridildi (305, s.297). Üsyanın yatırılması üçün bolşeviklər bura çoxsaylı hərbi gəmilər də göndərdilər. Belə bir plan hazırlanmışdı ki, piyada qüvvələr Lənkəran tərəfdən hücuma başlasınlar. *Astaraya isə gəmilər* vasitəsilə desant atılmalı idi. Bu desant üsyançılara arxadan zərbə vurmalı idi (255, s.111).

Çoxsaylı hərbi gəmilərin cəlb edilməsi ilə dekabrın 21-25-də üsyançılarla Qırmızı Ordu hissələri arasında çox gərgin döyüşlər getdi. Yalnız beş gündən sonra üsyançılar geri çəkilmək məcburiyyətində qaldılar (305, s.297).

Bolşevik qüvvələri Azərbaycanın zabit və əsgərlərinin iştirak etdiyi çoxsaylı antisovet üsyanlarını yatıra bilsələr də, bu, onlar üçün çox ciddi itkilər bahasına başa gəlirdi. Sovet mənbələrinin mə'lumatına görə 32-ci diviziya şəxsi hey'ətinin təxminən yarısını itirmişdi. XI ordunun hissə və birləşmələrindən Azərbaycanda gedən döyüşlərdə 2501 nəfər öldürülmüş və ya itkin düşmüş, 483 nəfər isə yaralanmış və xəstələnmişdi (250a, s.42). Bunlar da Azərbaycanın milli qüvvələri tərəfindən antisovet üsyanlarının nə qədər ciddi hazırlandığını və ardıcıllıqla aparıldığını nümayiş etdirir.

# NƏTİCƏ

1917-ci ilin fevralında Rusiyada baş verən burjua-demokratik inqilabı, ciddi siyasi proseslər Azərbaycanın ictimai-siyasi həyatında da böyük bir canlanma yaratdı. Milli təəssübkeşlik və milli dirçəliş ruhunda köklənmiş olan qüvvələrin fəaliyyəti daha geniş xarakter aldı və bu qüvvələrin təmsilçiləri milli ideyalara dayaqlanan təşkilatlarda qurumlanaraq xalqın milli müqəddəratının müəyyənləşdirilməsi uğrunda ardıcıl mübarizəyə qoşuldular.

Bu mübarizənin əsas istiqamətlərindən biri də milli tərkibli qoşun hissələrinin təşkilinə nail olunması idi. Mə'lumdur ki, Azərbaycan XIX əsrin əvvəllərində Rusiya tərəfindən işğal edildikdən sonra milli qoşun hissələrinin mövcudluğuna son qoyulmuşdu. Çar Rusiyası dini və etnik mənsubiyyət üzündən azərbaycanlıların hərbi xidmətə çağırılmasına şübhə ilə yanaşırdı və onların sədaqətinə bel bağlamırdı. Hərbi xidmətdən azad edilən əhalidən isə əlavə hərbi vergi tutulurdu. Yalnız çox az sayda azərbaycanlı ictimai mənşəyinə görə Çar Rusiyasının hərbi məktəblərinə daxil olmuş və zabit kimi ordu sıralarında xidmətini davam etdirmişdi. Bu vəziyyət 1917-ci ilin sonlarına kimi davam etdi. XX əsrin əvvəllərində azərbaycanlılarla qonşu olan həm ermənilər, həm də gürcülər arasında çoxsaylı hərbçilərin olmasına baxmayaraq azərbaycanlıların hərbi xidmətə cəlb edilməsindəki ayrı-seçkilik qalmaqda davam edirdi. Hətta fevral inqilabından sonra Zaqafqaziyada idarəetmə orqanı kimi yaradılmış olan Xüsusi komitə azərbaycanlılardan ibarət olan qoşun hissələrinin yaradılmasına razılıq veriləcəyini bildirsə də, bu məsələ həll edilməmiş qalırdı. Bu isə milli-azadlıq uğrunda mübarizəni genişləndirən qüvvələri narahat etməyə bilməzdi. Azərbaycanlılara qarşı erməni-daşnak təcavüzlərinin, onların millətçi iddialarının genişləndiyi bir şəraitdə milli tərkibli qoşun hissələrinin yaradılması əslində xalqın fiziki məhvinin qarşısının alınması üçün yeganə e'tibarlı vasitə idi.

1917-ci ilin oktyabrında Rusiyada bolşeviklərin hakimiyyəti ələ almasından sonra Zaqafqaziyada idarəetmə orqanı kimi yaradılmış olan Zaqafqaziya komissarlığı həmin ilin dekabrında Müsəlman Korpusunun yaradılması barədə qərar qəbul etdi. Bu korpus Qafqaz cəbhəsinin 6-cı korpusunun bazasında yaradılmalı idi. Korpusun strukturu demək olar ki, olduğu kimi saxlanıldı. Onun tərkibində hər biri 4 nışançı alaydan ibarət olan 2 nışançı diviziya, üç süvari alaydan ibarət olan süvari briqada, topçu hissəsi və s. hissə və bölmələr var idi. Korpusun komandanı vəzifəsinə istefada olan general-leytenant Ə.Şıxlınski tə'yin edilmişdi. Korpusun zabitləri müxtəlif millətlərdən idi. Onun sıralarında azərbaycanlı və bütünlükdə müsəlman zabitlərin qəbul edilməsinə üstünlük verilsə də, milli kadrlar xeyli az idi. Ona görə də digər millətlərdən, xüsusən də rus zabitlərindən istifadə edilməsinə yer verilirdi. Korpusun sıravi hey'əti isə yalnız müsəlmanlardan komplektləşdirilməli idi. Buna görə azərbaycanlı əhali arasından çağırışçıların toplanmasına başlandı. Doğrudur, bu məsələ elə də asan deyildi. Təxminən bir əsr müddətindən hərbi xidmətdən yadırğamış olan xalqın hərbə münasibətində birdən-birə dönüş yaratmaq çətin idi. Bununla belə, xalqın müqəddəratının müəyyənləşdirilməsi işində ordunun əhəmiyyətini başa düşən milli əhval-ruhiyyəli vətəndaşlar könüllü surətdə ordu sıralarına yazılırdılar. Məsələn, Bakıda Azərbaycan süvari diviziyonu təşkil edilmişdi. Azərbaycanın tanınmış milyonçuları Hacı Zeynalabdin Tağıyevin və Şəmsi Əsədullayevin övladları da könüllü surətdə bu diviziyonda xidmətə yazılmışdılar.

Müsəlman Korpusu Zaqafqaziya Komissarlığının sərəncamında olan Qafqaz cəbhəsinin tərkibinə daxil idi. Milli qoşun birləşməsi kimi təşkilinə başlansa da, Müsəlman Korpusunu Azərbaycan Ordusu saymaq olmaz. Çünki bu vaxt heç müstəqil Azərbaycan dövləti yox idi. Ancaq bu korpus sonradan yaradılan müstəqil Azərbaycan Ordusu üçün bir özül rolunu oynadı. Müsəlman Korpusunun təşkilinə başlanması xalqın psixologiyasında bir dəyişiklik yaratdı, azərbaycanlılardan ibarət olan qoşun hissələrinin formalaşdırılmasının mümkünlüyünə bir inam oyatdı. Azərbaycanın müstəqilliyinin e'lan edilməsindən əvvəl mövcud olan milli qoşun hissələrinin xidmət tarixinin öyrənilməsi göstərir ki, Ə.Şıxlinski və ətrafına topladığı zabitlər müstəqil ordunun təşkili üçün özül rolunu oynayacaq bir sıra hissə və bölmələrin formalaşdırılmasında çox böyük işlər görmüşdülər. Milli müsəlman komitələri tərəfindən himayə olunan bu hissə və birləşmələr Lənkəran bölgəsində, Şamaxıda, şimal rayonlarında hətta bolşeviklərin və bolşevik pərdəsi altında gizlənmiş daşnak qüvvələrinə ciddi zərbələr vurmuşdular.

Müsəlman Korpusunun maddi tə'minatı Milli müsəlman komitələri və Zaqafqaziya komissarlığı tərəfindən aparılırdı. Lakin bu qurumların imkanları elə də böyük deyildi. Xüsusilə silah çatışmazlığı üzündən hissələrin təchizi çox pis vəziyyətdə idi. Bu məsələnin həlli üçün Qafqaz cəbhəsinə tərk edib gedən bu sıra hərbi eşelonlar Gəncə ətrafında tərksilah edilirdilər. Milli qüvvələr Lənkəran bölgəsində də rus qoşun bölmələri üzərinə hücum edib xeyli silah əldə etmişdilər. Bu isə qoşun hissələrinin hərbi imkanlarını yaxşılaşdırırdı. Bakıda güclü bazaya malik olan bolşevik-daşnak elementləri bundan çox ciddi narahatçılıq keçirirdilər. Milli qüvvələr üzərinə hücuma başlamaq üçün bolşevik-daşnak elementləri 1918-ci ilin mart ayının sonunda Bakıda kütləvi qırğın təşkil etdilər. Sonra bu qırğın-

lar Şamaxı və Qubada davam etdirildi. Bolşevik-daşnak qüvvələri milli qoşun hissələrinin müqavimətini qıraraq Gəncəyə qədər irəliləmək və burada mərkəzləşmiş olan Azərbaycanın milli qüvvələrini məhv etmək istəyirdilər. 1918-ci il may ayının 28-də Azərbaycanın istiqlaliyyəti e'lan edilsə də, Bakı bolşeviklərin hakimiyyəti altında qalmaqda idi və onların tabeçiliyində olan qoşun hissələri iyun ayının əvvəllərində Gəncəyə doğru yürüşə başladılar. 1918-ci il iyunun 4-də Azərbaycanla Türkiyə arasında imzalanan dostluq müqaviləsinə görə türk qoşun hissələri Azərbaycana daxil oldu və respublika ərazisinin bolşevik-daşnak elementlərindən təmizlənməsində xüsusi rol oynadılar.

Azərbaycan ərazisinə ilkin olaraq 5-ci türk diviziyası daxil oldu və onun ilk hissələri 1918-ci il iyunun 9-da Gəncəyə çatdı. 5-ci türk diviziyası təşkilati baxımdan Müsəlman Korpusunun tərkibinə daxil idi. Bütün qoşunlara komandanlıq isə Nuru Paşanın rəhbərliyi altında olan Qafqaz İslam Ordusunun qərargahına tapşırılmışdı.

1918-ci il iyunun 26-da Müsəlman Korpusu Xüsusi Azərbaycan Korpusu adlandırıldı və qoşunlarla hökumət arasında əlaqələrin yaradılması üçün Baş hərbi müvəkkillik tə'sis edildi. •

Türk və Azərbaycan qoşunları Yevlaxa doğru irəliləyən bolşevik qoşunlarının qarşısını kəsərək onlara ciddi zərbələr endirdilər. Qüvvələrin düzgün bölüşdürülməsi, çevik taktika işlədilməsi və möhkəm iradə nəticəsində birləşmiş Türk-Azərbaycan qoşunları uğurlu döyüş yolu keçərək 1918-ci il sentyabrın 15-də Bakı şəhərini tamamilə azad etdilər.

1918-ci ilin iyun-sentyabr ayları arasında Bakı uğrunda əvvəlcə bolşevik, sonra da Sentrokaspi qoşunları ilə döyüşlərin aparıldığı vaxt Azərbaycanın qoşun hissələrinin formalaşdırılması istiqamətində də müəyyən addımlar atılırdı: Gəncədə Milli Hərbiyyə Məktəbi açıldı, qoşun hissələrinin komplektləşdirilməsi üçün çağırış-səfərbərlik işi genişləndirildi. Bununla belə, qoşunların maddi-texniki təchizatı xeyli zəif olaraq qalmaqda idi. Hərbi texnika çatışmadığı kimi, əsgərlərin paltarları və yeməyi də lazımi tələblərə cavab vermirdi. Çağırış işində xeyli əliəyrilik və qanunsuzluq aşkar edilmişdi.

1918-ci il oktyabrın 30-da Birinci dünya müharibəsinin nəticələri ilə bağlı imzalanmış Mudros müqaviləsinin şərtlərinə görə türk qoşunları Azərbaycandan çıxarıldı. Bakıya müttəfiq dövlətlərin təmsilçisi kimi ingilis qoşunları bölmələri yeridildi.

Türk qoşunlarının respublikanı tərk etməsindən sonra Azərbaycan Ordusunun formalaşdırılmasının bütün məs'uliyyəti 1918-ci noyabrın 7-də tə'sis edilmiş Hərbi Nazirliyin üzərinə düşdü. Nazirliyin formalaşdırılması tam artilleriya generalı Səməd bəy Mehmandarova həvalə edildi.

S.Mehmandarov tərəfindən diqqət yetirilən başlıca məsələlərdən biri Azərbaycan Ordusunun təşkilati xüsusiyyətlərinin müəyyənləşdirilməsi.



dövrün tələblərinə uyğun olan struktur formasının seçilməsi idi. Bu cəhətin ordunun formalaşdırılmasında əhəmiyyəti nəzərə alındığı üçün daim təkmilləşdirilmə prosesində olmuş və vaxt ötdükcə daha səmərəli formalar qəbul edilmişdi. 1918-ci il noyabrın 15-də Nazirliyin Ümumi qərargahı tə'sis edildi. Qoşunların döyüş və səfərbərlik hazırlığının gücləndirilməsi üçün 1919-cu ilin mart ayında Ərkani-hərb yaradıldı və təcrübəli hərbçi, genaral-leytenant M.Sulkeviç onun rəisi tə'yin edildi. Ordunun genişlənməsi ilə bağlı ayrı-ayrı idarələrin strukturu da təkmilləşdirildi və işlək bir vəziyyətə gətirildi. 1920-ci ilin martında isə Ümumi qərargahla Ərkani-hərbin yerində Ümumordu qərargahı yaradıldı. Ordunun nizamnamələri yenidən işləndi, yeni geyim formaları təsdiq edildi, döyüş bayraqlarının təsviri qəbul edildi, orduda Azərbaycan dilinin işlənməsi barədə əmr verildi.

1918-ci ilin dekabr ayında Hərbi Nazirlik Gəncəyə köçürüldü və 1919-cu ilin iyun ayınadək burada fəaliyyət göstərdi. 1919-cu ilin iyun ayının sonu-iyul ayının əvvəllərində Hərbi Nazirlik yenidən Bakıya qayıtdı. 1919-cu ilin yanvar ayında Xüsusi Azərbaycan Korpusu ləğv edildi. Hərbi Nazirliyin rəhbərliyi diviziya sisteminin saxlanmasına üstünlük verdi. 1920-ci ilin mart ayında Azərbaycan Ordusunun iki piyada diviziyası, onun hər birinin tərkibində isə dörd piyada alayı var idi. Bundan başqa, üç süvari alayından ibarət süvari diviziyası, iki topçu briqadası və bir sıra digər hissə və bölmələr də fəaliyyət göstərirdi. Diviziya sisteminin seçilməsi qoşunların çevik və operativ idarə edilməsini tə'min edirdi.

Konkret hərbi-tarixi şəraitə müvafiq olaraq Hərbi Nazirliyin rəhbərliyi xüsusi idarəetmə formalarının tətbiqinə də yol verirdi. Lənkəran dəstəsinin, Xaçmaz-Quba və Zəngəzur dəstələrinin yaradılması daimi bir hal olmayıb icra edilən vəzifənin xüsusiyyətləri ilə bağlı müəyyən bir müddət üçün təşkil edilmişdi.

Azərbaycan Ordusunun formalaşdırılması və möhkəmləndirilməsi sahəsində daim diqqət mərkəzində dayanan məsələlərdən biri də qoşunların maddi-texniki bazasının yaradılması idi. Çar Rusiyası dövründə Azərbaycanda hərbi infrastrukturanın yaradılmaması respublikanın vəziyyətini xüsusilə çətinləşdirirdi. İqtisadiyyatın lazımınca qurulmaması, inflyasiyanın baş alıb getməsi ordunun maddi-texniki təchizatını daim çətinliklərlə qarşılaşdırırdı.

Doğrudur, ordunun bütün mövcudluğu dövründə maddi-texniki ehtiyac tamamilə həll edilməmişdi.Bununla belə, aparılan məqsədyönlü fəaliyyət bu sahədəki böhranlı vəziyyəti aradan qaldırmış, qoşunların həyatında bir dönüş yaratmışdı. Bu hər şeydən əvvəl ordunun təchizatı və tə'minatı sahəsində Hərbi Nazirliyin rəhbərliyi ilə hökumət arasında qarşılıqlı və işgüzar əlaqələrin yaradılması, habelə mövcud ehtiyatlardan düzgün və qənaətlə istifadə edilməsi nəticəsində mümkün olmuşdu. Hərbi Nazirliyin

